**Toxunulmaz və şərəfli iki məscidin xadimi,
kral Abdullah ibn Əbdüləziz Əli Saud tərəfindən
Allah yolunda vəqf olaraq sədəqə edilir**

satışı qadağandır
**Pulsuz paylanılır**



# QURANİ KƏRİM

**və**
**Azərbaycan dilində
mənaca tərcüməsi**

**Müqəddəs Quranı nəşr edən kral Fəhd adına kompleks**

إِنَّا نَحْنُ نَزَّلْنَا الذِّكْرَ وَإِنَّا لَهُ لَحَافِظُونَ




Qurani Kərim və onun Azərbaycan dilində mənaca tərcüməsinin bu nüsxəsi, toxunulmaz və şərəfli iki məscidin xadimi, Səudiyyə Ərəbistanı Kralı, Abdullah ibn Əbdüləziz Əli Səudun təşəbbüsü ilə çap edilmişdir

تشرف بالأمر بطباعة هذا المصحف الشريف وترجمة معانيه
خادم الحرمين الشريفين الملك عبدالله بن عبدالعزيز آل سعود
ملك المملكة العربية السعودية

وقف لله تعالى من خادم الحرمين الشريفين
الملك عبد الله بن عبد العزيز آل سعود
ولا يجوز بيعه
يوزع مجانا




مجمع الملك فهد لطباعة المصحف الشريف

بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ

# مقدمة

بقلم معالي الشيخ: صالح بن عبدالعزيز بن محمد آل الشيخ
وزير الشؤون الإسلامية والأوقاف والدعوة والإرشاد
المشرف العام على المجمع

الحمد لله رب العالمين، القائل في كتابه الكريم:
﴿... قَدْ جَاءَكُم مِّنَ اللَّهِ نُورٌ وَكِتَابٌ مُّبِينٌ﴾.
والصلاة والسلام على أشرف الأنبياء والمرسلين، نبينا محمد، القائل:
**«خيركم من تعلّم القرآن وعلّمه»**.

أما بعد:

فإنفاذاً لتوجيهات خادم الحرمين الشريفين، الملك عبدالله بن عبدالعزيز آل سعود، -حفظه الله-، بالعناية بكتاب الله، والعمل على تيسير نشره، وتوزيعه بين المسلمين، في مشارق الأرض ومغاربها، وتفسيره، وترجمة معانيه إلى مختلف لغات العالم.

وإيماناً من وزارة الشؤون الإسلامية والأوقاف والدعوة والإرشاد بالمملكة العربية السعودية بأهمية ترجمة معاني القرآن الكريم إلى جميع لغات العالم المهمة تسهيلاً لفهمه على المسلمين الناطقين بغير العربية، وتحقيقاً للبلاغ المأمور به في قوله ﷺ: **«بلّغوا عني ولو آية»**.

وخدمة لإخواننا الناطقين باللغة الأذرية يطيب لمجمع الملك فهد لطباعة المصحف الشريف بالمدينة المنورة أن يقدم للقارئ الكريم هذه الترجمة إلى اللغة الأذرية التي قام بها الشيخ علي خان موسايف، وراجعها من قبل المجمع الشيخ واصف بالاشوف.

ونحمد الله سبحانه وتعالى أن وفق لإنجاز هذا العمل العظيم الذي نرجو أن يكون خالصاً لوجهه الكريم، وأن ينفع به الناس.

إننا لندرك أن ترجمة معاني القرآن الكريم -مهما بلغت دقتها- ستكون قاصرة عن أداء المعاني العظيمة التي يدل عليها النص القرآني المعجز، وأن المعاني التي تؤديها الترجمة إنما هي حصيلة ما بلغه علم المترجم في فهم كتاب الله الكريم، وأنه يعتريها ما يعتري عمل البشر كلّه من خطأ ونقص.

ومن ثم نرجو من كل قارئ لهذه الترجمة أن يوافي مجمع الملك فهد لطباعة المصحف الشريف بالمدينة النبوية بما قد يجده فيها من خطأ أو نقص أو زيادة للإفادة من الاستدراكات في الطبعات القادمة إن شاء الله.

والله الموفق، وهو الهادي إلى سواء السبيل، اللهم تقبل منا إنك أنت السميع العليم.

**Mərhəmətli və Rəhmli Allahın Adı ilə!**
**Əlahəzrət şeyx Saleh ibn Əbdül-Əziz Əli Şeyxin**

## Ön sözü

Həmd olsun Allaha, aləmlərin Rəbbinə! O, Özünün Kəramətli Kitabında belə buyurmuşdur: “Allahdan sizə bir nur və açıq-aydın bir Kitab gəlmişdir.”

Peyğəmbərlərin və elçilərin ən şərəflisinə – Peyğəmbərimiz Muhəmmədə Allahın salavatı və salamı olsun! O demişdir: “Sizin ən xeyirliniz Quranı öyrənənlər və onu başqalarına öyrədənlərdir.”

Toxunulmaz və şərəfli iki məscidin Xadimi, Kral Abdullah ibn Əbdül-Əziz Əli Səud (Allah onu qorusun) özünə şərəf saymışdır ki, Allahın Kitabına qayğı göstərib onun Şərqdə və Qərbdə müsəlmanlar arasında yayılması işinə yardım etsin. Buna görə, o, Quranın şərhinin hazırlanmasına və onun ayələrinin mənalarının müxtəlif dünya dillərinə tərcümə edilməsinə sərəncam vermişdir.

Səudiyyə Ərəbistanı Krallığının İslam işləri, vəqfləri, təbliğatı və təlimi nazirliyi də ərəb dilini bilməyən müsəlmanların Quranı oxuyub yaxşı başa düşə bilmələri üçün Qurani Kərimin dünyanın əsas dillərinə tərcümə edilməsinə böyük diqqət yetirir. Biz bununla insanlara haqqı çatdırmağa və “Hətta bu bir ayə belə olsa, mənim adımdan təbliğ edin!” deyə buyurmuş Muhəmməd Peyğəmbərin (ona Allahın salavatı və salamı olsun!) əmrini yerinə yetirməyə səy edirik.

Bütün yuxarıda qeyd etdiklərimizin əsasında qərara almışıq ki, bizim azərbaycandilli qardaşlarımıza qayğı göstərərək, Mədinə şəhərində yerləşən və Kral Fəhdin adını daşıyan Qurani Kərimin nəşri üzrə Kompleksə müraciətlə xahiş edək ki, şeyx Əlixan Musayev tərəfindən həyata keçirilmiş Qurani Kərimin Azərbaycan dilində mənaca tərcüməsini hörmətli oxucularımıza təqdim etsin. Qurani Kərimin nəşri üzrə Kompleksin təklifi ilə

bu tərcümə üzərində yoxlama işini şeyx Vasif Balaşov həyata keçirmişdir.

Biz anlayırıq ki, Müqəddəs Quranın mənalarının tərcüməsi nə qədər dəqiq olsa da, Quranın ecazkar ayələrinin ehtiva etdiyi dərin mahiyyətini tam mənada vəsf etdirə bilməz. Bu tərcümə, onu həyata keçirənin Quran elmləri sahəsində əldə etdiyi biliklərin əsasında dərk etməyə müyəssər olduğu mənaların inikasıdır. Lakin bu tərcümə, hər hansı bir insan əməyi olan digər əsərlər kimi, səhv və nöqsanlardan xali deyildir. Məhz buna görə hər bir oxucudan xahiş edirik ki, bu tərcümədə aşkar edilən bütün səhvlər, əlavələr və təhriflər haqqında Mədinə şəhərində yerləşən Kral Fəhd adına Qurani Kərimin nəşri üzrə Kompleksə xəbər versinlər. Beləliklə, əgər Allah istəsə, siz bizə kitabın gələcək nəşrlərində səhvlərin təkrar edilməsindən çəkinməyimizə yardım etmiş olarsınız.

İnsanları xeyirxah işlərə yönəldən və onlara doğru yol göstərən təkcə Allahdır. Ey Allah, bizim yaxşı əməllərimizi qəbul et, axı Sən – Eşidən, Bilənsən!

**İslam işləri, vəqfləri,**
**təbliğatı və təlimi naziri,**
**Qurani Kərimin nəşri üzrə**
**Kompleksin Baş Nəzarətçisi**
**Saleh ibn Əbdül-Əziz Əli Şeyx**

## Müqəddimə

Həqiqətən, şükür və tərif yalnız Allaha məxsusdur! Biz Ona həmd edir, Onu köməyə çağırır, Ondan bağışlanma və bizi doğru yola yönəltməyi diləyir, nəfslərimizin şərindən və pis əməllərimizdən qorunmaq üçün yalnız Ona pənah aparırıq. Allah kimə hidayət verərsə, o, doğru yolda olar, kimi azdırarsa, onu doğru yola yönəldən tapılmaz. Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə haqqı olan məbud yoxdur, Onun şəriki yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir.

**"Ey iman gətirənlər! Allahdan layiqincə qorxun və ancaq müsəlman olduğunuz halda ölün!"**[Əli-İmran:102]

**"Ey insanlar! Sizi tək bir şəxsdən xəlq edən, ondan da zövcəsini yaradan və onlardan da bir çox kişi və qadın** *törədib yer üzünə* **yayan Rəbbinizdən qorxun! Adı ilə bir-birinizdən** *cürbəcür şeylər* **istədiyiniz Allahdan qorxun və qohumluq əlaqələrini kəsməkdən** *çəkinin*! **Həqiqətən, Allah sizə nəzarət edəndir!"** [ən-Nisa: 1]

**"Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz söyləyin!** *Əgər belə etsəniz,* **Allah əməllərinizi islah edər və günahlarınızı bağışlayar. Hər kəs Allaha və Onun elçisinə itaət etsə, böyük bir səadətə nail olar."** [əl-Əhzab: 70-71]

Müqəddəs Qurani Kərim Uca Allahın bəşəriyyətə nazil etdiyi ən böyük möcüzələrindən biri olmaqla yanaşı, Qiyamət gününə qədər yeganə rəhbər olacaq sonuncu ilahi Kitabdır. Qurani Kərim Muhəmməd peyğəmbərə ﷺ iyirmi üç il ərzində Allah tərəfindən nazil olmuş və yer üzərindəki bütün insanlara doğru yol göstərmişdir. Quran ayələrinin iyirmi üç il ərzində əvvəl Məkkə və sonra Mədinə şəhərlərində Peyğəmbərə ﷺ vəhy olunması hikmətlərindən onun əzbərlənməsini və mənalarının izahını, həmçinin ondakı buyruqların icrasını insanlar üçün asanlaşdırmaq idi.

Uca Allah buyurur: **“Kafirlər dedilər: “Nə üçün Quran ona bir dəfəlik bütöv nazil olmadı?” Biz onu sənin qəlbini möhkəmləndirmək üçün tədricən nazil etdik və onu ən gözəl şəkildə *ayəbəayə* izah etdik.”** [əl-Furqan: 32]

Quran əzəmətliliyindən biri də onun bütün peyğəmbərlərin şəriətini tamamlamasıdır. Uca Allah məhz Qurani Kərimdə bütün peyğəmbərlərin dini olan İslamı kamilləşdirir. Bu barədə Uca Allah buyurur: **“Bu gün dininizi sizin üçün kamil etdim, sizə olan nemətimi tamamladım və bir din olaraq sizin üçün İslamı bəyənib seçdim.”** [əl-Maidə: 3]

**“Biz hər ümmətə: “Allaha ibadət edin, tağutdan uzaq olun”–** *deyə* **elçi göndərdik. Onlardan kimisini Allah doğru yola yönəltmiş, kimisinə də azmaq nəsib etmişdir. Yer üzündə gəzib dolaşın və görün** *haqqı* **yalan sayanların aqibəti necə oldu!”** [ən-Nəhl: 36]

Qurani Kərim eyni zamanda özündən əvvəl göndərilmiş Tövratı, Zəburu və İncili də təsdiq edir. Uca Allah buyurur: **“Əlif. Ləm. Mim. Allah. Ondan başqa** *ibadətə layiq olan* **məbud yoxdur,** *əbədi* **Yaşayandır,** *bütün yaradılanların* **Qəyyumudur. O, sənə Kitabı gerçək olaraq, ondan əvvəlkiləri təsdiqləməsi üçün nazil etdi. Tövratı və İncili də O nazil etdi.”** [Əli-İmran: 1-3]

Qurani Kərim göndərildlyi gündən indiyə qədər hər bir əsrdə yaşayan insanların başa düşəcəyi asan və aydın üsluba malikdir. Bu barədə Uca Allah buyurur: **“Biz Quranı yada salmaq üçün asanlaşdırdıq. Amma heç bir yada salan varmı?”** [əl-Qəmər: 22]

Qurani Kərim ədəbi üslubda bənzəri olmayan və daima elmi möcüzələri ilə alimləri heyrətləndirən bir kitabdır. Həqiqətən, Quran zülmətləri yaran nur və haqqı batildən ayıran, azmışlara yol göstərən rəhbərdir. Allahın Kəlamı olan bu Kitab Tövhidi, ictimai siyasi həyatın mühüm məsələlərini, hüquqi problemləri, sağlam həyat tərzini, mənəvi və əxlaqi dəyərləri, valideynlərə göstərilən qayğını, qadına olan hörmət və izzəti əks etdirən bir mənbədir. Həmçinin bəşəriyyə-

tə göndərilmiş peyğəmbərlərin tarixi və insanların gələcəyi haqqında, möminlər üçün qanunlar toplusunu, Axirət həyatının reallığını göstərən ən möhtəşəm Kitab, Qurani Kərimdir. Bu Kitabın oxunması, öyrənilməsi və başqalarına öyrədilməsi bir ibadətdir.

Quran öyüd-nəsihətdir! Məgər yer üzərində insanlar üçün bu Kitabdan daha xeyirli öyüd-nəsihət mövcuddur? Uca Allah buyurur: **“Allahın ayələrini ələ salmayın. Allahın sizə olan nemətlərini, öyüd-nəsihət vermək üçün nazil etdiyi Kitab və hikməti yadınıza salın. Allahdan qorxun və bilin ki, Allah hər şeyi bilir.”** [əl-Bəqərə: 231]

***“Bu, insanları*** **qorxutmaq və möminlərə öyüd-nəsihət vermək üçün sənə nazil edilən Kitabdır. Ona görə qəlbin heç narahat olmasın.”** [əl-Əraf: 2]

Quran sözünün mənası “oxumaq” deməkdir. Quranın həmçinin Kitab, Zikr, Tənzil, Furqan adları da məşhurdur.

Bütün səmavi kitablardan fərqli olaraq Qurani Kərim insanlar tərəfindən heç bir dəyişikliyə uğramamış və Qiyamət gününə qədər haqqın qaynağı olaraq qalacaqdır. Uca Allah buyurur: **“Şübhəsiz ki, Zikri Biz nazil etdik, əlbəttə, Biz də onu qoruyacağıq!”** [əl-Hicr: 9]

**“Rəbbinin kəlamı həm doğruluq, həm də ədalət baxımından tamamlanmışdır. Heç kəs Onun kəlmələrini dəyişə bilməz. O, Eşidəndir, Görəndir.”** [əl-Ənam: 115]

Qurani Kərimi Cəbrail عليه السلام Muhəmməd peyğəmbərlə ﷺ birlikdə hər ramazan ayında oxuyar, əvvəldən axıra qədər yenidən təkrar edərdi. Peyğəmbərimiz ﷺ vəfat etdiyi il Cəbrail عليه السلام onunla birlikdə Quranı iki dəfə oxumuşdu.

Qurani Kərimin əsas qayələrindən biri insanları məhz tək Allaha ibadət etməyə, Ona şərik qoşmamağa və bütün işlərdə yalnız Ona təvəkkül etməyə çağırışdır. Bu haqda Allahın Kitabında çoxlu ayələr mövcuddur: **“Allaha ibadət edin və heç bir şeyi Ona şərik qoşmayın!”** [ən-Nisa: 36]

**"Onların yalvardıqları məbudların özləri də Rəbbinə – hansı daha yaxın olacaq deyə vəsilə axtarırlar, Onun rəhmətini umurlar, əzabından qorxurlar. Həqiqətən, Rəbbinin əzabından qorunmaq gərəkdir!"** [əl-İsra: 57]

**"Əgər sən onlardan: "Göyləri və yeri kim yaratmışdır?"– deyə soruşsan, onlar mütləq: "Allah!"– deyəcəklər. De: "Bir deyin görək, əgər Allah mənə bir zərər toxundurmaq istəsə, sizin Allahdan başqa ibadət etdikləriniz Onun zərərini aradan qaldıra bilərlərmi? Ya da O mənə bir mərhəmət göstərmək istəsə, onlar Onun mərhəmətinin qarşısını ala bilərlərmi?" De: "Mənə Allah yetər. Təvəkkül edənlər yalnız Ona təvəkkül edirlər!"** [əz-Zumər: 38]

Allah Təala Öz Kitabında Özünü necə vəsf edirsə, peyğəmbərimiz ﷺ öz sünnəsində Rəbbinin ad və sifətlərini necə öyrədirsə, biz də o cür qəbul etməliyik. **"Onun heç bir bənzəri yoxdur. O, Eşidəndir, Görəndir."** [əş-Şura: 11]

Qurani Kərim nazil olduğu dövrdə şer, natiqlik sənəti yüksək olan bir cəmiyyətdə ecazkar bəlağəti və üslubu ilə bütün insan sözündən üstün olaraq bir daha Allah Kəlamı olmasını sübut etmişdir. Həmçinin, Allah insanlara Öz Kəlamı ilə meydan oxuyur: **"Əgər qulumuza nazil etdiyimizə şübhə edirsinizsə, onda ona bənzər bir surə gətirin və əgər doğru deyirsinizsə, Allahdan savayı *bütün* şahidlərinizi *köməyə* çağırın!"** [əl-Bəqərə: 23]

Qurani Kərimdə Muhəmməd peyğəmbərə ﷺ itaətin vacibliyi xüsusi əhəmiyyətə malikdir. Peyğəmbərimiz ﷺ ayələrin nazil olma səbəblərini, hökmlərini, dəqiq mənasını, icra olunmasını bilmiş və əshabələrə öyrətmişdir. Muhəmməd peyğəmbərin ﷺ həyatı elə Quranın təfsiridir!

Allah Təalanın Qurani Kərimdə Muhəmməd peyğəmbərə ﷺ itaətin vacibliyini açıqlayan bəzi ayələrlə tanış olaq: **"Xeyr! Sənin Rəbbinə and olsun ki, onlar öz aralarında baş verən çəkişmələrdə səni hakim hesab etməyincə, sonra da verdiyin hökmlərə görə özlərində bir sıxıntı duymadan tam təslim olmayınca iman gətirmiş olmazlar."**[ən-Nisa:65]

**“De: “Əgər siz Allahı sevirsinizsə, mənim ardımca gəlin ki, Allah da sizi sevsin və günahlarınızı bağışlasın. Allah Bağışlayandır, Rəhmlidir. De: “Allaha və *göndərdiyi* Elçiyə itaət edin!” Əgər üz döndərərlərsə, şübhəsiz ki, Allah kafirləri sevməz.”** [Əli-İmran: 31-32]

Qurani Kərim bütövlüklə Lövhi-Məhfuzdan dünya səmasına endirilmiş, sonra da iyirmi üç il ərzində Cəbrail ﷺ vasitəsilə ayə-ayə, surə-surə Muhəmməd peyğəmbərə ﷺ çatdırılmışdır.

Quranı vahid bir kitab şəklində tərtibi ilk dəfə Əbu Bəkrin ﷺ xəlifəliyi dövründə olmuşdur. Belə ki, Ömər ibn Xəttabın ﷺ təşəbbüsü ilə bu məsələ qalxmış və bunun səbəblərindən biri də Quranı əzbər bilən yetmiş əshabənin döyüşlərin birində düşmən tərəfindən öldürülməsi olmuşdur. Əbu Bəkr bu məsul işi Zeyd ibn Sabit ﷺ başda olmaqla bir neçə əshabəyə tapşırmış və onlar ilk nüsxəni tərtib etmişlər. Qurani Kərimin oxunuşunda müxtəlif qiraətlərin mövcudluğu və bu səpgidə meydana çıxmış bəzi ixtilaflar Osman ibn Əffanı ﷺ xəlifə olduğu dövrdə vadar edir ki, O, Quranı vahid mətndə kitab olaraq bir neçə nüsxədə tərtib etsin. Bu nüsxələrdən biri Mədinə şəhərində saxlanılmış, digərləri isə başqa müsəlman ölkələrinə göndərilmişdir.

Qurani Kərim 114 surədən ibarət olaraq 86 surə Məkkədə və 28 surə Mədinədə nazil olmuşdur. Surə sözünün mənası mövqe, şərəf deməkdir. Surələr isə ayələrdən ibarətdir. Ayə sözünün mənası əlamət, işarə, nişanə deməkdir. Ayə sözünə Qurani Kərimdə həmçinin möcüzə, ibrət, dəlil mənalarında da rast gəlinir. Muhəmməd peyğəmbərə ﷺ nazil olmuş ilk ayələr Ələq surəsinin 1-5 ayələridir.

Qurani Kərimin başa düşülməsi üçün Quranın öz ayələri və Muhəmməd peyğəmbərin ﷺ səhih hədisləri ilə təfsirinə zərurət yaranır. Uca Allah buyurur: *“Biz peyğəmbərləri* **aydın dəlillər və kitablarla** *göndərdik*. **Sənə də Zikri nazil etdik ki, insanlara, onlara nazil olanı izah edəsən və bəlkə, onlar fikirləşələr.”** [ən-Nəhl: 44]

**“Biz *hər hansı* bir ayəni dəyişdirir və ya onu unutduruqsa, ondan daha yaxşısını, və ya ona bənzərini gətiririk. Məgər bilmirsən ki, Allah hər şeyə qadirdir?”** [əl-Bəqərə: 106]

Qeyd etmək lazımdır ki, tərcümədə Allahın zatına aid isimlər böyük hərflərlə verilmiş, çox nadir hallarda isə tərcümədə ayənin mənasını tamamlamaq məqsədi ilə orijinalda köməkçi sözlər kursivlə göstərilmişdir.

Hörməli və dəyərli oxucu!

Azərbaycan dilinə mənaca tərcümə edilmiş Müqəddəs Qurani Kərim yalnız oxumaq üçün deyil, eyni zamanda anlaşılmaq və yaşanmaq üçün vacib sayılan bir kitabdır! Ümid edirəm ki, bu tərcümə yeganə haqq din olan İslamın tədrisində və tətbiqində, cəmiyyətimizin əmin-amanlıqda yaşamasında, batil inanclardan məhz tək Allaha sığınmaqda, mənəvi əxlaqi dəyərlərin aşılanmasında, bir anlıq belə həyatın mənasının dərk edilməsində, azad və qürurlu bir şəxsiyyətin formalaşmasında, Allahın dost və düşmənlərinin tanınmasında, halal və haramın bilinməsində, Axirət həyatinin xoş aqibətinin qazanılmasinda bir vasitə olacaq.

## əl-Fatihə («Kitabı açan») surəsi

## سُورَةُ الفَاتِحَةِ

1. Mərhəmətli və Rəhmli Allahın adı ilə!
2. Həmd olsun aləmlərin Rəbbi Allaha,
3. Mərhəmətli və Rəhmliyə,
4. Haqq-hesab gününün Hökmdarına!
5. Biz yalnız Sənə ibadət edir və yalnız Səndən kömək diləyirik.
6. Bizi doğru yola yönəlt –
7. nemət bəxş etdiyin şəxslərin yoluna, qəzəbə uğramışların və azmışların *yoluna* yox!

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ ﴿١﴾

ٱلْحَمْدُ لِلَّهِ رَبِّ ٱلْعَٰلَمِينَ ﴿٢﴾

ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ ﴿٣﴾

مَٰلِكِ يَوْمِ ٱلدِّينِ ﴿٤﴾

إِيَّاكَ نَعْبُدُ وَإِيَّاكَ نَسْتَعِينُ ﴿٥﴾

ٱهْدِنَا ٱلصِّرَٰطَ ٱلْمُسْتَقِيمَ ﴿٦﴾

صِرَٰطَ ٱلَّذِينَ أَنْعَمْتَ عَلَيْهِمْ غَيْرِ ٱلْمَغْضُوبِ
عَلَيْهِمْ وَلَا ٱلضَّآلِّينَ ﴿٧﴾



# əl-Bəqərə («İnək») surəsi

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

1. Əlif. Ləm. Mim.
2. Bu, qətiyyən şübhə doğurmayan, müttəqilərə doğru yol göstərən bir Kitabdır.
3. O kəslər ki, qeybə iman gətirir, namaz qılır və Bizim onlara verdiyimiz ruzidən *Allah yolunda* xərcləyirlər;
4. O kəslər ki, sənə nazil olana və səndən əvvəl nazil olanlara iman gətirir, axirətə də yəqinliklə inanırlar.
5. Onlar öz Rəbbindən *gələn* doğru yoldadırlar. Məhz onlar nicat tapanlardır.
6. Həqiqətən, kafirləri qorxutsan da, qorxutmasan da, onlar üçün fərqi yoxdur, iman gətirməzlər.
7. Allah onların qəlblərini və qulaqlarını möhürləmiş, gözlərinə də pərdə çəkmişdir. Onlar üçün böyük bir əzab vardır.
8. İnsanlar arasında elələri də vardır ki, mömin olmadıqları halda: “Allaha və Axirət gününə inanırıq”– deyirlər.
9. Onlar Allahı və iman gətirənləri aldatmağa çalışırlar. Halbuki yalnız özlərini aldadır və *bunu* anlamırlar.
10. Onların qəlblərində xəstəlik vardır və Allah da onların xəstəliyini artırmışdır. Yalan söylədiklərinə görə

## سُورَةُ البَقَرَةِ

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

الٓمٓ ١

ذَٰلِكَ ٱلْكِتَٰبُ لَا رَيْبَ ۛ فِيهِ ۛ هُدًى لِّلْمُتَّقِينَ ٢

ٱلَّذِينَ يُؤْمِنُونَ بِٱلْغَيْبِ وَيُقِيمُونَ ٱلصَّلَوٰةَ
وَمِمَّا رَزَقْنَٰهُمْ يُنفِقُونَ ٣

وَٱلَّذِينَ يُؤْمِنُونَ بِمَآ أُنزِلَ إِلَيْكَ وَمَآ أُنزِلَ مِن
قَبْلِكَ وَبِٱلْءَاخِرَةِ هُمْ يُوقِنُونَ ٤

أُو۟لَٰٓئِكَ عَلَىٰ هُدًى مِّن رَّبِّهِمْ ۖ وَأُو۟لَٰٓئِكَ
هُمُ ٱلْمُفْلِحُونَ ٥

إِنَّ ٱلَّذِينَ كَفَرُوا۟ سَوَآءٌ عَلَيْهِمْ ءَأَنذَرْتَهُمْ
أَمْ لَمْ تُنذِرْهُمْ لَا يُؤْمِنُونَ ٦

خَتَمَ ٱللَّهُ عَلَىٰ قُلُوبِهِمْ وَعَلَىٰ سَمْعِهِمْ ۖ وَعَلَىٰٓ
أَبْصَٰرِهِمْ غِشَٰوَةٌ ۖ وَلَهُمْ عَذَابٌ عَظِيمٌ ٧

وَمِنَ ٱلنَّاسِ مَن يَقُولُ ءَامَنَّا بِٱللَّهِ وَبِٱلْيَوْمِ
ٱلْءَاخِرِ وَمَا هُم بِمُؤْمِنِينَ ٨

يُخَٰدِعُونَ ٱللَّهَ وَٱلَّذِينَ ءَامَنُوا۟ وَمَا يَخْدَعُونَ
إِلَّآ أَنفُسَهُمْ وَمَا يَشْعُرُونَ ٩

فِى قُلُوبِهِم مَّرَضٌ فَزَادَهُمُ ٱللَّهُ مَرَضًا ۖ
وَلَهُمْ عَذَابٌ أَلِيمٌۢ بِمَا كَانُوا۟ يَكْذِبُونَ ١٠

də ağrılı-acılı bir əzab çəkəcəklər.

11. Onlara: “Yer üzündə fəsad törətməyin!”– deyildiyi zaman: “Biz ki, ancaq xeyirxahlıq edənlərik!”– deyirlər.

وَإِذَا قِيلَ لَهُمْ لَا تُفْسِدُوا فِي الْأَرْضِ قَالُوا إِنَّمَا
نَحْنُ مُصْلِحُونَ ﴿١١﴾

12. Sözsüz ki, onlar fəsad törədənlərdir, amma *bunu* başa düşmürlər.

أَلَا إِنَّهُمْ هُمُ الْمُفْسِدُونَ وَلَٰكِن
لَّا يَشْعُرُونَ ﴿١٢﴾

13. Onlara: “*Bu* insanlar iman gətirdiyi kimi siz də iman gətirin!”– deyildiyi zaman: “Biz də səfehlərin iman gətirdikləri kimi iman gətirək?”– deyirlər. Doğrusu, onlar özləri səfehdirlər, lakin *bunu* bilmirlər.

وَإِذَا قِيلَ لَهُمْ آمِنُوا كَمَا آمَنَ النَّاسُ
قَالُوا أَنُؤْمِنُ كَمَا آمَنَ السُّفَهَاءُ ۗ أَلَا إِنَّهُمْ
هُمُ السُّفَهَاءُ وَلَٰكِن لَّا يَعْلَمُونَ ﴿١٣﴾

14. Onlar möminlərlə rastlaşdıqda: “Biz iman gətirdik!”– deyirlər, öz şeytanları (azmış dostları) ilə təklikdə qaldıqda isə: “Biz sizinləyik. Biz *möminlərə* ancaq istehza edirik!”– deyirlər.

وَإِذَا لَقُوا الَّذِينَ آمَنُوا قَالُوا آمَنَّا وَإِذَا خَلَوْا
إِلَىٰ شَيَاطِينِهِمْ قَالُوا إِنَّا مَعَكُمْ إِنَّمَا نَحْنُ
مُسْتَهْزِئُونَ ﴿١٤﴾

15. Allah da onlara istehza edər və azğınlıqlarını *o qədər* artırar ki, sərgərdan gəzərlər.

اللَّهُ يَسْتَهْزِئُ بِهِمْ وَيَمُدُّهُمْ فِي طُغْيَانِهِمْ
يَعْمَهُونَ ﴿١٥﴾

16. Onlar, doğru yolu verib azğınlığı satın almış kimsələrdir. Amma onların ticarəti qazanc gətirmədi və *özləri də* doğru yola yönəlmədilər.

أُولَٰئِكَ الَّذِينَ اشْتَرَوُا الضَّلَالَةَ بِالْهُدَىٰ
فَمَا رَبِحَت تِّجَارَتُهُمْ وَمَا كَانُوا
مُهْتَدِينَ ﴿١٦﴾

17. Onların məsəli *zülmət gecədə* od qalayan kimsənin məsəlinə bənzər. Alov onun ətrafındakıları işıqlandırdığı zaman Allah onların

مَثَلُهُمْ كَمَثَلِ الَّذِي اسْتَوْقَدَ نَارًا فَلَمَّا
أَضَاءَتْ مَا حَوْلَهُ ذَهَبَ اللَّهُ بِنُورِهِمْ
وَتَرَكَهُمْ فِي ظُلُمَاتٍ لَّا يُبْصِرُونَ ﴿١٧﴾

nurunu aparar, özlərini də *heç bir şey* görə bilməyəcəkləri zülmətlər içərisində buraxar.

18. *Onlar* kar, lal və kor olduqlarına görə *doğru yola* qayıtmazlar.

صُمٌّۢ بُكۡمٌ عُمۡيٞ فَهُمۡ لَا يَرۡجِعُونَ ١٨

19. Yaxud onların *məsəli* zülmət içində göy gurultusu və şimşəklə yağan leysana *düşənlərin məsəlinə* bənzəyir ki, ildırımdan ölmək qorxusu ilə barmaqlarını qulaqlarına tıxayırlar. Şübhəsiz ki, Allah kafirləri *hər tərəfdən* əhatəyə almışdır.

أَوۡ كَصَيِّبٖ مِّنَ ٱلسَّمَآءِ فِيهِ ظُلُمَٰتٞ وَرَعۡدٞ
وَبَرۡقٞ يَجۡعَلُونَ أَصَٰبِعَهُمۡ فِيٓ ءَاذَانِهِم مِّنَ
ٱلصَّوَٰعِقِ حَذَرَ ٱلۡمَوۡتِۚ وَٱللَّهُ مُحِيطُۢ بِٱلۡكَٰفِرِينَ ١٩

20. Şimşək az qalır ki, onların gözlərini çıxartsın. *Şimşək hər dəfə* onların *yolunu* işıqlandırdıqda onunla gedirlər, zülmət onları bürüdükdə isə dayanıb dururlar. Əgər Allah istəsəydi, onları eşitməkdən və görməkdən məhrum edərdi. Şübhəsiz ki, Allah hər şeyə qadirdir.

يَكَادُ ٱلۡبَرۡقُ يَخۡطَفُ أَبۡصَٰرَهُمۡۖ كُلَّمَآ أَضَآءَ
لَهُم مَّشَوۡاْ فِيهِ وَإِذَآ أَظۡلَمَ عَلَيۡهِمۡ قَامُواْۚ
وَلَوۡ شَآءَ ٱللَّهُ لَذَهَبَ بِسَمۡعِهِمۡ وَأَبۡصَٰرِهِمۡۚ
إِنَّ ٱللَّهَ عَلَىٰ كُلِّ شَيۡءٖ قَدِيرٞ ٢٠

21. Ey insanlar! Sizi və sizdən öncəkiləri yaratmış Rəbbinizə ibadət edin ki, bəlkə *Allahdan* qorxasınız.

يَٰٓأَيُّهَا ٱلنَّاسُ ٱعۡبُدُواْ رَبَّكُمُ ٱلَّذِي خَلَقَكُمۡ
وَٱلَّذِينَ مِن قَبۡلِكُمۡ لَعَلَّكُمۡ تَتَّقُونَ ٢١

22. O, sizin üçün yer üzünü döşəmə, göyü isə tavan etdi. Göydən su endirib onunla sizin üçün *növbənöv* məhsullardan ruzi yetişdirdi. Siz də *bunu* bildiyiniz halda *heç kəsi* Allaha tay tutmayın.

ٱلَّذِي جَعَلَ لَكُمُ ٱلۡأَرۡضَ فِرَٰشٗا وَٱلسَّمَآءَ
بِنَآءٗ وَأَنزَلَ مِنَ ٱلسَّمَآءِ مَآءٗ فَأَخۡرَجَ بِهِۦ مِنَ
ٱلثَّمَرَٰتِ رِزۡقٗا لَّكُمۡۖ فَلَا تَجۡعَلُواْ لِلَّهِ أَندَادٗا
وَأَنتُمۡ تَعۡلَمُونَ ٢٢

23. Əgər qulumuza nazil etdiyimizə şübhə edirsinizsə, onda ona bənzər

وَإِن كُنتُمۡ فِي رَيۡبٖ مِّمَّا نَزَّلۡنَا عَلَىٰ عَبۡدِنَا فَأۡتُواْ

bir surə gətirin və əgər doğru deyirsinizsə, Allahdan savayı *bütün* şahidlərinizi *köməyə* çağırın!

بِسُورَةٍ مِّن مِّثْلِهِۦ وَٱدْعُوا۟ شُهَدَآءَكُم مِّن
دُونِ ٱللَّهِ إِن كُنتُمْ صَـٰدِقِينَ ﴿٢٣﴾

**24.** Əgər siz bunu edə bilmirsinizsə, – heç edə də bilməzsiniz – onda yanacağı insanlardan və daşlardan olan, kafirlər üçün hazırlanmış oddan çəkinin.

فَإِن لَّمْ تَفْعَلُوا۟ وَلَن تَفْعَلُوا۟ فَٱتَّقُوا۟ ٱلنَّارَ ٱلَّتِى
وَقُودُهَا ٱلنَّاسُ وَٱلْحِجَارَةُ ۖ أُعِدَّتْ
لِلْكَـٰفِرِينَ ﴿٢٤﴾

**25.** İman gətirib saleh əməllər edənlərə müjdə ver ki, onlar üçün *ağacları* altından çaylar axan Cənnət bağları vardır. Hər dəfə onun meyvələrindən onlara ruzi verildikcə: "Bu ki, əvvəlcə bizə verilən ruzidir!"– deyəcəklər. Halbuki onlara onun oxşarı veriləcəkdir. Onlardan ötrü orada pak zövcələr var və onlar orada əbədi qalacaqlar.

وَبَشِّرِ ٱلَّذِينَ ءَامَنُوا۟ وَعَمِلُوا۟ ٱلصَّـٰلِحَـٰتِ
أَنَّ لَهُمْ جَنَّـٰتٍ تَجْرِى مِن تَحْتِهَا ٱلْأَنْهَـٰرُ ۖ
كُلَّمَا رُزِقُوا۟ مِنْهَا مِن ثَمَرَةٍ رِّزْقًا ۙ قَالُوا۟
هَـٰذَا ٱلَّذِى رُزِقْنَا مِن قَبْلُ ۖ وَأُتُوا۟ بِهِۦ
مُتَشَـٰبِهًا ۖ وَلَهُمْ فِيهَآ أَزْوَٰجٌ مُّطَهَّرَةٌ ۖ وَهُمْ
فِيهَا خَـٰلِدُونَ ﴿٢٥﴾

**26.** Həqiqətən, Allah ağcaqanadı və *istər böyüklükdə*, *istərsə də kiçiklikdə* ondan da üstün olanı məsəl çəkməkdən utanmaz. İman gətirənlər bilirlər ki, bu, onların Rəbbindən *gələn* haqdır. Küfr edənlər isə deyirlər: "Bu məsəllə Allah nə *demək* istədi?" Halbuki O bununla bir çoxlarını azdırır və bir çoxlarını da haqq yoluna yönəldir. Lakin O, bununla yalnız fasiqləri yoldan çıxarır.

۞ إِنَّ ٱللَّهَ لَا يَسْتَحْىِۦٓ أَن يَضْرِبَ مَثَلًا
مَّا بَعُوضَةً فَمَا فَوْقَهَا ۚ فَأَمَّا ٱلَّذِينَ ءَامَنُوا۟
فَيَعْلَمُونَ أَنَّهُ ٱلْحَقُّ مِن رَّبِّهِمْ ۖ وَأَمَّا
ٱلَّذِينَ كَفَرُوا۟ فَيَقُولُونَ مَاذَآ أَرَادَ ٱللَّهُ
بِهَـٰذَا مَثَلًا ۘ يُضِلُّ بِهِۦ كَثِيرًا
وَيَهْدِى بِهِۦ كَثِيرًا ۚ وَمَا يُضِلُّ بِهِۦٓ
إِلَّا ٱلْفَـٰسِقِينَ ﴿٢٦﴾

**27.** O kəslər ki, Allahla əhd-peyman bağladıqdan sonra onu pozur, Allahın qovuşdurulmasını əmr etdiyi *qohumluq əlaqələrini* kəsir və yer

ٱلَّذِينَ يَنقُضُونَ عَهْدَ ٱللَّهِ مِنۢ بَعْدِ
مِيثَـٰقِهِۦ وَيَقْطَعُونَ مَآ أَمَرَ ٱللَّهُ بِهِۦٓ
أَن يُوصَلَ وَيُفْسِدُونَ فِى ٱلْأَرْضِ ۚ أُو۟لَـٰٓئِكَ

üzündə fitnə-fəsad törədirlər. Məhz
onlar ziyana uğrayanlardır!

هُمُ ٱلْخَٰسِرُونَ ٢٧

28. Allahı necə inkar edirsiniz ki, siz ölü
idiniz, O sizi diriltdi? Sonra O sizi
öldürəcək və yenə dirildəcək, daha
sonra isə siz Ona qaytarılacaqsınız.

كَيْفَ تَكْفُرُونَ بِٱللَّهِ وَكُنتُمْ
أَمْوَٰتًا فَأَحْيَٰكُمْ ثُمَّ يُمِيتُكُمْ ثُمَّ
يُحْيِيكُمْ ثُمَّ إِلَيْهِ تُرْجَعُونَ ٢٨

29. Yer üzündə olanların hamısını sizə
görə xəlq edən, sonra göyə tərəf
yönəlib onu yeddi qat göy edən
Odur. O, hər şeyi bilir.

هُوَ ٱلَّذِى خَلَقَ لَكُم مَّا فِى ٱلْأَرْضِ جَمِيعًا
ثُمَّ ٱسْتَوَىٰٓ إِلَى ٱلسَّمَآءِ فَسَوَّىٰهُنَّ سَبْعَ
سَمَٰوَٰتٍ وَهُوَ بِكُلِّ شَىْءٍ عَلِيمٌ ٢٩

30. Sənin Rəbbin mələklərə: “Mən
yer üzündə bir canişin bərqərar
edəcəyəm!”– dedikdə, onlar: “Biz
Səni həmd-səna ilə tərifədiyimiz və
Səni müqəddəs tutduğumuz halda,
Sən orada fəsad törədib qan salacaq
bir kəsmi yerləşdirəcəksən?”–
söylədilər. O dedi: “Şübhəsiz ki, Mən
sizin bilmədiklərinizi bilirəm!”

وَإِذْ قَالَ رَبُّكَ لِلْمَلَٰٓئِكَةِ إِنِّى جَاعِلٌ فِى ٱلْأَرْضِ
خَلِيفَةً قَالُوٓا۟ أَتَجْعَلُ فِيهَا مَن يُفْسِدُ فِيهَا
وَيَسْفِكُ ٱلدِّمَآءَ وَنَحْنُ نُسَبِّحُ بِحَمْدِكَ
وَنُقَدِّسُ لَكَ قَالَ إِنِّىٓ أَعْلَمُ مَا لَا تَعْلَمُونَ ٣٠

31. *Allah* Adəmə bütün *şeylərin*
adlarını öyrətdi. Sonra onları
mələklərə göstərib dedi: “Doğru
danışanlarsınızsa, bunların adlarını
Mənə deyin!”

وَعَلَّمَ ءَادَمَ ٱلْأَسْمَآءَ كُلَّهَا ثُمَّ عَرَضَهُمْ عَلَى
ٱلْمَلَٰٓئِكَةِ فَقَالَ أَنۢبِـُٔونِى بِأَسْمَآءِ هَٰٓؤُلَآءِ
إِن كُنتُمْ صَٰدِقِينَ ٣١

32. Onlar dedilər: “Sən pak və
müqəddəssən! Sənin bizə
öyrətdiklərindən başqa bizdə heç
bir bilik yoxdur! Həqiqətən, Sən
Bilənsən, Müdriksən!”

قَالُوا۟ سُبْحَٰنَكَ لَا عِلْمَ لَنَآ إِلَّا مَا عَلَّمْتَنَآ إِنَّكَ أَنتَ
ٱلْعَلِيمُ ٱلْحَكِيمُ ٣٢

33. *Allah* dedi: “Ey Adəm, bunların
adlarını onlara bildir!” O, bunların
adlarını onlara bildirdikdə *Allah*

قَالَ يَٰٓـَٔادَمُ أَنۢبِئْهُم بِأَسْمَآئِهِمْ فَلَمَّآ أَنۢبَأَهُم
بِأَسْمَآئِهِمْ قَالَ أَلَمْ أَقُل لَّكُمْ إِنِّىٓ أَعْلَمُ

dedi: "Mən sizə demədim ki, göylərdə və yerdə olan qeybi, aşkara çıxartdığınızı və gizli saxladığınızı bilirəm?"

غَيْبَ ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضِ وَأَعْلَمُ مَا تُبْدُونَ
وَمَا كُنتُمْ تَكْتُمُونَ ٣٣

34. Bir zaman Biz mələklərə: "Adəmə səcdə edin!"– dedikdə, İblisdən başqa *hamısı* səcdə etdi. O imtina edib təkəbbür göstərdi və kafir oldu.

وَإِذْ قُلْنَا لِلْمَلَٰٓئِكَةِ ٱسْجُدُوا۟ لِءَادَمَ فَسَجَدُوٓا۟ إِلَّآ
إِبْلِيسَ أَبَىٰ وَٱسْتَكْبَرَ وَكَانَ مِنَ ٱلْكَٰفِرِينَ ٣٤

35. Biz dedik: "Ey Adəm! Sən zövcənlə birlikdə Cənnətdə sakin ol və orada rahatlıqla nemətlərimizdən istədiyiniz yerdə yeyin *için*, təkcə bu ağaca yaxınlaşmayın! Yoxsa zalımlardan olarsınız".

وَقُلْنَا يَٰٓـَٔادَمُ ٱسْكُنْ أَنتَ وَزَوْجُكَ ٱلْجَنَّةَ
وَكُلَا مِنْهَا رَغَدًا حَيْثُ شِئْتُمَا وَلَا تَقْرَبَا
هَٰذِهِ ٱلشَّجَرَةَ فَتَكُونَا مِنَ ٱلظَّٰلِمِينَ ٣٥

36. Şeytan isə o ağacla onları çaşdırıb olduqları yerdən çıxartdı. Biz dedik: "Bir-birinizə düşmən olaraq aşağı enin! Yerdə sizin üçün müəyyən *olunmuş* vaxtadək məskən və gün-güzəran vardır".

فَأَزَلَّهُمَا ٱلشَّيْطَٰنُ عَنْهَا فَأَخْرَجَهُمَا مِمَّا كَانَا فِيهِ
وَقُلْنَا ٱهْبِطُوا۟ بَعْضُكُمْ لِبَعْضٍ عَدُوٌّ وَلَكُمْ فِى
ٱلْأَرْضِ مُسْتَقَرٌّ وَمَتَٰعٌ إِلَىٰ حِينٍ ٣٦

37. Adəm *tövbə etmək üçün* Rəbbindən kəlmələr öyrəndi, O da onun tövbəsini qəbul etdi. Doğrudan da O, tövbələri qəbul edəndir, Rəhmlidir.

فَتَلَقَّىٰٓ ءَادَمُ مِن رَّبِّهِۦ كَلِمَٰتٍ فَتَابَ عَلَيْهِ
إِنَّهُۥ هُوَ ٱلتَّوَّابُ ٱلرَّحِيمُ ٣٧

38. Biz dedik: "Hamınız oradan *yerə* enin! Mənim tərəfimdən sizə doğru yol göstəricisi gəldikdə Mənim yol göstəricimin ardınca gedənlərə heç bir qorxu yoxdur və onlar kədərlənməyəcəklər".

قُلْنَا ٱهْبِطُوا۟ مِنْهَا جَمِيعًا فَإِمَّا يَأْتِيَنَّكُم مِّنِّى
هُدًى فَمَن تَبِعَ هُدَاىَ فَلَا خَوْفٌ عَلَيْهِمْ
وَلَا هُمْ يَحْزَنُونَ ٣٨

39. Kafir olub ayələrimizi yalan sayanlar isə Od sakinləridirlər. Onlar orada əbədi qalacaqlar!

وَٱلَّذِينَ كَفَرُوا۟ وَكَذَّبُوا۟ بِـَٔايَٰتِنَآ أُو۟لَٰٓئِكَ
أَصْحَٰبُ ٱلنَّارِ هُمْ فِيهَا خَٰلِدُونَ ٣٩

**40.** Ey İsrail oğulları! Sizə bəxş etdiyim nemətimi yadınıza salın və Mənə verdiyiniz əhdə sadiq olun ki, Mən də sizə verdiyim əhdi yerinə yetirim. Təkcə Məndən qorxun!

يَٰبَنِيٓ إِسۡرَٰٓءِيلَ ٱذۡكُرُواْ نِعۡمَتِيَ ٱلَّتِيٓ أَنۡعَمۡتُ عَلَيۡكُمۡ
وَأَوۡفُواْ بِعَهۡدِيٓ أُوفِ بِعَهۡدِكُمۡ وَإِيَّٰيَ فَٱرۡهَبُونِ ﴿٤٠﴾

**41.** Sizdə olanı təsdiqləyici kimi nazil etdiyim *Qurana* iman gətirin və onu inkar edənlərin ən birincisi olmayın! Mənim ayələrimi ucuz qiymətə satmayın və yalnız Məndən qorxun.

وَءَامِنُواْ بِمَآ أَنزَلۡتُ مُصَدِّقٗا لِّمَا مَعَكُمۡ
وَلَا تَكُونُوٓاْ أَوَّلَ كَافِرِۭ بِهِۦۖ وَلَا تَشۡتَرُواْ
بِـَٔايَٰتِي ثَمَنٗا قَلِيلٗا وَإِيَّٰيَ فَٱتَّقُونِ ﴿٤١﴾

**42.** Özünüz də bilə-bilə haqqa batil donu geyindirməyin və haqqı gizlətməyin.

وَلَا تَلۡبِسُواْ ٱلۡحَقَّ بِٱلۡبَٰطِلِ وَتَكۡتُمُواْ ٱلۡحَقَّ وَأَنتُمۡ
تَعۡلَمُونَ ﴿٤٢﴾

**43.** Namaz qılın, zəkat verin və rüku edənlərlə birlikdə rüku edin!

وَأَقِيمُواْ ٱلصَّلَوٰةَ وَءَاتُواْ ٱلزَّكَوٰةَ
وَٱرۡكَعُواْ مَعَ ٱلرَّٰكِعِينَ ﴿٤٣﴾

**44.** Siz Kitab oxuyub insanlara xeyirxahlığı əmr etdiyiniz halda, özünüzü unudursunuz? Məgər anlamırsınız?

۞أَتَأۡمُرُونَ ٱلنَّاسَ بِٱلۡبِرِّ وَتَنسَوۡنَ أَنفُسَكُمۡ
وَأَنتُمۡ تَتۡلُونَ ٱلۡكِتَٰبَۚ أَفَلَا تَعۡقِلُونَ ﴿٤٤﴾

**45.** Səbir etmək və namaz qılmaqla *Allahdan* kömək diləyin! Həqiqətən, bu, *Allaha* itaət edənlərdən başqa *hamıya* ağır gəlir.

وَٱسۡتَعِينُواْ بِٱلصَّبۡرِ وَٱلصَّلَوٰةِۚ وَإِنَّهَا لَكَبِيرَةٌ
إِلَّا عَلَى ٱلۡخَٰشِعِينَ ﴿٤٥﴾

**46.** Çünki onlar öz Rəbbi ilə qarşılaşacaqlarını və Ona qayıdacaqlarını yəqin bilirlər.

ٱلَّذِينَ يَظُنُّونَ أَنَّهُم مُّلَٰقُواْ رَبِّهِمۡ وَأَنَّهُمۡ إِلَيۡهِ
رَٰجِعُونَ ﴿٤٦﴾

**47.** Ey İsrail oğulları! Sizə bəxş etdiyim nemətimi və sizi aləmlərdən üstün etdiyimi xatırlayın.

يَٰبَنِيٓ إِسۡرَٰٓءِيلَ ٱذۡكُرُواْ نِعۡمَتِيَ ٱلَّتِيٓ أَنۡعَمۡتُ
عَلَيۡكُمۡ وَأَنِّي فَضَّلۡتُكُمۡ عَلَى ٱلۡعَٰلَمِينَ ﴿٤٧﴾

48. Qorxun o gündən ki, *o vaxt* heç kəs heç kəsə fayda verə bilməyəcək, heç kəsdən şəfaət qəbul olunmayacaq, heç kəsdən bir fidyə alınmayacaq və *günahkarlara* kömək göstərilməyəcəkdir.

وَاتَّقُوا يَوْمًا لَا تَجْزِي نَفْسٌ عَنْ نَفْسٍ شَيْئًا
وَلَا يُقْبَلُ مِنْهَا شَفَاعَةٌ وَلَا يُؤْخَذُ مِنْهَا عَدْلٌ
وَلَا هُمْ يُنْصَرُونَ ٤٨

49. Bir zaman Biz sizi Fironun tərəfdarlarından xilas etdik. *O vaxt* onlar sizə ağır əzablar verir, oğlan uşaqlarınızı öldürür, qadınlarınızı isə sağ buraxırdılar. Bunda Rəbbiniz tərəfindən sizin üçün böyük bir sınaq var idi.

وَإِذْ نَجَّيْنَاكُمْ مِنْ آلِ فِرْعَوْنَ يَسُومُونَكُمْ
سُوءَ الْعَذَابِ يُذَبِّحُونَ أَبْنَاءَكُمْ
وَيَسْتَحْيُونَ نِسَاءَكُمْ وَفِي ذَٰلِكُمْ بَلَاءٌ مِنْ
رَبِّكُمْ عَظِيمٌ ٤٩

50. O zaman Biz sizə görə dənizi yardıq, sizi xilas etdik və Fironun tərəfdarlarını gözünüzün qabağında *dənizdə* batırdıq.

وَإِذْ فَرَقْنَا بِكُمُ الْبَحْرَ فَأَنْجَيْنَاكُمْ وَأَغْرَقْنَا
آلَ فِرْعَوْنَ وَأَنْتُمْ تَنْظُرُونَ ٥٠

51. O zaman Biz Musaya *vəhy üçün* qırx gecəlik vədə verdik. Sonra siz onun ardından buzovu özünüzə məbud qəbul edərək zalım oldunuz.

وَإِذْ وَاعَدْنَا مُوسَىٰ أَرْبَعِينَ لَيْلَةً ثُمَّ اتَّخَذْتُمُ
الْعِجْلَ مِنْ بَعْدِهِ وَأَنْتُمْ ظَالِمُونَ ٥١

52. Sonra bunun ardınca Biz sizi bağışladıq ki, bəlkə şükür edəsiniz.

ثُمَّ عَفَوْنَا عَنْكُمْ مِنْ بَعْدِ ذَٰلِكَ لَعَلَّكُمْ
تَشْكُرُونَ ٥٢

53. O zaman Biz Musaya Kitab və *haqqı batildən ayıran* Furqan verdik ki, bəlkə doğru yolla gedəsiniz.

وَإِذْ آتَيْنَا مُوسَى الْكِتَابَ وَالْفُرْقَانَ
لَعَلَّكُمْ تَهْتَدُونَ ٥٣

54. O zaman Musa öz qövmünə dedi: "Ey qövmüm! Siz buzova ibadət etməklə özünüzə zülm etdiniz. Odur ki, Yaradanınıza tövbə edin və özünüzü (sizlərdən özlərinə zülm edənləri) öldürün. Bu, Yaradanınızın yanında sizin üçün xeyirlidir". O, sizin tövbənizi qəbul etdi. Doğrudan

وَإِذْ قَالَ مُوسَىٰ لِقَوْمِهِ يَا قَوْمِ إِنَّكُمْ ظَلَمْتُمْ
أَنْفُسَكُمْ بِاتِّخَاذِكُمُ الْعِجْلَ فَتُوبُوا إِلَىٰ
بَارِئِكُمْ فَاقْتُلُوا أَنْفُسَكُمْ ذَٰلِكُمْ
خَيْرٌ لَكُمْ عِنْدَ بَارِئِكُمْ فَتَابَ عَلَيْكُمْ
إِنَّهُ هُوَ التَّوَّابُ الرَّحِيمُ ٥٤

da O, tövbələri qəbul edəndir, Rəhmlidir.

55. O zaman siz: “Ey Musa! Biz Allahı açıq-aşkar görməyincə sənə iman gətirməyəcəyik!”– dediniz və gözünüz görə-görə sizi ildırım vurdu.

وَإِذْ قُلْتُمْ يَٰمُوسَىٰ لَن نُّؤْمِنَ لَكَ حَتَّىٰ نَرَى ٱللَّهَ
جَهْرَةً فَأَخَذَتْكُمُ ٱلصَّٰعِقَةُ وَأَنتُمْ تَنظُرُونَ ٥٥

56. Ölümünüzdən sonra Biz sizi diriltdik ki, bəlkə şükür edəsiniz.

ثُمَّ بَعَثْنَٰكُم مِّنۢ بَعْدِ مَوْتِكُمْ لَعَلَّكُمْ
تَشْكُرُونَ ٥٦

57. Biz sizin üstünüzə buludla kölgə saldıq, sizə manna və bildirçin endirdik *və*: “Sizə ruzi olaraq verdiyimiz pak şeylərdən yeyin!”– *dedik*. Onlar Bizə deyil, ancaq özlərinə zülm etdilər.

وَظَلَّلْنَا عَلَيْكُمُ ٱلْغَمَامَ وَأَنزَلْنَا عَلَيْكُمُ ٱلْمَنَّ
وَٱلسَّلْوَىٰ ۖ كُلُوا۟ مِن طَيِّبَٰتِ مَا رَزَقْنَٰكُمْ ۖ
وَمَا ظَلَمُونَا وَلَٰكِن كَانُوٓا۟ أَنفُسَهُمْ يَظْلِمُونَ ٥٧

58. O zaman Biz dedik: “Bu kəndə daxil olun və orada istədiyiniz yerlərdə, rahatlıqla yeyin için. Qapıdan səcdə edərək daxil olun və: “Bizi bağışla!”– deyin ki, sizin günahlarınızı bağışlayaq”. Biz yaxşı işlər görənlərə *mükafatlarını* artırarıq.

وَإِذْ قُلْنَا ٱدْخُلُوا۟ هَٰذِهِ ٱلْقَرْيَةَ فَكُلُوا۟ مِنْهَا
حَيْثُ شِئْتُمْ رَغَدًا وَٱدْخُلُوا۟ ٱلْبَابَ سُجَّدًا
وَقُولُوا۟ حِطَّةٌ نَّغْفِرْ لَكُمْ خَطَٰيَٰكُمْ ۚ
وَسَنَزِيدُ ٱلْمُحْسِنِينَ ٥٨

59. Zülm edənlər özlərinə deyilən sözü başqası ilə dəyişdilər. Biz də zülm edənlərə etdikləri günaha görə göydən əzab göndərdik.

فَبَدَّلَ ٱلَّذِينَ ظَلَمُوا۟ قَوْلًا غَيْرَ ٱلَّذِى قِيلَ
لَهُمْ فَأَنزَلْنَا عَلَى ٱلَّذِينَ ظَلَمُوا۟ رِجْزًا مِّنَ
ٱلسَّمَآءِ بِمَا كَانُوا۟ يَفْسُقُونَ ٥٩

60. O zaman Musa öz xalqı üçün su istədikdə, Biz: “Əsanla daşa vur!”– dedik. *Daşdan* on iki çeşmə qaynayıb çıxdı. Hər qəbilə su içəcəyi yeri tanıdı. *Onlara dedik*: “Allahın sizə verdiyi ruzidən yeyin-için və yer üzündə fəsad yayıb pis işlərə qurşanmayın!”

۞ وَإِذِ ٱسْتَسْقَىٰ مُوسَىٰ لِقَوْمِهِۦ فَقُلْنَا ٱضْرِب
بِّعَصَاكَ ٱلْحَجَرَ ۖ فَٱنفَجَرَتْ مِنْهُ ٱثْنَتَا
عَشْرَةَ عَيْنًا ۖ قَدْ عَلِمَ كُلُّ أُنَاسٍ مَّشْرَبَهُمْ ۖ
كُلُوا۟ وَٱشْرَبُوا۟ مِن رِّزْقِ ٱللَّهِ وَلَا تَعْثَوْا۟ فِى
ٱلْأَرْضِ مُفْسِدِينَ ٦٠

**61.** Onda siz dediniz: "Ey Musa! Biz eyni cür yeməklərə dözməyəcəyik. Ona görə də bizim üçün Rəbbinə bizə yerin bitirdiklərindən – tərəvəzindən, xiyarından, sarımsağından, mərciməyindən və soğanından yetirməsi üçün dua et!" O dedi: "Siz xeyirli olan şeylərin daha dəyərsiz şeylərlə əvəz olunmasınımı istəyirsiniz? Şəhərə girin! Şübhəsiz ki, *orada* istədiyinizi taparsınız!" Onlara zəlillik və düşgünlük üz verdi və onlar Allahın qəzəbinə düçar oldular. Bu *cəza* ona görə idi ki, onlar Allahın ayələrini inkar edirdilər və *bəzi* peyğəmbərləri haqsız yerə öldürürdülər. Bu *həm də* onların asi olduqlarına və həddi aşdıqlarına görə idi.

وَإِذْ قُلْتُمْ يَٰمُوسَىٰ لَن نَّصْبِرَ عَلَىٰ طَعَامٍ وَٰحِدٍ
فَٱدْعُ لَنَا رَبَّكَ يُخْرِجْ لَنَا مِمَّا تُنۢبِتُ
ٱلْأَرْضُ مِنۢ بَقْلِهَا وَقِثَّآئِهَا وَفُومِهَا
وَعَدَسِهَا وَبَصَلِهَا ۖ قَالَ أَتَسْتَبْدِلُونَ ٱلَّذِى
هُوَ أَدْنَىٰ بِٱلَّذِى هُوَ خَيْرٌ ۚ ٱهْبِطُوا۟ مِصْرًا
فَإِنَّ لَكُم مَّا سَأَلْتُمْ ۗ وَضُرِبَتْ عَلَيْهِمُ ٱلذِّلَّةُ
وَٱلْمَسْكَنَةُ وَبَآءُو بِغَضَبٍ مِّنَ ٱللَّهِ ۗ ذَٰلِكَ
بِأَنَّهُمْ كَانُوا۟ يَكْفُرُونَ بِـَٔايَٰتِ ٱللَّهِ
وَيَقْتُلُونَ ٱلنَّبِيِّـۧنَ بِغَيْرِ ٱلْحَقِّ ۗ ذَٰلِكَ بِمَا عَصَوا۟
وَّكَانُوا۟ يَعْتَدُونَ ﴿٦١﴾

**62.** Şübhəsiz ki, möminlərin, yəhudi, nəsrani və sabiilərdən Allaha və Axirət gününə iman gətirənlərin və yaxşı iş görənlərin mükafatı öz Rəbbi yanındadır. Onlara heç bir qorxu yoxdur və onlar kədərlənməyəcəklər.

إِنَّ ٱلَّذِينَ ءَامَنُوا۟ وَٱلَّذِينَ هَادُوا۟ وَٱلنَّصَٰرَىٰ
وَٱلصَّٰبِـِٔينَ مَنْ ءَامَنَ بِٱللَّهِ وَٱلْيَوْمِ ٱلْءَاخِرِ
وَعَمِلَ صَٰلِحًا فَلَهُمْ أَجْرُهُمْ عِندَ رَبِّهِمْ
وَلَا خَوْفٌ عَلَيْهِمْ وَلَا هُمْ يَحْزَنُونَ ﴿٦٢﴾

**63.** Bir zaman sizdən əhd-peyman aldıq, dağı başınız üstünə qaldırdıq *və buyurduq*: "Sizə verdiyimizdən möhkəm yapışın və onun içindəkiləri yada salın ki, bəlkə *Allahdan* qorxasınız!"

وَإِذْ أَخَذْنَا مِيثَٰقَكُمْ وَرَفَعْنَا فَوْقَكُمُ
ٱلطُّورَ خُذُوا۟ مَآ ءَاتَيْنَٰكُم بِقُوَّةٍ
وَٱذْكُرُوا۟ مَا فِيهِ لَعَلَّكُمْ تَتَّقُونَ ﴿٦٣﴾

**64.** Sonra bunun ardınca siz *yenə* üz döndərdiniz. Əgər sizə Allahın lütfü və rəhmi olmasaydı, əlbəttə, ziyana uğrayanlardan olardınız.

ثُمَّ تَوَلَّيْتُم مِّنۢ بَعْدِ ذَٰلِكَ ۖ فَلَوْلَا فَضْلُ ٱللَّهِ
عَلَيْكُمْ وَرَحْمَتُهُۥ لَكُنتُم مِّنَ ٱلْخَٰسِرِينَ ﴿٦٤﴾

**65.** Siz artıq içərinizdən şənbə günü həddi aşanları tanıyırsınız. Biz də onlara: "Mənfur meymunlar olun!"– dedik.

وَلَقَدْ عَلِمْتُمُ الَّذِينَ اعْتَدَوْا مِنكُمْ فِي السَّبْتِ
فَقُلْنَا لَهُمْ كُونُوا قِرَدَةً خَاسِئِينَ ٦٥

**66.** Biz bunu onlarla *bir dövrdə* olanlar və onlardan sonra gələnlər üçün ibrət, müttəqilər üçün isə öyüd-nəsihət etdik.

فَجَعَلْنَاهَا نَكَالًا لِّمَا بَيْنَ يَدَيْهَا
وَمَا خَلْفَهَا وَمَوْعِظَةً لِّلْمُتَّقِينَ ٦٦

**67.** Bir zaman Musa öz xalqına dedi: "Allah sizə bir inək kəsmənizi əmr edir!" Onlar: "Sən bizi ələ salırsan?"– dedilər. *Musa*: "Cahil olmaqdan Allaha sığınıram!"– dedi.

وَإِذْ قَالَ مُوسَىٰ لِقَوْمِهِ إِنَّ اللَّهَ يَأْمُرُكُمْ أَن
تَذْبَحُوا بَقَرَةً قَالُوا أَتَتَّخِذُنَا هُزُوًا قَالَ
أَعُوذُ بِاللَّهِ أَنْ أَكُونَ مِنَ الْجَاهِلِينَ ٦٧

**68.** Onlar dedilər: "Rəbbinə dua et ki, onun nə cür *inək* olduğunu bizə bildirsin!" *Musa* dedi: "*Allah* buyurur ki, o, nə çox qoca, nə də çox cavan, bunların ikisinin arasında olan orta yaşlı bir inəkdir. Sizə nə əmr edilirsə, *onu da* yerinə yetirin!"

قَالُوا ادْعُ لَنَا رَبَّكَ يُبَيِّن لَّنَا مَا هِيَ قَالَ إِنَّهُ
يَقُولُ إِنَّهَا بَقَرَةٌ لَّا فَارِضٌ وَلَا بِكْرٌ
عَوَانٌ بَيْنَ ذَٰلِكَ فَافْعَلُوا مَا تُؤْمَرُونَ ٦٨

**69.** Onlar dedilər: "Rəbbinə dua et ki, onun rəngini də bizə bildirsin!" *Musa* dedi: "*Allah* buyurur ki, o, sarı rəngli parlaq bir inəkdir. *Ona* baxanları sevindirir".

قَالُوا ادْعُ لَنَا رَبَّكَ يُبَيِّن لَّنَا مَا لَوْنُهَا قَالَ
إِنَّهُ يَقُولُ إِنَّهَا بَقَرَةٌ صَفْرَاءُ فَاقِعٌ لَّوْنُهَا
تَسُرُّ النَّاظِرِينَ ٦٩

**70.** Onlar dedilər: "Rəbbinə dua et ki, onun nə cür *inək* olduğunu bizə bildirsin! Çünki *bu* inək bizə başqa *inəklərə* bənzər görünür. Əgər Allah istəsə, biz düz yolda olarıq".

قَالُوا ادْعُ لَنَا رَبَّكَ يُبَيِّن لَّنَا مَا هِيَ إِنَّ الْبَقَرَ
تَشَابَهَ عَلَيْنَا وَإِنَّا إِن شَاءَ اللَّهُ لَمُهْتَدُونَ ٧٠

**71.** *Musa* dedi: "*Allah* buyurur ki, o, nə yer şumlamağa, nə də əkin

قَالَ إِنَّهُ يَقُولُ إِنَّهَا بَقَرَةٌ لَّا ذَلُولٌ تُثِيرُ الْأَرْضَ

وَلَا تَسۡقِي ٱلۡحَرۡثَ مُسَلَّمَةٞ لَّا شِيَةَ فِيهَاۚ قَالُواْ
ٱلۡـَٔـٰنَ جِئۡتَ بِٱلۡحَقِّۚ فَذَبَحُوهَا وَمَا كَادُواْ
يَفۡعَلُونَ ٧١

suvarmağa ram edilməmiş bir inəkdir. O, sağlamdır və onda *heç bir* ləkə-qüsur yoxdur". Onlar: "İndi sən əsl həqiqəti bildirdin!"– dedilər və onu kəsdilər. Halbuki az qala *bunu* yerinə yetirməyəcəkdilər.

وَإِذۡ قَتَلۡتُمۡ نَفۡسٗا فَٱدَّٰرَٰٔتُمۡ فِيهَاۖ وَٱللَّهُ مُخۡرِجٞ
مَّا كُنتُمۡ تَكۡتُمُونَ ٧٢

72. O zaman siz bir nəfəri öldürmüşdünüz və onun *qatili* barəsində mübahisə edirdiniz. Allah isə sizin gizlətdiklərinizi aşkara çıxarar.

فَقُلۡنَا ٱضۡرِبُوهُ بِبَعۡضِهَاۚ كَذَٰلِكَ يُحۡيِ ٱللَّهُ
ٱلۡمَوۡتَىٰ وَيُرِيكُمۡ ءَايَٰتِهِۦ لَعَلَّكُمۡ تَعۡقِلُونَ ٧٣

73. Biz dedik: "*İnəyin* bir parçasını *ölüyə* vurun!" Allah ölüləri bu cür dirildir və Öz ayələrini sizə göstərir ki, bəlkə anlayasınız.

ثُمَّ قَسَتۡ قُلُوبُكُم مِّنۢ بَعۡدِ ذَٰلِكَ فَهِيَ
كَٱلۡحِجَارَةِ أَوۡ أَشَدُّ قَسۡوَةٗۚ وَإِنَّ مِنَ ٱلۡحِجَارَةِ
لَمَا يَتَفَجَّرُ مِنۡهُ ٱلۡأَنۡهَٰرُۚ وَإِنَّ مِنۡهَا لَمَا يَشَّقَّقُ
فَيَخۡرُجُ مِنۡهُ ٱلۡمَآءُۚ وَإِنَّ مِنۡهَا لَمَا يَهۡبِطُ مِنۡ
خَشۡيَةِ ٱللَّهِۗ وَمَا ٱللَّهُ بِغَٰفِلٍ عَمَّا تَعۡمَلُونَ ٧٤

74. Sonra bunun ardınca sizin qəlbləriniz sərtləşib daş kimi, hətta ondan da sərt oldu. Həqiqətən, daşlardan eləsi var ki, içərisindən çaylar qaynayıb çıxar. Onlardan eləsi də var ki, yarılar, içərisindən su çıxar. Eləsi də var ki, Allahın qorxusundan *yuvarlanıb yerə* düşər. Allah sizin nə etdiklərinizdən xəbərsiz deyildir.

۞أَفَتَطۡمَعُونَ أَن يُؤۡمِنُواْ لَكُمۡ وَقَدۡ كَانَ فَرِيقٞ
مِّنۡهُمۡ يَسۡمَعُونَ كَلَٰمَ ٱللَّهِ ثُمَّ يُحَرِّفُونَهُۥ
مِنۢ بَعۡدِ مَا عَقَلُوهُ وَهُمۡ يَعۡلَمُونَ ٧٥

75. Siz *yəhudilərin* sizə inanacaqlarınamı ümid edirsiniz? Halbuki onlardan bir zümrə var idi ki, Allahın Sözünü eşidib anladıqdan sonra, bilə-bilə onu təhrif edirdilər.

وَإِذَا لَقُواْ ٱلَّذِينَ ءَامَنُواْ قَالُوٓاْ ءَامَنَّا وَإِذَا
خَلَا بَعۡضُهُمۡ إِلَىٰ بَعۡضٖ قَالُوٓاْ أَتُحَدِّثُونَهُم
بِمَا فَتَحَ ٱللَّهُ عَلَيۡكُمۡ لِيُحَآجُّوكُم بِهِۦ عِندَ
رَبِّكُمۡۚ أَفَلَا تَعۡقِلُونَ ٧٦

76. Onlar möminlərlə rastlaşanda: "Biz iman gətirdik!"– deyir, bir-birləri ilə xəlvətdə qalanda isə: "Allahın sizə bildirdiyini onlara danışırsınız ki, Rəbbinizin yanında bunu sizə

*qarşı* dəlil gətirsinlər? Məgər başa düşmürsünüz?"– deyirlər.

77. Məgər onlar bilmirlər ki, Allah onların gizli saxladıqlarını və aşkara çıxartdıqlarını bilir?

أَوَلَا يَعْلَمُونَ أَنَّ ٱللَّهَ يَعْلَمُ مَا يُسِرُّونَ
وَمَا يُعْلِنُونَ ٧٧

78. Onların arasında Kitabı bilməyən elə savadsızlar vardır ki, onlar ancaq xülyalara *dalar* və ancaq zənnə uyarlar.

وَمِنْهُمْ أُمِّيُّونَ لَا يَعْلَمُونَ ٱلْكِتَٰبَ
إِلَّآ أَمَانِىَّ وَإِنْ هُمْ إِلَّا يَظُنُّونَ ٧٨

79. Vay o şəxslərin halına ki, onlar öz əlləri ilə kitab yazır, sonra da: "Bu, Allah tərəfindəndir!"– deyirlər ki, onunla cüzi miqdarda pul əldə edə bilsinlər. Öz əlləri ilə yazdıqlarına görə vay onların halına! Qazandıqları şeyə görə vay onların halına!

فَوَيْلٌ لِّلَّذِينَ يَكْتُبُونَ ٱلْكِتَٰبَ بِأَيْدِيهِمْ
ثُمَّ يَقُولُونَ هَٰذَا مِنْ عِندِ ٱللَّهِ لِيَشْتَرُوا۟
بِهِۦ ثَمَنًا قَلِيلًا ۖ فَوَيْلٌ لَّهُم مِّمَّا كَتَبَتْ
أَيْدِيهِمْ وَوَيْلٌ لَّهُم مِّمَّا يَكْسِبُونَ ٧٩

80. Onlar dedilər: "Od bizə ancaq bir neçə gün toxunacaq!" De: "Məgər siz Allahdan əhd almısınız? Allah verdiyi əhdə əsla xilaf çıxmaz! Yoxsa Allaha qarşı bilmədiyinizi danışırsınız?"

وَقَالُوا۟ لَن تَمَسَّنَا ٱلنَّارُ إِلَّآ أَيَّامًا
مَّعْدُودَةً ۚ قُلْ أَتَّخَذْتُمْ عِندَ ٱللَّهِ عَهْدًا
فَلَن يُخْلِفَ ٱللَّهُ عَهْدَهُۥٓ ۖ أَمْ تَقُولُونَ
عَلَى ٱللَّهِ مَا لَا تَعْلَمُونَ ٨٠

81. Xeyr! Günah qazanan və xətaları özlərini bürüyən kimsələr – məhz onlar Od sakinləridir və orada əbədi qalacaqlar!

بَلَىٰ مَن كَسَبَ سَيِّئَةً وَأَحَٰطَتْ بِهِۦ
خَطِيٓـَٔتُهُۥ فَأُو۟لَٰٓئِكَ أَصْحَٰبُ ٱلنَّارِ ۖ هُمْ
فِيهَا خَٰلِدُونَ ٨١

82. İman gətirib yaxşı işlər görənlər isə Cənnət sakinləridir. Onlar orada əbədi qalacaqlar!

وَٱلَّذِينَ ءَامَنُوا۟ وَعَمِلُوا۟ ٱلصَّٰلِحَٰتِ أُو۟لَٰٓئِكَ
أَصْحَٰبُ ٱلْجَنَّةِ ۖ هُمْ فِيهَا خَٰلِدُونَ ٨٢

83. Bir zaman Biz İsrail oğulları ilə: "Allahdan qeyrisinə ibadət etməyəcək, valideynlərə, qohum-

وَإِذْ أَخَذْنَا مِيثَٰقَ بَنِىٓ إِسْرَٰٓءِيلَ
لَا تَعْبُدُونَ إِلَّا ٱللَّهَ وَبِٱلْوَٰلِدَيْنِ إِحْسَانًا

əqrəbaya, yetimlərə və kasıblara xeyirxahlıq edəcək, insanlara xoş söz deyəcək, namaz qılacaq və zəkat verəcəksiniz!"– *deyə* əhd bağladıq. Sonra az bir qisminiz istisna olmaqla, *haqdan* üz çevirib döndünüz.

وَذِى ٱلْقُرْبَىٰ وَٱلْيَتَٰمَىٰ وَٱلْمَسَٰكِينِ وَقُولُوا۟ لِلنَّاسِ حُسْنًا وَأَقِيمُوا۟ ٱلصَّلَوٰةَ وَءَاتُوا۟ ٱلزَّكَوٰةَ ثُمَّ تَوَلَّيْتُمْ إِلَّا قَلِيلًا مِّنكُمْ وَأَنتُم مُّعْرِضُونَ ﴿٨٣﴾

84. O zaman Biz sizinlə: "Bir-birinizin qanını tökməyəcəksiniz, bir-birinizi yurdlarınızdan çıxarmayacaqsınız!"– *deyə* əhd kəsdik. Sonra da siz *özünüz* şahidlik edərək *bu əhdi* təsdiqlədiniz.

وَإِذْ أَخَذْنَا مِيثَٰقَكُمْ لَا تَسْفِكُونَ دِمَآءَكُمْ وَلَا تُخْرِجُونَ أَنفُسَكُم مِّن دِيَٰرِكُمْ ثُمَّ أَقْرَرْتُمْ وَأَنتُمْ تَشْهَدُونَ ﴿٨٤﴾

85. Siz o kəslərsiniz ki, bir-birinizi öldürürsünüz, özünüzdən olan bir dəstəni öz yurdundan çıxarırsınız, onlara qarşı pislik və düşmənçilik etməkdə bir-birinizə kömək edirsiniz. Onlar əsir tutulub yanınıza gətiriləndə, fidyə verib onları azad edirsiniz. Halbuki onları *yurdlarından* çıxartmaq sizə haram edilmişdi. Yoxsa siz Kitabın bir qisminə inanıb, digər qismini inkarmı edirsiniz? Sizlərdən bunu edənin cəzası dünya həyatında rüsvay olmaq, Qiyamət günü isə ən şiddətli əzaba məhkum olmaqdır. Allah sizin etdiklərinizdən bixəbər deyildir.

ثُمَّ أَنتُمْ هَٰٓؤُلَآءِ تَقْتُلُونَ أَنفُسَكُمْ وَتُخْرِجُونَ فَرِيقًا مِّنكُم مِّن دِيَٰرِهِمْ تَظَٰهَرُونَ عَلَيْهِم بِٱلْإِثْمِ وَٱلْعُدْوَٰنِ وَإِن يَأْتُوكُمْ أُسَٰرَىٰ تُفَٰدُوهُمْ وَهُوَ مُحَرَّمٌ عَلَيْكُمْ إِخْرَاجُهُمْ ۚ أَفَتُؤْمِنُونَ بِبَعْضِ ٱلْكِتَٰبِ وَتَكْفُرُونَ بِبَعْضٍ ۚ فَمَا جَزَآءُ مَن يَفْعَلُ ذَٰلِكَ مِنكُمْ إِلَّا خِزْىٌ فِى ٱلْحَيَوٰةِ ٱلدُّنْيَا ۖ وَيَوْمَ ٱلْقِيَٰمَةِ يُرَدُّونَ إِلَىٰٓ أَشَدِّ ٱلْعَذَابِ ۗ وَمَا ٱللَّهُ بِغَٰفِلٍ عَمَّا تَعْمَلُونَ ﴿٨٥﴾

86. Onlar axirəti verib dünya həyatını satın aldılar. Ona görə də onların nə əzabı yüngülləşdiriləcək, nə də onlara kömək göstəriləcəkdir.

أُو۟لَٰٓئِكَ ٱلَّذِينَ ٱشْتَرَوُا۟ ٱلْحَيَوٰةَ ٱلدُّنْيَا بِٱلْءَاخِرَةِ ۖ فَلَا يُخَفَّفُ عَنْهُمُ ٱلْعَذَابُ وَلَا هُمْ يُنصَرُونَ ﴿٨٦﴾

87. Biz Musaya Kitab verdik və ondan sonra bir-birinin ardınca elçilər

وَلَقَدْ ءَاتَيْنَا مُوسَى ٱلْكِتَٰبَ وَقَفَّيْنَا

göndərdik. Biz Məryəm oğlu İsaya da açıq-aydın dəlillər verdik və onu müqəddəs ruh *Cəbrail* ilə qüvvətləndirdik. Məgər hər dəfə sizə *göndərilən* elçi ürəyinizə yatmayan bir şey gətirəndə siz təkəbbür göstərmədinizmi? *Onların* bir qismini yalançı hesab edib, bir qismini də öldürmədinizmi?

مِنۢ بَعۡدِهِۦ بِٱلرُّسُلِۖ وَءَاتَيۡنَا عِيسَى ٱبۡنَ
مَرۡيَمَ ٱلۡبَيِّنَٰتِ وَأَيَّدۡنَٰهُ بِرُوحِ ٱلۡقُدُسِۗ أَفَكُلَّمَا
جَآءَكُمۡ رَسُولُۢ بِمَا لَا تَهۡوَىٰٓ أَنفُسُكُمُ
ٱسۡتَكۡبَرۡتُمۡ فَفَرِيقٗا كَذَّبۡتُمۡ وَفَرِيقٗا تَقۡتُلُونَ ٨٧

88. Onlar dedilər: “Qəlblərimiz qapalıdır!” Xeyr, Allah onları məhz küfrlərinə görə lənətləmişdir. Odur ki, onlar olduqca az inanırlar.

وَقَالُواْ قُلُوبُنَا غُلۡفُۢۚ بَل لَّعَنَهُمُ ٱللَّهُ
بِكُفۡرِهِمۡ فَقَلِيلٗا مَّا يُؤۡمِنُونَ ٨٨

89. Onlara Allah tərəfindən özlərində olanı təsdiqləyən bir Kitab gəldikdə *onu inkar etdilər*. Halbuki əvvəllər kafirlər üzərində qələbə diləyirdilər. Onlara tanıdıqları *peyğəmbər* gəldikdə isə onu inkar etdilər. Allah kafirlərə lənət etsin!

وَلَمَّا جَآءَهُمۡ كِتَٰبٞ مِّنۡ عِندِ ٱللَّهِ مُصَدِّقٞ
لِّمَا مَعَهُمۡ وَكَانُواْ مِن قَبۡلُ يَسۡتَفۡتِحُونَ
عَلَى ٱلَّذِينَ كَفَرُواْ فَلَمَّا جَآءَهُم مَّا عَرَفُواْ
كَفَرُواْ بِهِۦۚ فَلَعۡنَةُ ٱللَّهِ عَلَى ٱلۡكَٰفِرِينَ ٨٩

90. Allahın Öz qullarından istədiyi kimsəyə Öz lütfündən bəxş etməsinə həsəd aparmaq və Onun nazil etdiyini inkar etməklə nəfslərini satıb əvəzində aldıqları şey necə də pisdir! Onlar *Allahın* onlara bəslədiyi qəzəbi daha da şiddətləndirdilər. Kafirlərə alçaldıcı bir əzab vardır.

بِئۡسَمَا ٱشۡتَرَوۡاْ بِهِۦٓ أَنفُسَهُمۡ أَن يَكۡفُرُواْ
بِمَآ أَنزَلَ ٱللَّهُ بَغۡيًا أَن يُنَزِّلَ ٱللَّهُ مِن فَضۡلِهِۦ
عَلَىٰ مَن يَشَآءُ مِنۡ عِبَادِهِۦۖ فَبَآءُو بِغَضَبٍ
عَلَىٰ غَضَبٖۚ وَلِلۡكَٰفِرِينَ عَذَابٞ مُّهِينٞ ٩٠

91. Onlara: “Allahın nazil etdiyinə inanın!”– deyildikdə, onlar: “Biz özümüzə nazil edilənə inanırıq”– deyib onun ardınca gələni inkar edirlər. Halbuki *Quran* onların yanında olanı təsdiqləyən bir

وَإِذَا قِيلَ لَهُمۡ ءَامِنُواْ بِمَآ أَنزَلَ ٱللَّهُ قَالُواْ
نُؤۡمِنُ بِمَآ أُنزِلَ عَلَيۡنَا وَيَكۡفُرُونَ بِمَا
وَرَآءَهُۥ وَهُوَ ٱلۡحَقُّ مُصَدِّقٗا لِّمَا مَعَهُمۡۗ قُلۡ
فَلِمَ تَقۡتُلُونَ أَنۢبِيَآءَ ٱللَّهِ مِن قَبۡلُ إِن

həqiqətdir. De: “Əgər siz inanan idinizsə, bəs nə üçün əvvəllər Allahın peyğəmbərlərini öldürürdünüz?”

كُنتُم مُّؤْمِنِينَ ﴿٩١﴾

**92.** Musa sizə açıq-aydın dəlillər gətirmişdi. O getdikdən sonra siz buzovu ilahiləşdirib özünüzə zülm etdiniz.

۞ وَلَقَدْ جَآءَكُم مُّوسَىٰ بِٱلْبَيِّنَٰتِ ثُمَّ
ٱتَّخَذْتُمُ ٱلْعِجْلَ مِنۢ بَعْدِهِۦ وَأَنتُمْ
ظَٰلِمُونَ ﴿٩٢﴾

**93.** O zaman Biz sizinlə əhd bağlayıb dağı *başınızın* üstünə qaldırdıq: “Sizə verdiyimizdən möhkəm yapışın və eşidin!”– *deyə əmr etdik*. Onlar: “Eşitdik və asi olduq!”– dedilər. Küfrlərinə görə buzova *olan məhəbbət* onların qəlblərinə yeridildi. De: “Əgər siz möminsinizsə, imanınızın sizə əmr etdiyi şey necə də pisdir!”

وَإِذْ أَخَذْنَا مِيثَٰقَكُمْ وَرَفَعْنَا
فَوْقَكُمُ ٱلطُّورَ خُذُوا۟ مَآ ءَاتَيْنَٰكُم
بِقُوَّةٍ وَٱسْمَعُوا۟ ۖ قَالُوا۟ سَمِعْنَا وَعَصَيْنَا
وَأُشْرِبُوا۟ فِى قُلُوبِهِمُ ٱلْعِجْلَ
بِكُفْرِهِمْ ۚ قُلْ بِئْسَمَا يَأْمُرُكُم بِهِۦٓ
إِيمَٰنُكُمْ إِن كُنتُم مُّؤْمِنِينَ ﴿٩٣﴾

**94.** De: “Əgər Allah yanında Axirət yurdu digər insanlara deyil, yalnız sizin üçün hazırlanıbsa və doğru deyirsinizsə, onda *özünüzə* ölüm diləyin!”

قُلْ إِن كَانَتْ لَكُمُ ٱلدَّارُ ٱلْءَاخِرَةُ عِندَ ٱللَّهِ
خَالِصَةً مِّن دُونِ ٱلنَّاسِ فَتَمَنَّوُا۟
ٱلْمَوْتَ إِن كُنتُمْ صَٰدِقِينَ ﴿٩٤﴾

**95.** Onlar öz əllərinin etdiyinə görə bunu heç vaxt diləməzlər. Allah zalımları tanıyır.

وَلَن يَتَمَنَّوْهُ أَبَدًۢا بِمَا قَدَّمَتْ أَيْدِيهِمْ ۗ
وَٱللَّهُ عَلِيمٌۢ بِٱلظَّٰلِمِينَ ﴿٩٥﴾

**96.** Sən onların həyata bütün insanlardan, hətta müşriklərdən də daha həris olduqlarını görəcəksən. Onlardan hər biri min il ömür sürməsini istər. Halbuki uzun ömür belə onu əzabdan uzaqlaşdıra bilməz. Allah onların nə etdiklərini görür.

وَلَتَجِدَنَّهُمْ أَحْرَصَ ٱلنَّاسِ عَلَىٰ حَيَوٰةٍ وَمِنَ
ٱلَّذِينَ أَشْرَكُوا۟ ۚ يَوَدُّ أَحَدُهُمْ لَوْ يُعَمَّرُ أَلْفَ
سَنَةٍ وَمَا هُوَ بِمُزَحْزِحِهِۦ مِنَ ٱلْعَذَابِ
أَن يُعَمَّرَ ۗ وَٱللَّهُ بَصِيرٌۢ بِمَا يَعْمَلُونَ ﴿٩٦﴾

**97.** De: "Cəbrailə düşmən olan kəs *bilsin ki*, Allahın izni ilə *Quranı* özündən əvvəlkiləri təsdiqləyən, möminlərə doğru yol göstərən və müjdə verən *bir kitab* kimi sənin qəlbinə o nazil etmişdir".

قُلْ مَن كَانَ عَدُوًّا لِّجِبْرِيلَ فَإِنَّهُۥ
نَزَّلَهُۥ عَلَىٰ قَلْبِكَ بِإِذْنِ ٱللَّهِ مُصَدِّقًا لِّمَا
بَيْنَ يَدَيْهِ وَهُدًى وَبُشْرَىٰ لِلْمُؤْمِنِينَ ٩٧

**98.** Kim Allaha, Onun mələklərinə və elçilərinə, Cəbrailə və Mikailə düşməndirsə, şübhəsiz ki, Allah da o kafirlərə düşməndir.

مَن كَانَ عَدُوًّا لِّلَّهِ وَمَلَٰٓئِكَتِهِۦ
وَرُسُلِهِۦ وَجِبْرِيلَ وَمِيكَىٰلَ فَإِنَّ ٱللَّهَ
عَدُوٌّ لِّلْكَٰفِرِينَ ٩٨

**99.** Biz sənə aydın başa düşülən dəlillər nazil etdik ki, onları da yalnız fasiqlər inkar edərlər.

وَلَقَدْ أَنزَلْنَآ إِلَيْكَ ءَايَٰتٍۭ بَيِّنَٰتٍ
وَمَا يَكْفُرُ بِهَآ إِلَّا ٱلْفَٰسِقُونَ ٩٩

**100.** Onlar hər dəfə əhd bağladıqda içərilərindən bir dəstə onu pozmurmu? Həm də onların çoxu *buna* inanmır.

أَوَكُلَّمَا عَٰهَدُوا۟ عَهْدًا نَّبَذَهُۥ فَرِيقٌ
مِّنْهُم بَلْ أَكْثَرُهُمْ لَا يُؤْمِنُونَ ١٠٠

**101.** Onlara Allah tərəfindən özlərində olanı təsdiqləyən bir elçi gəldikdə Kitab verilənlərdən bir dəstə guya *həqiqəti* bilmirmiş kimi Allahın Kitabına arxa çevirdilər.

وَلَمَّا جَآءَهُمْ رَسُولٌ مِّنْ عِندِ ٱللَّهِ مُصَدِّقٌ
لِّمَا مَعَهُمْ نَبَذَ فَرِيقٌ مِّنَ ٱلَّذِينَ
أُوتُوا۟ ٱلْكِتَٰبَ كِتَٰبَ ٱللَّهِ وَرَآءَ
ظُهُورِهِمْ كَأَنَّهُمْ لَا يَعْلَمُونَ ١٠١

**102.** Onlar Suleymanın səltənətində şeytanların oxuduqlarının ardınca getdilər. Süleyman kafir olmadı. Lakin şeytanlar sehri və Babildə Harut və Marut adlı iki mələyə nazil olanı insanlara öyrədərək kafir oldular. *Mələklər*: "Biz ancaq bir sınağıq, sən gəl kafir olma!"– deməmiş *onu* heç kəsə öyrətmirdilər. *Yəhudilər* ərlə arvadı bir-birindən ayıracaq işləri onlardan öyrənirdilər. Lakin onlar Allahın izni olmadan heç kəsə zərər verə

وَٱتَّبَعُوا۟ مَا تَتْلُوا۟ ٱلشَّيَٰطِينُ عَلَىٰ مُلْكِ سُلَيْمَٰنَ
وَمَا كَفَرَ سُلَيْمَٰنُ وَلَٰكِنَّ ٱلشَّيَٰطِينَ
كَفَرُوا۟ يُعَلِّمُونَ ٱلنَّاسَ ٱلسِّحْرَ وَمَآ أُنزِلَ
عَلَى ٱلْمَلَكَيْنِ بِبَابِلَ هَٰرُوتَ وَمَٰرُوتَ
وَمَا يُعَلِّمَانِ مِنْ أَحَدٍ حَتَّىٰ يَقُولَآ إِنَّمَا نَحْنُ
فِتْنَةٌ فَلَا تَكْفُرْ فَيَتَعَلَّمُونَ مِنْهُمَا
مَا يُفَرِّقُونَ بِهِۦ بَيْنَ ٱلْمَرْءِ وَزَوْجِهِۦ وَمَا هُم
بِضَآرِّينَ بِهِۦ مِنْ أَحَدٍ إِلَّا بِإِذْنِ ٱللَّهِ
وَيَتَعَلَّمُونَ مَا يَضُرُّهُمْ وَلَا يَنفَعُهُمْ

bilməzlər. Onlar özlərinə zərər verən, faydası olmayan şeyləri öyrənirdilər. Onlar bilirdilər ki, onu əldə edən kimsə üçün axirətdə heç bir pay yoxdur. Nəfslərinin əvəzində satın aldıqları şey necə də pisdir! Kaş *bunu* biləydilər!

وَلَقَدْ عَلِمُوا۟ لَمَنِ ٱشْتَرَىٰهُ مَا لَهُۥ فِى
ٱلْءَاخِرَةِ مِنْ خَلَٰقٍ ۚ وَلَبِئْسَ مَا شَرَوْا۟ بِهِۦٓ
أَنفُسَهُمْ ۚ لَوْ كَانُوا۟ يَعْلَمُونَ ١٠٢

103. Onlar iman gətirib *Allahdan* qorxsaydılar, Allahın verdiyi mükafat *onlar üçün* daha xeyirli olardı. Kaş *bunu* biləydilər!

وَلَوْ أَنَّهُمْ ءَامَنُوا۟ وَٱتَّقَوْا۟ لَمَثُوبَةٌ مِّنْ عِندِ
ٱللَّهِ خَيْرٌ ۖ لَّوْ كَانُوا۟ يَعْلَمُونَ ١٠٣

104. Ey iman gətirənlər! *Peyğəmbərə*: “Bizə qayğı göstər!”– deməyin; “Bizə nəzər yetir!”– deyin və *Allahın əmrini* eşidin! Kafirləri ağrılı-acılı bir əzab gözləyir.

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ لَا تَقُولُوا۟ رَٰعِنَا
وَقُولُوا۟ ٱنظُرْنَا وَٱسْمَعُوا۟ ۗ
وَلِلْكَٰفِرِينَ عَذَابٌ أَلِيمٌ ١٠٤

105. Nə Kitab əhlinin kafir olanları, nə də müşriklər sizə Rəbbinizdən bir xeyir nazil olmasını istəmirlər. Allah isə mərhəmətini istədiyi şəxsə məxsus edir. Allah böyük lütf sahibidir.

مَّا يَوَدُّ ٱلَّذِينَ كَفَرُوا۟ مِنْ أَهْلِ ٱلْكِتَٰبِ
وَلَا ٱلْمُشْرِكِينَ أَن يُنَزَّلَ عَلَيْكُم مِّنْ
خَيْرٍ مِّن رَّبِّكُمْ ۗ وَٱللَّهُ يَخْتَصُّ بِرَحْمَتِهِۦ
مَن يَشَآءُ ۚ وَٱللَّهُ ذُو ٱلْفَضْلِ ٱلْعَظِيمِ ١٠٥

106. Biz *hər hansı* bir ayəni dəyişdirir və ya onu unutdururuqsa, ondan daha yaxşısını, və ya ona bənzərini gətiririk. Məgər bilmirsən ki, Allah hər şeyə qadirdir?

۞ مَا نَنسَخْ مِنْ ءَايَةٍ أَوْ نُنسِهَا نَأْتِ بِخَيْرٍ
مِّنْهَآ أَوْ مِثْلِهَآ ۗ أَلَمْ تَعْلَمْ أَنَّ ٱللَّهَ عَلَىٰ
كُلِّ شَىْءٍ قَدِيرٌ ١٠٦

107. Bilmirsənmi ki, göylərdə və yerdə hökmranlıq təkcə Allaha məxsusdur? Sizin Allahdan başqa nə bir himayəçiniz, nə də bir köməkçiniz vardır.

أَلَمْ تَعْلَمْ أَنَّ ٱللَّهَ لَهُۥ مُلْكُ ٱلسَّمَٰوَٰتِ
وَٱلْأَرْضِ ۗ وَمَا لَكُم مِّن دُونِ ٱللَّهِ مِن وَلِىٍّ
وَلَا نَصِيرٍ ١٠٧

108. Yoxsa *bundan* əvvəl Musadan tələb olunduğu kimi siz də

أَمْ تُرِيدُونَ أَن تَسْـَٔلُوا۟ رَسُولَكُمْ كَمَا

Peyğəmbərinizdən *möcüzə* tələb etmək istəyirsiniz? İmanı küfrə dəyişən kəs, əlbəttə, doğru yoldan azmışdır.

سُئِلَ مُوسَىٰ مِن قَبۡلُۗ وَمَن يَتَبَدَّلِ ٱلۡكُفۡرَ
بِٱلۡإِيمَٰنِ فَقَدۡ ضَلَّ سَوَآءَ ٱلسَّبِيلِ ١٠٨

109. Kitab əhlindən bir çoxu həqiqəti bildikdən sonra da, paxıllıqları üzündən sizi, siz iman gətirdikdən sonra kafirliyə qaytarmaq istəyərlər. Allah Öz əmrini verincəyə qədər *onları* bağışlayın və *onlara* baş qoşmayın! Həqiqətən, Allah hər şeyə qadirdir.

وَدَّ كَثِيرٞ مِّنۡ أَهۡلِ ٱلۡكِتَٰبِ لَوۡ يَرُدُّونَكُم
مِّنۢ بَعۡدِ إِيمَٰنِكُمۡ كُفَّارًا حَسَدٗا مِّنۡ
عِندِ أَنفُسِهِم مِّنۢ بَعۡدِ مَا تَبَيَّنَ لَهُمُ
ٱلۡحَقُّۖ فَٱعۡفُواْ وَٱصۡفَحُواْ حَتَّىٰ يَأۡتِيَ ٱللَّهُ
بِأَمۡرِهِۦٓۗ إِنَّ ٱللَّهَ عَلَىٰ كُلِّ شَيۡءٖ قَدِيرٞ ١٠٩

110. Namaz qılın, zəkat verin! Qabaqcadan özünüz üçün nə xeyir hazırlasanız onun *əvəzini* Allahın yanında tapacaqsanız. Şübhəsiz ki, Allah nə etdiklərinizi görür.

وَأَقِيمُواْ ٱلصَّلَوٰةَ وَءَاتُواْ ٱلزَّكَوٰةَۚ
وَمَا تُقَدِّمُواْ لِأَنفُسِكُم مِّنۡ خَيۡرٖ تَجِدُوهُ
عِندَ ٱللَّهِۗ إِنَّ ٱللَّهَ بِمَا تَعۡمَلُونَ بَصِيرٞ ١١٠

111. Onlar dedilər: "Yəhudilərdən və ya xaçpərəstlərdən başqa heç kəs Cənnətə daxil olmayacaq!" Bu onların xam xəyallarıdır. De: "Əgər doğru deyirsinizsə, dəlilinizi gətirin!"

وَقَالُواْ لَن يَدۡخُلَ ٱلۡجَنَّةَ إِلَّا مَن كَانَ
هُودًا أَوۡ نَصَٰرَىٰۗ تِلۡكَ أَمَانِيُّهُمۡۗ قُلۡ هَاتُواْ
بُرۡهَٰنَكُمۡ إِن كُنتُمۡ صَٰدِقِينَ ١١١

112. Xeyr! Kim yaxşı işlər görüb Allaha təslim olarsa, Rəbbi yanında onun mükafatı olar. Onlara heç bir qorxu yoxdur və onlar kədərlənməyəcəklər.

بَلَىٰۚ مَنۡ أَسۡلَمَ وَجۡهَهُۥ لِلَّهِ وَهُوَ مُحۡسِنٞ فَلَهُۥٓ
أَجۡرُهُۥ عِندَ رَبِّهِۦ وَلَا خَوۡفٌ عَلَيۡهِمۡ
وَلَا هُمۡ يَحۡزَنُونَ ١١٢

113. Yəhudilər: "Xaçpərəstlər heç bir şeyə əsaslanmırlar!"– deyir, xaçpərəstlər isə: "Yəhudilər heç bir şeyə əsaslanmırlar!"– deyirlər. Halbuki onlar Kitab oxuyandırlar.

وَقَالَتِ ٱلۡيَهُودُ لَيۡسَتِ ٱلنَّصَٰرَىٰ عَلَىٰ شَيۡءٖ
وَقَالَتِ ٱلنَّصَٰرَىٰ لَيۡسَتِ ٱلۡيَهُودُ عَلَىٰ شَيۡءٖ
وَهُمۡ يَتۡلُونَ ٱلۡكِتَٰبَۗ كَذَٰلِكَ قَالَ ٱلَّذِينَ
لَا يَعۡلَمُونَ مِثۡلَ قَوۡلِهِمۡۚ فَٱللَّهُ يَحۡكُمُ بَيۡنَهُمۡ

Cahillər də onların danışdığı kimi danışırlar. Allah ixtilafa düşdükləri şey barəsində Qiyamət günü onların arasında hökm verəcəkdir.

يَوْمَ الْقِيَامَةِ فِيمَا كَانُوا فِيهِ يَخْتَلِفُونَ ١١٣

114. Allahın məscidlərində Onun adının zikr edilməsinə maneçilik törədənlərdən və onların viranə qalmasına çalışanlardan daha zalım kim ola bilər? Əslində onlar oraya qorxa-qorxa daxil olmalı idilər. Onlar üçün dünyada rüsvayçılıq, axirətdə isə böyük bir əzab vardır.

وَمَنْ أَظْلَمُ مِمَّنْ مَنَعَ مَسَاجِدَ اللَّهِ أَنْ يُذْكَرَ
فِيهَا اسْمُهُ وَسَعَىٰ فِي خَرَابِهَا ۚ أُولَٰئِكَ مَا كَانَ
لَهُمْ أَنْ يَدْخُلُوهَا إِلَّا خَائِفِينَ ۚ لَهُمْ فِي
الدُّنْيَا خِزْيٌ وَلَهُمْ فِي الْآخِرَةِ عَذَابٌ عَظِيمٌ ١١٤

115. Məşriq də, məğrib də Allahındır! Hansı səmtə yönəlsəniz, Allahın Üzü orada olar. Həqiqətən, Allah *hər şeyi* Əhatəedəndir, Biləndir.

وَلِلَّهِ الْمَشْرِقُ وَالْمَغْرِبُ ۚ فَأَيْنَمَا تُوَلُّوا فَثَمَّ وَجْهُ
اللَّهِ ۚ إِنَّ اللَّهَ وَاسِعٌ عَلِيمٌ ١١٥

116. Onlar dedilər: “Allah *Özünə* övlad götürmüşdür!” Halbuki O, pakdır, müqəddəsdir! Həqiqətən, göylərdə və yerdə nə varsa, Ona məxsusdur. Hər şey Ona baş əyir.

وَقَالُوا اتَّخَذَ اللَّهُ وَلَدًا ۗ سُبْحَانَهُ ۖ بَلْ لَهُ مَا فِي
السَّمَاوَاتِ وَالْأَرْضِ ۖ كُلٌّ لَهُ قَانِتُونَ ١١٦

117. Göyləri və yeri icad edən Odur. O, bir işi yaratmaq istədikdə ona ancaq: “Ol!”– deyər, o da olar.

بَدِيعُ السَّمَاوَاتِ وَالْأَرْضِ ۖ وَإِذَا قَضَىٰ أَمْرًا
فَإِنَّمَا يَقُولُ لَهُ كُنْ فَيَكُونُ ١١٧

118. Cahillər dedilər: “Bəs nə üçün Allah bizi danışdırmır, yaxud bizə bir ayə gəlmir?” Onların əcdadları da elə onlar kimi danışırdılar. Onların qəlbləri bir-birinə oxşayır. Biz, yəqinliklə inanan bir xalqa dəlillərimizi bəyan etmişik.

وَقَالَ الَّذِينَ لَا يَعْلَمُونَ لَوْلَا يُكَلِّمُنَا
اللَّهُ أَوْ تَأْتِينَا آيَةٌ ۗ كَذَٰلِكَ قَالَ الَّذِينَ
مِنْ قَبْلِهِمْ مِثْلَ قَوْلِهِمْ ۘ تَشَابَهَتْ قُلُوبُهُمْ ۗ
قَدْ بَيَّنَّا الْآيَاتِ لِقَوْمٍ يُوقِنُونَ ١١٨

**119.** Biz səni haqq ilə müjdələyən və xəbərdarlıq edən *bir peyğəmbər* göndərdik. Cəhənnəm sakinləri barəsində isə sən sorğu-sual olunmayacaqsan.

إِنَّآ أَرۡسَلۡنَٰكَ بِٱلۡحَقِّ بَشِيرٗا وَنَذِيرٗاۖ
وَلَا تُسۡـَٔلُ عَنۡ أَصۡحَٰبِ ٱلۡجَحِيمِ ١١٩

**120.** Sən onların dininə tabe olmayınca, nə yəhudilər, nə də xaçpərəstlər səndən razı qalmayacaqlar. De: “Yalnız Allahın haqq yolu doğru yoldur!” Əgər sənə gələn elmdən sonra onların istəklərinə uysan, səni Allahdan nə bir qoruyan, nə də bir xilas edən olar.

وَلَن تَرۡضَىٰ عَنكَ ٱلۡيَهُودُ وَلَا ٱلنَّصَٰرَىٰ حَتَّىٰ
تَتَّبِعَ مِلَّتَهُمۡۗ قُلۡ إِنَّ هُدَى ٱللَّهِ هُوَ ٱلۡهُدَىٰۗ
وَلَئِنِ ٱتَّبَعۡتَ أَهۡوَآءَهُم بَعۡدَ ٱلَّذِي جَآءَكَ مِنَ
ٱلۡعِلۡمِ مَا لَكَ مِنَ ٱللَّهِ مِن وَلِيّٖ وَلَا نَصِيرٍ ١٢٠

**121.** Kitab verdiyimiz kəslər onu layiqincə oxuyurlar. Onlar ona iman gətirənlərdir. Onu inkar edənlər isə ziyana uğrayanlardır.

ٱلَّذِينَ ءَاتَيۡنَٰهُمُ ٱلۡكِتَٰبَ يَتۡلُونَهُۥ حَقَّ تِلَاوَتِهِۦٓ
أُوْلَٰٓئِكَ يُؤۡمِنُونَ بِهِۦۗ وَمَن يَكۡفُرۡ بِهِۦ فَأُوْلَٰٓئِكَ
هُمُ ٱلۡخَٰسِرُونَ ١٢١

**122.** Ey İsrail oğulları! Sizə bəxş etdiyim nemətimi və *vaxtı ilə* sizi aləmlərdən üstün etdiyimi xatırlayın.

يَٰبَنِيٓ إِسۡرَٰٓءِيلَ ٱذۡكُرُواْ نِعۡمَتِيَ ٱلَّتِيٓ أَنۡعَمۡتُ
عَلَيۡكُمۡ وَأَنِّي فَضَّلۡتُكُمۡ عَلَى ٱلۡعَٰلَمِينَ ١٢٢

**123.** Qorxun o gündən ki, *o vaxt* heç kəs heç kəsə fayda verə bilməyəcək, heç kəsdən bir fidyə qəbul edilməyəcək, heç kəsin şəfaəti fayda verməyəcək və onlara kömək göstərilməyəcək.

وَٱتَّقُواْ يَوۡمٗا لَّا تَجۡزِي نَفۡسٌ عَن نَّفۡسٖ شَيۡـٔٗا وَلَا يُقۡبَلُ
مِنۡهَا عَدۡلٞ وَلَا تَنفَعُهَا شَفَٰعَةٞ وَلَا هُمۡ يُنصَرُونَ ١٢٣

**124.** Rəbbi İbrahimi *bəzi* kəlmələrlə sınadığı zaman o, bunları tamamilə yerinə yetirdi. *Allah*: “Mən səni insanlara imam edəcəyəm!”– dedi. *İbrahim*: “Nəslimdən də *imam et*!”– dedi. *Allah*: “Zalımlar Mənim *onlarla*

۞ وَإِذِ ٱبۡتَلَىٰٓ إِبۡرَٰهِـۧمَ رَبُّهُۥ بِكَلِمَٰتٖ فَأَتَمَّهُنَّۖ
قَالَ إِنِّي جَاعِلُكَ لِلنَّاسِ إِمَامٗاۖ قَالَ وَمِن
ذُرِّيَّتِيۖ قَالَ لَا يَنَالُ عَهۡدِي ٱلظَّٰلِمِينَ ١٢٤

əhd *bağlamağıma* nail olmazlar!"– dedi.

125. Biz *müqəddəs* Evi insanlar üçün ziyarət və əmin-amanlıq yeri etdik. "İbrahimin dayandığı yeri namazgah edin!" Biz İbrahimə və İsmailə: "Evimi təvaf edənlər, etikafa girənlər, rüku və səcdə edənlər üçün təmizləyin!"– dedik.

وَإِذْ جَعَلْنَا ٱلْبَيْتَ مَثَابَةً لِّلنَّاسِ وَأَمْنًا وَٱتَّخِذُوا۟
مِن مَّقَامِ إِبْرَٰهِـۧمَ مُصَلًّى ۖ وَعَهِدْنَآ إِلَىٰٓ إِبْرَٰهِـۧمَ
وَإِسْمَـٰعِيلَ أَن طَهِّرَا بَيْتِىَ لِلطَّآئِفِينَ
وَٱلْعَـٰكِفِينَ وَٱلرُّكَّعِ ٱلسُّجُودِ ﴿١٢٥﴾

126. Bir zaman İbrahim dedi: "Ey Rəbbim! Buranı təhlükəsiz bir şəhər et, onun əhalisinə, – onlardan Allaha və Axirət gününə iman gətirənlərə – *hər növ* məhsullardan ruzi ver!" *Allah* dedi: "Mən kafir olanlara bir qədər zövq almağa izin verərəm, sonra da onları Cəhənnəm əzabına giriftar edərəm. Ora necə də pis dönüş yeridir!"

وَإِذْ قَالَ إِبْرَٰهِـۧمُ رَبِّ ٱجْعَلْ هَـٰذَا بَلَدًا ءَامِنًا
وَٱرْزُقْ أَهْلَهُۥ مِنَ ٱلثَّمَرَٰتِ مَنْ ءَامَنَ مِنْهُم بِٱللَّهِ
وَٱلْيَوْمِ ٱلْـَٔاخِرِ ۖ قَالَ وَمَن كَفَرَ فَأُمَتِّعُهُۥ قَلِيلًا
ثُمَّ أَضْطَرُّهُۥٓ إِلَىٰ عَذَابِ ٱلنَّارِ ۖ وَبِئْسَ ٱلْمَصِيرُ ﴿١٢٦﴾

127. O zaman İbrahim və İsmail *müqəddəs* Evin bünövrəsini qaldırarkən *belə dua etdilər*: "Ey Rəbbimiz! *Bunu* bizdən qəbul et! Həqiqətən, Sən Eşidənsən, Bilənsən!

وَإِذْ يَرْفَعُ إِبْرَٰهِـۧمُ ٱلْقَوَاعِدَ مِنَ ٱلْبَيْتِ وَإِسْمَـٰعِيلُ
رَبَّنَا تَقَبَّلْ مِنَّآ ۖ إِنَّكَ أَنتَ ٱلسَّمِيعُ ٱلْعَلِيمُ ﴿١٢٧﴾

128. Ey Rəbbimiz! İkimizi də Sənə təslim olacaq, nəslimizdən də Sənə təslim olan bir ümmət et. Bizə ibadət qaydalarını göstər və bizim tövbələrimizi qəbul et! Həqiqətən, Sən tövbələri qəbul edənsən, Rəhmlisən!

رَبَّنَا وَٱجْعَلْنَا مُسْلِمَيْنِ لَكَ وَمِن ذُرِّيَّتِنَآ
أُمَّةً مُّسْلِمَةً لَّكَ وَأَرِنَا مَنَاسِكَنَا وَتُبْ عَلَيْنَآ ۖ
إِنَّكَ أَنتَ ٱلتَّوَّابُ ٱلرَّحِيمُ ﴿١٢٨﴾

129. Ey Rəbbimiz! Onların içərisindən özlərinə elə bir elçi göndər ki, Sənin ayələrini onlara oxusun, Kitabı və

رَبَّنَا وَٱبْعَثْ فِيهِمْ رَسُولًا مِّنْهُمْ يَتْلُوا۟ عَلَيْهِمْ
ءَايَـٰتِكَ وَيُعَلِّمُهُمُ ٱلْكِتَـٰبَ وَٱلْحِكْمَةَ

hikməti onlara öyrətsin və onları *günahlardan* təmizləsin! Həqiqətən, Sən Qüdrətlisən, Müdriksən!”

وَيُزَكِّيهِمۡۖ إِنَّكَ أَنتَ ٱلۡعَزِيزُ ٱلۡحَكِيمُ ١٢٩

130. Səfeh olanlardan başqa kim İbrahimin dinindən üz çevirər? Biz onu dünyada *elçi* seçdik. Şübhəsiz ki, o, axirətdə də əməlisalehlərdən olacaqdır.

وَمَن يَرۡغَبُ عَن مِّلَّةِ إِبۡرَٰهِـۧمَ إِلَّا مَن سَفِهَ
نَفۡسَهُۥۚ وَلَقَدِ ٱصۡطَفَيۡنَٰهُ فِي ٱلدُّنۡيَاۖ وَإِنَّهُۥ
فِي ٱلۡأٓخِرَةِ لَمِنَ ٱلصَّٰلِحِينَ ١٣٠

131. Rəbbi ona: “Təslim ol!”– dedikdə, o: “Aləmlərin Rəbbinə təslim oldum!”– demişdi.

إِذۡ قَالَ لَهُۥ رَبُّهُۥٓ أَسۡلِمۡۖ قَالَ أَسۡلَمۡتُ لِرَبِّ
ٱلۡعَٰلَمِينَ ١٣١

132. İbrahim də, Yaqub da bunu oğullarına vəsiyyət etdilər: “Ey oğullarım! Həqiqətən, Allah bu dini sizin üçün seçmişdir. Siz də ancaq müsəlman olaraq ölməlisiniz!”

وَوَصَّىٰ بِهَآ إِبۡرَٰهِـۧمُ بَنِيهِ وَيَعۡقُوبُ يَٰبَنِيَّ
إِنَّ ٱللَّهَ ٱصۡطَفَىٰ لَكُمُ ٱلدِّينَ فَلَا تَمُوتُنَّ
إِلَّا وَأَنتُم مُّسۡلِمُونَ ١٣٢

133. Yoxsa siz Yaquba ölüm gəldikdə *onun* yanında idiniz? O zaman o, öz oğullarına dedi: “Məndən sonra nəyə ibadət edəcəksiniz?” Onlar dedilər: “Sənin İlahına, atalarının – İbrahimin, İsmailin və İshaqın İlahı olan Tək İlaha ibadət edəcəyik. Biz yalnız Ona təslim olanlarıq!”

أَمۡ كُنتُمۡ شُهَدَآءَ إِذۡ حَضَرَ يَعۡقُوبَ ٱلۡمَوۡتُ
إِذۡ قَالَ لِبَنِيهِ مَا تَعۡبُدُونَ مِنۢ بَعۡدِيۖ قَالُواْ
نَعۡبُدُ إِلَٰهَكَ وَإِلَٰهَ ءَابَآئِكَ إِبۡرَٰهِـۧمَ
وَإِسۡمَٰعِيلَ وَإِسۡحَٰقَ إِلَٰهٗا وَٰحِدٗا وَنَحۡنُ لَهُۥ
مُسۡلِمُونَ ١٣٣

134. Onlar bir ümmət idi ki, gəlib getdilər. Onların qazandıqları özlərinə, sizin qazandığınız isə sizə aiddir. Siz onların etdikləri barədə sorğu-suala tutulmayacaqsınız.

تِلۡكَ أُمَّةٞ قَدۡ خَلَتۡۖ لَهَا مَا كَسَبَتۡ وَلَكُم
مَّا كَسَبۡتُمۡۖ وَلَا تُسۡـَٔلُونَ عَمَّا كَانُواْ
يَعۡمَلُونَ ١٣٤

135. Onlar dedilər: “Yəhudi və ya xaçpərəst olun ki, doğru yola yönələsiniz!” De: “Əksinə, *biz* hənif İbrahimin dinindəyik. O, müşriklərdən deyildi”.

وَقَالُواْ كُونُواْ هُودًا أَوۡ نَصَٰرَىٰ تَهۡتَدُواْۗ قُلۡ بَلۡ
مِلَّةَ إِبۡرَٰهِـۧمَ حَنِيفٗاۖ وَمَا كَانَ مِنَ ٱلۡمُشۡرِكِينَ ١٣٥

136. Deyin: “Biz Allaha, bizə nazil olana, İbrahimə, İsmailə, İshaqa,

قُولُوٓاْ ءَامَنَّا بِٱللَّهِ وَمَآ أُنزِلَ إِلَيۡنَا وَمَآ أُنزِلَ

Yaquba və onun nəslinə nazil olana, Musa və İsaya verilənlərə, özlərinin Rəbbi tərəfindən peyğəmbərlərə verilənlərə iman gətirdik. Biz onların arasında fərq qoymuruq. Biz yalnız Ona təslim olanlarıq!"

إِلَىٰٓ إِبۡرَٰهِـۧمَ وَإِسۡمَٰعِيلَ وَإِسۡحَٰقَ وَيَعۡقُوبَ
وَٱلۡأَسۡبَاطِ وَمَآ أُوتِيَ مُوسَىٰ وَعِيسَىٰ
وَمَآ أُوتِيَ ٱلنَّبِيُّونَ مِن رَّبِّهِمۡ لَا نُفَرِّقُ
بَيۡنَ أَحَدٖ مِّنۡهُمۡ وَنَحۡنُ لَهُۥ مُسۡلِمُونَ ١٣٦

137. Əgər onlar da siz iman gətirdiyinizə iman gətirsələr, doğru yola yönəlmiş olarlar. Yox, əgər üz döndərsələr, mütləq ixtilafa düşmüş olarlar. Onlardan *qorunmaq üçün* Allah sənə kifayət edər. O, Eşidəndir, Biləndir!

فَإِنۡ ءَامَنُواْ بِمِثۡلِ مَآ ءَامَنتُم بِهِۦ فَقَدِ
ٱهۡتَدَواْۖ وَّإِن تَوَلَّوۡاْ فَإِنَّمَا هُمۡ فِي شِقَاقٖۖ
فَسَيَكۡفِيكَهُمُ ٱللَّهُۚ وَهُوَ ٱلسَّمِيعُ ٱلۡعَلِيمُ ١٣٧

138. *De*: "*Budur* Allahın dini! Kimin dini Allahın dinindən daha doğru ola bilər? Biz yalnız Ona ibadət edənlərik!"

صِبۡغَةَ ٱللَّهِ وَمَنۡ أَحۡسَنُ مِنَ ٱللَّهِ
صِبۡغَةٗۖ وَنَحۡنُ لَهُۥ عَٰبِدُونَ ١٣٨

139. De: "Allah barəsində bizimlə mübahisəmi edirsiniz? Halbuki O, bizim də Rəbbimiz, sizin də Rəbbinizdir! Bizim əməllərimiz bizə, sizin əməlləriniz isə sizə aiddir. Biz Ona sadiq olanlarıq!"

قُلۡ أَتُحَآجُّونَنَا فِي ٱللَّهِ وَهُوَ رَبُّنَا وَرَبُّكُمۡ
وَلَنَآ أَعۡمَٰلُنَا وَلَكُمۡ أَعۡمَٰلُكُمۡ وَنَحۡنُ لَهُۥ
مُخۡلِصُونَ ١٣٩

140. Yoxsa siz İbrahimin, İsmailin, İshaqın, Yaqubun və onun nəslinin yəhudi və yaxud xaçpərəst olduğunu deyirsiniz? De: "Siz daha yaxşı bilirsiniz, yoxsa Allah?" Allahın onlara nazil etdiyi şəhadəti gizlədən kimsələrdən daha zalım kim ola bilər? Allah sizin etdiklərinizdən xəbərsiz deyildir.

أَمۡ تَقُولُونَ إِنَّ إِبۡرَٰهِـۧمَ وَإِسۡمَٰعِيلَ
وَإِسۡحَٰقَ وَيَعۡقُوبَ وَٱلۡأَسۡبَاطَ كَانُواْ
هُودًا أَوۡ نَصَٰرَىٰۗ قُلۡ ءَأَنتُمۡ أَعۡلَمُ أَمِ ٱللَّهُۗ
وَمَنۡ أَظۡلَمُ مِمَّن كَتَمَ شَهَٰدَةً عِندَهُۥ
مِنَ ٱللَّهِۗ وَمَا ٱللَّهُ بِغَٰفِلٍ عَمَّا تَعۡمَلُونَ ١٤٠

141. Onlar bir ümmət idi ki, gəlib getdi. Onların qazandıqları özlərinə, sizin qazandığınız isə sizə aiddir. Siz onların etdikləri barədə sorğu-sual olunmayacaqsınız.

تِلۡكَ أُمَّةٞ قَدۡ خَلَتۡۖ لَهَا مَا كَسَبَتۡ
وَلَكُم مَّا كَسَبۡتُمۡۖ وَلَا تُسۡـَٔلُونَ
عَمَّا كَانُواْ يَعۡمَلُونَ ١٤١

142. Səfeh adamlar deyəcəklər: “Onları üz tutduqları qiblədən döndərən nə oldu?” De: “Məşriq də, məğrib də Allahındır. O, istədiyi kəsi doğru yola yönəldir!”

۞سَيَقُولُ ٱلسُّفَهَآءُ مِنَ ٱلنَّاسِ مَا وَلَّىٰهُمۡ عَن
قِبۡلَتِهِمُ ٱلَّتِي كَانُواْ عَلَيۡهَاۚ قُل لِّلَّهِ ٱلۡمَشۡرِقُ وَٱلۡمَغۡرِبُۚ
يَهۡدِي مَن يَشَآءُ إِلَىٰ صِرَٰطٖ مُّسۡتَقِيمٖ ١٤٢

143. Beləliklə Biz sizi orta bir ümmət etdik ki, siz insanlara şahid olasınız, peyğəmbər də sizə şahid olsun. Biz, əvvəl üz tutduğun qibləni ancaq ona görə təyin etdik ki, peyğəmbərin ardınca gedənləri üz döndərənlərdən fərqləndirək. Bu, Allahın doğru yola yönəltdiyi şəxslərdən başqa *hamısına* ağır gəldi. Allah sizin imanınızı puç etməz. Həqiqətən də, Allah insanlara qarşı Şəfqətlidir, Rəhmlidir.

وَكَذَٰلِكَ جَعَلۡنَٰكُمۡ أُمَّةٗ وَسَطٗا
لِّتَكُونُواْ شُهَدَآءَ عَلَى ٱلنَّاسِ وَيَكُونَ ٱلرَّسُولُ
عَلَيۡكُمۡ شَهِيدٗاۗ وَمَا جَعَلۡنَا ٱلۡقِبۡلَةَ ٱلَّتِي
كُنتَ عَلَيۡهَآ إِلَّا لِنَعۡلَمَ مَن يَتَّبِعُ ٱلرَّسُولَ
مِمَّن يَنقَلِبُ عَلَىٰ عَقِبَيۡهِۚ وَإِن كَانَتۡ
لَكَبِيرَةً إِلَّا عَلَى ٱلَّذِينَ هَدَى ٱللَّهُۗ وَمَا كَانَ
ٱللَّهُ لِيُضِيعَ إِيمَٰنَكُمۡۚ إِنَّ ٱللَّهَ
بِٱلنَّاسِ لَرَءُوفٞ رَّحِيمٞ ١٤٣

144. Biz sənin üzünün göyə tərəf çevrildiyini gördük və Biz səni razı qalacağın qibləyə tərəf döndərəcəyik. Sən üzünü Məscidulharama tərəf çevir! Harada olursunuzsa olun, üzünüzü ona tərəf çevirin! Şübhəsiz ki, Kitab verilənlər bunun öz Rəbbi tərəfindən gerçək olduğunu bilirlər. Allah onların etdiklərindən xəbərsiz deyildir.

قَدۡ نَرَىٰ تَقَلُّبَ وَجۡهِكَ فِي ٱلسَّمَآءِۖ فَلَنُوَلِّيَنَّكَ
قِبۡلَةٗ تَرۡضَىٰهَاۚ فَوَلِّ وَجۡهَكَ شَطۡرَ
ٱلۡمَسۡجِدِ ٱلۡحَرَامِۚ وَحَيۡثُ مَا كُنتُمۡ فَوَلُّواْ
وُجُوهَكُمۡ شَطۡرَهُۥۗ وَإِنَّ ٱلَّذِينَ أُوتُواْ
ٱلۡكِتَٰبَ لَيَعۡلَمُونَ أَنَّهُ ٱلۡحَقُّ مِن رَّبِّهِمۡۗ
وَمَا ٱللَّهُ بِغَٰفِلٍ عَمَّا يَعۡمَلُونَ ١٤٤

145. Kitab verilənlərə hər cür dəlil gətirsən də, onlar sənin qiblənə üz tutmazlar. Sən də onların qibləsinə üz tutan deyilsən. Onlar özləri də

وَلَئِنۡ أَتَيۡتَ ٱلَّذِينَ أُوتُواْ ٱلۡكِتَٰبَ بِكُلِّ
ءَايَةٖ مَّا تَبِعُواْ قِبۡلَتَكَۚ وَمَآ أَنتَ بِتَابِعٖ
قِبۡلَتَهُمۡۚ وَمَا بَعۡضُهُم بِتَابِعٖ قِبۡلَةَ بَعۡضٖۚ

وَلَئِنِ ٱتَّبَعْتَ أَهْوَآءَهُم مِّنۢ بَعْدِ مَا جَآءَكَ
مِنَ ٱلْعِلْمِ إِنَّكَ إِذًا لَّمِنَ ٱلظَّٰلِمِينَ ﴿١٤٥﴾

bir-birlərinin qibləsinə üz tutan deyillər. Əgər sənə gələn elmdən sonra onların istəklərinə uysan, sən də zalımlardan olarsan.

ٱلَّذِينَ ءَاتَيْنَٰهُمُ ٱلْكِتَٰبَ يَعْرِفُونَهُۥ كَمَا
يَعْرِفُونَ أَبْنَآءَهُمْ ۖ وَإِنَّ فَرِيقًا مِّنْهُمْ
لَيَكْتُمُونَ ٱلْحَقَّ وَهُمْ يَعْلَمُونَ ﴿١٤٦﴾

146. Kitab verdiyimiz şəxslər onu (Peyğəmbəri və yaxud Kəbənin qiblə olduğunu) öz oğullarını tanıdıqları kimi tanıyırlar. Həqiqətən də, onlardan bir dəstə haqqı bilə-bilə gizlədir.

ٱلْحَقُّ مِن رَّبِّكَ ۖ فَلَا تَكُونَنَّ مِنَ ٱلْمُمْتَرِينَ ﴿١٤٧﴾

147. Haqq sənin Rəbbindəndir! Odur ki, şübhə edənlərdən olma!

وَلِكُلٍّ وِجْهَةٌ هُوَ مُوَلِّيهَا ۖ فَٱسْتَبِقُوا۟
ٱلْخَيْرَٰتِ ۚ أَيْنَ مَا تَكُونُوا۟ يَأْتِ بِكُمُ ٱللَّهُ جَمِيعًا ۚ
إِنَّ ٱللَّهَ عَلَىٰ كُلِّ شَىْءٍ قَدِيرٌ ﴿١٤٨﴾

148. Hər kəsin üz tutduğu bir qibləsi vardır. Yaxşı işlər görməkdə bir-birinizlə yarışın. Harada olursunuz olun Allah sizin hamınızı *bir yerə* toplayacaqdır. Şübhəsiz ki, Allah hər şeyə qadirdir.

وَمِنْ حَيْثُ خَرَجْتَ فَوَلِّ وَجْهَكَ شَطْرَ
ٱلْمَسْجِدِ ٱلْحَرَامِ ۖ وَإِنَّهُۥ لَلْحَقُّ مِن رَّبِّكَ ۗ
وَمَا ٱللَّهُ بِغَٰفِلٍ عَمَّا تَعْمَلُونَ ﴿١٤٩﴾

149. Hara *səfərə* çıxsan, *namaz qıldıqda* üzünü Məscidulharama tərəf çevir! Çünki bu, sənin Rəbbindən *gələn* haqdır! Allah sizin etdiklərinizdən xəbərsiz deyildir.

وَمِنْ حَيْثُ خَرَجْتَ فَوَلِّ وَجْهَكَ شَطْرَ
ٱلْمَسْجِدِ ٱلْحَرَامِ ۚ وَحَيْثُ مَا كُنتُمْ فَوَلُّوا۟
وُجُوهَكُمْ شَطْرَهُۥ لِئَلَّا يَكُونَ لِلنَّاسِ عَلَيْكُمْ
حُجَّةٌ إِلَّا ٱلَّذِينَ ظَلَمُوا۟ مِنْهُمْ فَلَا تَخْشَوْهُمْ
وَٱخْشَوْنِى وَلِأُتِمَّ نِعْمَتِى عَلَيْكُمْ وَلَعَلَّكُمْ
تَهْتَدُونَ ﴿١٥٠﴾

150. Hara *səfərə* çıxsan, *namaz qıldıqda* üzünü Məscidulharama tərəf çevir! Harada olursunuzsa olun, üzünüzü ona tərəf çevirin ki, zalımlardan başqa heç kəsin sizə qarşı bir dəlili olmasın. Onlardan qorxmayın, Məndən qorxun ki, Mən də sizə olan nemətimi tamamlayım və bəlkə, siz doğru yola yönələsiniz.

كَمَآ أَرْسَلْنَا فِيكُمْ رَسُولًا مِّنكُمْ يَتْلُوا۟ عَلَيْكُمْ

151. Həmçinin öz içərinizdən ayələrimizi sizə oxuyan, sizi *günahlardan*

təmizləyən, Kitabı və hikməti sizə öyrədən, habelə bilmədiklərinizi də sizə öyrədən bir
Elçi göndərdik.

ءَايَٰتِنَا وَيُزَكِّيكُمْ وَيُعَلِّمُكُمُ ٱلْكِتَٰبَ
وَٱلْحِكْمَةَ وَيُعَلِّمُكُم مَّا لَمْ تَكُونُوا۟ تَعْلَمُونَ ١٥١

152. Siz Məni yad edin ki, Mən də sizi yad edim! Mənə şükür edin, Mənə küfr etməyin!

فَٱذْكُرُونِىٓ أَذْكُرْكُمْ وَٱشْكُرُوا۟ لِى
وَلَا تَكْفُرُونِ ١٥٢

153. Ey iman gətirənlər! Səbir etmək və namaz qılmaqla *Allahdan* kömək diləyin. Həqiqətən, Allah səbir edənlərlədir!

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ ٱسْتَعِينُوا۟ بِٱلصَّبْرِ
وَٱلصَّلَوٰةِ ۚ إِنَّ ٱللَّهَ مَعَ ٱلصَّٰبِرِينَ ١٥٣

154. Allah yolunda ölənlərə: “Ölüdürlər!” deməyin. Əksinə, *onlar* diridirlər, lakin siz *bunu* duymursunuz.

وَلَا تَقُولُوا۟ لِمَن يُقْتَلُ فِى سَبِيلِ ٱللَّهِ أَمْوَٰتٌۢ ۚ
بَلْ أَحْيَآءٌ وَلَٰكِن لَّا تَشْعُرُونَ ١٥٤

155. Biz sizi bir az qorxu, bir az aclıq, bir az da mal-dövlət, insan və məhsul itkisi ilə sınayarıq. Səbir edənlərə müjdə ver.

وَلَنَبْلُوَنَّكُم بِشَىْءٍ مِّنَ ٱلْخَوْفِ وَٱلْجُوعِ
وَنَقْصٍ مِّنَ ٱلْأَمْوَٰلِ وَٱلْأَنفُسِ وَٱلثَّمَرَٰتِ ۗ
وَبَشِّرِ ٱلصَّٰبِرِينَ ١٥٥

156. O kəslər ki, onlara bir müsibət üz verdikdə: “Biz, Allaha məxsusuq və Ona da qayıdacağıq!”– deyirlər.

ٱلَّذِينَ إِذَآ أَصَٰبَتْهُم مُّصِيبَةٌ قَالُوٓا۟ إِنَّا لِلَّهِ
وَإِنَّآ إِلَيْهِ رَٰجِعُونَ ١٥٦

157. Onlara öz Rəbbi tərəfindən tariflər və mərhəmət vardır. Məhz onlar doğru yolda olanlardır.

أُو۟لَٰٓئِكَ عَلَيْهِمْ صَلَوَٰتٌ مِّن رَّبِّهِمْ وَرَحْمَةٌ ۖ
وَأُو۟لَٰٓئِكَ هُمُ ٱلْمُهْتَدُونَ ١٥٧

158. Həqiqətən, Səfa və Mərvə Allahın qoyduğu nişanələrdəndir. Kim *müqəddəs* Evi həcc və ya ümrə *niyyəti ilə* ziyarət edərsə, bunları təvaf etməsində ona heç bir günah olmaz. Kim yaxşı bir iş görsə, *bilsin ki*, Allah şükrün əvəzini verəndir, Biləndir.

۞ إِنَّ ٱلصَّفَا وَٱلْمَرْوَةَ مِن شَعَآئِرِ ٱللَّهِ ۖ فَمَنْ
حَجَّ ٱلْبَيْتَ أَوِ ٱعْتَمَرَ فَلَا جُنَاحَ عَلَيْهِ أَن
يَطَّوَّفَ بِهِمَا ۚ وَمَن تَطَوَّعَ خَيْرًا فَإِنَّ ٱللَّهَ
شَاكِرٌ عَلِيمٌ ١٥٨

159. Kitabda insanlara bəyan etdiyimiz açıq-aydın dəlilləri və doğru yol göstərən ayələri nazil etdikdən sonra onları gizli saxlayanlara həm Allah lənət edir, həm də lənət edə bilənlər lənət oxuyurlar!

إِنَّ ٱلَّذِينَ يَكۡتُمُونَ مَآ أَنزَلۡنَا مِنَ ٱلۡبَيِّنَٰتِ
وَٱلۡهُدَىٰ مِنۢ بَعۡدِ مَا بَيَّنَّٰهُ لِلنَّاسِ فِي
ٱلۡكِتَٰبِ أُوْلَٰٓئِكَ يَلۡعَنُهُمُ ٱللَّهُ
وَيَلۡعَنُهُمُ ٱللَّٰعِنُونَ ﴿١٥٩﴾

160. Yalnız tövbə edənlər, *əməllərini* islah edənlər və *haqqı* bəyan edənlər istisnadır. Mən onların tövbəsini qəbul edərəm. Mən tövbələri qəbul edənəm, Rəhmliyəm!

إِلَّا ٱلَّذِينَ تَابُواْ وَأَصۡلَحُواْ وَبَيَّنُواْ فَأُوْلَٰٓئِكَ
أَتُوبُ عَلَيۡهِمۡ وَأَنَا ٱلتَّوَّابُ ٱلرَّحِيمُ ﴿١٦٠﴾

161. Kafir olub kafir kimi də ölənlərə Allahın, mələklərin və bütün insanların lənəti olsun!

إِنَّ ٱلَّذِينَ كَفَرُواْ وَمَاتُواْ وَهُمۡ كُفَّارٌ
أُوْلَٰٓئِكَ عَلَيۡهِمۡ لَعۡنَةُ ٱللَّهِ وَٱلۡمَلَٰٓئِكَةِ وَٱلنَّاسِ
أَجۡمَعِينَ ﴿١٦١﴾

162. Onlar bu lənətin içərisində həmişəlik qalarlar. Onların əzabı yüngülləşdirilməyəcək və onlara möhlət də verilməyəcəkdir.

خَٰلِدِينَ فِيهَا لَا يُخَفَّفُ عَنۡهُمُ ٱلۡعَذَابُ
وَلَا هُمۡ يُنظَرُونَ ﴿١٦٢﴾

163. Sizin məbudunuz Tək olan İlahdır. Ondan başqa məbud yoxdur, Mərhəmətlidir, Rəhmlidir.

وَإِلَٰهُكُمۡ إِلَٰهٞ وَٰحِدٞۖ لَّآ إِلَٰهَ إِلَّا هُوَ ٱلرَّحۡمَٰنُ
ٱلرَّحِيمُ ﴿١٦٣﴾

164. Həqiqətən də, göylərin və yerin yaradılmasında, gecə ilə gündüzün bir-birilə əvəz olunmasında, insanlara fayda verən şeylərlə *yüklənmiş halda* dənizdə üzən gəmilərdə, Allahın göydən endirdiyi, onunla da ölmüş torpağı dirildiyi suda, *Onun* bütün heyvanatı *yer üzünə* yaymasında, küləklərin *istiqamətinin* dəyişdirilməsində və göylə yer

إِنَّ فِي خَلۡقِ ٱلسَّمَٰوَٰتِ وَٱلۡأَرۡضِ وَٱخۡتِلَٰفِ
ٱلَّيۡلِ وَٱلنَّهَارِ وَٱلۡفُلۡكِ ٱلَّتِي تَجۡرِي فِي
ٱلۡبَحۡرِ بِمَا يَنفَعُ ٱلنَّاسَ وَمَآ أَنزَلَ ٱللَّهُ مِنَ
ٱلسَّمَآءِ مِن مَّآءٖ فَأَحۡيَا بِهِ ٱلۡأَرۡضَ بَعۡدَ
مَوۡتِهَا وَبَثَّ فِيهَا مِن كُلِّ دَآبَّةٖ وَتَصۡرِيفِ
ٱلرِّيَٰحِ وَٱلسَّحَابِ ٱلۡمُسَخَّرِ بَيۡنَ ٱلسَّمَآءِ
وَٱلۡأَرۡضِ لَأٓيَٰتٖ لِّقَوۡمٖ يَعۡقِلُونَ ﴿١٦٤﴾

arasında ram edilmiş buludlarda, başa düşən insanlar üçün dəlillər vardır.

165. İnsanlardan elələri də vardır ki, Allahdan qeyrilərini *Ona* tay tutur, onları da Allahı sevdikləri kimi sevirlər. İman gətirənlərin isə Allaha olan sevgisi daha güclüdür. Kaş zülm edənlər əzabı gördükləri zaman bütün qüdrət və qüvvətin Allaha məxsus olduğunu və Allahın şiddətli əzab verdiyini görəydilər.

وَمِنَ ٱلنَّاسِ مَن يَتَّخِذُ مِن دُونِ ٱللَّهِ أَندَادًا
يُحِبُّونَهُمۡ كَحُبِّ ٱللَّهِۖ وَٱلَّذِينَ ءَامَنُوٓاْ أَشَدُّ
حُبًّا لِّلَّهِۗ وَلَوۡ يَرَى ٱلَّذِينَ ظَلَمُوٓاْ إِذۡ
يَرَوۡنَ ٱلۡعَذَابَ أَنَّ ٱلۡقُوَّةَ لِلَّهِ جَمِيعًا
وَأَنَّ ٱللَّهَ شَدِيدُ ٱلۡعَذَابِ ١٦٥

166. O zaman, tabe olunmuş *başçılar* tabe olanlardan uzaqlaşacaq, *hamısı* əzabı görəcək və aralarındakı əlaqələr kəsiləcəkdir.

إِذۡ تَبَرَّأَ ٱلَّذِينَ ٱتُّبِعُواْ مِنَ ٱلَّذِينَ ٱتَّبَعُواْ
وَرَأَوُاْ ٱلۡعَذَابَ وَتَقَطَّعَتۡ بِهِمُ
ٱلۡأَسۡبَابُ ١٦٦

167. Tabe olanlar deyəcəklər: “Əgər bizim üçün *dünyaya* dönüş olsaydı, *indi* onlar bizdən uzaqlaşdıqları kimi biz də onlardan uzaqlaşardıq!” Beləcə, peşman olsunlar deyə Allah onlara özlərinin əməllərini göstərəcək və onlar *heç vaxt Cəhənnəm* odundan çıxa bilməyəcəklər.

وَقَالَ ٱلَّذِينَ ٱتَّبَعُواْ لَوۡ أَنَّ لَنَا كَرَّةً
فَنَتَبَرَّأَ مِنۡهُمۡ كَمَا تَبَرَّءُواْ مِنَّاۗ كَذَٰلِكَ
يُرِيهِمُ ٱللَّهُ أَعۡمَٰلَهُمۡ حَسَرَٰتٍ عَلَيۡهِمۡۖ
وَمَا هُم بِخَٰرِجِينَ مِنَ ٱلنَّارِ ١٦٧

168. Ey insanlar! Yerdə olan halal və təmiz ruzilərdən yeyin, şeytanın addım izləri ilə getməyin! O, sizin açıq-aşkar düşməninizdir.

يَٰٓأَيُّهَا ٱلنَّاسُ كُلُواْ مِمَّا فِي ٱلۡأَرۡضِ حَلَٰلٗا
طَيِّبٗا وَلَا تَتَّبِعُواْ خُطُوَٰتِ ٱلشَّيۡطَٰنِۚ
إِنَّهُۥ لَكُمۡ عَدُوّٞ مُّبِينٌ ١٦٨

169. O sizə pis və iyrənc işlər görməyi və Allaha qarşı bilmədiyiniz şeyləri söyləməyi əmr edir.

إِنَّمَا يَأۡمُرُكُم بِٱلسُّوٓءِ وَٱلۡفَحۡشَآءِ وَأَن
تَقُولُواْ عَلَى ٱللَّهِ مَا لَا تَعۡلَمُونَ ١٦٩

170. Onlara: “Allahın nazil etdiyinə tabe olun!”– deyildikdə, onlar: “Xeyr, biz atalarımızın tutduğu yolu tutacağıq!”– deyirlər. Bəs ataları bir şey anlamayıb doğru yola yönəlməyiblərsə necə?

وَإِذَا قِيلَ لَهُمُ ٱتَّبِعُوا۟ مَآ أَنزَلَ ٱللَّهُ قَالُوا۟ بَلْ
نَتَّبِعُ مَآ أَلْفَيْنَا عَلَيْهِ ءَابَآءَنَآ ۗ أَوَلَوْ كَانَ
ءَابَآؤُهُمْ لَا يَعْقِلُونَ شَيْـًٔا وَلَا يَهْتَدُونَ ١٧٠

171. Kafirlərin məsəli çığırtı və bağırtıdan başqa bir şey anlamayan *heyvanları* haylayan *çobanın* məsəlinə bənzəyir. Onlar kar, lal və kordurlar, *haqqı* anlamazlar.

وَمَثَلُ ٱلَّذِينَ كَفَرُوا۟ كَمَثَلِ ٱلَّذِى يَنْعِقُ
بِمَا لَا يَسْمَعُ إِلَّا دُعَآءً وَنِدَآءً ۚ صُمٌّۢ بُكْمٌ عُمْىٌ
فَهُمْ لَا يَعْقِلُونَ ١٧١

172. Ey iman gətirənlər! Sizə ruzi kimi verdiyimiz pak şeylərdən yeyin və əgər Allaha ibadət edirsinizsə, Ona şükür edin!

يَـٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ كُلُوا۟ مِن طَيِّبَـٰتِ
مَا رَزَقْنَـٰكُمْ وَٱشْكُرُوا۟ لِلَّهِ إِن كُنتُمْ
إِيَّاهُ تَعْبُدُونَ ١٧٢

173. O sizə ölü heyvanı, qanı, donuz ətini və Allahdan başqası üçün kəsiləni haram etmişdir. Hər kəs *harama* meyl etmədən və həddi aşmadan *bunlardan yeməyə* məcbur olarsa, bu ona günah hesab edilməz. Həqiqətən, Allah Bağışlayandır, Rəhmlidir.

إِنَّمَا حَرَّمَ عَلَيْكُمُ ٱلْمَيْتَةَ وَٱلدَّمَ وَلَحْمَ
ٱلْخِنزِيرِ وَمَآ أُهِلَّ بِهِۦ لِغَيْرِ ٱللَّهِ ۖ فَمَنِ ٱضْطُرَّ
غَيْرَ بَاغٍ وَلَا عَادٍ فَلَآ إِثْمَ عَلَيْهِ ۚ إِنَّ ٱللَّهَ
غَفُورٌ رَّحِيمٌ ١٧٣

174. Şübhəsiz ki, Allahın nazil etdiyi kitabda olanları gizli saxlayanlar və bununla cüzi miqdarda *pul* əldə edənlər öz qarınlarına oddan başqa bir şey doldurmurlar. Qiyamət günü Allah onları danışdırmaz və onları təmizə çıxarmaz. Onlar üçün ağrılı-acılı bir əzab vardır.

إِنَّ ٱلَّذِينَ يَكْتُمُونَ مَآ أَنزَلَ ٱللَّهُ مِنَ
ٱلْكِتَـٰبِ وَيَشْتَرُونَ بِهِۦ ثَمَنًا قَلِيلًا ۙ
أُو۟لَـٰٓئِكَ مَا يَأْكُلُونَ فِى بُطُونِهِمْ إِلَّا ٱلنَّارَ
وَلَا يُكَلِّمُهُمُ ٱللَّهُ يَوْمَ ٱلْقِيَـٰمَةِ
وَلَا يُزَكِّيهِمْ وَلَهُمْ عَذَابٌ أَلِيمٌ ١٧٤

175. Onlar doğru yolun əvəzinə azğınlığı, bağışlanmanın isə əvəzinə əzabı satın alan şəxslərdir. Onlar *Cəhənnəm* oduna necə də səbirlidirlər!

أُو۟لَـٰٓئِكَ ٱلَّذِينَ ٱشْتَرَوُا۟ ٱلضَّلَـٰلَةَ
بِٱلْهُدَىٰ وَٱلْعَذَابَ بِٱلْمَغْفِرَةِ ۚ فَمَآ
أَصْبَرَهُمْ عَلَى ٱلنَّارِ ١٧٥

176. Bu ona görədir ki, Allah kitabı haqq olaraq nazil etmişdir. Kitab barəsində ixtilaf edənlər isə, əlbəttə, *haqdan* uzaq bir ziddiyyət içindədirlər.

ذَٰلِكَ بِأَنَّ ٱللَّهَ نَزَّلَ ٱلۡكِتَٰبَ بِٱلۡحَقِّۗ وَإِنَّ ٱلَّذِينَ
ٱخۡتَلَفُواْ فِي ٱلۡكِتَٰبِ لَفِي شِقَاقِۭ بَعِيدٖ ١٧٦

177. Yaxşı əməl üzünüzü məşriqə və məğribə tərəf çevirməyiniz deyildir. Lakin yaxşı əməl *sahibləri* Allaha, Axirət gününə, mələklərə, kitablara, peyğəmbərlərə iman gətirən, sevdiyi malı qohum-əqrəbaya, yetimlərə, kasıblara, müsafirlərə, dilənənlərə və kölələrin azad edilməsinə sərf edən, namaz qılıb zəkat verən, əhd bağladıqda əhdlərini yerinə yetirən, sıxıntı və xəstəlik üz verdikdə, habelə döyüşdə səbir edən şəxslərdir. Onlar imanlarında doğru olanlardır. Müttəqi olanlar da elə məhz onlardır.

۞ لَّيۡسَ ٱلۡبِرَّ أَن تُوَلُّواْ وُجُوهَكُمۡ قِبَلَ
ٱلۡمَشۡرِقِ وَٱلۡمَغۡرِبِ وَلَٰكِنَّ ٱلۡبِرَّ مَنۡ ءَامَنَ
بِٱللَّهِ وَٱلۡيَوۡمِ ٱلۡأٓخِرِ وَٱلۡمَلَٰٓئِكَةِ وَٱلۡكِتَٰبِ
وَٱلنَّبِيِّـۧنَ وَءَاتَى ٱلۡمَالَ عَلَىٰ حُبِّهِۦ ذَوِي ٱلۡقُرۡبَىٰ
وَٱلۡيَتَٰمَىٰ وَٱلۡمَسَٰكِينَ وَٱبۡنَ ٱلسَّبِيلِ وَٱلسَّآئِلِينَ
وَفِي ٱلرِّقَابِ وَأَقَامَ ٱلصَّلَوٰةَ وَءَاتَى ٱلزَّكَوٰةَ
وَٱلۡمُوفُونَ بِعَهۡدِهِمۡ إِذَا عَٰهَدُواْۖ وَٱلصَّٰبِرِينَ
فِي ٱلۡبَأۡسَآءِ وَٱلضَّرَّآءِ وَحِينَ ٱلۡبَأۡسِۗ أُوْلَٰٓئِكَ
ٱلَّذِينَ صَدَقُواْۖ وَأُوْلَٰٓئِكَ هُمُ ٱلۡمُتَّقُونَ ١٧٧

178. Ey iman gətirənlər! Öldürülənlərə görə sizə, azad kəsə görə azad olandan, köləyə görə kölədən, qadına görə qadından qisas almaq vacib edildi. Əgər *qatil*, qardaşı (ölənin varisləri) tərəfindən *qanbahası müqabilində* bir şeylə əfv edilsə, onda insafla davranmalı və *qanbahası* ona müvafiq qaydada ödənilməlidir. Bu, Rəbbiniz tərəfindən bir yüngülləşdirmə və mərhəmətdir. Bundan sonra kim həddi aşsa, onun üçün ağrılı-acılı bir əzab vardır.

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ كُتِبَ عَلَيۡكُمُ ٱلۡقِصَاصُ
فِي ٱلۡقَتۡلَىۖ ٱلۡحُرُّ بِٱلۡحُرِّ وَٱلۡعَبۡدُ بِٱلۡعَبۡدِ وَٱلۡأُنثَىٰ
بِٱلۡأُنثَىٰۚ فَمَنۡ عُفِيَ لَهُۥ مِنۡ أَخِيهِ شَيۡءٞ فَٱتِّبَاعُۢ
بِٱلۡمَعۡرُوفِ وَأَدَآءٌ إِلَيۡهِ بِإِحۡسَٰنٖۗ ذَٰلِكَ تَخۡفِيفٞ
مِّن رَّبِّكُمۡ وَرَحۡمَةٞۗ فَمَنِ ٱعۡتَدَىٰ بَعۡدَ ذَٰلِكَ
فَلَهُۥ عَذَابٌ أَلِيمٞ ١٧٨

179. Qisasda sizin üçün həyat (əmin-amanlıq) vardır, ey ağıl sahibləri! Bəlkə *Allahdan* qorxasınız.

وَلَكُمْ فِي الْقِصَاصِ حَيَوٰةٌ يَٰٓأُولِي الْأَلْبَٰبِ
لَعَلَّكُمْ تَتَّقُونَ ١٧٩

180. Sizlərdən birinə ölüm gəldiyi zaman qoyub gedəcəyi var-dövlətdən müvafiq qaydada valideynlərə və yaxın qohumlara vəsiyyət etməsi ona vacib edilmişdir. *Bu*, müttəqilər üçün bir borcdur.

كُتِبَ عَلَيْكُمْ إِذَا حَضَرَ أَحَدَكُمُ الْمَوْتُ
إِن تَرَكَ خَيْرًا الْوَصِيَّةُ لِلْوَٰلِدَيْنِ وَالْأَقْرَبِينَ
بِالْمَعْرُوفِ حَقًّا عَلَى الْمُتَّقِينَ ١٨٠

181. Kim *ölənin vəsiyyətini* eşitdikdən sonra onu dəyişdirsə, günahı ancaq onu dəyişdirənlərin üzərinə düşər. Şübhəsiz ki, Allah Eşidəndir, Biləndir!

فَمَنۢ بَدَّلَهُۥ بَعْدَمَا سَمِعَهُۥ فَإِنَّمَآ إِثْمُهُۥ عَلَى
الَّذِينَ يُبَدِّلُونَهُۥٓ إِنَّ اللَّهَ سَمِيعٌ عَلِيمٌ ١٨١

182. Kim də vəsiyyət edənin haqsızlıq etməsindən və ya günah işlətməsindən ehtiyat edib *tərəflərin* arasını düzəldərsə, ona heç bir günah olmaz. Şübhəsiz ki, Allah Bağışlayandır, Rəhmlidir!

فَمَنْ خَافَ مِن مُّوصٍ جَنَفًا أَوْ إِثْمًا فَأَصْلَحَ
بَيْنَهُمْ فَلَآ إِثْمَ عَلَيْهِ إِنَّ اللَّهَ غَفُورٌ
رَّحِيمٌ ١٨٢

183. Ey iman gətirənlər! Sizdən əvvəlkilərə vacib edildiyi kimi, sizə də oruc tutmaq vacib edildi ki, bəlkə *pis əməllərdən* çəkinəsiniz.

يَٰٓأَيُّهَا الَّذِينَ ءَامَنُوا كُتِبَ عَلَيْكُمُ
الصِّيَامُ كَمَا كُتِبَ عَلَى الَّذِينَ مِن
قَبْلِكُمْ لَعَلَّكُمْ تَتَّقُونَ ١٨٣

184. Müəyyən sayda olan günləri *oruc tutmalısınız*. Sizlərdən xəstə və ya səfərdə olanlar başqa günlərdə eyni sayda *oruc tutmalıdırlar*. Buna taqəti olmayanlar isə *buraxdığı hər gününün əvəzinə* bir kasıbı yedirtməklə fidyə verməlidirlər. Kim könüllü olaraq yaxşılıq etsə,

أَيَّامًا مَّعْدُودَٰتٍ فَمَن كَانَ مِنكُم
مَّرِيضًا أَوْ عَلَىٰ سَفَرٍ فَعِدَّةٌ مِّنْ أَيَّامٍ أُخَرَ وَعَلَى
الَّذِينَ يُطِيقُونَهُۥ فِدْيَةٌ طَعَامُ مِسْكِينٍ
فَمَن تَطَوَّعَ خَيْرًا فَهُوَ خَيْرٌ لَّهُۥ وَأَن تَصُومُوا
خَيْرٌ لَّكُمْ إِن كُنتُمْ تَعْلَمُونَ ١٨٤

bu onun üçün daha xeyirli olar. Biləsiniz ki, sizə oruc tutmaq daha xeyirlidir.

185. İnsanlara doğru yolu göstərən, bu yolun və *haqqı batildən* ayırd edənin açıq-aydın dəlilləri olan Quran ramazan ayında nazil edilmişdir. Sizlərdən bu aya çatan şəxslər *həmin ayı* oruc tutmalıdırlar. Xəstə və ya səfərdə olanlar isə başqa günlərdə eyni sayda *oruc tutmalıdırlar*. Allah sizin üçün çətinlik deyil, asanlıq istəyir. O, *istəyir ki*, siz müddəti (buraxdığınız günlərin orucunu) tamamlayasınız və sizi doğru yola yönəltdiyinə görə Onu uca tutasınız. Bəlkə şükür edəsiniz.

شَهۡرُ رَمَضَانَ ٱلَّذِيٓ أُنزِلَ فِيهِ ٱلۡقُرۡءَانُ
هُدٗى لِّلنَّاسِ وَبَيِّنَٰتٖ مِّنَ ٱلۡهُدَىٰ وَٱلۡفُرۡقَانِۚ
فَمَن شَهِدَ مِنكُمُ ٱلشَّهۡرَ فَلۡيَصُمۡهُۖ
وَمَن كَانَ مَرِيضًا أَوۡ عَلَىٰ سَفَرٖ فَعِدَّةٞ مِّنۡ
أَيَّامٍ أُخَرَۗ يُرِيدُ ٱللَّهُ بِكُمُ ٱلۡيُسۡرَ وَلَا يُرِيدُ
بِكُمُ ٱلۡعُسۡرَ وَلِتُكۡمِلُواْ ٱلۡعِدَّةَ
وَلِتُكَبِّرُواْ ٱللَّهَ عَلَىٰ مَا هَدَىٰكُمۡ
وَلَعَلَّكُمۡ تَشۡكُرُونَ ١٨٥

186. Qullarım səndən Mənim barəmdə soruşsalar, Mən *onlara* yaxınam, Mənə yalvaranın duasını yalvardığı vaxt qəbul edərəm. Qoy onlar da Mənim çağırışımı qəbul edib Mənə iman gətirsinlər ki, doğru yola yönələ bilsinlər.

وَإِذَا سَأَلَكَ عِبَادِي عَنِّي فَإِنِّي قَرِيبٌۖ أُجِيبُ
دَعۡوَةَ ٱلدَّاعِ إِذَا دَعَانِۖ فَلۡيَسۡتَجِيبُواْ لِي
وَلۡيُؤۡمِنُواْ بِي لَعَلَّهُمۡ يَرۡشُدُونَ ١٨٦

187. Orucluq gecəsi zövcələrinizlə yaxınlıq etmək sizə halal edildi. Onlar sizin üçün bir libas, siz də onlar üçün bir libassınız. Allah bilir ki, siz *orucluq gecələrində zövcələrinizlə yaxınlıq etməklə* özünüzə xəyanət edirsiniz. Elə buna görə də O, tövbənizi qəbul edib sizi bağışladı. Artıq *bu gündən*

أُحِلَّ لَكُمۡ لَيۡلَةَ ٱلصِّيَامِ ٱلرَّفَثُ إِلَىٰ
نِسَآئِكُمۡۚ هُنَّ لِبَاسٞ لَّكُمۡ وَأَنتُمۡ لِبَاسٞ
لَّهُنَّۗ عَلِمَ ٱللَّهُ أَنَّكُمۡ كُنتُمۡ تَخۡتَانُونَ
أَنفُسَكُمۡ فَتَابَ عَلَيۡكُمۡ وَعَفَا عَنكُمۡۖ
فَٱلۡـَٰٔنَ بَٰشِرُوهُنَّ وَٱبۡتَغُواْ مَا كَتَبَ ٱللَّهُ لَكُمۡۚ
وَكُلُواْ وَٱشۡرَبُواْ حَتَّىٰ يَتَبَيَّنَ لَكُمُ ٱلۡخَيۡطُ
ٱلۡأَبۡيَضُ مِنَ ٱلۡخَيۡطِ ٱلۡأَسۡوَدِ مِنَ ٱلۡفَجۡرِۖ

onlara yaxınlaşın və Allahın sizin üçün *əzəldən* müəyyən etdiyinə nail olmağa çalışın. Dan yeri söküləndə ağ sap qara sapdan (şəfəq gecənin qaranlığından) seçilənə qədər yeyin-için. Sonra gecəyədək orucunuzu tamamlayın. Məscidlərdə etikafda olduğunuz zaman onlarla yaxınlıq etməyin. Bunlar Allahın *qoyduğu* hüdudlardır, onlara yaxınlaşmayın! Allah Öz ayələrini insanlara belə bəyan edir ki, bəlkə *Ondan* qorxalar.

ثُمَّ أَتِمُّوا۟ ٱلصِّيَامَ إِلَى ٱلَّيْلِ ۚ وَلَا تُبَـٰشِرُوهُنَّ
وَأَنتُمْ عَـٰكِفُونَ فِى ٱلْمَسَـٰجِدِ ۗ تِلْكَ حُدُودُ ٱللَّهِ
فَلَا تَقْرَبُوهَا ۗ كَذَٰلِكَ يُبَيِّنُ ٱللَّهُ ءَايَـٰتِهِۦ لِلنَّاسِ
لَعَلَّهُمْ يَتَّقُونَ ﴿١٨٧﴾

188. Mallarınızı öz aranızda haqsızlıqla yeməyin və camaatın malının bir qismini bilə-bilə günah yolu ilə yeyəsiniz deyə hakimləri ələ almağa çalışmayın.

وَلَا تَأْكُلُوٓا۟ أَمْوَٰلَكُم بَيْنَكُم بِٱلْبَـٰطِلِ
وَتُدْلُوا۟ بِهَآ إِلَى ٱلْحُكَّامِ لِتَأْكُلُوا۟ فَرِيقًا
مِّنْ أَمْوَٰلِ ٱلنَّاسِ بِٱلْإِثْمِ وَأَنتُمْ تَعْلَمُونَ ﴿١٨٨﴾

189. Səndən yeni doğan aylar barəsində soruşurlar. De: "Bunlar insanlar və həcc üçün vaxt ölçüləridir". Evlərə arxa tərəfindən daxil olmağınız yaxşı əməl deyildir. Lakin yaxşı əməl *sahibi* Allahdan qorxan şəxsdir. Evlərə qapılarından daxil olun! Allahdan qorxun ki, bəlkə nicat tapasınız.

۞ يَسْـَٔلُونَكَ عَنِ ٱلْأَهِلَّةِ ۖ قُلْ هِىَ مَوَٰقِيتُ
لِلنَّاسِ وَٱلْحَجِّ ۗ وَلَيْسَ ٱلْبِرُّ بِأَن تَأْتُوا۟
ٱلْبُيُوتَ مِن ظُهُورِهَا وَلَـٰكِنَّ ٱلْبِرَّ مَنِ
ٱتَّقَىٰ ۗ وَأْتُوا۟ ٱلْبُيُوتَ مِنْ أَبْوَٰبِهَا ۚ
وَٱتَّقُوا۟ ٱللَّهَ لَعَلَّكُمْ تُفْلِحُونَ ﴿١٨٩﴾

190. Sizinlə vuruşanlara qarşı Allah yolunda siz də vuruşun və həddi aşmayın! Həqiqətən, Allah həddi aşanları sevmir.

وَقَـٰتِلُوا۟ فِى سَبِيلِ ٱللَّهِ ٱلَّذِينَ
يُقَـٰتِلُونَكُمْ وَلَا تَعْتَدُوٓا۟ ۚ إِنَّ ٱللَّهَ لَا يُحِبُّ
ٱلْمُعْتَدِينَ ﴿١٩٠﴾

191. *Müşrikləri* harada yaxalasanız öldürün və sizi çıxartdıqları yerdən siz də onları çıxardın! Fitnə qətldən daha pisdir. Onlar sizə qarşı Məscidulharamın yanında vuruşmayınca, siz də onlara qarşı

وَٱقْتُلُوهُمْ حَيْثُ ثَقِفْتُمُوهُمْ وَأَخْرِجُوهُم مِّنْ حَيْثُ
أَخْرَجُوكُمْ ۚ وَٱلْفِتْنَةُ أَشَدُّ مِنَ ٱلْقَتْلِ ۚ وَلَا تُقَـٰتِلُوهُمْ
عِندَ ٱلْمَسْجِدِ ٱلْحَرَامِ حَتَّىٰ يُقَـٰتِلُوكُمْ فِيهِ ۖ فَإِن
قَـٰتَلُوكُمْ فَٱقْتُلُوهُمْ ۗ كَذَٰلِكَ جَزَآءُ ٱلْكَـٰفِرِينَ ﴿١٩١﴾

orada vuruşmayın. Əgər sizinlə vuruşsalar, siz də onları öldürün. Kafirlərin cəzası belədir.

192. Əgər onlar *günah işlərə* son qoysalar, əlbəttə ki, Allah Bağışlayandır, Rəhmlidir!

فَإِنِ ٱنتَهَوْا۟ فَإِنَّ ٱللَّهَ غَفُورٌ رَّحِيمٌ ١٩٢

193. Fitnə aradan qalxana qədər və din ancaq Allaha məxsus edilənədək onlara qarşı vuruşun! Əgər son qoysalar, *bilin ki*, düşmənçilik ancaq zalımlara qarşı olur.

وَقَٰتِلُوهُمْ حَتَّىٰ لَا تَكُونَ فِتْنَةٌ وَيَكُونَ ٱلدِّينُ لِلَّهِ
فَإِنِ ٱنتَهَوْا۟ فَلَا عُدْوَٰنَ إِلَّا عَلَى ٱلظَّٰلِمِينَ ١٩٣

194. Haram ay haram aya görədir. Haram olanları *pozmağın cəzası* qisas almaqdır. Kim sizə qarşı təcavüz etsə, siz də ona qarşı onun təcavüz etdiyi qədər təcavüz edin. Allahdan qorxun və bilin ki, Allah müttəqilərlədir.

ٱلشَّهْرُ ٱلْحَرَامُ بِٱلشَّهْرِ ٱلْحَرَامِ وَٱلْحُرُمَٰتُ قِصَاصٌ فَمَنِ
ٱعْتَدَىٰ عَلَيْكُمْ فَٱعْتَدُوا۟ عَلَيْهِ بِمِثْلِ مَا ٱعْتَدَىٰ
عَلَيْكُمْ وَٱتَّقُوا۟ ٱللَّهَ وَٱعْلَمُوٓا۟ أَنَّ ٱللَّهَ مَعَ ٱلْمُتَّقِينَ ١٩٤

195. *Malınızdan* Allah yolunda xərcləyin və öz əllərinizlə özünüzü təhlükəyə atmayın. Yaxşılıq edin! Həqiqətən, Allah yaxşılıq edənləri sevir.

وَأَنفِقُوا۟ فِى سَبِيلِ ٱللَّهِ وَلَا تُلْقُوا۟ بِأَيْدِيكُمْ إِلَى
ٱلتَّهْلُكَةِ وَأَحْسِنُوٓا۟ إِنَّ ٱللَّهَ يُحِبُّ ٱلْمُحْسِنِينَ ١٩٥

196. Allah üçün həcc və ümrəni tam yerinə yetirin. Əgər sizin qarşınızı kəssələr, müyəssər olan bir qurbanlıq *verin*. Qurbanlıq öz yerinə çatana qədər başınızı qırxmayın. Sizlərdən xəstələnən və ya başındakı *xəstəlikdən* əziyyət çəkən varsa, fidyə olaraq ya oruc tutmalı, ya sədəqə verməli, ya da qurban kəsməlidir. Əmin-amanlıq içində olduğunuz təqdirdə ümrəni *bitirib* həccə qədər *qadağan*

وَأَتِمُّوا۟ ٱلْحَجَّ وَٱلْعُمْرَةَ لِلَّهِ فَإِنْ أُحْصِرْتُمْ فَمَا
ٱسْتَيْسَرَ مِنَ ٱلْهَدْىِ وَلَا تَحْلِقُوا۟ رُءُوسَكُمْ حَتَّىٰ يَبْلُغَ
ٱلْهَدْىُ مَحِلَّهُۥ فَمَن كَانَ مِنكُم مَّرِيضًا أَوْ بِهِۦٓ أَذًى مِّن
رَّأْسِهِۦ فَفِدْيَةٌ مِّن صِيَامٍ أَوْ صَدَقَةٍ أَوْ نُسُكٍ فَإِذَآ
أَمِنتُمْ فَمَن تَمَتَّعَ بِٱلْعُمْرَةِ إِلَى ٱلْحَجِّ فَمَا ٱسْتَيْسَرَ
مِنَ ٱلْهَدْىِ فَمَن لَّمْ يَجِدْ فَصِيَامُ ثَلَٰثَةِ أَيَّامٍ فِى
ٱلْحَجِّ وَسَبْعَةٍ إِذَا رَجَعْتُمْ تِلْكَ عَشَرَةٌ كَامِلَةٌ ذَٰلِكَ
لِمَن لَّمْ يَكُنْ أَهْلُهُۥ حَاضِرِى ٱلْمَسْجِدِ ٱلْحَرَامِ
وَٱتَّقُوا۟ ٱللَّهَ وَٱعْلَمُوٓا۟ أَنَّ ٱللَّهَ شَدِيدُ ٱلْعِقَابِ ١٩٦

*olunanlardan* istifadə edən kəs asan başa gələn bir qurbanlıq verməlidir. Q*urbanlıq* tapmayanlar isə həcc əsnasında üç gün və *vətəninə* qayıtdıqda isə yeddi gün oruc tutmalıdır. Bu da tam on gün edir. Bu, ailəsi Məscidulharamda yaşamayanlara aiddir. Allahdan qorxun və bilin ki, Allah şiddətli cəza verəndir.

197. Həcc *ziyarəti* məlum olan aylardadır. Bu aylarda həcci yerinə yetirməyi niyyət edən kəs həcc *ziyarəti* əsnasında *qadınıyla* yaxınlıq etməməli, günah işlər görməməli və mübahisələrə qoşulmamalıdır. Sizin etdiyiniz yaxşılıqları Allah bilir. *Özünüzlə* azuqə götürün! Ən yaxşı azuqə isə təqvadır. Məndən qorxun, ey ağıl sahibləri!

ٱلْحَجُّ أَشْهُرٌ مَّعْلُومَٰتٌ فَمَن فَرَضَ
فِيهِنَّ ٱلْحَجَّ فَلَا رَفَثَ وَلَا فُسُوقَ
وَلَا جِدَالَ فِى ٱلْحَجِّ وَمَا تَفْعَلُوا۟ مِنْ
خَيْرٍ يَعْلَمْهُ ٱللَّهُ وَتَزَوَّدُوا۟ فَإِنَّ خَيْرَ
ٱلزَّادِ ٱلتَّقْوَىٰ وَٱتَّقُونِ يَٰٓأُو۟لِى ٱلْأَلْبَٰبِ ١٩٧

198. Rəbbinizdən lütf diləmək (həcc vaxtı ticarət etmək) sizə günah deyildir. Ərəfatdan axışıb gəldikdə Məşərulharamda Allahı yada salın! Sizi doğru yola yönəltdiyinə görə Onu yad edin. Hərçənd ki, bundan əvvəl siz azmışlardan idiniz.

لَيْسَ عَلَيْكُمْ جُنَاحٌ أَن تَبْتَغُوا۟
فَضْلًا مِّن رَّبِّكُمْ فَإِذَآ أَفَضْتُم مِّنْ
عَرَفَٰتٍ فَٱذْكُرُوا۟ ٱللَّهَ عِندَ ٱلْمَشْعَرِ
ٱلْحَرَامِ وَٱذْكُرُوهُ كَمَا هَدَىٰكُمْ
وَإِن كُنتُم مِّن قَبْلِهِۦ لَمِنَ ٱلضَّآلِّينَ ١٩٨

199. Sonra insanların axışıb gəldiyi yerdən siz də gəlin. Allahdan bağışlanmanızı diləyin. Şübhəsiz ki, Allah Bağışlayandır, Rəhmlidir.

ثُمَّ أَفِيضُوا۟ مِنْ حَيْثُ أَفَاضَ ٱلنَّاسُ
وَٱسْتَغْفِرُوا۟ ٱللَّهَ إِنَّ ٱللَّهَ غَفُورٌ
رَّحِيمٌ ١٩٩

**200.** *Həcc* mərasiminizi bitirdikdə *vaxtilə* atalarınızı yad etdiyiniz kimi, hətta bundan da artıq Allahı yad edin! İnsanlar arasında: "Ey Rəbbimiz! Bizə *verəcəyini* elə bu dünyada ver!"– deyənlər vardır. Belə şəxslərin axirətdə heç bir payı yoxdur.

فَإِذَا قَضَيْتُم مَّنَاسِكَكُمْ فَاذْكُرُوا اللَّهَ
كَذِكْرِكُمْ آبَاءَكُمْ أَوْ أَشَدَّ ذِكْرًا
فَمِنَ النَّاسِ مَن يَقُولُ رَبَّنَا آتِنَا فِي
الدُّنْيَا وَمَا لَهُ فِي الْآخِرَةِ مِنْ خَلَاقٍ ٢٠٠

**201.** Onlardan: "Ey Rəbbimiz! Bizə həm *bu* dünyada, həm də axirətdə gözəl nemətlər ver və bizi Od əzabından qoru!"– deyənləri də vardır.

وَمِنْهُم مَّن يَقُولُ رَبَّنَا آتِنَا فِي
الدُّنْيَا حَسَنَةً وَفِي الْآخِرَةِ حَسَنَةً
وَقِنَا عَذَابَ النَّارِ ٢٠١

**202.** Belələri üçün qazandıqları *əməllərə* görə bir pay vardır. Allah tez haqq-hesab çəkəndir.

أُولَٰئِكَ لَهُمْ نَصِيبٌ مِّمَّا كَسَبُوا
وَاللَّهُ سَرِيعُ الْحِسَابِ ٢٠٢

**203.** Sayı müəyyən olan günlərdə (zil-Hiccənin 11-i, 12-si və 13-ü) Allahı yad edin. Kim iki gün ərzində *ziyarətini tamamlayıb* geri qayıtsa, ona heç bir günah olmaz. Kim (13-cü gün Minada) yubanarsa, ona da heç bir günah olmaz. *Bu*, Allahdan qorxanlara aiddir. Allahdan qorxun və bilin ki, Onun hüzuruna toplanılacaqsınız.

۞ وَاذْكُرُوا اللَّهَ فِي أَيَّامٍ مَّعْدُودَاتٍ فَمَن
تَعَجَّلَ فِي يَوْمَيْنِ فَلَا إِثْمَ عَلَيْهِ وَمَن
تَأَخَّرَ فَلَا إِثْمَ عَلَيْهِ لِمَنِ اتَّقَىٰ وَاتَّقُوا
اللَّهَ وَاعْلَمُوا أَنَّكُمْ إِلَيْهِ تُحْشَرُونَ ٢٠٣

**204.** İnsanların eləsi də var ki, onun bu dünya həyatında danışdığı sözlər səni heyran edər. O, qəlbində olana Allahı şahid göstərər. Əslində o, ən qatı mübahisəçidir.

وَمِنَ النَّاسِ مَن يُعْجِبُكَ قَوْلُهُ فِي
الْحَيَاةِ الدُّنْيَا وَيُشْهِدُ اللَّهَ عَلَىٰ مَا فِي
قَلْبِهِ وَهُوَ أَلَدُّ الْخِصَامِ ٢٠٤

**205.** O, dönüb getdikdə yer üzündə fitnə-fəsad törətməyə, əkinləri və nəsilləri məhv etməyə çalışar. Allah isə fitnə-fəsadı sevmir.

وَإِذَا تَوَلَّىٰ سَعَىٰ فِي الْأَرْضِ لِيُفْسِدَ فِيهَا
وَيُهْلِكَ الْحَرْثَ وَالنَّسْلَ وَاللَّهُ لَا يُحِبُّ
الْفَسَادَ ٢٠٥

**206.** Ona: “Allahdan qorx!”– deyildikdə, lovğalıq onu daha da günaha sürükləyər. Ona Cəhənnəm kifayət edər. Ora nə pis yataqdır!

وَإِذَا قِيلَ لَهُ اتَّقِ اللَّهَ أَخَذَتْهُ الْعِزَّةُ بِالْإِثْمِ فَحَسْبُهُ جَهَنَّمُ وَلَبِئْسَ الْمِهَادُ ﴿٢٠٦﴾

**207.** İnsanların eləsi də var ki, Allahın razılığını qazanmaq üçün canını da verər. Allah Öz qullarına qarşı Şəfqətlidir.

وَمِنَ النَّاسِ مَن يَشْرِي نَفْسَهُ ابْتِغَاءَ مَرْضَاتِ اللَّهِ وَاللَّهُ رَءُوفٌ بِالْعِبَادِ ﴿٢٠٧﴾

**208.** Ey iman gətirənlər! İslamı bütövlüklə qəbul edin və şeytanın addım izləri ilə getməyin. Şübhəsiz ki, o sizə açıq-aydın düşməndir.

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا ادْخُلُوا فِي السِّلْمِ كَافَّةً وَلَا تَتَّبِعُوا خُطُوَاتِ الشَّيْطَانِ إِنَّهُ لَكُمْ عَدُوٌّ مُّبِينٌ ﴿٢٠٨﴾

**209.** Sizə açıq-aydın dəlillər gəldikdən sonra *haqq yoldan* çıxsanız, bilin ki, Allah Qüdrətlidir, Müdrikdir.

فَإِن زَلَلْتُم مِّن بَعْدِ مَا جَاءَتْكُمُ الْبَيِّنَاتُ فَاعْلَمُوا أَنَّ اللَّهَ عَزِيزٌ حَكِيمٌ ﴿٢٠٩﴾

**210.** Yoxsa onlar ancaq onu gözləyirlər ki, Allah bulud kölgəsində mələklərlə birlikdə gəlsin və iş bitmiş olsun? *Bütün* işlər Allaha qaytarılacaqdır.

هَلْ يَنظُرُونَ إِلَّا أَن يَأْتِيَهُمُ اللَّهُ فِي ظُلَلٍ مِّنَ الْغَمَامِ وَالْمَلَائِكَةُ وَقُضِيَ الْأَمْرُ وَإِلَى اللَّهِ تُرْجَعُ الْأُمُورُ ﴿٢١٠﴾

**211.** İsrail oğullarından soruş ki, Biz onlara nə qədər aydın dəlillər göndərdik. Allahın nemətini əldə etdikdən sonra onu dəyişdirənlərə Allah şiddətli cəza verəcəkdir.

سَلْ بَنِي إِسْرَائِيلَ كَمْ آتَيْنَاهُم مِّنْ آيَةٍ بَيِّنَةٍ وَمَن يُبَدِّلْ نِعْمَةَ اللَّهِ مِن بَعْدِ مَا جَاءَتْهُ فَإِنَّ اللَّهَ شَدِيدُ الْعِقَابِ ﴿٢١١﴾

**212.** Dünya həyatı kafirlər üçün gözəlləşdirildi. Onlar iman gətirənləri məsxərəyə qoyurdular. Halbuki müttəqilər qiyamət günü

زُيِّنَ لِلَّذِينَ كَفَرُوا الْحَيَاةُ الدُّنْيَا وَيَسْخَرُونَ مِنَ الَّذِينَ آمَنُوا وَالَّذِينَ اتَّقَوْا فَوْقَهُمْ يَوْمَ الْقِيَامَةِ وَاللَّهُ يَرْزُقُ مَن يَشَاءُ بِغَيْرِ حِسَابٍ ﴿٢١٢﴾

onlardan üstün olacaqlar. Allah istədiyi kəsə hesabsız ruzi verər.

213. İnsanlar tək bir ümmət idi. Allah *onlara* müjdə verən və qorxudan peyğəmbərlər göndərdi, onlarla birlikdə haqq olan kitab nazil etdi ki, insanlar arasında onların ixtilafa düşdükləri şeylərə dair hökm versin. Halbuki *kitab* verilmiş şəxslər özlərinə açıq-aydın dəlillər gəldikdən sonra aralarındakı paxıllıq üzündən ixtilafa düşdülər. Allah isə Öz icazəsi ilə iman gətirənləri ixtilafda olduqları *məsələlərdə* haqqa yönəltdi. Allah istədiyini düz yola yönəldər.

كَانَ ٱلنَّاسُ أُمَّةً وَٰحِدَةً فَبَعَثَ ٱللَّهُ
ٱلنَّبِيِّـۧنَ مُبَشِّرِينَ وَمُنذِرِينَ وَأَنزَلَ مَعَهُمُ
ٱلْكِتَٰبَ بِٱلْحَقِّ لِيَحْكُمَ بَيْنَ ٱلنَّاسِ فِيمَا
ٱخْتَلَفُوا۟ فِيهِ ۚ وَمَا ٱخْتَلَفَ فِيهِ إِلَّا ٱلَّذِينَ
أُوتُوهُ مِنۢ بَعْدِ مَا جَآءَتْهُمُ ٱلْبَيِّنَٰتُ بَغْيًۢا
بَيْنَهُمْ ۖ فَهَدَى ٱللَّهُ ٱلَّذِينَ ءَامَنُوا۟ لِمَا
ٱخْتَلَفُوا۟ فِيهِ مِنَ ٱلْحَقِّ بِإِذْنِهِۦ ۗ وَٱللَّهُ
يَهْدِى مَن يَشَآءُ إِلَىٰ صِرَٰطٍ مُّسْتَقِيمٍ ٢١٣

214. Yoxsa siz elə güman edirdiniz ki, sizdən əvvəlkilərin başına gələnlər sizin başınıza gəlmədən Cənnətə daxil olacaqsınız? Onlara elə kasıblıq və xəstəlik üz vermiş, elə sarsılmışdılar ki, hətta Peyğəmbər və onunla birlikdə olan möminlər də: "Allahın köməyi nə vaxt *gələcək*?"– dedilər. Həqiqətən, Allahın köməyi yaxındır.

أَمْ حَسِبْتُمْ أَن تَدْخُلُوا۟ ٱلْجَنَّةَ وَلَمَّا يَأْتِكُم مَّثَلُ
ٱلَّذِينَ خَلَوْا۟ مِن قَبْلِكُم ۖ مَّسَّتْهُمُ ٱلْبَأْسَآءُ وَٱلضَّرَّآءُ
وَزُلْزِلُوا۟ حَتَّىٰ يَقُولَ ٱلرَّسُولُ وَٱلَّذِينَ ءَامَنُوا۟
مَعَهُۥ مَتَىٰ نَصْرُ ٱللَّهِ ۗ أَلَآ إِنَّ نَصْرَ ٱللَّهِ قَرِيبٌ ٢١٤

215. Səndən *Allah yolunda* nə verəcəklərini soruşurlar. De: "Verəcəyiniz hər bir xeyir valideynlərə, qohum-əqrəbaya, yetimlərə, kasıblara və müsafirlərə aiddir. Siz nə yaxşılıq edirsinizsə, şübhəsiz ki, Allah onu bilir".

يَسْـَٔلُونَكَ مَاذَا يُنفِقُونَ ۖ قُلْ مَآ أَنفَقْتُم
مِّنْ خَيْرٍ فَلِلْوَٰلِدَيْنِ وَٱلْأَقْرَبِينَ وَٱلْيَتَٰمَىٰ
وَٱلْمَسَٰكِينِ وَٱبْنِ ٱلسَّبِيلِ ۗ وَمَا تَفْعَلُوا۟ مِنْ
خَيْرٍ فَإِنَّ ٱللَّهَ بِهِۦ عَلِيمٌ ٢١٥

216. Sizin xoşunuza gəlməsə də, cihad sizə vacib edildi. Ola bilsin ki, sevmədiyiniz bir şey sizin üçün xeyirli, sevdiyiniz bir şey isə sizin üçün zərərli olsun. Allah bilir, siz isə *bunu* bilmirsiniz.

كُتِبَ عَلَيْكُمُ الْقِتَالُ وَهُوَ كُرْهٌ لَّكُمْ
وَعَسَىٰ أَن تَكْرَهُوا شَيْئًا وَهُوَ خَيْرٌ لَّكُمْ
وَعَسَىٰ أَن تُحِبُّوا شَيْئًا وَهُوَ شَرٌّ لَّكُمْ
وَاللَّهُ يَعْلَمُ وَأَنتُمْ لَا تَعْلَمُونَ ٢١٦

217. Səndən haram ayında vuruşmaq barəsində soruşurlar. De: “Bu ayda vuruşmaq böyük günahdır. Lakin *insanları* Allah yolundan sapdırmaq, Onu inkar etmək, *müsəlmanları* Məscidulharama buraxmamaq və onun sakinlərini oradan çıxartmaq Allah yanında daha böyük günahdır. Fitnə isə qətldən də böyük günahdır”. *Kafirlər* bacarsalar, sizi dininizdən döndərənə qədər sizinlə vuruşmaqdan əl çəkməyəcəklər. Sizlərdən hər kim dinindən dönüb kafir olaraq ölsə, onun əməlləri dünyada və axirətdə puça çıxar. Onlar Od sakinləridirlər və orada əbədi qalacaqlar.

يَسْأَلُونَكَ عَنِ الشَّهْرِ الْحَرَامِ قِتَالٍ فِيهِ ۖ قُلْ قِتَالٌ
فِيهِ كَبِيرٌ ۖ وَصَدٌّ عَن سَبِيلِ اللَّهِ وَكُفْرٌ
بِهِ وَالْمَسْجِدِ الْحَرَامِ وَإِخْرَاجُ أَهْلِهِ مِنْهُ
أَكْبَرُ عِندَ اللَّهِ ۚ وَالْفِتْنَةُ أَكْبَرُ مِنَ الْقَتْلِ ۗ
وَلَا يَزَالُونَ يُقَاتِلُونَكُمْ حَتَّىٰ يَرُدُّوكُمْ عَن
دِينِكُمْ إِنِ اسْتَطَاعُوا ۚ وَمَن يَرْتَدِدْ مِنكُمْ عَن
دِينِهِ فَيَمُتْ وَهُوَ كَافِرٌ فَأُولَٰئِكَ حَبِطَتْ
أَعْمَالُهُمْ فِي الدُّنْيَا وَالْآخِرَةِ ۖ وَأُولَٰئِكَ
أَصْحَابُ النَّارِ ۖ هُمْ فِيهَا خَالِدُونَ ٢١٧

218. Həqiqətən də, iman gətirənlər, hicrət edənlər və Allah yolunda cihad edənlər, Allahın mərhəmətinə ümid edirlər. Allah Bağışlayandır, Rəhmlidir.

إِنَّ الَّذِينَ آمَنُوا وَالَّذِينَ هَاجَرُوا
وَجَاهَدُوا فِي سَبِيلِ اللَّهِ أُولَٰئِكَ يَرْجُونَ
رَحْمَتَ اللَّهِ ۚ وَاللَّهُ غَفُورٌ رَّحِيمٌ ٢١٨

219. Səndən sərxoşedici *içki* və qumar barəsində soruşurlar. De: “İkisində də həm böyük günah, həm də insanlar üçün mənfəət vardır. Amma günahları mənfəətlərindən daha böyükdür”. Səndən *Allah yolunda* nə xərcləyəcəklərini soruşurlar. De:

۞ يَسْأَلُونَكَ عَنِ الْخَمْرِ وَالْمَيْسِرِ ۖ قُلْ فِيهِمَا
إِثْمٌ كَبِيرٌ وَمَنَافِعُ لِلنَّاسِ وَإِثْمُهُمَا
أَكْبَرُ مِن نَّفْعِهِمَا ۗ وَيَسْأَلُونَكَ مَاذَا
يُنفِقُونَ قُلِ الْعَفْوَ ۗ كَذَٰلِكَ يُبَيِّنُ اللَّهُ لَكُمُ
الْآيَاتِ لَعَلَّكُمْ تَتَفَكَّرُونَ ٢١٩

"*Ehtiyacınızdan* artıq qalanını!" Allah ayələri sizə belə bəyan edir ki, bəlkə fikirləşəsiniz –

220. dünya və axirət barəsində. Səndən yetimlər haqqında soruşurlar. De: "Onlara yaxşılıq etmək xeyirlidir. Əgər onları *öz işinizə* qatırsınızsa, *bilin ki*, onlar sizin qardaşlarınızdır". Allah fəsad törədəni yaxşılıq edəndən ayırd edir. Əgər Allah istəsəydi, əlbəttə, sizi çətin vəziyyətə salardı. Şübhəsiz ki, Allah Qüdrətlidir, Müdrikdir.

فِي ٱلدُّنۡيَا وَٱلۡأٓخِرَةِۗ وَيَسۡـَٔلُونَكَ عَنِ ٱلۡيَتَٰمَىٰۖ
قُلۡ إِصۡلَاحٞ لَّهُمۡ خَيۡرٞۖ وَإِن تُخَالِطُوهُمۡ
فَإِخۡوَٰنُكُمۡۚ وَٱللَّهُ يَعۡلَمُ ٱلۡمُفۡسِدَ مِنَ
ٱلۡمُصۡلِحِۚ وَلَوۡ شَآءَ ٱللَّهُ لَأَعۡنَتَكُمۡۚ
إِنَّ ٱللَّهَ عَزِيزٌ حَكِيمٞ ﴿٢٢٠﴾

221. Müşrik qadınlar iman gətirməyincə onlarla evlənməyin. Əlbəttə, iman gətirmiş bir kəniz, sizi heyran edən müşrik bir qadından daha xeyirlidir. Müşrik kişilər iman gətirməyincə *mömin qadınları* onlara ərə verməyin. Əlbəttə, iman gətirmiş bir kölə, sizi heyran edən müşrik bir kişidən daha xeyirlidir. Onlar Oda çağırırlar. Allah isə Öz izni ilə Cənnətə və bağışlanmağa dəvət edir. O, Öz ayələrini insanlara bəyan edir ki, bəlkə, düşünüb ibrət alsınlar.

وَلَا تَنكِحُواْ ٱلۡمُشۡرِكَٰتِ حَتَّىٰ يُؤۡمِنَّۚ وَلَأَمَةٞ
مُّؤۡمِنَةٌ خَيۡرٞ مِّن مُّشۡرِكَةٖ وَلَوۡ أَعۡجَبَتۡكُمۡۗ
وَلَا تُنكِحُواْ ٱلۡمُشۡرِكِينَ حَتَّىٰ يُؤۡمِنُواْۚ وَلَعَبۡدٞ مُّؤۡمِنٌ
خَيۡرٞ مِّن مُّشۡرِكٖ وَلَوۡ أَعۡجَبَكُمۡۗ أُوْلَٰٓئِكَ
يَدۡعُونَ إِلَى ٱلنَّارِۖ وَٱللَّهُ يَدۡعُوٓاْ إِلَى ٱلۡجَنَّةِ
وَٱلۡمَغۡفِرَةِ بِإِذۡنِهِۦۖ وَيُبَيِّنُ ءَايَٰتِهِۦ لِلنَّاسِ
لَعَلَّهُمۡ يَتَذَكَّرُونَ ﴿٢٢١﴾

222. Səndən heyz barəsində soruşurlar. De: "Bu, əziyyətverici bir haldır. Heyz vaxtı qadınlarla *yaxınlıq etməkdən* uzaq olun və pak olmayınca onlarla yaxınlıq etməyin. Onlar təmizləndikdən sonra isə Allahın sizə buyurduğu yerdən

وَيَسۡـَٔلُونَكَ عَنِ ٱلۡمَحِيضِۖ قُلۡ هُوَ أَذٗى فَٱعۡتَزِلُواْ
ٱلنِّسَآءَ فِي ٱلۡمَحِيضِ وَلَا تَقۡرَبُوهُنَّ حَتَّىٰ
يَطۡهُرۡنَۖ فَإِذَا تَطَهَّرۡنَ فَأۡتُوهُنَّ مِنۡ حَيۡثُ أَمَرَكُمُ
ٱللَّهُۚ إِنَّ ٱللَّهَ يُحِبُّ ٱلتَّوَّٰبِينَ وَيُحِبُّ ٱلۡمُتَطَهِّرِينَ ﴿٢٢٢﴾

onlara yaxınlaşın". Şübhəsiz ki, Allah tövbə edənləri də sevir, pak olanları da.

223. Qadınlarınız sizin tarlanızdır. Tarlanıza nə təhər istəyirsinizsə, yaxınlaşın. Özünüz üçün qabaqcadan *yaxşı işlər* hazırlayın. Allahdan qorxun və bilin ki, siz Onunla qarşılaşacaqsınız. Möminləri müjdələ.

نِسَآؤُكُمۡ حَرۡثٞ لَّكُمۡ فَأۡتُواْ حَرۡثَكُمۡ أَنَّىٰ
شِئۡتُمۡۖ وَقَدِّمُواْ لِأَنفُسِكُمۡۚ وَٱتَّقُواْ ٱللَّهَ
وَٱعۡلَمُوٓاْ أَنَّكُم مُّلَٰقُوهُۗ وَبَشِّرِ ٱلۡمُؤۡمِنِينَ ٢٢٣

224. Andlarınıza görə Allahın adını, yaxşılıq etmənizə, Allahdan qorxmanıza və insanlar arasında sülh yaratmanıza dair bir manеəyə çevirməyin. Allah Eşidəndir, Biləndir!

وَلَا تَجۡعَلُواْ ٱللَّهَ عُرۡضَةٗ لِّأَيۡمَٰنِكُمۡ أَن تَبَرُّواْ
وَتَتَّقُواْ وَتُصۡلِحُواْ بَيۡنَ ٱلنَّاسِۚ
وَٱللَّهُ سَمِيعٌ عَلِيمٞ ٢٢٤

225. Allah sizi qərəzsiz içdiyiniz andlara görə cəzalandırmaz, lakin O, sizi qəlbinizin qərəzinə – *qəsdən içdiyiniz andlara* görə cəzalandıracaqdır. Allah Bağışlayandır, Həlimdir.

لَّا يُؤَاخِذُكُمُ ٱللَّهُ بِٱللَّغۡوِ فِيٓ أَيۡمَٰنِكُمۡ وَلَٰكِن يُؤَاخِذُكُم
بِمَا كَسَبَتۡ قُلُوبُكُمۡۗ وَٱللَّهُ غَفُورٌ حَلِيمٞ ٢٢٥

226. Qadınları ilə yaxınlıq etməməyi and içənlər üçün gözləmə müddəti dörd aydır. Əgər onlar *fikirlərindən* dönsələr, əlbəttə ki, Allah Bağışlayandır, Rəhmlidir.

لِّلَّذِينَ يُؤۡلُونَ مِن نِّسَآئِهِمۡ تَرَبُّصُ أَرۡبَعَةِ
أَشۡهُرٖۖ فَإِن فَآءُو فَإِنَّ ٱللَّهَ غَفُورٞ رَّحِيمٞ ٢٢٦

227. Əgər onlar boşanmaq qərarına gəlsələr, şübhəsiz ki, Allah Eşidəndir, Biləndir!

وَإِنۡ عَزَمُواْ ٱلطَّلَٰقَ فَإِنَّ ٱللَّهَ سَمِيعٌ عَلِيمٞ ٢٢٧

228. Boşanmış qadınlar üç heyz müddəti gözləməlidirlər. Əgər Allaha və Axirət gününə iman gətirirlərsə,

وَٱلۡمُطَلَّقَٰتُ يَتَرَبَّصۡنَ بِأَنفُسِهِنَّ ثَلَٰثَةَ قُرُوٓءٖۚ
وَلَا يَحِلُّ لَهُنَّ أَن يَكۡتُمۡنَ مَا خَلَقَ ٱللَّهُ فِيٓ

Allahın onların bətnində yaratdığını gizlətmək onlara halal olmaz. Əgər bu *müddət ərzində* onların ərləri barışmaq istəsələr, onları qaytarmağa daha çox haqlıdırlar. *Kişilərin* qadınlar üzərində *şəriətə* müvafiq haqları olduğu kimi onların da *kişilər üzərində* haqları vardır. Kişilərin onlar üzərində olan haqları isə bir dərəcə üstündür. Allah Qüdrətlidir, Müdrikdir.

أَرْحَامِهِنَّ إِن كُنَّ يُؤْمِنَّ بِاللَّهِ وَالْيَوْمِ الْآخِرِ ۚ
وَبُعُولَتُهُنَّ أَحَقُّ بِرَدِّهِنَّ فِي ذَٰلِكَ إِنْ أَرَادُوا
إِصْلَاحًا ۚ وَلَهُنَّ مِثْلُ الَّذِي عَلَيْهِنَّ بِالْمَعْرُوفِ ۚ
وَلِلرِّجَالِ عَلَيْهِنَّ دَرَجَةٌ ۗ وَاللَّهُ عَزِيزٌ حَكِيمٌ ﴿٢٢٨﴾

229. Boşanma iki dəfə *olar*. Bundan sonra *qadını şəriətə* müvafiq qayda üzrə saxlamaq, yaxud xoşluqla buraxmaq gərəkdir. Onlara verdiklərinizdən bir şey götürmək sizə halal olmaz. Yalnız hər ikisinin Allahın hədlərini yerinə yetirməyəcəklərindən qorxması istisnadır. Əgər siz onların Allahın hədlərini yerinə yetirməyəcəklərindən qorxsanız, qadının *boşanmaq üçün* bir şey əvəz verməsində ikisinə də heç bir günah yoxdur. Bunlar Allahın hüdudlarıdır, onları aşmayın! Allahın hüdudlarını aşanlar – məhz onlar zalımlardır.

الطَّلَاقُ مَرَّتَانِ ۖ فَإِمْسَاكٌ بِمَعْرُوفٍ أَوْ تَسْرِيحٌ
بِإِحْسَانٍ ۗ وَلَا يَحِلُّ لَكُمْ أَن تَأْخُذُوا مِمَّا
آتَيْتُمُوهُنَّ شَيْئًا إِلَّا أَن يَخَافَا أَلَّا يُقِيمَا
حُدُودَ اللَّهِ ۖ فَإِنْ خِفْتُمْ أَلَّا يُقِيمَا حُدُودَ اللَّهِ
فَلَا جُنَاحَ عَلَيْهِمَا فِيمَا افْتَدَتْ بِهِ ۗ تِلْكَ حُدُودُ
اللَّهِ فَلَا تَعْتَدُوهَا ۚ وَمَن يَتَعَدَّ حُدُودَ اللَّهِ فَأُولَٰئِكَ
هُمُ الظَّالِمُونَ ﴿٢٢٩﴾

230. Əgər onu *üçüncü dəfə* boşayarsa, bundan sonra o *qadın* başqa bir kişiyə ərə getməyincə *əvvəlki ərinə qayıtmaq* halal olmaz. Əgər *sonrakı əri* onu boşasa, Allahın hədlərini yerinə yetirəcəklərini güman etdikləri təqdirdə *yenidən*

فَإِن طَلَّقَهَا فَلَا تَحِلُّ لَهُ مِن بَعْدُ حَتَّىٰ تَنكِحَ زَوْجًا
غَيْرَهُ ۗ فَإِن طَلَّقَهَا فَلَا جُنَاحَ عَلَيْهِمَا أَن
يَتَرَاجَعَا إِن ظَنَّا أَن يُقِيمَا حُدُودَ اللَّهِ ۗ
وَتِلْكَ حُدُودُ اللَّهِ يُبَيِّنُهَا لِقَوْمٍ يَعْلَمُونَ ﴿٢٣٠﴾

əlaqə qurmalarında ikisinə də heç bir günah yoxdur. Bunlar Allahın hədləridir, onları anlayan adamlara bəyan edir.

231. Qadınlarınızı boşadığınız və onların gözləmə müddəti sona yetişdiyi zaman onları ya *şəriətə* müvafiq qayda üzrə saxlayın, ya da müvafiq qayda üzrə buraxın. Zərər vurmaq və təcavüz etmək məqsədilə onları saxlamayın. Kim bunu etsə, ancaq özünə zülm etmiş olar. Allahın ayələrini ələ salmayın. Allahın sizə olan nemətlərini, öyüd-nəsihət vermək üçün nazil etdiyi Kitab və hikməti yadınıza salın. Allahdan qorxun və bilin ki, Allah hər şeyi bilir.

وَإِذَا طَلَّقْتُمُ ٱلنِّسَآءَ فَبَلَغْنَ أَجَلَهُنَّ
فَأَمْسِكُوهُنَّ بِمَعْرُوفٍ أَوْ سَرِّحُوهُنَّ
بِمَعْرُوفٍ ۚ وَلَا تُمْسِكُوهُنَّ ضِرَارًا لِّتَعْتَدُوا۟ ۚ
وَمَن يَفْعَلْ ذَٰلِكَ فَقَدْ ظَلَمَ نَفْسَهُۥ ۚ وَلَا تَتَّخِذُوٓا۟
ءَايَٰتِ ٱللَّهِ هُزُوًا ۚ وَٱذْكُرُوا۟ نِعْمَتَ ٱللَّهِ عَلَيْكُمْ
وَمَآ أَنزَلَ عَلَيْكُم مِّنَ ٱلْكِتَٰبِ وَٱلْحِكْمَةِ يَعِظُكُم بِهِۦ ۚ
وَٱتَّقُوا۟ ٱللَّهَ وَٱعْلَمُوٓا۟ أَنَّ ٱللَّهَ بِكُلِّ شَىْءٍ عَلِيمٌ ٢٣١

232. Qadınlarınızı boşadığınız və onların gözləmə müddəti başa çatdığı zaman *ərlə arvad şəriətə* müvafiq qayda üzrə öz aralarında razılığa gələrsə, o qadınlara yenidən əvvəlki ərlərinə ərə getməyə mane olmayın. Bu sizlərdən Allaha və Axirət gününə iman gətirənlərə verilən bir öyüd-nəsihətdir. Bu sizin üçün daha yaxşı və daha pakdır. Allah bilir, siz isə bilmirsiniz.

وَإِذَا طَلَّقْتُمُ ٱلنِّسَآءَ فَبَلَغْنَ أَجَلَهُنَّ فَلَا
تَعْضُلُوهُنَّ أَن يَنكِحْنَ أَزْوَٰجَهُنَّ إِذَا تَرَٰضَوْا۟
بَيْنَهُم بِٱلْمَعْرُوفِ ۗ ذَٰلِكَ يُوعَظُ بِهِۦ مَن كَانَ مِنكُمْ
يُؤْمِنُ بِٱللَّهِ وَٱلْيَوْمِ ٱلْءَاخِرِ ۗ ذَٰلِكُمْ أَزْكَىٰ لَكُمْ
وَأَطْهَرُ ۗ وَٱللَّهُ يَعْلَمُ وَأَنتُمْ لَا تَعْلَمُونَ ٢٣٢

233. Analar öz övladlarını tam iki il əmizdirsinlər. *Bu*, əmizdirməni tamamlamaq istəyənlər üçündür. Anaların yeməyi və geyimi *şəriətə* müvafiq qaydada uşağın atasının

۞ وَٱلْوَٰلِدَٰتُ يُرْضِعْنَ أَوْلَٰدَهُنَّ حَوْلَيْنِ كَامِلَيْنِ ۖ
لِمَنْ أَرَادَ أَن يُتِمَّ ٱلرَّضَاعَةَ ۚ وَعَلَى ٱلْمَوْلُودِ لَهُۥ
رِزْقُهُنَّ وَكِسْوَتُهُنَّ بِٱلْمَعْرُوفِ ۚ لَا تُكَلَّفُ
نَفْسٌ إِلَّا وُسْعَهَا ۚ لَا تُضَآرَّ وَٰلِدَةٌۢ بِوَلَدِهَا

üzərinə düşür. Heç kəs qüvvəsi çatdığından artıq yüklənməz. Nə anaya öz övladına görə, nə də ataya öz övladına görə zərər verilməməlidir. *Bu vəzifə* eynilə varisin üzərinə düşür. Əgər *ata və ana* özlərinin razılığı və məsləhəti ilə *uşağı* süddən kəsmək istəsələr, ikisinə də heç bir günah sayılmaz. Əgər siz uşaqlarınızı *süd anasına* əmizdirmək istəyirsinizsə və *süd haqqını* müvafiq qayda üzrə ödəsəniz, sizə heç bir günah olmaz. Allahdan qorxun və bilin ki, Allah sizin nə etdiklərinizi görür.

وَلَا مَوْلُودٌ لَّهُۥ بِوَلَدِهِۦ ۚ وَعَلَى ٱلْوَارِثِ مِثْلُ ذَٰلِكَ ۗ
فَإِنْ أَرَادَا فِصَالًا عَن تَرَاضٍ مِّنْهُمَا وَتَشَاوُرٍ
فَلَا جُنَاحَ عَلَيْهِمَا ۗ وَإِنْ أَرَدتُّمْ أَن تَسْتَرْضِعُوٓا۟
أَوْلَـٰدَكُمْ فَلَا جُنَاحَ عَلَيْكُمْ إِذَا سَلَّمْتُم
مَّآ ءَاتَيْتُم بِٱلْمَعْرُوفِ ۗ وَٱتَّقُوا۟ ٱللَّهَ وَٱعْلَمُوٓا۟
أَنَّ ٱللَّهَ بِمَا تَعْمَلُونَ بَصِيرٌ ﴿٢٣٣﴾

234. Sizlərdən ölənlərin qoyub getdiyi zövcələr dörd ay on gün gözləməlidirlər. Onların gözləmə müddəti bitərkən *şəriətə* müvafiq qayda üzrə özləri barədə etdikləri işə görə sizə günah sayılmaz. Allah nə etdiklərinizdən xəbərdardır.

وَٱلَّذِينَ يُتَوَفَّوْنَ مِنكُمْ وَيَذَرُونَ أَزْوَٰجًا
يَتَرَبَّصْنَ بِأَنفُسِهِنَّ أَرْبَعَةَ أَشْهُرٍ وَعَشْرًا ۖ
فَإِذَا بَلَغْنَ أَجَلَهُنَّ فَلَا جُنَاحَ عَلَيْكُمْ
فِيمَا فَعَلْنَ فِىٓ أَنفُسِهِنَّ بِٱلْمَعْرُوفِ ۗ
وَٱللَّهُ بِمَا تَعْمَلُونَ خَبِيرٌ ﴿٢٣٤﴾

235. Qadınlara elçi göndərmək istəyinizi işarə ilə bildirməkdə və ya ürəyinizdə gizlətməkdə sizə heç bir günah yoxdur. Allah bilir ki, siz onları xatırlayacaqsınız. Lakin onlarla gizlicə vədələşməyin, onlara yalnız *şəriətə* müvafiq qayda üzrə söz deyin. Gözləmə vaxtı başa çatmayıncaya qədər nikah etmək qərarına gəlməyin. Bilin ki, Allah sizin qəlblərinizdə olanları bilir. Ondan qorxun! Bilin ki, Allah Bağışlayandır, Rəhmlidir!

وَلَا جُنَاحَ عَلَيْكُمْ فِيمَا عَرَّضْتُم بِهِۦ مِنْ
خِطْبَةِ ٱلنِّسَآءِ أَوْ أَكْنَنتُمْ فِىٓ أَنفُسِكُمْ ۚ عَلِمَ
ٱللَّهُ أَنَّكُمْ سَتَذْكُرُونَهُنَّ وَلَـٰكِن
لَّا تُوَاعِدُوهُنَّ سِرًّا إِلَّآ أَن تَقُولُوا۟ قَوْلًا
مَّعْرُوفًا ۚ وَلَا تَعْزِمُوا۟ عُقْدَةَ ٱلنِّكَاحِ حَتَّىٰ
يَبْلُغَ ٱلْكِتَـٰبُ أَجَلَهُۥ ۚ وَٱعْلَمُوٓا۟ أَنَّ ٱللَّهَ يَعْلَمُ
مَا فِىٓ أَنفُسِكُمْ فَٱحْذَرُوهُ ۚ وَٱعْلَمُوٓا۟
أَنَّ ٱللَّهَ غَفُورٌ حَلِيمٌ ﴿٢٣٥﴾

236. Yaxınlıq etmədiyiniz və mehrini təyin etmədiyiniz qadınları boşasanız, sizə heç bir günah gəlməz. Onlara *şəriətə* müvafiq qayda üzrə pay verin. Varlı öz imkanına görə, kasıb da öz imkanına görə *versin. Bu isə* yaxşılıq edənlər üçün bir borcdur.

لَا جُنَاحَ عَلَيْكُمْ إِن طَلَّقْتُمُ ٱلنِّسَآءَ مَا لَمْ
تَمَسُّوهُنَّ أَوْ تَفْرِضُوا۟ لَهُنَّ فَرِيضَةً ۚ
وَمَتِّعُوهُنَّ عَلَى ٱلْمُوسِعِ قَدَرُهُۥ وَعَلَى ٱلْمُقْتِرِ
قَدَرُهُۥ مَتَٰعًۢا بِٱلْمَعْرُوفِ ۖ حَقًّا عَلَى ٱلْمُحْسِنِينَ ٢٣٦

237. Qadınlar üçün mehr təyin etdikdən sonra, yaxınlıq etməzdən əvvəl onları boşasanız, təyin etdiyinizin yarısını *onlara* verməlisiniz. Qadınların *bunu ərlərinə* bağışlaması və ya əlində nikah müqaviləsi olanın bunu *qadına* bağışlaması isə istisnadır. Sizin bağışlamağınız təqvaya daha yaxındır. Bir-birinizə güzəşt etməyi unutmayın. Allah sizin nə etdiklərinizi görür.

وَإِن طَلَّقْتُمُوهُنَّ مِن قَبْلِ أَن تَمَسُّوهُنَّ وَقَدْ
فَرَضْتُمْ لَهُنَّ فَرِيضَةً فَنِصْفُ مَا فَرَضْتُمْ
إِلَّآ أَن يَعْفُونَ أَوْ يَعْفُوَا۟ ٱلَّذِى بِيَدِهِۦ عُقْدَةُ
ٱلنِّكَاحِ ۚ وَأَن تَعْفُوٓا۟ أَقْرَبُ لِلتَّقْوَىٰ ۚ وَلَا تَنسَوُا۟
ٱلْفَضْلَ بَيْنَكُمْ ۚ إِنَّ ٱللَّهَ بِمَا تَعْمَلُونَ
بَصِيرٌ ٢٣٧

238. Namazları və *günortadan sonrakı* orta namazı qoruyun və Allah qarşısında mütiliklə durun.

حَٰفِظُوا۟ عَلَى ٱلصَّلَوَٰتِ وَٱلصَّلَوٰةِ
ٱلْوُسْطَىٰ وَقُومُوا۟ لِلَّهِ قَٰنِتِينَ ٢٣٨

239. Əgər *nədənsə* qorxsanız, *namazınızı* ayaq üstə və ya minik üzərində *qılın*. Təhlükə sovuşduqda isə Allahı, sizə bilmədiklərinizi necə öyrədibsə, o cür yad edin!

فَإِنْ خِفْتُمْ فَرِجَالًا أَوْ رُكْبَانًا ۖ فَإِذَآ
أَمِنتُمْ فَٱذْكُرُوا۟ ٱللَّهَ كَمَا عَلَّمَكُم
مَّا لَمْ تَكُونُوا۟ تَعْلَمُونَ ٢٣٩

240. Sizlərdən ölən və *özündən sonra* zövcələr qoyub gedən kimsələr zövcələrinə bir ilin tamamınadək *evlərindən* çıxarılmamaq şərtilə baxılmasını vəsiyyət etməlidirlər. Əgər onlar *öz istəkləri ilə* çıxıb getsələr, *şəriətə* müvafiq qayda

وَٱلَّذِينَ يُتَوَفَّوْنَ مِنكُمْ وَيَذَرُونَ
أَزْوَٰجًا وَصِيَّةً لِّأَزْوَٰجِهِم مَّتَٰعًا إِلَى
ٱلْحَوْلِ غَيْرَ إِخْرَاجٍ ۚ فَإِنْ خَرَجْنَ فَلَا جُنَاحَ
عَلَيْكُمْ فِى مَا فَعَلْنَ فِىٓ أَنفُسِهِنَّ مِن
مَّعْرُوفٍ ۗ وَٱللَّهُ عَزِيزٌ حَكِيمٌ ٢٤٠

üzrə özləri barəsində etdiklərinə
görə sizə günah gəlməz. Allah
Qüdrətlidir, Müdrikdir.

241. Boşanmış qadınlara *şəriətə* müvafiq
qayda üzrə yaxşılıq etmək lazımdır.
*Bu*, müttəqilər üçün bir borcdur.

وَلِلْمُطَلَّقَٰتِ مَتَٰعٌۢ بِٱلْمَعْرُوفِ ۖ حَقًّا عَلَى
ٱلْمُتَّقِينَ ﴿٢٤١﴾

242. Allah Öz ayələrini sizə
belə bəyan edir ki,
bəlkə başa düşəsiniz.

كَذَٰلِكَ يُبَيِّنُ ٱللَّهُ لَكُمْ ءَايَٰتِهِۦ
لَعَلَّكُمْ تَعْقِلُونَ ﴿٢٤٢﴾

243. Minlərlə *adam* olduqları halda
ölüm qorxusundan yurdlarından
çıxanları görmədinmi? Allah
onlara: “Ölün!”– dedi. Sonra isə
onları diriltdi. Doğrudan da, Allah
insanlara qarşı lütfkardır, lakin
insanların çoxu *buna* şükür etmir.

۞ أَلَمْ تَرَ إِلَى ٱلَّذِينَ خَرَجُوا۟ مِن دِيَٰرِهِمْ
وَهُمْ أُلُوفٌ حَذَرَ ٱلْمَوْتِ فَقَالَ لَهُمُ ٱللَّهُ
مُوتُوا۟ ثُمَّ أَحْيَٰهُمْ ۚ إِنَّ ٱللَّهَ لَذُو فَضْلٍ
عَلَى ٱلنَّاسِ وَلَٰكِنَّ أَكْثَرَ ٱلنَّاسِ
لَا يَشْكُرُونَ ﴿٢٤٣﴾

244. Allah yolunda vuruşun
və bilin ki, Allah
Eşidəndir, Biləndir!

وَقَٰتِلُوا۟ فِى سَبِيلِ ٱللَّهِ وَٱعْلَمُوٓا۟ أَنَّ ٱللَّهَ
سَمِيعٌ عَلِيمٌ ﴿٢٤٤﴾

245. Kim Allaha gözəl bir borc versə
(malından Allah yolunda xərcləsə),
O da onun üçün bunu qat-qat artırar.
Allah *kimisinin ruzisini* azaldar,
*kimisinin ruzisini də* artırar. Siz Ona
qaytarılacaqsınız.

مَّن ذَا ٱلَّذِى يُقْرِضُ ٱللَّهَ قَرْضًا حَسَنًا
فَيُضَٰعِفَهُۥ لَهُۥٓ أَضْعَافًا كَثِيرَةً ۚ وَٱللَّهُ
يَقْبِضُ وَيَبْصُۜطُ وَإِلَيْهِ تُرْجَعُونَ ﴿٢٤٥﴾

246. Musadan sonra İsrail oğullarından
olan əyanların *başına gələnləri*
bilmirsənmi? O zaman onlar öz
peyğəmbərlərinə dedilər: “Bizə
bir hökmdar təyin et ki, Allah
yolunda vuruşaq!” O dedi: “Sizə
vuruşma vacib edilsə, ola bilsin ki,

أَلَمْ تَرَ إِلَى ٱلْمَلَإِ مِنۢ بَنِىٓ إِسْرَٰٓءِيلَ مِنۢ
بَعْدِ مُوسَىٰٓ إِذْ قَالُوا۟ لِنَبِىٍّ لَّهُمُ ٱبْعَثْ
لَنَا مَلِكًا نُّقَٰتِلْ فِى سَبِيلِ ٱللَّهِ ۖ قَالَ هَلْ
عَسَيْتُمْ إِن كُتِبَ عَلَيْكُمُ ٱلْقِتَالُ أَلَّا
تُقَٰتِلُوا۟ ۖ قَالُوا۟ وَمَا لَنَآ أَلَّا نُقَٰتِلَ فِى

vuruşmayasınız?" Onlar dedilər: "Madam ki, biz yurdumuzdan çıxarılmışıq və övladlarımızdan ayrılmışıq, onda nə üçün Allah yolunda vuruşmayaq?" Vuruşmaq onlara vacib edildikdə isə onlardan az bir qismi istisna olmaqla *hamısı döyüşdən* üz çevirdilər. Allah zalımları tanıyır.

سَبِيلِ ٱللَّهِ وَقَدْ أُخْرِجْنَا مِن دِيَٰرِنَا
وَأَبْنَآئِنَا ۖ فَلَمَّا كُتِبَ عَلَيْهِمُ ٱلْقِتَالُ
تَوَلَّوْا۟ إِلَّا قَلِيلًا مِّنْهُمْ ۗ وَٱللَّهُ عَلِيمٌۢ
بِٱلظَّٰلِمِينَ ﴿٢٤٦﴾

247. Peyğəmbərləri onlara dedi: "Allah Talutu sizə hökmdar təyin etdi!" Onlar dedilər: "O necə bizə hökmdar ola bilər ki, biz hökmdarlığa ondan daha çox layiqik və ona heç böyük var-dövlət də verilməmişdir". O dedi: "Allah sizin üzərinizə onu *hökmdar* seçdi, elm və bədəncə onun gücünü artırdı. Allah Öz mülkünü istədiyi kəsə verir. Allah *hər şeyi* Əhatəedəndir, Biləndir".

وَقَالَ لَهُمْ نَبِيُّهُمْ إِنَّ ٱللَّهَ قَدْ بَعَثَ
لَكُمْ طَالُوتَ مَلِكًا ۚ قَالُوٓا۟ أَنَّىٰ
يَكُونُ لَهُ ٱلْمُلْكُ عَلَيْنَا وَنَحْنُ أَحَقُّ
بِٱلْمُلْكِ مِنْهُ وَلَمْ يُؤْتَ سَعَةً مِّنَ ٱلْمَالِ ۚ
قَالَ إِنَّ ٱللَّهَ ٱصْطَفَىٰهُ عَلَيْكُمْ وَزَادَهُۥ
بَسْطَةً فِى ٱلْعِلْمِ وَٱلْجِسْمِ ۖ وَٱللَّهُ يُؤْتِى
مُلْكَهُۥ مَن يَشَآءُ ۚ وَٱللَّهُ وَٰسِعٌ عَلِيمٌ ﴿٢٤٧﴾

248. Peyğəmbərləri onlara dedi: "Onun hökmdarlığının əlaməti sizə bir sandığın gəlməsidir. Onun içərisində Rəbbinizdən bir təskinlik, Musadan və Harundan qalan *bəzi* şeylər vardır. Onu mələklər gətirəcək. Əgər siz möminsinizsə, bu sizin üçün bir dəlildir".

وَقَالَ لَهُمْ نَبِيُّهُمْ إِنَّ ءَايَةَ مُلْكِهِۦٓ
أَن يَأْتِيَكُمُ ٱلتَّابُوتُ فِيهِ
سَكِينَةٌ مِّن رَّبِّكُمْ وَبَقِيَّةٌ مِّمَّا
تَرَكَ ءَالُ مُوسَىٰ وَءَالُ هَٰرُونَ
تَحْمِلُهُ ٱلْمَلَٰٓئِكَةُ ۚ إِنَّ فِى ذَٰلِكَ لَءَايَةً
لَّكُمْ إِن كُنتُم مُّؤْمِنِينَ ﴿٢٤٨﴾

249. Talut qoşunla birlikdə *döyüşə* yola düşdükdə *əsgərlərinə* dedi: "Allah sizi bir çayla imtahan edəcək. Kim ondan içsə, məndən deyildir. Bir ovuc götürən istisna

فَلَمَّا فَصَلَ طَالُوتُ بِٱلْجُنُودِ قَالَ إِنَّ
ٱللَّهَ مُبْتَلِيكُم بِنَهَرٍ فَمَن شَرِبَ مِنْهُ فَلَيْسَ
مِنِّى وَمَن لَّمْ يَطْعَمْهُ فَإِنَّهُۥ مِنِّىٓ إِلَّا مَنِ
ٱغْتَرَفَ غُرْفَةًۢ بِيَدِهِۦ ۚ فَشَرِبُوا۟ مِنْهُ

olmaqla, kim ondan dadmasa, o, məndəndir". Onların az bir qismi istisna olmaqla *hamısı* ondan su içdilər. *Talut* onunla olan möminlərlə birlikdə çayı keçdikdən sonra *bəziləri* dedilər: "Bu gün bizim Caluta və onun qoşununa gücümüz çatmayacaq". Allahla qarşılaşacaqlarını yəqin bilənlər isə dedilər: "Neçə-neçə az saylı dəstələr Allahın izni ilə çox saylı dəstələrə qalib gəlmişdir!" Allah səbir edənlərlədir.

إِلَّا قَلِيلًا مِّنْهُمْ ۚ فَلَمَّا جَاوَزَهُۥ هُوَ
وَٱلَّذِينَ ءَامَنُوا۟ مَعَهُۥ قَالُوا۟ لَا طَاقَةَ لَنَا
ٱلْيَوْمَ بِجَالُوتَ وَجُنُودِهِۦ ۚ قَالَ ٱلَّذِينَ
يَظُنُّونَ أَنَّهُم مُّلَٰقُوا۟ ٱللَّهِ كَم مِّن
فِئَةٍ قَلِيلَةٍ غَلَبَتْ فِئَةً كَثِيرَةًۢ
بِإِذْنِ ٱللَّهِ ۗ وَٱللَّهُ مَعَ ٱلصَّٰبِرِينَ ﴿٢٤٩﴾

250. Onlar Calutun və onun qoşununun qarşısına çıxdıqda dedilər: "Ey Rəbbimiz! Bizə səbir ver, qədəmlərimizi möhkəmlət və kafir qövmə qələbə çalmaqda bizə yardım et!"

وَلَمَّا بَرَزُوا۟ لِجَالُوتَ وَجُنُودِهِۦ قَالُوا۟
رَبَّنَآ أَفْرِغْ عَلَيْنَا صَبْرًا وَثَبِّتْ أَقْدَامَنَا
وَٱنصُرْنَا عَلَى ٱلْقَوْمِ ٱلْكَٰفِرِينَ ﴿٢٥٠﴾

251. *Möminlər* Allahın izni ilə onları darmadağın etdilər. Davud Calutu öldürdü. Allah ona hökmranlıq və hikmət verdi, ona istədiyini öyrətdi. Əgər Allah insanların bəzilərini digərləri ilə dəf etməsəydi, yer üzü fəsada uğrayardı. Lakin Allah aləmlərə qarşı lütfkardır.

فَهَزَمُوهُم بِإِذْنِ ٱللَّهِ وَقَتَلَ دَاوُۥدُ
جَالُوتَ وَءَاتَىٰهُ ٱللَّهُ ٱلْمُلْكَ
وَٱلْحِكْمَةَ وَعَلَّمَهُۥ مِمَّا يَشَآءُ ۗ وَلَوْلَا
دَفْعُ ٱللَّهِ ٱلنَّاسَ بَعْضَهُم بِبَعْضٍ
لَّفَسَدَتِ ٱلْأَرْضُ وَلَٰكِنَّ ٱللَّهَ ذُو
فَضْلٍ عَلَى ٱلْعَٰلَمِينَ ﴿٢٥١﴾

252. Bunlar Allahın ayələridir. Biz onları sənə haqq olaraq oxuyuruq. Şübhəsiz ki, sən göndərilən elçilərdənsən.

تِلْكَ ءَايَٰتُ ٱللَّهِ نَتْلُوهَا عَلَيْكَ
بِٱلْحَقِّ ۚ وَإِنَّكَ لَمِنَ
ٱلْمُرْسَلِينَ ﴿٢٥٢﴾

253. Biz o elçilərin bəzisini digərlərindən üstün etdik. Onlardan bəzisi ilə Allah danışmış, bəzisini

۞ تِلْكَ ٱلرُّسُلُ فَضَّلْنَا بَعْضَهُمْ عَلَىٰ بَعْضٍ ۘ
مِّنْهُم مَّن كَلَّمَ ٱللَّهُ ۖ وَرَفَعَ بَعْضَهُمْ دَرَجَٰتٍ ۚ

isə dərəcələrə yüksəltmişdir. Biz Məryəm oğlu İsaya açıq-aydın dəlillər verdik və onu müqəddəs Ruh *Cəbrail* ilə qüvvətləndirdik. Əgər Allah istəsəydi, onlardan sonra gələnlər özlərinə açıq-aydın dəlillər gəldikdən sonra bir-biriləri ilə vuruşmazdılar. Lakin onlar ixtilaf etdilər. Onlardan kimisi iman gətirdi, kimisi də inkar etdi. Əgər Allah istəsəydi, onlar bir-biriləri ilə vuruşmazdılar. Lakin Allah istədiyini edir.

وَءَاتَيْنَا عِيسَى ٱبْنَ مَرْيَمَ ٱلْبَيِّنَٰتِ وَأَيَّدْنَٰهُ
بِرُوحِ ٱلْقُدُسِ وَلَوْ شَآءَ ٱللَّهُ مَا ٱقْتَتَلَ
ٱلَّذِينَ مِنۢ بَعْدِهِم مِّنۢ بَعْدِ مَا جَآءَتْهُمُ
ٱلْبَيِّنَٰتُ وَلَٰكِنِ ٱخْتَلَفُوا۟ فَمِنْهُم مَّنْ
ءَامَنَ وَمِنْهُم مَّن كَفَرَ وَلَوْ شَآءَ ٱللَّهُ
مَا ٱقْتَتَلُوا۟ وَلَٰكِنَّ ٱللَّهَ يَفْعَلُ مَا يُرِيدُ ﴿٢٥٣﴾

254. Ey iman gətirənlər! Alış-verişin, dostluğun və şəfaətin olmayacağı gün gəlməmişdən öncə sizə verdiyimiz ruzidən *Allah yolunda* xərcləyin! Kafirlər isə zalımdırlar.

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوٓا۟ أَنفِقُوا۟ مِمَّا رَزَقْنَٰكُم
مِّن قَبْلِ أَن يَأْتِىَ يَوْمٌ لَّا بَيْعٌ فِيهِ وَلَا خُلَّةٌ
وَلَا شَفَٰعَةٌ وَٱلْكَٰفِرُونَ هُمُ ٱلظَّٰلِمُونَ ﴿٢٥٤﴾

255. Allah, Ondan başqa *ibadətə layiq olan* məbud yoxdur, *əbədi* Yaşayandır, *bütün yaratdıqlarının* Qəyyumudur. Onu nə mürgü, nə də yuxu tutar. Göylərdə və yerdə nə varsa, Ona məxsusdur. Onun izni olmadan Onun yanında kim havadarlıq edə bilər? O, *məxluqatın* gələcəyini və keçmişini bilir. Onlar Onun elmindən, Onun istədiyindən başqa heç bir şey qavraya bilməzlər. Onun Kürsüsü göyləri və yeri əhatə edir. Bunları qoruyub saxlamaq Ona ağır gəlmir. O, Ucadır, Uludur.

ٱللَّهُ لَآ إِلَٰهَ إِلَّا هُوَ ٱلْحَىُّ ٱلْقَيُّومُ لَا تَأْخُذُهُۥ
سِنَةٌ وَلَا نَوْمٌ لَّهُۥ مَا فِى ٱلسَّمَٰوَٰتِ وَمَا فِى
ٱلْأَرْضِ مَن ذَا ٱلَّذِى يَشْفَعُ عِندَهُۥٓ إِلَّا
بِإِذْنِهِۦ يَعْلَمُ مَا بَيْنَ أَيْدِيهِمْ وَمَا خَلْفَهُمْ
وَلَا يُحِيطُونَ بِشَىْءٍ مِّنْ عِلْمِهِۦٓ إِلَّا بِمَا شَآءَ
وَسِعَ كُرْسِيُّهُ ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضَ وَلَا يَـُٔودُهُۥ
حِفْظُهُمَا وَهُوَ ٱلْعَلِىُّ ٱلْعَظِيمُ ﴿٢٥٥﴾

256. Dində məcburiyyət yoxdur. Artıq doğru yol azğınlıqdan aydın

لَآ إِكْرَاهَ فِى ٱلدِّينِ قَد تَّبَيَّنَ ٱلرُّشْدُ مِنَ ٱلْغَىِّ

fərqlənir. Hər kəs tağutu inkar edib Allaha iman gətirərsə, heç vaxt qırılmayan ən möhkəm dəstəkdən yapışmış olar. Allah Eşidəndir, Biləndir.

فَمَن يَكۡفُرۡ بِٱلطَّٰغُوتِ وَيُؤۡمِنۢ بِٱللَّهِ فَقَدِ
ٱسۡتَمۡسَكَ بِٱلۡعُرۡوَةِ ٱلۡوُثۡقَىٰ لَا ٱنفِصَامَ
لَهَاۗ وَٱللَّهُ سَمِيعٌ عَلِيمٌ ٢٥٦

257. Allah iman gətirənlərin Himayədarıdır, onları zülmətlərdən nura çıxarır. Kafirlərin dostları isə tağutlardır, onları nurdan zülmətlərə salarlar. Onlar Od sakinləridirlər və orada əbədi qalacaqlar.

ٱللَّهُ وَلِيُّ ٱلَّذِينَ ءَامَنُواْ يُخۡرِجُهُم مِّنَ
ٱلظُّلُمَٰتِ إِلَى ٱلنُّورِۖ وَٱلَّذِينَ كَفَرُوٓاْ
أَوۡلِيَآؤُهُمُ ٱلطَّٰغُوتُ يُخۡرِجُونَهُم مِّنَ
ٱلنُّورِ إِلَى ٱلظُّلُمَٰتِۗ أُوْلَٰٓئِكَ أَصۡحَٰبُ
ٱلنَّارِۖ هُمۡ فِيهَا خَٰلِدُونَ ٢٥٧

258. Allahın verdiyi hakimiyyətə görə İbrahim ilə Rəbbi barəsində höcətləşən kəsin *əhvalatını* bilmirsənmi? İbrahim: “Mənim Rəbbim həm dirildir, həm də öldürür!”– dedikdə *padşah*: “Mən də həm dirildir, həm də öldürürəm!”– demişdi. İbrahim: “Allah günəşi məşriqdən gətirir. Sən də onu məğribdən gətir!”– dedikdə, o kafir çaşıb qalmışdı. Allah zalım qövmü doğru yola yönəltməz.

أَلَمۡ تَرَ إِلَى ٱلَّذِي حَآجَّ إِبۡرَٰهِـۧمَ فِي رَبِّهِۦٓ أَنۡ
ءَاتَىٰهُ ٱللَّهُ ٱلۡمُلۡكَ إِذۡ قَالَ إِبۡرَٰهِـۧمُ رَبِّيَ
ٱلَّذِي يُحۡيِۦ وَيُمِيتُ قَالَ أَنَا۠ أُحۡيِۦ وَأُمِيتُۖ
قَالَ إِبۡرَٰهِـۧمُ فَإِنَّ ٱللَّهَ يَأۡتِي بِٱلشَّمۡسِ
مِنَ ٱلۡمَشۡرِقِ فَأۡتِ بِهَا مِنَ ٱلۡمَغۡرِبِ فَبُهِتَ
ٱلَّذِي كَفَرَۗ وَٱللَّهُ لَا يَهۡدِي ٱلۡقَوۡمَ
ٱلظَّٰلِمِينَ ٢٥٨

259. Və ya *damları* uçulub xarabalığa çevrilmiş bir kəndin yanından keçən kimsənin *hekayətini* bilmirsənmi? O demişdi: “Allah bu kəndi ölümündən sonra necə dirildəcək?” Allah onu öldürüb yüz il saxladı, sonra da dirildib dedi: “Nə qədər qaldın?” O dedi: “Bir gün yaxud bir gündən də az qaldım!” *Allah* dedi: “Əksinə, sən yüz il qaldın. Öz

أَوۡ كَٱلَّذِي مَرَّ عَلَىٰ قَرۡيَةٖ وَهِيَ خَاوِيَةٌ عَلَىٰ
عُرُوشِهَا قَالَ أَنَّىٰ يُحۡيِۦ هَٰذِهِ ٱللَّهُ بَعۡدَ
مَوۡتِهَاۖ فَأَمَاتَهُ ٱللَّهُ مِاْئَةَ عَامٖ ثُمَّ بَعَثَهُۥۖ
قَالَ كَمۡ لَبِثۡتَۖ قَالَ لَبِثۡتُ يَوۡمًا أَوۡ بَعۡضَ
يَوۡمٖۖ قَالَ بَل لَّبِثۡتَ مِاْئَةَ عَامٖ فَٱنظُرۡ
إِلَىٰ طَعَامِكَ وَشَرَابِكَ لَمۡ يَتَسَنَّهۡۖ وَٱنظُرۡ
إِلَىٰ حِمَارِكَ وَلِنَجۡعَلَكَ ءَايَةٗ لِّلنَّاسِۖ

yeməyinə və içdiyin suya bax, hələ də xarab olmayıb. Uzunqulağına da bax! Biz səni insanlar üçün bir dəlil etdik. Sümüklərə bax, gör Biz onları necə bir-birinə birləşdirir, sonra da onların üstünü ətlə örtürük". Ona *həqiqət* bəlli olduqda: "Mən artıq bilirəm ki, Allah hər şeyə qadirdir!"– dedi.

وَانظُرْ إِلَى الْعِظَامِ كَيْفَ نُنشِزُهَا ثُمَّ
نَكْسُوهَا لَحْمًا ۚ فَلَمَّا تَبَيَّنَ لَهُ قَالَ
أَعْلَمُ أَنَّ اللَّهَ عَلَىٰ كُلِّ شَيْءٍ قَدِيرٌ ٢٥٩

**260.** Bir zaman İbrahim: "Ey Rəbbim, ölüləri necə diriltdiyini mənə göstər!"– dedi. *Rəbbi ona*: "Məgər sən inanmırsan?"– dedi. *İbrahim* dedi: "Əlbəttə *inanıram*! Amma *istəyirəm ki*, qəlbim rahat olsun". *Allah* buyurdu: "Quşlardan dördünü tut və onları özünə tərəf çəkib tikə-tikə et. Sonra hər dağın başına onlardan bir parça qoy, sonra da onları çağır, tez sənin yanına gələcəklər. Bil ki, Allah Qüdrətlidir, hikmət Sahibidir!"

وَإِذْ قَالَ إِبْرَاهِيمُ رَبِّ أَرِنِي كَيْفَ تُحْيِي
الْمَوْتَىٰ ۖ قَالَ أَوَلَمْ تُؤْمِن ۖ قَالَ بَلَىٰ وَلَٰكِن
لِّيَطْمَئِنَّ قَلْبِي ۖ قَالَ فَخُذْ أَرْبَعَةً مِّنَ الطَّيْرِ
فَصُرْهُنَّ إِلَيْكَ ثُمَّ اجْعَلْ عَلَىٰ كُلِّ جَبَلٍ
مِّنْهُنَّ جُزْءًا ثُمَّ ادْعُهُنَّ يَأْتِينَكَ سَعْيًا ۚ
وَاعْلَمْ أَنَّ اللَّهَ عَزِيزٌ حَكِيمٌ ٢٦٠

**261.** Mallarını Allah yolunda xərcləyənlərin məsəli yeddi sünbül verən bir toxumun məsəlinə bənzəyir ki, sünbüllərin hər birində yüz ədəd dən vardır. Allah istədiyi kimsənin *mükafatını* artırar. Allah *hər şeyi* Əhatəedəndir, Biləndir.

مَّثَلُ الَّذِينَ يُنفِقُونَ أَمْوَالَهُمْ فِي سَبِيلِ اللَّهِ
كَمَثَلِ حَبَّةٍ أَنبَتَتْ سَبْعَ سَنَابِلَ فِي
كُلِّ سُنبُلَةٍ مِّائَةُ حَبَّةٍ ۗ وَاللَّهُ
يُضَاعِفُ لِمَن يَشَاءُ ۗ وَاللَّهُ وَاسِعٌ عَلِيمٌ ٢٦١

**262.** Mallarını Allah yolunda xərcləyənlərin və xərclədiklərinin ardından minnət qoymayan və əziyyət verməyənlərin, Rəbbi yanında mükafatları vardır. Onlara

الَّذِينَ يُنفِقُونَ أَمْوَالَهُمْ فِي سَبِيلِ اللَّهِ ثُمَّ
لَا يُتْبِعُونَ مَا أَنفَقُوا مَنًّا وَلَا أَذًى ۙ لَّهُمْ
أَجْرُهُمْ عِندَ رَبِّهِمْ وَلَا خَوْفٌ عَلَيْهِمْ
وَلَا هُمْ يَحْزَنُونَ ٢٦٢

heç bir qorxu yoxdur və onlar kədərlənməyəcəklər.

263. Xoş söz demək və xətaları bağışlamaq, minnətlə verilən sədəqədən daha yaxşıdır. Allah Zəngindir, Həlimdir.

۞ قَوْلٌ مَّعْرُوفٌ وَمَغْفِرَةٌ خَيْرٌ مِّن صَدَقَةٍ
يَتْبَعُهَآ أَذًى ۗ وَٱللَّهُ غَنِىٌّ حَلِيمٌ ٢٦٣

264. Ey iman gətirənlər! Sədəqələrinizi, özünü camaata göstərmək məqsədilə xərcləyən, Allaha və Axirət gününə inanmayan şəxs kimi minnət qoymaqla və əziyyət verməklə puç etməyin. Bunun məsəli üzərində torpaq olan hamar qayanın məsəlinə bənzəyir ki, şiddətli yağış yağıb onu çılpaq hala salmışdır. Onlar qazandıqlarından heç bir şeyə nail olmazlar. Allah kafir xalqı doğru yola yönəltməz.

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ لَا تُبْطِلُوا۟
صَدَقَٰتِكُم بِٱلْمَنِّ وَٱلْأَذَىٰ كَٱلَّذِى يُنفِقُ
مَالَهُۥ رِئَآءَ ٱلنَّاسِ وَلَا يُؤْمِنُ بِٱللَّهِ وَٱلْيَوْمِ
ٱلْءَاخِرِ ۖ فَمَثَلُهُۥ كَمَثَلِ صَفْوَانٍ عَلَيْهِ تُرَابٌ
فَأَصَابَهُۥ وَابِلٌ فَتَرَكَهُۥ صَلْدًا ۖ لَّا يَقْدِرُونَ عَلَىٰ
شَىْءٍ مِّمَّا كَسَبُوا۟ ۗ وَٱللَّهُ لَا يَهْدِى ٱلْقَوْمَ
ٱلْكَٰفِرِينَ ٢٦٤

265. Mallarını Allahın razılığını qazanmaq və nəfslərini möhkəmləndirmək üçün xərcləyənlərin məsəli təpə üzərindəki bağın məsəlinə bənzəyir ki, ona şiddətli yağış düşdükdən sonra o öz bəhrəsini iki qat verər. Hərgah ona şiddətli yağış düşməzsə, narın yağış da *bəs edər*. Allah sizin nə etdiklərinizi görür.

وَمَثَلُ ٱلَّذِينَ يُنفِقُونَ أَمْوَٰلَهُمُ ٱبْتِغَآءَ
مَرْضَاتِ ٱللَّهِ وَتَثْبِيتًا مِّنْ أَنفُسِهِمْ كَمَثَلِ
جَنَّةٍۭ بِرَبْوَةٍ أَصَابَهَا وَابِلٌ فَـَٔاتَتْ أُكُلَهَا
ضِعْفَيْنِ فَإِن لَّمْ يُصِبْهَا وَابِلٌ فَطَلٌّ ۗ
وَٱللَّهُ بِمَا تَعْمَلُونَ بَصِيرٌ ٢٦٥

266. Məgər sizlərdən biri istəyərmi ki, onun xurma ağaclarından və üzümlüklərdən ibarət, *ağacları* altından çaylar axan və içində də onun üçün hər cür meyvələr olan bir bağı olsun, *sonra da* ona qocalıq

أَيَوَدُّ أَحَدُكُمْ أَن تَكُونَ لَهُۥ جَنَّةٌ مِّن نَّخِيلٍ
وَأَعْنَابٍ تَجْرِى مِن تَحْتِهَا ٱلْأَنْهَٰرُ لَهُۥ فِيهَا
مِن كُلِّ ٱلثَّمَرَٰتِ وَأَصَابَهُ ٱلْكِبَرُ وَلَهُۥ
ذُرِّيَّةٌ ضُعَفَآءُ فَأَصَابَهَآ إِعْصَارٌ فِيهِ نَارٌ

üz verdiyi zaman, özünün də *o bağa* möhtac olan uşaqları olduğu bir halda *bu bağa* odlu bir qasırğa düşüb *onu* yandırsın? Allah ayələri sizə belə bəyan edir ki, bəlkə fikirləşəsiniz.

فَاحْتَرَقَتْ ۗ كَذَٰلِكَ يُبَيِّنُ اللَّهُ لَكُمُ الْآيَاتِ
لَعَلَّكُمْ تَتَفَكَّرُونَ ﴿٢٦٦﴾

267. Ey iman gətirənlər! Qazandığınız və sizin üçün torpaqdan yetişdirdiyimiz şeylərin yaxşısından *Allah yolunda* xərcləyin. Özünüzə verildiyi təqdirdə ancaq göz yumub alacağınız pis şeylərdən xərcləməyə çalışmayın. Bilin ki, Allah Zəngindir, Tərifəlayiqdir.

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا أَنْفِقُوا مِنْ طَيِّبَاتِ
مَا كَسَبْتُمْ وَمِمَّا أَخْرَجْنَا لَكُمْ مِنَ
الْأَرْضِ ۖ وَلَا تَيَمَّمُوا الْخَبِيثَ مِنْهُ
تُنْفِقُونَ وَلَسْتُمْ بِآخِذِيهِ إِلَّا أَنْ تُغْمِضُوا
فِيهِ ۚ وَاعْلَمُوا أَنَّ اللَّهَ غَنِيٌّ حَمِيدٌ ﴿٢٦٧﴾

268. Şeytan sizi yoxsulluqla qorxudur və yaramaz işlər görməyi əmr edir. Allah isə sizə Öz tərəfindən bağışlanma və mərhəmət olunacağını vəd edir. Allah *hər şeyi* Əhatəedəndir, Biləndir.

الشَّيْطَانُ يَعِدُكُمُ الْفَقْرَ وَيَأْمُرُكُمْ
بِالْفَحْشَاءِ ۖ وَاللَّهُ يَعِدُكُمْ مَغْفِرَةً مِنْهُ
وَفَضْلًا ۗ وَاللَّهُ وَاسِعٌ عَلِيمٌ ﴿٢٦٨﴾

269. *Allah* istədiyi kəsə hikmət bəxş edir. Kimə hikmət verilmişsə, ona çoxlu xeyir nəsib edilmişdir. Bunu isə ancaq düşüncəli insanlar anlayarlar.

يُؤْتِي الْحِكْمَةَ مَنْ يَشَاءُ ۚ وَمَنْ يُؤْتَ
الْحِكْمَةَ فَقَدْ أُوتِيَ خَيْرًا كَثِيرًا ۗ
وَمَا يَذَّكَّرُ إِلَّا أُولُو الْأَلْبَابِ ﴿٢٦٩﴾

270. Xərclədiyiniz hər bir sədəqəni və verdiyiniz hər bir nəziri şübhəsiz ki, Allah bilir. Zalımların isə köməkçiləri olmaz.

وَمَا أَنْفَقْتُمْ مِنْ نَفَقَةٍ أَوْ نَذَرْتُمْ مِنْ
نَذْرٍ فَإِنَّ اللَّهَ يَعْلَمُهُ ۗ
وَمَا لِلظَّالِمِينَ مِنْ أَنْصَارٍ ﴿٢٧٠﴾

271. Sədəqələri aşkarda verirsinizsə, bu çox gözəl. Əgər onu yoxsullara gizlində versəniz, bu sizin üçün daha yaxşı olar. *Allah* sizin bəzi günahlarınızdan keçər. Allah nə etdiklərinizdən xəbərdardır.

إِنْ تُبْدُوا الصَّدَقَاتِ فَنِعِمَّا هِيَ ۖ
وَإِنْ تُخْفُوهَا وَتُؤْتُوهَا الْفُقَرَاءَ
فَهُوَ خَيْرٌ لَكُمْ ۚ وَيُكَفِّرُ
عَنْكُمْ مِنْ سَيِّئَاتِكُمْ ۗ وَاللَّهُ
بِمَا تَعْمَلُونَ خَبِيرٌ ﴿٢٧١﴾

272. Onların doğru yola gəlməsi sənə aid deyildir. Yalnız Allah istədiyi şəxsi doğru yola yönəldir. Xərclədiyiniz hər bir sədəqə özünüz üçündür. Siz onu ancaq Allahın Üzünü dilədiyinizə görə (ixlasla) sərf edirsiniz. Malınızdan *Allah yolunda* nə xərcləsəniz, əvəzi sizə tam verilər və sizə zülm edilməz.

۞لَّيْسَ عَلَيْكَ هُدَىٰهُمْ وَلَٰكِنَّ ٱللَّهَ
يَهْدِى مَن يَشَآءُ ۗ وَمَا تُنفِقُوا۟ مِنْ خَيْرٍ
فَلِأَنفُسِكُمْ ۚ وَمَا تُنفِقُونَ إِلَّا
ٱبْتِغَآءَ وَجْهِ ٱللَّهِ ۚ وَمَا تُنفِقُوا۟ مِنْ خَيْرٍ
يُوَفَّ إِلَيْكُمْ وَأَنتُمْ لَا تُظْلَمُونَ ﴿٢٧٢﴾

273. *Sədəqə* Allah yolunda cihad edən və yer üzündə hərəkət edə bilməyən yoxsullar üçündür. *Bu adamlar* həya edib dilənmədiklərinə görə tanımayan adam onları varlı hesab edir. Sən onları üzlərindən tanıyırsan. Onlar insanlardan israrla *bir şey* istəməzlər. Şübhəsiz ki, Allah malınızdan nə sərf etdiyinizi bilir.

لِلْفُقَرَآءِ ٱلَّذِينَ أُحْصِرُوا۟ فِى سَبِيلِ
ٱللَّهِ لَا يَسْتَطِيعُونَ ضَرْبًا فِى
ٱلْأَرْضِ يَحْسَبُهُمُ ٱلْجَاهِلُ أَغْنِيَآءَ
مِنَ ٱلتَّعَفُّفِ تَعْرِفُهُم بِسِيمَٰهُمْ
لَا يَسْـَٔلُونَ ٱلنَّاسَ إِلْحَافًا ۗ وَمَا تُنفِقُوا۟
مِنْ خَيْرٍ فَإِنَّ ٱللَّهَ بِهِۦ عَلِيمٌ ﴿٢٧٣﴾

274. Mallarını gecə və gündüz, gizli və aşkar xərcləyənlərin öz Rəbbi yanında mükafatı vardır. Onlara heç bir qorxu yoxdur və onlar kədərlənməyəcəklər.

ٱلَّذِينَ يُنفِقُونَ أَمْوَٰلَهُم بِٱلَّيْلِ
وَٱلنَّهَارِ سِرًّا وَعَلَانِيَةً فَلَهُمْ
أَجْرُهُمْ عِندَ رَبِّهِمْ وَلَا خَوْفٌ
عَلَيْهِمْ وَلَا هُمْ يَحْزَنُونَ ﴿٢٧٤﴾

275. Sələm yeyənlər *qəbirlərindən* şeytan toxunub dəli eləmiş kimsənin qalxdığı kimi qalxarlar. Bu onların: "Alış-veriş də sələmçilik kimidir!"– demələrinə görədir. Halbuki, Allah alış-verişi halal, sələmçiliyi isə haram etmişdir. Hər kim özünə Rəbbindən xəbərdarlıq gəldikdən sonra *sələmçiliyə* son qoyarsa, olub-keçənlər ona bağışlanar və onun işi

ٱلَّذِينَ يَأْكُلُونَ ٱلرِّبَوٰا۟ لَا يَقُومُونَ إِلَّا
كَمَا يَقُومُ ٱلَّذِى يَتَخَبَّطُهُ ٱلشَّيْطَٰنُ مِنَ
ٱلْمَسِّ ۚ ذَٰلِكَ بِأَنَّهُمْ قَالُوٓا۟ إِنَّمَا ٱلْبَيْعُ مِثْلُ
ٱلرِّبَوٰا۟ ۗ وَأَحَلَّ ٱللَّهُ ٱلْبَيْعَ وَحَرَّمَ ٱلرِّبَوٰا۟ ۚ فَمَن
جَآءَهُۥ مَوْعِظَةٌ مِّن رَّبِّهِۦ فَٱنتَهَىٰ فَلَهُۥ
مَا سَلَفَ وَأَمْرُهُۥٓ إِلَى ٱللَّهِ ۖ وَمَنْ عَادَ فَأُو۟لَٰٓئِكَ
أَصْحَٰبُ ٱلنَّارِ ۖ هُمْ فِيهَا خَٰلِدُونَ ﴿٢٧٥﴾

Allaha qalar. *Sələmçiliyə* qayıdanlar isə Od sakinləridirlər. Onlar orada əbədi qalacaqlar.

276. Allah sələmi puç edir, sədəqələri isə artırır. Allah kafirləri və günahkarları sevməz.

يَمۡحَقُ ٱللَّهُ ٱلرِّبَوٰاْ وَيُرۡبِي ٱلصَّدَقَٰتِۗ وَٱللَّهُ
لَا يُحِبُّ كُلَّ كَفَّارٍ أَثِيمٍ ٢٧٦

277. Həqiqətən, iman gətirib saleh əməllər edən, namaz qılan və zəkat verənləri Rəbbinin yanında mükafatlar gözləyir. Onlara heç bir qorxu yoxdur və onlar kədərlənməyəcəklər.

إِنَّ ٱلَّذِينَ ءَامَنُواْ وَعَمِلُواْ ٱلصَّٰلِحَٰتِ
وَأَقَامُواْ ٱلصَّلَوٰةَ وَءَاتَوُاْ ٱلزَّكَوٰةَ لَهُمۡ
أَجۡرُهُمۡ عِندَ رَبِّهِمۡ وَلَا خَوۡفٌ عَلَيۡهِمۡ
وَلَا هُمۡ يَحۡزَنُونَ ٢٧٧

278. Ey iman gətirənlər! Allahdan qorxun və əgər möminsinizsə, sələmdən qalan faizi almayın.

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ ٱتَّقُواْ ٱللَّهَ وَذَرُواْ
مَا بَقِيَ مِنَ ٱلرِّبَوٰٓاْ إِن كُنتُم مُّؤۡمِنِينَ ٢٧٨

279. Bunu etməsəniz, Allahın və Onun Elçisinin sizə müharibə elan etdiyini bilin. Yox, əgər tövbə etsəniz, sərmayəniz sizindir. Nə siz zülm edərsiniz, nə də sizə zülm olunar.

فَإِن لَّمۡ تَفۡعَلُواْ فَأۡذَنُواْ بِحَرۡبٖ مِّنَ ٱللَّهِ
وَرَسُولِهِۦۖ وَإِن تُبۡتُمۡ فَلَكُمۡ رُءُوسُ
أَمۡوَٰلِكُمۡ لَا تَظۡلِمُونَ وَلَا تُظۡلَمُونَ ٢٧٩

280. Əgər borclu olan adam ağır şərait içindədirsə, onun vəziyyəti düzələnə qədər ona möhlət verin. Bilin ki, borcu bağışlamaq sizin üçün daha xeyirlidir.

وَإِن كَانَ ذُو عُسۡرَةٖ فَنَظِرَةٌ إِلَىٰ مَيۡسَرَةٖۚ
وَأَن تَصَدَّقُواْ خَيۡرٞ لَّكُمۡ إِن كُنتُمۡ
تَعۡلَمُونَ ٢٨٠

281. Allahın hüzuruna qaytarılacağınız gündən qorxun! Sonra hər kəsə qazandığının əvəzi büsbütün veriləcək və onlara zülm olunmayacaqdır.

وَٱتَّقُواْ يَوۡمٗا تُرۡجَعُونَ فِيهِ إِلَى ٱللَّهِۖ ثُمَّ تُوَفَّىٰ
كُلُّ نَفۡسٖ مَّا كَسَبَتۡ وَهُمۡ لَا يُظۡلَمُونَ ٢٨١

282. Ey iman gətirənlər! Müəyyən bir müddətədək bir-birinizə borc verdikdə onu yazın. Qoy bunu aranızda bir katib ədalətlə qeyd etsin. Katib Allahın onu öyrətdiyi kimi yazmaqdan boyun qaçırmamalıdır. Qoy o yazsın, borc alan da *götürdüyü borcun miqdarını* yazdırsın, Rəbbi olan Allahdan qorxsun və borcdan heç nə əskiltməsin. Əgər borc alan ağıldan zəif və ya acizdirsə və yaxud özü yazdırmağa qadir deyilsə, qoy onun *etibarlı* yaxın adamı *borcu* ədalətlə yazdırsın. Aranızdakı kişilərdən iki nəfəri şahid tutun. Əgər iki kişi olmazsa, razı olduğunuz şahidlərdən bir kişi və iki qadını *şahid tutun* ki, *qadınlardan* biri unutduqda, o birisi onun yadına salsın. Şahidlər *şahidlik etməyə* çağırıldıqda boyun qaçırmasınlar. Az da olsa, çox da olsa, *həmin məbləği və* onun vaxtını yazmaqdan usanmayın. Bu, Allah yanında daha ədalətli, şahidlik üçün daha düzgün və şübhəyə düşməməyiniz üçün daha münasibdir. Yalnız aranızda gedən nağd ticarət istisnadır. Bunu yazmamağınız isə sizin üçün günah deyildir. Alver etdikdə şahid tutun. Amma katibə və şahidə zərər verilməməlidir. Əgər *zərər* yetirsəniz, şübhəsiz ki, bu, sizin üçün günahdır. Allahdan qorxun, Allah da sizi öyrətsin. Allah hər şeyi bilir.

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوٓاْ إِذَا تَدَايَنتُم بِدَيۡنٍ إِلَىٰٓ
أَجَلٖ مُّسَمّٗى فَٱكۡتُبُوهُۚ وَلۡيَكۡتُب بَّيۡنَكُمۡ
كَاتِبُۢ بِٱلۡعَدۡلِۚ وَلَا يَأۡبَ كَاتِبٌ أَن يَكۡتُبَ
كَمَا عَلَّمَهُ ٱللَّهُۚ فَلۡيَكۡتُبۡ وَلۡيُمۡلِلِ ٱلَّذِي
عَلَيۡهِ ٱلۡحَقُّ وَلۡيَتَّقِ ٱللَّهَ رَبَّهُۥ وَلَا يَبۡخَسۡ
مِنۡهُ شَيۡـٔٗاۚ فَإِن كَانَ ٱلَّذِي عَلَيۡهِ ٱلۡحَقُّ سَفِيهًا
أَوۡ ضَعِيفًا أَوۡ لَا يَسۡتَطِيعُ أَن يُمِلَّ هُوَ فَلۡيُمۡلِلۡ
وَلِيُّهُۥ بِٱلۡعَدۡلِۚ وَٱسۡتَشۡهِدُواْ شَهِيدَيۡنِ مِن
رِّجَالِكُمۡۖ فَإِن لَّمۡ يَكُونَا رَجُلَيۡنِ فَرَجُلٞ
وَٱمۡرَأَتَانِ مِمَّن تَرۡضَوۡنَ مِنَ ٱلشُّهَدَآءِ أَن تَضِلَّ
إِحۡدَىٰهُمَا فَتُذَكِّرَ إِحۡدَىٰهُمَا ٱلۡأُخۡرَىٰۚ
وَلَا يَأۡبَ ٱلشُّهَدَآءُ إِذَا مَا دُعُواْۚ وَلَا تَسۡـَٔمُوٓاْ أَن
تَكۡتُبُوهُ صَغِيرًا أَوۡ كَبِيرًا إِلَىٰٓ أَجَلِهِۦۚ
ذَٰلِكُمۡ أَقۡسَطُ عِندَ ٱللَّهِ وَأَقۡوَمُ لِلشَّهَٰدَةِ
وَأَدۡنَىٰٓ أَلَّا تَرۡتَابُوٓاْ إِلَّآ أَن تَكُونَ تِجَٰرَةً حَاضِرَةٗ
تُدِيرُونَهَا بَيۡنَكُمۡ فَلَيۡسَ عَلَيۡكُمۡ جُنَاحٌ
أَلَّا تَكۡتُبُوهَاۗ وَأَشۡهِدُوٓاْ إِذَا تَبَايَعۡتُمۡۚ
وَلَا يُضَآرَّ كَاتِبٞ وَلَا شَهِيدٞۚ وَإِن تَفۡعَلُواْ
فَإِنَّهُۥ فُسُوقُۢ بِكُمۡۗ وَٱتَّقُواْ ٱللَّهَۖ
وَيُعَلِّمُكُمُ ٱللَّهُۗ وَٱللَّهُ بِكُلِّ شَيۡءٍ
عَلِيمٞ ٢٨٢

283. Əgər səfərdə olsanız və katib tapmasanız, *borc yiyəsinə* saxlanılması üçün girov verin. Əgər sizlərdən biri digərinə etibar edibsə, qoy etibar olunmuş kimsə ona verilmiş borcu qaytarsın və Rəbbi olan Allahdan qorxsun. Şahidliyi gizlətməyin. Kim onu gizlədirsə, şübhəsiz ki, qəlbi günahkardır. Allah nə etdiklərinizi bilir.

وَإِن كُنتُمْ عَلَىٰ سَفَرٍ وَلَمْ تَجِدُوا۟ كَاتِبًا
فَرِهَٰنٌ مَّقْبُوضَةٌ ۖ فَإِنْ أَمِنَ بَعْضُكُم بَعْضًا
فَلْيُؤَدِّ ٱلَّذِى ٱؤْتُمِنَ أَمَٰنَتَهُۥ وَلْيَتَّقِ ٱللَّهَ رَبَّهُۥ ۗ
وَلَا تَكْتُمُوا۟ ٱلشَّهَٰدَةَ ۚ وَمَن يَكْتُمْهَا
فَإِنَّهُۥٓ ءَاثِمٌ قَلْبُهُۥ ۗ وَٱللَّهُ بِمَا تَعْمَلُونَ عَلِيمٌ ﴿٢٨٣﴾

284. Göylərdə və yerdə nə varsa, Allahındır. Siz içərinizdə olanı üzə çıxarsanız da, gizlətsəniz də Allah buna görə sizi hesaba çəkəcək. O, istədiyini bağışlayar, istədiyinə də əzab verər. Allah hər şeyə qadirdir.

لِّلَّهِ مَا فِى ٱلسَّمَٰوَٰتِ وَمَا فِى ٱلْأَرْضِ ۗ وَإِن تُبْدُوا۟
مَا فِىٓ أَنفُسِكُمْ أَوْ تُخْفُوهُ يُحَاسِبْكُم
بِهِ ٱللَّهُ ۖ فَيَغْفِرُ لِمَن يَشَآءُ وَيُعَذِّبُ مَن يَشَآءُ ۗ
وَٱللَّهُ عَلَىٰ كُلِّ شَىْءٍ قَدِيرٌ ﴿٢٨٤﴾

285. Peyğəmbər öz Rəbbindən ona nazil edilənə iman gətirdi, möminlər də *iman gətirdilər*. Hamısı Allaha, Onun mələklərinə, kitablarına və elçilərinə iman gətirdilər. *Onlar dedilər*: "Biz Onun elçiləri arasında fərq qoymuruq!" Onlar dedilər: "Eşitdik və itaət etdik! Ey Rəbbimiz! Səndən bağışlanma diləyirik, dönüş də yalnız Sənədir!"

ءَامَنَ ٱلرَّسُولُ بِمَآ أُنزِلَ إِلَيْهِ مِن رَّبِّهِۦ
وَٱلْمُؤْمِنُونَ ۚ كُلٌّ ءَامَنَ بِٱللَّهِ
وَمَلَٰٓئِكَتِهِۦ وَكُتُبِهِۦ وَرُسُلِهِۦ
لَا نُفَرِّقُ بَيْنَ أَحَدٍ مِّن رُّسُلِهِۦ ۚ وَقَالُوا۟ سَمِعْنَا
وَأَطَعْنَا ۖ غُفْرَانَكَ رَبَّنَا وَإِلَيْكَ ٱلْمَصِيرُ ﴿٢٨٥﴾

286. Allah hər kəsi yalnız onun qüvvəsi çatdığı qədər mükəlləf edər. Hər kəsin qazandığı *xeyir yalnız* onun özünə, qazandığı *şər də yalnız* öz əleyhinədir. "Ey Rəbbimiz, unutsaq və ya xəta etsək bizi cəzalandırma! Ey Rəbbimiz, bizdən əvvəlkilərə yüklədiyin kimi, bizə də ağır yük yükləmə! Ey Rəbbimiz,

لَا يُكَلِّفُ ٱللَّهُ نَفْسًا إِلَّا وُسْعَهَا ۚ لَهَا مَا كَسَبَتْ
وَعَلَيْهَا مَا ٱكْتَسَبَتْ ۗ رَبَّنَا لَا تُؤَاخِذْنَآ إِن
نَّسِينَآ أَوْ أَخْطَأْنَا ۚ رَبَّنَا وَلَا تَحْمِلْ عَلَيْنَآ
إِصْرًا كَمَا حَمَلْتَهُۥ عَلَى ٱلَّذِينَ مِن
قَبْلِنَا ۚ رَبَّنَا وَلَا تُحَمِّلْنَا مَا لَا طَاقَةَ لَنَا بِهِۦ ۖ
وَٱعْفُ عَنَّا وَٱغْفِرْ لَنَا وَٱرْحَمْنَآ ۚ أَنتَ
مَوْلَىٰنَا فَٱنصُرْنَا عَلَى ٱلْقَوْمِ ٱلْكَٰفِرِينَ ﴿٢٨٦﴾

gücümüz çatmayan şeyi daşımağa
bizi vadar etmə! Bizi əfv et, bizi
bağışla və bizə rəhm et! Sən bizim
Himayədarımızsan! Kafirləri
məğlub etməkdə bizə yardım et!"



## Əli-İmran
## («İmranın ailəsi») surəsi

*Mərhəmətli və Rəhmli*
*Allahın adı ilə!*

1. Əlif. Ləm. Mim.

2. Allah. Ondan başqa *ibadətə layiq olan* məbud yoxdur, *əbədi* Yaşayandır, *bütün yaradılanların* Qəyyumudur.

3. O, sənə Kitabı gerçək olaraq, ondan əvvəlkiləri təsdiqləməsi üçün nazil etdi. Tövratı və İncili də O nazil etdi –

4. daha əvvəllər insanlara doğru yolu göstərən rəhbər olmaq üçün. Furqanı da O nazil etdi. Şübhəsiz ki, Allahın ayələrini inkar edənlər üçün şiddətli bir əzab vardır. Allah Qüdrətlidir, intiqam almağa qadirdir.

5. Şübhəsiz ki, nə yerdə, nə də göydə heç bir şey Allahdan gizli qalmaz.

6. Bətnlərdə sizə istədiyi surəti verən Odur. Ondan başqa *ibadətə layiq olan* məbud yoxdur, Qüdrətlidir, Müdrikdir.

7. Kitabı sənə nazil edən Odur. O Kitabın bir qismi mənası aydın ayələrdir ki, bunlar da Kitabın anasıdır. Digərləri isə mənası aydın olmayan ayələrdir. Qəlblərində əyrilik olanlar fitnə-fəsad törətmək

## سُورَةُ آلِ عِمۡرَانَ

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

الٓمٓ ١

ٱللَّهُ لَآ إِلَٰهَ إِلَّا هُوَ ٱلۡحَيُّ ٱلۡقَيُّومُ ٢

نَزَّلَ عَلَيۡكَ ٱلۡكِتَٰبَ بِٱلۡحَقِّ مُصَدِّقٗا لِّمَا بَيۡنَ
يَدَيۡهِ وَأَنزَلَ ٱلتَّوۡرَىٰةَ وَٱلۡإِنجِيلَ ٣

مِن قَبۡلُ هُدٗى لِّلنَّاسِ وَأَنزَلَ ٱلۡفُرۡقَانَۗ
إِنَّ ٱلَّذِينَ كَفَرُواْ بِـَٔايَٰتِ ٱللَّهِ لَهُمۡ عَذَابٞ
شَدِيدٞۗ وَٱللَّهُ عَزِيزٞ ذُو ٱنتِقَامٍ ٤

إِنَّ ٱللَّهَ لَا يَخۡفَىٰ عَلَيۡهِ شَيۡءٞ فِي ٱلۡأَرۡضِ
وَلَا فِي ٱلسَّمَآءِ ٥

هُوَ ٱلَّذِي يُصَوِّرُكُمۡ فِي ٱلۡأَرۡحَامِ كَيۡفَ يَشَآءُۚ
لَآ إِلَٰهَ إِلَّا هُوَ ٱلۡعَزِيزُ ٱلۡحَكِيمُ ٦

هُوَ ٱلَّذِيٓ أَنزَلَ عَلَيۡكَ ٱلۡكِتَٰبَ مِنۡهُ ءَايَٰتٞ
مُّحۡكَمَٰتٌ هُنَّ أُمُّ ٱلۡكِتَٰبِ وَأُخَرُ
مُتَشَٰبِهَٰتٞۖ فَأَمَّا ٱلَّذِينَ فِي قُلُوبِهِمۡ زَيۡغٞ فَيَتَّبِعُونَ
مَا تَشَٰبَهَ مِنۡهُ ٱبۡتِغَآءَ ٱلۡفِتۡنَةِ وَٱبۡتِغَآءَ تَأۡوِيلِهِۦۖ

və istədikləri kimi yozmaq məqsədilə mənası aydın olmayanın ardınca düşərlər. Onun yozumunu isə Allahdan başqa heç kəs bilməz. Elmdə qüvvətli olanlar isə deyərlər: “Biz onlara iman gətirdik, hamısı bizim Rəbbimizdəndir”. Bunu isə ancaq ağıl sahibləri dərk edərlər.

وَمَا يَعْلَمُ تَأْوِيلَهُۥٓ إِلَّا ٱللَّهُ ۗ وَٱلرَّٰسِخُونَ فِى
ٱلْعِلْمِ يَقُولُونَ ءَامَنَّا بِهِۦ كُلٌّ مِّنْ عِندِ رَبِّنَا ۗ
وَمَا يَذَّكَّرُ إِلَّآ أُو۟لُوا۟ ٱلْأَلْبَٰبِ ٧

8. Ey Rəbbimiz! Bizi hidayət yoluna yönəltdikdən sonra qəlbimizi sapdırma və bizə Öz tərəfindən mərhəmət bəxş et. Həqiqətən, Sən Bəxşedənsən.

رَبَّنَا لَا تُزِغْ قُلُوبَنَا بَعْدَ إِذْ هَدَيْتَنَا وَهَبْ لَنَا
مِن لَّدُنكَ رَحْمَةً ۚ إِنَّكَ أَنتَ ٱلْوَهَّابُ ٨

9. Ey Rəbbimiz! Həqiqətən, *gerçəkləşəcəyinə* şübhə edilməyən bir gündə insanları *bir yerə* Sən yığacaqsan. Həqiqətən, Allah vədinə xilaf çıxmaz!

رَبَّنَآ إِنَّكَ جَامِعُ ٱلنَّاسِ لِيَوْمٍ لَّا رَيْبَ فِيهِ ۚ
إِنَّ ٱللَّهَ لَا يُخْلِفُ ٱلْمِيعَادَ ٩

10. Kafir olanların nə malları, nə də övladları onlara Allahın hüzurunda heç bir şeylə fayda verə bilməz. Onlar Cəhənnəmin yanacağıdırlar.

إِنَّ ٱلَّذِينَ كَفَرُوا۟ لَن تُغْنِىَ عَنْهُمْ
أَمْوَٰلُهُمْ وَلَآ أَوْلَٰدُهُم مِّنَ ٱللَّهِ شَيْـًٔا ۖ
وَأُو۟لَٰٓئِكَ هُمْ وَقُودُ ٱلنَّارِ ١٠

11. *Onların əməli* Firon nəslinin və onlardan əvvəlkilərin əməlinə bənzəyir. Onlar Bizim ayələrimizi yalan hesab etdilər, Allah da onları günahlarına görə yaxaladı. Allah şiddətli cəza verəndir.

كَدَأْبِ ءَالِ فِرْعَوْنَ وَٱلَّذِينَ مِن
قَبْلِهِمْ ۚ كَذَّبُوا۟ بِـَٔايَٰتِنَا فَأَخَذَهُمُ ٱللَّهُ
بِذُنُوبِهِمْ ۗ وَٱللَّهُ شَدِيدُ ٱلْعِقَابِ ١١

12. Kafirlərə de: “Siz məğlub olacaq və Cəhənnəmə toplanılacaqsınız! Ora nə pis yataqdır!”

قُل لِّلَّذِينَ كَفَرُوا۟ سَتُغْلَبُونَ
وَتُحْشَرُونَ إِلَىٰ جَهَنَّمَ ۚ وَبِئْسَ ٱلْمِهَادُ ١٢

13. Qarşı-qarşıya gələn iki dəstədə sizin üçün bir ibrət var idi. Dəstələrdən

قَدْ كَانَ لَكُمْ ءَايَةٌ فِى فِئَتَيْنِ ٱلْتَقَتَا ۖ

biri Allah yolunda vuruşurdu, digəri isə kafirlər idi. Onlar kafirlərin sayca iki qat artıq olduqlarını öz gözləri ilə görürdülər. Allah istədiyi kəsi Öz köməyi ilə qüvvətləndirir. Həqiqətən, bunda bəsirət sahibləri üçün bir ibrət vardır.

فِئَةٌ تُقَاتِلُ فِي سَبِيلِ ٱللَّهِ وَأُخْرَىٰ
كَافِرَةٌ يَرَوْنَهُم مِّثْلَيْهِمْ رَأْيَ ٱلْعَيْنِ
وَٱللَّهُ يُؤَيِّدُ بِنَصْرِهِۦ مَن يَشَآءُ إِنَّ فِي
ذَٰلِكَ لَعِبْرَةً لِّأُوْلِي ٱلْأَبْصَٰرِ ﴿١٣﴾

14. Qadınların, uşaqların, yığın-yığın qızıl-gümüşün, yaxşı cins atların, mal-qaranın və əkin yerlərinin verdiyi zövqlərə olan istək insanların gözünə gözəl göstərilmişdir. Bunlar, dünya həyatının keçici zövqüdür, gözəl qayıdış yeri isə Allah yanındadır.

زُيِّنَ لِلنَّاسِ حُبُّ ٱلشَّهَوَٰتِ مِنَ ٱلنِّسَآءِ
وَٱلْبَنِينَ وَٱلْقَنَٰطِيرِ ٱلْمُقَنطَرَةِ مِنَ ٱلذَّهَبِ
وَٱلْفِضَّةِ وَٱلْخَيْلِ ٱلْمُسَوَّمَةِ وَٱلْأَنْعَٰمِ
وَٱلْحَرْثِ ذَٰلِكَ مَتَٰعُ ٱلْحَيَوٰةِ ٱلدُّنْيَا وَٱللَّهُ
عِندَهُۥ حُسْنُ ٱلْمَـَٔابِ ﴿١٤﴾

15. De: “Sizə bunlardan daha yaxşısı barədə xəbər verimmi? Allahdan qorxanlar üçün Rəbbi yanında *ağacları* altından çaylar axan, içində əbədi qalacaqları Cənnət bağları, pak zövcələr və Allahın rizası vardır”. Allah qullarını görür.

۞ قُلْ أَؤُنَبِّئُكُم بِخَيْرٍ مِّن ذَٰلِكُمْ
لِلَّذِينَ ٱتَّقَوْا عِندَ رَبِّهِمْ جَنَّٰتٌ تَجْرِي مِن
تَحْتِهَا ٱلْأَنْهَٰرُ خَٰلِدِينَ فِيهَا وَأَزْوَٰجٌ
مُّطَهَّرَةٌ وَرِضْوَٰنٌ مِّنَ ٱللَّهِ
وَٱللَّهُ بَصِيرٌۢ بِٱلْعِبَادِ ﴿١٥﴾

16. O kəslər ki: “Ey Rəbbimiz! Həqiqətən, biz iman gətirdik, bizim günahlarımızı bağışla və bizi Od əzabından qoru!”– deyirlər;

ٱلَّذِينَ يَقُولُونَ رَبَّنَآ إِنَّنَآ ءَامَنَّا فَٱغْفِرْ
لَنَا ذُنُوبَنَا وَقِنَا عَذَابَ ٱلنَّارِ ﴿١٦﴾

17. *onlar* səbir edən, doğru danışan, müti olan, *malından Allah yolunda* xərcləyən və sübh çağına yaxın bağışlanma diləyən kimsələrdir.

ٱلصَّٰبِرِينَ وَٱلصَّٰدِقِينَ وَٱلْقَٰنِتِينَ وَٱلْمُنفِقِينَ
وَٱلْمُسْتَغْفِرِينَ بِٱلْأَسْحَارِ ﴿١٧﴾

18. Allah Özündən başqa *ibadətə layiq olan* məbudun olmadığına şahidlik etdi, mələklər və elm sahibləri də

شَهِدَ ٱللَّهُ أَنَّهُۥ لَآ إِلَٰهَ إِلَّا هُوَ
وَٱلْمَلَٰٓئِكَةُ وَأُوْلُوا ٱلْعِلْمِ قَآئِمًۢا

*şahidlik etdilər. Allah əbədi olaraq* ədalətli olmaqdadır. Ondan başqa *ibadətə layiq olan* məbud yoxdur, Qüdrətlidir, Müdrikdir.

بِٱلۡقِسۡطِۚ لَآ إِلَٰهَ إِلَّا هُوَ ٱلۡعَزِيزُ
ٱلۡحَكِيمُ ١٨

**19.** Həqiqətən, Allah yanında *qəbul olunan* din, İslamdır! Kitab verilənlər ancaq özlərinə elm gəldikdən sonra aralarındakı zülm və həsəd üzündən ixtilafa düşdülər. Kim Allahın ayələrini inkar edərsə, *bilsin ki*, Allah tez haqq-hesab çəkəndir.

إِنَّ ٱلدِّينَ عِندَ ٱللَّهِ ٱلۡإِسۡلَٰمُۗ وَمَا ٱخۡتَلَفَ
ٱلَّذِينَ أُوتُواْ ٱلۡكِتَٰبَ إِلَّا مِنۢ بَعۡدِ
مَا جَآءَهُمُ ٱلۡعِلۡمُ بَغۡيَۢا بَيۡنَهُمۡۗ وَمَن يَكۡفُرۡ
بِـَٔايَٰتِ ٱللَّهِ فَإِنَّ ٱللَّهَ سَرِيعُ ٱلۡحِسَابِ ١٩

**20.** Əgər onlar səninlə mübahisə edərlərsə, de: "Mən özümü ardımca gələnlərlə birlikdə Allaha təslim etmişəm!" Kitab verilənlərə və savadsızlara isə de: "Siz də təslim oldunuzmu?" Əgər təslim olsalar, doğru yola yönəlmiş olarlar. Üz döndərsələr, *bil ki*, sənin öhdənə düşən ancaq *haqqı* təbliğ etməkdir. Allah qullarını görür.

فَإِنۡ حَآجُّوكَ فَقُلۡ أَسۡلَمۡتُ وَجۡهِيَ لِلَّهِ
وَمَنِ ٱتَّبَعَنِۗ وَقُل لِّلَّذِينَ أُوتُواْ ٱلۡكِتَٰبَ
وَٱلۡأُمِّيِّـۧنَ ءَأَسۡلَمۡتُمۡۚ فَإِنۡ أَسۡلَمُواْ فَقَدِ
ٱهۡتَدَواْۖ وَّإِن تَوَلَّوۡاْ فَإِنَّمَا عَلَيۡكَ ٱلۡبَلَٰغُۗ
وَٱللَّهُ بَصِيرُۢ بِٱلۡعِبَادِ ٢٠

**21.** Allahın ayələrini inkar edənləri, peyğəmbərləri haqsız yerə öldürənləri və ədalətə çağıran insanları öldürənləri ağrılı-acılı bir əzabla müjdələ.

إِنَّ ٱلَّذِينَ يَكۡفُرُونَ بِـَٔايَٰتِ ٱللَّهِ
وَيَقۡتُلُونَ ٱلنَّبِيِّـۧنَ بِغَيۡرِ حَقّٖ وَيَقۡتُلُونَ
ٱلَّذِينَ يَأۡمُرُونَ بِٱلۡقِسۡطِ مِنَ ٱلنَّاسِ
فَبَشِّرۡهُم بِعَذَابٍ أَلِيمٍ ٢١

**22.** Onların əməlləri həm bu dünyada, həm də axirətdə heç olacaq, onların yardımçıları da olmayacaqdır.

أُوْلَٰٓئِكَ ٱلَّذِينَ حَبِطَتۡ أَعۡمَٰلُهُمۡ فِي ٱلدُّنۡيَا
وَٱلۡأٓخِرَةِ وَمَا لَهُم مِّن نَّٰصِرِينَ ٢٢

**23.** Kitabdan özlərinə bir pay verilmiş kəsləri görmədinmi? Onlar, aralarında hökm versin deyə, Allahın Kitabına dəvət olunurlar, sonra da onlardan bir dəstə *haqdan* üz çevirir.

أَلَمۡ تَرَ إِلَى ٱلَّذِينَ أُوتُواْ نَصِيبٗا مِّنَ ٱلۡكِتَٰبِ
يُدۡعَوۡنَ إِلَىٰ كِتَٰبِ ٱللَّهِ لِيَحۡكُمَ بَيۡنَهُمۡ ثُمَّ يَتَوَلَّىٰ
فَرِيقٞ مِّنۡهُمۡ وَهُم مُّعۡرِضُونَ ٢٣

**24.** Bu, onların: “Od bizə ancaq bir neçə gün toxunar!”– dedmələrinə görədir. Onları uydurduqları şeylər öz dinlərində aldadıb yoldan çıxartdı.

ذلك بأنهم قالوا لن تمسنا النار إلا
أياما معدودات ۖ وغرهم في دينهم
ما كانوا يفترون ﴿٢٤﴾

**25.** *Baş verəcəyinə* şübhə edilməyən bir gündə onları topladığımız və hər kəsə qazandığının əvəzi ödəniləcəyi, özlərinə də heç bir haqsızlıq edilməyəcəyi zaman *onların halı* necə olacaq?

فكيف إذا جمعناهم ليوم لا ريب فيه
ووفيت كل نفس ما كسبت وهم
لا يظلمون ﴿٢٥﴾

**26.** De: “Ey mülkün sahibi Allahım! Sən istədiyin kəsə mülkü verir və istədiyindən də onu geri alırsan; istədiyin kimsəni yüksəldir və istədiyini də alçaldırsan. Xeyir *yalnız* Sənin Əlindədir. Həqiqətən, Sən hər şeyə qadirsən.

قل اللهم مالك الملك تؤتي الملك من
تشاء وتنزع الملك ممن تشاء وتعز
من تشاء وتذل من تشاء ۖ بيدك الخير ۖ
إنك على كل شيء قدير ﴿٢٦﴾

**27.** Sən gecəni gündüzə qatır, gündüzü də gecəyə qatırsan; ölüdən diri çıxarır, diridən isə ölü çıxarırsan. Sən istədiyin kəsə hesabsız ruzi verirsən”.

تولج الليل في النهار وتولج النهار في الليل ۖ
وتخرج الحي من الميت وتخرج الميت من
الحي ۖ وترزق من تشاء بغير حساب ﴿٢٧﴾

**28.** Möminlər möminləri qoyub kafirləri dost tutmasınlar! Bunu edən kimsə *bilsin ki*, Allah ilə *onun* heç bir əlaqəsi yoxdur. Ancaq onlardan *gələn təhlükədən* çəkinməklə ehtiyat etməyiniz istisnadır. Allah sizi Özündən çəkindirir (Öz əzabı ilə qorxudur). Dönüş də ancaq Allahadır.

لا يتخذ المؤمنون الكافرين أولياء من دون
المؤمنين ۖ ومن يفعل ذلك فليس من الله في
شيء إلا أن تتقوا منهم تقاة ۗ ويحذركم
الله نفسه ۗ وإلى الله المصير ﴿٢٨﴾

**29.** De: “Kökslərinizdə olanı gizlətsəniz də, üzə çıxarsanız da, Allah onu bilir. O, göylərdə və yerdə olanları da bilir. Allah hər şeyə qadirdir.

قل إن تخفوا ما في صدوركم أو تبدوه
يعلمه الله ۗ ويعلم ما في السماوات وما في
الأرض ۗ والله على كل شيء قدير ﴿٢٩﴾

30. O gün ki, hər kəs etdiyi yaxşı və pis əməllərini *qarşısında* hazır görəcək, özü ilə *pis əməllərinin* arasında çox böyük məsafə olmasını arzulayacaqdır. Allah sizi Özündən çəkindirir (Öz əzabı ilə qorxudur). Allah qullarına Şəfqətlidir".

يَوۡمَ تَجِدُ كُلُّ نَفۡسٖ مَّا عَمِلَتۡ مِنۡ خَيۡرٖ
مُّحۡضَرٗا وَمَا عَمِلَتۡ مِن سُوٓءٖ تَوَدُّ لَوۡ أَنَّ بَيۡنَهَا
وَبَيۡنَهُۥٓ أَمَدَۢا بَعِيدٗاۗ وَيُحَذِّرُكُمُ ٱللَّهُ نَفۡسَهُۥۗ
وَٱللَّهُ رَءُوفُۢ بِٱلۡعِبَادِ ٣٠

31. De: "Əgər siz Allahı sevirsinizsə, mənim ardımca gəlin ki, Allah da sizi sevsin və günahlarınızı bağışlasın. Allah Bağışlayandır, Rəhmlidir".

قُلۡ إِن كُنتُمۡ تُحِبُّونَ ٱللَّهَ فَٱتَّبِعُونِي
يُحۡبِبۡكُمُ ٱللَّهُ وَيَغۡفِرۡ لَكُمۡ ذُنُوبَكُمۡۚ
وَٱللَّهُ غَفُورٞ رَّحِيمٞ ٣١

32. De: "Allaha və *göndərdiyi* Elçiyə itaət edin!" Əgər üz döndərərlərsə, şübhəsiz ki, Allah kafirləri sevməz.

قُلۡ أَطِيعُواْ ٱللَّهَ وَٱلرَّسُولَۖ فَإِن تَوَلَّوۡاْ فَإِنَّ ٱللَّهَ
لَا يُحِبُّ ٱلۡكَٰفِرِينَ ٣٢

33. Allah Adəmi, Nuhu, İbrahimin *mömin* nəslini və İmranın *mömin* nəslini seçib aləmlərdən üstün etdi.

۞إِنَّ ٱللَّهَ ٱصۡطَفَىٰٓ ءَادَمَ وَنُوحٗا وَءَالَ إِبۡرَٰهِيمَ
وَءَالَ عِمۡرَٰنَ عَلَى ٱلۡعَٰلَمِينَ ٣٣

34. Onlar biri digərindən olan *hənif* bir nəsil idilər. Allah Eşidəndir, Biləndir.

ذُرِّيَّةَۢ بَعۡضُهَا مِنۢ بَعۡضٖۗ وَٱللَّهُ سَمِيعٌ عَلِيمٌ ٣٤

35. Bir zaman İmranın arvadı demişdi: "Ey Rəbbim! Mən bətnimdəkini Sənə qul olmaq üçün nəzir etdim. Məndən qəbul et! Həqiqətən, Sən Eşidənsən, Bilənsən".

إِذۡ قَالَتِ ٱمۡرَأَتُ عِمۡرَٰنَ رَبِّ إِنِّي نَذَرۡتُ لَكَ
مَا فِي بَطۡنِي مُحَرَّرٗا فَتَقَبَّلۡ مِنِّيٓۖ إِنَّكَ أَنتَ
ٱلسَّمِيعُ ٱلۡعَلِيمُ ٣٥

36. Ondan azad olduğu zaman demişdi: "Ey Rəbbim! Mənim qızım oldu" – Allah onun nə doğduğunu daha yaxşı bilirdi, – "axı oğlan qız kimi deyildir. Mən onun adını Məryəm qoydum, onu və onun nəslini lənətlənmiş şeytandan *qorunmağı* Sənə həvalə edirəm".

فَلَمَّا وَضَعَتۡهَا قَالَتۡ رَبِّ إِنِّي وَضَعۡتُهَآ أُنثَىٰ وَٱللَّهُ
أَعۡلَمُ بِمَا وَضَعَتۡ وَلَيۡسَ ٱلذَّكَرُ كَٱلۡأُنثَىٰۖ وَإِنِّي
سَمَّيۡتُهَا مَرۡيَمَ وَإِنِّيٓ أُعِيذُهَا بِكَ وَذُرِّيَّتَهَا
مِنَ ٱلشَّيۡطَٰنِ ٱلرَّجِيمِ ٣٦

37. Rəbbi onu yaxşı tərzdə qəbul etdi, onu gözəl bir bitki kimi yetişdirdi və onu Zəkəriyyaya həvalə etdi. Zəkəriyya hər dəfə onun yanına ibadətgaha daxil olduqda, onun yanında ruzi olduğunu görərdi. O dedi: "Ey Məryəm! Bu, sənin üçün haradandır?" *Məryəm* dedi: "Bu, Allah tərəfindəndir. Həqiqətən, Allah istədiyi kimsəyə hesabsız ruzi verir".

فَتَقَبَّلَهَا رَبُّهَا بِقَبُولٍ حَسَنٍ وَأَنۢبَتَهَا نَبَاتًا حَسَنًا وَكَفَّلَهَا زَكَرِيَّا ۖ كُلَّمَا دَخَلَ عَلَيۡهَا زَكَرِيَّا ٱلۡمِحۡرَابَ وَجَدَ عِندَهَا رِزۡقًا ۖ قَالَ يَٰمَرۡيَمُ أَنَّىٰ لَكِ هَٰذَا ۖ قَالَتۡ هُوَ مِنۡ عِندِ ٱللَّهِ ۖ إِنَّ ٱللَّهَ يَرۡزُقُ مَن يَشَآءُ بِغَيۡرِ حِسَابٍ ٣٧

38. Elə oradaca Zəkəriyya Rəbbinə dua edərək dedi: "Ey Rəbbim! Öz tərəfindən mənə pak bir nəsil bəxş et! Şübhəsiz ki, Sən duaları Eşidənsən".

هُنَالِكَ دَعَا زَكَرِيَّا رَبَّهُۥ ۖ قَالَ رَبِّ هَبۡ لِي مِن لَّدُنكَ ذُرِّيَّةً طَيِّبَةً ۖ إِنَّكَ سَمِيعُ ٱلدُّعَآءِ ٣٨

39. O, mehrabda durub namaz qılarkən mələklər onu çağırdılar: "Allah səni, Allah tərəfindən olan Kəlməni təsdiq edən, *qövmünün* ağası, nəfsinə hakim və əməlisalehlərdən bir peyğəmbər olacaq Yəhya ilə müjdələyir".

فَنَادَتۡهُ ٱلۡمَلَٰٓئِكَةُ وَهُوَ قَآئِمٌ يُصَلِّي فِي ٱلۡمِحۡرَابِ أَنَّ ٱللَّهَ يُبَشِّرُكَ بِيَحۡيَىٰ مُصَدِّقًۢا بِكَلِمَةٍ مِّنَ ٱللَّهِ وَسَيِّدًا وَحَصُورًا وَنَبِيًّا مِّنَ ٱلصَّٰلِحِينَ ٣٩

40. O dedi: "Ey Rəbbim! Qocalıq məni haqladığı vaxt, zövcəm də sonsuz ikən mənim necə oğlum ola bilər?" *Allah* dedi: "Allah beləcə istədiyini edər".

قَالَ رَبِّ أَنَّىٰ يَكُونُ لِي غُلَٰمٌ وَقَدۡ بَلَغَنِيَ ٱلۡكِبَرُ وَٱمۡرَأَتِي عَاقِرٌ ۖ قَالَ كَذَٰلِكَ ٱللَّهُ يَفۡعَلُ مَا يَشَآءُ ٤٠

41. O dedi: "Ey Rəbbim! Mənim üçün bir əlamət təyin et". *Allah* dedi: "Sənin əlamətin, üç gün insanlarla ancaq işarə ilə danışmaq olacaqdır. *Həmin vaxtda* Rəbbini çox yad et və səhər-axşam *Onun şəninə* təriflər de!"

قَالَ رَبِّ ٱجۡعَل لِّيٓ ءَايَةً ۖ قَالَ ءَايَتُكَ أَلَّا تُكَلِّمَ ٱلنَّاسَ ثَلَٰثَةَ أَيَّامٍ إِلَّا رَمۡزًا ۗ وَٱذۡكُر رَّبَّكَ كَثِيرًا وَسَبِّحۡ بِٱلۡعَشِيِّ وَٱلۡإِبۡكَٰرِ ٤١

42. Bir zaman mələklər dedilər: "Ey Məryəm! Həqiqətən, Allah səni seçdi, təmizlədi və seçib aləmlərin qadınlarından üstün etdi.

وَإِذۡ قَالَتِ ٱلۡمَلَٰٓئِكَةُ يَٰمَرۡيَمُ إِنَّ ٱللَّهَ ٱصۡطَفَىٰكِ وَطَهَّرَكِ وَٱصۡطَفَىٰكِ عَلَىٰ نِسَآءِ ٱلۡعَٰلَمِينَ ٤٢

**43.** Ey Məryəm! Rəbbinə itaət et, səcdə qıl və rükuya gedənlərlə birlikdə rükuya get!"

يَٰمَرۡيَمُ ٱقۡنُتِي لِرَبِّكِ وَٱسۡجُدِي
وَٱرۡكَعِي مَعَ ٱلرَّٰكِعِينَ ٤٣

**44.** Bunlar qeyb xəbərlərindəndir ki, onu sənə vəhy edirik. Hansının Məryəmi himayə edəcəyi barədə qələmlərini *püşk* atdıqları zaman sən onların yanında deyildin. Bir-birilərilə mübahisə etdikdə də sən onların yanında deyildin.

ذَٰلِكَ مِنۡ أَنۢبَآءِ ٱلۡغَيۡبِ نُوحِيهِ إِلَيۡكَۚ وَمَا كُنتَ
لَدَيۡهِمۡ إِذۡ يُلۡقُونَ أَقۡلَٰمَهُمۡ أَيُّهُمۡ يَكۡفُلُ مَرۡيَمَ
وَمَا كُنتَ لَدَيۡهِمۡ إِذۡ يَخۡتَصِمُونَ ٤٤

**45.** O zaman mələklər dedilər: "Ey Məryəm! Həqiqətən, Allah səni Öz tərəfindən, adı Məryəm oğlu İsa Məsih olan bir kəlmə ilə müjdələyir. O, bu dünyada və axirətdə şan-şöhrətli və *Allaha* yaxınlaşdırılmışlardan olacaqdır.

إِذۡ قَالَتِ ٱلۡمَلَٰٓئِكَةُ يَٰمَرۡيَمُ إِنَّ ٱللَّهَ
يُبَشِّرُكِ بِكَلِمَةٖ مِّنۡهُ ٱسۡمُهُ ٱلۡمَسِيحُ
عِيسَى ٱبۡنُ مَرۡيَمَ وَجِيهٗا فِي ٱلدُّنۡيَا
وَٱلۡأٓخِرَةِ وَمِنَ ٱلۡمُقَرَّبِينَ ٤٥

**46.** O, *həm* beşikdə ikən, *həm də* yetkin çağında insanlarla danışacaqdır və salehlərdən olacaqdır".

وَيُكَلِّمُ ٱلنَّاسَ فِي ٱلۡمَهۡدِ وَكَهۡلٗا
وَمِنَ ٱلصَّٰلِحِينَ ٤٦

**47.** *Məryəm* dedi: "Ey Rəbbim! Mənə bir insan toxunmadığı bir halda necə övladım ola bilər?" *Allah* dedi: "Allah beləcə istədiyini yaradır. O, bir işin olmasını istədikdə ona ancaq "Ol!"– deyir, o da olur".

قَالَتۡ رَبِّ أَنَّىٰ يَكُونُ لِي وَلَدٞ وَلَمۡ يَمۡسَسۡنِي
بَشَرٞۖ قَالَ كَذَٰلِكِ ٱللَّهُ يَخۡلُقُ مَا يَشَآءُۚ إِذَا قَضَىٰٓ
أَمۡرٗا فَإِنَّمَا يَقُولُ لَهُۥ كُن فَيَكُونُ ٤٧

**48.** Allah ona yazmağı, hikməti, Tövratı və İncili öyrədəcək.

وَيُعَلِّمُهُ ٱلۡكِتَٰبَ وَٱلۡحِكۡمَةَ وَٱلتَّوۡرَىٰةَ
وَٱلۡإِنجِيلَ ٤٨

**49.** *Allah onu* İsrail oğullarına bir elçi edəcəkdir. *O deyəcəkdir*: "Mən sizə Rəbbinizdən *elçi olduğumu təsdiqləyən* bir əlamət gətirdim. Mən

وَرَسُولًا إِلَىٰ بَنِيٓ إِسۡرَٰٓءِيلَ أَنِّي قَدۡ
جِئۡتُكُم بِـَٔايَةٖ مِّن رَّبِّكُمۡ أَنِّيٓ أَخۡلُقُ
لَكُم مِّنَ ٱلطِّينِ كَهَيۡـَٔةِ ٱلطَّيۡرِ فَأَنفُخُ فِيهِ

sizin üçün palçıqdan quşa bənzər bir şey düzəldib ona üfürərəm, o da Allahın izni ilə quş olar. Allahın izni ilə anadangəlmə koru, cüzam xəstəliyinə tutulanı sağaldar və ölüləri diriltdərəm. Evlərinizdə yediyiniz və saxladığınız şeyləri sizə xəbər verərəm. Əgər möminsinizsə, şübhəsiz ki, bunda sizin üçün dəlil vardır.

فَيَكُونُ طَيْرًا بِإِذْنِ اللَّهِ ۖ وَأُبْرِئُ الْأَكْمَهَ
وَالْأَبْرَصَ وَأُحْيِي الْمَوْتَىٰ بِإِذْنِ اللَّهِ ۖ وَأُنَبِّئُكُم
بِمَا تَأْكُلُونَ وَمَا تَدَّخِرُونَ فِي بُيُوتِكُمْ ۚ إِنَّ فِي
ذَٰلِكَ لَآيَةً لَّكُمْ إِن كُنتُم مُّؤْمِنِينَ ﴿٤٩﴾

50. Məndən əvvəl *nazil olmuş* Tövratı təsdiqləyici kimi və sizə haram edilmiş bəzi şeyləri halal etmək üçün *göndərildim.* Mən sizə Rəbbinizdən bir dəlil gətirdim. Allahdan qorxun və mənə itaət edin.

وَمُصَدِّقًا لِّمَا بَيْنَ يَدَيَّ مِنَ التَّوْرَاةِ
وَلِأُحِلَّ لَكُم بَعْضَ الَّذِي حُرِّمَ
عَلَيْكُمْ ۚ وَجِئْتُكُم بِآيَةٍ مِّن رَّبِّكُمْ
فَاتَّقُوا اللَّهَ وَأَطِيعُونِ ﴿٥٠﴾

51. Həqiqətən, Allah mənim də Rəbbim, sizin də Rəbbinizdir. Ona ibadət edin! *Çünki* bu, düz yoldur".

إِنَّ اللَّهَ رَبِّي وَرَبُّكُمْ فَاعْبُدُوهُ ۗ هَٰذَا
صِرَاطٌ مُّسْتَقِيمٌ ﴿٥١﴾

52. İsa onlardakı küfrü hiss etdikdə dedi: "Allah yolunda kimlər mənə yardımçı olacaq?" Həvarilər dedilər: "Bizik Allahın *dininin* yardımçıları! Biz Allaha iman gətirdik. Sən də şahid ol ki, biz müsəlmanlarıq!

۞ فَلَمَّا أَحَسَّ عِيسَىٰ مِنْهُمُ الْكُفْرَ
قَالَ مَنْ أَنصَارِي إِلَى اللَّهِ ۖ قَالَ الْحَوَارِيُّونَ
نَحْنُ أَنصَارُ اللَّهِ آمَنَّا بِاللَّهِ وَاشْهَدْ
بِأَنَّا مُسْلِمُونَ ﴿٥٢﴾

53. Ey Rəbbimiz! Biz sənin nazil etdiyinə iman gətirdik və *göndərdiyin* elçinin ardınca getdik. Bizi də şahidlərlə bir yerdə yaz!"

رَبَّنَا آمَنَّا بِمَا أَنزَلْتَ وَاتَّبَعْنَا الرَّسُولَ
فَاكْتُبْنَا مَعَ الشَّاهِدِينَ ﴿٥٣﴾

54. Onlar hiylə qurdular, Allah da hiylə qurdu. Allah *hiylə quranlara qarşı* hiylə quranların ən xeyirlisidir.

وَمَكَرُوا وَمَكَرَ اللَّهُ ۖ وَاللَّهُ خَيْرُ
الْمَاكِرِينَ ﴿٥٤﴾

55. O vaxt Allah dedi: “Ey İsa! Mən sənin həyatına son qoyub Özümə tərəf qaldıracağam, səni kafirlərdən təmizləyəcək və sənin ardınca gedənləri Qiyamət gününə qədər kafirlərdən üstün edəcəyəm. Sonra sizin dönüşünüz Mənə olacaq. Mən də ixtilafa düşdüyünüz şeylər barəsində sizin aranızda hökm verəcəyəm.

إِذۡ قَالَ ٱللَّهُ يَٰعِيسَىٰٓ إِنِّي مُتَوَفِّيكَ وَرَافِعُكَ
إِلَيَّ وَمُطَهِّرُكَ مِنَ ٱلَّذِينَ كَفَرُواْ وَجَاعِلُ
ٱلَّذِينَ ٱتَّبَعُوكَ فَوۡقَ ٱلَّذِينَ كَفَرُوٓاْ إِلَىٰ
يَوۡمِ ٱلۡقِيَٰمَةِۖ ثُمَّ إِلَيَّ مَرۡجِعُكُمۡ فَأَحۡكُمُ
بَيۡنَكُمۡ فِيمَا كُنتُمۡ فِيهِ تَخۡتَلِفُونَ ٥٥

56. Kafirlərə isə bu dünyada və axirətdə şiddətli əzab verəcəyəm. Onların köməkçiləri də olmayacaqdır”.

فَأَمَّا ٱلَّذِينَ كَفَرُواْ فَأُعَذِّبُهُمۡ عَذَابٗا شَدِيدٗا
فِي ٱلدُّنۡيَا وَٱلۡأٓخِرَةِ وَمَا لَهُم مِّن نَّٰصِرِينَ ٥٦

57. *Allah* iman gətirib saleh əməllər işlədənlərin mükafatlarını tam verəcəkdir. Allah zalımları sevmir.

وَأَمَّا ٱلَّذِينَ ءَامَنُواْ وَعَمِلُواْ ٱلصَّٰلِحَٰتِ
فَيُوَفِّيهِمۡ أُجُورَهُمۡۗ وَٱللَّهُ لَا يُحِبُّ ٱلظَّٰلِمِينَ ٥٧

58. Bunlar sənə oxuduğumuz ayələrdən və hikmətli Zikrdəndir.

ذَٰلِكَ نَتۡلُوهُ عَلَيۡكَ مِنَ ٱلۡأٓيَٰتِ وَٱلذِّكۡرِ
ٱلۡحَكِيمِ ٥٨

59. Həqiqətən, Allah yanında İsanın məsəli Adəmin məsəli kimidir. *Allah* onu torpaqdan yaratdı, sonra isə ona “Ol!”– dedi, o da oldu.

إِنَّ مَثَلَ عِيسَىٰ عِندَ ٱللَّهِ كَمَثَلِ
ءَادَمَۖ خَلَقَهُۥ مِن تُرَابٖ ثُمَّ قَالَ لَهُۥ كُن فَيَكُونُ ٥٩

60. Haqq sənin Rəbbindəndir. Elə isə heç vaxt şübhə edənlərdən olma.

ٱلۡحَقُّ مِن رَّبِّكَ فَلَا تَكُن مِّنَ
ٱلۡمُمۡتَرِينَ ٦٠

61. Sənə bilik gəldikdən sonra kim səninlə *İsanın* barəsində mübahisə edərsə, de: “Gəlin oğullarımızı və oğullarınızı, qadınlarımızı və qadınlarınızı, özümüzü və özünüzü çağıraq, sonra isə dua edib

فَمَنۡ حَآجَّكَ فِيهِ مِنۢ بَعۡدِ مَا جَآءَكَ مِنَ ٱلۡعِلۡمِ
فَقُلۡ تَعَالَوۡاْ نَدۡعُ أَبۡنَآءَنَا وَأَبۡنَآءَكُمۡ
وَنِسَآءَنَا وَنِسَآءَكُمۡ وَأَنفُسَنَا وَأَنفُسَكُمۡ ثُمَّ
نَبۡتَهِلۡ فَنَجۡعَل لَّعۡنَتَ ٱللَّهِ عَلَى ٱلۡكَٰذِبِينَ ٦١

yalançılara Allahın lənət etməsini diləyək".

62. Həqiqətən, bu, gerçək bir hekayətdir. Allahdan başqa *ibadətə layiq olan* məbud yoxdur. Şübhəsiz ki, Allah Qüdrətlidir, Müdrikdir.

إِنَّ هَٰذَا لَهُوَ ٱلْقَصَصُ ٱلْحَقُّ ۚ وَمَا مِنْ إِلَٰهٍ
إِلَّا ٱللَّهُ ۚ وَإِنَّ ٱللَّهَ لَهُوَ ٱلْعَزِيزُ ٱلْحَكِيمُ ٦٢

63. Əgər onlar üz döndərsələr, şübhəsiz ki, Allah fitnə-fəsad törədənləri tanıyır.

فَإِن تَوَلَّوْا۟ فَإِنَّ ٱللَّهَ عَلِيمٌۢ بِٱلْمُفْسِدِينَ ٦٣

64. De: "Ey Kitab əhli! Bizim və sizin aranızda olan eyni bir kəlməyə gəlin ki, Allahdan başqasına ibadət etməyək, Ona heç bir şeyi şərik qoşmayaq və Allahı qoyub bir-birimizi ilahiləşdirməyək". Əgər onlar üz döndərsələr, deyin: "Şahid olun ki, biz müsəlmanlarıq!"

قُلْ يَٰٓأَهْلَ ٱلْكِتَٰبِ تَعَالَوْا۟ إِلَىٰ كَلِمَةٍ
سَوَآءٍۭ بَيْنَنَا وَبَيْنَكُمْ أَلَّا نَعْبُدَ إِلَّا ٱللَّهَ
وَلَا نُشْرِكَ بِهِۦ شَيْـًٔا وَلَا يَتَّخِذَ بَعْضُنَا بَعْضًا
أَرْبَابًا مِّن دُونِ ٱللَّهِ ۚ فَإِن تَوَلَّوْا۟ فَقُولُوا۟
ٱشْهَدُوا۟ بِأَنَّا مُسْلِمُونَ ٦٤

65. Ey Kitab əhli! Nə üçün İbrahim barəsində höcətləşirsiniz? Tövrat və İncil ancaq ondan sonra nazil edilmişdir, məgər anlamırsınız?

يَٰٓأَهْلَ ٱلْكِتَٰبِ لِمَ تُحَآجُّونَ فِىٓ إِبْرَٰهِيمَ
وَمَآ أُنزِلَتِ ٱلتَّوْرَىٰةُ وَٱلْإِنجِيلُ إِلَّا مِنۢ
بَعْدِهِۦٓ ۚ أَفَلَا تَعْقِلُونَ ٦٥

66. Bax, siz o kəslərsiniz ki, bildiyiniz şeylər barəsində höcətləşirsiniz. Bəs nə üçün bilmədiyiniz şeylər barəsində höcətləşirsiniz? Allah bilir, siz bilmirsiniz!

هَٰٓأَنتُمْ هَٰٓؤُلَآءِ حَٰجَجْتُمْ فِيمَا لَكُم
بِهِۦ عِلْمٌ فَلِمَ تُحَآجُّونَ فِيمَا لَيْسَ لَكُم
بِهِۦ عِلْمٌ ۚ وَٱللَّهُ يَعْلَمُ وَأَنتُمْ لَا تَعْلَمُونَ ٦٦

67. İbrahim nə yəhudi, nə də nəsrani idi. O, ancaq hənif bir müsəlman idi və müşriklərdən deyildi.

مَا كَانَ إِبْرَٰهِيمُ يَهُودِيًّا وَلَا نَصْرَانِيًّا
وَلَٰكِن كَانَ حَنِيفًا مُّسْلِمًا وَمَا كَانَ
مِنَ ٱلْمُشْرِكِينَ ٦٧

68. Həqiqətən, insanlardan İbrahimə ən yaxın olanı, onun ardınca gedənlər,

إِنَّ أَوْلَى ٱلنَّاسِ بِإِبْرَٰهِيمَ لَلَّذِينَ ٱتَّبَعُوهُ وَهَٰذَا

bu Peyğəmbər və iman gətirənlərdir. Allah möminlərin Himayədarıdır.

النَّبِيُّ وَالَّذِينَ آمَنُوا ۗ وَاللَّهُ وَلِيُّ الْمُؤْمِنِينَ ﴿٦٨﴾

69. Kitab əhlindən bir zümrə sizi azdırmaq istər. Onlar ancaq özlərini azdırırlar və *bunu da* hiss etmirlər.

وَدَّت طَّائِفَةٌ مِّنْ أَهْلِ الْكِتَابِ لَوْ يُضِلُّونَكُمْ
وَمَا يُضِلُّونَ إِلَّا أَنفُسَهُمْ وَمَا يَشْعُرُونَ ﴿٦٩﴾

70. Ey Kitab əhli! *Haqqa* şahid olduğunuz halda nə üçün Allahın ayələrini inkar edirsiniz?

يَا أَهْلَ الْكِتَابِ لِمَ تَكْفُرُونَ بِآيَاتِ اللَّهِ
وَأَنتُمْ تَشْهَدُونَ ﴿٧٠﴾

71. Ey Kitab əhli! Nə üçün siz bilə-bilə haqqa batil donu geyindirir və haqqı gizlədirsiniz?

يَا أَهْلَ الْكِتَابِ لِمَ تَلْبِسُونَ الْحَقَّ بِالْبَاطِلِ
وَتَكْتُمُونَ الْحَقَّ وَأَنتُمْ تَعْلَمُونَ ﴿٧١﴾

72. Kitab əhlindən bir zümrə dedi: "Möminlərə nazil edilənə günün əvvəlində iman gətirin və *günün* sonunda inkar edin ki, bəlkə onlar *öz dinlərindən* dönələr.

وَقَالَت طَّائِفَةٌ مِّنْ أَهْلِ الْكِتَابِ آمِنُوا
بِالَّذِي أُنزِلَ عَلَى الَّذِينَ آمَنُوا وَجْهَ النَّهَارِ
وَاكْفُرُوا آخِرَهُ لَعَلَّهُمْ يَرْجِعُونَ ﴿٧٢﴾

73. Yalnız sizin dininizin ardınca gələnlərə inanın ki, kiməsə sizə verilənin bənzəri verilməsin, yaxud *müsəlmanlar* Rəbbinizin yanında sizə dəlil gətirməsinlər". De: "Şübhəsiz ki, doğru yol Allahın haqq yoludur!" De: "Şübhəsiz ki, lütf Allahın Əlindədir və onu istədiyinə verir! Allah *hər şeyi* Əhatəedəndir, Biləndir".

وَلَا تُؤْمِنُوا إِلَّا لِمَن تَبِعَ دِينَكُمْ قُلْ إِنَّ
الْهُدَىٰ هُدَى اللَّهِ أَن يُؤْتَىٰ أَحَدٌ مِّثْلَ مَا أُوتِيتُمْ
أَوْ يُحَاجُّوكُمْ عِندَ رَبِّكُمْ ۗ قُلْ إِنَّ الْفَضْلَ بِيَدِ اللَّهِ
يُؤْتِيهِ مَن يَشَاءُ ۗ وَاللَّهُ وَاسِعٌ عَلِيمٌ ﴿٧٣﴾

74. O, Öz mərhəmətini istədiyi kəsə məxsus edir. Allah böyük lütf sahibidir.

يَخْتَصُّ بِرَحْمَتِهِ مَن يَشَاءُ ۗ وَاللَّهُ ذُو الْفَضْلِ
الْعَظِيمِ ﴿٧٤﴾

75. Kitab əhlindən eləsi var ki, ona bir yığın *mal* əmanət etsən, onu sənə *tam* qaytarar. Onlardan eləsi də var ki,

۞ وَمِنْ أَهْلِ الْكِتَابِ مَنْ إِن تَأْمَنْهُ بِقِنطَارٍ
يُؤَدِّهِ إِلَيْكَ وَمِنْهُم مَّنْ إِن تَأْمَنْهُ بِدِينَارٍ لَّا

ona bir dinar versən belə, başının üstündə durub tələb etməyincə onu sənə qaytarmaz. Bu, ona görədir ki, onlar: "Avamlardan ötrü bizə günah olmaz!"– deyirlər və bilə-bilə Allaha qarşı yalan söyləyirlər.

يُؤَدِّهِۦٓ إِلَيۡكَ إِلَّا مَا دُمۡتَ عَلَيۡهِ قَآئِمٗاۗ ذَٰلِكَ
بِأَنَّهُمۡ قَالُواْ لَيۡسَ عَلَيۡنَا فِي ٱلۡأُمِّيِّـۧنَ سَبِيلٞ
وَيَقُولُونَ عَلَى ٱللَّهِ ٱلۡكَذِبَ وَهُمۡ يَعۡلَمُونَ ٧٥

**76.** Xeyr! Kim əhdini yerinə yetirsə və *Allahdan* qorxsa, şübhəsiz ki, Allah müttəqiləri sevər.

بَلَىٰۚ مَنۡ أَوۡفَىٰ بِعَهۡدِهِۦ وَٱتَّقَىٰ فَإِنَّ ٱللَّهَ يُحِبُّ
ٱلۡمُتَّقِينَ ٧٦

**77.** Həqiqətən də, Allah ilə olan əhdlərini və andlarını ucuz qiymətə satan kəslər üçün axirətdə heç bir pay yoxdur. Allah onları danışdırmayacaq, Qiyamət günü onların üzünə baxmayacaq və onları təmizə çıxarmayacaqdır. Onlar üçün ağrılı-acılı bir əzab vardır.

إِنَّ ٱلَّذِينَ يَشۡتَرُونَ بِعَهۡدِ ٱللَّهِ وَأَيۡمَٰنِهِمۡ
ثَمَنٗا قَلِيلًا أُوْلَٰٓئِكَ لَا خَلَٰقَ لَهُمۡ فِي ٱلۡأٓخِرَةِ
وَلَا يُكَلِّمُهُمُ ٱللَّهُ وَلَا يَنظُرُ إِلَيۡهِمۡ يَوۡمَ
ٱلۡقِيَٰمَةِ وَلَا يُزَكِّيهِمۡ وَلَهُمۡ عَذَابٌ أَلِيمٞ ٧٧

**78.** Onlardan elə bir dəstə də vardır ki, oxuduqlarını Kitabdan hesab edəsiniz deyə Kitabı oxuyarkən dillərini əyib bükürlər. Halbuki bu, Kitabdan deyildir. Onlar: "Bu, Allah tərəfindəndir!"– deyirlər. Halbuki bu, Allah tərəfindən deyildir. Onlar bilə-bilə Allaha qarşı yalan danışırlar.

وَإِنَّ مِنۡهُمۡ لَفَرِيقٗا يَلۡوُۥنَ أَلۡسِنَتَهُم
بِٱلۡكِتَٰبِ لِتَحۡسَبُوهُ مِنَ ٱلۡكِتَٰبِ
وَمَا هُوَ مِنَ ٱلۡكِتَٰبِ وَيَقُولُونَ هُوَ مِنۡ
عِندِ ٱللَّهِ وَمَا هُوَ مِنۡ عِندِ ٱللَّهِ وَيَقُولُونَ عَلَى
ٱللَّهِ ٱلۡكَذِبَ وَهُمۡ يَعۡلَمُونَ ٧٨

**79.** Heç kimə yaraşmaz ki, Allah ona Kitab, hikmət və peyğəmbərlik verdikdən sonra insanlara: "Allaha yox, mənə qul olun!"– desin. Əksinə, *o deyər*: "Öyrətdiyiniz Kitabın və *ondan* öyrəndiyiniz şeyin sayəsində din xadimləri olun!"

مَا كَانَ لِبَشَرٍ أَن يُؤۡتِيَهُ ٱللَّهُ ٱلۡكِتَٰبَ
وَٱلۡحُكۡمَ وَٱلنُّبُوَّةَ ثُمَّ يَقُولَ لِلنَّاسِ كُونُواْ
عِبَادٗا لِّي مِن دُونِ ٱللَّهِ وَلَٰكِن كُونُواْ
رَبَّٰنِيِّـۧنَ بِمَا كُنتُمۡ تُعَلِّمُونَ
ٱلۡكِتَٰبَ وَبِمَا كُنتُمۡ تَدۡرُسُونَ ٧٩

**80.** O sizə mələkləri və peyğəmbərləri özünüzə məbudlar qəbul etməyi

وَلَا يَأۡمُرَكُمۡ أَن تَتَّخِذُواْ ٱلۡمَلَٰٓئِكَةَ

buyurmaz. Məgər o sizə, siz müsəlman olduqdan sonra kafir olmağı əmr edərmi?

وَالنَّبِيِّينَ أَرْبَابًا أَيَأْمُرُكُم بِالْكُفْرِ بَعْدَ
إِذْ أَنتُم مُّسْلِمُونَ ٨٠

81. Bir zaman Allah peyğəmbərlərdən: “Sizə Kitab və hikmət verdikdən sonra, özünüzdəkini təsdiqləyən bir elçi gəldikdə ona mütləq inanıb yardım edəcəksiniz”– deyə əhd almış və: “Razısınızmı və Mənim bu əhdimi qəbul edirsinizmi?”– demişdi. Onlar: “Razıyıq!”– demişdilər. *Allah da*: “Şahid olun, Mən də sizinlə bərabər şahid olanlardanam”– demişdir.

وَإِذْ أَخَذَ اللَّهُ مِيثَاقَ النَّبِيِّينَ لَمَا آتَيْتُكُم مِّن
كِتَابٍ وَحِكْمَةٍ ثُمَّ جَاءَكُمْ رَسُولٌ
مُّصَدِّقٌ لِّمَا مَعَكُمْ لَتُؤْمِنُنَّ بِهِ
وَلَتَنصُرُنَّهُ قَالَ أَأَقْرَرْتُمْ وَأَخَذْتُمْ عَلَىٰ
ذَٰلِكُمْ إِصْرِي قَالُوا أَقْرَرْنَا قَالَ فَاشْهَدُوا
وَأَنَا مَعَكُم مِّنَ الشَّاهِدِينَ ٨١

82. Bundan sonra üz döndərənlər – məhz onlar fasiqlərdir.

فَمَن تَوَلَّىٰ بَعْدَ ذَٰلِكَ فَأُولَٰئِكَ هُمُ
الْفَاسِقُونَ ٨٢

83. Yoxsa onlar Allahın dinindən başqa bir din axtarırlar? Halbuki göylərdə və yerdə olan hər bir məxluq istər-istəməz Ona təslim olmuş və Ona da qaytarılacaqdır.

أَفَغَيْرَ دِينِ اللَّهِ يَبْغُونَ وَلَهُ أَسْلَمَ مَن
فِي السَّمَاوَاتِ وَالْأَرْضِ طَوْعًا وَكَرْهًا
وَإِلَيْهِ يُرْجَعُونَ ٨٣

84. De: “Biz Allaha, bizə nazil edilənə, İbrahimə, İsmailə, İshaqa, Yaquba və onun nəslinə nazil edilənlərə, Musaya, İsaya və peyğəmbərlərə öz Rəbbi tərəfindən verilənlərə iman gətirdik. Biz onların heç birinin arasında fərq qoymuruq. Biz təkcə Ona təslim olanlarıq!”

قُلْ آمَنَّا بِاللَّهِ وَمَا أُنزِلَ عَلَيْنَا وَمَا أُنزِلَ
عَلَىٰ إِبْرَاهِيمَ وَإِسْمَاعِيلَ وَإِسْحَاقَ
وَيَعْقُوبَ وَالْأَسْبَاطِ وَمَا أُوتِيَ مُوسَىٰ وَعِيسَىٰ
وَالنَّبِيُّونَ مِن رَّبِّهِمْ لَا نُفَرِّقُ بَيْنَ أَحَدٍ
مِّنْهُمْ وَنَحْنُ لَهُ مُسْلِمُونَ ٨٤

85. İslamdan başqa bir din axtaran şəxsdən, o *din* heç vaxt qəbul olunmaz və o, axirətdə ziyana uğrayanlardan olar.

وَمَن يَبْتَغِ غَيْرَ الْإِسْلَامِ دِينًا فَلَن يُقْبَلَ
مِنْهُ وَهُوَ فِي الْآخِرَةِ مِنَ الْخَاسِرِينَ ٨٥

**86.** İman gətirdikdən, Peyğəmbərin həqiqi *peyğəmbər* olduğuna şahid olduqdan və özlərinə aydın dəlillər gəldikdən sonra kafir olan adamları Allah necə doğru yola yönəldər? Allah zalım adamları doğru yola yönəltməz.

كَيْفَ يَهْدِي ٱللَّهُ قَوْمًا كَفَرُوا۟ بَعْدَ
إِيمَٰنِهِمْ وَشَهِدُوٓا۟ أَنَّ ٱلرَّسُولَ حَقٌّ
وَجَآءَهُمُ ٱلْبَيِّنَٰتُ ۚ وَٱللَّهُ لَا يَهْدِي
ٱلْقَوْمَ ٱلظَّٰلِمِينَ ﴿٨٦﴾

**87.** Onların cəzası, şübhəsiz ki, Allahın, mələklərin və bütün insanların onları lənətləməsidir.

أُو۟لَٰٓئِكَ جَزَآؤُهُمْ أَنَّ عَلَيْهِمْ لَعْنَةَ ٱللَّهِ
وَٱلْمَلَٰٓئِكَةِ وَٱلنَّاسِ أَجْمَعِينَ ﴿٨٧﴾

**88.** Onlar *bu lənətin içində* həmişəlik qalacaqlar. Onların əzabı yüngülləşdirilməyəcək və onlara möhlət də verilməyəcəkdir.

خَٰلِدِينَ فِيهَا لَا يُخَفَّفُ عَنْهُمُ ٱلْعَذَابُ
وَلَا هُمْ يُنظَرُونَ ﴿٨٨﴾

**89.** Bundan sonra tövbə edib *öz əməllərini* islah edənlər isə istisnadır. Şübhəsiz ki, Allah Bağışlayandır, Rəhmlidir.

إِلَّا ٱلَّذِينَ تَابُوا۟ مِنۢ بَعْدِ ذَٰلِكَ وَأَصْلَحُوا۟
فَإِنَّ ٱللَّهَ غَفُورٌ رَّحِيمٌ ﴿٨٩﴾

**90.** Sözsüz ki, iman gətirdikdən sonra kafir olan və küfrlərini bir daha artıran kimsələrin tövbəsi qəbul olunmayacaq. Məhz onlar doğru yoldan azanlardır.

إِنَّ ٱلَّذِينَ كَفَرُوا۟ بَعْدَ إِيمَٰنِهِمْ ثُمَّ ٱزْدَادُوا۟
كُفْرًا لَّن تُقْبَلَ تَوْبَتُهُمْ وَأُو۟لَٰٓئِكَ هُمُ
ٱلضَّآلُّونَ ﴿٩٠﴾

**91.** Həqiqətən də, kafir olub kafir kimi də ölənlərin heç birindən dünya dolusu qızıl fidyə versə belə, qəbul olunmayacaqdır. Onlara ağrılı-acılı bir əzab hazırlanmışdır və onların köməkçiləri də olmayacaqdır.

إِنَّ ٱلَّذِينَ كَفَرُوا۟ وَمَاتُوا۟ وَهُمْ كُفَّارٌ
فَلَن يُقْبَلَ مِنْ أَحَدِهِم مِّلْءُ ٱلْأَرْضِ
ذَهَبًا وَلَوِ ٱفْتَدَىٰ بِهِۦٓ ۗ أُو۟لَٰٓئِكَ لَهُمْ عَذَابٌ
أَلِيمٌ وَمَا لَهُم مِّن نَّٰصِرِينَ ﴿٩١﴾

**92.** Sevdiyiniz şeylərdən Allah yolunda xərcləməyincə xeyrə nail olmayacaqsınız. Sizin nə

لَن تَنَالُوا۟ ٱلْبِرَّ حَتَّىٰ تُنفِقُوا۟ مِمَّا تُحِبُّونَ ۚ
وَمَا تُنفِقُوا۟ مِن شَيْءٍ فَإِنَّ ٱللَّهَ بِهِۦ عَلِيمٌ ﴿٩٢﴾

xərclədiyinizi, şübhəsiz
ki, Allah bilir.

93. Tövrat nazil olmamışdan əvvəl
İsrailin ancaq özü özünə haram etdiyi
şeylərdən başqa bütün yeməklər
İsrail oğullarına halal idi. De: "Əgər
doğru danışanlarsınızsa, Tövratı
gətirin və onu oxuyun!"

كُلُّ ٱلطَّعَامِ كَانَ حِلًّا لِّبَنِيٓ
إِسۡرَٰٓءِيلَ إِلَّا مَا حَرَّمَ إِسۡرَٰٓءِيلُ عَلَىٰ نَفۡسِهِۦ
مِن قَبۡلِ أَن تُنَزَّلَ ٱلتَّوۡرَىٰةُۚ قُلۡ فَأۡتُواْ بِٱلتَّوۡرَىٰةِ
فَٱتۡلُوهَآ إِن كُنتُمۡ صَٰدِقِينَ ٩٣

94. Bundan sonra Allaha qarşı
yalan uyduranlar – məhz
onlar zalımlardır.

فَمَنِ ٱفۡتَرَىٰ عَلَى ٱللَّهِ ٱلۡكَذِبَ مِنۢ بَعۡدِ
ذَٰلِكَ فَأُوْلَٰٓئِكَ هُمُ ٱلظَّٰلِمُونَ ٩٤

95. De: "Allah doğru söylədi. Odur
ki, İbrahimin hənif dininin ardınca
gedin. O, müşriklərdən deyildi".

قُلۡ صَدَقَ ٱللَّهُۗ فَٱتَّبِعُواْ مِلَّةَ إِبۡرَٰهِيمَ حَنِيفٗاۖ
وَمَا كَانَ مِنَ ٱلۡمُشۡرِكِينَ ٩٥

96. Həqiqətən, aləmlərdən ötrü bərəkət
və doğru yol göstəricisi kimi insanlar
üçün ilk qurulan ev Bəkkədədir.

إِنَّ أَوَّلَ بَيۡتٖ وُضِعَ لِلنَّاسِ لَلَّذِي بِبَكَّةَ
مُبَارَكٗا وَهُدٗى لِّلۡعَٰلَمِينَ ٩٦

97. Orada aydın nişanələr – İbrahimin
məqamı vardır. Oraya daxil
olanın təhlükəsizliyi təmin olunar.
Müqəddəs Evi ziyarət etmək
insanların – yoluna gücü çatan hər
kəsin – Allah qarşısında borcudur.
Kim bunu inkar edərsə, bilsin ki,
Allahın aləmlərə ehtiyacı yoxdur.

فِيهِ ءَايَٰتُۢ بَيِّنَٰتٞ مَّقَامُ إِبۡرَٰهِيمَۖ وَمَن
دَخَلَهُۥ كَانَ ءَامِنٗاۗ وَلِلَّهِ عَلَى ٱلنَّاسِ حِجُّ
ٱلۡبَيۡتِ مَنِ ٱسۡتَطَاعَ إِلَيۡهِ سَبِيلٗاۚ وَمَن كَفَرَ
فَإِنَّ ٱللَّهَ غَنِيٌّ عَنِ ٱلۡعَٰلَمِينَ ٩٧

98. De: "Ey Kitab əhli! Allah sizin
etdiklərinizə şahid olduğu halda,
nə üçün siz Allahın ayələrini inkar
edirsiniz?"

قُلۡ يَٰٓأَهۡلَ ٱلۡكِتَٰبِ لِمَ تَكۡفُرُونَ بِـَٔايَٰتِ ٱللَّهِ
وَٱللَّهُ شَهِيدٌ عَلَىٰ مَا تَعۡمَلُونَ ٩٨

99. De: "Ey Kitab əhli! Siz haqqa
şahid olduğunuz halda, nə üçün
doğru yolu əyri göstərməyə çalışıb

قُلۡ يَٰٓأَهۡلَ ٱلۡكِتَٰبِ لِمَ تَصُدُّونَ عَن
سَبِيلِ ٱللَّهِ مَنۡ ءَامَنَ تَبۡغُونَهَا عِوَجٗا وَأَنتُمۡ

iman gətirənləri Allah yolundan sapdırırsınız?" Halbuki, Allah sizin etdiklərinizdən xəbərsiz deyildir.

شُهَدَآءُ وَمَا ٱللَّهُ بِغَٰفِلٍ عَمَّا تَعْمَلُونَ ﴿٩٩﴾

100. Ey iman gətirənlər! Əgər Kitab verilənlərdən bir dəstəyə itaət etsəniz, onlar sizi, siz iman gətirdikdən sonra belə, döndərib kafir edərlər.

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوٓا۟ إِن تُطِيعُوا۟ فَرِيقًا
مِّنَ ٱلَّذِينَ أُوتُوا۟ ٱلْكِتَٰبَ يَرُدُّوكُم بَعْدَ
إِيمَٰنِكُمْ كَٰفِرِينَ ﴿١٠٠﴾

101. Sizə Allahın ayələri oxunduğu və Onun Elçisi sizinlə olduğu bir vaxtda, siz necə küfr edirsiniz? Kim Allaha möhkəm bağlanarsa, həqiqətən də, doğru yola yönəlmiş olar.

وَكَيْفَ تَكْفُرُونَ وَأَنتُمْ تُتْلَىٰ عَلَيْكُمْ ءَايَٰتُ
ٱللَّهِ وَفِيكُمْ رَسُولُهُۥ ۗ وَمَن يَعْتَصِم بِٱللَّهِ
فَقَدْ هُدِىَ إِلَىٰ صِرَٰطٍ مُّسْتَقِيمٍ ﴿١٠١﴾

102. Ey iman gətirənlər! Allahdan Ona layiq olan tərzdə qorxun və ancaq müsəlman olduğunuz halda ölün!

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ ٱتَّقُوا۟ ٱللَّهَ حَقَّ تُقَاتِهِۦ
وَلَا تَمُوتُنَّ إِلَّا وَأَنتُم مُّسْلِمُونَ ﴿١٠٢﴾

103. Hamınız Allahın ipindən möhkəm yapışın və parçalanmayın! Allahın sizə olan nemətini xatırlayın ki, siz bir-birinizə düşmən idiniz, O, sizin qəlblərinizi birləşdirdi və Onun neməti sayəsində bir-birinizlə qardaş oldunuz. Siz odlu bir uçurumun lap kənarında idiniz. O, sizi ondan xilas etdi. Allah Öz ayələrini sizə beləcə bəyan edir ki, bəlkə doğru yola gələsiniz.

وَٱعْتَصِمُوا۟ بِحَبْلِ ٱللَّهِ جَمِيعًا وَلَا تَفَرَّقُوا۟ ۚ
وَٱذْكُرُوا۟ نِعْمَتَ ٱللَّهِ عَلَيْكُمْ إِذْ كُنتُمْ
أَعْدَآءً فَأَلَّفَ بَيْنَ قُلُوبِكُمْ فَأَصْبَحْتُم
بِنِعْمَتِهِۦٓ إِخْوَٰنًا وَكُنتُمْ عَلَىٰ شَفَا حُفْرَةٍ
مِّنَ ٱلنَّارِ فَأَنقَذَكُم مِّنْهَا ۗ كَذَٰلِكَ يُبَيِّنُ ٱللَّهُ
لَكُمْ ءَايَٰتِهِۦ لَعَلَّكُمْ تَهْتَدُونَ ﴿١٠٣﴾

104. Qoy sizin içərinizdən xeyrə çağıran, yaxşı işlər görməyi buyuran və pis əməlləri qadağan edən bir camaat çıxsın. Məhz onlar nicata qovuşanlardır.

وَلْتَكُن مِّنكُمْ أُمَّةٌ يَدْعُونَ إِلَى ٱلْخَيْرِ
وَيَأْمُرُونَ بِٱلْمَعْرُوفِ وَيَنْهَوْنَ عَنِ ٱلْمُنكَرِ ۚ
وَأُو۟لَٰٓئِكَ هُمُ ٱلْمُفْلِحُونَ ﴿١٠٤﴾

105. Özlərinə aydın dəlillər gəldikdən sonra firqələrə ayrılıb ixtilaf edənlər kimi olmayın. Onları böyük bir əzab gözləyir.

وَلَا تَكُونُوا كَالَّذِينَ تَفَرَّقُوا وَاخْتَلَفُوا مِنْ بَعْدِ
مَا جَاءَهُمُ الْبَيِّنَاتُ وَأُولَٰئِكَ لَهُمْ عَذَابٌ
عَظِيمٌ ﴿١٠٥﴾

106. O gün neçə-neçə üzlər ağaracaq, neçə-neçə üzlər də qaralacaqdır. Üzləri qaralan kəslərə: "İman gətirdikdən sonra kafirmi oldunuz? Elə isə, küfrünüzə görə dadın əzabı!" – deyiləcəkdir.

يَوْمَ تَبْيَضُّ وُجُوهٌ وَتَسْوَدُّ وُجُوهٌ فَأَمَّا الَّذِينَ
اسْوَدَّتْ وُجُوهُهُمْ أَكَفَرْتُمْ بَعْدَ إِيمَانِكُمْ
فَذُوقُوا الْعَذَابَ بِمَا كُنْتُمْ تَكْفُرُونَ ﴿١٠٦﴾

107. Üzləri ağ olan kəslər isə Allahın mərhəməti altında olacaq və orada əbədi qalacaqlar.

وَأَمَّا الَّذِينَ ابْيَضَّتْ وُجُوهُهُمْ فَفِي رَحْمَةِ
اللَّهِ هُمْ فِيهَا خَالِدُونَ ﴿١٠٧﴾

108. Bunlar Allahın ayələridir. Onları sənə bir həqiqət olaraq oxuyuruq. Allah aləmlərə haqsızlıq etmək istəmir.

تِلْكَ آيَاتُ اللَّهِ نَتْلُوهَا عَلَيْكَ بِالْحَقِّ
وَمَا اللَّهُ يُرِيدُ ظُلْمًا لِلْعَالَمِينَ ﴿١٠٨﴾

109. Göylərdə və yerdə nə varsa, Allaha məxsusdur və axırda bütün işlər Allaha qaytarılacaqdır.

وَلِلَّهِ مَا فِي السَّمَاوَاتِ وَمَا فِي الْأَرْضِ
وَإِلَى اللَّهِ تُرْجَعُ الْأُمُورُ ﴿١٠٩﴾

110. Siz insanlar arasında üzə çıxarılmış ən xeyirli ümmətsiniz. Siz yaxşı işlər görməyi əmr edir, pis əməlləri qadağan edir və Allaha iman gətirirsiniz. Kitab əhli də iman gətirsəydi, əlbəttə, onlar üçün yaxşı olardı. Onların arasında iman gətirənlər də vardır. Əksəriyyəti isə haqq yolunu azmış fasiqlərdir.

كُنْتُمْ خَيْرَ أُمَّةٍ أُخْرِجَتْ لِلنَّاسِ تَأْمُرُونَ
بِالْمَعْرُوفِ وَتَنْهَوْنَ عَنِ الْمُنْكَرِ
وَتُؤْمِنُونَ بِاللَّهِ وَلَوْ آمَنَ أَهْلُ الْكِتَابِ
لَكَانَ خَيْرًا لَهُمْ مِنْهُمُ الْمُؤْمِنُونَ
وَأَكْثَرُهُمُ الْفَاسِقُونَ ﴿١١٠﴾

111. Onlar sizə əziyyətdən başqa bir zərər yetirə bilməzlər. Əgər sizinlə vuruşmalı olsalar, arxa çevirib

لَنْ يَضُرُّوكُمْ إِلَّا أَذًى وَإِنْ يُقَاتِلُوكُمْ
يُوَلُّوكُمُ الْأَدْبَارَ ثُمَّ لَا يُنْصَرُونَ ﴿١١١﴾

qaçarlar. Sonra isə onlara
kömək də edilməz.

112. Onlar harada olursa olsunlar, Allahın və mömin insanların himayəsində olanlar istisna olmaqla onlara həmişə zəlillik qismət olar. Onlar Allahın qəzəbinə düçar olmuş və onlara mənəvi yoxsulluq üz vermişdir. Bu cəza ona görədir ki, onlar Allahın ayələrini inkar etmiş və bəzi peyğəmbərləri haqsız yerə öldürmüşlər. Bu həm də ona görədir ki, onlar asi olmuş və həddi aşmışlar.

ضُرِبَتۡ عَلَيۡهِمُ ٱلذِّلَّةُ أَيۡنَ مَا ثُقِفُوٓاْ إِلَّا
بِحَبۡلٖ مِّنَ ٱللَّهِ وَحَبۡلٖ مِّنَ ٱلنَّاسِ وَبَآءُو
بِغَضَبٖ مِّنَ ٱللَّهِ وَضُرِبَتۡ عَلَيۡهِمُ
ٱلۡمَسۡكَنَةُۚ ذَٰلِكَ بِأَنَّهُمۡ كَانُواْ يَكۡفُرُونَ
بِـَٔايَٰتِ ٱللَّهِ وَيَقۡتُلُونَ ٱلۡأَنۢبِيَآءَ بِغَيۡرِ حَقّٖۚ
ذَٰلِكَ بِمَا عَصَواْ وَّكَانُواْ يَعۡتَدُونَ ١١٢

113. Hamısı eyni cür deyillər. Kitab əhli içərisində haqdan möhkəm yapışan bir camaat vardır ki, onlar gecələri səcdəyə qapanıb Allahın ayələrini oxuyurlar.

۞ لَيۡسُواْ سَوَآءٗۗ مِّنۡ أَهۡلِ ٱلۡكِتَٰبِ أُمَّةٞ
قَآئِمَةٞ يَتۡلُونَ ءَايَٰتِ ٱللَّهِ ءَانَآءَ ٱلَّيۡلِ
وَهُمۡ يَسۡجُدُونَ ١١٣

114. Belələri Allaha, Axirət gününə iman gətirir, yaxşı işlər görməyi buyurur, pis əməlləri qadağan edir və xeyirxah işlər görməyə tələsirlər. Məhz onlar əməlisalehlərdəndirlər.

يُؤۡمِنُونَ بِٱللَّهِ وَٱلۡيَوۡمِ ٱلۡأٓخِرِ وَيَأۡمُرُونَ
بِٱلۡمَعۡرُوفِ وَيَنۡهَوۡنَ عَنِ ٱلۡمُنكَرِ
وَيُسَٰرِعُونَ فِي ٱلۡخَيۡرَٰتِۖ وَأُوْلَٰٓئِكَ
مِنَ ٱلصَّٰلِحِينَ ١١٤

115. Onların etdiyi yaxşılıqlar əvəzsiz qalmayacaqdır. Allah müttəqiləri tanıyır.

وَمَا يَفۡعَلُواْ مِنۡ خَيۡرٖ فَلَن يُكۡفَرُوهُۗ
وَٱللَّهُ عَلِيمُۢ بِٱلۡمُتَّقِينَ ١١٥

116. Kafirlərin malları da, övladları da onlara Allah yanında heç bir şeydə fayda verə bilməz. Onlar Od sakinləridirlər və orada əbədi qalacaqlar.

إِنَّ ٱلَّذِينَ كَفَرُواْ لَن تُغۡنِيَ عَنۡهُمۡ أَمۡوَٰلُهُمۡ
وَلَآ أَوۡلَٰدُهُم مِّنَ ٱللَّهِ شَيۡـٔٗاۖ وَأُوْلَٰٓئِكَ
أَصۡحَٰبُ ٱلنَّارِۖ هُمۡ فِيهَا خَٰلِدُونَ ١١٦

**117.** Onların bu dünya həyatında sərf etdiklərinin məsəli, özlərinə zülm edən adamların tarlasına ziyan vurub onu məhv edən çox soyuq bir küləyin məsəlinə bənzəyir. Allah onlara zülm etmədi, lakin onlar özləri özlərinə zülm edirdilər.

مَثَلُ مَا يُنفِقُونَ فِي هَٰذِهِ ٱلْحَيَوٰةِ ٱلدُّنْيَا
كَمَثَلِ رِيحٍ فِيهَا صِرٌّ أَصَابَتْ حَرْثَ قَوْمٍ
ظَلَمُوٓا۟ أَنفُسَهُمْ فَأَهْلَكَتْهُ ۚ وَمَا
ظَلَمَهُمُ ٱللَّهُ وَلَٰكِنْ أَنفُسَهُمْ يَظْلِمُونَ ﴿١١٧﴾

**118.** Ey iman gətirənlər! Sizlərdən olmayanı özünüzə sirdaş tutmayın. Onlar sizə qarşı fəsad törətməkdən əl çəkməzlər, sizin sıxıntıya düşməyinizi istəyərlər. Düşmənçilikləri onların ağızlarından çıxan sözlərdən bəllidir. Köksləridə gizlətdikləri düşmənçilik isə daha böyükdür. Əgər anlayırsınızsa, Biz ayələri artıq sizə bəyan etdik.

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ لَا تَتَّخِذُوا۟ بِطَانَةً مِّن
دُونِكُمْ لَا يَأْلُونَكُمْ خَبَالًا وَدُّوا۟ مَا عَنِتُّمْ
قَدْ بَدَتِ ٱلْبَغْضَآءُ مِنْ أَفْوَٰهِهِمْ
وَمَا تُخْفِي صُدُورُهُمْ أَكْبَرُ ۚ قَدْ بَيَّنَّا لَكُمُ
ٱلْءَايَٰتِ ۖ إِن كُنتُمْ تَعْقِلُونَ ﴿١١٨﴾

**119.** Bax, siz o kəslərsiniz ki, onlara məhəbbət bəsləyir, onlar isə sizi sevmirlər. Siz nazil olan kitabların hamısına inanırsınız. Onlar sizinlə rastlaşanda: "Biz iman gətirdik!"– deyirlər, təklikdə qalanda isə sizə qarşı qəzəbdən barmaqlarının ucunu gəmirirlər. De: "Qəzəbinizdən ölün!" Şübhəsiz ki, Allah köksləridə olanları bilir.

هَٰٓأَنتُمْ أُو۟لَآءِ تُحِبُّونَهُمْ وَلَا يُحِبُّونَكُمْ
وَتُؤْمِنُونَ بِٱلْكِتَٰبِ كُلِّهِۦ وَإِذَا لَقُوكُمْ قَالُوٓا۟
ءَامَنَّا وَإِذَا خَلَوْا۟ عَضُّوا۟ عَلَيْكُمُ ٱلْأَنَامِلَ
مِنَ ٱلْغَيْظِ ۚ قُلْ مُوتُوا۟ بِغَيْظِكُمْ ۗ إِنَّ ٱللَّهَ عَلِيمٌۢ
بِذَاتِ ٱلصُّدُورِ ﴿١١٩﴾

**120.** Sizə bir uğur nəsib olsa, bu onları kədərləndirər. Sizə bir fəlakət üz verdikdə isə, buna fərəhlənərlər. Əgər səbir etsəniz və Allahdan qorxsanız, onların qurduğu hiylə sizi ziyana sala bilməz. Həqiqətən,

إِن تَمْسَسْكُمْ حَسَنَةٌ تَسُؤْهُمْ وَإِن تُصِبْكُمْ
سَيِّئَةٌ يَفْرَحُوا۟ بِهَا ۖ وَإِن تَصْبِرُوا۟ وَتَتَّقُوا۟
لَا يَضُرُّكُمْ كَيْدُهُمْ شَيْـًٔا ۗ إِنَّ ٱللَّهَ بِمَا
يَعْمَلُونَ مُحِيطٌ ﴿١٢٠﴾

Allah onların nə etdiklərini əhatə edir.

121. O zaman sən Uhuddakı döyüşdən ötrü möminləri mövqelərə yerləşdirmək üçün səhər tezdən ailəndən ayrılıb getdin. Allah, Eşidəndir, Biləndir!

وَإِذْ غَدَوْتَ مِنْ أَهْلِكَ تُبَوِّئُ ٱلْمُؤْمِنِينَ
مَقَٰعِدَ لِلْقِتَالِ ۗ وَٱللَّهُ سَمِيعٌ عَلِيمٌ ﴿١٢١﴾

122. O zaman sizlərdən iki dəstə ruhdan düşməyə hazır idilər. Allah isə onların yardımçısı oldu. Qoy möminlər Allaha təvəkkül etsinlər.

إِذْ هَمَّت طَّآئِفَتَانِ مِنكُمْ أَن تَفْشَلَا وَٱللَّهُ
وَلِيُّهُمَا ۗ وَعَلَى ٱللَّهِ فَلْيَتَوَكَّلِ ٱلْمُؤْمِنُونَ ﴿١٢٢﴾

123. Siz zəif olduğunuz halda Allah, Bədrdə sizə yardım etdi. Elə isə Allahdan qorxun ki, bəlkə şükür edəsiniz.

وَلَقَدْ نَصَرَكُمُ ٱللَّهُ بِبَدْرٍ وَأَنتُمْ أَذِلَّةٌ ۖ فَٱتَّقُوا۟ ٱللَّهَ
لَعَلَّكُمْ تَشْكُرُونَ ﴿١٢٣﴾

124. O vaxt sən möminlərə demişdin: “Rəbbinizin göndərdiyi üç min mələyin köməyinizə çatması, sizə bəs etmirmi?”

إِذْ تَقُولُ لِلْمُؤْمِنِينَ أَلَن يَكْفِيَكُمْ أَن يُمِدَّكُمْ
رَبُّكُم بِثَلَٰثَةِ ءَالَٰفٍ مِّنَ ٱلْمَلَٰٓئِكَةِ مُنزَلِينَ ﴿١٢٤﴾

125. Əlbəttə, siz səbir etsəniz, Allahdan qorxsanız və onlar bu saat sizin üstünüzə hücuma keçsələr, Rəbbiniz nişanlanmış beş min mələklə sizə yardım edər.

بَلَىٰٓ ۚ إِن تَصْبِرُوا۟ وَتَتَّقُوا۟ وَيَأْتُوكُم مِّن
فَوْرِهِمْ هَٰذَا يُمْدِدْكُمْ رَبُّكُم بِخَمْسَةِ
ءَالَٰفٍ مِّنَ ٱلْمَلَٰٓئِكَةِ مُسَوِّمِينَ ﴿١٢٥﴾

126. Allah bunu sizə ancaq bir müjdə və qəlbiniz bununla sakit olsun deyə etdi. Kömək ancaq Qüdrətli və Müdrik Allahdandır.

وَمَا جَعَلَهُ ٱللَّهُ إِلَّا بُشْرَىٰ لَكُمْ وَلِتَطْمَئِنَّ
قُلُوبُكُم بِهِۦ ۗ وَمَا ٱلنَّصْرُ إِلَّا مِنْ عِندِ
ٱللَّهِ ٱلْعَزِيزِ ٱلْحَكِيمِ ﴿١٢٦﴾

127. Bu ona görə idi ki, Allah bununla kafirlərin bir bölüyünü qırğına versin və ya onları darmadağın etsin ki, məyus halda geri dönsünlər.

لِيَقْطَعَ طَرَفًا مِّنَ ٱلَّذِينَ كَفَرُوٓا۟
أَوْ يَكْبِتَهُمْ فَيَنقَلِبُوا۟ خَآئِبِينَ ﴿١٢٧﴾

128. Bu işin sənə aidiyyəti yoxdur. Allah ya onların tövbəsini qəbul edər, ya da onlara əzab verər. Çünki onlar zalımdırlar.

لَيْسَ لَكَ مِنَ الْأَمْرِ شَيْءٌ أَوْ يَتُوبَ عَلَيْهِمْ
أَوْ يُعَذِّبَهُمْ فَإِنَّهُمْ ظَالِمُونَ ﴿١٢٨﴾

129. Göylərdə və yerdə nə varsa, Allahındır. O, istədiyini bağışlayar, istədiyinə də əzab verər. Allah Bağışlayandır, Rəhmlidir.

وَلِلَّهِ مَا فِي السَّمَاوَاتِ وَمَا فِي الْأَرْضِ
يَغْفِرُ لِمَنْ يَشَاءُ وَيُعَذِّبُ مَنْ يَشَاءُ
وَاللَّهُ غَفُورٌ رَحِيمٌ ﴿١٢٩﴾

130. Ey iman gətirənlər! Dəfələrlə artırılmış olan sələmi yeməyin! Allahdan qorxun ki, bəlkə, nicat tapasınız.

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا لَا تَأْكُلُوا الرِّبَا
أَضْعَافًا مُضَاعَفَةً وَاتَّقُوا اللَّهَ لَعَلَّكُمْ
تُفْلِحُونَ ﴿١٣٠﴾

131. Kafirlər üçün hazırlanmış Oddan çəkinin.

وَاتَّقُوا النَّارَ الَّتِي أُعِدَّتْ لِلْكَافِرِينَ ﴿١٣١﴾

132. Allaha və Peyğəmbərə itaət edin ki, bəlkə sizə rəhm olunsun.

وَأَطِيعُوا اللَّهَ وَالرَّسُولَ لَعَلَّكُمْ تُرْحَمُونَ ﴿١٣٢﴾

133. Rəbbiniz tərəfindən bağışlanmağa və müttəqilər üçün hazırlanmış, genişliyi göylər və yer qədər olan Cənnətə tələsin.

۞ وَسَارِعُوا إِلَىٰ مَغْفِرَةٍ مِنْ رَبِّكُمْ
وَجَنَّةٍ عَرْضُهَا السَّمَاوَاتُ وَالْأَرْضُ
أُعِدَّتْ لِلْمُتَّقِينَ ﴿١٣٣﴾

134. O müttəqilər ki, bolluq zamanı da, qıtlıq zamanı da mallarından Allah yolunda xərcləyir, qəzəblərini boğur və insanları bağışlayırlar. Allah yaxşı iş görənləri sevir.

الَّذِينَ يُنْفِقُونَ فِي السَّرَّاءِ وَالضَّرَّاءِ
وَالْكَاظِمِينَ الْغَيْظَ وَالْعَافِينَ
عَنِ النَّاسِ وَاللَّهُ يُحِبُّ الْمُحْسِنِينَ ﴿١٣٤﴾

135. O kəslər ki, bir pis iş gördükdə, yaxud özlərinə zülm etdikdə Allahı xatırlayıb günahlarının bağışlanmasını diləyərlər, – günahları Allahdan başqa kim bağışlaya bilər? – onlar bilə-bilə etdiklərinə görə israr etməzlər.

وَالَّذِينَ إِذَا فَعَلُوا فَاحِشَةً أَوْ ظَلَمُوا
أَنْفُسَهُمْ ذَكَرُوا اللَّهَ فَاسْتَغْفَرُوا
لِذُنُوبِهِمْ وَمَنْ يَغْفِرُ الذُّنُوبَ إِلَّا اللَّهُ وَلَمْ
يُصِرُّوا عَلَىٰ مَا فَعَلُوا وَهُمْ يَعْلَمُونَ ﴿١٣٥﴾

136. Onların mükafatı, Rəbbindən bağışlanma və ağacları altından çaylar axan Cənnət bağlarıdır ki, orada əbədi qalacaqlar. Yaxşı əməl sahiblərinin mükafatı necə də gözəldir!

أُوْلَٰٓئِكَ جَزَآؤُهُم مَّغۡفِرَةٞ مِّن رَّبِّهِمۡ
وَجَنَّٰتٞ تَجۡرِي مِن تَحۡتِهَا ٱلۡأَنۡهَٰرُ خَٰلِدِينَ
فِيهَاۚ وَنِعۡمَ أَجۡرُ ٱلۡعَٰمِلِينَ ١٣٦

137. Sizdən öncə də neçə-neçə əhvalatlar olub keçmişdi. Odur ki, yer üzündə gəzib dolaşın və görün haqqı yalan sayanların aqibəti necə olmuşdur.

قَدۡ خَلَتۡ مِن قَبۡلِكُمۡ سُنَنٞ فَسِيرُواْ
فِي ٱلۡأَرۡضِ فَٱنظُرُواْ كَيۡفَ كَانَ عَٰقِبَةُ
ٱلۡمُكَذِّبِينَ ١٣٧

138. Bu, insanlar üçün bir açıqlama, doğru yol göstəricisi və öyüd-nəsihətdir.

هَٰذَا بَيَانٞ لِّلنَّاسِ وَهُدٗى وَمَوۡعِظَةٞ
لِّلۡمُتَّقِينَ ١٣٨

139. Acizlik göstərməyin və kədərlənməyin. Möminsinizsə, üstün olacaqsınız.

وَلَا تَهِنُواْ وَلَا تَحۡزَنُواْ وَأَنتُمُ ٱلۡأَعۡلَوۡنَ إِن
كُنتُم مُّؤۡمِنِينَ ١٣٩

140. Əgər siz Uhud döyüşündə yara almışsınızsa, o düşmən qövm də bu cür yara almışdı. Biz bu günləri – qalibiyyəti və məğlubiyyəti insanlar arasında növbə ilə dəyişdiririk ki, Allah iman gətirənləri üzə çıxarsın və aranızdan şəhidlər seçsin. Allah zalımları sevmir.

إِن يَمۡسَسۡكُمۡ قَرۡحٞ فَقَدۡ مَسَّ ٱلۡقَوۡمَ قَرۡحٞ
مِّثۡلُهُۥۚ وَتِلۡكَ ٱلۡأَيَّامُ نُدَاوِلُهَا بَيۡنَ ٱلنَّاسِ
وَلِيَعۡلَمَ ٱللَّهُ ٱلَّذِينَ ءَامَنُواْ وَيَتَّخِذَ مِنكُمۡ
شُهَدَآءَۗ وَٱللَّهُ لَا يُحِبُّ ٱلظَّٰلِمِينَ ١٤٠

141. Həm də ona görə belə edirik ki, Allah möminləri təmizə çıxarsın və kafirləri məhv etsin.

وَلِيُمَحِّصَ ٱللَّهُ ٱلَّذِينَ ءَامَنُواْ وَيَمۡحَقَ
ٱلۡكَٰفِرِينَ ١٤١

142. Yoxsa elə güman edirdiniz ki, Allah içərinizdən cihada çıxanları və səbir edənləri bəlli etmədən siz Cənnətə daxil olacaqsınız?

أَمۡ حَسِبۡتُمۡ أَن تَدۡخُلُواْ ٱلۡجَنَّةَ وَلَمَّا يَعۡلَمِ ٱللَّهُ
ٱلَّذِينَ جَٰهَدُواْ مِنكُمۡ وَيَعۡلَمَ ٱلصَّٰبِرِينَ ١٤٢

143. Siz ölümlə qarşılaşmamışdan öncə onu arzulayırdınız. İndi isə siz onu öz gözlərinizlə gördünüz.

وَلَقَدْ كُنتُمْ تَمَنَّوْنَ ٱلْمَوْتَ مِن قَبْلِ أَن
تَلْقَوْهُ فَقَدْ رَأَيْتُمُوهُ وَأَنتُمْ تَنظُرُونَ ١٤٣

144. Muhəmməd ancaq bir elçidir. Ondan əvvəl də elçilər gəlib getmişlər. Məgər o ölərsə və ya öldürülərsə siz gerimi dönəcəksiniz? Kim geri dönərsə, Allaha heç bir zərər yetirməz. Allah şükür edənləri mükafatlandırar.

وَمَا مُحَمَّدٌ إِلَّا رَسُولٌ قَدْ خَلَتْ مِن قَبْلِهِ
ٱلرُّسُلُ أَفَإِيْن مَّاتَ أَوْ قُتِلَ ٱنقَلَبْتُمْ عَلَىٰٓ
أَعْقَٰبِكُمْ وَمَن يَنقَلِبْ عَلَىٰ عَقِبَيْهِ فَلَن يَضُرَّ
ٱللَّهَ شَيْـًٔا وَسَيَجْزِى ٱللَّهُ ٱلشَّٰكِرِينَ ١٤٤

145. Hər bir kəs ancaq Allahın izni ilə, əzəldən müəyyən edilmiş bir vaxtda ölür. Kim dünya mükafatını istəsə, ona bundan verərik. Kim də axirət mükafatını istəsə, ona da ondan verərik. Biz şükür edənləri mütləq mükafatlandıracağıq.

وَمَا كَانَ لِنَفْسٍ أَن تَمُوتَ إِلَّا بِإِذْنِ
ٱللَّهِ كِتَٰبًا مُّؤَجَّلًا وَمَن يُرِدْ ثَوَابَ ٱلدُّنْيَا
نُؤْتِهِۦ مِنْهَا وَمَن يُرِدْ ثَوَابَ ٱلْـَٔاخِرَةِ نُؤْتِهِۦ
مِنْهَا وَسَنَجْزِى ٱلشَّٰكِرِينَ ١٤٥

146. Neçə-neçə peyğəmbər olmuşdur ki, bir çox dindarlarla birlikdə vuruşmuşlar. Onlar Allah yolunda başlarına gələnlərə görə nə ruhdan düşmüş, nə zəifləmiş, nə də düşmənə boyun əymişlər. Allah səbir edənləri sevir.

وَكَأَيِّن مِّن نَّبِىٍّ قَٰتَلَ مَعَهُۥ رِبِّيُّونَ كَثِيرٌ
فَمَا وَهَنُوا۟ لِمَآ أَصَابَهُمْ فِى سَبِيلِ ٱللَّهِ وَمَا ضَعُفُوا۟
وَمَا ٱسْتَكَانُوا۟ وَٱللَّهُ يُحِبُّ ٱلصَّٰبِرِينَ ١٤٦

147. Onların dedikləri ancaq: “Ey Rəbbimiz! Günahlarımızı və əməllərimizdə həddi aşmağımızı bizə bağışla; qədəmlərimizi sabit et və kafir qövmə qələbə çalmaqda bizə yardım et!”– olmuşdur.

وَمَا كَانَ قَوْلَهُمْ إِلَّآ أَن قَالُوا۟ رَبَّنَا ٱغْفِرْ لَنَا ذُنُوبَنَا
وَإِسْرَافَنَا فِىٓ أَمْرِنَا وَثَبِّتْ أَقْدَامَنَا
وَٱنصُرْنَا عَلَى ٱلْقَوْمِ ٱلْكَٰفِرِينَ ١٤٧

148. Beləliklə Allah onlara həm dünya mükafatını, həm də gözəl axirət mükafatını verdi. Allah yaxşı iş görənləri sevir.

فَـَٔاتَىٰهُمُ ٱللَّهُ ثَوَابَ ٱلدُّنْيَا وَحُسْنَ ثَوَابِ
ٱلْـَٔاخِرَةِ وَٱللَّهُ يُحِبُّ ٱلْمُحْسِنِينَ ١٤٨

149. Ey iman gətirənlər! Əgər kafirlərə itaət etsəniz, onlar sizi geriyə qaytarar və siz də ziyana uğramış halda geriyə qayıdarsınız.

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوٓاْ إِن تُطِيعُواْ ٱلَّذِينَ كَفَرُواْ يَرُدُّوكُمْ عَلَىٰٓ أَعْقَٰبِكُمْ فَتَنقَلِبُواْ خَٰسِرِينَ ١٤٩

150. Xeyr! Allah sizin Himayədarınızdır. O, kömək edənlərin ən yaxşısıdır.

بَلِ ٱللَّهُ مَوْلَىٰكُمْ ۖ وَهُوَ خَيْرُ ٱلنَّٰصِرِينَ ١٥٠

151. Haqqında heç bir dəlil nazil etmədiyi şeyi Allaha şərik qoşduqlarına görə, kafirlərin qəlblərinə qorxu salacağıq. Onların sığınacaqları yer Oddur. Zalımların məskunlaşacağı yer necə də pisdir!

سَنُلْقِى فِى قُلُوبِ ٱلَّذِينَ كَفَرُواْ ٱلرُّعْبَ بِمَآ أَشْرَكُواْ بِٱللَّهِ مَا لَمْ يُنَزِّلْ بِهِۦ سُلْطَٰنًا ۖ وَمَأْوَىٰهُمُ ٱلنَّارُ ۚ وَبِئْسَ مَثْوَى ٱلظَّٰلِمِينَ ١٥١

152. Siz Allahın izni ilə düşmənləri qırıb-çatdığınız zaman, Allah sizə verdiyi vədini yerinə yetirdi. Nəhayət O, sizə arzuladığınız şeyi göstərdikdən sonra ruhdan düşdünüz, Peyğəmbərin əmri barəsində bir-birinizlə mübahisə etdiniz və asi oldunuz. İçərinizdən kimisi dünyanı, kimisi də axirəti istəyirdi. Sonra Allah sizi sınamaq üçün üzünüzü onlardan döndərdi. O, artıq sizi bağışladı. Allah möminlərə qarşı lütfkardır.

وَلَقَدْ صَدَقَكُمُ ٱللَّهُ وَعْدَهُۥٓ إِذْ تَحُسُّونَهُم بِإِذْنِهِۦ ۖ حَتَّىٰٓ إِذَا فَشِلْتُمْ وَتَنَٰزَعْتُمْ فِى ٱلْأَمْرِ وَعَصَيْتُم مِّنۢ بَعْدِ مَآ أَرَىٰكُم مَّا تُحِبُّونَ ۚ مِنكُم مَّن يُرِيدُ ٱلدُّنْيَا وَمِنكُم مَّن يُرِيدُ ٱلْءَاخِرَةَ ۚ ثُمَّ صَرَفَكُمْ عَنْهُمْ لِيَبْتَلِيَكُمْ ۖ وَلَقَدْ عَفَا عَنكُمْ ۗ وَٱللَّهُ ذُو فَضْلٍ عَلَى ٱلْمُؤْمِنِينَ ١٥٢

153. O zaman Peyğəmbər arxanızdan – düşmənə yaxın olan sıralardan sizi çağırdığı halda siz heç kimə əhəmiyyət vermədən düşməndən qaçırdınız. Allah da sizi qəminizin üstünə qəm qoymaqla cəzalandırdı ki, əlinizdən çıxan şeylərə və başınıza gələn müsibətə görə

۞ إِذْ تُصْعِدُونَ وَلَا تَلْوُۥنَ عَلَىٰٓ أَحَدٍ وَٱلرَّسُولُ يَدْعُوكُمْ فِىٓ أُخْرَىٰكُمْ فَأَثَٰبَكُمْ غَمًّۢا بِغَمٍّ لِّكَيْلَا تَحْزَنُواْ عَلَىٰ مَا فَاتَكُمْ وَلَا مَآ أَصَٰبَكُمْ ۗ وَٱللَّهُ خَبِيرٌۢ بِمَا تَعْمَلُونَ ١٥٣

kədərlənməyəsiniz. Allah nə etdiklərinizdən xəbərdardır.

154. Sonra O, bu qəm-qüssənin ardınca sizə bir təskinlik – bir qisminizi bürüyən mürgü nazil etdi. O biri qisminiz isə öz canlarının hayına qaldı. Onlar: “Bu işdə bizim üçün bir xeyir varmı?”– deyə Allah barəsində haqsız olaraq, cahiliyyə dövründəkinə bənzər düşüncələrə qapıldılar. De: “Bütün işlər Allaha aiddir!” Onlar sənə bildirmədiklərini öz içərilərində gizlədir: “Əgər bu işdə bizim üçün bir xeyir olsaydı, elə buradaca öldürülməzdik”– deyirlər. De: “Əgər siz evlərinizdə olsaydınız belə, öldürülməsi qabaqcadan müəyyən edilmiş kimsələr yenə çıxıb öləcəkləri yerlərə gedərdilər. Allah sizin kökslərinizdə olanları sınamaq, qəlblərinizdə olanları təmizləmək üçün belə etdi. Allah kökslərdə olanları bilir”.

ثُمَّ أَنزَلَ عَلَيْكُم مِّنۢ بَعْدِ ٱلْغَمِّ أَمَنَةً نُّعَاسًا
يَغْشَىٰ طَآئِفَةً مِّنكُمْ ۖ وَطَآئِفَةٌ قَدْ أَهَمَّتْهُمْ
أَنفُسُهُمْ يَظُنُّونَ بِٱللَّهِ غَيْرَ ٱلْحَقِّ ظَنَّ
ٱلْجَٰهِلِيَّةِ ۖ يَقُولُونَ هَل لَّنَا مِنَ ٱلْأَمْرِ مِن شَىْءٍ ۗ
قُلْ إِنَّ ٱلْأَمْرَ كُلَّهُۥ لِلَّهِ ۗ يُخْفُونَ فِىٓ أَنفُسِهِم مَّا لَا
يُبْدُونَ لَكَ ۖ يَقُولُونَ لَوْ كَانَ لَنَا مِنَ ٱلْأَمْرِ شَىْءٌ مَّا
قُتِلْنَا هَٰهُنَا ۗ قُل لَّوْ كُنتُمْ فِى بُيُوتِكُمْ لَبَرَزَ ٱلَّذِينَ
كُتِبَ عَلَيْهِمُ ٱلْقَتْلُ إِلَىٰ مَضَاجِعِهِمْ ۖ وَلِيَبْتَلِىَ
ٱللَّهُ مَا فِى صُدُورِكُمْ وَلِيُمَحِّصَ مَا فِى
قُلُوبِكُمْ ۗ وَٱللَّهُ عَلِيمٌۢ بِذَاتِ ٱلصُّدُورِ ﴿١٥٤﴾

155. Uhudda iki qoşun qarşılaşdığı gün içərinizdən üz döndərənləri şeytan, qazandıqları bəzi günahlar üzündən səhv etməyə vadar etdi. Allah artıq onları bağışladı. Həqiqətən, Allah Bağışlayandır, Həlimdir.

إِنَّ ٱلَّذِينَ تَوَلَّوْا۟ مِنكُمْ يَوْمَ ٱلْتَقَى ٱلْجَمْعَانِ
إِنَّمَا ٱسْتَزَلَّهُمُ ٱلشَّيْطَٰنُ بِبَعْضِ مَا كَسَبُوا۟ ۖ
وَلَقَدْ عَفَا ٱللَّهُ عَنْهُمْ ۗ إِنَّ ٱللَّهَ غَفُورٌ حَلِيمٌ ﴿١٥٥﴾

156. Ey iman gətirənlər! Səfərə çıxmış və ya müharibəyə getmiş qardaşları barəsində: “Əgər onlar bizim yanımızda olsaydılar, nə ölər, nə də

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ لَا تَكُونُوا۟ كَٱلَّذِينَ كَفَرُوا۟
وَقَالُوا۟ لِإِخْوَٰنِهِمْ إِذَا ضَرَبُوا۟ فِى ٱلْأَرْضِ أَوْ كَانُوا۟
غُزًّى لَّوْ كَانُوا۟ عِندَنَا مَا مَاتُوا۟ وَمَا قُتِلُوا۟

öldürülərdilər"– deyən kafirlər kimi olmayın! Allah bunu onların qəlblərində qəm-qüssə olsun deyə belə etdi. Diriləndən də, öldürən də Allahdır. Allah nə etdiklərinizi görür.

لِيَجْعَلَ ٱللَّهُ ذَٰلِكَ حَسْرَةً فِي قُلُوبِهِمْ وَٱللَّهُ
يُحْيِۦ وَيُمِيتُ وَٱللَّهُ بِمَا تَعْمَلُونَ بَصِيرٌ ﴿١٥٦﴾

157. Əgər siz Allah yolunda öldürülər və ya ölərsinizsə, bilin ki, Allahın günahınızdan keçməsi və sizə mərhəmət göstərməsi kafirlərin yığdıqları şeylərdən daha xeyirlidir.

وَلَئِن قُتِلْتُمْ فِي سَبِيلِ ٱللَّهِ أَوْ مُتُّمْ لَمَغْفِرَةٌ
مِّنَ ٱللَّهِ وَرَحْمَةٌ خَيْرٌ مِّمَّا يَجْمَعُونَ ﴿١٥٧﴾

158. Ölsəniz də, öldürülsəniz də, mütləq Allahın hüzuruna gətirilib cəm olunacaqsınız.

وَلَئِن مُّتُّمْ أَوْ قُتِلْتُمْ لَإِلَى ٱللَّهِ تُحْشَرُونَ ﴿١٥٨﴾

159. Allahın mərhəməti sayəsində sən onlarla mülayim rəftar etdin. Əgər sən kobud və daş qəlbli olsaydın, onlar hökmən sənin ətrafından dağılışardılar. Sən onların günahından keç, Allahdan onların bağışlanmalarını dilə və görəcəyin işlər barədə onlarla məsləhətləş. Qəti qərara gəldikdə isə Allaha təvəkkül et! Həqiqətən, Allah təvəkkül edənləri sevir.

فَبِمَا رَحْمَةٍ مِّنَ ٱللَّهِ لِنتَ لَهُمْ وَلَوْ كُنتَ فَظًّا
غَلِيظَ ٱلْقَلْبِ لَٱنفَضُّوا مِنْ حَوْلِكَ فَٱعْفُ
عَنْهُمْ وَٱسْتَغْفِرْ لَهُمْ وَشَاوِرْهُمْ فِي ٱلْأَمْرِ فَإِذَا
عَزَمْتَ فَتَوَكَّلْ عَلَى ٱللَّهِ إِنَّ ٱللَّهَ يُحِبُّ ٱلْمُتَوَكِّلِينَ ﴿١٥٩﴾

160. Əgər Allah sizə kömək edərsə, heç kəs sizə qalib gələ bilməz. Əgər O, sizi zəlil edərsə, Ondan sonra kim sizə yardım edə bilər? Qoy möminlər Allaha təvəkkül etsinlər!

إِن يَنصُرْكُمُ ٱللَّهُ فَلَا غَالِبَ لَكُمْ
وَإِن يَخْذُلْكُمْ فَمَن ذَا ٱلَّذِي يَنصُرُكُم مِّنۢ
بَعْدِهِۦ وَعَلَى ٱللَّهِ فَلْيَتَوَكَّلِ ٱلْمُؤْمِنُونَ ﴿١٦٠﴾

161. Peyğəmbərə əmanətə xəyanət etmək yaraşmaz. Əmanətə xəyanət edən kimsə Qiyamət günü xəyanət

وَمَا كَانَ لِنَبِيٍّ أَن يَغُلَّ وَمَن يَغْلُلْ يَأْتِ
بِمَا غَلَّ يَوْمَ ٱلْقِيَٰمَةِ ثُمَّ تُوَفَّىٰ كُلُّ

etdiyi şeylə gələr. Sonra da hər kəsə əməllərinin əvəzi tam veriləcək və onlara zülm edilməyəcəkdir.

نَفْسٍ مَّا كَسَبَتْ وَهُمْ لَا يُظْلَمُونَ ﴿١٦١﴾

162. Məgər Allahın razılığını qazanmaq üçün gedən kimsə, Allahın qəzəbinə gələn və sığınacaq yeri Cəhənnəm olan bir kimsə ilə bərabər tutula bilərmi? Ora nə pis qayıdış yeridir!

أَفَمَنِ ٱتَّبَعَ رِضْوَٰنَ ٱللَّهِ كَمَنۢ بَآءَ بِسَخَطٍ
مِّنَ ٱللَّهِ وَمَأْوَىٰهُ جَهَنَّمُ ۚ وَبِئْسَ ٱلْمَصِيرُ ﴿١٦٢﴾

163. Onlar Allah yanında müxtəlif dərəcələrdə olacaqlar. Allah onların nə etdiklərini görür!

هُمْ دَرَجَٰتٌ عِندَ ٱللَّهِ ۗ وَٱللَّهُ بَصِيرٌۢ بِمَا
يَعْمَلُونَ ﴿١٦٣﴾

164. Allah möminlərə, öz aralarından onlara Allahın ayələrini oxuyan, onları günahlardan təmizləyən, onlara Kitabı və Hikməti öyrədən bir Elçi göndərməklə mərhəmət göstərmişdir. Halbuki əvvəllər onlar açıq-aydın azğınlıqda idilər.

لَقَدْ مَنَّ ٱللَّهُ عَلَى ٱلْمُؤْمِنِينَ إِذْ بَعَثَ فِيهِمْ
رَسُولًا مِّنْ أَنفُسِهِمْ يَتْلُوا۟ عَلَيْهِمْ ءَايَٰتِهِۦ
وَيُزَكِّيهِمْ وَيُعَلِّمُهُمُ ٱلْكِتَٰبَ وَٱلْحِكْمَةَ
وَإِن كَانُوا۟ مِن قَبْلُ لَفِى ضَلَٰلٍ مُّبِينٍ ﴿١٦٤﴾

165. Siz onların başına ikiqat müsibət gətirmiş olduğunuz halda, başınıza bir müsibət gəldiyi zaman: “Bu, haradan gəldi?”– söylədiniz. De: “Bu, sizin özünüzdəndir!” Həqiqətən, Allah hər şeyə qadirdir.

أَوَلَمَّآ أَصَٰبَتْكُم مُّصِيبَةٌ قَدْ أَصَبْتُم
مِّثْلَيْهَا قُلْتُمْ أَنَّىٰ هَٰذَا ۖ قُلْ هُوَ مِنْ عِندِ
أَنفُسِكُمْ ۗ إِنَّ ٱللَّهَ عَلَىٰ كُلِّ شَىْءٍ قَدِيرٌ ﴿١٦٥﴾

166. Uhudda iki qoşunun üz-üzə gəldiyi gün sizə üz vermiş müsibət Allahın izni ilə oldu ki, möminləri aşkara çıxartsın

وَمَآ أَصَٰبَكُمْ يَوْمَ ٱلْتَقَى ٱلْجَمْعَانِ فَبِإِذْنِ ٱللَّهِ
وَلِيَعْلَمَ ٱلْمُؤْمِنِينَ ﴿١٦٦﴾

167. və münafiqləri bəlli etsin. Onlara: “Gəlin, Allah yolunda döyüşün, yaxud heç olmasa müdafiədə durun!”– deyildi. Onlar: “Döyüş

وَلِيَعْلَمَ ٱلَّذِينَ نَافَقُوا۟ ۚ وَقِيلَ لَهُمْ تَعَالَوْا۟ قَٰتِلُوا۟
فِى سَبِيلِ ٱللَّهِ أَوِ ٱدْفَعُوا۟ ۖ قَالُوا۟ لَوْ نَعْلَمُ قِتَالًا
لَّٱتَّبَعْنَٰكُمْ ۗ هُمْ لِلْكُفْرِ يَوْمَئِذٍ أَقْرَبُ مِنْهُمْ

olacağını bilsəydik sizin ardınızca gedərdik"– dedilər. Onlar o gün imandan çox küfrə yaxın idilər. Onlar qəlblərində olmayanı ağızları ilə deyirlər. Halbuki Allah onların nəyi gizlətdiklərini çox yaxşı bilir.

لِلْإِيمَٰنِ يَقُولُونَ بِأَفْوَٰهِهِم مَّا لَيْسَ فِى
قُلُوبِهِمْ وَٱللَّهُ أَعْلَمُ بِمَا يَكْتُمُونَ ﴿١٦٧﴾

168. Evlərində oturub öz qardaşları barəsində: "Əgər onlar bizə qulaq asmış olsaydılar, öldürülməzdilər"– söyləyənlərə de: "Əgər doğru danışırsınızsa, onda ölümü özünüzdən uzaqlaşdırın!"

ٱلَّذِينَ قَالُوا۟ لِإِخْوَٰنِهِمْ وَقَعَدُوا۟ لَوْ أَطَاعُونَا
مَا قُتِلُوا۟ قُلْ فَٱدْرَءُوا۟ عَنْ أَنفُسِكُمُ ٱلْمَوْتَ
إِن كُنتُمْ صَٰدِقِينَ ﴿١٦٨﴾

169. Allah yolunda öldürülənləri əsla ölmüş sanma. Əksinə, onlar diridirlər; özlərinin Rəbbi yanında onlara ruzi verilir.

وَلَا تَحْسَبَنَّ ٱلَّذِينَ قُتِلُوا۟ فِى سَبِيلِ ٱللَّهِ أَمْوَٰتًۢا
بَلْ أَحْيَآءٌ عِندَ رَبِّهِمْ يُرْزَقُونَ ﴿١٦٩﴾

170. Onlar Allahın Öz lütfündən onlara verdiyi nemətlərə sevinir, arxalarınca gəlib hələ onlara çatmamış kəslərin heç bir qorxu ilə qarşılaşmayacaqlarına və onların kədərlənməyəcəklərinə fərəhlənirlər.

فَرِحِينَ بِمَآ ءَاتَىٰهُمُ ٱللَّهُ مِن فَضْلِهِۦ
وَيَسْتَبْشِرُونَ بِٱلَّذِينَ لَمْ يَلْحَقُوا۟ بِهِم
مِّنْ خَلْفِهِمْ أَلَّا خَوْفٌ عَلَيْهِمْ وَلَا هُمْ يَحْزَنُونَ ﴿١٧٠﴾

171. Onlar Allahın nemətinə, lütfkarlığına, həm də Allahın möminlərin mükafatını heçə çıxarmayacağına sevinirlər.

۞ يَسْتَبْشِرُونَ بِنِعْمَةٍ مِّنَ ٱللَّهِ وَفَضْلٍ
وَأَنَّ ٱللَّهَ لَا يُضِيعُ أَجْرَ ٱلْمُؤْمِنِينَ ﴿١٧١﴾

172. Onlar yaralandıqdan sonra da Allahın və Peyğəmbərinin dəvətini qəbul etdilər. İçərilərindən yaxşı işlər görənlər və Allahdan qorxanlar üçün böyük bir mükafat vardır.

ٱلَّذِينَ ٱسْتَجَابُوا۟ لِلَّهِ وَٱلرَّسُولِ مِنۢ بَعْدِ
مَآ أَصَابَهُمُ ٱلْقَرْحُ لِلَّذِينَ أَحْسَنُوا۟ مِنْهُمْ
وَٱتَّقَوْا۟ أَجْرٌ عَظِيمٌ ﴿١٧٢﴾

173. Bəzi adamlar onlara: "Camaat sizə qarşı ordu toplayıbdır, onlardan qorxun!"– dedilər. Bu, onların imanını daha da artırdı və onlar: "Allah bizə yetər. O nə gözəl Qoruyandır!"– dedilər.

الَّذِينَ قَالَ لَهُمُ النَّاسُ إِنَّ النَّاسَ قَدْ جَمَعُوا
لَكُمْ فَاخْشَوْهُمْ فَزَادَهُمْ إِيمَانًا وَقَالُوا
حَسْبُنَا اللَّهُ وَنِعْمَ الْوَكِيلُ ١٧٣

174. Onlar özlərinə heç bir pislik toxunmadan, Allahın neməti və mərhəməti sayəsində geri döndülər və Allahın razılığına tabe oldular. Allah böyük lütf sahibidir.

فَانْقَلَبُوا بِنِعْمَةٍ مِنَ اللَّهِ وَفَضْلٍ لَمْ
يَمْسَسْهُمْ سُوءٌ وَاتَّبَعُوا رِضْوَانَ اللَّهِ
وَاللَّهُ ذُو فَضْلٍ عَظِيمٍ ١٧٤

175. O şeytan sadəcə sizi öz dostları ilə qorxudur. Möminsinizsə, onlardan qorxmayın, Məndən qorxun!

إِنَّمَا ذَٰلِكُمُ الشَّيْطَانُ يُخَوِّفُ أَوْلِيَاءَهُ
فَلَا تَخَافُوهُمْ وَخَافُونِ إِنْ كُنْتُمْ مُؤْمِنِينَ ١٧٥

176. Küfrə can atanlar səni kədərləndirməsin. Çünki onlar Allaha heç bir zərər yetirə bilməzlər. Allah istəyir ki, onlara axirətdə heç bir şey nəsib etməsin. Onlar üçün böyük bir əzab vardır.

وَلَا يَحْزُنْكَ الَّذِينَ يُسَارِعُونَ فِي الْكُفْرِ إِنَّهُمْ
لَنْ يَضُرُّوا اللَّهَ شَيْئًا يُرِيدُ اللَّهُ أَلَّا يَجْعَلَ لَهُمْ
حَظًّا فِي الْآخِرَةِ وَلَهُمْ عَذَابٌ عَظِيمٌ ١٧٦

177. Doğrudan da, imanı əldən verib küfrü alanlar Allaha heç bir zərər yetirə bilməzlər. Onları ağrılı-acılı bir əzab gözləyir.

إِنَّ الَّذِينَ اشْتَرَوُا الْكُفْرَ بِالْإِيمَانِ لَنْ يَضُرُّوا
اللَّهَ شَيْئًا وَلَهُمْ عَذَابٌ أَلِيمٌ ١٧٧

178. Kafirlər elə güman etməsinlər ki, Bizim onlara möhlət verməyimiz xeyirlərinədir. Biz onlara ona görə möhlət veririk ki, günahlarını daha da artırsınlar. Onlar üçün alçaldıcı bir əzab hazırlanmışdır.

وَلَا يَحْسَبَنَّ الَّذِينَ كَفَرُوا أَنَّمَا نُمْلِي لَهُمْ
خَيْرٌ لِأَنْفُسِهِمْ إِنَّمَا نُمْلِي لَهُمْ لِيَزْدَادُوا إِثْمًا
وَلَهُمْ عَذَابٌ مُهِينٌ ١٧٨

179. Allah pisi yaxşıdan ayırmayınca möminləri sizin olduğunuz

مَا كَانَ اللَّهُ لِيَذَرَ الْمُؤْمِنِينَ عَلَىٰ مَا أَنْتُمْ

vəziyyətdə tərk edən deyildir. Allah sizə qeybi bildirən deyildir. Lakin, Allah Öz elçilərindən istədiyini seçər. Odur ki, Allaha və Onun elçilərinə iman gətirin! Əgər iman gətirib Allahdan qorxsanız, sizə böyük bir mükafat verilər.

عليه حتى يميز الخبيث من الطيب وما كان
الله ليطلعكم على الغيب ولكن الله يجتبي من
رسله من يشاء فآمنوا بالله ورسله وإن
تؤمنوا وتتقوا فلكم أجر عظيم ﴿١٧٩﴾

180. Allahın Öz lütfündən bəxş etdiyini xərcləməyə xəsislik edənlər elə güman etməsinlər ki, bu, onların xeyrinədir. Əksinə, bu, onlar üçün pisdir. Onların xəsislik etdikləri şey qiyamət günü boyunlarına dolanacaqdır. Göylərin və yerin mirası Allaha məxsusdur. Allah nə etdiklərinizdən xəbərdardır.

ولا يحسبن الذين يبخلون بما آتاهم الله
من فضله هو خيرا لهم بل هو شر لهم
سيطوقون ما بخلوا به يوم القيامة ولله
ميراث السماوات والأرض
والله بما تعملون خبير ﴿١٨٠﴾

181. “Allah kasıbdır, biz isə varlıyıq!”– deyənlərin sözünü Allah eşitdi. Biz onların dediklərini və haqsız olaraq peyğəmbərləri öldürmələrini yazacaq və onlara deyəcəyik: “Dadın yandırıb-yaxan Odun əzabını!

لقد سمع الله قول الذين قالوا إن الله
فقير ونحن أغنياء سنكتب ما قالوا
وقتلهم الأنبياء بغير حق ونقول
ذوقوا عذاب الحريق ﴿١٨١﴾

182. Bu, öz əllərinizlə etdiyiniz əməllərə görədir. Yoxsa Allah qullarına zülm edən deyildir”.

ذلك بما قدمت أيديكم وأن الله
ليس بظلام للعبيد ﴿١٨٢﴾

183. Onlar dedilər: “Allah bizdən əhd almışdı ki, heç bir elçiyə, odun yandıracağı bir qurban gətirməyincə inanmayaq”. De: “Məndən əvvəl də sizə elçilər açıq-aydın dəlillərlə və dediyiniz qurbanla gəlmişdilər. Əgər doğru danışanlarsınızsa, onda nə üçün onları öldürürdünüz?”

الذين قالوا إن الله عهد إلينا ألا
نؤمن لرسول حتى يأتينا بقربان
تأكله النار قل قد جاءكم رسل من
قبلي بالبينات وبالذي قلتم فلم
قتلتموهم إن كنتم صادقين ﴿١٨٣﴾

184. Əgər onlar səni yalançı hesab etsələr, bil ki, səndən əvvəl açıq-aydın dəlillər, müqəddəs yazılar və nur saçan Kitabla gəlmiş elçiləri də yalançı hesab etmişdilər.

فَإِن كَذَّبُوكَ فَقَدْ كُذِّبَ رُسُلٌ مِّن
قَبْلِكَ جَآءُو بِٱلْبَيِّنَٰتِ وَٱلزُّبُرِ
وَٱلْكِتَٰبِ ٱلْمُنِيرِ ﴿١٨٤﴾

185. Hər bir kəs ölümü dadacaqdır. Lakin Qiyamət günü mükafatlarınız sizə tam veriləcəkdir. Kim Oddan uzaqlaşdırılıb, Cənnətə daxil edilərsə, o uğur qazanmış olar. Dünya həyatı isə aldadıcı ləzzətdən başqa bir şey deyildir.

كُلُّ نَفْسٍ ذَآئِقَةُ ٱلْمَوْتِ ۗ وَإِنَّمَا تُوَفَّوْنَ
أُجُورَكُمْ يَوْمَ ٱلْقِيَٰمَةِ ۖ فَمَن زُحْزِحَ
عَنِ ٱلنَّارِ وَأُدْخِلَ ٱلْجَنَّةَ فَقَدْ فَازَ ۗ
وَمَا ٱلْحَيَوٰةُ ٱلدُّنْيَآ إِلَّا مَتَٰعُ ٱلْغُرُورِ ﴿١٨٥﴾

186. Siz hökmən malınız və canınızla sınaqdan keçiriləcəksiniz. Sizdən əvvəl Kitab verilənlərdən və müşriklərdən bir çox əziyyətverici sözlər eşidəcəksiniz. Əgər səbir edib Allahdan qorxsanız, bilin ki, bu, əzmkarlıq tələb edən əməllərdəndir.

۞ لَتُبْلَوُنَّ فِىٓ أَمْوَٰلِكُمْ وَأَنفُسِكُمْ
وَلَتَسْمَعُنَّ مِنَ ٱلَّذِينَ أُوتُوا۟
ٱلْكِتَٰبَ مِن قَبْلِكُمْ وَمِنَ ٱلَّذِينَ
أَشْرَكُوٓا۟ أَذًى كَثِيرًا ۚ وَإِن تَصْبِرُوا۟ وَتَتَّقُوا۟
فَإِنَّ ذَٰلِكَ مِنْ عَزْمِ ٱلْأُمُورِ ﴿١٨٦﴾

187. O zaman Allah Kitab verilənlərlə əhd bağlayıb: "Siz o Kitabı mütləq insanlara aydınlaşdıracaqsınız və onu gizlətməyəcəksiniz!"– deyə buyurdu. Onlar isə bu əhdi qulaqardına vurub onu ucuz qiymətə satdılar. Onların bu alveri necə də pisdir!

وَإِذْ أَخَذَ ٱللَّهُ مِيثَٰقَ ٱلَّذِينَ أُوتُوا۟ ٱلْكِتَٰبَ
لَتُبَيِّنُنَّهُۥ لِلنَّاسِ وَلَا تَكْتُمُونَهُۥ فَنَبَذُوهُ
وَرَآءَ ظُهُورِهِمْ وَٱشْتَرَوْا۟ بِهِۦ ثَمَنًا قَلِيلًا ۖ
فَبِئْسَ مَا يَشْتَرُونَ ﴿١٨٧﴾

188. Törətdikləri əməllərdən fərəhlənən və etmədikləri işlərə görə tərif olunmağı xoşlayan kimsələrin əzabdan qurtulacaqlarını əsla güman etmə. Onlara acılı-ağrılı bir əzab hazırlanmışdır.

لَا تَحْسَبَنَّ ٱلَّذِينَ يَفْرَحُونَ بِمَآ أَتَوا۟ وَّيُحِبُّونَ أَن
يُحْمَدُوا۟ بِمَا لَمْ يَفْعَلُوا۟ فَلَا تَحْسَبَنَّهُم
بِمَفَازَةٍ مِّنَ ٱلْعَذَابِ ۖ وَلَهُمْ عَذَابٌ أَلِيمٌ ﴿١٨٨﴾

189. Göylərin və yerin hökmranlığı Allaha məxsusdur. Allah hər şeyə qadirdir.

وَلِلَّهِ مُلْكُ ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضِ ۗ وَٱللَّهُ عَلَىٰ كُلِّ شَيْءٍ قَدِيرٌ ١٨٩

190. Doğrusu, göylərin və yerin xəlq edilməsində, gecə ilə gündüzün bir-birini əvəz etməsində ağıllı adamlar üçün dəlillər vardır.

إِنَّ فِي خَلْقِ ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضِ وَٱخْتِلَٰفِ ٱلَّيْلِ وَٱلنَّهَارِ لَءَايَٰتٍ لِّأُولِي ٱلْأَلْبَٰبِ ١٩٠

191. O kəslər ki, ayaq üstə olanda da, oturanda da, uzananda da Allahı yad edir, göylərin və yerin yaradılması haqqında düşünür və deyirlər: "Ey Rəbbimiz! Sən bunları əbəs yerə xəlq etməmisən. Sən pak və müqəddəssən. Bizi Odun əzabından qoru!

ٱلَّذِينَ يَذْكُرُونَ ٱللَّهَ قِيَٰمًا وَقُعُودًا وَعَلَىٰ جُنُوبِهِمْ وَيَتَفَكَّرُونَ فِي خَلْقِ ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضِ رَبَّنَا مَا خَلَقْتَ هَٰذَا بَٰطِلًا سُبْحَٰنَكَ فَقِنَا عَذَابَ ٱلنَّارِ ١٩١

192. Ey Rəbbimiz! Sən Oda saldığın kəsi rüsvay edərsən. Zalımların köməkçiləri olmaz.

رَبَّنَآ إِنَّكَ مَن تُدْخِلِ ٱلنَّارَ فَقَدْ أَخْزَيْتَهُۥ ۖ وَمَا لِلظَّٰلِمِينَ مِنْ أَنصَارٍ ١٩٢

193. Ey Rəbbimiz! Həqiqətən, biz: "Rəbbinizə iman gətirin!"– deyə imana çağıran bir kimsənin çağırışını eşidib iman gətirdik. Ey Rəbbimiz! Günahlarımızı bizə bağışla, təqsirlərimizdən keç və canımızı itaətkarlarla bir yerdə al!

رَّبَّنَآ إِنَّنَا سَمِعْنَا مُنَادِيًا يُنَادِي لِلْإِيمَٰنِ أَنْ ءَامِنُوا بِرَبِّكُمْ فَـَٔامَنَّا ۚ رَبَّنَا فَٱغْفِرْ لَنَا ذُنُوبَنَا وَكَفِّرْ عَنَّا سَيِّـَٔاتِنَا وَتَوَفَّنَا مَعَ ٱلْأَبْرَارِ ١٩٣

194. Ey Rəbbimiz! Öz elçilərinin vasitəsi ilə bizə vəd etdiklərini ver və Qiyamət günü bizi rüsvay etmə! Şübhəsiz ki, Sən vədindən dönməzsən!"

رَبَّنَا وَءَاتِنَا مَا وَعَدتَّنَا عَلَىٰ رُسُلِكَ وَلَا تُخْزِنَا يَوْمَ ٱلْقِيَٰمَةِ ۗ إِنَّكَ لَا تُخْلِفُ ٱلْمِيعَادَ ١٩٤

195. Rəbbi onlara belə cavab verdi: "Mən, sizlərdən yaxşı işlər

فَٱسْتَجَابَ لَهُمْ رَبُّهُمْ أَنِّي لَآ أُضِيعُ عَمَلَ

görən – istər kişi, istərsə də qadın olsun, – heç bir kəsin əməyini puç etmərəm. Siz bir-birinizdənsiniz. Hicrət edənlərin, öz yurdlarından çıxarılanların, Mənim yolumda əziyyətə düçar olanların, vuruşanların və öldürülənlərin, əlbəttə, təqsirlərindən keçəcək və onları ağacları altından çaylar axan Cənnət bağlarına daxil edəcəyəm. Bu, Allah tərəfindən bir mükafatdır. Gözəl mükafat məhz Allah yanındadır".

عَمِلٍ مِّنكُم مِّن ذَكَرٍ أَوْ أُنثَىٰ بَعْضُكُم مِّنۢ
بَعْضٍ فَٱلَّذِينَ هَاجَرُوا۟ وَأُخْرِجُوا۟ مِن دِيَـٰرِهِمْ
وَأُوذُوا۟ فِى سَبِيلِى وَقَـٰتَلُوا۟ وَقُتِلُوا۟ لَأُكَفِّرَنَّ
عَنْهُمْ سَيِّـَٔاتِهِمْ وَلَأُدْخِلَنَّهُمْ جَنَّـٰتٍ
تَجْرِى مِن تَحْتِهَا ٱلْأَنْهَـٰرُ ثَوَابًا مِّنْ عِندِ ٱللَّهِ
وَٱللَّهُ عِندَهُۥ حُسْنُ ٱلثَّوَابِ ١٩٥

196. Qoy kafirlərin diyarbədiyar gəzib dolaşması səni aldatmasın!

لَا يَغُرَّنَّكَ تَقَلُّبُ ٱلَّذِينَ كَفَرُوا۟ فِى ٱلْبِلَـٰدِ ١٩٦

197. Bu, az bir mənfəətdir. Sonra isə onların yeri Cəhənnəmdir. Ora nə pis yataqdır!

مَتَـٰعٌ قَلِيلٌ ثُمَّ مَأْوَىٰهُمْ جَهَنَّمُ ۚ وَبِئْسَ
ٱلْمِهَادُ ١٩٧

198. Öz Rəbbindən qorxanları ağacları altından çaylar axan Cənnət bağları gözləyir ki, onlar orada əbədi qalacaqlar. Bu, Allahdan bir ziyafətdir. Allahın yanında olan nemətlər möminlər üçün daha xeyirlidir.

لَـٰكِنِ ٱلَّذِينَ ٱتَّقَوْا۟ رَبَّهُمْ لَهُمْ جَنَّـٰتٌ
تَجْرِى مِن تَحْتِهَا ٱلْأَنْهَـٰرُ خَـٰلِدِينَ فِيهَا نُزُلًا
مِّنْ عِندِ ٱللَّهِ ۗ وَمَا عِندَ ٱللَّهِ خَيْرٌ لِّلْأَبْرَارِ ١٩٨

199. Həqiqətən, Kitab əhlindən elələri də var ki, Allaha müti olaraq həm Allaha, həm sizə nazil edilənə, həm də özlərinə nazil edilənə iman gətirir, Allahın ayələrini ucuz qiymətə satmırlar. Onların öz Rəbbi yanında mükafatları vardır. Şübhəsiz ki, Allah tez haqq-hesab çəkəndir.

وَإِنَّ مِنْ أَهْلِ ٱلْكِتَـٰبِ لَمَن يُؤْمِنُ بِٱللَّهِ
وَمَآ أُنزِلَ إِلَيْكُمْ وَمَآ أُنزِلَ إِلَيْهِمْ
خَـٰشِعِينَ لِلَّهِ لَا يَشْتَرُونَ بِـَٔايَـٰتِ ٱللَّهِ
ثَمَنًا قَلِيلًا ۗ أُو۟لَـٰٓئِكَ لَهُمْ أَجْرُهُمْ عِندَ
رَبِّهِمْ ۗ إِنَّ ٱللَّهَ سَرِيعُ ٱلْحِسَابِ ١٩٩

200. Ey iman gətirənlər! Səbir edin, dözümlü olun, sərhəd boyu növbə ilə keşik çəkin və Allahdan qorxun ki, bəlkə nicat tapasınız!

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ ٱصْبِرُواْ وَصَابِرُواْ
وَرَابِطُواْ وَٱتَّقُواْ ٱللَّهَ لَعَلَّكُمْ
تُفْلِحُونَ ﴿٢٠٠﴾



## ən-Nisa
## («**Qadınlar**») surəsi

*Mərhəmətli və Rəhmli*
*Allahın adı ilə!*

1. Ey insanlar! Sizi tək bir candan xəlq edən, onun özündən zövcəsini yaradan və onlardan da bir çox kişi və qadın *törədib yer üzünə* yayan Rəbbinizdən qorxun! Adı ilə bir-birinizdən *cürbəcür şeylər* istədiyiniz Allahdan və qohumluq əlaqələrini kəsməkdən çəkinin! Həqiqətən, Allah sizə nəzarət edir.

2. Yetimlərin mallarını özlərinə verin və yaxşını pis ilə dəyişməyin. Onların mallarını öz mallarınızla birlikdə yeməyin. Şübhəsiz ki, bu, böyük günahdır.

3. Yetim qızlara qarşı ədalətli olmayacağınızdan qorxursunuzsa, onda xoşunuza gələn *halal* qadınlardan ikisi, üçü və dördü ilə evlənin. Əgər *o qadınlarla* ədalətlə dolanmayacağınızdan qorxursunuzsa, onda *onlardan* biri ilə və yaxud sahib olduğunuz cariyələrlə *kifayətlənin*. Bu, haqsızlıq etməməyə daha yaxındır.

4. Qadınlara öz mehrlərini könül xoşluğu ilə verin! Əgər onlar öz xoşları ilə bundan sizə bir pay versələr, onu nuşcanlıqla və halallıqla yeyin!

## سُورَةُ النِّسَاءِ

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

يَٰٓأَيُّهَا ٱلنَّاسُ ٱتَّقُواْ رَبَّكُمُ ٱلَّذِي خَلَقَكُم مِّن نَّفۡسٖ
وَٰحِدَةٖ وَخَلَقَ مِنۡهَا زَوۡجَهَا وَبَثَّ مِنۡهُمَا رِجَالٗا
كَثِيرٗا وَنِسَآءٗۚ وَٱتَّقُواْ ٱللَّهَ ٱلَّذِي تَسَآءَلُونَ
بِهِۦ وَٱلۡأَرۡحَامَۚ إِنَّ ٱللَّهَ كَانَ عَلَيۡكُمۡ رَقِيبٗا ١

وَءَاتُواْ ٱلۡيَتَٰمَىٰٓ أَمۡوَٰلَهُمۡۖ وَلَا تَتَبَدَّلُواْ ٱلۡخَبِيثَ
بِٱلطَّيِّبِۖ وَلَا تَأۡكُلُوٓاْ أَمۡوَٰلَهُمۡ إِلَىٰٓ أَمۡوَٰلِكُمۡۚ
إِنَّهُۥ كَانَ حُوبٗا كَبِيرٗا ٢

وَإِنۡ خِفۡتُمۡ أَلَّا تُقۡسِطُواْ فِي ٱلۡيَتَٰمَىٰ فَٱنكِحُواْ
مَا طَابَ لَكُم مِّنَ ٱلنِّسَآءِ مَثۡنَىٰ وَثُلَٰثَ وَرُبَٰعَۖ
فَإِنۡ خِفۡتُمۡ أَلَّا تَعۡدِلُواْ فَوَٰحِدَةً أَوۡ مَا مَلَكَتۡ
أَيۡمَٰنُكُمۡۚ ذَٰلِكَ أَدۡنَىٰٓ أَلَّا تَعُولُواْ ٣

وَءَاتُواْ ٱلنِّسَآءَ صَدُقَٰتِهِنَّ نِحۡلَةٗۚ فَإِن طِبۡنَ
لَكُمۡ عَن شَيۡءٖ مِّنۡهُ نَفۡسٗا فَكُلُوهُ هَنِيٓـٔٗا مَّرِيٓـٔٗا ٤

5. Dolanışığınız üçün Allahın sizə vasitə etdiyi mallarınızı ağılsızlara verməyin. Onlara o maldan yedirdib geyindirin və onlara yaxşı nəsihətlər verin.

وَلَا تُؤۡتُواْ ٱلسُّفَهَآءَ أَمۡوَٰلَكُمُ ٱلَّتِي جَعَلَ ٱللَّهُ لَكُمۡ قِيَٰمٗا وَٱرۡزُقُوهُمۡ فِيهَا وَٱكۡسُوهُمۡ وَقُولُواْ لَهُمۡ قَوۡلٗا مَّعۡرُوفٗا ٥

6. Yetimlər yetkinlik yaşına çatdıqda onları imtahana çəkin. Əgər onların ağıllı olduqlarını görsəniz, mallarını özlərinə qaytarın. Onlar böyüyüb *mallarını məndən alacaqlar* deyə o malı israfçılıqla, tələm-tələsik yeməyin. Varlı olan nəfsini saxlasın, yoxsul olan isə o *maldan* insafla yesin. *Yetimlərin* mallarını özlərinə qaytardığınız zaman onlara şahidlər tutun. Haqq-hesab çəkməyə Allah yetər.

وَٱبۡتَلُواْ ٱلۡيَتَٰمَىٰ حَتَّىٰٓ إِذَا بَلَغُواْ ٱلنِّكَاحَ فَإِنۡ ءَانَسۡتُم مِّنۡهُمۡ رُشۡدٗا فَٱدۡفَعُوٓاْ إِلَيۡهِمۡ أَمۡوَٰلَهُمۡۖ وَلَا تَأۡكُلُوهَآ إِسۡرَافٗا وَبِدَارًا أَن يَكۡبَرُواْۚ وَمَن كَانَ غَنِيّٗا فَلۡيَسۡتَعۡفِفۡۖ وَمَن كَانَ فَقِيرٗا فَلۡيَأۡكُلۡ بِٱلۡمَعۡرُوفِۚ فَإِذَا دَفَعۡتُمۡ إِلَيۡهِمۡ أَمۡوَٰلَهُمۡ فَأَشۡهِدُواْ عَلَيۡهِمۡۚ وَكَفَىٰ بِٱللَّهِ حَسِيبٗا ٦

7. Valideynlərin və yaxın qohumların qoyub getdikləri *maldan* kişilərə pay düşür; valideynlərin və yaxın qohumların qoyub getdikləri *maldan* qadınlara da pay düşür. Bu *mal* istər az olsun, istərsə də çox, *onlar üçün* müəyyən edilmiş bir paydır.

لِّلرِّجَالِ نَصِيبٞ مِّمَّا تَرَكَ ٱلۡوَٰلِدَانِ وَٱلۡأَقۡرَبُونَ وَلِلنِّسَآءِ نَصِيبٞ مِّمَّا تَرَكَ ٱلۡوَٰلِدَانِ وَٱلۡأَقۡرَبُونَ مِمَّا قَلَّ مِنۡهُ أَوۡ كَثُرَۚ نَصِيبٗا مَّفۡرُوضٗا ٧

8. Əgər bölgü vaxtı orada qohumlar, yetimlər və kasıblar iştirak edərlərsə, onlara o *maldan* bir şey verin, özlərinə də xoş söz deyin.

وَإِذَا حَضَرَ ٱلۡقِسۡمَةَ أُوْلُواْ ٱلۡقُرۡبَىٰ وَٱلۡيَتَٰمَىٰ وَٱلۡمَسَٰكِينُ فَٱرۡزُقُوهُم مِّنۡهُ وَقُولُواْ لَهُمۡ قَوۡلٗا مَّعۡرُوفٗا ٨

9. Qoy özlərindən sonra zəif övladlar qoyub gedəcəkləri təqdirdə onlardan ötrü qorxan kəslər *yetimlərdən ötrü də* qorxsunlar. Qoy onlar Allahdan qorxsunlar və doğru söz söyləsinlər.

وَلۡيَخۡشَ ٱلَّذِينَ لَوۡ تَرَكُواْ مِنۡ خَلۡفِهِمۡ ذُرِّيَّةٗ ضِعَٰفًا خَافُواْ عَلَيۡهِمۡ فَلۡيَتَّقُواْ ٱللَّهَ وَلۡيَقُولُواْ قَوۡلٗا سَدِيدًا ٩

10. Həqiqətən, yetimlərin mallarını haqsızlıqla yeyənlər öz qarınlarına ancaq od doldururlar və onlar yandırıb-yaxan oda girəcəklər.

إِنَّ ٱلَّذِينَ يَأۡكُلُونَ أَمۡوَٰلَ ٱلۡيَتَٰمَىٰ ظُلۡمًا
إِنَّمَا يَأۡكُلُونَ فِي بُطُونِهِمۡ نَارٗاۖ
وَسَيَصۡلَوۡنَ سَعِيرٗا ١٠

11. Allah övladlarınız haqqında sizə *belə* tövsiyə edir; kişiyə, iki qadının payı qədər *pay* düşür. Əgər *övladların hamısı* ikidən artıq sayda qadındırlarsa, *vəfat edənin* qoyub getdiyi *malın* üçdə iki hissəsi onlara çatır. Əgər təkcə bir qadındırsa, *mirasın* yarısı ona çatır. Əgər *ölənin* övladı varsa, onun valideynlərinin hər birinə qoyub getdiyi *malının* altıda bir hissəsi çatır. Əgər onun övladı yoxdursa, varisi də *ancaq* valideynləridirsə, onun anasına *mirasının* üçdə bir hissəsi düşür. Əgər *ölənin* qardaşları *və ya bacıları* varsa, onun anasına *mirasının* altıda bir hissəsi düşür. *Bu bölgü* ölənin vəsiyyəti yerinə yetirildikdən və ya borcu ödənildikdən sonra *aparılır*. Valideynlərinizdən və övladlarınızdan hansının fayda baxımından sizə daha yaxın olduğunu siz bilmirsiniz. *Bunlar* Allah tərəfindən buyurulmuş fərz əməllərdir. Həqiqətən, Allah Biləndir, Müdrikdir.

يُوصِيكُمُ ٱللَّهُ فِيٓ أَوۡلَٰدِكُمۡۖ لِلذَّكَرِ مِثۡلُ
حَظِّ ٱلۡأُنثَيَيۡنِۚ فَإِن كُنَّ نِسَآءٗ فَوۡقَ
ٱثۡنَتَيۡنِ فَلَهُنَّ ثُلُثَا مَا تَرَكَۖ وَإِن كَانَتۡ
وَٰحِدَةٗ فَلَهَا ٱلنِّصۡفُۚ وَلِأَبَوَيۡهِ لِكُلِّ وَٰحِدٖ
مِّنۡهُمَا ٱلسُّدُسُ مِمَّا تَرَكَ إِن كَانَ لَهُۥ وَلَدٞۚ
فَإِن لَّمۡ يَكُن لَّهُۥ وَلَدٞ وَوَرِثَهُۥٓ أَبَوَاهُ فَلِأُمِّهِ ٱلثُّلُثُۚ
فَإِن كَانَ لَهُۥٓ إِخۡوَةٞ فَلِأُمِّهِ ٱلسُّدُسُۚ مِنۢ بَعۡدِ
وَصِيَّةٖ يُوصِي بِهَآ أَوۡ دَيۡنٍۗ ءَابَآؤُكُمۡ وَأَبۡنَآؤُكُمۡ
لَا تَدۡرُونَ أَيُّهُمۡ أَقۡرَبُ لَكُمۡ نَفۡعٗاۚ فَرِيضَةٗ
مِّنَ ٱللَّهِۗ إِنَّ ٱللَّهَ كَانَ عَلِيمًا حَكِيمٗا ١١

12. Əgər *vəfat etmiş* zövcələrinizin övladı yoxdursa, onların vəsiyyəti yerinə yetirildikdən və ya borcu ödənildikdən sonra, qoyub getdikləri *malın* yarısı sizindir.

۞ وَلَكُمۡ نِصۡفُ مَا تَرَكَ أَزۡوَٰجُكُمۡ
إِن لَّمۡ يَكُن لَّهُنَّ وَلَدٞۚ فَإِن كَانَ
لَهُنَّ وَلَدٞ فَلَكُمُ ٱلرُّبُعُ مِمَّا تَرَكۡنَۚ
مِنۢ بَعۡدِ وَصِيَّةٖ يُوصِينَ بِهَآ

Yox əgər onların övladı varsa, onda qoyub getdiklərinin dörddə bir hissəsi sizindir. Əgər sizin övladınız yoxdursa, vəsiyyətiniz yerinə yetirildikdən və ya borcunuz ödənildikdən sonra, qoyub getdiyiniz *malın* dörddə bir hissəsi zövcələrinizə çatır. Yox əgər övladınız varsa, onda qoyub getdiyiniz *malın* səkkizdə bir hissəsi onlara çatır. Əgər *vəfat etmiş* kişinin və ya qadının valideyni və övladı yoxdursa, *eyni anadan* bir qardaşı və ya bir bacısı varsa, onda onların hər birinə *mirasın* altıda bir hissəsi düşür. Əgər onlar *sayca* bundan artıq olsalar, *mirasın* üçdə birinə şərikdirlər. *Bu bölgü, vərəsələrə zərər yetirməmək şərti ilə* vəsiyyətin yerinə yetirilməsindən və ya borcun ödənilməsindən sonra *aparılır*. *Bunlar* Allah tərəfindən bir tövsiyədir. Allah Biləndir, Həlimdir.

أَوْ دَيْنٍ ۚ وَلَهُنَّ الرُّبُعُ مِمَّا تَرَكْتُمْ إِن
لَّمْ يَكُن لَّكُمْ وَلَدٌ ۚ فَإِن كَانَ
لَكُمْ وَلَدٌ فَلَهُنَّ الثُّمُنُ مِمَّا تَرَكْتُم ۚ
مِّن بَعْدِ وَصِيَّةٍ تُوصُونَ بِهَا أَوْ دَيْنٍ ۗ
وَإِن كَانَ رَجُلٌ يُورَثُ كَلَالَةً
أَوِ امْرَأَةٌ وَلَهُ أَخٌ أَوْ أُخْتٌ فَلِكُلِّ وَاحِدٍ
مِّنْهُمَا السُّدُسُ ۚ فَإِن كَانُوا أَكْثَرَ
مِن ذَٰلِكَ فَهُمْ شُرَكَاءُ فِي الثُّلُثِ ۚ
مِن بَعْدِ وَصِيَّةٍ يُوصَىٰ بِهَا أَوْ دَيْنٍ
غَيْرَ مُضَارٍّ ۚ وَصِيَّةً مِّنَ اللَّهِ ۗ
وَاللَّهُ عَلِيمٌ حَلِيمٌ ﴿١٢﴾

13. Bunlar Allahın *qoyduğu* hüdudlarıdır. Kim Allaha və Onun Elçisinə itaət edərsə, *Allah* onu *ağacları* altından çaylar axan, içində əbədi qalacaqları Cənnət bağlarına daxil edər. Bu, böyük uğurdur.

تِلْكَ حُدُودُ اللَّهِ ۚ وَمَن يُطِعِ اللَّهَ
وَرَسُولَهُ يُدْخِلْهُ جَنَّاتٍ تَجْرِي
مِن تَحْتِهَا الْأَنْهَارُ خَالِدِينَ
فِيهَا ۚ وَذَٰلِكَ الْفَوْزُ الْعَظِيمُ ﴿١٣﴾

14. Kim Allaha və Onun Elçisinə asi olub Onun hüdudlarını aşarsa, *Allah* onu içində əbədi qalacağı *Cəhənnəm* oduna vasil edər. Onun üçün alçaldıcı bir əzab vardır.

وَمَن يَعْصِ اللَّهَ وَرَسُولَهُ وَيَتَعَدَّ
حُدُودَهُ يُدْخِلْهُ نَارًا خَالِدًا فِيهَا
وَلَهُ عَذَابٌ مُّهِينٌ ﴿١٤﴾

**15.** Zinakarlıq edən qadınlarınıza qarşı özünüzdən dörd şahid çağırın! Əgər onlar şahidlik etsələr, o qadınları, ölüm onların həyatına son qoyanadək və yaxud Allah onlar üçün bir yol açanadək evlərdə həbs edin!

وَٱلَّٰتِي يَأۡتِينَ ٱلۡفَٰحِشَةَ مِن نِّسَآئِكُمۡ
فَٱسۡتَشۡهِدُواْ عَلَيۡهِنَّ أَرۡبَعَةٗ مِّنكُمۡۖ
فَإِن شَهِدُواْ فَأَمۡسِكُوهُنَّ فِي ٱلۡبُيُوتِ
حَتَّىٰ يَتَوَفَّىٰهُنَّ ٱلۡمَوۡتُ أَوۡ يَجۡعَلَ ٱللَّهُ
لَهُنَّ سَبِيلٗا ١٥

**16.** Aranızda belə *yaramaz* iş tutanların hər ikisinə əziyyət verin. Əgər tövbə edib *əməllərini* islah etsələr, onlardan əl çəkin. Həqiqətən, Allah tövbələri qəbul edəndir, Rəhmlidir.

وَٱلَّذَانِ يَأۡتِيَٰنِهَا مِنكُمۡ فَـَٔاذُوهُمَاۖ
فَإِن تَابَا وَأَصۡلَحَا فَأَعۡرِضُواْ عَنۡهُمَآۗ
إِنَّ ٱللَّهَ كَانَ تَوَّابٗا رَّحِيمًا ١٦

**17.** Allah ancaq o kəslərin tövbələrini qəbul edir ki, onlar avamlıqları üzündən pis iş gördükdən sonra tezliklə tövbə edirlər. Allah onların tövbələrini qəbul edər. Həqiqətən, Allah Biləndir, Müdrikdir.

إِنَّمَا ٱلتَّوۡبَةُ عَلَى ٱللَّهِ لِلَّذِينَ يَعۡمَلُونَ
ٱلسُّوٓءَ بِجَهَٰلَةٖ ثُمَّ يَتُوبُونَ مِن قَرِيبٖ
فَأُوْلَٰٓئِكَ يَتُوبُ ٱللَّهُ عَلَيۡهِمۡۗ
وَكَانَ ٱللَّهُ عَلِيمًا حَكِيمٗا ١٧

**18.** Günah işlər görməkdə davam edənlərdən birinə ölüm gəldiyi zaman: “Mən indi tövbə etdim!”– deyənlərin də, kafir kimi ölənlərin də tövbəsi qəbul deyildir. Biz onlar üçün ağrılı-acılı bir əzab hazırlamışıq.

وَلَيۡسَتِ ٱلتَّوۡبَةُ لِلَّذِينَ يَعۡمَلُونَ
ٱلسَّيِّـَٔاتِ حَتَّىٰٓ إِذَا حَضَرَ أَحَدَهُمُ
ٱلۡمَوۡتُ قَالَ إِنِّي تُبۡتُ ٱلۡـَٰٔنَ وَلَا ٱلَّذِينَ
يَمُوتُونَ وَهُمۡ كُفَّارٌۚ أُوْلَٰٓئِكَ أَعۡتَدۡنَا
لَهُمۡ عَذَابًا أَلِيمٗا ١٨

**19.** Ey iman gətirənlər! Qadınlara zorla varis çıxmaq sizə halal deyildir. *Qadınlar* açıq-aşkar yaramaz bir iş görməyincə, onlara verdiklərinizin bir hissəsini geri almaq üçün onları sıxışdırmayın. Onlarla xoş rəftar edin. Əgər onlar xoşunuza gəlmirsə, ola bilsin ki, xoşlamadığınız bir şeydə Allah sizə çoxlu xeyir nəsib etmiş olsun.

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ لَا يَحِلُّ لَكُمۡ أَن
تَرِثُواْ ٱلنِّسَآءَ كَرۡهٗاۖ وَلَا تَعۡضُلُوهُنَّ لِتَذۡهَبُواْ
بِبَعۡضِ مَآ ءَاتَيۡتُمُوهُنَّ إِلَّآ أَن يَأۡتِينَ
بِفَٰحِشَةٖ مُّبَيِّنَةٖۚ وَعَاشِرُوهُنَّ بِٱلۡمَعۡرُوفِۚ
فَإِن كَرِهۡتُمُوهُنَّ فَعَسَىٰٓ أَن تَكۡرَهُواْ شَيۡـٔٗا
وَيَجۡعَلَ ٱللَّهُ فِيهِ خَيۡرٗا كَثِيرٗا ١٩

**20.** Əgər bir arvadın yerinə başqa bir arvad almaq istəsəniz, onlardan birinə yığın-yığın mal vermiş olsanız belə, heç bir şey geri almayın! Məgər *verdiyinizi* böhtan atmaq və açıq-aşkar günah işlətməkləmi geri alacaqsınız?

وَإِنْ أَرَدتُّمُ ٱسْتِبْدَالَ زَوْجٍ مَّكَانَ
زَوْجٍ وَءَاتَيْتُمْ إِحْدَىٰهُنَّ قِنطَارًا
فَلَا تَأْخُذُوا۟ مِنْهُ شَيْـًٔا ۚ أَتَأْخُذُونَهُۥ
بُهْتَٰنًا وَإِثْمًا مُّبِينًا ٢٠

**21.** Onu necə geri ala bilərsiniz ki, siz bir-birinizlə yaxınlıq etmişdiniz və onlar da sizdən möhkəm əhd-peyman almışdılar.

وَكَيْفَ تَأْخُذُونَهُۥ وَقَدْ أَفْضَىٰ
بَعْضُكُمْ إِلَىٰ بَعْضٍ وَأَخَذْنَ مِنكُم
مِّيثَٰقًا غَلِيظًا ٢١

**22.** Olub-keçənlər istisna olmaqla *bundan sonra* atalarınızın evlənmiş olduğu qadınlarla evlənməyin. Həqiqətən, bu, iyrənc və qəzəb doğuran bir əməl və murdar bir yoldur.

وَلَا تَنكِحُوا۟ مَا نَكَحَ ءَابَآؤُكُم
مِّنَ ٱلنِّسَآءِ إِلَّا مَا قَدْ سَلَفَ ۚ إِنَّهُۥ كَانَ
فَٰحِشَةً وَمَقْتًا وَسَآءَ سَبِيلًا ٢٢

**23.** Sizə analarınız, qızlarınız, bacılarınız, bibiləriniz, xalalarınız, qardaş qızları, bacı qızları, sizi əmizdirən süd analarınız, süd bacılarınız, arvadlarınızın anaları, yaxınlıq etdiyiniz qadınlarınızın himayənizdə olan qızları, – yox əgər o qadınlarla yaxınlıq etməmişsinizsə, onda bu *ögey qızlarınızla evlənməyiniz* sizə günah deyildir, – öz belinizdən gələn oğullarınızın arvadları *ilə evlənmək* və iki bacını birlikdə almaq haram edildi. Olub-keçənlər isə artıq keçmişdir. Həqiqətən, Allah Bağışlayandır, Rəhmlidir.

حُرِّمَتْ عَلَيْكُمْ أُمَّهَٰتُكُمْ
وَبَنَاتُكُمْ وَأَخَوَٰتُكُمْ وَعَمَّٰتُكُمْ
وَخَٰلَٰتُكُمْ وَبَنَاتُ ٱلْأَخِ وَبَنَاتُ
ٱلْأُخْتِ وَأُمَّهَٰتُكُمُ ٱلَّٰتِىٓ أَرْضَعْنَكُمْ
وَأَخَوَٰتُكُم مِّنَ ٱلرَّضَٰعَةِ وَأُمَّهَٰتُ
نِسَآئِكُمْ وَرَبَٰٓئِبُكُمُ ٱلَّٰتِى فِى
حُجُورِكُم مِّن نِّسَآئِكُمُ ٱلَّٰتِى
دَخَلْتُم بِهِنَّ فَإِن لَّمْ تَكُونُوا۟ دَخَلْتُم
بِهِنَّ فَلَا جُنَاحَ عَلَيْكُمْ وَحَلَٰٓئِلُ
أَبْنَآئِكُمُ ٱلَّذِينَ مِنْ أَصْلَٰبِكُمْ
وَأَن تَجْمَعُوا۟ بَيْنَ ٱلْأُخْتَيْنِ إِلَّا
مَا قَدْ سَلَفَ ۗ إِنَّ ٱللَّهَ كَانَ
غَفُورًا رَّحِيمًا ٢٣

24. Sahib olduğunuz cariyələr istisna olmaqla ərli qadınları almaq da sizə haram edildi. Allahın sizə buyurduğu hökmü belədir. Bunlardan başqaları ilə, öz malınızla, nikah etməklə, zinakarlığa yol vermədən evlənməyiniz sizə halal edildi. Evləndiyiniz qadınlardan zövq aldığınıza görə onlara, vacib buyurulmuş mehrlərini verin. Bu mehr müəyyən edildikdən sonra öz aranızda razılaşdığınız şeyə görə sizə heç bir günah olmaz. Həqiqətən, Allah Biləndir, Müdrikdir.

۞ وَالْمُحْصَنَاتُ مِنَ النِّسَاءِ إِلَّا
مَا مَلَكَتْ أَيْمَانُكُمْ كِتَابَ اللَّهِ
عَلَيْكُمْ وَأُحِلَّ لَكُمْ مَا وَرَاءَ ذَٰلِكُمْ أَنْ تَبْتَغُوا
بِأَمْوَالِكُمْ مُحْصِنِينَ غَيْرَ مُسَافِحِينَ فَمَا
اسْتَمْتَعْتُمْ بِهِ مِنْهُنَّ فَآتُوهُنَّ أُجُورَهُنَّ
فَرِيضَةً وَلَا جُنَاحَ عَلَيْكُمْ فِيمَا تَرَاضَيْتُمْ
بِهِ مِنْ بَعْدِ الْفَرِيضَةِ إِنَّ اللَّهَ
كَانَ عَلِيمًا حَكِيمًا ﴿٢٤﴾

25. Sizlərdən hər kəs maddi imkanı olmadığına görə azad mömin qadınlarla evlənə bilmirsə, onda sahib olduğu mömin kənizlərdən alsın. Allah sizin imanınıza daha yaxşı bələddir. Siz bir-birinizdənsiniz. Bu kənizlər namusunu qoruyan, zinakarlıq etməyən və aşna saxlamayan qadınlardırsa, onlarla sahiblərinin icazəsi ilə evlənin və mehrlərini şəriətə müvafiq qaydada verin. Əgər ərə getdikdən sonra zina etsələr, onlara, azad qadınlara verilən cəzanın yarısı tətbiq edilər. Kənizlərlə evlənmək sıxıntıya düşməkdən və ya zina etməkdən qorxanlarınız üçündür. Amma səbirli olsanız, bu sizin üçün daha yaxşı olar. Allah Bağışlayandır, Rəhmlidir.

وَمَنْ لَمْ يَسْتَطِعْ مِنْكُمْ طَوْلًا أَنْ
يَنْكِحَ الْمُحْصَنَاتِ الْمُؤْمِنَاتِ فَمِنْ مَا
مَلَكَتْ أَيْمَانُكُمْ مِنْ فَتَيَاتِكُمُ
الْمُؤْمِنَاتِ وَاللَّهُ أَعْلَمُ بِإِيمَانِكُمْ
بَعْضُكُمْ مِنْ بَعْضٍ فَانْكِحُوهُنَّ بِإِذْنِ
أَهْلِهِنَّ وَآتُوهُنَّ أُجُورَهُنَّ بِالْمَعْرُوفِ
مُحْصَنَاتٍ غَيْرَ مُسَافِحَاتٍ وَلَا مُتَّخِذَاتِ
أَخْدَانٍ فَإِذَا أُحْصِنَّ فَإِنْ أَتَيْنَ
بِفَاحِشَةٍ فَعَلَيْهِنَّ نِصْفُ مَا عَلَى
الْمُحْصَنَاتِ مِنَ الْعَذَابِ ذَٰلِكَ لِمَنْ
خَشِيَ الْعَنَتَ مِنْكُمْ وَأَنْ تَصْبِرُوا
خَيْرٌ لَكُمْ وَاللَّهُ غَفُورٌ رَحِيمٌ ﴿٢٥﴾

26. Allah sizə şəriət hökmlərini bəyan etmək, sizi özünüzdən əvvəlkilərin yollarına yönəltmək və tövbələrinizi qəbul etmək istəyir. Allah Biləndir, Müdrikdir.

يُرِيدُ ٱللَّهُ لِيُبَيِّنَ لَكُمْ وَيَهْدِيَكُمْ
سُنَنَ ٱلَّذِينَ مِن قَبْلِكُمْ وَيَتُوبَ
عَلَيْكُمْ ۗ وَٱللَّهُ عَلِيمٌ حَكِيمٌ ﴿٢٦﴾

27. Allah sizin tövbələrinizi qəbul etmək istədiyi halda, ehtiraslara qapılanlar sizi çox kənara meyl etməyə – haqdan uzaqlaşmağa yönəldərlər.

وَٱللَّهُ يُرِيدُ أَن يَتُوبَ عَلَيْكُمْ وَيُرِيدُ
ٱلَّذِينَ يَتَّبِعُونَ ٱلشَّهَوَٰتِ أَن تَمِيلُوا۟
مَيْلًا عَظِيمًا ﴿٢٧﴾

28. Allah sizin üçün şəriət hökmlərini yüngülləşdirmək istəyir, çünki insan zəif yaradılmışdır.

يُرِيدُ ٱللَّهُ أَن يُخَفِّفَ عَنكُمْ ۚ وَخُلِقَ
ٱلْإِنسَٰنُ ضَعِيفًا ﴿٢٨﴾

29. Ey iman gətirənlər! Qarşılıqlı razılıqla aparılan ticarət istisna olmaqla mallarınızı öz aranızda haqsız yerə yeməyin və bir-birinizi məhv etməyin. Həqiqətən, Allah sizə qarşı rəhmlidir.

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ لَا تَأْكُلُوٓا۟ أَمْوَٰلَكُم
بَيْنَكُم بِٱلْبَٰطِلِ إِلَّآ أَن تَكُونَ تِجَٰرَةً عَن
تَرَاضٍ مِّنكُمْ ۚ وَلَا تَقْتُلُوٓا۟ أَنفُسَكُمْ ۚ
إِنَّ ٱللَّهَ كَانَ بِكُمْ رَحِيمًا ﴿٢٩﴾

30. Kim bu əməlləri düşmənçilik və zülm etməklə yerinə yetirərsə, Biz onu odda yandıracağıq. Bu da Allah üçün asandır.

وَمَن يَفْعَلْ ذَٰلِكَ عُدْوَٰنًا وَظُلْمًا فَسَوْفَ نُصْلِيهِ
نَارًا ۚ وَكَانَ ذَٰلِكَ عَلَى ٱللَّهِ يَسِيرًا ﴿٣٠﴾

31. Sizə qadağan olunmuş böyük günahlardan çəkinsəniz, Biz sizin təqsirlərinizdən keçər və sizi şərəfli bir keçidə – Cənnətə daxil edərik.

إِن تَجْتَنِبُوا۟ كَبَآئِرَ مَا تُنْهَوْنَ عَنْهُ
نُكَفِّرْ عَنكُمْ سَيِّـَٔاتِكُمْ وَنُدْخِلْكُم
مُّدْخَلًا كَرِيمًا ﴿٣١﴾

32. Allahın birinizi digərinizdən üstün etdiyi şeyə tamah salmayın. Kişilərin qazandıqlarından öz nəsibi, qadınların da qazandıqlarından öz nəsibi vardır. Allahdan, Onun lütfünü diləyin. Həqiqətən, Allah hər şeyi Biləndir.

وَلَا تَتَمَنَّوْا۟ مَا فَضَّلَ ٱللَّهُ بِهِۦ بَعْضَكُمْ عَلَىٰ
بَعْضٍ ۚ لِّلرِّجَالِ نَصِيبٌ مِّمَّا ٱكْتَسَبُوا۟ ۖ
وَلِلنِّسَآءِ نَصِيبٌ مِّمَّا ٱكْتَسَبْنَ ۚ وَسْـَٔلُوا۟
ٱللَّهَ مِن فَضْلِهِۦٓ ۚ إِنَّ ٱللَّهَ كَانَ
بِكُلِّ شَىْءٍ عَلِيمًا ﴿٣٢﴾

33. Hər kəs üçün valideynlərin və yaxın qohumların qoyub getdikləri maldan öz paylarını alacaq varislər təyin etdik. Siz də əhd bağladığınız kəslərin paylarını özlərinə verin. Həqiqətən, Allah hər şeyə Şahiddir.

وَلِكُلٍّ جَعَلْنَا مَوَٰلِيَ مِمَّا تَرَكَ
ٱلْوَٰلِدَانِ وَٱلْأَقْرَبُونَ وَٱلَّذِينَ عَقَدَتْ
أَيْمَٰنُكُمْ فَـَٔاتُوهُمْ نَصِيبَهُمْ إِنَّ ٱللَّهَ
كَانَ عَلَىٰ كُلِّ شَيْءٍ شَهِيدًا ٣٣

34. Allahın onlardan birini digərindən üstün etdiyinə və öz mallarından xərclədiklərinə görə kişilər qadınlar üzərində himayəçidirlər. Əməlisaleh qadınlar Allaha itaət edər və qorunması lazım gələn şeyləri Allahın himayəsi sayəsində qoruyub saxlayarlar. Özbaşınalıq etmələrindən qorxduğunuz qadınlara nəsihət edin, yataqda onları tərk edin və onları döyün! Əgər sizə itaət etsələr, onlara əziyyət vermək üçün başqa yol axtarmayın. Həqiqətən, Allah Ucadır, Böyükdür.

ٱلرِّجَالُ قَوَّٰمُونَ عَلَى ٱلنِّسَآءِ بِمَا فَضَّلَ
ٱللَّهُ بَعْضَهُمْ عَلَىٰ بَعْضٍ وَبِمَآ أَنفَقُواْ مِنْ
أَمْوَٰلِهِمْ فَٱلصَّٰلِحَٰتُ قَٰنِتَٰتٌ حَٰفِظَٰتٌ
لِّلْغَيْبِ بِمَا حَفِظَ ٱللَّهُ وَٱلَّٰتِي
تَخَافُونَ نُشُوزَهُنَّ فَعِظُوهُنَّ
وَٱهْجُرُوهُنَّ فِي ٱلْمَضَاجِعِ وَٱضْرِبُوهُنَّ
فَإِنْ أَطَعْنَكُمْ فَلَا تَبْغُواْ عَلَيْهِنَّ سَبِيلًا
إِنَّ ٱللَّهَ كَانَ عَلِيًّا كَبِيرًا ٣٤

35. Əgər ər-arvad arasında ixtilaf olacağından qorxsanız, onda kişinin ailəsindən bir hakim və qadının ailəsindən bir hakim göndərin. Əgər bunlar islah etmək istəsələr, Allah da onları barışdırar. Həqiqətən, Allah Biləndir, hər şeydən Xəbərdardır.

وَإِنْ خِفْتُمْ شِقَاقَ بَيْنِهِمَا فَٱبْعَثُواْ حَكَمًا
مِّنْ أَهْلِهِۦ وَحَكَمًا مِّنْ أَهْلِهَآ إِن يُرِيدَآ
إِصْلَٰحًا يُوَفِّقِ ٱللَّهُ بَيْنَهُمَآ إِنَّ ٱللَّهَ
كَانَ عَلِيمًا خَبِيرًا ٣٥

36. Allaha ibadət edin və heç bir şeyi Ona şərik qoşmayın! Valideynlərə, qohum-əqrəbaya, yetimlərə, kasıblara, yaxın və uzaq qonum-qonşuya, yol yoldaşına, müsafirə və sahib olduğunuz kölə və kənizlərə yaxşılıq edin! Həqiqətən, Allah lovğalıq edənləri və özünü öyənləri sevmir.

۞ وَٱعْبُدُواْ ٱللَّهَ وَلَا تُشْرِكُواْ بِهِۦ
شَيْـًٔا وَبِٱلْوَٰلِدَيْنِ إِحْسَٰنًا وَبِذِي ٱلْقُرْبَىٰ
وَٱلْيَتَٰمَىٰ وَٱلْمَسَٰكِينِ وَٱلْجَارِ ذِي
ٱلْقُرْبَىٰ وَٱلْجَارِ ٱلْجُنُبِ وَٱلصَّاحِبِ
بِٱلْجَنۢبِ وَٱبْنِ ٱلسَّبِيلِ وَمَا مَلَكَتْ
أَيْمَٰنُكُمْ إِنَّ ٱللَّهَ لَا يُحِبُّ مَن
كَانَ مُخْتَالًا فَخُورًا ٣٦

37. O kəslər ki, xəsislik edir və insanları da xəsisliyə sövq etdirirlər, Allahın Öz lütfündən onlara verdiyini gizlədirlər. Biz kafirlər üçün alçaldıcı bir əzab hazırlamışıq.

ٱلَّذِينَ يَبْخَلُونَ وَيَأْمُرُونَ ٱلنَّاسَ
بِٱلْبُخْلِ وَيَكْتُمُونَ مَآ ءَاتَىٰهُمُ ٱللَّهُ
مِن فَضْلِهِۦ ۗ وَأَعْتَدْنَا لِلْكَٰفِرِينَ عَذَابًا
مُّهِينًا ٣٧

38. Və o kəslər ki, öz mallarını insanlara göstərmək məqsədilə xərcləyir, Allaha və Axirət gününə inanmırlar. Kimin yoldaşı şeytandırsa, necə də pis yoldaşdır o!

وَٱلَّذِينَ يُنفِقُونَ أَمْوَٰلَهُمْ رِئَآءَ ٱلنَّاسِ
وَلَا يُؤْمِنُونَ بِٱللَّهِ وَلَا بِٱلْيَوْمِ ٱلْءَاخِرِ ۗ وَمَن
يَكُنِ ٱلشَّيْطَٰنُ لَهُۥ قَرِينًا فَسَآءَ قَرِينًا ٣٨

39. Məgər onlar Allaha və Axirət gününə iman gətirib Allahın onlara verdiyi ruzidən Onun yolunda xərcləsəydilər, nə itirərdilər? Allah onların hər bir işini bilir.

وَمَاذَا عَلَيْهِمْ لَوْ ءَامَنُوا۟ بِٱللَّهِ وَٱلْيَوْمِ ٱلْءَاخِرِ
وَأَنفَقُوا۟ مِمَّا رَزَقَهُمُ ٱللَّهُ ۚ وَكَانَ ٱللَّهُ
بِهِمْ عَلِيمًا ٣٩

40. Həqiqətən, Allah zərrə qədər də olsa zülm etməz. Əgər qulun gördüyü iş yaxşı əməl olarsa, Allah bunu artırar və Öz tərəfindən böyük mükafat verər.

إِنَّ ٱللَّهَ لَا يَظْلِمُ مِثْقَالَ ذَرَّةٍ ۖ وَإِن تَكُ
حَسَنَةً يُضَٰعِفْهَا وَيُؤْتِ مِن لَّدُنْهُ
أَجْرًا عَظِيمًا ٤٠

41. Biz hər ümmətdən bir şahid gətirəcəyimiz və səni də onlara şahid gətirəcəyimiz zaman onların halı necə olacaq?

فَكَيْفَ إِذَا جِئْنَا مِن كُلِّ أُمَّةٍۭ بِشَهِيدٍ
وَجِئْنَا بِكَ عَلَىٰ هَٰٓؤُلَآءِ شَهِيدًا ٤١

42. Küfr edib Peyğəmbərə asi olanlar o gün yerin altına girməyi arzu edəcəklər. Onlar heç bir sözü Allahdan gizlədə bilməyəcəklər.

يَوْمَئِذٍ يَوَدُّ ٱلَّذِينَ كَفَرُوا۟ وَعَصَوُا۟
ٱلرَّسُولَ لَوْ تُسَوَّىٰ بِهِمُ ٱلْأَرْضُ وَلَا يَكْتُمُونَ
ٱللَّهَ حَدِيثًا ٤٢

43. Ey iman gətirənlər! Sərxoş ikən nə dediyinizi anlayana qədər və cinsi əlaqədən sonra natəmiz olduğunuz halda, – yolda olan müsafirlər istisna

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ لَا تَقْرَبُوا۟ ٱلصَّلَوٰةَ وَأَنتُمْ
سُكَٰرَىٰ حَتَّىٰ تَعْلَمُوا۟ مَا تَقُولُونَ
وَلَا جُنُبًا إِلَّا عَابِرِى سَبِيلٍ حَتَّىٰ تَغْتَسِلُوا۟

olmaqla – qüsl edənədək namaza yaxınlaşmayın. Əgər xəstə və ya səfərdə olsanız, yaxud sizlərdən biri ayaq yolundan gəlibsə və ya qadınlarla yaxınlıq etmişsinizsə, su tapmasanız, təmiz torpaqla təyəmmüm edin, üzünüzə və əllərinizə sürtün! Həqiqətən, Allah əfv edəndir, Bağışlayandır.

وَإِن كُنتُم مَّرْضَىٰ أَوْ عَلَىٰ سَفَرٍ أَوْ جَاءَ أَحَدٌ
مِّنكُم مِّنَ الْغَائِطِ أَوْ لَامَسْتُمُ النِّسَاءَ فَلَمْ
تَجِدُوا مَاءً فَتَيَمَّمُوا صَعِيدًا طَيِّبًا
فَامْسَحُوا بِوُجُوهِكُمْ وَأَيْدِيكُمْ ۗ
إِنَّ اللَّهَ كَانَ عَفُوًّا غَفُورًا ﴿٤٣﴾

44. Kitabdan özlərinə pay verilmiş kəsləri görmürsənmi ki, onlar azğınlığı satın alıblar və sizi də doğru yoldan azdırmaq istəyirlər?

أَلَمْ تَرَ إِلَى الَّذِينَ أُوتُوا نَصِيبًا مِّنَ الْكِتَابِ
يَشْتَرُونَ الضَّلَالَةَ وَيُرِيدُونَ أَن تَضِلُّوا
السَّبِيلَ ﴿٤٤﴾

45. Allah sizin düşmənlərinizi daha yaxşı tanıyır. Himayəçi olaraq Allah kifayət edər! Yardımçı olaraq Allah yetər!

وَاللَّهُ أَعْلَمُ بِأَعْدَائِكُمْ ۚ وَكَفَىٰ بِاللَّهِ وَلِيًّا وَكَفَىٰ
بِاللَّهِ نَصِيرًا ﴿٤٥﴾

46. Yəhudilərdən bəziləri kəlmələrin yerini dəyişdirir, dillərini əyərək və dinə tənə vuraraq: “Eşitdik və asi olduq!”, “eşidilməyəni eşit!”, “bizə qayğı göstər!”– deyirlər. Əgər onlar: “Eşitdik və itaət etdik!”, “eşit!”, “bizə nəzər yetir!”– desəydilər, əlbəttə, onlar üçün daha xeyirli və daha doğru olardı. Lakin Allah küfrlərinə görə onları lənətlədi. Onlar olduqca az inanırlar, yaxud onların yalnız az bir hissəsi iman gətirir.

مِّنَ الَّذِينَ هَادُوا يُحَرِّفُونَ الْكَلِمَ عَن
مَّوَاضِعِهِ وَيَقُولُونَ سَمِعْنَا وَعَصَيْنَا
وَاسْمَعْ غَيْرَ مُسْمَعٍ وَرَاعِنَا لَيًّا بِأَلْسِنَتِهِمْ
وَطَعْنًا فِي الدِّينِ ۚ وَلَوْ أَنَّهُمْ قَالُوا سَمِعْنَا وَأَطَعْنَا
وَاسْمَعْ وَانظُرْنَا لَكَانَ خَيْرًا لَّهُمْ وَأَقْوَمَ وَلَٰكِن
لَّعَنَهُمُ اللَّهُ بِكُفْرِهِمْ فَلَا يُؤْمِنُونَ إِلَّا قَلِيلًا ﴿٤٦﴾

47. Ey Kitab verilmişlər! Üzləri sıyırıb dümdüz edərək arxalarına çevirməmişdən, yaxud şənbə əhlini lənətlədiyimiz kimi onları da lənətləməmişdən öncə yanınızda olanı təsdiqləyici kimi nazil

يَا أَيُّهَا الَّذِينَ أُوتُوا الْكِتَابَ آمِنُوا بِمَا نَزَّلْنَا
مُصَدِّقًا لِّمَا مَعَكُم مِّن قَبْلِ أَن نَّطْمِسَ
وُجُوهًا فَنَرُدَّهَا عَلَىٰ أَدْبَارِهَا أَوْ نَلْعَنَهُمْ كَمَا لَعَنَّا
أَصْحَابَ السَّبْتِ ۚ وَكَانَ أَمْرُ اللَّهِ مَفْعُولًا ﴿٤٧﴾

etdiyimiz Qurana iman gətirin! Allahın əmri mütləq yerinə yetəcəkdir.

48. Şübhəsiz ki, Allah Özünə şərik qoşulmasını bağışlamaz, bundan başqa *günahları* isə istədiyi kimsəyə bağışlayar. Allaha şərik qoşan kəs iftira atmaqla böyük bir günah etmiş olur.

إِنَّ ٱللَّهَ لَا يَغْفِرُ أَن يُشْرَكَ بِهِۦ وَيَغْفِرُ مَا دُونَ
ذَٰلِكَ لِمَن يَشَآءُ ۚ وَمَن يُشْرِكْ بِٱللَّهِ فَقَدِ ٱفْتَرَىٰٓ
إِثْمًا عَظِيمًا ﴿٤٨﴾

49. Özlərini öyənləri görmürsənmi? Xeyr! Allah istədiyini tərifləyər və onlara xurma çərdəyindəki lif qədər haqsızlıq edilməz.

أَلَمْ تَرَ إِلَى ٱلَّذِينَ يُزَكُّونَ أَنفُسَهُم ۚ بَلِ ٱللَّهُ يُزَكِّى
مَن يَشَآءُ وَلَا يُظْلَمُونَ فَتِيلًا ﴿٤٩﴾

50. Bax, necə də Allaha qarşı yalan uydururlar. Bu, açıq-aşkar günah sayılmaq üçün kifayət edər!

ٱنظُرْ كَيْفَ يَفْتَرُونَ عَلَى ٱللَّهِ ٱلْكَذِبَ ۖ
وَكَفَىٰ بِهِۦٓ إِثْمًا مُّبِينًا ﴿٥٠﴾

51. Kitabdan pay verilmiş kəsləri görmədinmi? Özləri cibtə və tağuta inanmaqla yanaşı hələ bir kafirlər üçün də: “Bunlar möminlərdən daha doğru yoldadırlar”– deyirlər.

أَلَمْ تَرَ إِلَى ٱلَّذِينَ أُوتُوا۟ نَصِيبًا مِّنَ
ٱلْكِتَٰبِ يُؤْمِنُونَ بِٱلْجِبْتِ وَٱلطَّٰغُوتِ
وَيَقُولُونَ لِلَّذِينَ كَفَرُوا۟ هَٰٓؤُلَآءِ أَهْدَىٰ
مِنَ ٱلَّذِينَ ءَامَنُوا۟ سَبِيلًا ﴿٥١﴾

52. Onlar Allahın lənətlədiyi kəslərdir. Allah kimi lənətləyərsə, ona heç bir yardımçı tapmazsan.

أُو۟لَٰٓئِكَ ٱلَّذِينَ لَعَنَهُمُ ٱللَّهُ ۖ وَمَن يَلْعَنِ ٱللَّهُ فَلَن
تَجِدَ لَهُۥ نَصِيرًا ﴿٥٢﴾

53. Yoxsa hökmranlıqdan onların bir payı vardır? Elə olsaydı, onlar insanlara xurma çərdəyinin bir qırıntısını belə verməzdilər.

أَمْ لَهُمْ نَصِيبٌ مِّنَ ٱلْمُلْكِ فَإِذًا لَّا يُؤْتُونَ
ٱلنَّاسَ نَقِيرًا ﴿٥٣﴾

54. Yoxsa onlar Allahın Öz lütfündən insanlara verdiyi şeyə görə onlara həsəd aparırlar? Biz İbrahimin nəslinə də Kitab və Hikmət bəxş

أَمْ يَحْسُدُونَ ٱلنَّاسَ عَلَىٰ مَآ ءَاتَىٰهُمُ ٱللَّهُ مِن
فَضْلِهِۦ ۖ فَقَدْ ءَاتَيْنَآ ءَالَ إِبْرَٰهِيمَ ٱلْكِتَٰبَ
وَٱلْحِكْمَةَ وَءَاتَيْنَٰهُم مُّلْكًا عَظِيمًا ﴿٥٤﴾

etmiş və onlara böyük bir səltənət vermişdik.

55. Onlardan kimi Muhəmmədə iman gətirdi, kimi də ondan üz çevirdi. Yandırıb-yaxan od kimi Cəhənnəm onlara yetər.

فَمِنْهُم مَّنْ ءَامَنَ بِهِۦ وَمِنْهُم مَّن صَدَّ عَنْهُۚ
وَكَفَىٰ بِجَهَنَّمَ سَعِيرًا ٥٥

56. Şübhəsiz ki, ayələrimizi inkar edənləri odda yandıracağıq. Hər dəfə onların dəriləri yandıqca, əzabı daim dadsınlar deyə, Biz o dəriləri başqa dərilərlə əvəz edəcəyik. Həqiqətən, Allah Qüdrətlidir, Müdrikdir.

إِنَّ ٱلَّذِينَ كَفَرُوا۟ بِـَٔايَٰتِنَا سَوْفَ نُصْلِيهِمْ نَارًا
كُلَّمَا نَضِجَتْ جُلُودُهُم بَدَّلْنَٰهُمْ جُلُودًا غَيْرَهَا
لِيَذُوقُوا۟ ٱلْعَذَابَۗ إِنَّ ٱللَّهَ كَانَ عَزِيزًا حَكِيمًا ٥٦

57. İman gətirib saleh əməllər işləyənləri isə ağacları altından çaylar axan, içində əbədi məskunlaşacaqları Cənnət bağlarına daxil edəcəyik. Onlar üçün orada pak zövcələr vardır. Biz onları sıx kölgəliklərdə yerləşdirəcəyik.

وَٱلَّذِينَ ءَامَنُوا۟ وَعَمِلُوا۟ ٱلصَّٰلِحَٰتِ سَنُدْخِلُهُمْ
جَنَّٰتٍ تَجْرِى مِن تَحْتِهَا ٱلْأَنْهَٰرُ خَٰلِدِينَ فِيهَآ
أَبَدًاۖ لَّهُمْ فِيهَآ أَزْوَٰجٌ مُّطَهَّرَةٌۖ وَنُدْخِلُهُمْ
ظِلًّا ظَلِيلًا ٥٧

58. Həqiqətən, Allah sizə əmanətləri sahiblərinə qaytarmanızı və insanlar arasında hökm verərkən ədalətlə hökm vermənizi əmr edir. Allahın sizə verdiyi bu öyüd-nəsihət necə də gözəldir! Şübhəsiz ki, Allah Eşidəndir, Görəndir.

۞ إِنَّ ٱللَّهَ يَأْمُرُكُمْ أَن تُؤَدُّوا۟ ٱلْأَمَٰنَٰتِ إِلَىٰٓ
أَهْلِهَا وَإِذَا حَكَمْتُم بَيْنَ ٱلنَّاسِ أَن
تَحْكُمُوا۟ بِٱلْعَدْلِۚ إِنَّ ٱللَّهَ نِعِمَّا يَعِظُكُم بِهِۦٓۗ
إِنَّ ٱللَّهَ كَانَ سَمِيعًۢا بَصِيرًا ٥٨

59. Ey iman gətirənlər! Allaha və Elçisinə itaət edin, həm də özünüzdən olan rəhbərlərə şəriətə uyğun şəkildə itaət edin. Əgər bir şey haqqında mübahisə etsəniz, Allaha və Axirət gününə inanırsınızsa, Allaha və Onun Elçisinə müraciət edin. Bu, sizin

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوٓا۟ أَطِيعُوا۟ ٱللَّهَ وَأَطِيعُوا۟ ٱلرَّسُولَ
وَأُو۟لِى ٱلْأَمْرِ مِنكُمْۖ فَإِن تَنَٰزَعْتُمْ فِى شَىْءٍ فَرُدُّوهُ
إِلَى ٱللَّهِ وَٱلرَّسُولِ إِن كُنتُمْ تُؤْمِنُونَ بِٱللَّهِ وَٱلْيَوْمِ
ٱلْءَاخِرِۚ ذَٰلِكَ خَيْرٌ وَأَحْسَنُ تَأْوِيلًا ٥٩

üçün daha xeyirli və nəticə etibarilə daha yaxşıdır.

60. Sənə nazil edilənə və səndən əvvəl nazil edilənlərə iman gətirdiklərini iddia edənləri görmədinmi? Onlar mühakimə olunmaları üçün tağuta müraciət etmək istəyirlər. Halbuki onlara tağuta inanmamaq əmr olunmuşdur. Şeytan isə onları dərin bir azğınlığa salmaq istəyir.

أَلَمْ تَرَ إِلَى الَّذِينَ يَزْعُمُونَ أَنَّهُمْ آمَنُوا
بِمَا أُنزِلَ إِلَيْكَ وَمَا أُنزِلَ مِن قَبْلِكَ
يُرِيدُونَ أَن يَتَحَاكَمُوا إِلَى الطَّاغُوتِ
وَقَدْ أُمِرُوا أَن يَكْفُرُوا بِهِ وَيُرِيدُ
الشَّيْطَانُ أَن يُضِلَّهُمْ ضَلَالًا بَعِيدًا ٦٠

61. Onlara: “Allahın nazil etdiyinə və Elçisinə tərəf gəlin!”– deyildikdə, münafiqlərin səndən nifrətlə üz çevirdiklərini görürsən.

وَإِذَا قِيلَ لَهُمْ تَعَالَوْا إِلَىٰ مَا أَنزَلَ
اللَّهُ وَإِلَى الرَّسُولِ رَأَيْتَ الْمُنَافِقِينَ
يَصُدُّونَ عَنكَ صُدُودًا ٦١

62. Öz əlləri ilə törətdikləri əməllərə görə onlara müsibət üz verdikdən sonra sənin yanına gəlib: “Biz ancaq yaxşılıq etmək və mübahisə edənləri barışdırmaq istədik!”– deyə Allaha and içdikdə onların halı necə olacaq?

فَكَيْفَ إِذَا أَصَابَتْهُم مُّصِيبَةٌ بِمَا
قَدَّمَتْ أَيْدِيهِمْ ثُمَّ جَاءُوكَ يَحْلِفُونَ بِاللَّهِ
إِنْ أَرَدْنَا إِلَّا إِحْسَانًا وَتَوْفِيقًا ٦٢

63. Onlar o kəslərdir ki, Allah onların qəlblərində olanı bilir. Elə isə onlardan üz döndər, onlara öyüd-nəsihət ver və özləri barədə onlara təsir göstərə biləcək söz söylə.

أُولَٰئِكَ الَّذِينَ يَعْلَمُ اللَّهُ مَا فِي
قُلُوبِهِمْ فَأَعْرِضْ عَنْهُمْ وَعِظْهُمْ
وَقُل لَّهُمْ فِي أَنفُسِهِمْ قَوْلًا بَلِيغًا ٦٣

64. Biz hər bir elçini, Allahın izni ilə, ona məhz itaət edilsin deyə göndərdik. Əgər onlar özlərinə zülm etdikləri zaman sənin yanına gəlib Allahdan bağışlanma diləsəydilər və Peyğəmbər də onlar üçün bağışlanma diləsəydi, əlbəttə ki, Allahın tövbələri qəbul edən və Rəhmli olduğunu görərdilər.

وَمَا أَرْسَلْنَا مِن رَّسُولٍ إِلَّا لِيُطَاعَ
بِإِذْنِ اللَّهِ وَلَوْ أَنَّهُمْ إِذ ظَّلَمُوا
أَنفُسَهُمْ جَاءُوكَ فَاسْتَغْفَرُوا اللَّهَ
وَاسْتَغْفَرَ لَهُمُ الرَّسُولُ لَوَجَدُوا
اللَّهَ تَوَّابًا رَّحِيمًا ٦٤

65. Xeyr! Sənin Rəbbinə and olsun ki, onlar öz aralarında baş verən çəkişmələrdə səni hakim hesab etməyincə, sonra da verdiyin hökmlərə görə özlərində bir sıxıntı duymadan tam təslim olmayınca iman gətirmiş olmazlar.

فَلَا وَرَبِّكَ لَا يُؤْمِنُونَ حَتَّىٰ يُحَكِّمُوكَ
فِيمَا شَجَرَ بَيْنَهُمْ ثُمَّ لَا يَجِدُوا فِي
أَنفُسِهِمْ حَرَجًا مِّمَّا قَضَيْتَ وَيُسَلِّمُوا
تَسْلِيمًا ٦٥

66. Əgər Biz onlara: "Özünüzü (aranızdakı günahkarları) öldürün və yaxud yurdlarınızdan çıxın!"– deyə buyurmuş olsaydıq, içərilərindən çox azı bunu yerinə yetirərdi. Əgər onlar özlərinə verilən öyüd-nəsihətlərə əməl etsəydilər, əlbəttə, bu, onlar üçün daha xeyirli və daha mükəmməl olardı.

وَلَوْ أَنَّا كَتَبْنَا عَلَيْهِمْ أَنِ اقْتُلُوا أَنفُسَكُمْ
أَوِ اخْرُجُوا مِن دِيَارِكُم مَّا فَعَلُوهُ إِلَّا قَلِيلٌ
مِّنْهُمْ وَلَوْ أَنَّهُمْ فَعَلُوا مَا يُوعَظُونَ بِهِ
لَكَانَ خَيْرًا لَّهُمْ وَأَشَدَّ تَثْبِيتًا ٦٦

67. Onda Biz də onlara Öz tərəfimizdən böyük bir mükafat verər

وَإِذًا لَّآتَيْنَاهُم مِّن لَّدُنَّا أَجْرًا عَظِيمًا ٦٧

68. və onları doğru yola yönəldərdik.

وَلَهَدَيْنَاهُمْ صِرَاطًا مُّسْتَقِيمًا ٦٨

69. Allaha və Onun Elçisinə itaət edənlər Allahın onlara nemət olaraq bəxş etdiyi peyğəmbərlərlə, sidq ürəkdən inananlarla, şəhidlərlə və əməlisalehlərlə birlikdə olacaqlar. Onlar necə də gözəl dostlardır.

وَمَن يُطِعِ اللَّهَ وَالرَّسُولَ فَأُولَٰئِكَ مَعَ الَّذِينَ
أَنْعَمَ اللَّهُ عَلَيْهِم مِّنَ النَّبِيِّينَ
وَالصِّدِّيقِينَ وَالشُّهَدَاءِ وَالصَّالِحِينَ
وَحَسُنَ أُولَٰئِكَ رَفِيقًا ٦٩

70. Bu lütf Allahdandır. Bilən olaraq Allah kifayət edər.

ذَٰلِكَ الْفَضْلُ مِنَ اللَّهِ وَكَفَىٰ بِاللَّهِ عَلِيمًا ٧٠

71. Ey iman gətirənlər! Ehtiyatınızı əldən verməyin, düşmənə qarşı ya bölüklərlə, ya da hamınız birgə çıxın.

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا خُذُوا حِذْرَكُمْ
فَانفِرُوا ثُبَاتٍ أَوِ انفِرُوا جَمِيعًا ٧١

72. İçərinizdə elələri də var ki, cihada çıxdıqda özlərini yubandırar və sizə bir müsibət üz vermiş olduqda: "Allah mənə mərhəmət göstərdi ki,

وَإِنَّ مِنكُمْ لَمَن لَّيُبَطِّئَنَّ فَإِنْ أَصَابَتْكُم
مُّصِيبَةٌ قَالَ قَدْ أَنْعَمَ اللَّهُ عَلَيَّ إِذْ لَمْ
أَكُن مَّعَهُمْ شَهِيدًا ٧٢

mən onlarla birlikdə bəlaya düçar olmadım"– deyər.

73. Əgər Allahdan sizə bir lütf yetişərsə, onda guya sizinlə onun arasında heç vaxt bağlılıq olmamış kimi: "Kaş mən də onlarla birlikdə olub böyük bir uğur qazanaydım!"– deyər.

وَلَئِنْ أَصَابَكُمْ فَضْلٌ مِنَ اللَّهِ لَيَقُولَنَّ كَأَنْ لَمْ تَكُنْ بَيْنَكُمْ وَبَيْنَهُ مَوَدَّةٌ يَا لَيْتَنِي كُنْتُ مَعَهُمْ فَأَفُوزَ فَوْزًا عَظِيمًا ٧٣

74. Qoy dünya həyatını atıb axirəti satın alanlar Allah yolunda vuruşsunlar. Kim Allah yolunda vuruşub öldürülərsə və ya qalib gələrsə, Biz ona böyük bir mükafat verəcəyik.

فَلْيُقَاتِلْ فِي سَبِيلِ اللَّهِ الَّذِينَ يَشْرُونَ الْحَيَاةَ الدُّنْيَا بِالْآخِرَةِ ۚ وَمَنْ يُقَاتِلْ فِي سَبِيلِ اللَّهِ فَيُقْتَلْ أَوْ يَغْلِبْ فَسَوْفَ نُؤْتِيهِ أَجْرًا عَظِيمًا ٧٤

75. Sizə nə olub ki, Allah yolunda və: "Ey Rəbbimiz! Bizi əhalisi zalım olan bu şəhərdən çıxart, bizə Öz tərəfindən bir himayəçi təyin et, bizə Öz tərəfindən bir yardımçı təyin et!"– deyən zəif kişilər, qadınlar və uşaqlar uğrunda vuruşmursunuz?

وَمَا لَكُمْ لَا تُقَاتِلُونَ فِي سَبِيلِ اللَّهِ وَالْمُسْتَضْعَفِينَ مِنَ الرِّجَالِ وَالنِّسَاءِ وَالْوِلْدَانِ الَّذِينَ يَقُولُونَ رَبَّنَا أَخْرِجْنَا مِنْ هَٰذِهِ الْقَرْيَةِ الظَّالِمِ أَهْلُهَا وَاجْعَلْ لَنَا مِنْ لَدُنْكَ وَلِيًّا وَاجْعَلْ لَنَا مِنْ لَدُنْكَ نَصِيرًا ٧٥

76. Möminlər Allah yolunda, kafirlər isə tağut yolunda vuruşurlar. Elə isə şeytanın dostları ilə vuruşun! Şübhəsiz ki, şeytanın hiyləsi zəifdir.

الَّذِينَ آمَنُوا يُقَاتِلُونَ فِي سَبِيلِ اللَّهِ ۖ وَالَّذِينَ كَفَرُوا يُقَاتِلُونَ فِي سَبِيلِ الطَّاغُوتِ فَقَاتِلُوا أَوْلِيَاءَ الشَّيْطَانِ ۖ إِنَّ كَيْدَ الشَّيْطَانِ كَانَ ضَعِيفًا ٧٦

77. Məgər sən, özlərinə: "Müharibədən əl çəkin, namaz qılın və zəkat verin!"– deyilən kəsləri görmədinmi? Onlara vuruşmaq vacib edildikdə, içərilərindən bir dəstəsi Allahdan qorxduqları kimi və ya daha artıq qorxu ilə insanlardan qorxdular və: "Ey Rəbbimiz! Vuruşmağı nə üçün bizə vacib etdin? Nə olardı ki, bizə yaxın vaxtadək möhlət verəydin!"–

أَلَمْ تَرَ إِلَى الَّذِينَ قِيلَ لَهُمْ كُفُّوا أَيْدِيَكُمْ وَأَقِيمُوا الصَّلَاةَ وَآتُوا الزَّكَاةَ فَلَمَّا كُتِبَ عَلَيْهِمُ الْقِتَالُ إِذَا فَرِيقٌ مِنْهُمْ يَخْشَوْنَ النَّاسَ كَخَشْيَةِ اللَّهِ أَوْ أَشَدَّ خَشْيَةً ۚ وَقَالُوا رَبَّنَا لِمَ كَتَبْتَ عَلَيْنَا الْقِتَالَ لَوْلَا أَخَّرْتَنَا إِلَىٰ أَجَلٍ قَرِيبٍ ۗ قُلْ مَتَاعُ الدُّنْيَا قَلِيلٌ وَالْآخِرَةُ خَيْرٌ لِمَنِ اتَّقَىٰ وَلَا تُظْلَمُونَ فَتِيلًا ٧٧

dedilər. De: "Dünyanın ləzzəti azdır. Müttəqilər üçün isə axirət daha xeyirlidir. Sizə xurma çərdəyindəki lif qədər belə haqsızlıq edilməz".

78. Harada olursunuzsa olun, ölüm sizi haqlayacaq. Hətta yüksək qalalarda olsanız belə. Onlara bir yaxşılıq üz verdikdə: "Bu, Allahdandır!"– deyər, bir pislik üz verdikdə isə: "Bu, səndəndir!"– deyərlər. De: "Hamısı Allahdandır!" Bu adamlara nə olub ki, az qala söz də anlamırlar?

أَيْنَمَا تَكُونُوا۟ يُدْرِككُّمُ ٱلْمَوْتُ وَلَوْ كُنتُمْ فِى بُرُوجٍ مُّشَيَّدَةٍ ۗ وَإِن تُصِبْهُمْ حَسَنَةٌ يَقُولُوا۟ هَـٰذِهِۦ مِنْ عِندِ ٱللَّهِ ۖ وَإِن تُصِبْهُمْ سَيِّئَةٌ يَقُولُوا۟ هَـٰذِهِۦ مِنْ عِندِكَ ۚ قُلْ كُلٌّ مِّنْ عِندِ ٱللَّهِ ۖ فَمَالِ هَـٰٓؤُلَآءِ ٱلْقَوْمِ لَا يَكَادُونَ يَفْقَهُونَ حَدِيثًا ﴿٧٨﴾

79. Sənə gələn yaxşılıq Allahdandır, sənin başına gələn bəla isə sənin özündəndir. Biz səni insanlara elçi göndərdik. Şahid olaraq Allah kifayət edər.

مَّآ أَصَابَكَ مِنْ حَسَنَةٍ فَمِنَ ٱللَّهِ ۖ وَمَآ أَصَابَكَ مِن سَيِّئَةٍ فَمِن نَّفْسِكَ ۚ وَأَرْسَلْنَـٰكَ لِلنَّاسِ رَسُولًا ۚ وَكَفَىٰ بِٱللَّهِ شَهِيدًا ﴿٧٩﴾

80. Kim Peyğəmbərə itaət edərsə, Allaha itaət etmiş olar, kim üz çevirərsə, bil ki, Biz səni onlara gözətçi göndərməmişik.

مَّن يُطِعِ ٱلرَّسُولَ فَقَدْ أَطَاعَ ٱللَّهَ ۖ وَمَن تَوَلَّىٰ فَمَآ أَرْسَلْنَـٰكَ عَلَيْهِمْ حَفِيظًا ﴿٨٠﴾

81. Onlar: "İtaət edirik!"– deyirlər. Sənin yanından çıxıb getdikdə isə onların bir qismi gecələr bir yerə yığışıb sənin dediyinin əksinə tədbir görürlər. Allah onların gecələr nə tədbir gördüklərini yazır. Onlardan üz döndər və Allaha təvəkkül et! Qoruyan olaraq Allah yetər.

وَيَقُولُونَ طَاعَةٌ فَإِذَا بَرَزُوا۟ مِنْ عِندِكَ بَيَّتَ طَآئِفَةٌ مِّنْهُمْ غَيْرَ ٱلَّذِى تَقُولُ ۖ وَٱللَّهُ يَكْتُبُ مَا يُبَيِّتُونَ ۖ فَأَعْرِضْ عَنْهُمْ وَتَوَكَّلْ عَلَى ٱللَّهِ ۚ وَكَفَىٰ بِٱللَّهِ وَكِيلًا ﴿٨١﴾

82. Məgər onlar Quran barəsində düşünmürlərmi? Əgər o, Allahdan başqası tərəfindən olsaydı, əlbəttə, onda çoxlu ziddiyyət tapardılar.

أَفَلَا يَتَدَبَّرُونَ ٱلْقُرْءَانَ ۚ وَلَوْ كَانَ مِنْ عِندِ غَيْرِ ٱللَّهِ لَوَجَدُوا۟ فِيهِ ٱخْتِلَـٰفًا كَثِيرًا ﴿٨٢﴾

**83.** Onlara əmin-amanlıq və ya qorxu xəbəri gəldikdə, onu yayarlar. Halbuki bunu Peyğəmbərə və özlərindən olan nüfuz sahiblərinə çatdırsaydılar, içərilərindən onun mahiyyətinə varan kəslər o xəbəri bilərdilər. Əgər sizə Allahın lütfü və rəhmi olmasaydı, əlbəttə, az bir qisminiz istisna olmaqla, hamınız şeytana uyardınız.

وَإِذَا جَآءَهُمۡ أَمۡرٞ مِّنَ ٱلۡأَمۡنِ أَوِ ٱلۡخَوۡفِ أَذَاعُواْ
بِهِۦۖ وَلَوۡ رَدُّوهُ إِلَى ٱلرَّسُولِ وَإِلَىٰٓ أُوْلِي ٱلۡأَمۡرِ
مِنۡهُمۡ لَعَلِمَهُ ٱلَّذِينَ يَسۡتَنۢبِطُونَهُۥ مِنۡهُمۡۗ
وَلَوۡلَا فَضۡلُ ٱللَّهِ عَلَيۡكُمۡ وَرَحۡمَتُهُۥ
لَٱتَّبَعۡتُمُ ٱلشَّيۡطَٰنَ إِلَّا قَلِيلٗا ٨٣

**84.** Sən Allah yolunda vuruş! Sən ancaq özünə cavabdehsən. Möminləri də döyüşə təşviq et! Ola bilsin ki, Allah kafirlərin qüvvəsinin qarşısını alsın. Allahın qüvvəsi daha çox, cəzası daha şiddətlidir.

فَقَٰتِلۡ فِي سَبِيلِ ٱللَّهِ لَا تُكَلَّفُ إِلَّا نَفۡسَكَۚ
وَحَرِّضِ ٱلۡمُؤۡمِنِينَۖ عَسَى ٱللَّهُ أَن يَكُفَّ بَأۡسَ
ٱلَّذِينَ كَفَرُواْۚ وَٱللَّهُ أَشَدُّ بَأۡسٗا وَأَشَدُّ
تَنكِيلٗا ٨٤

**85.** Kim yaxşı bir işə vasitəçilik etsə, ona bunun savabından bir pay düşər, kim də pis bir işə vasitəçilik etsə, ona da onun günahdan bir pay düşər. Allah hər şeyi Qoruyandır.

مَّن يَشۡفَعۡ شَفَٰعَةً حَسَنَةٗ يَكُن لَّهُۥ
نَصِيبٞ مِّنۡهَاۖ وَمَن يَشۡفَعۡ شَفَٰعَةٗ سَيِّئَةٗ يَكُن
لَّهُۥ كِفۡلٞ مِّنۡهَاۗ وَكَانَ ٱللَّهُ عَلَىٰ كُلِّ شَيۡءٖ مُّقِيتٗا ٨٥

**86.** Biri sizinlə salamlaşdığı zaman siz onun salamını daha böyük ehtiramla alın və ya verilən salamı olduğu kimi qaytarın! Həqiqətən, Allah hər şeyin haqq-hesabını çəkəndir.

وَإِذَا حُيِّيتُم بِتَحِيَّةٖ فَحَيُّواْ بِأَحۡسَنَ مِنۡهَآ
أَوۡ رُدُّوهَآۗ إِنَّ ٱللَّهَ كَانَ عَلَىٰ كُلِّ شَيۡءٍ حَسِيبًا ٨٦

**87.** Özündən başqa məbud olmayan Allah, baş verəcəyinə şübhə edilməyən Qiyamət günü sizi mütləq bir yerə toplayacaqdır. Verdiyi xəbərdə Allahdan daha doğru söyləyən kim ola bilər?

ٱللَّهُ لَآ إِلَٰهَ إِلَّا هُوَۚ لَيَجۡمَعَنَّكُمۡ إِلَىٰ يَوۡمِ ٱلۡقِيَٰمَةِ
لَا رَيۡبَ فِيهِۗ وَمَنۡ أَصۡدَقُ مِنَ ٱللَّهِ حَدِيثٗا ٨٧

**88.** Sizə nə oldu ki, münafiqlər barəsində iki dəstəyə ayrıldınız? Halbuki Allah

۞فَمَا لَكُمۡ فِي ٱلۡمُنَٰفِقِينَ فِئَتَيۡنِ وَٱللَّهُ

onları etdikləri əməllərə görə geriyə qaytarmışdır. Siz Allahın azdırdığı kimsəni doğru yola yönəltməkmi istəyirsiniz? Allahın azdırdığı kimsə üçün heç bir yol tapa bilməzsən.

أَرْكَسَهُم بِمَا كَسَبُوٓا۟ أَتُرِيدُونَ أَن تَهْدُوا۟ مَنْ
أَضَلَّ ٱللَّهُ وَمَن يُضْلِلِ ٱللَّهُ فَلَن تَجِدَ لَهُۥ سَبِيلًا ﴿٨٨﴾

89. Onlar özləri küfr etdikləri kimi, sizin də küfr edib onlarla eyni olmanızı istəyərlər. Onlar Allah yolunda hicrət etməyincə onlardan özünüzə dost tutmayın. Əgər üz çevirsələr, onları harada görsəniz, tutub öldürün. Onlardan nə bir dost, nə də bir köməkçi tutun.

وَدُّوا۟ لَوْ تَكْفُرُونَ كَمَا كَفَرُوا۟ فَتَكُونُونَ سَوَآءً
فَلَا تَتَّخِذُوا۟ مِنْهُمْ أَوْلِيَآءَ حَتَّىٰ يُهَاجِرُوا۟
فِى سَبِيلِ ٱللَّهِ فَإِن تَوَلَّوْا۟ فَخُذُوهُمْ وَٱقْتُلُوهُمْ
حَيْثُ وَجَدتُّمُوهُمْ وَلَا تَتَّخِذُوا۟ مِنْهُمْ وَلِيًّا
وَلَا نَصِيرًا ﴿٨٩﴾

90. Ancaq sizinlə aralarında müqavilə olan bir camaata qoşulanlar, ya da sizinlə və ya öz camaatı ilə vuruşacaqlarından köksləri sıxıldığı üçün sizin yanınıza gələn kimsələr istisnadır. Əgər Allah istəsəydi, onları sizə qarşı qaldırardı və onlar da sizinlə vuruşardılar. Əgər onlar sizdən aralanıb geri çəkilsələr, sizinlə vuruşmasalar və sizə sülh təklif etsələr, Allah sizə onlara qarşı vuruşmanıza yol verməz.

إِلَّا ٱلَّذِينَ يَصِلُونَ إِلَىٰ قَوْمٍۭ بَيْنَكُمْ وَبَيْنَهُم
مِّيثَـٰقٌ أَوْ جَآءُوكُمْ حَصِرَتْ صُدُورُهُمْ أَن
يُقَـٰتِلُوكُمْ أَوْ يُقَـٰتِلُوا۟ قَوْمَهُمْ وَلَوْ شَآءَ
ٱللَّهُ لَسَلَّطَهُمْ عَلَيْكُمْ فَلَقَـٰتَلُوكُمْ فَإِنِ
ٱعْتَزَلُوكُمْ فَلَمْ يُقَـٰتِلُوكُمْ وَأَلْقَوْا۟ إِلَيْكُمُ
ٱلسَّلَمَ فَمَا جَعَلَ ٱللَّهُ لَكُمْ عَلَيْهِمْ سَبِيلًا ﴿٩٠﴾

91. Siz bir başqalarına da rast gələcəksiniz ki, onlar həm sizdən, həm də öz camaatından arxayın olmaq istəyərlər. Onlar hər dəfə fitnəyə qaytarıldıqda gözüyumulu ona qoşularlar. Əgər onlar sizdən aralanıb geri çəkilməsələr, sizə sülh təklif etməsələr və sizdən əl çəkməsələr, onlara harada rast

سَتَجِدُونَ ءَاخَرِينَ يُرِيدُونَ أَن يَأْمَنُوكُمْ
وَيَأْمَنُوا۟ قَوْمَهُمْ كُلَّ مَا رُدُّوٓا۟ إِلَى ٱلْفِتْنَةِ
أُرْكِسُوا۟ فِيهَا فَإِن لَّمْ يَعْتَزِلُوكُمْ وَيُلْقُوٓا۟
إِلَيْكُمُ ٱلسَّلَمَ وَيَكُفُّوٓا۟ أَيْدِيَهُمْ فَخُذُوهُمْ
وَٱقْتُلُوهُمْ حَيْثُ ثَقِفْتُمُوهُمْ وَأُو۟لَـٰٓئِكُمْ
جَعَلْنَا لَكُمْ عَلَيْهِمْ سُلْطَـٰنًا مُّبِينًا ﴿٩١﴾

gəlsəniz, tutub öldürün. Biz onlara qarşı sizə açıq-aydın dəlil verdik.

92. Xəta istisna olmaqla heç bir mömünə başqa bir mömini öldürmək yaraşmaz. Hər kəs səhvən bir mömini öldürərsə, bir mömin kölə azad etməli və ölənin ailəsinə qanbahası verməlidir. Onların sədəqə verməsi – qatili əfv etməsi isə istisnadır. Əgər o ölən kimsə, mömin olduğu halda, sizə düşmən olan bir camaatdandırsa, onda qatil mömin bir kölə azad etməlidir. Əgər o, sizinlə aralarında müqavilə olan bir camaatdandırsa, onda qatil onun ailəsinə qanbahası verməli və mömin bir kölə azad etməlidir. Bunları etməyə imkan tapa bilməyən kəs Allah tərəfindən tövbəsinin qəbul olması üçün iki ay ardıcıl oruc tutmalıdır. Allah Biləndir, Müdrikdir.

وَمَا كَانَ لِمُؤْمِنٍ أَن يَقْتُلَ مُؤْمِنًا إِلَّا
خَطَـًٔا وَمَن قَتَلَ مُؤْمِنًا خَطَـًٔا فَتَحْرِيرُ
رَقَبَةٍ مُّؤْمِنَةٍ وَدِيَةٌ مُّسَلَّمَةٌ إِلَىٰٓ
أَهْلِهِۦٓ إِلَّآ أَن يَصَّدَّقُوا۟ فَإِن كَانَ مِن
قَوْمٍ عَدُوٍّ لَّكُمْ وَهُوَ مُؤْمِنٌ
فَتَحْرِيرُ رَقَبَةٍ مُّؤْمِنَةٍ وَإِن كَانَ مِن قَوْمٍ
بَيْنَكُمْ وَبَيْنَهُم مِّيثَـٰقٌ فَدِيَةٌ
مُّسَلَّمَةٌ إِلَىٰٓ أَهْلِهِۦ وَتَحْرِيرُ رَقَبَةٍ
مُّؤْمِنَةٍ فَمَن لَّمْ يَجِدْ فَصِيَامُ شَهْرَيْنِ
مُتَتَابِعَيْنِ تَوْبَةً مِّنَ ٱللَّهِ وَكَانَ
ٱللَّهُ عَلِيمًا حَكِيمًا ﴿٩٢﴾

93. Hər kəs qəsdən bir mömini öldürərsə, onun cəzası içərisində əbədi qalacağı Cəhənnəm olar. Allah ona qəzəblənər, onu lənətləyər və onun üçün böyük bir əzab hazırlayar.

وَمَن يَقْتُلْ مُؤْمِنًا مُّتَعَمِّدًا فَجَزَآؤُهُۥ
جَهَنَّمُ خَـٰلِدًا فِيهَا وَغَضِبَ ٱللَّهُ عَلَيْهِ
وَلَعَنَهُۥ وَأَعَدَّ لَهُۥ عَذَابًا عَظِيمًا ﴿٩٣﴾

94. Ey iman gətirənlər! Allah yolunda döyüşə çıxdığınız zaman kiminlə vuruşacağınızı yəqin edin və sizə salam verən şəxsə, dünya həyatının fani mənfəətinə can ataraq: "Sən mömin deyilsən!"– deməyin. Allah yanında çox qənimətlər vardır. Əvvəllər siz də belə idiniz, Allah

يَـٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوٓا۟ إِذَا ضَرَبْتُمْ فِى
سَبِيلِ ٱللَّهِ فَتَبَيَّنُوا۟ وَلَا تَقُولُوا۟ لِمَنْ أَلْقَىٰٓ
إِلَيْكُمُ ٱلسَّلَـٰمَ لَسْتَ مُؤْمِنًا
تَبْتَغُونَ عَرَضَ ٱلْحَيَوٰةِ ٱلدُّنْيَا
فَعِندَ ٱللَّهِ مَغَانِمُ كَثِيرَةٌ كَذَٰلِكَ
كُنتُم مِّن قَبْلُ فَمَنَّ ٱللَّهُ

sizə mərhəmət göstərdi. Odur ki, kiminlə vuruşacağınızı yəqin edin! Şübhəsiz ki, Allah nə etdiklərinizdən xəbərdardır.

عَلَيْكُمْ فَتَبَيَّنُوٓا۟ إِنَّ ٱللَّهَ كَانَ
بِمَا تَعْمَلُونَ خَبِيرًا ﴿٩٤﴾

95. Möminlərdən – üzürlülər istisna olmaqla – evdə oturanlarla Allah yolunda öz malları və canları ilə cihad edənlər eyni olmazlar. Allah öz malları və canları ilə cihad edənləri evdə oturanlardan dərəcə etibarilə üstün etdi. Allah onların hamısına ən gözəl nemət vəd etmişdir.
Allah mücahidləri evdə oturanlardan böyük bir mükafatla üstün etmişdir.

لَّا يَسْتَوِى ٱلْقَٰعِدُونَ مِنَ ٱلْمُؤْمِنِينَ غَيْرُ أُو۟لِى ٱلضَّرَرِ
وَٱلْمُجَٰهِدُونَ فِى سَبِيلِ ٱللَّهِ بِأَمْوَٰلِهِمْ وَأَنفُسِهِمْ
فَضَّلَ ٱللَّهُ ٱلْمُجَٰهِدِينَ بِأَمْوَٰلِهِمْ وَأَنفُسِهِمْ عَلَى
ٱلْقَٰعِدِينَ دَرَجَةً وَكُلًّا وَعَدَ ٱللَّهُ ٱلْحُسْنَىٰ وَفَضَّلَ ٱللَّهُ
ٱلْمُجَٰهِدِينَ عَلَى ٱلْقَٰعِدِينَ أَجْرًا عَظِيمًا ﴿٩٥﴾

96. Bu, Onun tərəfindən möminlərə nəsib olan dərəcələr, bağışlanma və mərhəmətdir. Allah Bağışlayandır, Rəhmlidir.

دَرَجَٰتٍ مِّنْهُ وَمَغْفِرَةً وَرَحْمَةً وَكَانَ ٱللَّهُ
غَفُورًا رَّحِيمًا ﴿٩٦﴾

97. Mələklər özlərinə zülm edənlərin canlarını alarkən onlara: “Siz nə halda idiniz?”– deyəcəklər. Onlar: “Biz yer üzündə zəif insanlar idik!”– deyəcəklər. Mələklər də onlara: “Məgər Allahın torpağı o qədər geniş deyildimi ki, siz orada hicrət edəydiniz?”– deyəcəklər. Onların sığınacaqları yer Cəhənnəmdir. Ora nə pis dönüş yeridir.

إِنَّ ٱلَّذِينَ تَوَفَّىٰهُمُ ٱلْمَلَٰٓئِكَةُ ظَالِمِىٓ أَنفُسِهِمْ
قَالُوا۟ فِيمَ كُنتُمْ قَالُوا۟ كُنَّا مُسْتَضْعَفِينَ فِى ٱلْأَرْضِ
قَالُوٓا۟ أَلَمْ تَكُنْ أَرْضُ ٱللَّهِ وَٰسِعَةً فَتُهَاجِرُوا۟ فِيهَا
فَأُو۟لَٰٓئِكَ مَأْوَىٰهُمْ جَهَنَّمُ وَسَآءَتْ مَصِيرًا ﴿٩٧﴾

98. Ancaq zülmə qarşı çarə tapmağa qadir olmayan və hicrət etməyə yol tapa bilməyən zəif kişi, qadın və uşaqlar istisnadır.

إِلَّا ٱلْمُسْتَضْعَفِينَ مِنَ ٱلرِّجَالِ وَٱلنِّسَآءِ
وَٱلْوِلْدَٰنِ لَا يَسْتَطِيعُونَ حِيلَةً وَلَا يَهْتَدُونَ
سَبِيلًا ﴿٩٨﴾

99. Ola bilsin ki, Allah onları əfv etsin. Həqiqətən, Allah əfv edəndir, Bağışlayandır.

فَأُوْلَٰٓئِكَ عَسَى ٱللَّهُ أَن يَعْفُوَ عَنْهُمْ
وَكَانَ ٱللَّهُ عَفُوًّا غَفُورًا ﴿٩٩﴾

100. Kim Allah üçün hicrət edərsə, yer üzündə çoxlu sığınacaq və bolluq tapar. Kim Allaha və Onun Elçisinə tərəf hicrət edərək evindən çıxdıqdan sonra da ölüm onu haqlayarsa, onun mükafatını Allah verər. Allah Bağışlayandır, Rəhmlidir.

۞وَمَن يُهَاجِرْ فِي سَبِيلِ ٱللَّهِ يَجِدْ فِي ٱلْأَرْضِ
مُرَٰغَمًا كَثِيرًا وَسَعَةً ۚ وَمَن يَخْرُجْ مِنۢ بَيْتِهِۦ
مُهَاجِرًا إِلَى ٱللَّهِ وَرَسُولِهِۦ ثُمَّ يُدْرِكْهُ ٱلْمَوْتُ فَقَدْ
وَقَعَ أَجْرُهُۥ عَلَى ٱللَّهِ ۗ وَكَانَ ٱللَّهُ غَفُورًا رَّحِيمًا ﴿١٠٠﴾

101. Yer üzündə səfərə çıxdığınız zaman kafirlərin sizə zərər yetirəcəklərindən qorxarsınızsa, namazı qısaltmanıza görə sizə günah gəlməz. Şübhəsiz ki, kafirlər sizin açıq-aydın düşmənlərinizdir.

وَإِذَا ضَرَبْتُمْ فِي ٱلْأَرْضِ فَلَيْسَ عَلَيْكُمْ جُنَاحٌ أَن
تَقْصُرُوا۟ مِنَ ٱلصَّلَوٰةِ إِنْ خِفْتُمْ أَن يَفْتِنَكُمُ ٱلَّذِينَ
كَفَرُوٓا۟ ۚ إِنَّ ٱلْكَٰفِرِينَ كَانُوا۟ لَكُمْ عَدُوًّا مُّبِينًا ﴿١٠١﴾

102. Sən səhabələrinin arasında olub onlara namaz qıldırdığın zaman onların bir dəstəsi səninlə birlikdə namaza dursun, silahlarını da özləri ilə götürsünlər. Bunlar səcdə etdikləri zaman birinci rükəti tamamlayanadək o biri dəstə arxanızda olsun. Sonra namazını qılmamış digər dəstə gəlib səninlə birlikdə namaz qılsın, ehtiyatlarını tutsunlar və silahlarını da özləri ilə götürsünlər. Kafirlər istərdilər ki, siz silahlarınızdan və əşyalarınızdan xəbərsiz olasınız və onlar da sizin üzərinizə bircə dəfə hücum etsinlər – bir həmlədə sizi məğlub etsinlər. Əgər siz yağışdan əziyyət çəksəniz və ya xəstə olsanız silahlarınızı

وَإِذَا كُنتَ فِيهِمْ فَأَقَمْتَ لَهُمُ ٱلصَّلَوٰةَ
فَلْتَقُمْ طَآئِفَةٌ مِّنْهُم مَّعَكَ وَلْيَأْخُذُوٓا۟
أَسْلِحَتَهُمْ ۖ فَإِذَا سَجَدُوا۟ فَلْيَكُونُوا۟ مِن
وَرَآئِكُمْ وَلْتَأْتِ طَآئِفَةٌ أُخْرَىٰ لَمْ يُصَلُّوا۟
فَلْيُصَلُّوا۟ مَعَكَ وَلْيَأْخُذُوا۟ حِذْرَهُمْ
وَأَسْلِحَتَهُمْ ۗ وَدَّ ٱلَّذِينَ كَفَرُوا۟
لَوْ تَغْفُلُونَ عَنْ أَسْلِحَتِكُمْ وَأَمْتِعَتِكُمْ
فَيَمِيلُونَ عَلَيْكُم مَّيْلَةً وَٰحِدَةً ۚ وَلَا جُنَاحَ
عَلَيْكُمْ إِن كَانَ بِكُمْ أَذًى مِّن مَّطَرٍ
أَوْ كُنتُم مَّرْضَىٰٓ أَن تَضَعُوٓا۟ أَسْلِحَتَكُمْ ۖ
وَخُذُوا۟ حِذْرَكُمْ ۗ إِنَّ ٱللَّهَ أَعَدَّ لِلْكَٰفِرِينَ
عَذَابًا مُّهِينًا ﴿١٠٢﴾

yerə qoymaq sizə günah deyildir, lakin ehtiyatınızı əldən verməyin. Şübhəsiz ki, Allah kafirlər üçün alçaldıcı bir əzab hazırlamışdır.

103. Namazı bitirdikdən sonra ayaq üstə olanda da, oturanda da, uzananda da Allahı yad edin. Təhlükə sizdən sovuşduqda isə, namazı lazımi qaydada qılın. Çünki namaz möminlərə müəyyən olunmuş vaxtlarda vacib edilmişdir.

فَإِذَا قَضَيۡتُمُ ٱلصَّلَوٰةَ فَٱذۡكُرُواْ ٱللَّهَ قِيَٰمٗا
وَقُعُودٗا وَعَلَىٰ جُنُوبِكُمۡۚ فَإِذَا
ٱطۡمَأۡنَنتُمۡ فَأَقِيمُواْ ٱلصَّلَوٰةَۚ إِنَّ ٱلصَّلَوٰةَ
كَانَتۡ عَلَى ٱلۡمُؤۡمِنِينَ كِتَٰبٗا مَّوۡقُوتٗا ١٠٣

104. Kafir qövmü təqib etməkdə zəiflik göstərməyin. Əgər siz döyüşdə əziyyət çəkirsinizsə, onlar da siz əziyyət çəkdiyiniz kimi əziyyət çəkirlər. Lakin siz onların ummadıqlarını Allahdan umursunuz. Allah Biləndir, Müdrikdir.

وَلَا تَهِنُواْ فِي ٱبۡتِغَآءِ ٱلۡقَوۡمِۖ إِن تَكُونُواْ
تَأۡلَمُونَ فَإِنَّهُمۡ يَأۡلَمُونَ كَمَا تَأۡلَمُونَۖ
وَتَرۡجُونَ مِنَ ٱللَّهِ مَا لَا يَرۡجُونَۗ
وَكَانَ ٱللَّهُ عَلِيمًا حَكِيمًا ١٠٤

105. Həqiqətən, Biz sənə Kitabı haqq olaraq nazil etdik ki, insanlar arasında Allahın sənə vəhy etdiyi ilə hökm verəsən. Odur ki, xainləri müdafiə edənlərdən olma.

إِنَّآ أَنزَلۡنَآ إِلَيۡكَ ٱلۡكِتَٰبَ بِٱلۡحَقِّ لِتَحۡكُمَ
بَيۡنَ ٱلنَّاسِ بِمَآ أَرَىٰكَ ٱللَّهُۚ وَلَا تَكُن
لِّلۡخَآئِنِينَ خَصِيمٗا ١٠٥

106. Allahdan bağışlanma dilə! Şübhəsiz ki, Allah Bağışlayandır, Rəhmlidir.

وَٱسۡتَغۡفِرِ ٱللَّهَۖ إِنَّ ٱللَّهَ كَانَ
غَفُورٗا رَّحِيمٗا ١٠٦

107. Özlərinə xəyanət edənlərdən ötrü mübahisə etmə. Şübhəsiz ki, Allah xəyanət edən günahkarı sevməz.

وَلَا تُجَٰدِلۡ عَنِ ٱلَّذِينَ يَخۡتَانُونَ أَنفُسَهُمۡۚ
إِنَّ ٱللَّهَ لَا يُحِبُّ مَن كَانَ خَوَّانًا أَثِيمٗا ١٠٧

108. Onlar öz günahlarını insanlardan gizlədir, Allahdan isə çəkinmirlər. Halbuki onlar Allahın razı qalmadığı sözləri gecələr xəlvətdə söylədikləri vaxt belə, O, onların

يَسۡتَخۡفُونَ مِنَ ٱلنَّاسِ وَلَا يَسۡتَخۡفُونَ
مِنَ ٱللَّهِ وَهُوَ مَعَهُمۡ إِذۡ يُبَيِّتُونَ مَا لَا
يَرۡضَىٰ مِنَ ٱلۡقَوۡلِۚ وَكَانَ ٱللَّهُ
بِمَا يَعۡمَلُونَ مُحِيطًا ١٠٨

yanında olur. Allah onların nə etdiklərini əhatə edir.

109. Bax, siz o kəslərsiniz ki, dünya həyatında onlardan ötrü mübahisə edirsiniz. Bəs Qiyamət günü onlardan ötrü Allahla kim mübahisə edəcək və yaxud onları kim qoruyacaq?

هَٰٓأَنتُمۡ هَٰٓؤُلَآءِ جَٰدَلۡتُمۡ عَنۡهُمۡ فِي ٱلۡحَيَوٰةِ
ٱلدُّنۡيَا فَمَن يُجَٰدِلُ ٱللَّهَ عَنۡهُمۡ يَوۡمَ ٱلۡقِيَٰمَةِ
أَم مَّن يَكُونُ عَلَيۡهِمۡ وَكِيلٗا ١٠٩

110. Kim pis bir iş görərsə və ya özü özünə zülm edərsə, sonra da Allahdan bağışlanma diləyərsə, Allahın Bağışlayan, Rəhmli olduğunu görər.

وَمَن يَعۡمَلۡ سُوٓءًا أَوۡ يَظۡلِمۡ نَفۡسَهُۥ ثُمَّ
يَسۡتَغۡفِرِ ٱللَّهَ يَجِدِ ٱللَّهَ غَفُورٗا رَّحِيمٗا ١١٠

111. Kim günah qazanarsa, onu ancaq özünün əleyhinə qazanmış olar. Allah Biləndir, Müdrikdir.

وَمَن يَكۡسِبۡ إِثۡمٗا فَإِنَّمَا يَكۡسِبُهُۥ عَلَىٰ
نَفۡسِهِۦۚ وَكَانَ ٱللَّهُ عَلِيمًا حَكِيمٗا ١١١

112. Kim xəta edər və ya günah qazanarsa, sonra da onu təqsiri olmayanın boynuna atarsa, özü özünə böhtan atmış və açıq aydın günaha batmış olar.

وَمَن يَكۡسِبۡ خَطِيٓـَٔةً أَوۡ إِثۡمٗا ثُمَّ يَرۡمِ بِهِۦ
بَرِيٓـٔٗا فَقَدِ ٱحۡتَمَلَ بُهۡتَٰنٗا وَإِثۡمٗا مُّبِينٗا ١١٢

113. Əgər sənə Allahın lütfü və rəhmi olmasaydı, əlbəttə, onların bir qismi səni doğru yoldan azdırmaq niyyətində olacaqdı. Amma onlar özlərindən başqa heç kəsi azdıra bilməz və sənə də heç bir şeylə zərər vura bilməzlər. Allah sənə Kitabı və Hikməti (Quranı və Sünnəni) nazil etdi və bilmədiyin şeyləri sənə öyrətdi. Allahın sənə olan lütfü böyükdür.

وَلَوۡلَا فَضۡلُ ٱللَّهِ عَلَيۡكَ وَرَحۡمَتُهُۥ لَهَمَّت
طَّآئِفَةٞ مِّنۡهُمۡ أَن يُضِلُّوكَ وَمَا يُضِلُّونَ
إِلَّآ أَنفُسَهُمۡۖ وَمَا يَضُرُّونَكَ مِن شَيۡءٖۚ
وَأَنزَلَ ٱللَّهُ عَلَيۡكَ ٱلۡكِتَٰبَ وَٱلۡحِكۡمَةَ
وَعَلَّمَكَ مَا لَمۡ تَكُن تَعۡلَمُۚ وَكَانَ فَضۡلُ
ٱللَّهِ عَلَيۡكَ عَظِيمٗا ١١٣

114. Onların gizli söhbətlərinin çoxunda xeyir yoxdur. Sədəqə verməyi və ya yaxşılıq etməyi yaxud da insanlar arasında sülh yaratmağı əmr edən şəxsin pıçıldaması isə istisnadır. Kim bunu Allahın razılığını qazanmaq üçün edərsə, Biz ona böyük mükafat verərik.

۞ لَّا خَيْرَ فِي كَثِيرٍ مِّن نَّجْوَاهُمْ إِلَّا مَنْ
أَمَرَ بِصَدَقَةٍ أَوْ مَعْرُوفٍ أَوْ إِصْلَاحٍ
بَيْنَ النَّاسِ ۚ وَمَن يَفْعَلْ ذَٰلِكَ ابْتِغَاءَ
مَرْضَاتِ اللَّهِ فَسَوْفَ نُؤْتِيهِ أَجْرًا عَظِيمًا ﴿١١٤﴾

115. Hər kəs özünə doğru yol bəlli olduqdan sonra Peyğəmbərə qarşı çıxsa və möminlərin yolundan başqa bir yolla getsə, onu üz tutduğu yola yönəldər və Cəhənnəmdə yandırarıq. Ora nə pis dönüş yeridir.

وَمَن يُشَاقِقِ الرَّسُولَ مِن بَعْدِ مَا تَبَيَّنَ لَهُ
الْهُدَىٰ وَيَتَّبِعْ غَيْرَ سَبِيلِ الْمُؤْمِنِينَ نُوَلِّهِ
مَا تَوَلَّىٰ وَنُصْلِهِ جَهَنَّمَ ۖ وَسَاءَتْ مَصِيرًا ﴿١١٥﴾

116. Şübhəsiz ki, Allah Özünə şərik qoşulmasını bağışlamaz. Bundan başqa *günahları* isə istədiyi kimsəyə bağışlayar. Allaha şərik qoşan şəxs əlbəttə ki, dərin bir azğınlığa düşmüşdür.

إِنَّ اللَّهَ لَا يَغْفِرُ أَن يُشْرَكَ بِهِ وَيَغْفِرُ
مَا دُونَ ذَٰلِكَ لِمَن يَشَاءُ ۚ وَمَن يُشْرِكْ بِاللَّهِ
فَقَدْ ضَلَّ ضَلَالًا بَعِيدًا ﴿١١٦﴾

117. Onlar Allahı qoyub, yalnız qadın adlarını daşıyan bütlərə yalvarır və yalnız üsyankar şeytana sitayiş edirlər.

إِن يَدْعُونَ مِن دُونِهِ إِلَّا إِنَاثًا وَإِن
يَدْعُونَ إِلَّا شَيْطَانًا مَّرِيدًا ﴿١١٧﴾

118. Allah şeytana lənət etdi. O isə dedi: "Mən Sənin qullarından müəyyən bir qismini hökmən ələ alacağam.

لَّعَنَهُ اللَّهُ ۘ وَقَالَ لَأَتَّخِذَنَّ مِنْ
عِبَادِكَ نَصِيبًا مَّفْرُوضًا ﴿١١٨﴾

119. Mən onları mütləq doğru yoldan azdıracaq və xülyalara salacağam; onlara mal-qaranın qulaqlarını kəsməyi buyuracaq və Allahın yaratdıqlarına dəyişiklik verməyi

وَلَأُضِلَّنَّهُمْ وَلَأُمَنِّيَنَّهُمْ وَلَآمُرَنَّهُمْ
فَلَيُبَتِّكُنَّ آذَانَ الْأَنْعَامِ
وَلَآمُرَنَّهُمْ فَلَيُغَيِّرُنَّ خَلْقَ اللَّهِ ۚ
وَمَن يَتَّخِذِ الشَّيْطَانَ وَلِيًّا مِّن دُونِ

əmr edəcəyəm". Allahı qoyub şeytanı özünə himayədar tutan şəxs açıq-aşkar ziyana uğramışdır.

اللَّهِ فَقَدْ خَسِرَ خُسْرَانًا مُّبِينًا ١١٩

120. Şeytan onlara vədlər verir və onları xülyalara salır. Lakin şeytanın onlara verdiyi vədlər aldatmaqdan başqa bir şey deyildir.

يَعِدُهُمْ وَيُمَنِّيهِمْ ۖ وَمَا يَعِدُهُمُ
الشَّيْطَانُ إِلَّا غُرُورًا ١٢٠

121. Onların sığınacaqları yer Cəhənnəmdir. Onlar oradan xilas olmağa bir yol tapa bilməzlər.

أُولَٰئِكَ مَأْوَاهُمْ جَهَنَّمُ
وَلَا يَجِدُونَ عَنْهَا مَحِيصًا ١٢١

122. İman gətirib saleh əməllər edənləri isə ağacları altından çaylar axan, içində əbədi qalacaqları Cənnət bağlarına daxil edəcəyik. Bu, Allahın gerçək vədi sayəsində olacaqdır. Sözündə Allahdan daha doğruçu kim ola bilər?

وَالَّذِينَ آمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ
سَنُدْخِلُهُمْ جَنَّاتٍ تَجْرِي مِن تَحْتِهَا
الْأَنْهَارُ خَالِدِينَ فِيهَا أَبَدًا ۖ وَعْدَ اللَّهِ
حَقًّا ۚ وَمَنْ أَصْدَقُ مِنَ اللَّهِ قِيلًا ١٢٢

123. Bu nemətə nail olmaq nə sizin arzunuzla, nə də Kitab əhlinin arzusu ilədir. Pislik edən kəs, onun cəzasını alacaq və o, Allahdan başqa özünə nə bir himayədar, nə də bir yardımçı tapmayacaqdır.

لَّيْسَ بِأَمَانِيِّكُمْ وَلَا أَمَانِيِّ أَهْلِ الْكِتَابِ ۗ
مَن يَعْمَلْ سُوءًا يُجْزَ بِهِ وَلَا يَجِدْ لَهُ مِن
دُونِ اللَّهِ وَلِيًّا وَلَا نَصِيرًا ١٢٣

124. Həm kişilərdən, həm də qadınlardan mömin olaraq yaxşı işlər görənlər Cənnətə girərlər və onlara xurma çərdəyinin qırıntısı qədər haqsızlıq edilməz.

وَمَن يَعْمَلْ مِنَ الصَّالِحَاتِ مِن
ذَكَرٍ أَوْ أُنثَىٰ وَهُوَ مُؤْمِنٌ فَأُولَٰئِكَ
يَدْخُلُونَ الْجَنَّةَ وَلَا يُظْلَمُونَ نَقِيرًا ١٢٤

125. Yaxşı işlər görərək Allaha təslim olan və hənif olaraq İbrahim dininin ardınca gedən şəxsdən din baxımından daha gözəl kim ola

وَمَنْ أَحْسَنُ دِينًا مِّمَّنْ أَسْلَمَ وَجْهَهُ لِلَّهِ
وَهُوَ مُحْسِنٌ وَاتَّبَعَ مِلَّةَ إِبْرَاهِيمَ حَنِيفًا ۗ
وَاتَّخَذَ اللَّهُ إِبْرَاهِيمَ خَلِيلًا ١٢٥

bilər? Allah İbrahimi sevimli dost tutmuşdur.

126. Göylərdə və yerdə nə varsa, Allaha məxsusdur. Allah hər şeyi əhatə edir.

وَلِلَّهِ مَا فِي ٱلسَّمَٰوَٰتِ وَمَا فِي ٱلْأَرْضِۚ
وَكَانَ ٱللَّهُ بِكُلِّ شَيْءٍ مُّحِيطًا ﴿١٢٦﴾

127. Səndən qadınlar barəsində hökm verməyini istəyirlər. De: “Onlar barəsində və həmçinin Kitabda sizə oxunan ayələrdə özlərinə müəyyən edilmiş mirası verməyərək evlənmək istədiyiniz yetim qızlar, zəif uşaqlar və yetimlərlə ədalətlə rəftar etməyiniz haqqında hökmü sizə Allah verir. Siz nə yaxşılıq edirsinizsə, şübhəsiz ki, Allah onu bilir”.

وَيَسْتَفْتُونَكَ فِي ٱلنِّسَآءِۖ قُلِ ٱللَّهُ
يُفْتِيكُمْ فِيهِنَّ وَمَا يُتْلَىٰ عَلَيْكُمْ فِي
ٱلْكِتَٰبِ فِي يَتَٰمَى ٱلنِّسَآءِ ٱلَّٰتِي
لَا تُؤْتُونَهُنَّ مَا كُتِبَ لَهُنَّ وَتَرْغَبُونَ أَن
تَنكِحُوهُنَّ وَٱلْمُسْتَضْعَفِينَ مِنَ ٱلْوِلْدَٰنِ وَأَن
تَقُومُواْ لِلْيَتَٰمَىٰ بِٱلْقِسْطِۚ وَمَا تَفْعَلُواْ مِنْ
خَيْرٍ فَإِنَّ ٱللَّهَ كَانَ بِهِۦ عَلِيمًا ﴿١٢٧﴾

128. Əgər bir qadın öz ərinin kobud rəftarından, yaxud ondan üz döndərməsindən qorxarsa, ər-arvadın öz aralarında barışığa gəlməsi onlara günah sayılmaz. Axı barışmaq daha xeyirlidir. Doğrusu, nəfslər xəsislik etməyə hazırdır. Əgər qadınlarla yaxşı davranıb Allahdan qorxsanız, bilin ki, Allah nə etdiklərinizdən xəbərdardır.

وَإِنِ ٱمْرَأَةٌ خَافَتْ مِنۢ بَعْلِهَا نُشُوزًا أَوْ
إِعْرَاضًا فَلَا جُنَاحَ عَلَيْهِمَآ أَن يُصْلِحَا
بَيْنَهُمَا صُلْحًاۚ وَٱلصُّلْحُ خَيْرٌۗ
وَأُحْضِرَتِ ٱلْأَنفُسُ ٱلشُّحَّۚ وَإِن تُحْسِنُواْ
وَتَتَّقُواْ فَإِنَّ ٱللَّهَ كَانَ بِمَا تَعْمَلُونَ
خَبِيرًا ﴿١٢٨﴾

129. Siz nə qədər istəsəniz də, arvadlar arasında ədalətlə davrana bilməzsiniz. Birinə tamamilə meyl edib, digərini asılı vəziyyətdə qoymayın. Əgər özünüzü doğruldub Allahdan qorxsanız, bilin ki, Allah Bağışlayandır, Rəhmlidir.

وَلَن تَسْتَطِيعُوٓاْ أَن تَعْدِلُواْ بَيْنَ ٱلنِّسَآءِ وَلَوْ
حَرَصْتُمْۖ فَلَا تَمِيلُواْ كُلَّ ٱلْمَيْلِ فَتَذَرُوهَا
كَٱلْمُعَلَّقَةِۚ وَإِن تُصْلِحُواْ وَتَتَّقُواْ
فَإِنَّ ٱللَّهَ كَانَ غَفُورًا رَّحِيمًا ﴿١٢٩﴾

130. Əgər ər-arvad ayrılsalar, Allah hər birini Öz lütfündən zəngin edər. Allah hər şeyi Əhatəedəndir, Müdrikdir.

وَإِن يَتَفَرَّقَا يُغْنِ ٱللَّهُ كُلًّا مِّن سَعَتِهِۦ ۚ وَكَانَ ٱللَّهُ وَٰسِعًا حَكِيمًا ١٣٠

131. Göylərdə və yerdə nə varsa, Allaha məxsusdur. Biz sizdən əvvəl Kitab verilənlərə də, sizə də Allahdan qorxmanızı buyurduq. Əgər Allaha küfr etsəniz, bilin ki, göylərdə və yerdə nə varsa, Allaha məxsusdur. Allah Zəngindir, Tərifəlayiqdir.

وَلِلَّهِ مَا فِى ٱلسَّمَٰوَٰتِ وَمَا فِى ٱلْأَرْضِ ۗ وَلَقَدْ وَصَّيْنَا ٱلَّذِينَ أُوتُوا۟ ٱلْكِتَٰبَ مِن قَبْلِكُمْ وَإِيَّاكُمْ أَنِ ٱتَّقُوا۟ ٱللَّهَ ۚ وَإِن تَكْفُرُوا۟ فَإِنَّ لِلَّهِ مَا فِى ٱلسَّمَٰوَٰتِ وَمَا فِى ٱلْأَرْضِ ۚ وَكَانَ ٱللَّهُ غَنِيًّا حَمِيدًا ١٣١

132. Göylərdə və yerdə nə varsa, Allaha məxsusdur. Qoruyan olaraq Allah yetər.

وَلِلَّهِ مَا فِى ٱلسَّمَٰوَٰتِ وَمَا فِى ٱلْأَرْضِ ۚ وَكَفَىٰ بِٱللَّهِ وَكِيلًا ١٣٢

133. Ey insanlar! Əgər Allah istəsə, sizi yox edib yerinizə başqalarını gətirər. Allah buna qadirdir.

إِن يَشَأْ يُذْهِبْكُمْ أَيُّهَا ٱلنَّاسُ وَيَأْتِ بِـَٔاخَرِينَ ۚ وَكَانَ ٱللَّهُ عَلَىٰ ذَٰلِكَ قَدِيرًا ١٣٣

134. Hər kəs dünya mükafatını istərsə, bilsin ki, dünyanın da, axirətin də mükafatı Allah yanındadır. Allah Eşidəndir, Görəndir.

مَّن كَانَ يُرِيدُ ثَوَابَ ٱلدُّنْيَا فَعِندَ ٱللَّهِ ثَوَابُ ٱلدُّنْيَا وَٱلْءَاخِرَةِ ۚ وَكَانَ ٱللَّهُ سَمِيعًۢا بَصِيرًا ١٣٤

135. Ey iman gətirənlər! Şahidliyiniz özünüzün və ya valideynlərin, ya da yaxın qohumların əleyhinə olsa belə, Allah şahidləri olub ədaləti qoruyun. Əleyhinə şahidlik edəcəyiniz şəxslərin varlı və ya kasıb olmasından asılı olmayaraq Allah onların hər ikisinə daha yaxındır. Arzularınıza uyaraq haqdan uzaqlaşmayın! Əgər siz yalan danışsanız və ya həqiqəti deməkdən boyun qaçırsanız,

۞ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ كُونُوا۟ قَوَّٰمِينَ بِٱلْقِسْطِ شُهَدَآءَ لِلَّهِ وَلَوْ عَلَىٰٓ أَنفُسِكُمْ أَوِ ٱلْوَٰلِدَيْنِ وَٱلْأَقْرَبِينَ ۚ إِن يَكُنْ غَنِيًّا أَوْ فَقِيرًا فَٱللَّهُ أَوْلَىٰ بِهِمَا ۖ فَلَا تَتَّبِعُوا۟ ٱلْهَوَىٰٓ أَن تَعْدِلُوا۟ ۚ وَإِن تَلْوُۥٓا۟ أَوْ تُعْرِضُوا۟ فَإِنَّ ٱللَّهَ كَانَ بِمَا تَعْمَلُونَ خَبِيرًا ١٣٥

bilin ki, Allah nə etdiklərinizdən xəbərdardır.

136. Ey iman gətirənlər! Allaha, Onun Elçisinə və Elçisinə nazil etdiyi Kitaba və ondan əvvəl nazil etdiyi kitablara iman gətirin! Allahı, Onun mələklərini, kitablarını, elçilərini və Axirət gününü inkar edən şəxs dərin bir azğınlığa düşmüşdür.

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا آمِنُوا بِاللَّهِ وَرَسُولِهِ
وَالْكِتَابِ الَّذِي نَزَّلَ عَلَىٰ رَسُولِهِ
وَالْكِتَابِ الَّذِي أَنْزَلَ مِنْ قَبْلُ وَمَنْ
يَكْفُرْ بِاللَّهِ وَمَلَائِكَتِهِ وَكُتُبِهِ وَرُسُلِهِ
وَالْيَوْمِ الْآخِرِ فَقَدْ ضَلَّ ضَلَالًا بَعِيدًا ﴿١٣٦﴾

137. Şübhəsiz ki, iman gətirib sonra kafir olan, yenə iman gətirib sonra kafir olan, sonra da küfrlərini artıranları Allah bağışlamayacaq və doğru yola yönəltməyəcəkdir.

إِنَّ الَّذِينَ آمَنُوا ثُمَّ كَفَرُوا ثُمَّ آمَنُوا ثُمَّ
كَفَرُوا ثُمَّ ازْدَادُوا كُفْرًا لَمْ يَكُنِ اللَّهُ لِيَغْفِرَ
لَهُمْ وَلَا لِيَهْدِيَهُمْ سَبِيلًا ﴿١٣٧﴾

138. Münafiqlərə müjdə ver ki, onlar üçün ağrılı-acılı bir əzab vardır.

بَشِّرِ الْمُنَافِقِينَ بِأَنَّ لَهُمْ عَذَابًا أَلِيمًا ﴿١٣٨﴾

139. Möminləri qoyub kafirləri özlərinə dost tutanlar gücü və əzəməti onlardamı axtarırlar? Halbuki qüvvət və əzəmət tamamilə Allaha məxsusdur.

الَّذِينَ يَتَّخِذُونَ الْكَافِرِينَ أَوْلِيَاءَ مِنْ
دُونِ الْمُؤْمِنِينَ أَيَبْتَغُونَ عِنْدَهُمُ الْعِزَّةَ
فَإِنَّ الْعِزَّةَ لِلَّهِ جَمِيعًا ﴿١٣٩﴾

140. Allah Kitabda sizə nazil etmişdir ki, Allahın ayələrinin inkar edildiyini və onlara istehza olunduğunu eşitdiyiniz zaman, günahkarlar başqa bir söhbətə keçməyincə onlarla bir yerdə oturmayın. Yoxsa siz də onların tayı olarsınız. Şübhəsiz ki, Allah bütün münafiqləri və kafirləri Cəhənnəmə toplayacaqdır.

وَقَدْ نَزَّلَ عَلَيْكُمْ فِي الْكِتَابِ أَنْ إِذَا سَمِعْتُمْ
آيَاتِ اللَّهِ يُكْفَرُ بِهَا وَيُسْتَهْزَأُ بِهَا فَلَا تَقْعُدُوا
مَعَهُمْ حَتَّىٰ يَخُوضُوا فِي حَدِيثٍ غَيْرِهِ إِنَّكُمْ إِذًا
مِثْلُهُمْ إِنَّ اللَّهَ جَامِعُ الْمُنَافِقِينَ
وَالْكَافِرِينَ فِي جَهَنَّمَ جَمِيعًا ﴿١٤٠﴾

141. Onlar sizə göz qoyur – gözləyirlər ki, sizə bir bəla gəlsin. Əgər

الَّذِينَ يَتَرَبَّصُونَ بِكُمْ فَإِنْ كَانَ لَكُمْ

Allahdan sizə bir qələbə gəlsə: "Məgər biz də sizinlə deyildikmi?"– deyərlər. Əgər kafirlərə bir qələbə nəsib olsa: "Məgər biz möminlərlə birlikdə sizə qalib gələ bilməzdikmi, sizi möminlərdən qorumadıqmı?"– söyləyərlər. Qiyamət günü Allah sizin aranızda hökm verəcəkdir. Allah kafirlərə möminləri məğlub etməyə yol verməyəcəkdir.

فَتْحٌ مِّنَ ٱللَّهِ قَالُوٓاْ أَلَمْ نَكُن مَّعَكُمْ وَإِن
كَانَ لِلْكَٰفِرِينَ نَصِيبٌ قَالُوٓاْ أَلَمْ
نَسْتَحْوِذْ عَلَيْكُمْ وَنَمْنَعْكُم مِّنَ ٱلْمُؤْمِنِينَ
فَٱللَّهُ يَحْكُمُ بَيْنَكُمْ يَوْمَ ٱلْقِيَٰمَةِ وَلَن يَجْعَلَ
ٱللَّهُ لِلْكَٰفِرِينَ عَلَى ٱلْمُؤْمِنِينَ سَبِيلًا ١٤١

142. Münafiqlər, həqiqətən də, Allahı aldatmağa çalışırlar. Halbuki Allah onları aldadır. Onlar namaza durarkən könülsüz qalxar, özlərini camaata göstərər və Allahı olduqca az yad edərlər.

إِنَّ ٱلْمُنَٰفِقِينَ يُخَٰدِعُونَ ٱللَّهَ وَهُوَ
خَٰدِعُهُمْ وَإِذَا قَامُوٓاْ إِلَى ٱلصَّلَوٰةِ قَامُواْ كُسَالَىٰ
يُرَآءُونَ ٱلنَّاسَ وَلَا يَذْكُرُونَ ٱللَّهَ إِلَّا قَلِيلًا ١٤٢

143. Onlar imanla küfrün arasında tərəddüd edir, nə bunlara, nə də onlara (nə möminlərə, nə də kafirlərə) tərəf olurlar. Allahın azdırdığı şəxs üçün heç bir yol tapa bilməzsən.

مُّذَبْذَبِينَ بَيْنَ ذَٰلِكَ لَآ إِلَىٰ هَٰٓؤُلَآءِ وَلَآ إِلَىٰ
هَٰٓؤُلَآءِ وَمَن يُضْلِلِ ٱللَّهُ فَلَن تَجِدَ لَهُۥ سَبِيلًا ١٤٣

144. Ey iman gətirənlər! Möminləri qoyub kafirləri özünüzə dost tutmayın. Yoxsa Allaha öz əleyhinizə açıq-aydın bir dəlil verməkmi istəyirsiniz?

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ لَا تَتَّخِذُواْ ٱلْكَٰفِرِينَ
أَوْلِيَآءَ مِن دُونِ ٱلْمُؤْمِنِينَ أَتُرِيدُونَ أَن
تَجْعَلُواْ لِلَّهِ عَلَيْكُمْ سُلْطَٰنًا مُّبِينًا ١٤٤

145. Həqiqətən, münafiqlər Odun ən aşağı təbəqəsində olacaqlar; və sən onlara heç bir köməkçi tapa bilməzsən.

إِنَّ ٱلْمُنَٰفِقِينَ فِى ٱلدَّرْكِ ٱلْأَسْفَلِ مِنَ ٱلنَّارِ
وَلَن تَجِدَ لَهُمْ نَصِيرًا ١٤٥

146. Tövbə edənlər, əməllərini islah edənlər, Allahdan möhkəm

إِلَّا ٱلَّذِينَ تَابُواْ وَأَصْلَحُواْ وَٱعْتَصَمُواْ

yapışanlar və öz dinlərini Allaha məxsus edənlər istisnadır. Bunlar möminlərlə birgə olacaqlar. Möminlərə isə Allah böyük mükafat verəcəkdir.

بِٱللَّهِ وَأَخۡلَصُواْ دِينَهُمۡ لِلَّهِ فَأُوْلَٰٓئِكَ مَعَ
ٱلۡمُؤۡمِنِينَۖ وَسَوۡفَ يُؤۡتِ ٱللَّهُ
ٱلۡمُؤۡمِنِينَ أَجۡرًا عَظِيمٗا ١٤٦

147. Şükür etsəniz və iman gətirsəniz, sizə əzab vermək Allahın nəyinə gərəkdir? Allah itaətkar qullarına təşəkkür edəndir, Biləndir.

مَّا يَفۡعَلُ ٱللَّهُ بِعَذَابِكُمۡ إِن شَكَرۡتُمۡ
وَءَامَنتُمۡۚ وَكَانَ ٱللَّهُ شَاكِرًا عَلِيمٗا ١٤٧

148. Allah pis sözün ucadan deyilməsini sevmir. Ancaq zülm olunan kimsələr istisnadır. Allah Eşidəndir, Biləndir.

۞ لَّا يُحِبُّ ٱللَّهُ ٱلۡجَهۡرَ بِٱلسُّوٓءِ مِنَ ٱلۡقَوۡلِ
إِلَّا مَن ظُلِمَۚ وَكَانَ ٱللَّهُ سَمِيعًا عَلِيمًا ١٤٨

149. Əgər bir xeyri aşkara çıxarsanız, yaxud onu gizlətsəniz və ya bir pisliyi bağışlasanız, bilin ki, Allah əfv edəndir, hər şeyə Qadirdir.

إِن تُبۡدُواْ خَيۡرًا أَوۡ تُخۡفُوهُ أَوۡ تَعۡفُواْ عَن سُوٓءٖ
فَإِنَّ ٱللَّهَ كَانَ عَفُوّٗا قَدِيرًا ١٤٩

150. Allahı və Onun elçilərini inkar edənlər, Allahı Onun elçilərindən ayırmaq istəyib: “Biz o elçilərin bəzisinə inanır, bəzilərinə isə inanmırıq!”– deyənlər və bunun arasında bir yol tutmaq istəyənlər –

إِنَّ ٱلَّذِينَ يَكۡفُرُونَ بِٱللَّهِ وَرُسُلِهِۦ وَيُرِيدُونَ
أَن يُفَرِّقُواْ بَيۡنَ ٱللَّهِ وَرُسُلِهِۦ وَيَقُولُونَ نُؤۡمِنُ
بِبَعۡضٖ وَنَكۡفُرُ بِبَعۡضٖ وَيُرِيدُونَ أَن
يَتَّخِذُواْ بَيۡنَ ذَٰلِكَ سَبِيلًا ١٥٠

151. məhz onlar əsl kafirlərdir. Biz kafirlər üçün alçaldıcı bir əzab hazırlamışıq.

أُوْلَٰٓئِكَ هُمُ ٱلۡكَٰفِرُونَ حَقّٗاۚ وَأَعۡتَدۡنَا
لِلۡكَٰفِرِينَ عَذَابٗا مُّهِينٗا ١٥١

152. Allaha və Onun elçilərinə iman gətirən və onlardan heç birinin arasında fərq qoymayanlara Allah öz mükafatlarını verəcəkdir. Allah Bağışlayandır, Rəhmlidir.

وَٱلَّذِينَ ءَامَنُواْ بِٱللَّهِ وَرُسُلِهِۦ وَلَمۡ يُفَرِّقُواْ
بَيۡنَ أَحَدٖ مِّنۡهُمۡ أُوْلَٰٓئِكَ سَوۡفَ
يُؤۡتِيهِمۡ أُجُورَهُمۡۚ وَكَانَ ٱللَّهُ غَفُورٗا رَّحِيمٗا ١٥٢

153. Kitab əhli səndən, onlara göydən bir kitab endirməyini istəyirlər. Onlar Musadan, bundan daha böyüyünü istəyərək: "Allahı bizə açıq-aşkar göstər!"– demişdilər. Haqsızlıqlarına görə onları ildırım vurmuşdu. Sonra onlara gələn açıq-aydın dəlillərin ardından buzovu məbud qəbul etdilər. Biz bunu da əfv etdik və Musaya açıq-aşkar dəlil verdik.

يَسْأَلُكَ أَهْلُ الْكِتَابِ أَنْ تُنَزِّلَ عَلَيْهِمْ
كِتَابًا مِنَ السَّمَاءِ فَقَدْ سَأَلُوا مُوسَىٰ أَكْبَرَ
مِنْ ذَٰلِكَ فَقَالُوا أَرِنَا اللَّهَ جَهْرَةً فَأَخَذَتْهُمُ
الصَّاعِقَةُ بِظُلْمِهِمْ ثُمَّ اتَّخَذُوا الْعِجْلَ مِنْ
بَعْدِ مَا جَاءَتْهُمُ الْبَيِّنَاتُ فَعَفَوْنَا عَنْ
ذَٰلِكَ وَآتَيْنَا مُوسَىٰ سُلْطَانًا مُبِينًا ﴿١٥٣﴾

154. Biz onlarla bağladığımız əhdə görə dağı başları üzərinə qaldırdıq və onlara: "Qapıdan səcdə edərək daxil olun!"– dedik. Biz onlara: "Şənbə günü üçün qoyulmuş qadağanı pozmayın!"– dedik. Biz onlarla möhkəm bir əhd-peyman bağlamışdıq.

وَرَفَعْنَا فَوْقَهُمُ الطُّورَ بِمِيثَاقِهِمْ وَقُلْنَا لَهُمُ
ادْخُلُوا الْبَابَ سُجَّدًا وَقُلْنَا لَهُمْ لَا تَعْدُوا
فِي السَّبْتِ وَأَخَذْنَا مِنْهُمْ مِيثَاقًا غَلِيظًا ﴿١٥٤﴾

155. Onlar bağladıqları əhd-peymanı pozduqlarına, Allahın ayələrini inkar etdiklərinə, peyğəmbərləri haqsız yerə öldürdüklərinə və: "Qəlblərimiz qapalıdır!"– dedələrinə görə lənətə düçar edildilər. Xeyr, küfrləri üzündən Allah onların qəlblərini möhürləmişdir. Onlar olduqca az inanırlar, yaxud onların yalnız az bir hissəsi iman gətirir.

فَبِمَا نَقْضِهِمْ مِيثَاقَهُمْ وَكُفْرِهِمْ بِآيَاتِ اللَّهِ
وَقَتْلِهِمُ الْأَنْبِيَاءَ بِغَيْرِ حَقٍّ وَقَوْلِهِمْ قُلُوبُنَا
غُلْفٌ بَلْ طَبَعَ اللَّهُ عَلَيْهَا بِكُفْرِهِمْ فَلَا
يُؤْمِنُونَ إِلَّا قَلِيلًا ﴿١٥٥﴾

156. Onlar həm də küfr etdiklərinə və Məryəmə böyük bir böhtan dediklərinə görə,

وَبِكُفْرِهِمْ وَقَوْلِهِمْ عَلَىٰ مَرْيَمَ بُهْتَانًا عَظِيمًا ﴿١٥٦﴾

157. bir də: "Həqiqətən, biz Allahın elçisi Məryəm oğlu İsa Məsihi

وَقَوْلِهِمْ إِنَّا قَتَلْنَا الْمَسِيحَ عِيسَى ابْنَ مَرْيَمَ

öldürdük!"– dediklərinə görə lənətə düçar edildilər. Halbuki onu nə öldürdülər, nə də çarmıxa çəkdilər. Onlara ancaq İsanın bənzəri göstərildi. Şübhəsiz ki, bunda ixtilaf edənlər onun barəsində şəkk-şübhə içindədirlər. Bu haqda onların, zənnə uymaqdan başqa heç bir məlumatı yoxdur. Onlar onu öldürdüklərinə yəqinliklə əmin deyillər.

رَسُولَ ٱللَّهِ وَمَا قَتَلُوهُ وَمَا صَلَبُوهُ وَلَٰكِن
شُبِّهَ لَهُمْ وَإِنَّ ٱلَّذِينَ ٱخْتَلَفُوا۟ فِيهِ لَفِى شَكٍّ
مِّنْهُ مَا لَهُم بِهِۦ مِنْ عِلْمٍ إِلَّا ٱتِّبَاعَ ٱلظَّنِّ
وَمَا قَتَلُوهُ يَقِينًۢا ﴿١٥٧﴾

158. Əksinə, Allah onu Özünə tərəf qaldırmışdır. Allah Qüdrətlidir, Müdrikdir.

بَل رَّفَعَهُ ٱللَّهُ إِلَيْهِ وَكَانَ ٱللَّهُ عَزِيزًا حَكِيمًا ﴿١٥٨﴾

159. Kitab əhlindən elə kimsə yoxdur ki, öz ölümündən, yaxud İsanın ölümündən əvvəl ona iman gətirməsin. Qiyamət günü isə İsa onların əleyhinə şahid olacaqdır.

وَإِن مِّنْ أَهْلِ ٱلْكِتَٰبِ إِلَّا لَيُؤْمِنَنَّ بِهِۦ قَبْلَ
مَوْتِهِۦ وَيَوْمَ ٱلْقِيَٰمَةِ يَكُونُ عَلَيْهِمْ شَهِيدًا ﴿١٥٩﴾

160. Yəhudilərin etdikləri zülmə görə, onlara daha öncə halal edilmiş gözəl nemətləri haram etdik. Həm də bir çoxlarını, eləcə də özlərini Allah yolundan döndərdiklərinə,

فَبِظُلْمٍ مِّنَ ٱلَّذِينَ هَادُوا۟ حَرَّمْنَا عَلَيْهِمْ
طَيِّبَٰتٍ أُحِلَّتْ لَهُمْ وَبِصَدِّهِمْ عَن سَبِيلِ
ٱللَّهِ كَثِيرًا ﴿١٦٠﴾

161. qadağan olunmasına baxmayaraq, sələm aldıqlarına və haqsız yerə insanların mallarını yediklərinə görə belə etdik. Biz onlardan olan kafirlər üçün ağrılı-acılı bir əzab hazırlamışıq.

وَأَخْذِهِمُ ٱلرِّبَوٰا۟ وَقَدْ نُهُوا۟ عَنْهُ وَأَكْلِهِمْ
أَمْوَٰلَ ٱلنَّاسِ بِٱلْبَٰطِلِ وَأَعْتَدْنَا لِلْكَٰفِرِينَ
مِنْهُمْ عَذَابًا أَلِيمًا ﴿١٦١﴾

162. Lakin onlardan elmdə qüvvətli olanlar və möminlər sənə nazil edilənə və səndən əvvəl nazil

لَّٰكِنِ ٱلرَّٰسِخُونَ فِى ٱلْعِلْمِ مِنْهُمْ وَٱلْمُؤْمِنُونَ
يُؤْمِنُونَ بِمَآ أُنزِلَ إِلَيْكَ وَمَآ أُنزِلَ مِن قَبْلِكَ

olanlara inanır, namaz qılır, zəkat verir, Allaha və Axirət gününə iman gətirirlər. Biz onlara böyük bir mükafat verəcəyik.

وَٱلْمُقِيمِينَ ٱلصَّلَوٰةَ ۚ وَٱلْمُؤْتُونَ ٱلزَّكَوٰةَ
وَٱلْمُؤْمِنُونَ بِٱللَّهِ وَٱلْيَوْمِ ٱلْـَٔاخِرِ أُو۟لَـٰٓئِكَ
سَنُؤْتِيهِمْ أَجْرًا عَظِيمًا ﴿١٦٢﴾

163. Biz Nuha və ondan sonrakı peyğəmbərlərə vəhy etdiyimiz kimi sənə də vəhy etdik. Biz İbrahimə, İsmailə, İshaqa, Yaquba və onun nəslinə, İsaya, Əyyuba, Yunusa, Haruna və Süleymana da vəhy etdik. Davuda da Zəburu verdik.

۞ إِنَّآ أَوْحَيْنَآ إِلَيْكَ كَمَآ أَوْحَيْنَآ إِلَىٰ نُوحٍ
وَٱلنَّبِيِّـۧنَ مِنۢ بَعْدِهِۦ ۚ وَأَوْحَيْنَآ إِلَىٰٓ إِبْرَٰهِيمَ
وَإِسْمَـٰعِيلَ وَإِسْحَـٰقَ وَيَعْقُوبَ
وَٱلْأَسْبَاطِ وَعِيسَىٰ وَأَيُّوبَ وَيُونُسَ
وَهَـٰرُونَ وَسُلَيْمَـٰنَ ۚ وَءَاتَيْنَا دَاوُۥدَ زَبُورًا ﴿١٦٣﴾

164. Daha öncə bir qisim elçilər barəsində sənə söylədik, digər elçilər barəsində isə sənə heç nə söyləmədik. Və Allah Musa ilə sözlə (vasitəsiz) danışdı.

وَرُسُلًا قَدْ قَصَصْنَـٰهُمْ عَلَيْكَ مِن قَبْلُ
وَرُسُلًا لَّمْ نَقْصُصْهُمْ عَلَيْكَ ۚ وَكَلَّمَ ٱللَّهُ
مُوسَىٰ تَكْلِيمًا ﴿١٦٤﴾

165. Biz müjdə verən və qorxudan elçilər göndərdik ki, insanların elçilərdən sonra Allaha qarşı bir bəhanəsi olmasın. Allah Qüdrətlidir, Müdrikdir.

رُّسُلًا مُّبَشِّرِينَ وَمُنذِرِينَ لِئَلَّا يَكُونَ
لِلنَّاسِ عَلَى ٱللَّهِ حُجَّةٌۢ بَعْدَ ٱلرُّسُلِ ۚ وَكَانَ ٱللَّهُ
عَزِيزًا حَكِيمًا ﴿١٦٥﴾

166. Fəqət Allah sənə nazil etdiyinə şahiddir. O, bu Quranı Öz elmi ilə nazil etmişdir. Mələklər də buna şahiddirlər. Şahid olaraq Allah kifayətdir.

لَّـٰكِنِ ٱللَّهُ يَشْهَدُ بِمَآ أَنزَلَ إِلَيْكَ ۖ أَنزَلَهُۥ بِعِلْمِهِۦ ۖ
وَٱلْمَلَـٰٓئِكَةُ يَشْهَدُونَ ۚ وَكَفَىٰ بِٱللَّهِ
شَهِيدًا ﴿١٦٦﴾

167. Kafir olub insanları Allah yolundan sapdıran kimsələr dərin bir azğınlığa düşmüşlər.

إِنَّ ٱلَّذِينَ كَفَرُوا۟ وَصَدُّوا۟ عَن سَبِيلِ
ٱللَّهِ قَدْ ضَلُّوا۟ ضَلَـٰلًۢا بَعِيدًا ﴿١٦٧﴾

168. Kafirləri və zalımları Allah bağışlamayacaq və doğru yola yönəltməyəcəkdir;

إِنَّ ٱلَّذِينَ كَفَرُوا۟ وَظَلَمُوا۟ لَمْ يَكُنِ ٱللَّهُ
لِيَغْفِرَ لَهُمْ وَلَا لِيَهْدِيَهُمْ طَرِيقًا ﴿١٦٨﴾

169. içərisində əbədi qalacaqları Cəhənnəm yolundan başqa. Bu isə Allah üçün asandır.

إِلَّا طَرِيقَ جَهَنَّمَ خَٰلِدِينَ فِيهَآ أَبَدًاۚ
وَكَانَ ذَٰلِكَ عَلَى ٱللَّهِ يَسِيرًا ١٦٩

170. Ey insanlar! Peyğəmbər sizə Rəbbinizdən gələn haqqı çatdırdı. Elə isə iman gətirin! Bu sizin üçün xeyirli olar. Əgər küfr etsəniz, şübhəsiz ki, göylərdə və yerdə nə varsa, Allaha məxsusdur. Allah Biləndir, Müdrikdir.

يَٰٓأَيُّهَا ٱلنَّاسُ قَدْ جَآءَكُمُ ٱلرَّسُولُ بِٱلْحَقِّ مِن
رَّبِّكُمْ فَـَٔامِنُوا۟ خَيْرًا لَّكُمْۚ وَإِن
تَكْفُرُوا۟ فَإِنَّ لِلَّهِ مَا فِى ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضِۚ
وَكَانَ ٱللَّهُ عَلِيمًا حَكِيمًا ١٧٠

171. Ey Kitab əhli! Dininizdə ifrata varmayın və Allah barəsində yalnız həqiqəti deyin. Məryəm oğlu İsa Məsih ancaq Allahın elçisi, Onun Məryəmə göndərdiyi “Ol!” kəlməsi və Onun tərəfindən göndərilən bir ruhdur. Allaha və Onun elçilərinə iman gətirin və: “Tanrı üçdür!” deməyin. Batil əqidənizə son qoyun! Bu sizin üçün xeyirli olar. Həqiqətən, Allah Tək İlahdır! O, pakdır, müqəddəsdir, övladı olmaqdan uzaqdır. Göylərdə və yerdə nə varsa, Ona məxsusdur. Qoruyan olaraq Allah yetər.

يَٰٓأَهْلَ ٱلْكِتَٰبِ لَا تَغْلُوا۟ فِى دِينِكُمْ
وَلَا تَقُولُوا۟ عَلَى ٱللَّهِ إِلَّا ٱلْحَقَّۚ إِنَّمَا
ٱلْمَسِيحُ عِيسَى ٱبْنُ مَرْيَمَ رَسُولُ ٱللَّهِ
وَكَلِمَتُهُۥٓ أَلْقَىٰهَآ إِلَىٰ مَرْيَمَ وَرُوحٌ مِّنْهُۖ
فَـَٔامِنُوا۟ بِٱللَّهِ وَرُسُلِهِۦۖ وَلَا تَقُولُوا۟ ثَلَٰثَةٌۚ
ٱنتَهُوا۟ خَيْرًا لَّكُمْۚ إِنَّمَا ٱللَّهُ إِلَٰهٌ وَٰحِدٌۖ
سُبْحَٰنَهُۥٓ أَن يَكُونَ لَهُۥ وَلَدٌۘ لَّهُۥ مَا فِى
ٱلسَّمَٰوَٰتِ وَمَا فِى ٱلْأَرْضِۗ وَكَفَىٰ بِٱللَّهِ
وَكِيلًا ١٧١

172. Nə İsa Məsih Allahın qulu olmağı özünə ar bilər, nə də Allaha yaxın olan mələklər. Allah Ona ibadət etməyi özlərinə ar bilənlərin və təkəbbürlük göstərənlərin hamısını Öz hüzuruna toplayacaqdır.

لَّن يَسْتَنكِفَ ٱلْمَسِيحُ أَن يَكُونَ عَبْدًا
لِّلَّهِ وَلَا ٱلْمَلَٰٓئِكَةُ ٱلْمُقَرَّبُونَۚ وَمَن
يَسْتَنكِفْ عَنْ عِبَادَتِهِۦ وَيَسْتَكْبِرْ
فَسَيَحْشُرُهُمْ إِلَيْهِ جَمِيعًا ١٧٢

173. İman gətirib xeyirxah işlər görənlərə gəldikdə isə, Allah onların mükafatlarını tam verəcək

فَأَمَّا ٱلَّذِينَ ءَامَنُوا۟ وَعَمِلُوا۟ ٱلصَّٰلِحَٰتِ
فَيُوَفِّيهِمْ أُجُورَهُمْ وَيَزِيدُهُم مِّن

və Öz lütfündən onlar üçün istədiyi qədər artıracaqdır. Allaha ibadət etməyi özlərinə ar bilənləri və təkəbbürlük göstərənlərə gəlincə, Allah onları ağrılı-acılı bir əzaba düçar edəcəkdir. Onlar Allahdan başqa özlərinə nə bir himayədar, nə də bir yardımçı tapacaqlar.

فَضْلِهِۦ ۖ وَأَمَّا ٱلَّذِينَ ٱسْتَنكَفُوا۟
وَٱسْتَكْبَرُوا۟ فَيُعَذِّبُهُمْ عَذَابًا أَلِيمًا
وَلَا يَجِدُونَ لَهُم مِّن دُونِ ٱللَّهِ وَلِيًّا
وَلَا نَصِيرًا ﴿١٧٣﴾

174. Ey insanlar! Sizə Rəbbinizdən bir dəlil gəldi və Biz sizə parlaq bir nur – Quran nazil etdik.

يَٰٓأَيُّهَا ٱلنَّاسُ قَدْ جَآءَكُم بُرْهَٰنٌ مِّن رَّبِّكُمْ
وَأَنزَلْنَآ إِلَيْكُمْ نُورًا مُّبِينًا ﴿١٧٤﴾

175. Allaha iman gətirən və Ondan möhkəm yapışan şəxsləri isə Allah Öz rəhməti və lütfünə qovuşduracaq və onları Özünə tərəf gedən düz yola yönəldəcəkdir.

فَأَمَّا ٱلَّذِينَ ءَامَنُوا۟ بِٱللَّهِ وَٱعْتَصَمُوا۟ بِهِۦ
فَسَيُدْخِلُهُمْ فِى رَحْمَةٍ مِّنْهُ وَفَضْلٍ
وَيَهْدِيهِمْ إِلَيْهِ صِرَٰطًا مُّسْتَقِيمًا ﴿١٧٥﴾

176. Səndən fitva istəyirlər. De: “Valideyni və övladı olmayan kəsin mirası barəsində fitvanı sizə Allah verir”. Əgər övladı olmayan şəxs öldükdə onun bacısı varsa, qoyub getdiyinin yarısı bacıya çatır. Əgər onun övladı yoxdursa, qardaşı ona varis olur. Əgər varislər iki bacıdırsa, ölən qardaşın qoyub getdiyinin üçdə iki hissəsi onlara çatır. Əgər varislər qardaş və bacılardırsa, kişiyə iki qadının payı qədər pay düşür. Allah bunu sizə bəyan edir ki, doğru yoldan çıxmayasınız. Allah hər şeyi bilir.

يَسْتَفْتُونَكَ قُلِ ٱللَّهُ يُفْتِيكُمْ فِى ٱلْكَلَٰلَةِ ۚ
إِنِ ٱمْرُؤٌا۟ هَلَكَ لَيْسَ لَهُۥ وَلَدٌ وَلَهُۥٓ أُخْتٌ
فَلَهَا نِصْفُ مَا تَرَكَ ۚ وَهُوَ يَرِثُهَآ إِن لَّمْ يَكُن
لَّهَا وَلَدٌ ۚ فَإِن كَانَتَا ٱثْنَتَيْنِ فَلَهُمَا ٱلثُّلُثَانِ
مِمَّا تَرَكَ ۚ وَإِن كَانُوٓا۟ إِخْوَةً رِّجَالًا وَنِسَآءً
فَلِلذَّكَرِ مِثْلُ حَظِّ ٱلْأُنثَيَيْنِ ۗ يُبَيِّنُ ٱللَّهُ لَكُمْ
أَن تَضِلُّوا۟ ۗ وَٱللَّهُ بِكُلِّ شَىْءٍ عَلِيمٌۢ ﴿١٧٦﴾

## əl-Maidə («Süfrə») surəsi

سُورَةُ المَائِدَةِ

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

1. Ey iman gətirənlər! Əhdlərinizi yerinə yetirin. *Haram edildiyi* sizə bildiriləcək heyvanlar və ihramda olarkən ovladığınız ov istisna olmaqla digər heyvanlar sizə halal edildi. Həqiqətən, Allah istədiyi hökmü verir.

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوٓاْ أَوۡفُواْ بِٱلۡعُقُودِۚ أُحِلَّتۡ لَكُم
بَهِيمَةُ ٱلۡأَنۡعَٰمِ إِلَّا مَا يُتۡلَىٰ عَلَيۡكُمۡ غَيۡرَ مُحِلِّي
ٱلصَّيۡدِ وَأَنتُمۡ حُرُمٌۗ إِنَّ ٱللَّهَ يَحۡكُمُ مَا يُرِيدُ ١

2. Ey iman gətirənlər! Allahın nişanələrinə, haram aylara, qurbanlıq heyvana, boynuna nişan taxılmış qurbanlıq heyvanlara, Rəbbinin lütfünü və razılığını diləyərək Beytulharama gələnlərə qarşı hörmətsizlik etməyi halal saymayın. İhramdan çıxdığınız zaman ov edə bilərsiniz. Sizi Məscidulharama daxil olmağa qoymayan camaata qarşı olan kin-küdurət sizi təcavüz etməyə sövq etməsin. Yaxşılıq etməkdə və Allahdan qorxmaqda bir-birinizə yardım edin. Günah işlər görməkdə və düşmənçilik etməkdə bir-birinizə köməkçi olmayın. Allahdan qorxun. Həqiqətən, Allah şiddətli cəza verəndir.

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ لَا تُحِلُّواْ شَعَٰٓئِرَ ٱللَّهِ
وَلَا ٱلشَّهۡرَ ٱلۡحَرَامَ وَلَا ٱلۡهَدۡيَ وَلَا ٱلۡقَلَٰٓئِدَ
وَلَآ ءَآمِّينَ ٱلۡبَيۡتَ ٱلۡحَرَامَ يَبۡتَغُونَ فَضۡلٗا مِّن رَّبِّهِمۡ
وَرِضۡوَٰنٗاۚ وَإِذَا حَلَلۡتُمۡ فَٱصۡطَادُواْۚ وَلَا يَجۡرِمَنَّكُمۡ
شَنَـَٔانُ قَوۡمٍ أَن صَدُّوكُمۡ عَنِ ٱلۡمَسۡجِدِ ٱلۡحَرَامِ
أَن تَعۡتَدُواْۘ وَتَعَاوَنُواْ عَلَى ٱلۡبِرِّ وَٱلتَّقۡوَىٰۖ
وَلَا تَعَاوَنُواْ عَلَى ٱلۡإِثۡمِ وَٱلۡعُدۡوَٰنِۚ وَٱتَّقُواْ
ٱللَّهَۖ إِنَّ ٱللَّهَ شَدِيدُ ٱلۡعِقَابِ ٢

3. Leş, qan, donuz əti, Allahdan başqasının adı ilə kəsilmiş, boğulmuş, döyülüb öldürülmüş, *hündür bir yerdən* yıxılıb gəbərmiş,

حُرِّمَتۡ عَلَيۡكُمُ ٱلۡمَيۡتَةُ وَٱلدَّمُ وَلَحۡمُ ٱلۡخِنزِيرِ وَمَآ أُهِلَّ
لِغَيۡرِ ٱللَّهِ بِهِۦ وَٱلۡمُنۡخَنِقَةُ وَٱلۡمَوۡقُوذَةُ وَٱلۡمُتَرَدِّيَةُ
وَٱلنَّطِيحَةُ وَمَآ أَكَلَ ٱلسَّبُعُ إِلَّا مَا ذَكَّيۡتُمۡ

buynuzlanıb öldürülmüş, yırtıcı heyvan tərəfindən parçalanıb yeyilmiş, – ölməmiş kəsdikləriniz istisnadır, dik qoyulmuş daşlar (bütlər və s.) üzərində kəsilmiş heyvanlar və fal oxları ilə qismət axtarmanız sizə haram edildi. Bunlar günahdır. Bu gün kafirlər *sizi* dininizdən *döndərməkdən* əllərini üzdülər. Onlardan qorxmayın, Məndən qorxun. Bu gün dininizi sizin üçün kamil etdim, sizə olan nemətimi tamamladım və bir din olaraq sizin üçün İslamı bəyənib seçdim. Hər kəs günaha meyl etməyərək aclıq üzündən *haram olanlardan istifadə etməyə* məcbur olarsa, *bilsin ki*, Allah Bağışlayandır, Rəhmlidir.

وَمَا ذُبِحَ عَلَى ٱلنُّصُبِ وَأَن تَسْتَقْسِمُوا۟ بِٱلْأَزْلَٰمِ
ذَٰلِكُمْ فِسْقٌ ٱلْيَوْمَ يَئِسَ ٱلَّذِينَ كَفَرُوا۟ مِن
دِينِكُمْ فَلَا تَخْشَوْهُمْ وَٱخْشَوْنِ ٱلْيَوْمَ أَكْمَلْتُ
لَكُمْ دِينَكُمْ وَأَتْمَمْتُ عَلَيْكُمْ نِعْمَتِى وَرَضِيتُ
لَكُمُ ٱلْإِسْلَٰمَ دِينًا فَمَنِ ٱضْطُرَّ فِى مَخْمَصَةٍ
غَيْرَ مُتَجَانِفٍ لِّإِثْمٍ فَإِنَّ ٱللَّهَ غَفُورٌ رَّحِيمٌ ٣

4. Səndən onlara nəyin halal edildiyini soruşurlar. De: “Təmiz nemətlər və Allahın sizə öyrətdiyindən öyrədib əhliləşdirdiyiniz yırtıcı heyvanların ovladıqları sizə halal edildi. Onların sizin üçün tutub gətirdiklərindən yeyin və *ova göndərərkən* onların üzərində Allahın adını çəkin. Allahdan qorxun! Şübhəsiz ki, Allah tez haqq-hesab çəkəndir”.

يَسْـَٔلُونَكَ مَاذَآ أُحِلَّ لَهُمْ قُلْ أُحِلَّ لَكُمُ
ٱلطَّيِّبَٰتُ وَمَا عَلَّمْتُم مِّنَ ٱلْجَوَارِحِ مُكَلِّبِينَ
تُعَلِّمُونَهُنَّ مِمَّا عَلَّمَكُمُ ٱللَّهُ فَكُلُوا۟ مِمَّآ
أَمْسَكْنَ عَلَيْكُمْ وَٱذْكُرُوا۟ ٱسْمَ ٱللَّهِ عَلَيْهِ
وَٱتَّقُوا۟ ٱللَّهَ إِنَّ ٱللَّهَ سَرِيعُ ٱلْحِسَابِ ٤

5. Bu gün pak nemətlər sizə halal edildi. Kitab verilənlərin yeməkləri sizə halal, sizin yeməkləriniz də onlara halaldır. İsmətli mömin qadınlar da, sizdən əvvəl Kitab verilənlərin ismətli qadınları da,

ٱلْيَوْمَ أُحِلَّ لَكُمُ ٱلطَّيِّبَٰتُ وَطَعَامُ ٱلَّذِينَ أُوتُوا۟
ٱلْكِتَٰبَ حِلٌّ لَّكُمْ وَطَعَامُكُمْ حِلٌّ لَّهُمْ
وَٱلْمُحْصَنَٰتُ مِنَ ٱلْمُؤْمِنَٰتِ وَٱلْمُحْصَنَٰتُ مِنَ
ٱلَّذِينَ أُوتُوا۟ ٱلْكِتَٰبَ مِن قَبْلِكُمْ إِذَآ ءَاتَيْتُمُوهُنَّ

namuslu olub zinakarlıq etməmək və aşna saxlamamaq şərti ilə mehrlərini verdiyiniz təqdirdə sizə halaldır. İmanı inkar edənin əməlləri boşa çıxar və o, Axirətdə ziyana uğrayanlardan olar.

أُجُورَهُنَّ مُحْصِنِينَ غَيْرَ مُسَٰفِحِينَ وَلَا مُتَّخِذِىٓ
أَخْدَانٍۗ وَمَن يَكْفُرْ بِٱلْإِيمَٰنِ فَقَدْ حَبِطَ عَمَلُهُۥ
وَهُوَ فِى ٱلْءَاخِرَةِ مِنَ ٱلْخَٰسِرِينَ ٥

6. Ey iman gətirənlər! Namaza durarkən üzünüzü və dirsəklərə qədər əllərinizi yuyun, başınıza məsh çəkin və topuqlara qədər ayaqlarınızı *yuyun. Əgər qadınlarınızla yaxınlıq edib* cənabət halında olmuşsunuzsa, qüsl edin. Əgər xəstə və ya səfərdə olsanız, yaxud sizlərdən biri ayaq yolundan gəlibsə və ya qadınlara toxunmuşsunuzsa (cinsi əlaqədə olmuşsunuzsa), su tapmasanız, təmiz torpaqla təyəmmüm edin və ondan üzünüzə və əllərinizə sürtün. Allah sizi çətinliyə salmaq istəməz, lakin O sizi pak etmək və sizə olan nemətini tamamlamaq istər ki, bəlkə şükür edəsiniz.

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوٓا۟ إِذَا قُمْتُمْ إِلَى
ٱلصَّلَوٰةِ فَٱغْسِلُوا۟ وُجُوهَكُمْ وَأَيْدِيَكُمْ
إِلَى ٱلْمَرَافِقِ وَٱمْسَحُوا۟ بِرُءُوسِكُمْ
وَأَرْجُلَكُمْ إِلَى ٱلْكَعْبَيْنِۚ وَإِن كُنتُمْ
جُنُبًا فَٱطَّهَّرُوا۟ۚ وَإِن كُنتُم مَّرْضَىٰٓ أَوْ عَلَىٰ
سَفَرٍ أَوْ جَآءَ أَحَدٌ مِّنكُم مِّنَ ٱلْغَآئِطِ
أَوْ لَٰمَسْتُمُ ٱلنِّسَآءَ فَلَمْ تَجِدُوا۟ مَآءً فَتَيَمَّمُوا۟
صَعِيدًا طَيِّبًا فَٱمْسَحُوا۟ بِوُجُوهِكُمْ
وَأَيْدِيكُم مِّنْهُۚ مَا يُرِيدُ ٱللَّهُ لِيَجْعَلَ
عَلَيْكُم مِّنْ حَرَجٍ وَلَٰكِن يُرِيدُ
لِيُطَهِّرَكُمْ وَلِيُتِمَّ نِعْمَتَهُۥ عَلَيْكُمْ
لَعَلَّكُمْ تَشْكُرُونَ ٦

7. Allahın sizə göstərdiyi lütfkarlığını və siz: “Eşitdik və itaət etdik!”– dediyiniz zaman sizinlə bağladığı əhdi xatırlayın. Allahdan qorxun! Şübhəsiz ki, O, kökslərdə olanları bilir.

وَٱذْكُرُوا۟ نِعْمَةَ ٱللَّهِ عَلَيْكُمْ وَمِيثَٰقَهُ
ٱلَّذِى وَاثَقَكُم بِهِۦٓ إِذْ قُلْتُمْ سَمِعْنَا
وَأَطَعْنَاۖ وَٱتَّقُوا۟ ٱللَّهَۚ إِنَّ ٱللَّهَ عَلِيمٌۢ بِذَاتِ
ٱلصُّدُورِ ٧

8. Ey iman gətirənlər! Allah xatirinə ədaləti qoruyan şahidlər olun. *Hər hansı bir* camaata qarşı olan kin-küdurət sizi ədalətsizliyə sövq etməsin. Ədalətli olun! Bu, təqvaya

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ كُونُوا۟ قَوَّٰمِينَ لِلَّهِ
شُهَدَآءَ بِٱلْقِسْطِۖ وَلَا يَجْرِمَنَّكُمْ
شَنَـَٔانُ قَوْمٍ عَلَىٰٓ أَلَّا تَعْدِلُوا۟ۚ ٱعْدِلُوا۟ هُوَ أَقْرَبُ
لِلتَّقْوَىٰۖ وَٱتَّقُوا۟ ٱللَّهَۚ إِنَّ ٱللَّهَ خَبِيرٌۢ

daha yaxındır. Allahdan qorxun! Şübhəsiz ki, Allah nə etdiklərinizdən xəbərdardır.

بِمَا تَعْمَلُونَ ٨

9. Allah iman gətirib saleh əməllər edənlərə vəd etmişdir ki, onlar üçün bağışlanma və böyük mükafat vardır.

وَعَدَ ٱللَّهُ ٱلَّذِينَ ءَامَنُوا۟ وَعَمِلُوا۟
ٱلصَّٰلِحَٰتِ لَهُم مَّغْفِرَةٌ وَأَجْرٌ
عَظِيمٌ ٩

10. Kafir olub ayələrimizi yalan sayanlar isə Cəhənnəm sakinləridirlər.

وَٱلَّذِينَ كَفَرُوا۟ وَكَذَّبُوا۟ بِـَٔايَٰتِنَآ
أُو۟لَٰٓئِكَ أَصْحَٰبُ ٱلْجَحِيمِ ١٠

11. Ey iman gətirənlər! Allahın sizə olan nemətini xatırlayın. Bir zaman bir tayfa sizə əl qaldırmaq fikrinə düşdükdə *Allah* onları sizdən əl çəkməyə məcbur etmişdi. Allahdan qorxun! Qoy möminlər Allaha təvəkkül etsinlər!

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ ٱذْكُرُوا۟ نِعْمَتَ
ٱللَّهِ عَلَيْكُمْ إِذْ هَمَّ قَوْمٌ أَن يَبْسُطُوٓا۟
إِلَيْكُمْ أَيْدِيَهُمْ فَكَفَّ أَيْدِيَهُمْ عَنكُمْ
وَٱتَّقُوا۟ ٱللَّهَ وَعَلَى ٱللَّهِ فَلْيَتَوَكَّلِ
ٱلْمُؤْمِنُونَ ١١

12. Allah İsrail oğulları ilə əhd bağlamışdı. Biz onlardan on iki başçı təyin etdik. Allah dedi: "Mən sizinləyəm. Əgər namaz qılsanız, zəkat versəniz, Mənim elçilərimə inanıb onlara yardım etsəniz və *kasıblara könüllü yardım etməklə* Allaha gözəl bir borc versəniz, əlbəttə, Mən təqsirlərinizdən keçər və sizi *ağacları* altından çaylar axan Cənnət bağlarına daxil edərəm. Sizlərdən kimsə bundan sonra kafir olsa, *bilsin ki*, artıq o, doğru yoldan azmışdır".

۞ وَلَقَدْ أَخَذَ ٱللَّهُ مِيثَٰقَ بَنِىٓ إِسْرَٰٓءِيلَ
وَبَعَثْنَا مِنْهُمُ ٱثْنَىْ عَشَرَ نَقِيبًا
وَقَالَ ٱللَّهُ إِنِّى مَعَكُمْ لَئِنْ أَقَمْتُمُ
ٱلصَّلَوٰةَ وَءَاتَيْتُمُ ٱلزَّكَوٰةَ وَءَامَنتُم
بِرُسُلِى وَعَزَّرْتُمُوهُمْ وَأَقْرَضْتُمُ ٱللَّهَ قَرْضًا
حَسَنًا لَّأُكَفِّرَنَّ عَنكُمْ سَيِّـَٔاتِكُمْ
وَلَأُدْخِلَنَّكُمْ جَنَّٰتٍ تَجْرِى مِن تَحْتِهَا
ٱلْأَنْهَٰرُ فَمَن كَفَرَ بَعْدَ ذَٰلِكَ
مِنكُمْ فَقَدْ ضَلَّ سَوَآءَ ٱلسَّبِيلِ ١٢

13. *İsrail oğulları* verdikləri əhdi pozduqlarına görə Biz onları lənətlədik və qəlblərini sərtləşdirdik. Onlar *Kitabda olan* kəlmələrin

فَبِمَا نَقْضِهِم مِّيثَٰقَهُمْ لَعَنَّٰهُمْ وَجَعَلْنَا
قُلُوبَهُمْ قَٰسِيَةً يُحَرِّفُونَ ٱلْكَلِمَ عَن
مَّوَاضِعِهِۦ وَنَسُوا۟ حَظًّا مِّمَّا ذُكِّرُوا۟

yerlərini dəyişdirirlər. Onlar *özlərinə* öyrədilmiş şeylərin bir hissəsini unutdular. İçərilərindən az bir qismi istisna olmaqla, sən onlardan daim xəyanət görəcəksən. Onları əfv et və *təqsirlərindən* keç. Şübhəsiz ki, Allah yaxşılıq edənləri sevir.

بِهِۦ ۚ وَلَا تَزَالُ تَطَّلِعُ عَلَىٰ خَآئِنَةٍ مِّنْهُمْ
إِلَّا قَلِيلًا مِّنْهُمْ ۖ فَٱعْفُ عَنْهُمْ وَٱصْفَحْ ۚ
إِنَّ ٱللَّهَ يُحِبُّ ٱلْمُحْسِنِينَ ﴿١٣﴾

14. “Biz xaçpərəstik!”– deyənlərlə də əhd bağlamışdıq. Onlar da *özlərinə* öyrədilənin bir hissəsini unutdular. Buna görə də onların arasına Qiyamət gününə qədər ədavət və kin saldıq. Allah onlara nə etdikləri barədə xəbər verəcəkdir.

وَمِنَ ٱلَّذِينَ قَالُوٓا۟ إِنَّا نَصَٰرَىٰٓ أَخَذْنَا
مِيثَٰقَهُمْ فَنَسُوا۟ حَظًّا مِّمَّا ذُكِّرُوا۟
بِهِۦ فَأَغْرَيْنَا بَيْنَهُمُ ٱلْعَدَاوَةَ
وَٱلْبَغْضَآءَ إِلَىٰ يَوْمِ ٱلْقِيَٰمَةِ ۚ وَسَوْفَ
يُنَبِّئُهُمُ ٱللَّهُ بِمَا كَانُوا۟ يَصْنَعُونَ ﴿١٤﴾

15. Ey Kitab əhli! Artıq sizə Kitabdan gizlətdiyiniz şeylərin bir çoxunu bəyan edən və bir çoxunun da üstündən keçən Elçimiz gəlmişdir. Artıq sizə Allahdan bir nur və açıq-aydın bir Kitab gəldi.

يَٰٓأَهْلَ ٱلْكِتَٰبِ قَدْ جَآءَكُمْ
رَسُولُنَا يُبَيِّنُ لَكُمْ كَثِيرًا
مِّمَّا كُنتُمْ تُخْفُونَ مِنَ ٱلْكِتَٰبِ
وَيَعْفُوا۟ عَن كَثِيرٍ ۚ قَدْ جَآءَكُم مِّنَ
ٱللَّهِ نُورٌ وَكِتَٰبٌ مُّبِينٌ ﴿١٥﴾

16. Allah, Onun rizasını arayan şəxsləri *bu Kitabla* əmin-amanlıq yollarına yönəldir, onları Öz izni ilə zülmətlərdən nura çıxarır və düz yola yönəldir.

يَهْدِى بِهِ ٱللَّهُ مَنِ ٱتَّبَعَ رِضْوَٰنَهُۥ
سُبُلَ ٱلسَّلَٰمِ وَيُخْرِجُهُم مِّنَ
ٱلظُّلُمَٰتِ إِلَى ٱلنُّورِ بِإِذْنِهِۦ
وَيَهْدِيهِمْ إِلَىٰ صِرَٰطٍ مُّسْتَقِيمٍ ﴿١٦﴾

17. “Şübhəsiz ki, Allah Məryəm oğlu Məsihdir!”– deyənlər artıq kafir oldular. De: “Əgər Allah Məryəm oğlu Məsihi, onun anasını və yer üzündə olanların hamısını məhv etmək istəsə, kim Ona bir şeylə mane ola bilər?” Göylərin, yerin və onların arasında olanların səltənəti

لَّقَدْ كَفَرَ ٱلَّذِينَ قَالُوٓا۟ إِنَّ ٱللَّهَ
هُوَ ٱلْمَسِيحُ ٱبْنُ مَرْيَمَ ۚ قُلْ فَمَن
يَمْلِكُ مِنَ ٱللَّهِ شَيْـًٔا إِنْ أَرَادَ أَن
يُهْلِكَ ٱلْمَسِيحَ ٱبْنَ مَرْيَمَ
وَأُمَّهُۥ وَمَن فِى ٱلْأَرْضِ جَمِيعًا ۗ
وَلِلَّهِ مُلْكُ ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضِ
وَمَا بَيْنَهُمَا ۚ يَخْلُقُ مَا يَشَآءُ ۚ وَٱللَّهُ عَلَىٰ

Allaha məxsusdur. *Allah* istədiyini yaradır. Allah hər şeyə qadirdir.

كُلِّ شَيْءٍ قَدِيرٌ ١٧

18. Yəhudilər və xaçpərəstlər: "Biz Allahın oğulları və Onun sevimliləriyik"– dedilər. De: "Onda nə üçün *Allah* sizə günahlarınıza görə əzab verir? Xeyr, siz də Onun yaratdığı bir bəşərsiniz". O, istədiyini bağışlar, istədiyinə də əzab verər. Göylərin, yerin və onların arasında olanların səltənəti Allaha məxsusdur. Dönüş də ancaq Onadır.

وَقَالَتِ ٱلْيَهُودُ وَٱلنَّصَٰرَىٰ نَحْنُ أَبْنَٰٓؤُا۟ ٱللَّهِ
وَأَحِبَّٰٓؤُهُۥ ۚ قُلْ فَلِمَ يُعَذِّبُكُم بِذُنُوبِكُم ۖ
بَلْ أَنتُم بَشَرٌ مِّمَّنْ خَلَقَ ۚ يَغْفِرُ لِمَن يَشَآءُ
وَيُعَذِّبُ مَن يَشَآءُ ۚ وَلِلَّهِ مُلْكُ ٱلسَّمَٰوَٰتِ
وَٱلْأَرْضِ وَمَا بَيْنَهُمَا ۖ وَإِلَيْهِ ٱلْمَصِيرُ ١٨

19. Ey Kitab əhli! Artıq sizə elçilərin ardı-arası kəsildiyi bir dövrdə: "Bizə müjdələyən və qorxudan kəs gəlmədi"– deməyəsiniz deyə *haqqı* bəyan edən Elçimiz gəldi. Artıq sizə müjdələyən və qorxudan *bir peyğəmbər* gəldi. Allah hər şeyə qadirdir.

يَٰٓأَهْلَ ٱلْكِتَٰبِ قَدْ جَآءَكُمْ رَسُولُنَا يُبَيِّنُ
لَكُمْ عَلَىٰ فَتْرَةٍ مِّنَ ٱلرُّسُلِ أَن تَقُولُوا۟
مَا جَآءَنَا مِنۢ بَشِيرٍ وَلَا نَذِيرٍ ۖ فَقَدْ جَآءَكُم
بَشِيرٌ وَنَذِيرٌ ۗ وَٱللَّهُ عَلَىٰ كُلِّ شَيْءٍ قَدِيرٌ ١٩

20. O zaman Musa öz qövmünə demişdi: "Ey qövmüm! Allahın sizə olan nemətini xatırlayın. O, sizin aranızdan peyğəmbərlər göndərdi, sizi hökmdarlar təyin etdi və aləmlərdən heç kəsə vermədiyini sizə verdi.

وَإِذْ قَالَ مُوسَىٰ لِقَوْمِهِۦ يَٰقَوْمِ ٱذْكُرُوا۟
نِعْمَةَ ٱللَّهِ عَلَيْكُمْ إِذْ جَعَلَ فِيكُمْ أَنۢبِيَآءَ
وَجَعَلَكُم مُّلُوكًا وَءَاتَىٰكُم مَّا لَمْ يُؤْتِ
أَحَدًا مِّنَ ٱلْعَٰلَمِينَ ٢٠

21. Ey qövmüm! Allahın sizin üçün müəyyən etdiyi müqəddəs torpağa daxil olun və arxa çevirməyin ki, ziyana uğrayaraq dönməyəsiniz".

يَٰقَوْمِ ٱدْخُلُوا۟ ٱلْأَرْضَ ٱلْمُقَدَّسَةَ ٱلَّتِى
كَتَبَ ٱللَّهُ لَكُمْ وَلَا تَرْتَدُّوا۟ عَلَىٰٓ
أَدْبَارِكُمْ فَتَنقَلِبُوا۟ خَٰسِرِينَ ٢١

22. Onlar dedilər: "Ey Musa! Orada, həqiqətən də, nəhəng adamlar vardır.

قَالُوا۟ يَٰمُوسَىٰٓ إِنَّ فِيهَا قَوْمًا جَبَّارِينَ

Onlar oradan çıxmayınca, biz əsla oraya daxil olmayacağıq. Əgər onlar oradan çıxsalar, biz daxil olarıq".

وَإِنَّا لَن نَّدْخُلَهَا حَتَّىٰ يَخْرُجُوا مِنْهَا فَإِن
يَخْرُجُوا مِنْهَا فَإِنَّا دَاخِلُونَ ٢٢

**23.** Allahdan qorxanlardan, Allahın nemət verdiyi iki kişi dedi: "Onların üzərinə *şəhər* qapısından daxil olun. Əgər siz ora daxil olsanız, əlbəttə, qalib gələrsiniz. Əgər möminsinizsə, Allaha təvəkkül edin!"

قَالَ رَجُلَانِ مِنَ الَّذِينَ يَخَافُونَ أَنْعَمَ اللَّهُ
عَلَيْهِمَا ادْخُلُوا عَلَيْهِمُ الْبَابَ فَإِذَا دَخَلْتُمُوهُ
فَإِنَّكُمْ غَالِبُونَ ۚ وَعَلَى اللَّهِ فَتَوَكَّلُوا
إِن كُنتُم مُّؤْمِنِينَ ٢٣

**24.** Onlar dedilər: "Ey Musa! Nə qədər ki onlar oradadırlar, biz ora heç vaxt girməyəcəyik. Odur ki, sən və sənin Rəbbin gedin, *onlarla* vuruşun. Biz isə burada oturacağıq".

قَالُوا يَا مُوسَىٰ إِنَّا لَن نَّدْخُلَهَا أَبَدًا مَّا دَامُوا
فِيهَا ۖ فَاذْهَبْ أَنتَ وَرَبُّكَ فَقَاتِلَا
إِنَّا هَاهُنَا قَاعِدُونَ ٢٤

**25.** O dedi: "Ey Rəbbim! Mən yalnız özümə və qardaşıma hökm edə bilərəm. Odur ki, Sən bizi bu günahkar tayfadan ayır!"

قَالَ رَبِّ إِنِّي لَا أَمْلِكُ إِلَّا نَفْسِي وَأَخِي ۖ
فَافْرُقْ بَيْنَنَا وَبَيْنَ الْقَوْمِ الْفَاسِقِينَ ٢٥

**26.** *Allah* dedi: "Artıq o *müqəddəs yer* onlara qırx il müddətinə haram edildi. Onlar yer üzündə sərgərdan gəzəcəklər. Sən isə günahkar tayfa üçün heyfsilənmə".

قَالَ فَإِنَّهَا مُحَرَّمَةٌ عَلَيْهِمْ ۛ أَرْبَعِينَ سَنَةً ۛ
يَتِيهُونَ فِي الْأَرْضِ ۚ فَلَا تَأْسَ عَلَى
الْقَوْمِ الْفَاسِقِينَ ٢٦

**27.** Onlara Adəmin iki oğlunun gerçək əhvalatını oxu. O zaman ikisi də qurban vermiş, onların birindən qəbul edilmiş, digərindən isə qəbul edilməmişdi. *Qurbanı qəbul olmayan oğlu öz qardaşına* demişdi: "Səni hökmən öldürəcəyəm!" *Qardaşı da ona belə* demişdi: "Allah ancaq müttəqilərdən *saleh əməlləri* qəbul edər!

۞ وَاتْلُ عَلَيْهِمْ نَبَأَ ابْنَيْ آدَمَ بِالْحَقِّ إِذْ قَرَّبَا
قُرْبَانًا فَتُقُبِّلَ مِنْ أَحَدِهِمَا وَلَمْ يُتَقَبَّلْ
مِنَ الْآخَرِ قَالَ لَأَقْتُلَنَّكَ ۖ قَالَ إِنَّمَا
يَتَقَبَّلُ اللَّهُ مِنَ الْمُتَّقِينَ ٢٧

28. Sən məni öldürmək üçün mənə əl qaldırsan da, mən səni öldürmək üçün sənə əl qaldıran deyiləm. Həqiqətən, mən aləmlərin Rəbbi olan Allahdan qorxuram.

لَئِنۢ بَسَطتَ إِلَيَّ يَدَكَ لِتَقۡتُلَنِي مَآ أَنَا۠
بِبَاسِطٖ يَدِيَ إِلَيۡكَ لِأَقۡتُلَكَۖ إِنِّيٓ أَخَافُ
ٱللَّهَ رَبَّ ٱلۡعَٰلَمِينَ ٢٨

29. Mən istəyirəm ki, sən, həm mənim günahımı, həm də öz günahını üzərinə götürəsən və Od sakinlərindən olasan. Zalımlara veriləcək cəza budur".

إِنِّيٓ أُرِيدُ أَن تَبُوٓأَ بِإِثۡمِي وَإِثۡمِكَ فَتَكُونَ مِنۡ
أَصۡحَٰبِ ٱلنَّارِۚ وَذَٰلِكَ جَزَٰٓؤُاْ ٱلظَّٰلِمِينَ ٢٩

30. Nəfsi onu qardaşını qətlə yetirməyə vadar etdi və o da nəfsinə tabe olaraq onu öldürdü və ziyana uğrayanlardan oldu.

فَطَوَّعَتۡ لَهُۥ نَفۡسُهُۥ قَتۡلَ أَخِيهِ فَقَتَلَهُۥ
فَأَصۡبَحَ مِنَ ٱلۡخَٰسِرِينَ ٣٠

31. Allah, yeri eşələyən bir qarğa göndərdi ki, *ölmüş digər bir qarğanı basdırmaqla* ona qardaşının cəsədini necə basdırmağı göstərsin. O dedi: "Vay halıma! Doğrudanmı mən, qardaşımın cəsədini basdırmaqda bu qarğa kimi olmaqdan da acizəm?" Beləliklə, o, peşmançılıq çəkənlərdən oldu.

فَبَعَثَ ٱللَّهُ غُرَابٗا يَبۡحَثُ فِي ٱلۡأَرۡضِ
لِيُرِيَهُۥ كَيۡفَ يُوَٰرِي سَوۡءَةَ أَخِيهِۚ قَالَ
يَٰوَيۡلَتَىٰٓ أَعَجَزۡتُ أَنۡ أَكُونَ مِثۡلَ هَٰذَا
ٱلۡغُرَابِ فَأُوَٰرِيَ سَوۡءَةَ أَخِيۖ فَأَصۡبَحَ مِنَ
ٱلنَّٰدِمِينَ ٣١

32. Buna görə də İsrail oğullarına yazıb buyurduq ki, kim bir adamı öldürməyən və ya yer üzündə fəsad törətməyən bir şəxsi öldürərsə, sanki bütün insanları öldürmüşdür. Kim də onu ölümdən xilas edərsə, sanki bütün insanları xilas etmiş hesab olunar. Elçilərimiz onlara aydın dəlillər gətirdilər. Onların çoxu isə bundan sonra da yer üzündə həddi aşdılar.

مِنۡ أَجۡلِ ذَٰلِكَ كَتَبۡنَا عَلَىٰ بَنِيٓ إِسۡرَٰٓءِيلَ
أَنَّهُۥ مَن قَتَلَ نَفۡسَۢا بِغَيۡرِ نَفۡسٍ أَوۡ فَسَادٖ
فِي ٱلۡأَرۡضِ فَكَأَنَّمَا قَتَلَ ٱلنَّاسَ
جَمِيعٗا وَمَنۡ أَحۡيَاهَا فَكَأَنَّمَآ أَحۡيَا
ٱلنَّاسَ جَمِيعٗاۚ وَلَقَدۡ جَآءَتۡهُمۡ رُسُلُنَا
بِٱلۡبَيِّنَٰتِ ثُمَّ إِنَّ كَثِيرٗا مِّنۡهُم بَعۡدَ
ذَٰلِكَ فِي ٱلۡأَرۡضِ لَمُسۡرِفُونَ ٣٢

33. Allaha və Onun Elçisinə qarşı müharibə edənlərin və yer üzündə fitnə-fəsad törətməyə səy göstərənlərin cəzası ancaq öldürülmək, və ya çarmıxa çəkilmək, ya əllərini və ayaqlarını çarpazvari kəsmək və yaxud da yaşadıqları yerdən sürgün edilməkdir. Bu, onlar üçün dünyada bir rüsvayçılıqdır. Axirətdə isə onları böyük bir əzab gözləyir.

إِنَّمَا جَزَٰٓؤُاْ ٱلَّذِينَ يُحَارِبُونَ ٱللَّهَ
وَرَسُولَهُۥ وَيَسۡعَوۡنَ فِي ٱلۡأَرۡضِ
فَسَادًا أَن يُقَتَّلُوٓاْ أَوۡ يُصَلَّبُوٓاْ أَوۡ تُقَطَّعَ
أَيۡدِيهِمۡ وَأَرۡجُلُهُم مِّنۡ خِلَٰفٍ أَوۡ يُنفَوۡاْ
مِنَ ٱلۡأَرۡضِۚ ذَٰلِكَ لَهُمۡ خِزۡيٞ فِي
ٱلدُّنۡيَاۖ وَلَهُمۡ فِي ٱلۡأٓخِرَةِ عَذَابٌ عَظِيمٌ ٣٣

34. Sizə məğlub olub əlinizə keçməzdən öncə tövbə edənlər olarsa, bilin ki, Allah Bağışlayandır, Rəhmlidir.

إِلَّا ٱلَّذِينَ تَابُواْ مِن قَبۡلِ أَن تَقۡدِرُواْ
عَلَيۡهِمۡۖ فَٱعۡلَمُوٓاْ أَنَّ ٱللَّهَ غَفُورٞ رَّحِيمٞ ٣٤

35. Ey iman gətirənlər! Allahdan qorxun, Ona *yaxınlaşmaq üçün* vasitə axtarın və Onun yolunda cihad edin ki, bəlkə nicat tapasınız.

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ ٱتَّقُواْ ٱللَّهَ وَٱبۡتَغُوٓاْ
إِلَيۡهِ ٱلۡوَسِيلَةَ وَجَٰهِدُواْ فِي سَبِيلِهِۦ
لَعَلَّكُمۡ تُفۡلِحُونَ ٣٥

36. Əgər yer üzündə olan hər şey, üstəlik bir o qədəri də kafirlərə məxsus olsaydı və onlar bunu Qiyamət gününün əzabından qurtarmaq üçün fidyə versəydilər, onlardan qəbul olunmazdı. Onlar üçün ağrılı-acılı bir əzab hazırlanmışdır.

إِنَّ ٱلَّذِينَ كَفَرُواْ لَوۡ أَنَّ لَهُم مَّا فِي ٱلۡأَرۡضِ
جَمِيعٗا وَمِثۡلَهُۥ مَعَهُۥ لِيَفۡتَدُواْ بِهِۦ مِنۡ
عَذَابِ يَوۡمِ ٱلۡقِيَٰمَةِ مَا تُقُبِّلَ مِنۡهُمۡۖ
وَلَهُمۡ عَذَابٌ أَلِيمٞ ٣٦

37. *Kafirlər* Oddan çıxmaq istərlər, lakin onlar oradan çıxan deyillər. Onları əbədi bir əzab gözləyir.

يُرِيدُونَ أَن يَخۡرُجُواْ مِنَ ٱلنَّارِ وَمَا هُم
بِخَٰرِجِينَ مِنۡهَاۖ وَلَهُمۡ عَذَابٞ مُّقِيمٞ ٣٧

38. Etdikləri əməlin əvəzində Allahın cəzası olaraq oğru kişinin və oğru qadının əllərini kəsin! Allah Qüdrətlidir, Müdrikdir.

وَٱلسَّارِقُ وَٱلسَّارِقَةُ فَٱقۡطَعُوٓاْ أَيۡدِيَهُمَا
جَزَآءَۢ بِمَا كَسَبَا نَكَٰلٗا مِّنَ ٱللَّهِۗ
وَٱللَّهُ عَزِيزٌ حَكِيمٞ ٣٨

39. Hər kim haqsızlıq etdikdən sonra tövbə edib *əməllərini* islah etsə, şübhəsiz ki, Allah onun tövbəsini qəbul edər. Həqiqətən, Allah Bağışlayandır, Rəhmlidir.

فَمَن تَابَ مِنۢ بَعۡدِ ظُلۡمِهِۦ وَأَصۡلَحَ فَإِنَّ ٱللَّهَ
يَتُوبُ عَلَيۡهِۚ إِنَّ ٱللَّهَ غَفُورٞ رَّحِيمٌ ٣٩

40. Məgər bilmirsən ki, göylərin və yerin hökmranlığı Allaha məxsusdur? O, istədiyinə əzab verər, istədiyini də bağışlayar. Allah hər şeyə qadirdir.

أَلَمۡ تَعۡلَمۡ أَنَّ ٱللَّهَ لَهُۥ مُلۡكُ ٱلسَّمَٰوَٰتِ
وَٱلۡأَرۡضِ يُعَذِّبُ مَن يَشَآءُ وَيَغۡفِرُ لِمَن
يَشَآءُۗ وَٱللَّهُ عَلَىٰ كُلِّ شَيۡءٖ قَدِيرٞ ٤٠

41. Ey Elçi! Qəlbləri iman gətirmədiyi halda ağızları ilə: "İman gətirdik!"– deyən kimsələrdən küfrə can atanlar qoy səni kədərləndirməsin. Həm yəhudilərdən yalana həvəslə qulaq asanlar, həm də sənin yanına gəlməyən başqa bir camaata həvəslə qulaq asanlar vardır. Onlar *haqqı dərk etdikdən* sonra kəlmələrin yerlərini dəyişdirib deyirlər: "Əgər sizə bu *dəyişdirilən hökm* verilsə, onu götürün. Yox əgər o verilməsə, çəkinin!" Allah kimi fitnəyə salmaq istərsə, sən ondan ötrü heç bir şeylə Allaha mane ola bilməzsən. Onlar o kəslərdir ki, Allah onların qəlbini təmizləmək istəməmişdir. Onlar dünyada rüsvay, axirətdə isə böyük bir əzaba düçar olacaqlar.

۞يَٰٓأَيُّهَا ٱلرَّسُولُ لَا يَحۡزُنكَ ٱلَّذِينَ
يُسَٰرِعُونَ فِي ٱلۡكُفۡرِ مِنَ ٱلَّذِينَ قَالُوٓاْ
ءَامَنَّا بِأَفۡوَٰهِهِمۡ وَلَمۡ تُؤۡمِن قُلُوبُهُمۡۛ وَمِنَ
ٱلَّذِينَ هَادُواْۛ سَمَّٰعُونَ لِلۡكَذِبِ
سَمَّٰعُونَ لِقَوۡمٍ ءَاخَرِينَ لَمۡ يَأۡتُوكَۖ
يُحَرِّفُونَ ٱلۡكَلِمَ مِنۢ بَعۡدِ مَوَاضِعِهِۦۖ
يَقُولُونَ إِنۡ أُوتِيتُمۡ هَٰذَا فَخُذُوهُ
وَإِن لَّمۡ تُؤۡتَوۡهُ فَٱحۡذَرُواْۚ وَمَن يُرِدِ ٱللَّهُ
فِتۡنَتَهُۥ فَلَن تَمۡلِكَ لَهُۥ مِنَ ٱللَّهِ شَيۡـًٔاۚ
أُوْلَٰٓئِكَ ٱلَّذِينَ لَمۡ يُرِدِ ٱللَّهُ أَن يُطَهِّرَ
قُلُوبَهُمۡۚ لَهُمۡ فِي ٱلدُّنۡيَا خِزۡيٞۖ وَلَهُمۡ فِي
ٱلۡأٓخِرَةِ عَذَابٌ عَظِيمٞ ٤١

42. Onlar yalana həvəslə qulaq asanlar və daima haram yeyənlərdir. Əgər onlar sənin yanına gəlsələr, aralarında hökm ver və ya onlardan üz çevir. Əgər onlardan üz çevirsən, sənə heç bir şeylə zərər verə bilməzlər. Əgər onların arasında

سَمَّٰعُونَ لِلۡكَذِبِ أَكَّٰلُونَ لِلسُّحۡتِۚ
فَإِن جَآءُوكَ فَٱحۡكُم بَيۡنَهُمۡ أَوۡ أَعۡرِضۡ
عَنۡهُمۡۖ وَإِن تُعۡرِضۡ عَنۡهُمۡ فَلَن يَضُرُّوكَ شَيۡـًٔاۖ
وَإِنۡ حَكَمۡتَ فَٱحۡكُم بَيۡنَهُم بِٱلۡقِسۡطِۚ
إِنَّ ٱللَّهَ يُحِبُّ ٱلۡمُقۡسِطِينَ ٤٢

hökm verməli olsan, ədalətlə hökm ver. Şübhəsiz ki, Allah ədalətli olanları sevir.

43. *İçində* Allahın hökmü olan Tövrat özlərində olduğu halda onlar səni necə hakim təyin edirlər? Hələ bir bundan sonra da *verdiyin hökmdən* üz çevirirlər. Onlar mömin deyillər.

وَكَيْفَ يُحَكِّمُونَكَ وَعِندَهُمُ ٱلتَّوْرَىٰةُ فِيهَا حُكْمُ ٱللَّهِ ثُمَّ يَتَوَلَّوْنَ مِنۢ بَعْدِ ذَٰلِكَ ۚ وَمَآ أُو۟لَـٰٓئِكَ بِٱلْمُؤْمِنِينَ ﴿٤٣﴾

44. Şübhəsiz ki, Tövratı Biz nazil etmişik. Onda hidayət və nur vardır. *Allaha* təslim olan peyğəmbərlər yəhudilər üçün bununla, din xadimləri və baş keşişlər isə Allahın Kitabından qorunub saxlanılanlarla hökm verirdilər. Onlar *hamısı* buna şahid oldular. İnsanlardan qorxmayın, Məndən qorxun! Ayələrimi ucuz qiymətə satmayın. Allahın nazil etdiyi ilə hökm verməyənlər – məhz onlar kafirlərdir.

إِنَّآ أَنزَلْنَا ٱلتَّوْرَىٰةَ فِيهَا هُدًى وَنُورٌ ۚ يَحْكُمُ بِهَا ٱلنَّبِيُّونَ ٱلَّذِينَ أَسْلَمُوا۟ لِلَّذِينَ هَادُوا۟ وَٱلرَّبَّـٰنِيُّونَ وَٱلْأَحْبَارُ بِمَا ٱسْتُحْفِظُوا۟ مِن كِتَـٰبِ ٱللَّهِ وَكَانُوا۟ عَلَيْهِ شُهَدَآءَ ۚ فَلَا تَخْشَوُا۟ ٱلنَّاسَ وَٱخْشَوْنِ وَلَا تَشْتَرُوا۟ بِـَٔايَـٰتِى ثَمَنًا قَلِيلًا ۚ وَمَن لَّمْ يَحْكُم بِمَآ أَنزَلَ ٱللَّهُ فَأُو۟لَـٰٓئِكَ هُمُ ٱلْكَـٰفِرُونَ ﴿٤٤﴾

45. Biz *Tövratda* onlara yazıb buyurduq ki, cana can, gözə göz, buruna burun, qulağa qulaq, dişə diş, *vurulmuş* yaralara da *yaralar* qisas alınmalıdır. Hər kəs bunu sədəqə etsə (qisasdan vaz keçsə), bu onun üçün kəffarə olar. Allahın nazil etdiyi ilə hökm verməyənlər – məhz onlar zalımlardır.

وَكَتَبْنَا عَلَيْهِمْ فِيهَآ أَنَّ ٱلنَّفْسَ بِٱلنَّفْسِ وَٱلْعَيْنَ بِٱلْعَيْنِ وَٱلْأَنفَ بِٱلْأَنفِ وَٱلْأُذُنَ بِٱلْأُذُنِ وَٱلسِّنَّ بِٱلسِّنِّ وَٱلْجُرُوحَ قِصَاصٌ ۚ فَمَن تَصَدَّقَ بِهِۦ فَهُوَ كَفَّارَةٌ لَّهُۥ ۚ وَمَن لَّمْ يَحْكُم بِمَآ أَنزَلَ ٱللَّهُ فَأُو۟لَـٰٓئِكَ هُمُ ٱلظَّـٰلِمُونَ ﴿٤٥﴾

46. Onların ardınca Məryəm oğlu İsanı özündən əvvəlki Tövratı təsdiqləyici olaraq göndərdik. Ona içərisində hidayət və nur olan, özündən əvvəlki Tövratı təsdiqləyən, müttəqilər üçün

وَقَفَّيْنَا عَلَىٰٓ ءَاثَـٰرِهِم بِعِيسَى ٱبْنِ مَرْيَمَ مُصَدِّقًا لِّمَا بَيْنَ يَدَيْهِ مِنَ ٱلتَّوْرَىٰةِ ۖ وَءَاتَيْنَـٰهُ ٱلْإِنجِيلَ فِيهِ هُدًى وَنُورٌ وَمُصَدِّقًا لِّمَا بَيْنَ يَدَيْهِ مِنَ ٱلتَّوْرَىٰةِ وَهُدًى وَمَوْعِظَةً لِّلْمُتَّقِينَ ﴿٤٦﴾

doğru yol göstəricisi və öyüd-nəsihət olan İncili verdik.

47. Qoy İncil əhli Allahın onda nazil etdiyi *şəriət qanunları* əsasında hökm versinlər. Allahın nazil etdiyi ilə hökm verməyənlər – məhz onlar fasiqlərdir.

وَلۡيَحۡكُمۡ أَهۡلُ ٱلۡإِنجِيلِ بِمَآ أَنزَلَ ٱللَّهُ فِيهِۚ
وَمَن لَّمۡ يَحۡكُم بِمَآ أَنزَلَ ٱللَّهُ فَأُوْلَٰٓئِكَ
هُمُ ٱلۡفَٰسِقُونَ ٤٧

48. Biz sənə, özündən əvvəlki kitabları təsdiqləyən və onları mühafizə edən Kitabı haqq olaraq nazil etdik. Elə isə onların arasında Allahın *sənə* nazil etdiyi *Kitabla* hökm ver. Sənə gələn haqdan ayrılıb onların istəklərinə tabe olma. Sizlərdən hər biriniz üçün bir şəriət və bir yol təyin etdik. Əgər Allah istəsəydi, sizi tək bir ümmət edərdi. Lakin *başqa-başqa olmanız* sizə verdikləri ilə sizi imtahan etməsi üçündür. Yaxşı işlər görməkdə bir-birinizlə yarışın. Hamınızın qayıdışı Allaha olacaq və O, ziddiyyətə düşəcəyiniz şeylər barəsində sizə xəbər verəcəkdir.

وَأَنزَلۡنَآ إِلَيۡكَ ٱلۡكِتَٰبَ بِٱلۡحَقِّ مُصَدِّقٗا
لِّمَا بَيۡنَ يَدَيۡهِ مِنَ ٱلۡكِتَٰبِ وَمُهَيۡمِنًا
عَلَيۡهِۖ فَٱحۡكُم بَيۡنَهُم بِمَآ أَنزَلَ ٱللَّهُۖ وَلَا تَتَّبِعۡ
أَهۡوَآءَهُمۡ عَمَّا جَآءَكَ مِنَ ٱلۡحَقِّۚ لِكُلّٖ جَعَلۡنَا
مِنكُمۡ شِرۡعَةٗ وَمِنۡهَاجٗاۚ وَلَوۡ شَآءَ ٱللَّهُ
لَجَعَلَكُمۡ أُمَّةٗ وَٰحِدَةٗ وَلَٰكِن
لِّيَبۡلُوَكُمۡ فِي مَآ ءَاتَىٰكُمۡۖ فَٱسۡتَبِقُواْ
ٱلۡخَيۡرَٰتِۚ إِلَى ٱللَّهِ مَرۡجِعُكُمۡ جَمِيعٗا
فَيُنَبِّئُكُم بِمَا كُنتُمۡ فِيهِ تَخۡتَلِفُونَ ٤٨

49. Onların aralarında Allahın *sənə* nazil etdiyi *Kitabla* hökm ver və onların istəklərinə tabe olma. Onlardan ehtiyat et ki, Allahın sənə nazil etdiyi *hökmlərin* bəzisindən səni sapdırmasınlar. Əgər onlar üz döndərsələr, bil ki, Allah onları bəzi günahlarına görə müsibətə düçar etmək istəyir. Həqiqətən, insanların çoxu fasiqlərdir.

وَأَنِ ٱحۡكُم بَيۡنَهُم بِمَآ أَنزَلَ ٱللَّهُ وَلَا تَتَّبِعۡ
أَهۡوَآءَهُمۡ وَٱحۡذَرۡهُمۡ أَن يَفۡتِنُوكَ عَنۢ بَعۡضِ
مَآ أَنزَلَ ٱللَّهُ إِلَيۡكَۖ فَإِن تَوَلَّوۡاْ فَٱعۡلَمۡ أَنَّمَا يُرِيدُ ٱللَّهُ
أَن يُصِيبَهُم بِبَعۡضِ ذُنُوبِهِمۡۗ وَإِنَّ كَثِيرٗا مِّنَ
ٱلنَّاسِ لَفَٰسِقُونَ ٤٩

50. Onlar cahiliyyə *dövrünün* hökmünümü istəyirlər? Qəti inanan bir camaat üçün Allahdan daha yaxşı hökm verən kim ola bilər?

أَفَحُكْمَ ٱلْجَٰهِلِيَّةِ يَبْغُونَ ۚ وَمَنْ أَحْسَنُ مِنَ
ٱللَّهِ حُكْمًا لِّقَوْمٍ يُوقِنُونَ ﴿٥٠﴾

51. Ey iman gətirənlər! Yəhudi və xaçpərəstləri *özünüzə* dost tutmayın! Onlar bir-birinin dostudurlar. Sizlərdən kim onları *özünə* dost tutarsa, o da onlardandır. Allah zalım qövmü doğru yola yönəltməz.

۞ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ لَا تَتَّخِذُوا۟ ٱلْيَهُودَ وَٱلنَّصَٰرَىٰٓ
أَوْلِيَآءَ ۘ بَعْضُهُمْ أَوْلِيَآءُ بَعْضٍ ۚ وَمَن يَتَوَلَّهُم مِّنكُمْ
فَإِنَّهُۥ مِنْهُمْ ۗ إِنَّ ٱللَّهَ لَا يَهْدِى ٱلْقَوْمَ ٱلظَّٰلِمِينَ ﴿٥١﴾

52. Sən qəlbində xəstəlik olanların: “Qorxuruq ki, başımıza bir fəlakət gələ”– deyərək onların *Kitab əhli* arasında vurnuxduqlarını görürsən. Ola bilsin ki, Allah qələbə *bəxş etsin* və ya Öz tərəfindən bir əmr versin və onlar ürəklərində gizlətdiklərindən peşman olsunlar.

فَتَرَى ٱلَّذِينَ فِى قُلُوبِهِم مَّرَضٌ يُسَٰرِعُونَ فِيهِمْ
يَقُولُونَ نَخْشَىٰٓ أَن تُصِيبَنَا دَآئِرَةٌ ۚ فَعَسَى ٱللَّهُ أَن
يَأْتِىَ بِٱلْفَتْحِ أَوْ أَمْرٍ مِّنْ عِندِهِۦ فَيُصْبِحُوا۟ عَلَىٰ
مَآ أَسَرُّوا۟ فِىٓ أَنفُسِهِمْ نَٰدِمِينَ ﴿٥٢﴾

53. İman gətirənlər isə deyəcəklər: “Sizinlə bərabər olacaqlarına dair Allahın adı ilə möhkəm and içənlər bunlardırmı?” Onların əməlləri puça çıxdı, özləri də ziyana uğrayanlardan oldular.

وَيَقُولُ ٱلَّذِينَ ءَامَنُوٓا۟ أَهَٰٓؤُلَآءِ ٱلَّذِينَ أَقْسَمُوا۟ بِٱللَّهِ
جَهْدَ أَيْمَٰنِهِمْ ۙ إِنَّهُمْ لَمَعَكُمْ ۚ حَبِطَتْ أَعْمَٰلُهُمْ
فَأَصْبَحُوا۟ خَٰسِرِينَ ﴿٥٣﴾

54. Ey iman gətirənlər! Sizlərdən hər kim dinindən dönsə, Allah *onun əvəzinə* Özünün sevdiyi və Onu sevən, möminlərə qarşı mülayim, kafirlərə qarşı isə sərt olan, Allah yolunda cihad edən və tənə edənin tənəsindən qorxmayan bir camaat gətirər. Bu, Allahın lütfüdür, onu istədiyinə verər. Allah *hər şeyi* Əhatəedəndir, Biləndir.

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ مَن يَرْتَدَّ مِنكُمْ عَن دِينِهِۦ
فَسَوْفَ يَأْتِى ٱللَّهُ بِقَوْمٍ يُحِبُّهُمْ وَيُحِبُّونَهُۥٓ أَذِلَّةٍ
عَلَى ٱلْمُؤْمِنِينَ أَعِزَّةٍ عَلَى ٱلْكَٰفِرِينَ يُجَٰهِدُونَ
فِى سَبِيلِ ٱللَّهِ وَلَا يَخَافُونَ لَوْمَةَ لَآئِمٍ ۚ ذَٰلِكَ فَضْلُ
ٱللَّهِ يُؤْتِيهِ مَن يَشَآءُ ۚ وَٱللَّهُ وَٰسِعٌ عَلِيمٌ ﴿٥٤﴾

55. Sizin himayədarınız yalnız Allah, Onun Elçisi və iman gətirənlərdir. Onlar *Allaha* boyun əyərək namaz qılır və zəkat verirlər.

إِنَّمَا وَلِيُّكُمُ ٱللَّهُ وَرَسُولُهُۥ وَٱلَّذِينَ ءَامَنُواْ ٱلَّذِينَ
يُقِيمُونَ ٱلصَّلَوٰةَ وَيُؤْتُونَ ٱلزَّكَوٰةَ وَهُمْ رَٰكِعُونَ ٥٥

56. Kim Allahı, Onun Elçisini və iman gətirənləri *özünə* dost tutarsa, ***bilsin ki***, qələbə çalanlar da məhz Allahın firqəsidir.

وَمَن يَتَوَلَّ ٱللَّهَ وَرَسُولَهُۥ وَٱلَّذِينَ ءَامَنُواْ
فَإِنَّ حِزْبَ ٱللَّهِ هُمُ ٱلْغَٰلِبُونَ ٥٦

57. Ey iman gətirənlər! Sizdən əvvəl Kitab verilənlərdən dininizi ələ salıb oyun-oyuncaq hesab edənləri və kafirləri *özünüzə* dost tutmayın. Əgər möminsinizsə, Allahdan qorxun.

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ لَا تَتَّخِذُواْ ٱلَّذِينَ ٱتَّخَذُواْ
دِينَكُمْ هُزُوًا وَلَعِبًا مِّنَ ٱلَّذِينَ أُوتُواْ ٱلْكِتَٰبَ
مِن قَبْلِكُمْ وَٱلْكُفَّارَ أَوْلِيَآءَ وَٱتَّقُواْ ٱللَّهَ
إِن كُنتُم مُّؤْمِنِينَ ٥٧

58. Siz namaza çağırdığınız zaman onlar onu məsxərəyə qoyub oyun-oyuncaq sayarlar. Bu ona görədir ki, onlar düşüncəsiz bir camaatdır.

وَإِذَا نَادَيْتُمْ إِلَى ٱلصَّلَوٰةِ ٱتَّخَذُوهَا هُزُوًا وَلَعِبًا
ذَٰلِكَ بِأَنَّهُمْ قَوْمٌ لَّا يَعْقِلُونَ ٥٨

59. De: "Ey Kitab əhli! Yalnız Allaha, bizə nazil edilənə və bizdən əvvəl nazil edilənlərə iman gətirdiyimizə və sizin əksəriyyətinizin günahkar olduğuna görəmi bizi məzəmmət edirsiniz?"

قُلْ يَٰٓأَهْلَ ٱلْكِتَٰبِ هَلْ تَنقِمُونَ مِنَّآ إِلَّآ أَنْ
ءَامَنَّا بِٱللَّهِ وَمَآ أُنزِلَ إِلَيْنَا وَمَآ أُنزِلَ مِن قَبْلُ
وَأَنَّ أَكْثَرَكُمْ فَٰسِقُونَ ٥٩

60. De: "Allah yanında cəza etibarilə bundan daha pisini sizə xəbər verimmi? *Bu,* Allahın lənətlədiyi, ona qəzəbləndiyi, özlərini də meymunlara və donuzlara döndərdiyi şəxslər və tağuta ibadət edənlərdir. Onlar, *axirətdə* yeri daha pis olan və doğru yoldan daha çox azanlardır!"

قُلْ هَلْ أُنَبِّئُكُم بِشَرٍّ مِّن ذَٰلِكَ مَثُوبَةً عِندَ ٱللَّهِ مَن
لَّعَنَهُ ٱللَّهُ وَغَضِبَ عَلَيْهِ وَجَعَلَ مِنْهُمُ ٱلْقِرَدَةَ
وَٱلْخَنَازِيرَ وَعَبَدَ ٱلطَّٰغُوتَ أُوْلَٰٓئِكَ شَرٌّ مَّكَانًا
وَأَضَلُّ عَن سَوَآءِ ٱلسَّبِيلِ ٦٠

61. Onlar sizin yanınıza gəldikdə: "Biz iman gətirdik!"– deyirlər. Halbuki onlar *sizin yanınıza* küfrlə gəlmiş və

وَإِذَا جَآءُوكُمْ قَالُوٓاْ ءَامَنَّا وَقَد دَّخَلُواْ بِٱلْكُفْرِ وَهُمْ
قَدْ خَرَجُواْ بِهِۦ وَٱللَّهُ أَعْلَمُ بِمَا كَانُواْ يَكْتُمُونَ ٦١

onunla da getmişlər. Allah onların gizlətdiklərini daha yaxşı bilir.

62. Sən onların bir çoxunu günaha, düşmənçiliyə və haram yeməyə tələsən görürsən. Onların tutduqları əməllər necə də pisdir!

وَتَرَىٰ كَثِيرًا مِّنْهُمْ يُسَٰرِعُونَ فِى ٱلْإِثْمِ وَٱلْعُدْوَٰنِ
وَأَكْلِهِمُ ٱلسُّحْتَ لَبِئْسَ مَا كَانُوا۟ يَعْمَلُونَ ٦٢

63. Nə üçün din xadimləri və baş keşişlər onlara günah sözləri və haram yeməyi qadağan etmirlər? Onların törətdikləri necə də pisdir!

لَوْلَا يَنْهَىٰهُمُ ٱلرَّبَّٰنِيُّونَ وَٱلْأَحْبَارُ عَن
قَوْلِهِمُ ٱلْإِثْمَ وَأَكْلِهِمُ ٱلسُّحْتَ لَبِئْسَ
مَا كَانُوا۟ يَصْنَعُونَ ٦٣

64. Yəhudilər dedilər: “Allahın Əli bağlıdır!” Onların öz əlləri bağlandı və dedikləri sözə görə lənətə gəldilər. Əksinə, Onun hər iki Əli açıqdır və O, *Öz lütfündən* istədiyi kimi sərf edir. Əlbəttə, Rəbbindən sənə nazil edilən *Kitab* onlardan bir çoxunun azğınlığını və küfrünü artıracaqdır. Biz onların arasına Qiyamət gününə qədər ədavət və kin saldıq. Onlar hər dəfə müharibə alovunu yandırdıqda Allah onu söndürər. Onlar yer üzündə fitnəkarlıq törətməyə səy göstərirlər. Allah isə fitnəkarları sevmir!

وَقَالَتِ ٱلْيَهُودُ يَدُ ٱللَّهِ مَغْلُولَةٌ غُلَّتْ أَيْدِيهِمْ
وَلُعِنُوا۟ بِمَا قَالُوا۟ بَلْ يَدَاهُ مَبْسُوطَتَانِ يُنفِقُ
كَيْفَ يَشَآءُ وَلَيَزِيدَنَّ كَثِيرًا مِّنْهُم مَّآ أُنزِلَ
إِلَيْكَ مِن رَّبِّكَ طُغْيَٰنًا وَكُفْرًا وَأَلْقَيْنَا بَيْنَهُمُ
ٱلْعَدَٰوَةَ وَٱلْبَغْضَآءَ إِلَىٰ يَوْمِ ٱلْقِيَٰمَةِ كُلَّمَآ
أَوْقَدُوا۟ نَارًا لِّلْحَرْبِ أَطْفَأَهَا ٱللَّهُ وَيَسْعَوْنَ
فِى ٱلْأَرْضِ فَسَادًا وَٱللَّهُ لَا يُحِبُّ ٱلْمُفْسِدِينَ ٦٤

65. Əgər Kitab əhli iman gətirib *Allahdan* qorxsaydı, əlbəttə, Biz, onların təqsirlərindən keçər və onları Nəim bağlarına daxil edərdik.

وَلَوْ أَنَّ أَهْلَ ٱلْكِتَٰبِ ءَامَنُوا۟ وَٱتَّقَوْا۟
لَكَفَّرْنَا عَنْهُمْ سَيِّـَٔاتِهِمْ
وَلَأَدْخَلْنَٰهُمْ جَنَّٰتِ ٱلنَّعِيمِ ٦٥

66. Əgər onlar Tövrata, İncilə və Rəbbindən özlərinə nazil edilənə düzgün əməl etsəydilər, onlar başları üstündə və ayaqları altında *olan nemətlərdən* yeyərdilər. Onların

وَلَوْ أَنَّهُمْ أَقَامُوا۟ ٱلتَّوْرَىٰةَ وَٱلْإِنجِيلَ وَمَآ أُنزِلَ
إِلَيْهِم مِّن رَّبِّهِمْ لَأَكَلُوا۟ مِن فَوْقِهِمْ
وَمِن تَحْتِ أَرْجُلِهِم مِّنْهُمْ أُمَّةٌ مُّقْتَصِدَةٌ
وَكَثِيرٌ مِّنْهُمْ سَآءَ مَا يَعْمَلُونَ ٦٦

arasında haqqı etiraf edən bir camaat vardır. Lakin onların çoxunun etdiyi əməllər necə də pisdir.

67. Ey Elçi! Rəbbindən sənə nazil ediləni təbliğ et! Əgər *belə* etməsən, Onun göstərişini – *sənə tapşırdığı elçilik vəzifəsini* yerinə yetirmiş olmazsan. Allah səni insanlardan qoruyar. Şübhəsiz ki, Allah kafir tayfanı doğru yola yönəltməz.

۞ يَٰٓأَيُّهَا ٱلرَّسُولُ بَلِّغۡ مَآ أُنزِلَ إِلَيۡكَ مِن
رَّبِّكَۖ وَإِن لَّمۡ تَفۡعَلۡ فَمَا بَلَّغۡتَ
رِسَالَتَهُۥۚ وَٱللَّهُ يَعۡصِمُكَ مِنَ ٱلنَّاسِۗ
إِنَّ ٱللَّهَ لَا يَهۡدِي ٱلۡقَوۡمَ ٱلۡكَٰفِرِينَ ٦٧

68. De: "Ey Kitab əhli! Nə qədər ki, Tövrata, İncilə və Rəbbinizdən sizə nazil edilənə düzgün əməl etmirsiniz, siz doğru yolda deyilsiniz". Əlbəttə, Rəbbindən sənə nazil edilən *Quran* onlardan bir çoxunun azğınlığını və küfrünü artıracaqdır. Sən isə kafir tayfa üçün heyfsilənmə.

قُلۡ يَٰٓأَهۡلَ ٱلۡكِتَٰبِ لَسۡتُمۡ عَلَىٰ شَيۡءٍ حَتَّىٰ
تُقِيمُواْ ٱلتَّوۡرَىٰةَ وَٱلۡإِنجِيلَ وَمَآ أُنزِلَ إِلَيۡكُم
مِّن رَّبِّكُمۡۗ وَلَيَزِيدَنَّ كَثِيرٗا مِّنۡهُم
مَّآ أُنزِلَ إِلَيۡكَ مِن رَّبِّكَ طُغۡيَٰنٗا وَكُفۡرٗاۖ
فَلَا تَأۡسَ عَلَى ٱلۡقَوۡمِ ٱلۡكَٰفِرِينَ ٦٨

69. İman gətirənlərin, habelə yəhudi, sabii və nəsranilərdən Allaha və Axirət gününə iman gətirib yaxşı iş görənlərin heç bir qorxusu yoxdur və onlar kədərlənməyəcəklər.

إِنَّ ٱلَّذِينَ ءَامَنُواْ وَٱلَّذِينَ هَادُواْ وَٱلصَّٰبِـُٔونَ
وَٱلنَّصَٰرَىٰ مَنۡ ءَامَنَ بِٱللَّهِ وَٱلۡيَوۡمِ ٱلۡأٓخِرِ وَعَمِلَ
صَٰلِحٗا فَلَا خَوۡفٌ عَلَيۡهِمۡ وَلَا هُمۡ يَحۡزَنُونَ ٦٩

70. Biz İsrail oğullarından əhd-peyman aldıq və onlara elçilər göndərdik. Hər dəfə bir elçi onlara könüllərinə yatmayan bir şey gətirəndə o *elçilərin* bir qismini yalançı hesab edər, bir qismini də öldürərdilər.

لَقَدۡ أَخَذۡنَا مِيثَٰقَ بَنِيٓ إِسۡرَٰٓءِيلَ وَأَرۡسَلۡنَآ إِلَيۡهِمۡ
رُسُلٗاۖ كُلَّمَا جَآءَهُمۡ رَسُولُۢ بِمَا لَا تَهۡوَىٰٓ
أَنفُسُهُمۡ فَرِيقٗا كَذَّبُواْ وَفَرِيقٗا يَقۡتُلُونَ ٧٠

71. Onlar müsibət gəlməyəcəyini güman etdilər, *beləliklə də* kor və kar oldular. Sonra Allah onların tövbələrini qəbul etdi. Daha sonra isə onlardan bir çoxu

وَحَسِبُوٓاْ أَلَّا تَكُونَ فِتۡنَةٞ فَعَمُواْ وَصَمُّواْ ثُمَّ
تَابَ ٱللَّهُ عَلَيۡهِمۡ ثُمَّ عَمُواْ وَصَمُّواْ كَثِيرٞ
مِّنۡهُمۡۚ وَٱللَّهُ بَصِيرُۢ بِمَا يَعۡمَلُونَ ٧١

yenə kor və kar oldular. Allah onların nə etdiklərini görür.

72. "Şübhəsiz ki, Allah Məryəm oğlu Məsihdir"– deyənlər artıq kafir oldular. Məsih isə demişdir: "Ey İsrail oğulları! Rəbbim və Rəbbiniz olan Allaha ibadət edin! Həqiqətən də, Allaha şərik qoşan kimsəyə, Allah Cənnəti haram etmiş və onun sığınacağı yer Oddur. Zalımlara kömək edən olmayacaqdır".

لَقَدْ كَفَرَ الَّذِينَ قَالُوٓا۟ إِنَّ اللَّهَ هُوَ الْمَسِيحُ ابْنُ
مَرْيَمَ ۖ وَقَالَ الْمَسِيحُ يَٰبَنِىٓ إِسْرَٰٓءِيلَ اعْبُدُوا۟
اللَّهَ رَبِّى وَرَبَّكُمْ ۖ إِنَّهُۥ مَن يُشْرِكْ بِاللَّهِ
فَقَدْ حَرَّمَ اللَّهُ عَلَيْهِ الْجَنَّةَ وَمَأْوَىٰهُ
النَّارُ ۖ وَمَا لِلظَّٰلِمِينَ مِنْ أَنصَارٍ ﴿٧٢﴾

73. "Allah üçlüyün üçüncüsüdür!"– deyənlər artıq kafir oldular. Halbuki Tək İlahdan başqa *ibadətə layiq olan* heç bir məbud yoxdur. Əgər onlar dediklərinə son qoymasalar, onlardan kafir olanlara mütləq ağrılı-acılı bir əzab toxunacaqdır.

لَّقَدْ كَفَرَ الَّذِينَ قَالُوٓا۟ إِنَّ اللَّهَ ثَالِثُ
ثَلَٰثَةٍ ۘ وَمَا مِنْ إِلَٰهٍ إِلَّآ إِلَٰهٌ وَٰحِدٌ ۚ وَإِن لَّمْ
يَنتَهُوا۟ عَمَّا يَقُولُونَ لَيَمَسَّنَّ الَّذِينَ
كَفَرُوا۟ مِنْهُمْ عَذَابٌ أَلِيمٌ ﴿٧٣﴾

74. Onlar Allaha tövbə edib Ondan bağışlanma diləməyəcəklərmi? Allah ki Bağışlayandır, Rəhmlidir.

أَفَلَا يَتُوبُونَ إِلَى اللَّهِ وَيَسْتَغْفِرُونَهُۥ ۚ
وَاللَّهُ غَفُورٌ رَّحِيمٌ ﴿٧٤﴾

75. Məryəm oğlu Məsih ancaq bir elçidir, ondan əvvəl də elçilər gəlib getmişlər. Onun anası isə *Allaha* sidq ürəkdən inanan bir qadın idi. Hər ikisi də yemək yeyirdi. Bax gör ayələrimizi onlara necə bəyan edirik, sonra da gör onlar *haqdan* necə döndərilirlər.

مَّا الْمَسِيحُ ابْنُ مَرْيَمَ إِلَّا رَسُولٌ قَدْ خَلَتْ مِن
قَبْلِهِ الرُّسُلُ وَأُمُّهُۥ صِدِّيقَةٌ ۖ كَانَا يَأْكُلَانِ
الطَّعَامَ ۗ انظُرْ كَيْفَ نُبَيِّنُ لَهُمُ الْءَايَٰتِ
ثُمَّ انظُرْ أَنَّىٰ يُؤْفَكُونَ ﴿٧٥﴾

76. De: "Allahı qoyub sizə nə bir zərər, nə də bir fayda verə bilməyən şeylərəmi ibadət edirsiniz?" Allah Eşidəndir, Biləndir.

قُلْ أَتَعْبُدُونَ مِن دُونِ اللَّهِ مَا لَا يَمْلِكُ لَكُمْ
ضَرًّا وَلَا نَفْعًا ۚ وَاللَّهُ هُوَ السَّمِيعُ الْعَلِيمُ ﴿٧٦﴾

77. De: “Ey Kitab əhli! Dininizdə haqsız yerə ifrata varmayın. Öncə azmış, bir çoxlarını da azdırmış və doğru yoldan çıxmış bir dəstənin istəklərinə tabe olmayın”.

قُلْ يَٰٓأَهْلَ ٱلْكِتَٰبِ لَا تَغْلُوا۟ فِى دِينِكُمْ غَيْرَ
ٱلْحَقِّ وَلَا تَتَّبِعُوٓا۟ أَهْوَآءَ قَوْمٍ قَدْ ضَلُّوا۟ مِن قَبْلُ
وَأَضَلُّوا۟ كَثِيرًا وَضَلُّوا۟ عَن سَوَآءِ ٱلسَّبِيلِ ﴿٧٧﴾

78. İsrail oğullarından kafir olanlar həm Davudun, həm də Məryəm oğlu İsanın dili ilə lənətləndilər. Bu, onların asi olduqlarına və *Allahın qoyduğu* hədləri aşdıqlarına görə idi.

لُعِنَ ٱلَّذِينَ كَفَرُوا۟ مِنۢ بَنِىٓ إِسْرَٰٓءِيلَ
عَلَىٰ لِسَانِ دَاوُۥدَ وَعِيسَى ٱبْنِ مَرْيَمَ ۚ ذَٰلِكَ
بِمَا عَصَوا۟ وَّكَانُوا۟ يَعْتَدُونَ ﴿٧٨﴾

79. Onlar bir-birlərini etdikləri pis əməllərdən çəkindirmirdilər. Onların etdikləri necə də pisdir!

كَانُوا۟ لَا يَتَنَاهَوْنَ عَن مُّنكَرٍ فَعَلُوهُ ۚ
لَبِئْسَ مَا كَانُوا۟ يَفْعَلُونَ ﴿٧٩﴾

80. Sən onların bir çoxunun kafirlərlə dostluq etdiyini görürsən. Nəfslərinin onlar üçün hazırladığı şey necə də pisdir! *Buna görə də* Allah onlara qəzəblənmişdir və onlar əzab içində əbədi qalacaqlar.

تَرَىٰ كَثِيرًا مِّنْهُمْ يَتَوَلَّوْنَ ٱلَّذِينَ
كَفَرُوا۟ ۚ لَبِئْسَ مَا قَدَّمَتْ لَهُمْ
أَنفُسُهُمْ أَن سَخِطَ ٱللَّهُ عَلَيْهِمْ وَفِى
ٱلْعَذَابِ هُمْ خَٰلِدُونَ ﴿٨٠﴾

81. Əgər onlar Allaha, Peyğəmbərə və ona nazil olana iman gətirsəydilər, müşrikləri özlərinə dost tutmazdılar. Lakin onların çoxu günahkarlardır.

وَلَوْ كَانُوا۟ يُؤْمِنُونَ بِٱللَّهِ وَٱلنَّبِىِّ وَمَآ
أُنزِلَ إِلَيْهِ مَا ٱتَّخَذُوهُمْ أَوْلِيَآءَ
وَلَٰكِنَّ كَثِيرًا مِّنْهُمْ فَٰسِقُونَ ﴿٨١﴾

82. Yəhudiləri və müşrikləri iman gətirənlərə qarşı düşmənçilik edən insanların ən pisi olduğunu görəcəksən. “Biz xaçpərəstik!”– deyənləri isə dostluq baxımından iman gətirənlərə ən yaxın olduğunu görəcəksən. Çünki onların arasında keşişlər və rahiblər vardır və onlar təkəbbürlük göstərmirlər.

۞ لَتَجِدَنَّ أَشَدَّ ٱلنَّاسِ عَدَٰوَةً لِّلَّذِينَ
ءَامَنُوا۟ ٱلْيَهُودَ وَٱلَّذِينَ أَشْرَكُوا۟ ۖ
وَلَتَجِدَنَّ أَقْرَبَهُم مَّوَدَّةً لِّلَّذِينَ ءَامَنُوا۟
ٱلَّذِينَ قَالُوٓا۟ إِنَّا نَصَٰرَىٰ ۚ ذَٰلِكَ بِأَنَّ
مِنْهُمْ قِسِّيسِينَ وَرُهْبَانًا وَأَنَّهُمْ
لَا يَسْتَكْبِرُونَ ﴿٨٢﴾

83. *Allahın* elçisinə nazil ediləni dinlədikləri zaman haqqı bildiklərinə görə onların gözlərinin yaşla dolduğunu görərsən. Onlar deyərlər: “Ey Rəbbimiz! Biz iman gətirdik, bizi də şahidlərlə bir yerə yaz!

وَإِذَا سَمِعُوا مَا أُنزِلَ إِلَى الرَّسُولِ
تَرَىٰ أَعْيُنَهُمْ تَفِيضُ مِنَ الدَّمْعِ مِمَّا
عَرَفُوا مِنَ الْحَقِّ يَقُولُونَ رَبَّنَا آمَنَّا
فَاكْتُبْنَا مَعَ الشَّاهِدِينَ ٨٣

84. Nə üçün biz Allaha və bizə gələn haqqa inanmayaq? Biz ki Rəbbimizin bizi əməlisaleh camaatla birlikdə Cənnətə daxil edəcəyinə ümid edirik”.

وَمَا لَنَا لَا نُؤْمِنُ بِاللَّهِ وَمَا جَاءَنَا مِنَ الْحَقِّ وَنَطْمَعُ
أَن يُدْخِلَنَا رَبُّنَا مَعَ الْقَوْمِ الصَّالِحِينَ ٨٤

85. Belə dediklərinə görə də Allah onları ağacları altından çaylar axan, içində əbədi qalacaqları Cənnət bağları ilə mükafatlandırdı. Yaxşı iş görənlərin mükafatı budur.

فَأَثَابَهُمُ اللَّهُ بِمَا قَالُوا جَنَّاتٍ تَجْرِي مِن
تَحْتِهَا الْأَنْهَارُ خَالِدِينَ فِيهَا وَذَٰلِكَ
جَزَاءُ الْمُحْسِنِينَ ٨٥

86. Kafir olub ayələrimizi yalan sayanlar Cəhənnəm sakinləridirlər.

وَالَّذِينَ كَفَرُوا وَكَذَّبُوا بِآيَاتِنَا أُولَٰئِكَ
أَصْحَابُ الْجَحِيمِ ٨٦

87. Ey iman gətirənlər! Allahın sizə halal buyurduğu təmiz ruziləri haram etməyin və həddi aşmayın. Həqiqətən, Allah həddi aşanları sevmir.

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا لَا تُحَرِّمُوا طَيِّبَاتِ
مَا أَحَلَّ اللَّهُ لَكُمْ وَلَا تَعْتَدُوا
إِنَّ اللَّهَ لَا يُحِبُّ الْمُعْتَدِينَ ٨٧

88. Allahın sizə ruzi olaraq verdiyi halal, təmiz nemətlərdən yeyin və iman gətirmiş olduğunuz Allahdan qorxun!

وَكُلُوا مِمَّا رَزَقَكُمُ اللَّهُ حَلَالًا طَيِّبًا
وَاتَّقُوا اللَّهَ الَّذِي أَنتُم بِهِ مُؤْمِنُونَ ٨٨

89. Allah sizi qəsdiniz olmadan içdiyiniz andlara görə cəzalandırmaz, lakin O, sizi qəsdlə içdiyiniz andlara görə cəzalandıracaqdır. Bunun kəffarəsi öz ailənizə yedirtdiyinizin orta hesabı dəyərində ya on kasıbı yedirtmək

لَا يُؤَاخِذُكُمُ اللَّهُ بِاللَّغْوِ فِي أَيْمَانِكُمْ
وَلَٰكِن يُؤَاخِذُكُم بِمَا عَقَّدتُّمُ الْأَيْمَانَ
فَكَفَّارَتُهُ إِطْعَامُ عَشَرَةِ مَسَاكِينَ مِنْ
أَوْسَطِ مَا تُطْعِمُونَ أَهْلِيكُمْ أَوْ كِسْوَتُهُمْ

və ya onları geyindirmək və yaxud da bir köləni azad etməkdir. Kəffarə vermək üçün bir şey tapmayan kimsə üç gün oruc tutmalıdır. Bu, and içib sonra pozduğunuz andlarınızın kəffarəsidir. Andlarınızı qoruyun! Allah Öz ayələrini sizə bu cür bəyan edir ki, bəlkə şükür edəsiniz.

أَوْ تَحْرِيرُ رَقَبَةٍ فَمَن لَّمْ يَجِدْ فَصِيَامُ
ثَلَٰثَةِ أَيَّامٍ ذَٰلِكَ كَفَّٰرَةُ أَيْمَٰنِكُمْ إِذَا
حَلَفْتُمْ وَٱحْفَظُوٓا۟ أَيْمَٰنَكُمْ كَذَٰلِكَ يُبَيِّنُ
ٱللَّهُ لَكُمْ ءَايَٰتِهِۦ لَعَلَّكُمْ تَشْكُرُونَ ﴿٨٩﴾

90. Ey iman gətirənlər! Şübhəsiz ki, sərxoşedici içki də, qumar da, tapınmaq məqsədilə dik qoyulmuş daşlar da, fal oxları da şeytan əməlindən olan murdar şeylərdir. Bunlardan çəkinin ki, bəlkə nicat tapasınız.

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوٓا۟ إِنَّمَا ٱلْخَمْرُ وَٱلْمَيْسِرُ
وَٱلْأَنصَابُ وَٱلْأَزْلَٰمُ رِجْسٌ مِّنْ عَمَلِ
ٱلشَّيْطَٰنِ فَٱجْتَنِبُوهُ لَعَلَّكُمْ تُفْلِحُونَ ﴿٩٠﴾

91. Həqiqətən, şeytan sərxoşedici içki və qumar vasitəsilə sizin aranıza ədavət və kin salmaq, sizi Allahı yad etməkdən və namazdan ayırmaq istəyər. Siz buna son qoyacaqsınızmı?

إِنَّمَا يُرِيدُ ٱلشَّيْطَٰنُ أَن يُوقِعَ بَيْنَكُمُ
ٱلْعَدَٰوَةَ وَٱلْبَغْضَآءَ فِى ٱلْخَمْرِ وَٱلْمَيْسِرِ
وَيَصُدَّكُمْ عَن ذِكْرِ ٱللَّهِ وَعَنِ
ٱلصَّلَوٰةِ فَهَلْ أَنتُم مُّنتَهُونَ ﴿٩١﴾

92. Allaha itaət edin, Onun Elçisinə itaət edin və asi olmaqdan çəkinin! Əgər üz çevirsəniz, bilin ki, Elçimizin öhdəsinə düşən ancaq açıq-aydın təbliğ etməkdir.

وَأَطِيعُوا۟ ٱللَّهَ وَأَطِيعُوا۟ ٱلرَّسُولَ وَٱحْذَرُوا۟
فَإِن تَوَلَّيْتُمْ فَٱعْلَمُوٓا۟ أَنَّمَا عَلَىٰ رَسُولِنَا
ٱلْبَلَٰغُ ٱلْمُبِينُ ﴿٩٢﴾

93. İman gətirib yaxşı işlər görənlərə, Allahdan qorxaraq iman gətirib yaxşı işlər gördükləri, sonra yenə Allahdan qorxaraq iman gətirdikləri, sonra yenə də Allahdan qorxaraq yaxşı işlər gördükləri təqdirdə, haram edilməmişdən əvvəl daddıqları şeylərə görə heç bir günah gəlməz.

لَيْسَ عَلَى ٱلَّذِينَ ءَامَنُوا۟ وَعَمِلُوا۟ ٱلصَّٰلِحَٰتِ
جُنَاحٌ فِيمَا طَعِمُوٓا۟ إِذَا مَا ٱتَّقَوا۟ وَّءَامَنُوا۟ وَعَمِلُوا۟
ٱلصَّٰلِحَٰتِ ثُمَّ ٱتَّقَوا۟ وَّءَامَنُوا۟ ثُمَّ ٱتَّقَوا۟
وَّأَحْسَنُوا۟ وَٱللَّهُ يُحِبُّ ٱلْمُحْسِنِينَ ﴿٩٣﴾

Allah yaxşı iş görənləri sevir.

94. Ey iman gətirənlər! Allah sizi əllərinizin və nizələrinizin çata biləcəyi bir ovla imtahan edəcək ki, Allah, gizlində (yaxud Onun Özünü görmədən) kimin Ondan qorxduğunu üzə çıxarsın. Bundan sonra həddi aşan kimsə üçün isə ağrılı-acılı bir əzab hazırlanmışdır.

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ لَيَبۡلُوَنَّكُمُ ٱللَّهُ بِشَيۡءٖ
مِّنَ ٱلصَّيۡدِ تَنَالُهُۥٓ أَيۡدِيكُمۡ وَرِمَاحُكُمۡ
لِيَعۡلَمَ ٱللَّهُ مَن يَخَافُهُۥ بِٱلۡغَيۡبِۚ فَمَنِ ٱعۡتَدَىٰ
بَعۡدَ ذَٰلِكَ فَلَهُۥ عَذَابٌ أَلِيمٞ ٩٤

95. Ey iman gətirənlər! İhramda ikən ovu öldürməyin. Sizlərdən kim onu qəsdən öldürərsə, kəffarəsi öldürdüyünə bənzər bir qurbanlıq heyvanı əvəz ödəməkdir. Buna sizlərdən iki ədalətli kişi qərar verməli, sonra da həmin qurbanlıq heyvan Kəbəyə çatdırılmalıdır. Yaxud kəffarə olaraq kasıbları yedirtməli, yaxud da buna bərabər oruc tutmalıdır ki, öz işinin zərərini dadsın. Allah olub-keçənləri bağışlamışdır. Hər kim yenə bu günaha qayıtsa, Allah ondan intiqam alar. Allah Qüdrətlidir, intiqam almağa qadirdir.

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ لَا تَقۡتُلُواْ ٱلصَّيۡدَ وَأَنتُمۡ
حُرُمٞۚ وَمَن قَتَلَهُۥ مِنكُم مُّتَعَمِّدٗا فَجَزَآءٞ
مِّثۡلُ مَا قَتَلَ مِنَ ٱلنَّعَمِ يَحۡكُمُ بِهِۦ ذَوَا عَدۡلٖ
مِّنكُمۡ هَدۡيَۢا بَٰلِغَ ٱلۡكَعۡبَةِ أَوۡ كَفَّٰرَةٞ طَعَامُ
مَسَٰكِينَ أَوۡ عَدۡلُ ذَٰلِكَ صِيَامٗا لِّيَذُوقَ
وَبَالَ أَمۡرِهِۦۗ عَفَا ٱللَّهُ عَمَّا سَلَفَۚ وَمَنۡ عَادَ
فَيَنتَقِمُ ٱللَّهُ مِنۡهُۚ وَٱللَّهُ عَزِيزٞ ذُو ٱنتِقَامٍ ٩٥

96. Həm sizin, həm də səfərdə olanların faydalanması üçün dəniz ovu və onu yemək sizə halal edildi. İhramda olduğunuz müddətdə isə quruda ov etmək sizə haram edildi. Hüzuruna toplanılacağınız Allahdan qorxun!

أُحِلَّ لَكُمۡ صَيۡدُ ٱلۡبَحۡرِ وَطَعَامُهُۥ مَتَٰعٗا لَّكُمۡ
وَلِلسَّيَّارَةِۖ وَحُرِّمَ عَلَيۡكُمۡ صَيۡدُ ٱلۡبَرِّ مَا دُمۡتُمۡ
حُرُمٗاۗ وَٱتَّقُواْ ٱللَّهَ ٱلَّذِيٓ إِلَيۡهِ تُحۡشَرُونَ ٩٦

97. Allah Kəbəni – müqəddəs evi, haram ayı, qurbanı və boynuna nişan taxılmış qurbanlıq heyvanları

۞ جَعَلَ ٱللَّهُ ٱلۡكَعۡبَةَ ٱلۡبَيۡتَ ٱلۡحَرَامَ
قِيَٰمٗا لِّلنَّاسِ وَٱلشَّهۡرَ ٱلۡحَرَامَ وَٱلۡهَدۡيَ وَٱلۡقَلَٰٓئِدَۚ

ذَٰلِكَ لِتَعْلَمُوٓا۟ أَنَّ ٱللَّهَ يَعْلَمُ مَا فِى ٱلسَّمَٰوَٰتِ وَمَا فِى
ٱلْأَرْضِ وَأَنَّ ٱللَّهَ بِكُلِّ شَىْءٍ عَلِيمٌ ٩٧

insanların işlərini yoluna qoymaq üçün bir vasitə kimi müəyyən etdi. Bu ona görədir ki, siz göylərdə və yerdə olanların Allaha bəlli olmasını və Allahın hər şeyi Bilən olduğunu anlayasınız.

ٱعْلَمُوٓا۟ أَنَّ ٱللَّهَ شَدِيدُ ٱلْعِقَابِ وَأَنَّ ٱللَّهَ
غَفُورٌ رَّحِيمٌ ٩٨

**98.** Agah olun ki, Allah şiddətli cəza verəndir, həmçinin də Allah Bağışlayandır, Rəhmlidir.

مَّا عَلَى ٱلرَّسُولِ إِلَّا ٱلْبَلَٰغُ ۗ وَٱللَّهُ يَعْلَمُ مَا
تُبْدُونَ وَمَا تَكْتُمُونَ ٩٩

**99.** Allahın elçisinin vəzifəsi ancaq təbliğ etməkdir. Allah sizin aşkara çıxardığınızı da, gizlində saxladığınızı da bilir.

قُل لَّا يَسْتَوِى ٱلْخَبِيثُ وَٱلطَّيِّبُ
وَلَوْ أَعْجَبَكَ كَثْرَةُ ٱلْخَبِيثِ ۚ فَٱتَّقُوا۟ ٱللَّهَ
يَٰٓأُو۟لِى ٱلْأَلْبَٰبِ لَعَلَّكُمْ تُفْلِحُونَ ١٠٠

**100.** De: “Murdar şeyin çox olması sənin xoşuna gəlsə belə, murdarla təmiz eyni ola bilməz”. Ey ağıl sahibləri! Allahdan qorxun ki, bəlkə nicat tapasınız.

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ لَا تَسْـَٔلُوا۟ عَنْ أَشْيَآءَ
إِن تُبْدَ لَكُمْ تَسُؤْكُمْ وَإِن تَسْـَٔلُوا۟ عَنْهَا
حِينَ يُنَزَّلُ ٱلْقُرْءَانُ تُبْدَ لَكُمْ عَفَا ٱللَّهُ
عَنْهَا ۗ وَٱللَّهُ غَفُورٌ حَلِيمٌ ١٠١

**101.** Ey iman gətirənlər! Sizə agah olunca xoşunuza gəlməyəcək şeylər barəsində soruşmayın. Əgər Quran nazil edildiyi zaman onlar haqqında soruşsanız, sizə aydın olar. Allah bunları – indiyə qədər verdiyiniz bu cür sualları əfv etdi. Allah Bağışlayandır, Rəhmlidir.

قَدْ سَأَلَهَا قَوْمٌ مِّن قَبْلِكُمْ ثُمَّ أَصْبَحُوا۟
بِهَا كَٰفِرِينَ ١٠٢

**102.** Sizdən əvvəl bir qövm bunları soruşmuş, sonra da bu səbəbdən kafir olmuşdu.

مَا جَعَلَ ٱللَّهُ مِنۢ بَحِيرَةٍ وَلَا سَآئِبَةٍ وَلَا وَصِيلَةٍ
وَلَا حَامٍ ۙ وَلَٰكِنَّ ٱلَّذِينَ كَفَرُوا۟ يَفْتَرُونَ عَلَى ٱللَّهِ

**103.** Allah müşriklərin bəhirə, saibə, vəsilə və ham adlandırıb bütlərə nəzir etdiyi heyvanlar barəsində

heç bir göstəriş verməmişdir. Lakin kafir olanlar Allaha qarşı yalan uydururlar. Onların çoxu isə bunu anlamır.

ٱلْكَذِبَ وَأَكْثَرُهُمْ لَا يَعْقِلُونَ ١٠٣

104. Onlara: “Allahın nazil etdiyinə və göndərdiyi Elçiyə tərəf gəlin”– deyildikdə: “Atalarımızın tutduğu yol bizə bəs edər”– deyirlər. Əgər ataları bir şey bilməyib, doğru yola yönəlməyiblərsə onda necə olsun?

وَإِذَا قِيلَ لَهُمْ تَعَالَوْا إِلَىٰ مَآ أَنزَلَ ٱللَّهُ وَإِلَى
ٱلرَّسُولِ قَالُوا حَسْبُنَا مَا وَجَدْنَا عَلَيْهِ
ءَابَآءَنَآ أَوَلَوْ كَانَ ءَابَآؤُهُمْ لَا يَعْلَمُونَ
شَيْـًٔا وَلَا يَهْتَدُونَ ١٠٤

105. Ey iman gətirənlər! Öz qeydinizə qalın! Siz doğru yolda olsanız, haqq yoldan azmışlar sizə zərər yetirə bilməzlər. Hamınızın dönüşü Allaha olacaq və O, etdiyiniz əməllər barədə sizə xəbər verəcəkdir.

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا عَلَيْكُمْ أَنفُسَكُمْ لَا يَضُرُّكُم
مَّن ضَلَّ إِذَا ٱهْتَدَيْتُمْ إِلَى ٱللَّهِ مَرْجِعُكُمْ
جَمِيعًا فَيُنَبِّئُكُم بِمَا كُنتُمْ تَعْمَلُونَ ١٠٥

106. Ey iman gətirənlər! Sizlərdən bir kimsəyə ölüm gəldiyi zaman, vəsiyyət vaxtı içinizdən iki ədalətli kişi, bir yerə səfərə çıxdığınız zaman başınıza ölüm müsibəti gəldikdə isə özünüzdən olmayan iki kişi aranızda şahidlik etsin. Əgər özünüzdən olmayan şahidlərə şübhə etsəniz, namazdan sonra hər ikisini saxlayın və qoy onlar: “Biz bu andımızı lap yaxın qohumlara belə heç bir qiymətə satmarıq və Allahın şahidliyini gizlətmərik. Əks halda biz, şübhəsiz ki, günahkarlardan olarıq”– deyə and içsinlər.

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا شَهَٰدَةُ بَيْنِكُمْ إِذَا
حَضَرَ أَحَدَكُمُ ٱلْمَوْتُ حِينَ ٱلْوَصِيَّةِ
ٱثْنَانِ ذَوَا عَدْلٍ مِّنكُمْ أَوْ ءَاخَرَانِ مِنْ غَيْرِكُمْ
إِنْ أَنتُمْ ضَرَبْتُمْ فِى ٱلْأَرْضِ فَأَصَٰبَتْكُم
مُّصِيبَةُ ٱلْمَوْتِ تَحْبِسُونَهُمَا مِنۢ بَعْدِ
ٱلصَّلَوٰةِ فَيُقْسِمَانِ بِٱللَّهِ إِنِ ٱرْتَبْتُمْ
لَا نَشْتَرِى بِهِۦ ثَمَنًا وَلَوْ كَانَ ذَا قُرْبَىٰ وَلَا
نَكْتُمُ شَهَٰدَةَ ٱللَّهِ إِنَّآ إِذًا لَّمِنَ ٱلْءَاثِمِينَ ١٠٦

107. Əgər hər ikisinin günah iş tutduqları aşkar edilsə, o zaman onların yerini haqsızlığa məruz

فَإِنْ عُثِرَ عَلَىٰٓ أَنَّهُمَا ٱسْتَحَقَّآ إِثْمًا فَـَٔاخَرَانِ
يَقُومَانِ مَقَامَهُمَا مِنَ ٱلَّذِينَ ٱسْتَحَقَّ عَلَيْهِمُ

qalanlardan ölən şəxsə daha yaxın olan iki kişi tutar və onlar: "Əlbəttə, bizim şahidliyimiz o iki nəfərin şahidliyindən daha doğrudur və biz həddi aşmadıq. Əks halda biz, şübhəsiz ki, zalımlardan olarıq"– deyə and içərlər.

ٱلْأَوْلَيَٰنِ فَيُقْسِمَانِ بِٱللَّهِ لَشَهَٰدَتُنَآ أَحَقُّ مِن
شَهَٰدَتِهِمَا وَمَا ٱعْتَدَيْنَآ إِنَّآ إِذًا لَّمِنَ
ٱلظَّٰلِمِينَ ﴿١٠٧﴾

108. Bu, onların olduğu kimi şahidlik etmələri və ya andlarının sonradan varislər tərəfindən başqa andlarla rədd edilməsindən qorxmaları üçün daha münasibdir. Allahdan qorxun və qulaq asın! Allah günahkar tayfanı doğru yola yönəltməz.

ذَٰلِكَ أَدْنَىٰٓ أَن يَأْتُوا۟ بِٱلشَّهَٰدَةِ عَلَىٰ وَجْهِهَآ
أَوْ يَخَافُوٓا۟ أَن تُرَدَّ أَيْمَٰنٌۢ بَعْدَ أَيْمَٰنِهِمْ ۗ وَٱتَّقُوا۟
ٱللَّهَ وَٱسْمَعُوا۟ ۗ وَٱللَّهُ لَا يَهْدِى ٱلْقَوْمَ ٱلْفَٰسِقِينَ ﴿١٠٨﴾

109. Allah elçilərini toplayacağı gün deyəcəkdir: "Sizə nə cavab verildi?" Onlar isə: "Bizim elmimiz yoxdur. Şübhəsiz ki, qeybləri bilən Sənsən!"– deyəcəklər.

۞ يَوْمَ يَجْمَعُ ٱللَّهُ ٱلرُّسُلَ فَيَقُولُ مَاذَآ أُجِبْتُمْ ۖ
قَالُوا۟ لَا عِلْمَ لَنَآ ۖ إِنَّكَ أَنتَ عَلَّٰمُ ٱلْغُيُوبِ ﴿١٠٩﴾

110. Allah deyəcəkdir: "Ey Məryəm oğlu İsa! Sənə və anana olan nemətimi xatırla! O zaman səni müqəddəs ruhla qüvvətləndirmişdim. Sən həm beşikdə ikən, həm də yetkin çağında insanlarla danışırdın. Sənə yazmağı, hikməti, Tövratı və İncili öyrətmişdim. Sən Mənim iznimlə palçıqdan quşa bənzər bir şey düzəldib ona üfürürdün, o da Mənim iznimlə quş olurdu. Sən Mənim iznimlə anadangəlmə koru və cüzam xəstəliyinə tutulanı sağaldır və Mənim iznimlə ölüləri dirildirdin. Sən İsrail oğullarının

إِذْ قَالَ ٱللَّهُ يَٰعِيسَى ٱبْنَ مَرْيَمَ ٱذْكُرْ نِعْمَتِى
عَلَيْكَ وَعَلَىٰ وَٰلِدَتِكَ إِذْ أَيَّدتُّكَ بِرُوحِ
ٱلْقُدُسِ تُكَلِّمُ ٱلنَّاسَ فِى ٱلْمَهْدِ وَكَهْلًا ۖ
وَإِذْ عَلَّمْتُكَ ٱلْكِتَٰبَ وَٱلْحِكْمَةَ
وَٱلتَّوْرَىٰةَ وَٱلْإِنجِيلَ ۖ وَإِذْ تَخْلُقُ مِنَ ٱلطِّينِ
كَهَيْـَٔةِ ٱلطَّيْرِ بِإِذْنِى فَتَنفُخُ فِيهَا فَتَكُونُ
طَيْرًۢا بِإِذْنِى ۖ وَتُبْرِئُ ٱلْأَكْمَهَ وَٱلْأَبْرَصَ
بِإِذْنِى ۖ وَإِذْ تُخْرِجُ ٱلْمَوْتَىٰ بِإِذْنِى ۖ
وَإِذْ كَفَفْتُ بَنِىٓ إِسْرَٰٓءِيلَ عَنكَ
إِذْ جِئْتَهُم بِٱلْبَيِّنَٰتِ فَقَالَ ٱلَّذِينَ كَفَرُوا۟
مِنْهُمْ إِنْ هَٰذَآ إِلَّا سِحْرٌ مُّبِينٌ ﴿١١٠﴾

yanına açıq-aydın dəlillərlə gəldikdə Mən onları səndən dəf etmişdim. Onlardan kafir olanlar isə demişdilər: "Bu, açıq-aydın sehrdən başqa bir şey deyildir".

111. Bir zaman Mən həvarilərə: "Mənə və elçimə iman gətirin!"– deyə vəhy etmişdim. Onlar da: "İman gətirdik. Sən də şahid ol ki, biz müsəlmanlarıq!"– demişdilər.

وَإِذْ أَوْحَيْتُ إِلَى ٱلْحَوَارِيِّـۧنَ أَنْ ءَامِنُوا۟ بِى
وَبِرَسُولِى قَالُوٓا۟ ءَامَنَّا وَٱشْهَدْ بِأَنَّنَا
مُسْلِمُونَ ﴿١١١﴾

112. Bir zaman həvarilər demişdilər: "Ey Məryəm oğlu İsa! Rəbbin bizə göydən bir süfrə endirə bilərmi?" O da onlara demişdi: "Əgər möminsinizsə, Allahdan qorxun".

إِذْ قَالَ ٱلْحَوَارِيُّونَ يَٰعِيسَى ٱبْنَ مَرْيَمَ هَلْ
يَسْتَطِيعُ رَبُّكَ أَن يُنَزِّلَ عَلَيْنَا مَآئِدَةً
مِّنَ ٱلسَّمَآءِ ۖ قَالَ ٱتَّقُوا۟ ٱللَّهَ إِن كُنتُم
مُّؤْمِنِينَ ﴿١١٢﴾

113. Onlar demişdilər: "Biz istəyirik ki, ondan yeyək, qəlblərimiz rahat olsun, bizə doğru söylədiyini bilək və o möcüzəyə şahidlik edənlərdən olaq".

قَالُوا۟ نُرِيدُ أَن نَّأْكُلَ مِنْهَا وَتَطْمَئِنَّ قُلُوبُنَا
وَنَعْلَمَ أَن قَدْ صَدَقْتَنَا وَنَكُونَ عَلَيْهَا
مِنَ ٱلشَّٰهِدِينَ ﴿١١٣﴾

114. Məryəm oğlu İsa dedi: "Ey Allahım! Ey bizim Rəbbimiz! Bizə göydən bir süfrə endir ki, bizim həm birincimiz, həm də axırıncımız üçün bir bayram və Səndən bir möcüzə olsun. Bizə ruzi ver, Sən ruzi verənlərin ən yaxşısısan!"

قَالَ عِيسَى ٱبْنُ مَرْيَمَ ٱللَّهُمَّ رَبَّنَآ أَنزِلْ عَلَيْنَا
مَآئِدَةً مِّنَ ٱلسَّمَآءِ تَكُونُ لَنَا عِيدًا لِّأَوَّلِنَا
وَءَاخِرِنَا وَءَايَةً مِّنكَ ۖ وَٱرْزُقْنَا وَأَنتَ خَيْرُ
ٱلرَّٰزِقِينَ ﴿١١٤﴾

115. Allah dedi: "Mən onu sizə endirəcəyəm. Amma bundan sonra aranızdan kafir olanlara aləmlərdən heç kəsə vermədiyim bir əzabı verəcəyəm".

قَالَ ٱللَّهُ إِنِّى مُنَزِّلُهَا عَلَيْكُمْ ۖ فَمَن يَكْفُرْ بَعْدُ
مِنكُمْ فَإِنِّىٓ أُعَذِّبُهُۥ عَذَابًا لَّآ أُعَذِّبُهُۥٓ أَحَدًا
مِّنَ ٱلْعَٰلَمِينَ ﴿١١٥﴾

116. Allah deyəcəkdir: "Ey Məryəm oğlu İsa! Sənmi insanlara: "Allahı qoyub məni və anamı iki məbud qəbul edin!"– demişdin?" İsa deyəcək: "Sən pak və müqəddəssən! Haqqım olmayan bir şeyi demək mənə yaraşmaz. Əgər bunu demiş olsaydım, əlbəttə, Sən onu bilərdin. Sən mənim qəlbimdə olanları bilirsən, mən isə Sənin Özündə olanları bilmirəm. Şübhəsiz ki, qeybləri bilən Sənsən!

وَإِذْ قَالَ ٱللَّهُ يَٰعِيسَى ٱبْنَ مَرْيَمَ ءَأَنتَ قُلْتَ لِلنَّاسِ
ٱتَّخِذُونِى وَأُمِّىَ إِلَٰهَيْنِ مِن دُونِ ٱللَّهِ ۖ قَالَ
سُبْحَٰنَكَ مَا يَكُونُ لِىٓ أَنْ أَقُولَ مَا لَيْسَ لِى بِحَقٍّ ۚ
إِن كُنتُ قُلْتُهُۥ فَقَدْ عَلِمْتَهُۥ ۚ تَعْلَمُ مَا فِى نَفْسِى
وَلَآ أَعْلَمُ مَا فِى نَفْسِكَ ۚ إِنَّكَ أَنتَ عَلَّٰمُ ٱلْغُيُوبِ ﴿١١٦﴾

117. Mən onlara ancaq Sənin mənə əmr etdiyini: "Mənim də Rəbbim, sizin də Rəbbiniz olan Allaha ibadət edin!"– demişəm. Nə qədər ki, onların arasında idim, mən onlara şahid idim. Sən məni onların arasından götürdükdən sonra isə onlara nəzarət edən Özün oldun. Sən hər şeyə Şahidsən.

مَا قُلْتُ لَهُمْ إِلَّا مَآ أَمَرْتَنِى بِهِۦٓ أَنِ ٱعْبُدُوا۟ ٱللَّهَ
رَبِّى وَرَبَّكُمْ ۚ وَكُنتُ عَلَيْهِمْ شَهِيدًا مَّا دُمْتُ
فِيهِمْ ۖ فَلَمَّا تَوَفَّيْتَنِى كُنتَ أَنتَ ٱلرَّقِيبَ عَلَيْهِمْ ۚ
وَأَنتَ عَلَىٰ كُلِّ شَىْءٍ شَهِيدٌ ﴿١١٧﴾

118. Əgər onlara əzab versən, sözsüz ki, onlar Sənin qullarındır. Əgər onları bağışlasan, şübhəsiz ki, Sən Qüdrətlisən, Müdriksən!"

إِن تُعَذِّبْهُمْ فَإِنَّهُمْ عِبَادُكَ ۖ وَإِن تَغْفِرْ لَهُمْ
فَإِنَّكَ أَنتَ ٱلْعَزِيزُ ٱلْحَكِيمُ ﴿١١٨﴾

119. Allah dedi: "Bu, doğru danışanlara doğruluqlarının fayda verəcəyi gündür! Onlar üçün ağacları altından çaylar axan və içində əbədi qalacaqları Cənnət bağları hazırlanmışdır". Allah onlardan razıdır, onlar da Ondan razıdırlar. Bu, böyük uğurdur.

قَالَ ٱللَّهُ هَٰذَا يَوْمُ يَنفَعُ ٱلصَّٰدِقِينَ صِدْقُهُمْ ۚ
لَهُمْ جَنَّٰتٌ تَجْرِى مِن تَحْتِهَا ٱلْأَنْهَٰرُ خَٰلِدِينَ فِيهَآ
أَبَدًا ۚ رَّضِىَ ٱللَّهُ عَنْهُمْ وَرَضُوا۟ عَنْهُ ۚ
ذَٰلِكَ ٱلْفَوْزُ ٱلْعَظِيمُ ﴿١١٩﴾

120. Göylərin, yerin və onların arasında olanların hökmranlığı Allaha məxsusdur və O, hər şeyə qadirdir.

لِلَّهِ مُلْكُ ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضِ وَمَا فِيهِنَّ
وَهُوَ عَلَىٰ كُلِّ شَيْءٍ قَدِيرٌۢ ﴿١٢٠﴾



## əl-Ənam («Mal-qara») surəsi

## سُورَةُ الأَنعَام

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

1. Göyləri və yeri yaradan, zülmətləri və nuru var edən Allaha həmd olsun! *Bu dəlillərdən* sonra kafir olanlar hələ də *bütləri* öz Rəbbinə tay tuturlar.

ٱلْحَمْدُ لِلَّهِ ٱلَّذِى خَلَقَ ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضَ
وَجَعَلَ ٱلظُّلُمَٰتِ وَٱلنُّورَ ۖ ثُمَّ ٱلَّذِينَ
كَفَرُوا۟ بِرَبِّهِمْ يَعْدِلُونَ ١

2. Sizi palçıqdan yaradan, sonra da əcəlinizi təyin edən Odur. Onun yanında *Qiyamət günü üçün də* bəlli bir əcəl vardır. *Bunu bildikdən* sonra siz yenə də şübhə edirsiniz.

هُوَ ٱلَّذِى خَلَقَكُم مِّن طِينٍ ثُمَّ قَضَىٰٓ أَجَلًا
وَأَجَلٌ مُّسَمًّى عِندَهُۥ ۖ ثُمَّ أَنتُمْ تَمْتَرُونَ ٢

3. O, həm göylərdə, həm də yerdə *ibadət olunan Tək* Allahdır. O, gizlində saxladığınızı da bilir, aşkarda etdiyinizi də. O, sizin nə qazanacağınızı da bilir.

وَهُوَ ٱللَّهُ فِى ٱلسَّمَٰوَٰتِ وَفِى ٱلْأَرْضِ ۖ يَعْلَمُ
سِرَّكُمْ وَجَهْرَكُمْ وَيَعْلَمُ مَا تَكْسِبُونَ ٣

4. Onlara Rəbbindən gələn elə bir ayə yoxdur ki, ondan üz çevirməsinlər.

وَمَا تَأْتِيهِم مِّنْ ءَايَةٍ مِّنْ ءَايَٰتِ رَبِّهِمْ إِلَّا
كَانُوا۟ عَنْهَا مُعْرِضِينَ ٤

5. Onlara haqq gəldikdə onu yalan saydılar. İstehza etdikləri şeyin xəbəri onlara tezliklə çatacaqdır.

فَقَدْ كَذَّبُوا۟ بِٱلْحَقِّ لَمَّا جَآءَهُمْ ۖ فَسَوْفَ يَأْتِيهِمْ
أَنۢبَٰٓؤُا۟ مَا كَانُوا۟ بِهِۦ يَسْتَهْزِءُونَ ٥

6. Məgər onlar özlərindən əvvəl neçə-neçə nəsilləri məhv etdiyimizi görmədilərmi? Biz onlara yer üzündə sizə vermədiyimiz imkanları vermişdik. Onların üzərinə *göydən* bol-bol yağış yağdırmış və *evlərinin* altından çaylar axıtmışdıq. Biz

أَلَمْ يَرَوْا۟ كَمْ أَهْلَكْنَا مِن قَبْلِهِم مِّن قَرْنٍ
مَّكَّنَّٰهُمْ فِى ٱلْأَرْضِ مَا لَمْ نُمَكِّن لَّكُمْ وَأَرْسَلْنَا
ٱلسَّمَآءَ عَلَيْهِم مِّدْرَارًا وَجَعَلْنَا ٱلْأَنْهَٰرَ تَجْرِى
مِن تَحْتِهِمْ فَأَهْلَكْنَٰهُم بِذُنُوبِهِمْ وَأَنشَأْنَا مِنۢ
بَعْدِهِمْ قَرْنًا ءَاخَرِينَ ٦

onları günahlarına görə həlak etdik və onlardan sonra başqa nəsillər yaratdıq.

7. Əgər sənə kağız üzərində bir yazı nazil etsəydik və onlar da əlləri ilə ona toxunsaydılar, kafir olanlar *yenə də*: "Bu, açıq-aydın sehrdən başqa bir şey deyildir!"– deyərdilər.

وَلَوْ نَزَّلْنَا عَلَيْكَ كِتَٰبًا فِي قِرْطَاسٍ فَلَمَسُوهُ بِأَيْدِيهِمْ
لَقَالَ ٱلَّذِينَ كَفَرُوٓا۟ إِنْ هَٰذَآ إِلَّا سِحْرٌ مُّبِينٌ ٧

8. Onlar: "Nə üçün ona mələk endirilməyib?"– dedilər. Əgər biz mələk endirsəydik, iş bitmiş olardı, onlara isə möhlət verilməzdi.

وَقَالُوا۟ لَوْلَآ أُنزِلَ عَلَيْهِ مَلَكٌ ۖ وَلَوْ أَنزَلْنَا مَلَكًا
لَّقُضِيَ ٱلْأَمْرُ ثُمَّ لَا يُنظَرُونَ ٨

9. Əgər biz onu mələk etsəydik, əlbəttə, onu kişi edərdik və onları bir daha düşdükləri şübhəyə salardıq.

وَلَوْ جَعَلْنَٰهُ مَلَكًا لَّجَعَلْنَٰهُ رَجُلًا
وَلَلَبَسْنَا عَلَيْهِم مَّا يَلْبِسُونَ ٩

10. Əlbəttə, səndən əvvəlki elçilərə də istehza edilmişdi. Amma istehza edənləri, məsxərəyə qoyduqları şey *hər tərəfdən* bürüdü.

وَلَقَدِ ٱسْتُهْزِئَ بِرُسُلٍ مِّن قَبْلِكَ فَحَاقَ
بِٱلَّذِينَ سَخِرُوا۟ مِنْهُم مَّا كَانُوا۟ بِهِۦ
يَسْتَهْزِءُونَ ١٠

11. De: "Yer üzündə gəzib dolaşın və görün *haqqı* yalan sayanların aqibəti necə oldu".

قُلْ سِيرُوا۟ فِي ٱلْأَرْضِ ثُمَّ ٱنظُرُوا۟ كَيْفَ
كَانَ عَٰقِبَةُ ٱلْمُكَذِّبِينَ ١١

12. De: "Göylərdə və yerdə olanlar kimə məxsusdur?" De: "Allaha məxsusdur!" *Allah* Özünə rəhmli olmağı yazmışdır. *Gələcəyinə* şübhə edilməyən Qiyamət günündə sizi O toplayacaqdır. Özlərini ziyana uğradanlar iman gətirməzlər.

قُل لِّمَن مَّا فِي ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضِ ۖ قُل لِّلَّهِ ۚ
كَتَبَ عَلَىٰ نَفْسِهِ ٱلرَّحْمَةَ ۚ لَيَجْمَعَنَّكُمْ
إِلَىٰ يَوْمِ ٱلْقِيَٰمَةِ لَا رَيْبَ فِيهِ ۚ ٱلَّذِينَ خَسِرُوٓا۟
أَنفُسَهُمْ فَهُمْ لَا يُؤْمِنُونَ ١٢

13. Gecə və gündüzdə sükunət içində olanların hamısı Ona məxsusdur. O, Eşidəndir, Biləndir.

۞ وَلَهُۥ مَا سَكَنَ فِي ٱلَّيْلِ وَٱلنَّهَارِ ۚ وَهُوَ
ٱلسَّمِيعُ ٱلْعَلِيمُ ١٣

**14.** De: "Mən göyləri və yeri Yaradan Allahdan başqasınımı dost tutacağam? O, *hamını* yedirir, Özünü isə *heç kəs* yedirmir". De: "Mənə *Allaha* təslim olanların birincisi olmaq əmr edildi". Odur ki, sən müşriklərdən olma.

قُلْ أَغَيْرَ ٱللَّهِ أَتَّخِذُ وَلِيًّا فَاطِرِ
ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضِ وَهُوَ يُطْعِمُ وَلَا
يُطْعَمُ ۗ قُلْ إِنِّىٓ أُمِرْتُ أَنْ أَكُونَ أَوَّلَ مَنْ
أَسْلَمَ ۖ وَلَا تَكُونَنَّ مِنَ ٱلْمُشْرِكِينَ ١٤

**15.** De: "Əzəmətli günün əzabından qorxduğum üçün Rəbbimə asi olmaram".

قُلْ إِنِّىٓ أَخَافُ إِنْ عَصَيْتُ رَبِّى عَذَابَ يَوْمٍ
عَظِيمٍ ١٥

**16.** O gün kim bu *əzabdan* qurtularsa, *Allah* ona rəhm etmişdir. Bu, açıq-aydın uğurdur.

مَّن يُصْرَفْ عَنْهُ يَوْمَئِذٍ فَقَدْ رَحِمَهُۥ ۚ وَذَٰلِكَ
ٱلْفَوْزُ ٱلْمُبِينُ ١٦

**17.** Əgər Allah sənə bir zərər vurmaq istəsə, bunun qarşısını Ondan başqa heç kəs ala bilməz. Əgər sənə bir xeyir toxundursa, *heç kəs Ona mane ola bilməz*. O, hər şeyə qadirdir.

وَإِن يَمْسَسْكَ ٱللَّهُ بِضُرٍّ فَلَا كَاشِفَ لَهُۥٓ
إِلَّا هُوَ ۖ وَإِن يَمْسَسْكَ بِخَيْرٍ فَهُوَ عَلَىٰ
كُلِّ شَىْءٍ قَدِيرٌ ١٧

**18.** O, Öz qulları üzərində mütləq hakimiyyət sahibidir. O, Hikmətlidir, *hər şeydən* Xəbərdardır.

وَهُوَ ٱلْقَاهِرُ فَوْقَ عِبَادِهِۦ ۚ وَهُوَ
ٱلْحَكِيمُ ٱلْخَبِيرُ ١٨

**19.** De: "Kimin şahidliyi daha böyükdür?" De: "Allah mənimlə sizin aranızda Şahiddir. Bu Quran mənə vəhy olundu ki, onunla sizi və onun çatacağı hər kəsi xəbərdar edim. Məgər siz Allahla yanaşı *ibadətə layiq olan* başqa məbudların olduğuna şahidlik edirsiniz?" De: "Mən şahidlik etmirəm!" De: "O, Tək olan İlahdır. Mən sizin şərik qoşduqlarınızdan uzağam".

قُلْ أَىُّ شَىْءٍ أَكْبَرُ شَهَٰدَةً ۖ قُلِ ٱللَّهُ ۖ شَهِيدٌۢ بَيْنِى وَبَيْنَكُمْ ۚ
وَأُوحِىَ إِلَىَّ هَٰذَا ٱلْقُرْءَانُ لِأُنذِرَكُم بِهِۦ وَمَنۢ بَلَغَ ۚ أَئِنَّكُمْ
لَتَشْهَدُونَ أَنَّ مَعَ ٱللَّهِ ءَالِهَةً أُخْرَىٰ ۚ قُل لَّآ أَشْهَدُ ۚ
قُلْ إِنَّمَا هُوَ إِلَٰهٌ وَٰحِدٌ وَإِنَّنِى بَرِىٓءٌ مِّمَّا تُشْرِكُونَ ١٩

**68.** Axı sən *səbəbini* bilmədiyin bir şeyə necə səbir edə bilərsən?"

وَكَيْفَ تَصْبِرُ عَلَىٰ مَا لَمْ تُحِطْ بِهِۦ خُبْرًا ٦٨

**69.** *Musa* dedi: "İnşallah, səbirli olduğumu görəcəksən. Sənin heç bir əmrindən çıxmayacağam".

قَالَ سَتَجِدُنِىٓ إِن شَآءَ ٱللَّهُ صَابِرًا وَلَآ أَعْصِى لَكَ أَمْرًا ٦٩

**70.** *Xızır* dedi: "Əgər mənə tabe olacaqsansa, özüm sənə bir xəbər bildirməyincə məndən heç bir şey haqqında soruşma".

قَالَ فَإِنِ ٱتَّبَعْتَنِى فَلَا تَسْـَٔلْنِى عَن شَىْءٍ حَتَّىٰٓ أُحْدِثَ لَكَ مِنْهُ ذِكْرًا ٧٠

**71.** Sonra hər ikisi yola düzəlib getdilər. Nəhayət *gəlib* gəmiyə mindikləri zaman *Xızır* onu deşdi. *Musa* dedi: "Sən gəmidə olanları suya qərq etmək üçünmü onu deşdin? Doğrusu, *günahı* böyük olan bir iş gördün".

فَٱنطَلَقَا حَتَّىٰٓ إِذَا رَكِبَا فِى ٱلسَّفِينَةِ خَرَقَهَا ۖ قَالَ أَخَرَقْتَهَا لِتُغْرِقَ أَهْلَهَا لَقَدْ جِئْتَ شَيْـًٔا إِمْرًا ٧١

**72.** *Xızır* dedi: "Mən demədimmi ki, sən mənim yanımda səbir edə bilməzsən?"

قَالَ أَلَمْ أَقُلْ إِنَّكَ لَن تَسْتَطِيعَ مَعِىَ صَبْرًا ٧٢

**73.** *Musa* dedi: "Unutduğum bir şeydən ötrü məni qınama və öz işimdə məni çətinliyə salma!"

قَالَ لَا تُؤَاخِذْنِى بِمَا نَسِيتُ وَلَا تُرْهِقْنِى مِنْ أَمْرِى عُسْرًا ٧٣

**74.** Yenə yola düzəldilər. Nəhayət, bir oğlan uşağı ilə rastlaşdıqda *Xızır* onu öldürdü. *Musa* dedi: "Heç kəsi öldürməyən günahsız bir cananı qəsd etdin? Doğrusu, çox pis bir iş tutdun".

فَٱنطَلَقَا حَتَّىٰٓ إِذَا لَقِيَا غُلَٰمًا فَقَتَلَهُۥ قَالَ أَقَتَلْتَ نَفْسًا زَكِيَّةًۢ بِغَيْرِ نَفْسٍ لَّقَدْ جِئْتَ شَيْـًٔا نُّكْرًا ٧٤

**75.** Xızır dedi: "Sənə demədimmi ki, mənim yanımda səbir edə bilməzsən?"

۞ قَالَ أَلَمْ أَقُل لَّكَ إِنَّكَ لَن تَسْتَطِيعَ مَعِىَ صَبْرًا ٧٥

**76.** Musa dedi: "Əgər bundan sonra səndən bir şey barəsində soruşsam, daha mənə yoldaş olma. Sən artıq

قَالَ إِن سَأَلْتُكَ عَن شَىْءٍۭ بَعْدَهَا فَلَا تُصَٰحِبْنِى ۖ قَدْ بَلَغْتَ مِن لَّدُنِّى عُذْرًا ٧٦

mənim diləyəcəyim sonuncu üzrxahlığa çatdın".

77. Yenə yola düzəldilər. Nəhayət, bir kənd əhlinin yanına gəlib camaatdan yeməyə bir şey istədilər. Camaat onları yeməyə qonaq etmək istəmədi. Onlar orada dağılmaq istəyən bir divar gördülər. Xızır onu düzəltdi. Musa dedi: "Əgər istəsəydin, bunun müqabilində zəhmət haqqı alardın".

فَٱنطَلَقَا حَتَّىٰٓ إِذَآ أَتَيَآ أَهۡلَ قَرۡيَةٍ ٱسۡتَطۡعَمَآ
أَهۡلَهَا فَأَبَوۡاْ أَن يُضَيِّفُوهُمَا فَوَجَدَا فِيهَا
جِدَارٗا يُرِيدُ أَن يَنقَضَّ فَأَقَامَهُۥۖ قَالَ لَوۡ شِئۡتَ
لَتَّخَذۡتَ عَلَيۡهِ أَجۡرٗا ٧٧

78. Xızır dedi: "Bu, mənimlə sənin aranda ayrılıqdır. Səbir edə bilmədiyin şeylərin yozumunu sənə xəbər verəcəyəm.

قَالَ هَٰذَا فِرَاقُ بَيۡنِي وَبَيۡنِكَۚ سَأُنَبِّئُكَ
بِتَأۡوِيلِ مَا لَمۡ تَسۡتَطِع عَّلَيۡهِ صَبۡرًا ٧٨

79. Gəmiyə gəlincə, o, dənizdə çalışan kasıb adamlara məxsus idi. Mənim onu korlamağımın səbəbi, onların önündə hər bir yararlı gəmini zorla ələ keçirən hökmdarın olması idi.

أَمَّا ٱلسَّفِينَةُ فَكَانَتۡ لِمَسَٰكِينَ يَعۡمَلُونَ
فِي ٱلۡبَحۡرِ فَأَرَدتُّ أَنۡ أَعِيبَهَا وَكَانَ وَرَآءَهُم
مَّلِكٞ يَأۡخُذُ كُلَّ سَفِينَةٍ غَصۡبٗا ٧٩

80. Oğlan uşağına gəldikdə, onun ata-anası mömin idilər. Biz uşağın böyüyəndə onları azğınlığa və küfrə sürükləməsindən qorxduq.

وَأَمَّا ٱلۡغُلَٰمُ فَكَانَ أَبَوَاهُ مُؤۡمِنَيۡنِ فَخَشِينَآ أَن
يُرۡهِقَهُمَا طُغۡيَٰنٗا وَكُفۡرٗا ٨٠

81. Biz istədik ki, onların Rəbbi onun əvəzində onlara ondan daha təmiz və daha mərhəmətli olan başqa bir övlad versin.

فَأَرَدۡنَآ أَن يُبۡدِلَهُمَا رَبُّهُمَا خَيۡرٗا مِّنۡهُ زَكَوٰةٗ
وَأَقۡرَبَ رُحۡمٗا ٨١

82. Divara gəldikdə isə, o, şəhərdəki iki yetim oğlanın idi. Altında onlara məxsus bir xəzinə vardı. Onların atası əməlisaleh adam olmuşdur. Rəbbin onların həddi-buluğa çatmalarını və Rəbbindən

وَأَمَّا ٱلۡجِدَارُ فَكَانَ لِغُلَٰمَيۡنِ يَتِيمَيۡنِ فِي
ٱلۡمَدِينَةِ وَكَانَ تَحۡتَهُۥ كَنزٞ لَّهُمَا وَكَانَ أَبُوهُمَا
صَٰلِحٗا فَأَرَادَ رَبُّكَ أَن يَبۡلُغَآ أَشُدَّهُمَا
وَيَسۡتَخۡرِجَا كَنزَهُمَا رَحۡمَةٗ مِّن رَّبِّكَۚ

bir mərhəmət olaraq öz xəzinələrini tapıb çıxartmalarını istədi. Mən bunları öz ixtiyarımla etmirdim. Sənin səbir edə bilmədiyin şeylərin yozumu budur!”

وَمَا فَعَلْتُهُۥ عَنْ أَمْرِى ۚ ذَٰلِكَ تَأْوِيلُ مَا لَمْ تَسْطِع عَّلَيْهِ صَبْرًا ﴿٨٢﴾

83. Səndən Zülqərneyn barəsində soruşurlar. De: “Onun barəsində sizə bir əhvalat danışacağam”.

وَيَسْـَٔلُونَكَ عَن ذِى ٱلْقَرْنَيْنِ ۖ قُلْ سَأَتْلُوا۟ عَلَيْكُم مِّنْهُ ذِكْرًا ﴿٨٣﴾

84. Həqiqətən, Biz ona yer üzündə hökmranlıq verdik və hər şeyin yolunu ona öyrətdik.

إِنَّا مَكَّنَّا لَهُۥ فِى ٱلْأَرْضِ وَءَاتَيْنَٰهُ مِن كُلِّ شَىْءٍ سَبَبًا ﴿٨٤﴾

85. O, yer üzündə gəzib dolaşmaq üçün səfərə çıxdı.

فَأَتْبَعَ سَبَبًا ﴿٨٥﴾

86. Nəhayət, günəşin batdığı yerə gəlib çatdıqda onu qara palçıqlı bir çeşmədə batan gördü. Zülqərneyn onun yanında bir tayfaya rast gəldi. Biz buyurduq: “Ey Zülqərneyn! Sən ya onları cəzalandırmalı, ya da onlarla yaxşı rəftar etməlisən!”

حَتَّىٰٓ إِذَا بَلَغَ مَغْرِبَ ٱلشَّمْسِ وَجَدَهَا تَغْرُبُ فِى عَيْنٍ حَمِئَةٍ وَوَجَدَ عِندَهَا قَوْمًا ۗ قُلْنَا يَٰذَا ٱلْقَرْنَيْنِ إِمَّآ أَن تُعَذِّبَ وَإِمَّآ أَن تَتَّخِذَ فِيهِمْ حُسْنًا ﴿٨٦﴾

87. O dedi: “Haqsızlıq edəni cəzalandıracağıq. Sonra o, Rəbbinə qaytarılacaqdır. O da ona ağır bir əzab verəcəkdir!

قَالَ أَمَّا مَن ظَلَمَ فَسَوْفَ نُعَذِّبُهُۥ ثُمَّ يُرَدُّ إِلَىٰ رَبِّهِۦ فَيُعَذِّبُهُۥ عَذَابًا نُّكْرًا ﴿٨٧﴾

88. İman gətirib yaxşı iş görən kimsəyə isə ən gözəl mükafat veriləcəkdir. Biz ona əmrimizdən asan olanı buyuracağıq”.

وَأَمَّا مَنْ ءَامَنَ وَعَمِلَ صَٰلِحًا فَلَهُۥ جَزَآءً ٱلْحُسْنَىٰ ۖ وَسَنَقُولُ لَهُۥ مِنْ أَمْرِنَا يُسْرًا ﴿٨٨﴾

89. Sonra o, yoluna davam etdi.

ثُمَّ أَتْبَعَ سَبَبًا ﴿٨٩﴾

90. Nəhayət, günəşin doğduğu yerə çatdıqda onu elə bir qövm üzərində

حَتَّىٰٓ إِذَا بَلَغَ مَطْلِعَ ٱلشَّمْسِ وَجَدَهَا تَطْلُعُ عَلَىٰ

قَوْمٍ لَّمْ نَجْعَل لَّهُم مِّن دُونِهَا سِتْرًا ٩٠

doğan gördü ki, onlar üçün günəşə qarşı heç bir örtük yaratmamışdıq.

كَذَٰلِكَ وَقَدْ أَحَطْنَا بِمَا لَدَيْهِ خُبْرًا ٩١

91. Bax belə! Biz onun başına gələnlərin hamısından xəbərdarıq.

ثُمَّ أَتْبَعَ سَبَبًا ٩٢

92. Sonra o, yenə yoluna davam etdi.

حَتَّىٰٓ إِذَا بَلَغَ بَيْنَ ٱلسَّدَّيْنِ وَجَدَ مِن دُونِهِمَا قَوْمًا
لَّا يَكَادُونَ يَفْقَهُونَ قَوْلًا ٩٣

93. Nəhayət, iki dağ arasına gəlib çatdıqda onların ön tərəfində az qala söz anlamayan bir tayfaya rast gəldi.

قَالُوا۟ يَٰذَا ٱلْقَرْنَيْنِ إِنَّ يَأْجُوجَ وَمَأْجُوجَ
مُفْسِدُونَ فِى ٱلْأَرْضِ فَهَلْ نَجْعَلُ لَكَ خَرْجًا
عَلَىٰٓ أَن تَجْعَلَ بَيْنَنَا وَبَيْنَهُمْ سَدًّا ٩٤

94. Onlar dedilər: “Ey Zülqərneyn! Yəcuc və Məcuc tayfaları yer üzündə fitnə-fəsad törədirlər. Bəlkə biz sənə xərac verək, sən də bizimlə onların arasında bir sədd düzəldəsən?”

قَالَ مَا مَكَّنِّى فِيهِ رَبِّى خَيْرٌ فَأَعِينُونِى بِقُوَّةٍ
أَجْعَلْ بَيْنَكُمْ وَبَيْنَهُمْ رَدْمًا ٩٥

95. O dedi: “Rəbbimin mənə əta etdiyi mülk daha yaxşıdır. Gəlin öz qüvvənizlə mənə kömək edin, mən də sizinlə onların arasında möhkəm bir sədd çəkim.

ءَاتُونِى زُبَرَ ٱلْحَدِيدِ ۖ حَتَّىٰٓ إِذَا سَاوَىٰ بَيْنَ ٱلصَّدَفَيْنِ
قَالَ ٱنفُخُوا۟ ۖ حَتَّىٰٓ إِذَا جَعَلَهُۥ نَارًا قَالَ ءَاتُونِىٓ أُفْرِغْ
عَلَيْهِ قِطْرًا ٩٦

96. Mənə dəmir parçaları gətirin!” Nəhayət, dağın iki yamacı arasını dəmir parçaları ilə doldurduqda: “Körükləyin!”– dedi. Dəmir közərən kimi: “Gətirin mənə, onun üstünə ərimiş mis töküm!”– dedi.

فَمَا ٱسْطَٰعُوٓا۟ أَن يَظْهَرُوهُ وَمَا ٱسْتَطَٰعُوا۟ لَهُۥ
نَقْبًا ٩٧

97. Yəcuc və Məcuc tayfaları nə səddin üstünə çıxa bildilər, nə də onu dəlib keçə bildilər.

قَالَ هَٰذَا رَحْمَةٌ مِّن رَّبِّى ۖ فَإِذَا جَآءَ وَعْدُ رَبِّى جَعَلَهُۥ
دَكَّآءَ ۖ وَكَانَ وَعْدُ رَبِّى حَقًّا ٩٨

98. Zülqərneyn dedi: “Bu, Rəbbimdən olan bir mərhəmətdir. Rəbbimin vədi gəldikdə isə onu yerlə yeksan edəcəkdir. Rəbbimin vədi həqiqətdir”.

99. O gün Yəcuc və Məcuc tayfalarını axışıb bir-birinə qarışmış halda buraxarıq. Sur üfürülən kimi məxluqatın hamısını bir yerə toplayarıq.

وَتَرَكۡنَا بَعۡضَهُمۡ يَوۡمَئِذٖ يَمُوجُ فِي بَعۡضٖۖ وَنُفِخَ
فِي ٱلصُّورِ فَجَمَعۡنَٰهُمۡ جَمۡعٗا ٩٩

100. O gün Biz Cəhənnəmi kafirlərə aşkar göstərərik.

وَعَرَضۡنَا جَهَنَّمَ يَوۡمَئِذٖ لِّلۡكَٰفِرِينَ عَرۡضًا ١٠٠

101. O kəslərə ki, gözləri Məni anmaqdan qapali idi, (ayələrimdən üz döndərərdilər) özləri də eşidə bilmirdilər.

ٱلَّذِينَ كَانَتۡ أَعۡيُنُهُمۡ فِي غِطَآءٍ عَن ذِكۡرِي وَكَانُواْ
لَا يَسۡتَطِيعُونَ سَمۡعًا ١٠١

102. Olmaya, kafirlər Məni qoyub qullarımı özlərinə dost tutacaqlarını güman edirdilər? Həqiqətən, Biz Cəhənnəmi kafirlər üçün mənzil hazırlamışıq.

أَفَحَسِبَ ٱلَّذِينَ كَفَرُوٓاْ أَن يَتَّخِذُواْ عِبَادِي مِن
دُونِيٓ أَوۡلِيَآءَۚ إِنَّآ أَعۡتَدۡنَا جَهَنَّمَ لِلۡكَٰفِرِينَ
نُزُلٗا ١٠٢

103. De: “Sizə əməlləri baxımından ən çox ziyana uğrayanlar barəsində xəbər verimmi?

قُلۡ هَلۡ نُنَبِّئُكُم بِٱلۡأَخۡسَرِينَ أَعۡمَٰلًا ١٠٣

104. O kəslər haqqında ki, onların dünya həyatındakı səyləri boşa çıxmışdır. Çünki onlar özlüyündə yaxşı işlər gördükləri gümanında idilər.

ٱلَّذِينَ ضَلَّ سَعۡيُهُمۡ فِي ٱلۡحَيَوٰةِ ٱلدُّنۡيَا وَهُمۡ يَحۡسَبُونَ
أَنَّهُمۡ يُحۡسِنُونَ صُنۡعًا ١٠٤

105. Onlar Rəbbinin ayələrini və Onunla qarşılaşacaqlarını inkar edən, buna görə də bütün əməlləri boşa çıxan kimsələrdir. Odur ki, Qiyamət günü Biz onlara heç bir çəki qoymayacağıq” (əməlləri boşa çixdığından tərəzidə çəkilməyə neç bir şeyləri olmayacaq.)

أُوْلَٰٓئِكَ ٱلَّذِينَ كَفَرُواْ بِـَٔايَٰتِ رَبِّهِمۡ وَلِقَآئِهِۦ
فَحَبِطَتۡ أَعۡمَٰلُهُمۡ فَلَا نُقِيمُ لَهُمۡ يَوۡمَ ٱلۡقِيَٰمَةِ
وَزۡنٗا ١٠٥

106. Kafir olduqlarına, ayələrimi və elçilərimi lağlağıya qoyduqlarına görə onların cəzası Cəhənnəmdir.

ذَٰلِكَ جَزَآؤُهُمۡ جَهَنَّمُ بِمَا كَفَرُواْ وَٱتَّخَذُوٓاْ ءَايَٰتِي
وَرُسُلِي هُزُوًا ١٠٦

107. İman gətirib saleh əməllər işləyənlərin məskəni isə Firdovs bağları olacaqdır.

إِنَّ ٱلَّذِينَ ءَامَنُوا۟ وَعَمِلُوا۟ ٱلصَّـٰلِحَـٰتِ كَانَتْ لَهُمْ
جَنَّـٰتُ ٱلْفِرْدَوْسِ نُزُلًا ١٠٧

108. Onlar orada əbədi qalacaq, oranı başqa bir yerə dəyişmək istəməyəcəklər.

خَـٰلِدِينَ فِيهَا لَا يَبْغُونَ عَنْهَا حِوَلًا ١٠٨

109. De: "Əgər Rəbbimin Sözlərini yazmaq üçün dəniz mürəkkəb olsaydı və bir o qədər də ona əlavə etsəydik belə, Rəbbimin Sözləri qurtarmadan öncə dənizin suyu qurtarardı".

قُل لَّوْ كَانَ ٱلْبَحْرُ مِدَادًا لِّكَلِمَـٰتِ رَبِّى لَنَفِدَ ٱلْبَحْرُ
قَبْلَ أَن تَنفَدَ كَلِمَـٰتُ رَبِّى وَلَوْ جِئْنَا بِمِثْلِهِۦ مَدَدًا ١٠٩

110. De: "Mən də sizin kimi bir insanam. Mənə vəhy olunur ki, sizin məbudunuz Tək olan İlahdır. Kim Rəbbi ilə qarşılaşacağına ümid bəsləyirsə, yaxşı işlər görsün və yerinə yetirdiyi ibadətlərində Rəbbinə heç kəsi şərik qoşmasın!"

قُلْ إِنَّمَآ أَنَا۠ بَشَرٌ مِّثْلُكُمْ يُوحَىٰٓ إِلَىَّ أَنَّمَآ إِلَـٰهُكُمْ إِلَـٰهٌ
وَٰحِدٌ ۖ فَمَن كَانَ يَرْجُوا۟ لِقَآءَ رَبِّهِۦ فَلْيَعْمَلْ
عَمَلًا صَـٰلِحًا وَلَا يُشْرِكْ بِعِبَادَةِ رَبِّهِۦٓ أَحَدًۢا ١١٠



## Məryəm surəsi

## سُورَةُ مَرۡيَمَ

*Mərhəmətli və Rəhmli*
*Allahın adı ilə!*

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

1. Kəf. Hə. Yə. Ayn. Sad.

كٓهيعٓصٓ ﴿١﴾

2. *Bu* sənin Rəbbinin Öz qulu Zəkəriyyaya *göstərdiyi* mərhəmətinin yada salınmasıdır.

ذِكۡرُ رَحۡمَتِ رَبِّكَ عَبۡدَهُۥ زَكَرِيَّآ ﴿٢﴾

3. Bir zaman *Zəkəriyya* Rəbbinə gizlicə dua edib

إِذۡ نَادَىٰ رَبَّهُۥ نِدَآءً خَفِيّٗا ﴿٣﴾

4. demişdi: “Ey Rəbbim! Artıq sümüklərim zəifləmiş, başım da ağappaq ağarmışdır. Ey Rəbbim! Sənə etdiyim dua sayəsində *heç vaxt* bədbəxt olmamışam.

قَالَ رَبِّ إِنِّي وَهَنَ ٱلۡعَظۡمُ مِنِّي وَٱشۡتَعَلَ
ٱلرَّأۡسُ شَيۡبٗا وَلَمۡ أَكُنۢ بِدُعَآئِكَ رَبِّ
شَقِيّٗا ﴿٤﴾

5. Mən özümdən sonra gələn qohumlarımdan *dinə etinasız yanaşacaqlarından* qorxuram. Zövcəm də sonsuzdur. Mənə Öz tərəfindən elə bir övlad bəxş et ki,

وَإِنِّي خِفۡتُ ٱلۡمَوَٰلِيَ مِن وَرَآءِي
وَكَانَتِ ٱمۡرَأَتِي عَاقِرٗا فَهَبۡ لِي مِن
لَّدُنكَ وَلِيّٗا ﴿٥﴾

6. o həm mənə, həm də Yaqub nəslinə varis olsun. Ey Rəbbim! Elə et ki, o *Sənin* razılığını qazanmış olsun!”

يَرِثُنِي وَيَرِثُ مِنۡ ءَالِ يَعۡقُوبَۖ وَٱجۡعَلۡهُ
رَبِّ رَضِيّٗا ﴿٦﴾

7. *Ona belə vəhy olundu*: “Ey Zəkəriyya! Səni Yəhya adlı bir oğulla müjdələyirik. Biz bu adı *ondan* öncə kimsəyə qoymamışıq!”

يَٰزَكَرِيَّآ إِنَّا نُبَشِّرُكَ بِغُلَٰمٍ ٱسۡمُهُۥ
يَحۡيَىٰ لَمۡ نَجۡعَل لَّهُۥ مِن قَبۡلُ سَمِيّٗا ﴿٧﴾

8. O dedi: “Ey Rəbbim! Zövcəm sonsuz bir qadın ikən, özüm də qocalığın son həddində olduğum halda necə mənim övladım ola bilər?”

قَالَ رَبِّ أَنَّىٰ يَكُونُ لِي غُلَٰمٞ وَكَانَتِ
ٱمۡرَأَتِي عَاقِرٗا وَقَدۡ بَلَغۡتُ مِنَ ٱلۡكِبَرِ
عِتِيّٗا ﴿٨﴾

9. *Mələk* dedi: «Bu, belədir, lakin Rəbbin buyurdu: "Bu Mənim üçün asandır. Axı əvvəlcə sənin özünü də sən heç bir şey deyilkən xəlq etmişdim!"»

قَالَ كَذَٰلِكَ قَالَ رَبُّكَ هُوَ عَلَيَّ هَيِّنٌ
وَقَدْ خَلَقْتُكَ مِن قَبْلُ وَلَمْ تَكُ شَيْـًٔا ٩

10. O dedi: "Ey Rəbbim! Mənim üçün bir əlamət müəyyən et". *Allah* buyurdu: "Əlamətin budur ki, sən sağlam ikən üç gecə adamlarla danışmayacaqsan!"

قَالَ رَبِّ ٱجْعَل لِّيٓ ءَايَةً ۚ قَالَ ءَايَتُكَ
أَلَّا تُكَلِّمَ ٱلنَّاسَ ثَلَٰثَ لَيَالٍ سَوِيًّا ١٠

11. O, mehrabdan öz qövmünün qarşısına çıxıb onlara işarə ilə başa saldı ki: "Səhər-axşam *Allaha* tariflər deyin!"

فَخَرَجَ عَلَىٰ قَوْمِهِۦ مِنَ ٱلْمِحْرَابِ فَأَوْحَىٰٓ
إِلَيْهِمْ أَن سَبِّحُوا۟ بُكْرَةً وَعَشِيًّا ١١

12. *Yəhyaya da*: "Ey Yəhya! Kitabdan möhkəm yapış!"– *deyə vəhy etdik.* Biz ona uşaq ikən hikmət bəxş etdik.

يَٰيَحْيَىٰ خُذِ ٱلْكِتَٰبَ بِقُوَّةٍ ۖ وَءَاتَيْنَٰهُ
ٱلْحُكْمَ صَبِيًّا ١٢

13. Üstəlik Öz tərəfimizdən bir şəfqət və paklıq da *bəxş etdik*. O, müttəqi idi.

وَحَنَانًا مِّن لَّدُنَّا وَزَكَوٰةً ۖ وَكَانَ تَقِيًّا ١٣

14. Həm də ata-anasına qarşı qayğıkeş *idi*; lovğa və asi deyildi.

وَبَرًّۢا بِوَٰلِدَيْهِ وَلَمْ يَكُن جَبَّارًا عَصِيًّا ١٤

15. Doğulduğu gün də, öləcəyi gün də, yenidən diriIdiləcəyi gün də ona salam olsun!

وَسَلَٰمٌ عَلَيْهِ يَوْمَ وُلِدَ وَيَوْمَ يَمُوتُ وَيَوْمَ
يُبْعَثُ حَيًّا ١٥

16. Kitabda Məryəmi də yada sal. O zaman o, ailəsindən *ayrılıb* şərq tərəfdə olan bir yerə çəkilmiş

وَٱذْكُرْ فِى ٱلْكِتَٰبِ مَرْيَمَ إِذِ ٱنتَبَذَتْ مِنْ
أَهْلِهَا مَكَانًا شَرْقِيًّا ١٦

17. və *ibadət vaxtı* onlardan *gizlənmək üçün* pərdə tutmuşdu. Biz Öz Ruhumuz *Cəbraili* onun yanına göndərdik. O, Məryəmin qarşısında kamil bir insan surətində peyda oldu.

فَٱتَّخَذَتْ مِن دُونِهِمْ حِجَابًا فَأَرْسَلْنَآ إِلَيْهَا
رُوحَنَا فَتَمَثَّلَ لَهَا بَشَرًا سَوِيًّا ١٧

**18.** *Məryəm* dedi: “Mən səndən Mərhəmətli *Allaha* sığınıram! Əgər müttəqisənsə, *mənə toxunma*”.

قَالَتْ إِنِّيٓ أَعُوذُ بِٱلرَّحْمَٰنِ مِنكَ إِن كُنتَ
تَقِيًّا ١٨

**19.** *Mələk* dedi: “Mən sənə ancaq pak bir oğlan bəxş etmək üçün Rəbbinin elçisiyəm”.

قَالَ إِنَّمَآ أَنَا۠ رَسُولُ رَبِّكِ لِأَهَبَ لَكِ غُلَٰمًا
زَكِيًّا ١٩

**20.** *Məryəm* dedi: “Mənə bir insan toxunmadığı və özüm də zinakar olmadığım halda, necə mənim övladım ola bilər?”

قَالَتْ أَنَّىٰ يَكُونُ لِي غُلَٰمٌ وَلَمْ يَمْسَسْنِي
بَشَرٌ وَلَمْ أَكُ بَغِيًّا ٢٠

**21.** *Mələk* dedi: «Bu belədir, lakin Rəbbin buyurdu: “Bu, Mənim üçün asandır. Biz onu insanlar üçün bir möcüzə və Öz tərəfimizdən bir mərhəmət edəcəyik. *Bu*, hökmü verilmiş bir işdir”».

قَالَ كَذَٰلِكِ قَالَ رَبُّكِ هُوَ عَلَيَّ هَيِّنٌ
وَلِنَجْعَلَهُۥٓ ءَايَةً لِّلنَّاسِ وَرَحْمَةً مِّنَّا
وَكَانَ أَمْرًا مَّقْضِيًّا ٢١

**22.** *Məryəm* uşağa qaldı və bətnindəki ilə birlikdə gedib uzaq bir yerə çəkildi.

۞ فَحَمَلَتْهُ فَٱنتَبَذَتْ بِهِۦ مَكَانًا قَصِيًّا ٢٢

**23.** Doğuş sancıları onu bir xurma ağacının gövdəsinə söykənməyə vadar etdi. O dedi: “Kaş bundan əvvəl öləydim və bir dəfəlik unudulaydım!”

فَأَجَآءَهَا ٱلْمَخَاضُ إِلَىٰ جِذْعِ ٱلنَّخْلَةِ
قَالَتْ يَٰلَيْتَنِي مِتُّ قَبْلَ هَٰذَا وَكُنتُ
نَسْيًا مَّنسِيًّا ٢٣

**24.** *Məryəmin* aşağı tərəfindən (İsa və ya Cəbrail) onu səsləyib dedi: “Qəm yemə, Rəbbin sənin *ayağının* altından bir bulaq axıtdı.

فَنَادَىٰهَا مِن تَحْتِهَآ أَلَّا تَحْزَنِي قَدْ جَعَلَ رَبُّكِ
تَحْتَكِ سَرِيًّا ٢٤

**25.** Xurma ağacının gövdəsini özünə tərəf silkələ ki, üstünə yetişmiş, təzə xurma tökülsün.

وَهُزِّيٓ إِلَيْكِ بِجِذْعِ ٱلنَّخْلَةِ تُسَٰقِطْ عَلَيْكِ
رُطَبًا جَنِيًّا ٢٥

**26.** Ye, iç, gözün aydın olsun! Əgər insanlardan kimisə görsən, de: “Mən Mərhəmətli *Allaha* oruc tutmağı

فَكُلِي وَٱشْرَبِي وَقَرِّي عَيْنًا فَإِمَّا تَرَيِنَّ مِنَ
ٱلْبَشَرِ أَحَدًا فَقُولِيٓ إِنِّي نَذَرْتُ لِلرَّحْمَٰنِ

nəzir etmişəm. Odur ki, bu gün heç kimlə danışmayacağam"».

صَوْمًا فَلَنْ أُكَلِّمَ ٱلْيَوْمَ إِنسِيًّا ٢٦

27. *Məryəm* körpəni qucağına alıb öz tayfasının yanına gətirdi. Onlar dedilər: "Ey Məryəm! Sən yaramaz (və ya görünməmiş) bir iş tutdun.

فَأَتَتْ بِهِۦ قَوْمَهَا تَحْمِلُهُۥ قَالُوا۟ يَٰمَرْيَمُ لَقَدْ جِئْتِ شَيْـًٔا فَرِيًّا ٢٧

28. Ey Harunun bacısı! Atan pis kişi, anan da pozğun deyildi".

يَٰٓأُخْتَ هَٰرُونَ مَا كَانَ أَبُوكِ ٱمْرَأَ سَوْءٍ وَمَا كَانَتْ أُمُّكِ بَغِيًّا ٢٨

29. *Məryəm* ona işarə etdi. Onlar dedilər: "Beşikdə olan körpə ilə necə danışaq?"

فَأَشَارَتْ إِلَيْهِ قَالُوا۟ كَيْفَ نُكَلِّمُ مَن كَانَ فِى ٱلْمَهْدِ صَبِيًّا ٢٩

30. *Körpə dil açıb* dedi: "Həqiqətən də, mən Allahın quluyam! O mənə Kitab verdi və məni peyğəmbər etdi.

قَالَ إِنِّى عَبْدُ ٱللَّهِ ءَاتَىٰنِىَ ٱلْكِتَٰبَ وَجَعَلَنِى نَبِيًّا ٣٠

31. Harada oluramsa olum, məni mübarək etdi və nə qədər ki sağam, mənə namaz qılıb zəkat verməyi əmr etdi.

وَجَعَلَنِى مُبَارَكًا أَيْنَ مَا كُنتُ وَأَوْصَٰنِى بِٱلصَّلَوٰةِ وَٱلزَّكَوٰةِ مَا دُمْتُ حَيًّا ٣١

32. Həm də *məni* anama qarşı qayğıkeş *etdi*; məni lovğa və bədbəxt etmədi.

وَبَرًّۢا بِوَٰلِدَتِى وَلَمْ يَجْعَلْنِى جَبَّارًا شَقِيًّا ٣٢

33. Doğulduğum gün də, öləcəyim gün də, yenidən dirildiləcəyim gün də mənə salam olsun!"

وَٱلسَّلَٰمُ عَلَىَّ يَوْمَ وُلِدتُّ وَيَوْمَ أَمُوتُ وَيَوْمَ أُبْعَثُ حَيًّا ٣٣

34. Barəsində şübhəyə düşdükləri haqq söz olan Məryəm oğlu İsa budur!

ذَٰلِكَ عِيسَى ٱبْنُ مَرْيَمَ قَوْلَ ٱلْحَقِّ ٱلَّذِى فِيهِ يَمْتَرُونَ ٣٤

35. Allaha övlad götürmək yaraşmaz. O, pak və müqəddəsdir! O, bir işin olmasını istədikdə ona ancaq "Ol!"– deyər, o da dərhal olar.

مَا كَانَ لِلَّهِ أَن يَتَّخِذَ مِن وَلَدٍ سُبْحَٰنَهُۥٓ إِذَا قَضَىٰٓ أَمْرًا فَإِنَّمَا يَقُولُ لَهُۥ كُن فَيَكُونُ ٣٥

36. *İsa dedi*: “Həqiqətən, Allah həm mənim Rəbbim, həm də sizin Rəbbinizdir. Elə isə yalnız Ona ibadət edin! Düz yol da budur”.

وَإِنَّ ٱللَّهَ رَبِّي وَرَبُّكُمۡ فَٱعۡبُدُوهُۚ هَٰذَا صِرَٰطٞ
مُّسۡتَقِيمٞ ٣٦

37. Sonra firqələrin arasında ziddiyyət düşdü. Böyük günü görəcək kafirlərin vay halına!

فَٱخۡتَلَفَ ٱلۡأَحۡزَابُ مِنۢ بَيۡنِهِمۡۖ فَوَيۡلٞ لِّلَّذِينَ
كَفَرُواْ مِن مَّشۡهَدِ يَوۡمٍ عَظِيمٍ ٣٧

38. Onlar Bizim hüzurumuza gələcəkləri gün necə yaxşı eşidəcək, necə də yaxşı görəcəklər! Lakin zalımlar bu gün açıq-aydın azğınlıq içindədirlər.

أَسۡمِعۡ بِهِمۡ وَأَبۡصِرۡ يَوۡمَ يَأۡتُونَنَاۖ لَٰكِنِ ٱلظَّٰلِمُونَ
ٱلۡيَوۡمَ فِي ضَلَٰلٖ مُّبِينٖ ٣٨

39. Sən onları işin bitmiş olacağı peşmançılıq günü ilə qorxut! İndi onlar hələ qəflətdədirlər və iman gətirmirlər.

وَأَنذِرۡهُمۡ يَوۡمَ ٱلۡحَسۡرَةِ إِذۡ قُضِيَ ٱلۡأَمۡرُ وَهُمۡ فِي
غَفۡلَةٖ وَهُمۡ لَا يُؤۡمِنُونَ ٣٩

40. Şübhəsiz ki, yerə və onun üstündə qalanlara təkcə biz sahib çıxacağıq. Onların qayıdışı Bizə olacaqdır.

إِنَّا نَحۡنُ نَرِثُ ٱلۡأَرۡضَ وَمَنۡ عَلَيۡهَا وَإِلَيۡنَا
يُرۡجَعُونَ ٤٠

41. Kitabda İbrahimi də xatırla! Həqiqətən, o, sadiq insan və peyğəmbər idi.

وَٱذۡكُرۡ فِي ٱلۡكِتَٰبِ إِبۡرَٰهِيمَۚ إِنَّهُۥ كَانَ صِدِّيقٗا
نَّبِيًّا ٤١

42. Bir zaman o, atasına demişdi: “Atacan! Nə üçün eşitməyən, görməyən və sənə heç bir faydası olmayan bir şeyə sitayiş edirsən?

إِذۡ قَالَ لِأَبِيهِ يَٰٓأَبَتِ لِمَ تَعۡبُدُ مَا لَا يَسۡمَعُ
وَلَا يُبۡصِرُ وَلَا يُغۡنِي عَنكَ شَيۡـٔٗا ٤٢

43. Atacan! Həqiqətən, sənə gəlməyən bir elm mənə gəlmişdir. Arxamca gəl ki, səni doğru yola yönəldim.

يَٰٓأَبَتِ إِنِّي قَدۡ جَآءَنِي مِنَ ٱلۡعِلۡمِ مَا لَمۡ يَأۡتِكَ
فَٱتَّبِعۡنِيٓ أَهۡدِكَ صِرَٰطٗا سَوِيّٗا ٤٣

44. Atacan! Şeytana ibadət etmə! Həqiqətən, şeytan Mərhəmətli *Allaha* çox asi oldu.

يَٰٓأَبَتِ لَا تَعۡبُدِ ٱلشَّيۡطَٰنَۖ إِنَّ ٱلشَّيۡطَٰنَ كَانَ
لِلرَّحۡمَٰنِ عَصِيّٗا ٤٤

45. Atacan! Qorxuram ki, Mərhəmətli *Allahdan* sənə bir əzab toxunsun və beləcə, şeytana yoldaş olasan".

يَٰٓأَبَتِ إِنِّيٓ أَخَافُ أَن يَمَسَّكَ عَذَابٞ مِّنَ
ٱلرَّحۡمَٰنِ فَتَكُونَ لِلشَّيۡطَٰنِ وَلِيّٗا ٤٥

46. *Atası* dedi: "Sən mənim məbudlarımdan üzmü çevirirsən, ey İbrahim!? Əgər *buna* son qoymasan, səni mütləq daşqalaq edəcəyəm. Uzun müddət məndən uzaq ol!"

قَالَ أَرَاغِبٌ أَنتَ عَنۡ ءَالِهَتِي يَٰٓإِبۡرَٰهِيمُۖ
لَئِن لَّمۡ تَنتَهِ لَأَرۡجُمَنَّكَۖ وَٱهۡجُرۡنِي مَلِيّٗا ٤٦

47. *İbrahim* dedi: "Sənə salam olsun! Mən Rəbbimdən sənin üçün bağışlanma diləyəcəyəm. Həqiqətən, O mənə qarşı çox lütfkardır.

قَالَ سَلَٰمٌ عَلَيۡكَۖ سَأَسۡتَغۡفِرُ لَكَ رَبِّيٓۖ إِنَّهُۥ
كَانَ بِي حَفِيّٗا ٤٧

48. Mən sizi və Allahdan başqa ibadət etdiklərinizi tərk edir və öz Rəbbimə dua edirəm. Ola bilsin ki, mən Rəbbimə dua etməklə heç vaxt bədbəxt olmayım".

وَأَعۡتَزِلُكُمۡ وَمَا تَدۡعُونَ مِن دُونِ ٱللَّهِ وَأَدۡعُواْ
رَبِّي عَسَىٰٓ أَلَّآ أَكُونَ بِدُعَآءِ رَبِّي شَقِيّٗا ٤٨

49. İbrahim onları və onların Allahdan başqa yalvardıqlarını tərk etdiyi zaman Biz ona İshaqı və Yaqubu bəxş etdik. Biz onların hər ikisini peyğəmbər etdik.

فَلَمَّا ٱعۡتَزَلَهُمۡ وَمَا يَعۡبُدُونَ مِن دُونِ ٱللَّهِ وَهَبۡنَا
لَهُۥٓ إِسۡحَٰقَ وَيَعۡقُوبَۖ وَكُلّٗا جَعَلۡنَا نَبِيّٗا ٤٩

50. Biz onlara öz mərhəmətimizdən əta etdik və *gələcək nəsillər həmişə yada salsın deyə* onlara yaxşı ad qismət elədik.

وَوَهَبۡنَا لَهُم مِّن رَّحۡمَتِنَا وَجَعَلۡنَا لَهُمۡ لِسَانَ
صِدۡقٍ عَلِيّٗا ٥٠

51. Kitabda Musanı da xatırla! Həqiqətən o, seçilmiş bir elçi və peyğəmbər idi.

وَٱذۡكُرۡ فِي ٱلۡكِتَٰبِ مُوسَىٰٓۚ إِنَّهُۥ كَانَ مُخۡلَصٗا
وَكَانَ رَسُولٗا نَّبِيّٗا ٥١

52. Biz *Musanı* Turun (dağın) sağ tərəfindən çağırdıq və *onunla* danışıb onu *özümüzə* yaxın etdik.

وَنَٰدَيۡنَٰهُ مِن جَانِبِ ٱلطُّورِ ٱلۡأَيۡمَنِ وَقَرَّبۡنَٰهُ
نَجِيّٗا ٥٢

53. Biz Öz mərhəmətimizdən ona qardaşı Harunu da bir peyğəmbər olaraq bəxş etdik.

وَوَهَبْنَا لَهُۥ مِن رَّحْمَتِنَآ أَخَاهُ هَٰرُونَ نَبِيًّا ٥٣

54. Kitabda İsmaili də xatırla! Həqiqətən, o öz vədinə sadiq idi. O, bir elçi və peyğəmbər idi.

وَٱذْكُرْ فِى ٱلْكِتَٰبِ إِسْمَٰعِيلَ إِنَّهُۥ كَانَ صَادِقَ ٱلْوَعْدِ وَكَانَ رَسُولًا نَّبِيًّا ٥٤

55. O öz ümmətinə namaz qılmağı, zəkat verməyi əmr edirdi. O, Rəbbinin rizasını qazanmışdı.

وَكَانَ يَأْمُرُ أَهْلَهُۥ بِٱلصَّلَوٰةِ وَٱلزَّكَوٰةِ وَكَانَ عِندَ رَبِّهِۦ مَرْضِيًّا ٥٥

56. Kitabda İdrisi də xatırla! Həqiqətən, o, düz danışan adam və bir peyğəmbər idi.

وَٱذْكُرْ فِى ٱلْكِتَٰبِ إِدْرِيسَ إِنَّهُۥ كَانَ صِدِّيقًا نَّبِيًّا ٥٦

57. Biz onu yüksək bir məqama ucaltdıq.

وَرَفَعْنَٰهُ مَكَانًا عَلِيًّا ٥٧

58. Onlar Allahın nemət bəxş etdiyi peyğəmbərlərdən, Adəmin və Nuhla birlikdə *gəmidə* daşıdığımız kimsələrin nəslindən, İbrahimin və İsrailin nəslindən seçib haqq yola yönəltdiyimiz kimsələrdəndir. Onlar özlərinə Mərhəmətli *Allahın* ayələri oxunduğu zaman səcdəyə qapanıb ağlayanlardır.

أُو۟لَٰٓئِكَ ٱلَّذِينَ أَنْعَمَ ٱللَّهُ عَلَيْهِم مِّنَ ٱلنَّبِيِّـۧنَ مِن ذُرِّيَّةِ ءَادَمَ وَمِمَّنْ حَمَلْنَا مَعَ نُوحٍ وَمِن ذُرِّيَّةِ إِبْرَٰهِيمَ وَإِسْرَٰٓءِيلَ وَمِمَّنْ هَدَيْنَا وَٱجْتَبَيْنَآ إِذَا تُتْلَىٰ عَلَيْهِمْ ءَايَٰتُ ٱلرَّحْمَٰنِ خَرُّوا۟ سُجَّدًا وَبُكِيًّا ۩ ٥٨

59. Onların arxasınca namazı buraxıb şəhvətə uyan bir nəsil gəldi. Onlar ziyana uğrayacaqlar.

۞ فَخَلَفَ مِنۢ بَعْدِهِمْ خَلْفٌ أَضَاعُوا۟ ٱلصَّلَوٰةَ وَٱتَّبَعُوا۟ ٱلشَّهَوَٰتِ فَسَوْفَ يَلْقَوْنَ غَيًّا ٥٩

60. Ancaq *Allaha* tövbə edib iman gətirənlər və saleh əməllər görənlərdən başqa! Onlar Cənnətə daxil olacaq və heç bir haqsızlığa məruz qalmayacaqlar.

إِلَّا مَن تَابَ وَءَامَنَ وَعَمِلَ صَٰلِحًا فَأُو۟لَٰٓئِكَ يَدْخُلُونَ ٱلْجَنَّةَ وَلَا يُظْلَمُونَ شَيْـًٔا ٦٠

61. *Bu Cənnət* Mərhəmətli *Allahın* Öz qullarına vəd etdiyi və onların görmədikləri Ədn bağlarıdır. Onun vədi mütləq yerinə yetəcəkdir.

جَنَّٰتِ عَدۡنٍ ٱلَّتِي وَعَدَ ٱلرَّحۡمَٰنُ عِبَادَهُۥ
بِٱلۡغَيۡبِۚ إِنَّهُۥ كَانَ وَعۡدُهُۥ مَأۡتِيّٗا ٦١

62. Onlar orada boş sözlər deyil, ancaq: “Salam!” eşidəcəklər. Orada səhər-axşam onların ruzisi olacaqdır.

لَّا يَسۡمَعُونَ فِيهَا لَغۡوًا إِلَّا سَلَٰمٗاۖ وَلَهُمۡ
رِزۡقُهُمۡ فِيهَا بُكۡرَةٗ وَعَشِيّٗا ٦٢

63. Qullarımızdan olan müttəqilər üçün miras edəcəyimiz Cənnət budur.

تِلۡكَ ٱلۡجَنَّةُ ٱلَّتِي نُورِثُ مِنۡ عِبَادِنَا مَن كَانَ
تَقِيّٗا ٦٣

64. *Mələklər dedi*: “Biz *dünyaya* ancaq sənin Rəbbinin əmri ilə enirik. Önümüzdə, arxamızda və onların arasında nə varsa, Ona məxsusdur. Rəbbin unudan deyildir”.

وَمَا نَتَنَزَّلُ إِلَّا بِأَمۡرِ رَبِّكَۖ لَهُۥ مَا بَيۡنَ أَيۡدِينَا
وَمَا خَلۡفَنَا وَمَا بَيۡنَ ذَٰلِكَۚ وَمَا كَانَ رَبُّكَ نَسِيّٗا ٦٤

65. O, göylərin, yerin və onların arasında olanların Rəbbidir! Elə isə yalnız Ona ibadət et və Ona ibadətdə səbirli ol! Heç Ona oxşarını tanıyırsanmı?!

رَّبُّ ٱلسَّمَٰوَٰتِ وَٱلۡأَرۡضِ وَمَا بَيۡنَهُمَا فَٱعۡبُدۡهُ
وَٱصۡطَبِرۡ لِعِبَٰدَتِهِۦۚ هَلۡ تَعۡلَمُ لَهُۥ سَمِيّٗا ٦٥

66. İnsan soruşar: “Doğrudanmı mən öldükdən sonra *qəbirdən* diri çıxardılacağam?”

وَيَقُولُ ٱلۡإِنسَٰنُ أَءِذَا مَا مِتُّ لَسَوۡفَ أُخۡرَجُ
حَيًّا ٦٦

67. Məgər insan ilk əvvəl onu heç bir şey deyilkən yaratdığımızı xatırlamırmı?

أَوَلَا يَذۡكُرُ ٱلۡإِنسَٰنُ أَنَّا خَلَقۡنَٰهُ مِن قَبۡلُ
وَلَمۡ يَكُ شَيۡـٔٗا ٦٧

68. Rəbbinə and olsun ki, Biz onları şeytanlarla birlikdə bir yerə toplayacaq, sonra da onları diz üstə çökmüş halda Cəhənnəmin ətrafına yerləşdirəcəyik.

فَوَرَبِّكَ لَنَحۡشُرَنَّهُمۡ وَٱلشَّيَٰطِينَ ثُمَّ
لَنُحۡضِرَنَّهُمۡ حَوۡلَ جَهَنَّمَ جِثِيّٗا ٦٨

69. Sonra hər firqədən Mərhəmətli *Allaha* ən çox asi olanı çıxardacağıq.

ثُمَّ لَنَنزِعَنَّ مِن كُلِّ شِيعَةٍ أَيُّهُمۡ أَشَدُّ عَلَى
ٱلرَّحۡمَٰنِ عِتِيّٗا ٦٩

70. Orada yanmağa daha çox layiq olanları, əlbəttə ki, Biz yaxşı tanıyırıq.

ثُمَّ لَنَحْنُ أَعْلَمُ بِالَّذِينَ هُمْ أَوْلَىٰ بِهَا صِلِيًّا ٧٠

71. İçinizdən hər kəs oraya varid olacaqdır. *Bu*, Rəbbinin *əzəldən* müəyyən etdiyi qəti bir qərardır.

وَإِن مِّنكُمْ إِلَّا وَارِدُهَا كَانَ عَلَىٰ رَبِّكَ حَتْمًا مَّقْضِيًّا ٧١

72. Sonra Biz müttəqiləri *oddan* xilas edəcək, zalımları isə orada diz üstə çökmüş halda tərk edəcəyik.

ثُمَّ نُنَجِّي الَّذِينَ اتَّقَوا وَّنَذَرُ الظَّالِمِينَ فِيهَا جِثِيًّا ٧٢

73. Onlara açıq-aydın ayələrimiz oxunduğu zaman kafirlər möminlərə deyərlər: "Bu iki firqədən hansının məqamı daha yaxşı, məclisi daha gözəldir?"

وَإِذَا تُتْلَىٰ عَلَيْهِمْ آيَاتُنَا بَيِّنَاتٍ قَالَ الَّذِينَ كَفَرُوا لِلَّذِينَ آمَنُوا أَيُّ الْفَرِيقَيْنِ خَيْرٌ مَّقَامًا وَأَحْسَنُ نَدِيًّا ٧٣

74. Biz onlardan əvvəl var-dövlət və zahiri görünüşcə onlardan daha üstün olan neçə-neçə nəsilləri məhv etdik.

وَكَمْ أَهْلَكْنَا قَبْلَهُم مِّن قَرْنٍ هُمْ أَحْسَنُ أَثَاثًا وَرِئْيًا ٧٤

75. De: "Qoy azğınlıqda olan hər kəsə Rəhman (geniş rəhmət sahibi olan Allah) uzun müddət möhlət versin! Nəhayət, özlərinə vəd olunan ya əzabı, ya da o Saatı gördükləri zaman onlar kimin məqamının daha pis, kimin ordusunun daha zəif olduğunu biləcəklər".

قُلْ مَن كَانَ فِي الضَّلَالَةِ فَلْيَمْدُدْ لَهُ الرَّحْمَٰنُ مَدًّا حَتَّىٰ إِذَا رَأَوْا مَا يُوعَدُونَ إِمَّا الْعَذَابَ وَإِمَّا السَّاعَةَ فَسَيَعْلَمُونَ مَنْ هُوَ شَرٌّ مَّكَانًا وَأَضْعَفُ جُندًا ٧٥

76. Allah doğru yolda olanların doğruluğunu artırar. Əbədi qalan yaxşı əməllər isə Rəbbinin yanında savab baxımından daha xeyirli, aqibətcə daha yaxşıdır.

وَيَزِيدُ اللَّهُ الَّذِينَ اهْتَدَوْا هُدًى وَالْبَاقِيَاتُ الصَّالِحَاتُ خَيْرٌ عِندَ رَبِّكَ ثَوَابًا وَخَيْرٌ مَّرَدًّا ٧٦

77. Ayələrimizi inkar edib: "Mənə hökmən var-dövlət və övlad veriləcəkdir!"– deyən adamı gördünmü?

أَفَرَأَيْتَ الَّذِي كَفَرَ بِآيَاتِنَا وَقَالَ لَأُوتَيَنَّ مَالًا وَوَلَدًا ٧٧

**78.** Olmaya, o, qeybdən xəbərdardır, yoxsa Rəhmandan vəd almışdır?

أَطَّلَعَ ٱلۡغَيۡبَ أَمِ ٱتَّخَذَ عِندَ ٱلرَّحۡمَٰنِ عَهۡدٗا ٧٨

**79.** Xeyr! Biz onun dediklərini yazacaq və əzabını qat-qat artıracağıq.

كَلَّاۚ سَنَكۡتُبُ مَا يَقُولُ وَنَمُدُّ لَهُۥ مِنَ ٱلۡعَذَابِ مَدّٗا ٧٩

**80.** Onun dediyi şeylər Bizə qalacaq və o, hüzurumuza tək-tənha gələcəkdir.

وَنَرِثُهُۥ مَا يَقُولُ وَيَأۡتِينَا فَرۡدٗا ٨٠

**81.** *Müşriklər* Allahdan başqa məbudlar qəbul etdilər ki, onlara kömək olsunlar.

وَٱتَّخَذُواْ مِن دُونِ ٱللَّهِ ءَالِهَةٗ لِّيَكُونُواْ لَهُمۡ عِزّٗا ٨١

**82.** Xeyr! *Onların Allahdan başqa ibadət etdiklıəi Qiyamət günü* onların ibadətini inkar edəcək və onların əleyhinə çıxacaqlar.

كَلَّاۚ سَيَكۡفُرُونَ بِعِبَادَتِهِمۡ وَيَكُونُونَ عَلَيۡهِمۡ ضِدًّا ٨٢

**83.** Məgər kafirlərin üstünə onları *günaha* sövq edən şeytanları göndərdiyimizi görmürsənmi?

أَلَمۡ تَرَ أَنَّآ أَرۡسَلۡنَا ٱلشَّيَٰطِينَ عَلَى ٱلۡكَٰفِرِينَ تَؤُزُّهُمۡ أَزّٗا ٨٣

**84.** Odur ki, onlardan ötrü *əzab diləməyə* tələsmə. Biz onların *günlərini* bir-bir sayırıq.

فَلَا تَعۡجَلۡ عَلَيۡهِمۡۖ إِنَّمَا نَعُدُّ لَهُمۡ عَدّٗا ٨٤

**85.** O gün Biz müttəqiləri Rəhmanın hüzuruna hörmətli nümayəndələr kimi toplayarıq.

يَوۡمَ نَحۡشُرُ ٱلۡمُتَّقِينَ إِلَى ٱلرَّحۡمَٰنِ وَفۡدٗا ٨٥

**86.** Günahkarları isə Cəhənnəmə susamış olduqları halda qovub apararıq.

وَنَسُوقُ ٱلۡمُجۡرِمِينَ إِلَىٰ جَهَنَّمَ وِرۡدٗا ٨٦

**87.** Rəhmandan əhd almış kəslərdən başqaları şəfaət etməyə qadir olmazlar.

لَّا يَمۡلِكُونَ ٱلشَّفَٰعَةَ إِلَّا مَنِ ٱتَّخَذَ عِندَ ٱلرَّحۡمَٰنِ عَهۡدٗا ٨٧

**88.** *Kafirlər*: “Rəhman özünə övlad götürmüşdür!”– dedilər.

وَقَالُواْ ٱتَّخَذَ ٱلرَّحۡمَٰنُ وَلَدٗا ٨٨

**89.** Siz olduqca pis bir iş tutdunuz.

لَقَدْ جِئْتُمْ شَيْـًٔا إِدًّا ٨٩

**90.** Bundan az qaldı göylər parçalansın, yer yarılsın və dağlar yerindən qopub uçsun –

تَكَادُ ٱلسَّمَٰوَٰتُ يَتَفَطَّرْنَ مِنْهُ
وَتَنشَقُّ ٱلْأَرْضُ وَتَخِرُّ ٱلْجِبَالُ هَدًّا ٩٠

**91.** Rəhmana övlad isnad etdiklərinə görə.

أَن دَعَوْا لِلرَّحْمَٰنِ وَلَدًا ٩١

**92.** Rəhmana özünə övlad götürmək yaraşmaz.

وَمَا يَنۢبَغِى لِلرَّحْمَٰنِ أَن يَتَّخِذَ وَلَدًا ٩٢

**93.** Göylərdə və yerdə olanların hamısı Rəhmanın hüzuruna ancaq bir qul kimi gələcək.

إِن كُلُّ مَن فِى ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضِ إِلَّآ
ءَاتِى ٱلرَّحْمَٰنِ عَبْدًا ٩٣

**94.** *Allah* onları hesablamış və bir-bir saymışdır.

لَّقَدْ أَحْصَىٰهُمْ وَعَدَّهُمْ عَدًّا ٩٤

**95.** Onların hər biri Qiyamət günü Onun hüzuruna tək-tənha gələcək.

وَكُلُّهُمْ ءَاتِيهِ يَوْمَ ٱلْقِيَٰمَةِ فَرْدًا ٩٥

**96.** İman gətirib yaxşı işlər görənlər üçün Rəhman *qəlblərdə* bir sevgi yaradacaq.

إِنَّ ٱلَّذِينَ ءَامَنُوا۟ وَعَمِلُوا۟ ٱلصَّٰلِحَٰتِ
سَيَجْعَلُ لَهُمُ ٱلرَّحْمَٰنُ وُدًّا ٩٦

**97.** Biz *Quranı* sənin dilinlə asanlaşdırdıq ki, onunla müttəqilərə müjdə verəsən və inadkarlara xəbərdarlıq edəsən.

فَإِنَّمَا يَسَّرْنَٰهُ بِلِسَانِكَ لِتُبَشِّرَ بِهِ
ٱلْمُتَّقِينَ وَتُنذِرَ بِهِۦ قَوْمًا لُّدًّا ٩٧

**98.** Biz onlardan əvvəl neçə-neçə nəsilləri məhv etdik. Heç onlardan kiminsə *mövcudluğunu* hiss edir və yaxud onlardan bir hənirti eşidirsənmi?

وَكَمْ أَهْلَكْنَا قَبْلَهُم مِّن قَرْنٍ هَلْ تُحِسُّ
مِنْهُم مِّنْ أَحَدٍ أَوْ تَسْمَعُ لَهُمْ رِكْزًۢا ٩٨

## Ta ha surəsi

## سُورَةُ طه

*Mərhəmətli və Rəhimli*
*Allahın adı ilə!*

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

1. Ta. Ha.

طه ۝١

2. Biz Quranı sənə ona görə nazil etmədik ki, əziyyətə düşəsən.

مَا أَنزَلْنَا عَلَيْكَ ٱلْقُرْءَانَ لِتَشْقَىٰٓ ۝٢

3. *Onu Allahdan* qorxanlar üçün ancaq nəsihət kimi *göndərdik*.

إِلَّا تَذْكِرَةً لِّمَن يَخْشَىٰ ۝٣

4. O, yeri və uca göyləri yaradan *Allah* tərəfindən nazil olmuşdur.

تَنزِيلًا مِّمَّنْ خَلَقَ ٱلْأَرْضَ وَٱلسَّمَٰوَٰتِ ٱلْعُلَى ۝٤

5. Mərhəmətli *Allah* Ərşə ucaldı.

ٱلرَّحْمَٰنُ عَلَى ٱلْعَرْشِ ٱسْتَوَىٰ ۝٥

6. Göylərdə, yerdə, onların arasında və torpağın altında nə varsa, Ona məxsusdur.

لَهُۥ مَا فِى ٱلسَّمَٰوَٰتِ وَمَا فِى ٱلْأَرْضِ وَمَا
بَيْنَهُمَا وَمَا تَحْتَ ٱلثَّرَىٰ ۝٦

7. Sən ucadan danışsan da, *danışmasan da, fərqi yoxdur*. Çünki *Allah* sirri də, *bundan* daha gizli olanı da bilir.

وَإِن تَجْهَرْ بِٱلْقَوْلِ فَإِنَّهُۥ يَعْلَمُ ٱلسِّرَّ
وَأَخْفَى ۝٧

8. Allah! Ondan başqa ibadətə layiq olan məbud yoxdur. Ən gözəl adlar təkcə Ona xasdır!

ٱللَّهُ لَآ إِلَٰهَ إِلَّا هُوَ ۖ لَهُ ٱلْأَسْمَآءُ ٱلْحُسْنَىٰ ۝٨

9. Musanın əhvalatı sənə gəlib çatdımı?

وَهَلْ أَتَىٰكَ حَدِيثُ مُوسَىٰٓ ۝٩

10. O zaman o, bir od görüb ailəsinə demişdi: “Dayanın! Mən bir od gördüm. Bəlkə, ondan sizə bir köz gətirdim, ya da odun yanında bir bələdçi tapdım!”

إِذْ رَءَا نَارًا فَقَالَ لِأَهْلِهِ ٱمْكُثُوٓا۟ إِنِّىٓ
ءَانَسْتُ نَارًا لَّعَلِّىٓ ءَاتِيكُم مِّنْهَا بِقَبَسٍ أَوْ أَجِدُ
عَلَى ٱلنَّارِ هُدًى ۝١٠

11. Oda yaxınlaşdıqda bir səda gəldi: “Ey Musa!

فَلَمَّآ أَتَىٰهَا نُودِىَ يَٰمُوسَىٰٓ ۝١١

**12.** Həqiqətən, Mən sənin Rəbbinəm. Başmaqlarını çıxart. Çünki sən müqəddəs Tuva vadisindəsən!

إِنِّيٓ أَنَا۠ رَبُّكَ فَٱخۡلَعۡ نَعۡلَيۡكَ إِنَّكَ بِٱلۡوَادِ
ٱلۡمُقَدَّسِ طُوٗى ﴿١٢﴾

**13.** Mən səni seçmişəm. *Sənə* vəhy olunanı dinlə!

وَأَنَا ٱخۡتَرۡتُكَ فَٱسۡتَمِعۡ لِمَا يُوحَىٰٓ ﴿١٣﴾

**14.** Həqiqətən, Mən Allaham. Məndən başqa heç bir məbud yoxdur. Mənə ibadət et və Məni xatırlamaq üçün namaz qıl!

إِنَّنِيٓ أَنَا ٱللَّهُ لَآ إِلَٰهَ إِلَّآ أَنَا۠ فَٱعۡبُدۡنِي وَأَقِمِ
ٱلصَّلَوٰةَ لِذِكۡرِيٓ ﴿١٤﴾

**15.** Həmin Saat hökmən gələcək! Hər kəsə törətdiklərinin əvəzi verilsin deyə, Mən onu az qala *Özümdən belə* gizlədirəm.

إِنَّ ٱلسَّاعَةَ ءَاتِيَةٌ أَكَادُ أُخۡفِيهَا لِتُجۡزَىٰ
كُلُّ نَفۡسِۭ بِمَا تَسۡعَىٰ ﴿١٥﴾

**16.** Qoy ona inanmayan və nəfsinin istəklərinə uyan bir kəs səni ondan yayındırmasın, yoxsa məhv olarsan!

فَلَا يَصُدَّنَّكَ عَنۡهَا مَن لَّا يُؤۡمِنُ بِهَا وَٱتَّبَعَ
هَوَىٰهُ فَتَرۡدَىٰ ﴿١٦﴾

**17.** Sağ əlindəki nədir, ey Musa?"

وَمَا تِلۡكَ بِيَمِينِكَ يَٰمُوسَىٰ ﴿١٧﴾

**18.** *Musa* dedi: "Bu mənim əsamdır. Ona söykənir və onunla qoyunlarıma yarpaq silkələyirəm. Bu, mənim üçün başqa işlərə də yarıyır".

قَالَ هِيَ عَصَايَ أَتَوَكَّؤُاْ عَلَيۡهَا وَأَهُشُّ
بِهَا عَلَىٰ غَنَمِي وَلِيَ فِيهَا مَـَٔارِبُ أُخۡرَىٰ ﴿١٨﴾

**19.** *Allah* buyurdu: "At onu *yerə*, ey Musa!"

قَالَ أَلۡقِهَا يَٰمُوسَىٰ ﴿١٩﴾

**20.** *Musa* onu *yerə* atdı və o, dərhal ilan olub sürətlə sürünməyə başladı.

فَأَلۡقَىٰهَا فَإِذَا هِيَ حَيَّةٞ تَسۡعَىٰ ﴿٢٠﴾

**21.** *Allah* buyurdu: "Götür onu, qorxma! Biz onu əvvəlki halına qaytaracağıq.

قَالَ خُذۡهَا وَلَا تَخَفۡۖ سَنُعِيدُهَا
سِيرَتَهَا ٱلۡأُولَىٰ ﴿٢١﴾

**22.** Əlini qoynuna sal ki, *əlin oradan* başqa bir möcüzə kimi ləkəsiz, ağappaq çıxsın.

وَٱضۡمُمۡ يَدَكَ إِلَىٰ جَنَاحِكَ تَخۡرُجۡ بَيۡضَآءَ مِنۡ
غَيۡرِ سُوٓءٍ ءَايَةً أُخۡرَىٰ ﴿٢٢﴾

**23.** *Belə etdik* ki, sənə ən böyük möcüzələrimizdən *bir neçəsini* göstərək.

لِنُرِيَكَ مِنْ ءَايَٰتِنَا ٱلْكُبْرَى ﴿٢٣﴾

**24.** Fironun yanına get! Çünki o, həddini aşmışdır".

ٱذْهَبْ إِلَىٰ فِرْعَوْنَ إِنَّهُۥ طَغَىٰ ﴿٢٤﴾

**25.** *Musa* dedi: "Ey Rəbbim! Köksümü açıb genişlət!

قَالَ رَبِّ ٱشْرَحْ لِى صَدْرِى ﴿٢٥﴾

**26.** İşimi yüngülləşdir!

وَيَسِّرْ لِىٓ أَمْرِى ﴿٢٦﴾

**27.** Dilimdəki düyünü aç ki,

وَٱحْلُلْ عُقْدَةً مِّن لِّسَانِى ﴿٢٧﴾

**28.** sözümü anlasınlar!

يَفْقَهُوا۟ قَوْلِى ﴿٢٨﴾

**29.** Mənə öz ailəmdən birköməkçi ver –

وَٱجْعَل لِّى وَزِيرًا مِّنْ أَهْلِى ﴿٢٩﴾

**30.** Qardaşım Harunu!

هَٰرُونَ أَخِى ﴿٣٠﴾

**31.** Onun sayəsində mənim gücümü artır!

ٱشْدُدْ بِهِۦٓ أَزْرِى ﴿٣١﴾

**32.** Onu işimə ortaq et (ona da peyğəmbərlik ver) ki,

وَأَشْرِكْهُ فِىٓ أَمْرِى ﴿٣٢﴾

**33.** Sənə çoxlu təriflər deyək

كَىْ نُسَبِّحَكَ كَثِيرًا ﴿٣٣﴾

**34.** və Səni çox zikr edək.

وَنَذْكُرَكَ كَثِيرًا ﴿٣٤﴾

**35.** Şübhəsiz ki, Sən bizi görürsən!"

إِنَّكَ كُنتَ بِنَا بَصِيرًا ﴿٣٥﴾

**36.** *Allah* buyurdu: "Dilədiyin sənə verildi, ey Musa!

قَالَ قَدْ أُوتِيتَ سُؤْلَكَ يَٰمُوسَىٰ ﴿٣٦﴾

**37.** Sənə bir dəfə də mərhəmət göstərmişdik.

وَلَقَدْ مَنَنَّا عَلَيْكَ مَرَّةً أُخْرَىٰٓ ﴿٣٧﴾

**38.** O vaxt ki, anana vəhy olunacaq şeyi belə vəhy etdik:

إِذْ أَوْحَيْنَآ إِلَىٰٓ أُمِّكَ مَا يُوحَىٰٓ ﴿٣٨﴾

**39.** "Onu bir sandığa qoyub çaya burax ki, çay onu sahilə atsın və həm Mənim düşmənim, həm də onun düşməni

أَنِ ٱقْذِفِيهِ فِى ٱلتَّابُوتِ فَٱقْذِفِيهِ فِى ٱلْيَمِّ فَلْيُلْقِهِ
ٱلْيَمُّ بِٱلسَّاحِلِ يَأْخُذْهُ عَدُوٌّ لِّى وَعَدُوٌّ لَّهُۥ ۚ وَأَلْقَيْتُ

olan birisi onu götürsün". Gözlərim önündə boya-başa çatdırılasan deyə, Öz tərəfimdən sənə qarşı *qullarım arasında* məhəbbət oyatdım.

عَلَيْكَ مَحَبَّةً مِّنِّي وَلِتُصْنَعَ عَلَىٰ عَيْنِيٓ ٣٩

40. O zaman bacın gedib *camaata* deyirdi: "Sizə onun qayğısına qalacaq birisini göstərimmi?" Beləliklə, gözü aydın olsun və qəm yeməsin deyə, səni anana qaytardıq. Sən *boya-başa çatdıqda* bir nəfəri öldürdün. *O vaxt* Biz səni qəm-qüssədən qurtardıq. Biz səni *çətin* sınaqlardan keçirtdik. Sən illərlə Mədyən əhli içində qaldın. Sonra da müəyyən olunmuş *məqama* gəlib çatdın, ey Musa!

إِذْ تَمْشِيٓ أُخْتُكَ فَتَقُولُ هَلْ أَدُلُّكُمْ عَلَىٰ مَن
يَكْفُلُهُۥۖ فَرَجَعْنَٰكَ إِلَىٰٓ أُمِّكَ كَيْ تَقَرَّ عَيْنُهَا
وَلَا تَحْزَنَۚ وَقَتَلْتَ نَفْسًا فَنَجَّيْنَٰكَ مِنَ ٱلْغَمِّ
وَفَتَنَّٰكَ فُتُونًاۚ فَلَبِثْتَ سِنِينَ فِيٓ أَهْلِ مَدْيَنَ
ثُمَّ جِئْتَ عَلَىٰ قَدَرٍ يَٰمُوسَىٰ ٤٠

41. Mən səni Özümə *peyğəmbər* seçdim!

وَٱصْطَنَعْتُكَ لِنَفْسِي ٤١

42. Sən və qardaşın möcüzələrimlə gedin və Məni zikr etməkdə zəiflik göstərməyin.

ٱذْهَبْ أَنتَ وَأَخُوكَ بِـَٔايَٰتِي وَلَا تَنِيَا فِي
ذِكْرِي ٤٢

43. Fironun yanına gedin. Çünki o, həddini aşmışdır.

ٱذْهَبَآ إِلَىٰ فِرْعَوْنَ إِنَّهُۥ طَغَىٰ ٤٣

44. Onunla yumşaq danışın. Bəlkə, öyüd-nəsihət qəbul etsin, yaxud qorxsun!"

فَقُولَا لَهُۥ قَوْلًا لَّيِّنًا لَّعَلَّهُۥ يَتَذَكَّرُ أَوْ يَخْشَىٰ ٤٤

45. Onlar dedilər: "Ey Rəbbimiz! Biz, onun bizə şiddətli cəza verməsindən və ya həddini aşmasından qorxuruq".

قَالَا رَبَّنَآ إِنَّنَا نَخَافُ أَن يَفْرُطَ عَلَيْنَآ أَوْ أَن
يَطْغَىٰ ٤٥

46. *Allah* buyurdu: "Qorxmayın, çünki Mən sizinləyəm, eşidirəm və görürəm!

قَالَ لَا تَخَافَآ إِنَّنِي مَعَكُمَآ أَسْمَعُ وَأَرَىٰ ٤٦

47. Onun yanına gedib deyin: "Biz sənin Rəbbinin elçiləriyik. İsrail oğullarını bizimlə göndər və onlara əziyyət vermə. Biz sənin yanına Rəbbindən dəlillə gəlmişik. Doğru yolla gedənlərə salam olsun!

فَأْتِيَاهُ فَقُولَا إِنَّا رَسُولَا رَبِّكَ فَأَرْسِلْ مَعَنَا بَنِيٓ إِسْرَٰٓءِيلَ وَلَا تُعَذِّبْهُمْۖ قَدْ جِئْنَٰكَ بِـَٔايَةٍ مِّن رَّبِّكَۖ وَٱلسَّلَٰمُ عَلَىٰ مَنِ ٱتَّبَعَ ٱلْهُدَىٰٓ ٤٧

48. Bizə vəhy edildi ki, əzab, *haqqı* yalan sayıb üz döndərənlərə veriləcəkdir!"

إِنَّا قَدْ أُوحِيَ إِلَيْنَآ أَنَّ ٱلْعَذَابَ عَلَىٰ مَن كَذَّبَ وَتَوَلَّىٰ ٤٨

49. *Firon* dedi: "Rəbbiniz kimdir, ey Musa?"

قَالَ فَمَن رَّبُّكُمَا يَٰمُوسَىٰ ٤٩

50. *Musa* dedi: "Rəbbimiz hər şeyə öz xilqətini verən, sonra da *ona* doğru yolu göstərəndir!"

قَالَ رَبُّنَا ٱلَّذِيٓ أَعْطَىٰ كُلَّ شَيْءٍ خَلْقَهُۥ ثُمَّ هَدَىٰ ٥٠

51. *Firon* dedi: "Bəs əvvəlki nəsillərin halı necə olacaq?"

قَالَ فَمَا بَالُ ٱلْقُرُونِ ٱلْأُولَىٰ ٥١

52. *Musa* dedi: "Onlar haqqındakı bilgi Rəbbimin yanında olan bir Kitabdadır. Rəbbim nə xəta edir, nə də unudur!"

قَالَ عِلْمُهَا عِندَ رَبِّي فِي كِتَٰبٍۖ لَّا يَضِلُّ رَبِّي وَلَا يَنسَى ٥٢

53. O, yer üzünü sizin üçün beşik etmiş, orada sizin üçün yollar salmış və göydən su endirmişdir. Biz onunla cürbəcür bitkilərdən cüt-cüt yetişdirdik.

ٱلَّذِي جَعَلَ لَكُمُ ٱلْأَرْضَ مَهْدًا وَسَلَكَ لَكُمْ فِيهَا سُبُلًا وَأَنزَلَ مِنَ ٱلسَّمَآءِ مَآءً فَأَخْرَجْنَا بِهِۦٓ أَزْوَٰجًا مِّن نَّبَاتٍ شَتَّىٰ ٥٣

54. *Onlardan* həm özünüz yeyin, həm də heyvanlarınızı yemləyin. Həqiqətən, bunlarda başa düşənlər üçün dəlillər vardır.

كُلُوا۟ وَٱرْعَوْا۟ أَنْعَٰمَكُمْۗ إِنَّ فِي ذَٰلِكَ لَأٓيَٰتٍ لِّأُو۟لِي ٱلنُّهَىٰ ٥٤

55. Biz sizi torpaqdan yaratdıq. Sizi ora qaytaracaq və bir daha oradan çıxardacağıq.

۞ مِنْهَا خَلَقْنَٰكُمْ وَفِيهَا نُعِيدُكُمْ وَمِنْهَا نُخْرِجُكُمْ تَارَةً أُخْرَىٰ ٥٥

**56.** Biz dəlillərimizin hamısını *Firona* göstərdik. O isə *bu dəlilləri* yalan sayıb qəbul etmədi.

وَلَقَدۡ أَرَيۡنَٰهُ ءَايَٰتِنَا كُلَّهَا فَكَذَّبَ وَأَبَىٰ ٥٦

**57.** *Firon* dedi: "Sən öz sehrinlə bizi öz torpağımızdan qovub çıxartmağamı gəlmisən, ey Musa?

قَالَ أَجِئۡتَنَا لِتُخۡرِجَنَا مِنۡ أَرۡضِنَا بِسِحۡرِكَ
يَٰمُوسَىٰ ٥٧

**58.** Biz də sənə buna bənzər bir sehr göstərə bilərik. Bizimlə öz aranda görüş vaxtı təyin et. Nə biz, nə də sən vədə xilaf çıxmayaq. *Bu hamımız üçün* münasib bir yerdə olsun".

فَلَنَأۡتِيَنَّكَ بِسِحۡرٖ مِّثۡلِهِۦ فَٱجۡعَلۡ بَيۡنَنَا
وَبَيۡنَكَ مَوۡعِدٗا لَّا نُخۡلِفُهُۥ نَحۡنُ وَلَآ أَنتَ مَكَانٗا
سُوٗى ٥٨

**59.** *Musa* dedi: "Görüş vaxtınız bayram günü, camaatın *bir yerə* toplaşacağı səhər vaxtıdır!"

قَالَ مَوۡعِدُكُمۡ يَوۡمُ ٱلزِّينَةِ وَأَن يُحۡشَرَ ٱلنَّاسُ
ضُحٗى ٥٩

**60.** Firon üz çevirdi, sonra da bütün hiyləgərlik vasitələrini (sehrbazlarının hamısını) toplayıb gəldi.

فَتَوَلَّىٰ فِرۡعَوۡنُ فَجَمَعَ كَيۡدَهُۥ ثُمَّ أَتَىٰ ٦٠

**61.** Musa onlara dedi: "Vay halınıza! Allaha qarşı yalan uydurmayın, yoxsa O sizi əzabla məhv edər. İftira yaxan ziyana uğrayar.

قَالَ لَهُم مُّوسَىٰ وَيۡلَكُمۡ لَا تَفۡتَرُواْ عَلَى ٱللَّهِ
كَذِبٗا فَيُسۡحِتَكُم بِعَذَابٖۖ وَقَدۡ خَابَ مَنِ
ٱفۡتَرَىٰ ٦١

**62.** *Fironun adamları* öz aralarında işləri barəsində mübahisə edib xəlvətcə söhbət etdilər.

فَتَنَٰزَعُوٓاْ أَمۡرَهُم بَيۡنَهُمۡ وَأَسَرُّواْ ٱلنَّجۡوَىٰ ٦٢

**63.** Onlar dedilər: "Bu ikisi, doğrudan da, sehrbazdır. Onlar öz sehrləri ilə sizi torpağınızdan qovub çıxartmaq və sizin ən gözəl yolunuzu aradan götürmək istəyirlər.

قَالُوٓاْ إِنۡ هَٰذَٰنِ لَسَٰحِرَٰنِ يُرِيدَانِ أَن
يُخۡرِجَاكُم مِّنۡ أَرۡضِكُم بِسِحۡرِهِمَا وَيَذۡهَبَا
بِطَرِيقَتِكُمُ ٱلۡمُثۡلَىٰ ٦٣

**64.** Odur ki, bütün hiylələrinizi cəmləşdirib *meydana* dəstə-dəstə

فَأَجۡمِعُواْ كَيۡدَكُمۡ ثُمَّ ٱئۡتُواْ صَفّٗاۚ وَقَدۡ أَفۡلَحَ ٱلۡيَوۡمَ

gəlin. Bu gün qələbə çalan xilas olacaqdır”.

مَنِ ٱسْتَعْلَىٰ ٦٤

65. *Sehrbazlar* dedilər: “Ey Musa! Ya sən *əvvəlcə əlindəkini* at, ya da birinci atan biz olaq!”

قَالُوا۟ يَٰمُوسَىٰٓ إِمَّآ أَن تُلْقِىَ وَإِمَّآ أَن نَّكُونَ أَوَّلَ
مَنْ أَلْقَىٰ ٦٥

66. *Musa* dedi: “Yox, siz atın!” *Sehrbazlar əllərindəkiləri yerə atan kimi* sehrləri sayəsində ona elə gəldi ki, onların kəndirləri və çomaqları hərəkətə gəlib sürünür.

قَالَ بَلْ أَلْقُوا۟ ۖ فَإِذَا حِبَالُهُمْ وَعِصِيُّهُمْ يُخَيَّلُ
إِلَيْهِ مِن سِحْرِهِمْ أَنَّهَا تَسْعَىٰ ٦٦

67. Musanın ürəyi xoflandı.

فَأَوْجَسَ فِى نَفْسِهِۦ خِيفَةً مُّوسَىٰ ٦٧

68. Biz dedik: “Qorxma, qalib gələn mütləq sən olacaqsan!

قُلْنَا لَا تَخَفْ إِنَّكَ أَنتَ ٱلْأَعْلَىٰ ٦٨

69. Sağ əlindəkini yerə at, onların qurduqlarını udsun. Onların qurduqları sadəcə sehrbaz hiyləsidir. Sehrbaz isə, hara gedirsə-getsin, uğur qazanmaz”.

وَأَلْقِ مَا فِى يَمِينِكَ تَلْقَفْ مَا صَنَعُوٓا۟ ۖ إِنَّمَا صَنَعُوا۟
كَيْدُ سَٰحِرٍ ۖ وَلَا يُفْلِحُ ٱلسَّاحِرُ حَيْثُ أَتَىٰ ٦٩

70. Sehrbazlar səcdəyə qapanıb dedilər: “Biz Harunun və Musanın Rəbbinə iman gətirdik!”

فَأُلْقِىَ ٱلسَّحَرَةُ سُجَّدًا قَالُوٓا۟ ءَامَنَّا بِرَبِّ هَٰرُونَ
وَمُوسَىٰ ٧٠

71. *Firon* dedi: “Mən sizə izin verməmişdən əvvəl siz ona iman gətirdiniz? Şübhəsiz ki, o sizə sehr öyrədən böyüyünüzdür. Mən sizin əllərinizi və ayaqlarınızı çarpaz kəsdirəcək, özünüzü də xurma ağaclarının gövdələrində çarmıxa çəkəcəyəm. Onda hansımızın əzabının daha şiddətli və daha sürəkli olduğunu biləcəksiniz!”

قَالَ ءَامَنتُمْ لَهُۥ قَبْلَ أَنْ ءَاذَنَ لَكُمْ ۖ إِنَّهُۥ لَكَبِيرُكُمُ
ٱلَّذِى عَلَّمَكُمُ ٱلسِّحْرَ ۖ فَلَأُقَطِّعَنَّ أَيْدِيَكُمْ
وَأَرْجُلَكُم مِّنْ خِلَٰفٍ وَلَأُصَلِّبَنَّكُمْ فِى جُذُوعِ
ٱلنَّخْلِ وَلَتَعْلَمُنَّ أَيُّنَآ أَشَدُّ عَذَابًا وَأَبْقَىٰ ٧١

72. Onlar dedilər: "Biz heç vaxt səni bizə gələn bu aydın dəlillərdən və bizi yaradandan üstün tutmayacağıq. İndi nə hökm verəcəksənsə, ver. Sən ancaq bu dünyada hökm verə bilərsən!

قَالُوا۟ لَن نُّؤْثِرَكَ عَلَىٰ مَا جَآءَنَا مِنَ ٱلْبَيِّنَٰتِ
وَٱلَّذِى فَطَرَنَا ۖ فَٱقْضِ مَآ أَنتَ قَاضٍ ۖ إِنَّمَا تَقْضِى
هَٰذِهِ ٱلْحَيَوٰةَ ٱلدُّنْيَآ ٧٢

73. Həqiqətən, biz Rəbbimizə iman gətirdik ki, O bizi günahlarımıza və sənin bizi məcbur etdirdiyin sehrə görə bağışlasın. Allahın *mükafatı* daha xeyirli, *cəzası* isə daha sürəklidir!"

إِنَّآ ءَامَنَّا بِرَبِّنَا لِيَغْفِرَ لَنَا خَطَٰيَٰنَا وَمَآ أَكْرَهْتَنَا
عَلَيْهِ مِنَ ٱلسِّحْرِ ۗ وَٱللَّهُ خَيْرٌ وَأَبْقَىٰٓ ٧٣

74. Kim Rəbbinin hüzuruna günahkar kimi gələrsə, cəhənnəmlik olar. O, orada nə ölər, nə də yaşayar.

إِنَّهُۥ مَن يَأْتِ رَبَّهُۥ مُجْرِمًا فَإِنَّ لَهُۥ جَهَنَّمَ لَا يَمُوتُ
فِيهَا وَلَا يَحْيَىٰ ٧٤

75. Kim *Onun hüzuruna* yaxşı əməllər etmiş bir mömin kimi gələrsə, onlara ən yüksək dərəcələr nəsib olar –

وَمَن يَأْتِهِۦ مُؤْمِنًا قَدْ عَمِلَ ٱلصَّٰلِحَٰتِ فَأُو۟لَٰٓئِكَ
لَهُمُ ٱلدَّرَجَٰتُ ٱلْعُلَىٰ ٧٥

76. *ağacları* altından çaylar axan Ədn bağları. Onlar orada əbədi qalarlar. Bu, *günahlardan* təmizlənənlərin mükafatıdır.

جَنَّٰتُ عَدْنٍ تَجْرِى مِن تَحْتِهَا ٱلْأَنْهَٰرُ خَٰلِدِينَ
فِيهَا ۚ وَذَٰلِكَ جَزَآءُ مَن تَزَكَّىٰ ٧٦

77. Biz Musaya: "Qullarımla birlikdə gecə yola çıx, *əsanı suya vurmaqla* onlar üçün dənizdə quru yol aç. *Düşmənin* sizə çatmasından qorxma, çəkinmə!"– *deyə* vəhy etdik.

وَلَقَدْ أَوْحَيْنَآ إِلَىٰ مُوسَىٰٓ أَنْ أَسْرِ بِعِبَادِى
فَٱضْرِبْ لَهُمْ طَرِيقًا فِى ٱلْبَحْرِ يَبَسًا لَّا تَخَٰفُ
دَرَكًا وَلَا تَخْشَىٰ ٧٧

78. Firon öz ordusu ilə onları təqib etdi və dəniz onları qaplayıb batırdı.

فَأَتْبَعَهُمْ فِرْعَوْنُ بِجُنُودِهِۦ فَغَشِيَهُم مِّنَ ٱلْيَمِّ
مَا غَشِيَهُمْ ٧٨

79. Firon öz xalqını azğınlığa sürüklədi və *onlara* doğru yol göstərmədi.

وَأَضَلَّ فِرْعَوْنُ قَوْمَهُۥ وَمَا هَدَىٰ ٧٩

**80.** Ey İsrail oğulları! Biz sizi düşməninizdən xilas etdik. Sizə Tur dağının sağ tərəfinə *gəlməyiniz üçün* vədə verdik. Sizə *göydən* manna və bildirçin endirdik.

يَٰبَنِيٓ إِسۡرَٰٓءِيلَ قَدۡ أَنجَيۡنَٰكُم مِّنۡ عَدُوِّكُمۡ وَوَٰعَدۡنَٰكُمۡ جَانِبَ ٱلطُّورِ ٱلۡأَيۡمَنَ وَنَزَّلۡنَا عَلَيۡكُمُ ٱلۡمَنَّ وَٱلسَّلۡوَىٰ ٨٠

**81.** Sizə verdiyimiz ruzilərin təmizindən yeyin və bunda həddi aşmayın, yoxsa sizə qəzəbim tutar. Qəzəbimə gəlmiş kimsə isə bədbəxt olar.

كُلُواْ مِن طَيِّبَٰتِ مَا رَزَقۡنَٰكُمۡ وَلَا تَطۡغَوۡاْ فِيهِ فَيَحِلَّ عَلَيۡكُمۡ غَضَبِيۖ وَمَن يَحۡلِلۡ عَلَيۡهِ غَضَبِي فَقَدۡ هَوَىٰ ٨١

**82.** Mən, həqiqətən də, tövbə edib, iman gətirib yaxşı işlər görən, sonra da doğru yolu tutanları bağışlayıram.

وَإِنِّي لَغَفَّارٞ لِّمَن تَابَ وَءَامَنَ وَعَمِلَ صَٰلِحٗا ثُمَّ ٱهۡتَدَىٰ ٨٢

**83.** *Allah buyurdu*: "Səni öz qövmündən ayrılmağa tələsdirən nə idi, ey Musa?"

۞وَمَآ أَعۡجَلَكَ عَن قَوۡمِكَ يَٰمُوسَىٰ ٨٣

**84.** *Musa* dedi: "Onlar da arxamca gəlirlər. Məndən razı qalasan deyə, Sənin yanına tələsdim, ey Rəbbim!"

قَالَ هُمۡ أُوْلَآءِ عَلَىٰٓ أَثَرِي وَعَجِلۡتُ إِلَيۡكَ رَبِّ لِتَرۡضَىٰ ٨٤

**85.** *Allah* buyurdu: "Səndən sonra qövmünü sınağa çəkdik. Samiri onları yoldan çıxartdı".

قَالَ فَإِنَّا قَدۡ فَتَنَّا قَوۡمَكَ مِنۢ بَعۡدِكَ وَأَضَلَّهُمُ ٱلسَّامِرِيُّ ٨٥

**86.** Musa qəzəbli, kədərli halda qövmünün yanına qayıdıb dedi: "Ey qövmüm! Məgər Rəbbiniz sizə gözəl bir vəd verməmişdimi? Doğrudanmı bu vaxt sizə uzun gəldi? Yoxsa Rəbbinizdən sizə bir qəzəb gəlməsini istəyib mənə verdiyiniz vədə xilaf çıxdınız?"

فَرَجَعَ مُوسَىٰٓ إِلَىٰ قَوۡمِهِۦ غَضۡبَٰنَ أَسِفٗاۚ قَالَ يَٰقَوۡمِ أَلَمۡ يَعِدۡكُمۡ رَبُّكُمۡ وَعۡدًا حَسَنًاۚ أَفَطَالَ عَلَيۡكُمُ ٱلۡعَهۡدُ أَمۡ أَرَدتُّمۡ أَن يَحِلَّ عَلَيۡكُمۡ غَضَبٞ مِّن رَّبِّكُمۡ فَأَخۡلَفۡتُم مَّوۡعِدِي ٨٦

**87.** Onlar dedilər: "Biz sənə verdiyimiz vədə öz ixtiyarımızla xilaf çıxmadıq. Lakin biz o xalqın zinət əşyasından olan ağır yüklərlə yüklənmişdik. Biz

قَالُواْ مَآ أَخۡلَفۡنَا مَوۡعِدَكَ بِمَلۡكِنَا وَلَٰكِنَّا حُمِّلۡنَآ أَوۡزَارٗا مِّن زِينَةِ ٱلۡقَوۡمِ فَقَذَفۡنَٰهَا فَكَذَٰلِكَ أَلۡقَى ٱلسَّامِرِيُّ ٨٧

onları *oda* atdıq. Həmçinin Samiri də *onu oda* atdı".

**88.** *Samiri* onlar üçün böyürən bir buzov heykəli düzəltdi. *Buzova məftun olanlar*: "Sizin də məbudunuz, Musanın da məbudu budur. Lakin o *bunu* unutmuşdur"– dedilər.

فَأَخْرَجَ لَهُمْ عِجْلًا جَسَدًا لَّهُۥ خُوَارٌ فَقَالُوا۟
هَٰذَآ إِلَٰهُكُمْ وَإِلَٰهُ مُوسَىٰ فَنَسِىَ ﴿٨٨﴾

**89.** Məgər *bu heykəlin* onlara heç bir cavab vermədiyini, onlara nə bir zərər, nə də bir fayda verməyə qadir olmadığını görmürdülərmi?!

أَفَلَا يَرَوْنَ أَلَّا يَرْجِعُ إِلَيْهِمْ قَوْلًا وَلَا
يَمْلِكُ لَهُمْ ضَرًّا وَلَا نَفْعًا ﴿٨٩﴾

**90.** Bundan əvvəl Harun onlara demişdi: "Ey qövmüm! Siz bununla ancaq sınağa çəkildiniz. Həqiqətən, sizin Rəbbiniz Rəhmandır. Mənə tabe olun və əmrimə itaət edin!"

وَلَقَدْ قَالَ لَهُمْ هَٰرُونُ مِن قَبْلُ يَٰقَوْمِ إِنَّمَا
فُتِنتُم بِهِۦ ۖ وَإِنَّ رَبَّكُمُ ٱلرَّحْمَٰنُ فَٱتَّبِعُونِى
وَأَطِيعُوٓا۟ أَمْرِى ﴿٩٠﴾

**91.** Onlar: "Musa yanımıza qayıtmayınca biz ona sitayiş etməkdən əl çəkməyəcəyik!"– dedilər.

قَالُوا۟ لَن نَّبْرَحَ عَلَيْهِ عَٰكِفِينَ حَتَّىٰ يَرْجِعَ
إِلَيْنَا مُوسَىٰ ﴿٩١﴾

**92.** *Musa* dedi: "Ey Harun! Onların azdıqlarını gördüyün zaman sənə nə mane oldu ki,

قَالَ يَٰهَٰرُونُ مَا مَنَعَكَ إِذْ رَأَيْتَهُمْ ضَلُّوٓا۟ ﴿٩٢﴾

**93.** ardımca gəlmədin? Əmrimə qarşımı çıxdın?

أَلَّا تَتَّبِعَنِ ۖ أَفَعَصَيْتَ أَمْرِى ﴿٩٣﴾

**94.** *Harun* dedi: "Ey anamın oğlu! Saqqalımdan, saçımdan tutma. Doğrusu, mən sənin: "İsrail oğullarını bir-birindən ayırdın, sözümə baxmadın!"– deyəcəyindən qorxdum.

قَالَ يَبْنَؤُمَّ لَا تَأْخُذْ بِلِحْيَتِى وَلَا بِرَأْسِىٓ ۖ إِنِّى
خَشِيتُ أَن تَقُولَ فَرَّقْتَ بَيْنَ بَنِىٓ إِسْرَٰٓءِيلَ
وَلَمْ تَرْقُبْ قَوْلِى ﴿٩٤﴾

**95.** *Musa* dedi: "Məqsədin nə idi, ey Samiri?"

قَالَ فَمَا خَطْبُكَ يَٰسَٰمِرِىُّ ﴿٩٥﴾

gəzir, bəzisi də dörd ayaq üstündə gəzir. Allah istədiyini yaradır. Şübhəsiz ki, Allah hər şeyə qadirdir.

مَّن يَمْشِي عَلَىٰٓ أَرْبَعٍ يَخْلُقُ ٱللَّهُ مَا يَشَآءُ إِنَّ ٱللَّهَ
عَلَىٰ كُلِّ شَيْءٍ قَدِيرٌ ٤٥

46. Biz açıq-aydın ayələr nazil etdik. Allah istədiyini doğru yola yönəldir.

لَّقَدْ أَنزَلْنَآ ءَايَٰتٍ مُّبَيِّنَٰتٍ وَٱللَّهُ يَهْدِي مَن
يَشَآءُ إِلَىٰ صِرَٰطٍ مُّسْتَقِيمٍ ٤٦

47. *Münafiqlər*: “Allaha və Peyğəmbərə iman gətirdik, itaət etdik!”– deyirlər. Bundan sonra isə onlardan bir dəstə üz çevirir. Onlar mömin deyillər.

وَيَقُولُونَ ءَامَنَّا بِٱللَّهِ وَبِٱلرَّسُولِ وَأَطَعْنَا ثُمَّ
يَتَوَلَّىٰ فَرِيقٌ مِّنْهُم مِّنۢ بَعْدِ ذَٰلِكَ وَمَآ أُوْلَٰٓئِكَ
بِٱلْمُؤْمِنِينَ ٤٧

48. Aralarında hökm vermək üçün Allaha və Onun Elçisinə çağırıldıqları zaman onlardan bir dəstə üz çevirir.

وَإِذَا دُعُوٓاْ إِلَى ٱللَّهِ وَرَسُولِهِۦ لِيَحْكُمَ بَيْنَهُمْ
إِذَا فَرِيقٌ مِّنْهُم مُّعْرِضُونَ ٤٨

49. Onlar haqlı olsaydılar, itaət edib onun yanına gələrdilər.

وَإِن يَكُن لَّهُمُ ٱلْحَقُّ يَأْتُوٓاْ إِلَيْهِ مُذْعِنِينَ ٤٩

50. Onların qəlbində xəstəlikmi var? Yoxsa onlar şübhəyəmi düşüblər? Ya da Allahın və Onun Elçisinin onlara haqsızlıq edəcəklərindən qorxurlar? Xeyr, məhz onlar zalımdırlar.

أَفِي قُلُوبِهِم مَّرَضٌ أَمِ ٱرْتَابُوٓاْ أَمْ يَخَافُونَ أَن يَحِيفَ
ٱللَّهُ عَلَيْهِمْ وَرَسُولُهُۥ بَلْ أُوْلَٰٓئِكَ هُمُ ٱلظَّٰلِمُونَ ٥٠

51. Aralarında hökm vermək üçün Allaha və Onun Elçisinə çağırıldıqda möminlərin sözü ancaq: “Eşitdik və itaət etdik!”– demələridir. Nicat tapanlar da məhz onlardır.

إِنَّمَا كَانَ قَوْلَ ٱلْمُؤْمِنِينَ إِذَا دُعُوٓاْ إِلَى ٱللَّهِ
وَرَسُولِهِۦ لِيَحْكُمَ بَيْنَهُمْ أَن يَقُولُواْ سَمِعْنَا
وَأَطَعْنَا وَأُوْلَٰٓئِكَ هُمُ ٱلْمُفْلِحُونَ ٥١

52. Allaha və Onun Elçisinə itaət edənlər, Allahdan qorxub çəkinənlər – məhz onlar uğur qazananlardır.

وَمَن يُطِعِ ٱللَّهَ وَرَسُولَهُۥ وَيَخْشَ ٱللَّهَ وَيَتَّقْهِ
فَأُوْلَٰٓئِكَ هُمُ ٱلْفَآئِزُونَ ٥٢

53. *Münafiqlər* Allaha çox möhkəm and içdilər ki, əgər sən onlara əmr etsən, onlar mütləq *döyüşə* çıxacaqlar. De:

۞ وَأَقْسَمُواْ بِٱللَّهِ جَهْدَ أَيْمَٰنِهِمْ لَئِنْ أَمَرْتَهُمْ
لَيَخْرُجُنَّ قُل لَّا تُقْسِمُواْ طَاعَةٌ مَّعْرُوفَةٌ

“And içməyin! İtaətiniz bəllidir. Şübhəsiz ki, Allah nə etdiklərinizdən xəbərdardır”.

إِنَّ ٱللَّهَ خَبِيرُۢ بِمَا تَعۡمَلُونَ ٥٣

54. De: “Allaha və Peyğəmbərə itaət edin”. Əgər üz çevirsəniz, *bilin ki,* o ancaq özünə həvalə edilənə cavabdehdir, siz də ancaq özünüzə həvalə edilənə cavabdehsiniz. Əgər ona itaət etsəniz, doğru yola yönəlmiş olarsınız. Peyğəmbərin öhdəsinə düşən isə ancaq açıq-aşkar təbliğat aparmaqdır.

قُلۡ أَطِيعُواْ ٱللَّهَ وَأَطِيعُواْ ٱلرَّسُولَۖ فَإِن تَوَلَّوۡاْ
فَإِنَّمَا عَلَيۡهِ مَا حُمِّلَ وَعَلَيۡكُم مَّا حُمِّلۡتُمۡۖ
وَإِن تُطِيعُوهُ تَهۡتَدُواْۚ وَمَا عَلَى ٱلرَّسُولِ إِلَّا
ٱلۡبَلَٰغُ ٱلۡمُبِينُ ٥٤

55. Allah sizlərdən iman gətirib yaxşı işlər görənlərə vəd etmişdir ki, özlərindən əvvəlkiləri varislər etdiyi kimi onları da yer üzünün varisləri edəcək, möminlər üçün onların Özünün bəyəndiyi dinini möhkəmləndirəcək və onların qorxusunu sonra arxayınçılıqla əvəz edəcəkdir. Onlar Mənə ibadət edir və heç nəyi Mənə şərik qoşmurlar. Bundan sonra küfr edənlər – məhz onlar fasiqlərdir.

وَعَدَ ٱللَّهُ ٱلَّذِينَ ءَامَنُواْ مِنكُمۡ وَعَمِلُواْ
ٱلصَّٰلِحَٰتِ لَيَسۡتَخۡلِفَنَّهُمۡ فِي ٱلۡأَرۡضِ
كَمَا ٱسۡتَخۡلَفَ ٱلَّذِينَ مِن قَبۡلِهِمۡ
وَلَيُمَكِّنَنَّ لَهُمۡ دِينَهُمُ ٱلَّذِي ٱرۡتَضَىٰ
لَهُمۡ وَلَيُبَدِّلَنَّهُم مِّنۢ بَعۡدِ خَوۡفِهِمۡ أَمۡنٗاۚ
يَعۡبُدُونَنِي لَا يُشۡرِكُونَ بِي شَيۡـٔٗاۚ وَمَن كَفَرَ
بَعۡدَ ذَٰلِكَ فَأُوْلَٰٓئِكَ هُمُ ٱلۡفَٰسِقُونَ ٥٥

56. Namaz qılın, zəkat verin və Peyğəmbərə itaət edin ki, sizə rəhm edilsin.

وَأَقِيمُواْ ٱلصَّلَوٰةَ وَءَاتُواْ ٱلزَّكَوٰةَ وَأَطِيعُواْ
ٱلرَّسُولَ لَعَلَّكُمۡ تُرۡحَمُونَ ٥٦

57. Kafirlərin yer üzündə *Allahdan* yaxa qurtara biləcəklərini zənn etmə. Onların sığınacaqları yer oddur. Ora nə pis dönüş yeridir!

لَا تَحۡسَبَنَّ ٱلَّذِينَ كَفَرُواْ مُعۡجِزِينَ فِي ٱلۡأَرۡضِۚ
وَمَأۡوَىٰهُمُ ٱلنَّارُۖ وَلَبِئۡسَ ٱلۡمَصِيرُ ٥٧

58. Ey iman gətirənlər! Sahib olduğunuz kölələr və həddi-buluğa çatmayanlar *yanınıza girmək istədikdə* qoy

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ لِيَسۡتَـٔۡذِنكُمُ ٱلَّذِينَ
مَلَكَتۡ أَيۡمَٰنُكُمۡ وَٱلَّذِينَ لَمۡ يَبۡلُغُواْ ٱلۡحُلُمَ مِنكُمۡ

üç vaxtda sizdən izin istəsinlər: sübh namazından əvvəl, günorta paltarınızı çıxartdığınız zaman və gecə namazından sonra. *Bu* sizin çılpaq ola biləcəyiniz üç vaxtdır. Qalan vaxtlarda bir-birinizin yanına *icazəsiz* girməkdə nə sizə, nə də onlara heç bir günah gəlməz. Allah ayələri sizə belə izah edir. Allah Biləndir, Müdrikdir.

ثَلَٰثَ مَرَّٰتٍ مِّن قَبْلِ صَلَوٰةِ ٱلْفَجْرِ وَحِينَ
تَضَعُونَ ثِيَابَكُم مِّنَ ٱلظَّهِيرَةِ وَمِنۢ بَعْدِ
صَلَوٰةِ ٱلْعِشَآءِ ثَلَٰثُ عَوْرَٰتٍ لَّكُمْ لَيْسَ عَلَيْكُمْ
وَلَا عَلَيْهِمْ جُنَاحٌۢ بَعْدَهُنَّ طَوَّٰفُونَ عَلَيْكُم
بَعْضُكُمْ عَلَىٰ بَعْضٍ كَذَٰلِكَ يُبَيِّنُ ٱللَّهُ
لَكُمُ ٱلْءَايَٰتِ وَٱللَّهُ عَلِيمٌ حَكِيمٌ ﴿٥٨﴾

59. Sizin uşaqlar da həddi-buluğa çatanda qoy özlərindən əvvəlkilər *yanınıza girmək üçün* izin istədikləri kimi izin istəsinlər. Allah Öz ayələrini sizə belə izah edir. Allah Biləndir, Müdrikdir.

وَإِذَا بَلَغَ ٱلْأَطْفَٰلُ مِنكُمُ ٱلْحُلُمَ
فَلْيَسْتَـْٔذِنُوا۟ كَمَا ٱسْتَـْٔذَنَ ٱلَّذِينَ مِن
قَبْلِهِمْ كَذَٰلِكَ يُبَيِّنُ ٱللَّهُ لَكُمْ ءَايَٰتِهِۦ
وَٱللَّهُ عَلِيمٌ حَكِيمٌ ﴿٥٩﴾

60. Ərə getməkdən ümidini üzmüş yaşlı qadınlara ayıb yerlərini göstərmədən hicablarını soyunmasında günah yoxdur. Lakin bunu etməmək onlar üçün daha xeyirlidir. Allah Eşidəndir, Biləndir.

وَٱلْقَوَٰعِدُ مِنَ ٱلنِّسَآءِ ٱلَّٰتِى لَا يَرْجُونَ
نِكَاحًا فَلَيْسَ عَلَيْهِنَّ جُنَاحٌ أَن يَضَعْنَ
ثِيَابَهُنَّ غَيْرَ مُتَبَرِّجَٰتٍۭ بِزِينَةٍ وَأَن
يَسْتَعْفِفْنَ خَيْرٌ لَّهُنَّ وَٱللَّهُ سَمِيعٌ
عَلِيمٌ ﴿٦٠﴾

61. Kora, çolağa, bir də xəstəyə günah gəlməz. Sizin özünüzə də öz evlərinizdə, yaxud atalarınızın evlərində, yaxud analarınızın evlərində, yaxud qardaşlarınızın evlərində, yaxud bacılarınızın evlərində, yaxud əmilərinizin evlərində, yaxud bibilərinizin evlərində, yaxud dayılarınızın evlərində, yaxud xalalarınızın evlərində, yaxud açarları əllərinizdə olan evlərdə, yaxud dostlarınızın evlərində yemək yeməkdə heç bir

لَّيْسَ عَلَى ٱلْأَعْمَىٰ حَرَجٌ وَلَا عَلَى ٱلْأَعْرَجِ
حَرَجٌ وَلَا عَلَى ٱلْمَرِيضِ حَرَجٌ وَلَا عَلَىٰٓ
أَنفُسِكُمْ أَن تَأْكُلُوا۟ مِنۢ بُيُوتِكُمْ أَوْ
بُيُوتِ ءَابَآئِكُمْ أَوْ بُيُوتِ أُمَّهَٰتِكُمْ
أَوْ بُيُوتِ إِخْوَٰنِكُمْ أَوْ بُيُوتِ أَخَوَٰتِكُمْ
أَوْ بُيُوتِ أَعْمَٰمِكُمْ أَوْ بُيُوتِ
عَمَّٰتِكُمْ أَوْ بُيُوتِ أَخْوَٰلِكُمْ أَوْ
بُيُوتِ خَٰلَٰتِكُمْ أَوْ مَا مَلَكْتُم
مَّفَاتِحَهُۥٓ أَوْ صَدِيقِكُمْ لَيْسَ

günah gəlməz. Bir yerdə, yaxud ayrı-ayrılıqda yemək yeməyinizdə də sizə heç bir günah gəlməz. Evlərə daxil olduğunuz zaman özünüzü Allah tərəfindən mübarək və çox xoş bir salamla salamlayın. Allah ayələrini sizə belə izah edir ki, başa düşəsiniz.

عَلَيْكُمْ جُنَاحٌ أَن تَأْكُلُوا جَمِيعًا أَوْ
أَشْتَاتًا فَإِذَا دَخَلْتُم بُيُوتًا فَسَلِّمُوا عَلَىٰ
أَنفُسِكُمْ تَحِيَّةً مِّنْ عِندِ ٱللَّهِ مُبَٰرَكَةً طَيِّبَةً
كَذَٰلِكَ يُبَيِّنُ ٱللَّهُ لَكُمُ ٱلْءَايَٰتِ
لَعَلَّكُمْ تَعْقِلُونَ ﴿٦١﴾

62. Möminlər ancaq Allaha və Onun Elçisinə iman gətirən kimsələrdir. Onlar ümumi bir işə görə *Peyğəmbərlə* bir yerdə olduqda ondan izn almamış heç yerə getmirlər. Səndən izin istəyənlər, sözsüz ki, Allaha və Onun Elçisinə iman gətirənlərdir. Əgər onlar bəzi işləri üçün səndən izin istəsələr, onlardan istədiyin kəsə izin ver və onlar üçün Allahdan bağışlanma dilə. Həqiqətən, Allah Bağışlayandır, Rəhmlidir.

إِنَّمَا ٱلْمُؤْمِنُونَ ٱلَّذِينَ ءَامَنُوا بِٱللَّهِ وَرَسُولِهِۦ
وَإِذَا كَانُوا مَعَهُۥ عَلَىٰ أَمْرٍ جَامِعٍ لَّمْ يَذْهَبُوا
حَتَّىٰ يَسْتَـْٔذِنُوهُ إِنَّ ٱلَّذِينَ يَسْتَـْٔذِنُونَكَ أُولَٰٓئِكَ
ٱلَّذِينَ يُؤْمِنُونَ بِٱللَّهِ وَرَسُولِهِۦ فَإِذَا
ٱسْتَـْٔذَنُوكَ لِبَعْضِ شَأْنِهِمْ فَأْذَن لِّمَن
شِئْتَ مِنْهُمْ وَٱسْتَغْفِرْ لَهُمُ ٱللَّهَ إِنَّ
ٱللَّهَ غَفُورٌ رَّحِيمٌ ﴿٦٢﴾

63. Peyğəmbəri, öz aranızda bir-birinizi çağırdığınız kimi çağırmayın. Allah sizin aranızdan daldalanaraq xəlvətcə çıxıb gedənləri bilir. Qoy onun əmrinə qarşı çıxanlar başlarına bir bəla gəlməsindən, yaxud özlərinə ağrılı-acılı bir əzab üz verməsindən qorxsunlar.

لَّا تَجْعَلُوا دُعَآءَ ٱلرَّسُولِ بَيْنَكُمْ كَدُعَآءِ
بَعْضِكُم بَعْضًا قَدْ يَعْلَمُ ٱللَّهُ ٱلَّذِينَ
يَتَسَلَّلُونَ مِنكُمْ لِوَاذًا فَلْيَحْذَرِ ٱلَّذِينَ
يُخَالِفُونَ عَنْ أَمْرِهِۦٓ أَن تُصِيبَهُمْ فِتْنَةٌ
أَوْ يُصِيبَهُمْ عَذَابٌ أَلِيمٌ ﴿٦٣﴾

64. Göylərdə və yerdə nə varsa, Allaha məxsusdur. O sizin nə əməl sahibi olduğunuzu və *qullarının* Onun hüzuruna qaytarılacaqları günü bilir. Allah onlara nə etdiklərini bildirəcəkdir. Allah hər şeyi bilir.

أَلَآ إِنَّ لِلَّهِ مَا فِى ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضِ قَدْ
يَعْلَمُ مَآ أَنتُمْ عَلَيْهِ وَيَوْمَ يُرْجَعُونَ إِلَيْهِ
فَيُنَبِّئُهُم بِمَا عَمِلُوا وَٱللَّهُ بِكُلِّ شَىْءٍ عَلِيمٌۢ ﴿٦٤﴾

## əl-Furqan
## («Haqqı batildən ayıran») surəsi

سورة الفرقان

*Mərhəmətli və Rəhmli*
*Allahın adı ilə!*

بسم الله الرحمن الرحيم

1. Aləmləri xəbərdar etməsindən ötrü Öz quluna Furqanı nazil edən *Allah* ən Əzəmətli, xeyri və bərəkəti bol Olandır!

تبارك الذي نزل الفرقان على عبده ليكون
للعالمين نذيرا ١

2. Göylərin və yerin səltənəti Ona məxsusdur. O, Özünə oğul götürməmişdir və səltənətində də şəriki olan yoxdur. O, bütün şeyləri xəlq etmiş və onlara münasib bir biçim vermişdir.

الذي له ملك السماوات والأرض ولم يتخذ
ولدا ولم يكن له شريك في الملك وخلق
كل شيء فقدره تقديرا ٢

3. *Kafirlər* isə Onun əvəzinə heç nəyə fayda verməyən, həm də özləri yaradılan, özlərinə nə bir zərər, nə də bir xeyir verməyə qadir olmayan, öldürməyə, həyat verməyə və yenidən diriltməyə qüdrəti olmayanları özlərinə məbud götürdülər.

واتخذوا من دونه آلهة لا يخلقون شيئا
وهم يخلقون ولا يملكون لأنفسهم
ضرا ولا نفعا ولا يملكون موتا ولا حياة
ولا نشورا ٣

4. Kafirlər: “Bu, *Muhəmmədin* uydurduğu yalandan başqa bir şey deyildir. Ona bu işdə başqa adamlar da kömək etmişlər”– dedilər. Beləcə, onlar haqsızlığa və iftiraya yol verdilər.

وقال الذين كفروا إن هذا إلا إفك
افتراه وأعانه عليه قوم آخرون فقد
جاءو ظلما وزورا ٤

5. Onlar: “Bu, keçmişdəkilərin nağıllarıdır. O bunları *başqasına* yazdırmışdır. Bunlar səhər-axşam onun özünə oxunur”– dedilər.

وقالوا أساطير الأولين اكتتبها فهي
تملى عليه بكرة وأصيلا ٥

6. De: “Onu göylərdə və yerdə olan sirləri bilən *Allah* nazil etmişdir. Həqiqətən, O, Bağışlayandır, Rəhmlidir!”

قُلْ أَنزَلَهُ ٱلَّذِى يَعْلَمُ ٱلسِّرَّ فِى ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضِ ۚ إِنَّهُۥ كَانَ غَفُورًا رَّحِيمًا ﴿٦﴾

7. Onlar dedilər: “*Bu* necə elçidir ki, yemək yeyir, bazarları gəzib dolaşır? Nə üçün ona özü ilə birlikdə xəbərdarlıq edən bir mələk göndərilmədi?

وَقَالُوا۟ مَالِ هَٰذَا ٱلرَّسُولِ يَأْكُلُ ٱلطَّعَامَ وَيَمْشِى فِى ٱلْأَسْوَاقِ ۙ لَوْلَآ أُنزِلَ إِلَيْهِ مَلَكٌ فَيَكُونَ مَعَهُۥ نَذِيرًا ﴿٧﴾

8. Niyə ona bir xəzinə verilmədi? Niyə meyvəsindən yeyib dolanmasından ötrü bir bağı olmadı?” Zalımlar: “Siz ancaq sehrlənmiş bir adamın ardınca gedirsiniz”– dedilər.

أَوْ يُلْقَىٰٓ إِلَيْهِ كَنزٌ أَوْ تَكُونُ لَهُۥ جَنَّةٌ يَأْكُلُ مِنْهَا ۚ وَقَالَ ٱلظَّٰلِمُونَ إِن تَتَّبِعُونَ إِلَّا رَجُلًا مَّسْحُورًا ﴿٨﴾

9. Gör sənə aid hansı məsəlləri çəkdilər! Onlar *haqq yoldan* azdılar və bir daha o yolu tapa bilməyəcəklər!

ٱنظُرْ كَيْفَ ضَرَبُوا۟ لَكَ ٱلْأَمْثَٰلَ فَضَلُّوا۟ فَلَا يَسْتَطِيعُونَ سَبِيلًا ﴿٩﴾

10. İstəsə, sənin üçün onların dediklərindən daha xeyirlisini, *ağacları* altından çaylar axan Cənnət bağlarını yaradan, sənin üçün qəsrlər inşa edə bilən *Allah* ən Əzəmətli, xeyri və bərəkəti bol Olandır.

تَبَارَكَ ٱلَّذِىٓ إِن شَآءَ جَعَلَ لَكَ خَيْرًا مِّن ذَٰلِكَ جَنَّٰتٍ تَجْرِى مِن تَحْتِهَا ٱلْأَنْهَٰرُ وَيَجْعَل لَّكَ قُصُورًۢا ﴿١٠﴾

11. Lakin onlar *Qiyamət* Saatını da yalan saydılar. Biz də onu yalan sayanlardan ötrü yandırıb-yaxan bir od hazırladıq.

بَلْ كَذَّبُوا۟ بِٱلسَّاعَةِ ۖ وَأَعْتَدْنَا لِمَن كَذَّبَ بِٱلسَّاعَةِ سَعِيرًا ﴿١١﴾

12. Onlar *Cəhənnəm* odunu uzaq məsafədən gördükdə belə onun necə qəzəblə qaynamasını duyacaq və xışıltısını eşidəcəklər.

إِذَا رَأَتْهُم مِّن مَّكَانٍۭ بَعِيدٍ سَمِعُوا۟ لَهَا تَغَيُّظًا وَزَفِيرًا ﴿١٢﴾

13. Onlar əlləri boynunda bağlı halda *Cəhənnəmin* dar bir yerinə atıldıqları zaman ölüm diləyərlər.

وَإِذَآ أُلۡقُواْ مِنۡهَا مَكَانٗا ضَيِّقٗا مُّقَرَّنِينَ
دَعَوۡاْ هُنَالِكَ ثُبُورٗا ١٣

14. *Onlara deyilər*: "Bu gün özünüzə bir ölüm deyil, çoxlu-çoxlu ölümlər istəyin!"

لَّا تَدۡعُواْ ٱلۡيَوۡمَ ثُبُورٗا وَٰحِدٗا وَٱدۡعُواْ ثُبُورٗا
كَثِيرٗا ١٤

15. De: "Bu yaxşıdır, yoxsa müttəqilərə bir mükafat və dönüş yeri olaraq vəd edilən Əbədiyyət bağı?"

قُلۡ أَذَٰلِكَ خَيۡرٌ أَمۡ جَنَّةُ ٱلۡخُلۡدِ ٱلَّتِي وُعِدَ
ٱلۡمُتَّقُونَۚ كَانَتۡ لَهُمۡ جَزَآءٗ وَمَصِيرٗا ١٥

16. Onlardan ötrü orada istədikləri hər şey vardır. Onlar orada əbədi qalacaqlar. Bu, sənin Rəbbinin Öz öhdəsinə götürdüyü *və yerinə yetirilməsi* arzu olunan bir vəddir.

لَّهُمۡ فِيهَا مَا يَشَآءُونَ خَٰلِدِينَۚ كَانَ
عَلَىٰ رَبِّكَ وَعۡدٗا مَّسۡـُٔولٗا ١٦

17. O gün *Allah* onları və onların Allahdan başqa sitayiş etdiklərinin hamısını məhşər ayağında cəm edərək deyəcək: "Mənim bu qullarımı *haqq yoldan* sizmi azdırdınız, yoxsa onlar özləri azdılar?"

وَيَوۡمَ يَحۡشُرُهُمۡ وَمَا يَعۡبُدُونَ مِن دُونِ
ٱللَّهِ فَيَقُولُ ءَأَنتُمۡ أَضۡلَلۡتُمۡ عِبَادِي
هَٰٓؤُلَآءِ أَمۡ هُمۡ ضَلُّواْ ٱلسَّبِيلَ ١٧

18. Onlar deyəcəklər: "Sən pak və müqəddəssən! Sənin əvəzinə özümüzə başqa himayədarlar götürmək bizə yaraşmaz. Lakin Sən onlara və atalarına o qədər firavanlıq nəsib etdin ki, axırda Zikri də yaddan çıxartdılar və məhvə məhkum olunmuş bir zümrəyə çevrildilər".

قَالُواْ سُبۡحَٰنَكَ مَا كَانَ يَنۢبَغِي لَنَآ أَن نَّتَّخِذَ
مِن دُونِكَ مِنۡ أَوۡلِيَآءَ وَلَٰكِن مَّتَّعۡتَهُمۡ
وَءَابَآءَهُمۡ حَتَّىٰ نَسُواْ ٱلذِّكۡرَ وَكَانُواْ
قَوۡمَۢا بُورٗا ١٨

19. *Kafirlərə deyiləcəkdir*: "Onlar sizin dediklərinizi təkzib etdilər. Artıq siz nə *əzabı özünüzdən* dəf edər, nə də başqa bir əlacınız qalmamışdır.

فَقَدۡ كَذَّبُوكُم بِمَا تَقُولُونَ فَمَا
تَسۡتَطِيعُونَ صَرۡفٗا وَلَا نَصۡرٗاۚ وَمَن يَظۡلِم
مِّنكُمۡ نُذِقۡهُ عَذَابٗا كَبِيرٗا ١٩

Zülm edənlərinizə böyük bir əzab daddıracağıq".

20. Səndən önçəki elçilərimiz də yemək yeyər, bazarları gəzib dolanardılar. Sizin bəzilərinizi digərlərinizlə sınaqdan keçirtdik ki, *görək* səbir edə biləcəksinizmi? Sənin Rəbbin Görəndir.

وَمَآ أَرۡسَلۡنَا قَبۡلَكَ مِنَ ٱلۡمُرۡسَلِينَ إِلَّآ إِنَّهُمۡ
لَيَأۡكُلُونَ ٱلطَّعَامَ وَيَمۡشُونَ فِي
ٱلۡأَسۡوَاقِۗ وَجَعَلۡنَا بَعۡضَكُمۡ لِبَعۡضٖ فِتۡنَةً
أَتَصۡبِرُونَۗ وَكَانَ رَبُّكَ بَصِيرٗا ٢٠

21. Bizimlə qarşılaşacaqlarını güman etməyənlər dedilər: "Nə üçün bizə mələklər göndərilmədi? Niyə biz Rəbbimizi görmürük?" Onlar özləri haqqında yüksək fikirdə oldular və böyük üsyankarlıq etdilər.

۞ وَقَالَ ٱلَّذِينَ لَا يَرۡجُونَ لِقَآءَنَا لَوۡلَآ أُنزِلَ
عَلَيۡنَا ٱلۡمَلَٰٓئِكَةُ أَوۡ نَرَىٰ رَبَّنَاۗ لَقَدِ
ٱسۡتَكۡبَرُواْ فِيٓ أَنفُسِهِمۡ وَعَتَوۡ عُتُوّٗا كَبِيرٗا ٢١

22. Məhz mələkləri görəcəkləri gün günahkarlara heç bir müjdə olmayacaqdır. Mələklər deyəcəklər: "Cənnətə girməyiniz qadağandır, qadağan!"

يَوۡمَ يَرَوۡنَ ٱلۡمَلَٰٓئِكَةَ لَا بُشۡرَىٰ يَوۡمَئِذٖ
لِّلۡمُجۡرِمِينَ وَيَقُولُونَ حِجۡرٗا مَّحۡجُورٗا ٢٢

23. Biz onların etdikləri əməllərə baxdıqdan sonra onları sovrulmuş toz dənəciklərinə çevirərik.

وَقَدِمۡنَآ إِلَىٰ مَا عَمِلُواْ مِنۡ عَمَلٖ فَجَعَلۡنَٰهُ
هَبَآءٗ مَّنثُورًا ٢٣

24. Həmin gün Cənnət sakinlərinin qalacağı yer daha lətafətli və istirahət edəcəyi yer daha gözəl olacaqdır.

أَصۡحَٰبُ ٱلۡجَنَّةِ يَوۡمَئِذٍ خَيۡرٞ مُّسۡتَقَرّٗا
وَأَحۡسَنُ مَقِيلٗا ٢٤

25. Həmin gün göy buludla parçalanacaq və mələklər yerə endiriləcəkdir.

وَيَوۡمَ تَشَقَّقُ ٱلسَّمَآءُ بِٱلۡغَمَٰمِ وَنُزِّلَ ٱلۡمَلَٰٓئِكَةُ
تَنزِيلًا ٢٥

26. Həmin gün gerçək hökm vermək ancaq Mərhəmətli Allaha məxsusdur. O, kafirlər üçün çətin bir gün olacaqdır.

ٱلۡمُلۡكُ يَوۡمَئِذٍ ٱلۡحَقُّ لِلرَّحۡمَٰنِۚ وَكَانَ يَوۡمًا
عَلَى ٱلۡكَٰفِرِينَ عَسِيرٗا ٢٦

**27.** Həmin gün zalım kimsə barmaqlarını dişləyərək deyəcəkdir: “Kaş ki, mən Peyğəmbərin yolunu tutub gedəydim!

وَيَوْمَ يَعَضُّ ٱلظَّالِمُ عَلَىٰ يَدَيْهِ يَقُولُ
يَٰلَيْتَنِي ٱتَّخَذْتُ مَعَ ٱلرَّسُولِ سَبِيلًا ﴿٢٧﴾

**28.** Vay halıma! Kaş ki, filankəslə dost olmayaydım!

يَٰوَيْلَتَىٰ لَيْتَنِي لَمْ أَتَّخِذْ فُلَانًا خَلِيلًا ﴿٢٨﴾

**29.** Çünki Zikr mənə çatdıqdan sonra o məni ondan uzaqlaşdırdı”. Həqiqətən, şeytan insanı tənha qoyub qaçandır.

لَّقَدْ أَضَلَّنِي عَنِ ٱلذِّكْرِ بَعْدَ إِذْ جَآءَنِي ۗ
وَكَانَ ٱلشَّيْطَٰنُ لِلْإِنسَٰنِ خَذُولًا ﴿٢٩﴾

**30.** Peyğəmbər: “Ey Rəbbim! Qövmüm bu Quranı tərk etdi!”– deyəcək.

وَقَالَ ٱلرَّسُولُ يَٰرَبِّ إِنَّ قَوْمِي ٱتَّخَذُوا۟ هَٰذَا
ٱلْقُرْءَانَ مَهْجُورًا ﴿٣٠﴾

**31.** Beləcə, Biz hər peyğəmbər üçün günahkarlardan bir düşmən etdik. Doğru yol göstəricisi və yardımçı olaraq Rəbbin sənə yetər.

وَكَذَٰلِكَ جَعَلْنَا لِكُلِّ نَبِيٍّ عَدُوًّا مِّنَ
ٱلْمُجْرِمِينَ ۗ وَكَفَىٰ بِرَبِّكَ هَادِيًا وَنَصِيرًا ﴿٣١﴾

**32.** Kafirlər dedilər: “Nə üçün Quran ona bir dəfəlik bütöv nazil olmadı?” Biz onu sənin qəlbini möhkəmləndirmək üçün tədricən nazil etdik və onu ən gözəl şəkildə ayəbəayə izah etdik.

وَقَالَ ٱلَّذِينَ كَفَرُوا۟ لَوْلَا نُزِّلَ عَلَيْهِ ٱلْقُرْءَانُ
جُمْلَةً وَٰحِدَةً ۚ كَذَٰلِكَ لِنُثَبِّتَ بِهِۦ فُؤَادَكَ ۖ
وَرَتَّلْنَٰهُ تَرْتِيلًا ﴿٣٢﴾

**33.** Onlar sənin yanına gəlib elə bir məsəl çəkməzlər ki, ona cavab olaraq Biz sənə haqqı və ən yaxşı yozumu verməyək.

وَلَا يَأْتُونَكَ بِمَثَلٍ إِلَّا جِئْنَٰكَ بِٱلْحَقِّ
وَأَحْسَنَ تَفْسِيرًا ﴿٣٣﴾

**34.** Üzüstə sürüklənib Cəhənnəmə toplanılacaq kimsələr – məhz onlar yerləri ən pis olan, haqq yoldan ən çox azan kimsələrdir.

ٱلَّذِينَ يُحْشَرُونَ عَلَىٰ وُجُوهِهِمْ إِلَىٰ جَهَنَّمَ
أُو۟لَٰٓئِكَ شَرٌّ مَّكَانًا وَأَضَلُّ سَبِيلًا ﴿٣٤﴾

**35.** Həqiqətən, Kitabı Musaya Biz verdik və qardaşı Harunu da ona köməkçi etdik.

وَلَقَدْ ءَاتَيْنَا مُوسَى ٱلْكِتَٰبَ وَجَعَلْنَا مَعَهُۥٓ
أَخَاهُ هَٰرُونَ وَزِيرًا ﴿٣٥﴾

**36.** Onlara: "Ayələrimizi yalan sayan bir tayfanın yanına gedin!"- dedik. Sonra Biz o tayfanı yerli-dibli yox etdik.

فَقُلْنَا ٱذْهَبَآ إِلَى ٱلْقَوْمِ ٱلَّذِينَ كَذَّبُوا۟
بِـَٔايَٰتِنَا فَدَمَّرْنَٰهُمْ تَدْمِيرًا ٣٦

**37.** Biz Nuh qövmünü elçiləri yalançı saydıqları zaman suda batırdıq və onları insanlar üçün bir ibrət etdik. Biz zalımlar üçün ağrılı-acılı bir əzab hazırlamışıq.

وَقَوْمَ نُوحٍ لَّمَّا كَذَّبُوا۟ ٱلرُّسُلَ أَغْرَقْنَٰهُمْ
وَجَعَلْنَٰهُمْ لِلنَّاسِ ءَايَةً ۖ وَأَعْتَدْنَا لِلظَّٰلِمِينَ
عَذَابًا أَلِيمًا ٣٧

**38.** Biz Adı, Səmudu, Rəss əhlini və onların arasında olan bir çox nəsilləri də məhv etdik.

وَعَادًا وَثَمُودَا۟ وَأَصْحَٰبَ ٱلرَّسِّ وَقُرُونًۢا
بَيْنَ ذَٰلِكَ كَثِيرًا ٣٨

**39.** Biz onların hamısına məsəllər çəkdik və onların hamısını büsbütün məhv etdik.

وَكُلًّا ضَرَبْنَا لَهُ ٱلْأَمْثَٰلَ ۖ وَكُلًّا
تَبَّرْنَا تَتْبِيرًا ٣٩

**40.** Məkkə müşrikləri bəla yağmuru düşüb viran qalmış şəhərin yanından keçmişdilər. Məgər onlar onu görməmişdilər? Xeyr, onlar öldükdən sonra dirilməyə inanmırlar.

وَلَقَدْ أَتَوْا۟ عَلَى ٱلْقَرْيَةِ ٱلَّتِىٓ أُمْطِرَتْ مَطَرَ
ٱلسَّوْءِ ۚ أَفَلَمْ يَكُونُوا۟ يَرَوْنَهَا ۚ بَلْ كَانُوا۟
لَا يَرْجُونَ نُشُورًا ٤٠

**41.** Onlar səni gördükdə ancaq sənə lağ edir və deyirlər: "Budurmu Allahın elçi göndərdiyi kəs?

وَإِذَا رَأَوْكَ إِن يَتَّخِذُونَكَ إِلَّا هُزُوًا أَهَٰذَا
ٱلَّذِى بَعَثَ ٱللَّهُ رَسُولًا ٤١

**42.** Əgər biz məbudlarımıza tapınmaqda səbirli olmasaydıq, az qala o bizi onlardan uzaqlaşdıracaqdı". Onlar əzabı gördükləri zaman kimin haqq yoldan daha çox azdığını anlayacaqlar.

إِن كَادَ لَيُضِلُّنَا عَنْ ءَالِهَتِنَا لَوْلَآ أَن
صَبَرْنَا عَلَيْهَا ۚ وَسَوْفَ يَعْلَمُونَ حِينَ
يَرَوْنَ ٱلْعَذَابَ مَنْ أَضَلُّ سَبِيلًا ٤٢

**43.** Nəfsinin istəyini ilahiləşdirən kimsəni gördünmü? Sən ona vəkillikmi edəcəksən?

أَرَءَيْتَ مَنِ ٱتَّخَذَ إِلَٰهَهُۥ هَوَىٰهُ أَفَأَنتَ
تَكُونُ عَلَيْهِ وَكِيلًا ٤٣

44. Yoxsa elə hesab edirsən ki, onların əksəriyyəti eşidəcək və ya anlayacaq? Onlar heyvan kimidirlər, hətta, haqq yoldan daha çox uzaqlaşmışlar.

أَمْ تَحْسَبُ أَنَّ أَكْثَرَهُمْ يَسْمَعُونَ أَوْ يَعْقِلُونَ ۚ إِنْ هُمْ إِلَّا كَالْأَنْعَامِ ۖ بَلْ هُمْ أَضَلُّ سَبِيلًا ﴿٤٤﴾

45. Məgər Rəbbinin kölgəni necə uzatdığını görmürsənmi? Əgər O istəsəydi, onu hərəkətsiz halda saxlayardı. Sonra Biz günəşi onun bələdçisi etdik.

أَلَمْ تَرَ إِلَىٰ رَبِّكَ كَيْفَ مَدَّ الظِّلَّ وَلَوْ شَاءَ لَجَعَلَهُ سَاكِنًا ثُمَّ جَعَلْنَا الشَّمْسَ عَلَيْهِ دَلِيلًا ﴿٤٥﴾

46. Sonra o kölgəni yavaş-yavaş Özümüzə tərəf çəkdik.

ثُمَّ قَبَضْنَاهُ إِلَيْنَا قَبْضًا يَسِيرًا ﴿٤٦﴾

47. Sizin üçün gecəni örtük, yuxunu rahatlıq, gündüzü də canlanma vaxtı edən Odur.

وَهُوَ الَّذِي جَعَلَ لَكُمُ اللَّيْلَ لِبَاسًا وَالنَّوْمَ سُبَاتًا وَجَعَلَ النَّهَارَ نُشُورًا ﴿٤٧﴾

48. Küləkləri Öz mərhəməti önündə yağışdan qabaq müjdəçi olaraq göndərən Odur. Biz göydən tərtəmiz su endirdik ki,

وَهُوَ الَّذِي أَرْسَلَ الرِّيَاحَ بُشْرًا بَيْنَ يَدَيْ رَحْمَتِهِ ۚ وَأَنْزَلْنَا مِنَ السَّمَاءِ مَاءً طَهُورًا ﴿٤٨﴾

49. onunla ölü bir diyarı canlandıraq, yaratdığımız neçə-neçə heyvanlara və neçə-neçə insanlara ondan içirdək.

لِنُحْيِيَ بِهِ بَلْدَةً مَيْتًا وَنُسْقِيَهُ مِمَّا خَلَقْنَا أَنْعَامًا وَأَنَاسِيَّ كَثِيرًا ﴿٤٩﴾

50. Biz düşünüb ibrət alsınlar deyə o suyu onların arasında paylaşdırdıq. Lakin insanların çoxu küfrdən başqa bir şey qəbul etmədilər.

وَلَقَدْ صَرَّفْنَاهُ بَيْنَهُمْ لِيَذَّكَّرُوا فَأَبَىٰ أَكْثَرُ النَّاسِ إِلَّا كُفُورًا ﴿٥٠﴾

51. Əgər istəsəydik, hər kəndə qorxudan bir peyğəmbər göndərərdik.

وَلَوْ شِئْنَا لَبَعَثْنَا فِي كُلِّ قَرْيَةٍ نَذِيرًا ﴿٥١﴾

52. Belə olduqda sən kafirlərə baş əymə və onlara qarşı bu Quranla böyük bir cihad et!

فَلَا تُطِعِ الْكَافِرِينَ وَجَاهِدْهُمْ بِهِ جِهَادًا كَبِيرًا ﴿٥٢﴾

53. Birinin suyu dadlı və şirin, digərininki isə duzlu və acı olan iki dənizi qovuşduraraq aralarında maneə və keçilməz sədd qoyan Odur.

۞ وَهُوَ ٱلَّذِى مَرَجَ ٱلْبَحْرَيْنِ هَٰذَا عَذْبٌ فُرَاتٌ وَهَٰذَا مِلْحٌ أُجَاجٌ وَجَعَلَ بَيْنَهُمَا بَرْزَخًا وَحِجْرًا مَّحْجُورًا ﴿٥٣﴾

54. Sudan insan yaradan, ona qan qohumları və sonradan qohum olanları bəxş edən Odur. Rəbbin hər şeyə Qadirdir.

وَهُوَ ٱلَّذِى خَلَقَ مِنَ ٱلْمَآءِ بَشَرًا فَجَعَلَهُۥ نَسَبًا وَصِهْرًا ۗ وَكَانَ رَبُّكَ قَدِيرًا ﴿٥٤﴾

55. Onlar Allahı qoyub özlərinə nə xeyir, nə də zərər verə bilməyənlərə ibadət edirlər. Kafir öz Rəbbinə qarşı şeytana köməkçidir.

وَيَعْبُدُونَ مِن دُونِ ٱللَّهِ مَا لَا يَنفَعُهُمْ وَلَا يَضُرُّهُمْ ۗ وَكَانَ ٱلْكَافِرُ عَلَىٰ رَبِّهِۦ ظَهِيرًا ﴿٥٥﴾

56. Biz səni ancaq müjdə verən və xəbərdarlıq edən kimi göndərdik.

وَمَآ أَرْسَلْنَٰكَ إِلَّا مُبَشِّرًا وَنَذِيرًا ﴿٥٦﴾

57. De: “Mən bunun əvəzinə sizdən heç bir mükafat istəmirəm. Təkcə onu istəyirəm ki, insanlar Rəbbinə tərəf aparan bir yol tutsunlar”.

قُلْ مَآ أَسْـَٔلُكُمْ عَلَيْهِ مِنْ أَجْرٍ إِلَّا مَن شَآءَ أَن يَتَّخِذَ إِلَىٰ رَبِّهِۦ سَبِيلًا ﴿٥٧﴾

58. Ölməz, əbədi Yaşayana təvəkkül et və Onu həmd-səna ilə təriflə. Onun Öz qullarının günahlarından agah olması kifayətdir.

وَتَوَكَّلْ عَلَى ٱلْحَىِّ ٱلَّذِى لَا يَمُوتُ وَسَبِّحْ بِحَمْدِهِۦ ۚ وَكَفَىٰ بِهِۦ بِذُنُوبِ عِبَادِهِۦ خَبِيرًا ﴿٥٨﴾

59. O, göyləri, yeri və onların arasındakıları altı gündə yaratdı, sonra da Ərşə ucaldı. O, Mərhəmətli Allahdır. Bunu biləndən soruş!

ٱلَّذِى خَلَقَ ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضَ وَمَا بَيْنَهُمَا فِى سِتَّةِ أَيَّامٍ ثُمَّ ٱسْتَوَىٰ عَلَى ٱلْعَرْشِ ۚ ٱلرَّحْمَٰنُ فَسْـَٔلْ بِهِۦ خَبِيرًا ﴿٥٩﴾

60. Onlara: “Mərhəmətli Allaha səcdə edin!”– deyildikdə: “Mərhəmətli Allah nədir? Məgər bizə əmr etdiyin şeyə səcdə etməliyik?”– deyərlər. Bu da onların nifrətini artırar.

وَإِذَا قِيلَ لَهُمُ ٱسْجُدُوا۟ لِلرَّحْمَٰنِ قَالُوا۟ وَمَا ٱلرَّحْمَٰنُ أَنَسْجُدُ لِمَا تَأْمُرُنَا وَزَادَهُمْ نُفُورًا ۩ ﴿٦٠﴾

61. Səmada bürclər qoyan və orada günəş və nurlu bir ay yaradan *Allah* ən Əzəmətli, xeyri və bərəkəti bol Olandır.

تَبَارَكَ ٱلَّذِى جَعَلَ فِى ٱلسَّمَآءِ بُرُوجًا
وَجَعَلَ فِيهَا سِرَٰجًا وَقَمَرًا مُّنِيرًا ٦١

62. Yada salmaq və şükür etmək istəyənlər üçün gecə ilə gündüzü bir-birinin ardınca gətirən Odur.

وَهُوَ ٱلَّذِى جَعَلَ ٱلَّيْلَ وَٱلنَّهَارَ خِلْفَةً لِّمَنْ
أَرَادَ أَن يَذَّكَّرَ أَوْ أَرَادَ شُكُورًا ٦٢

63. Mərhəmətli Allahın qulları o kəslərdir ki, onlar yer üzündə təvazökarlıqla gəzər, cahillər onlara xoşagəlməz bir söz dedikdə: "Salam!"- deyərlər.

وَعِبَادُ ٱلرَّحْمَٰنِ ٱلَّذِينَ يَمْشُونَ عَلَى ٱلْأَرْضِ هَوْنًا
وَإِذَا خَاطَبَهُمُ ٱلْجَٰهِلُونَ قَالُوا۟ سَلَٰمًا ٦٣

64. Onlar gecələrini Rəbbi üçün səcdədə və qiyamda keçirərlər.

وَٱلَّذِينَ يَبِيتُونَ لِرَبِّهِمْ سُجَّدًا وَقِيَٰمًا ٦٤

65. Onlar deyərlər: "Ey Rəbbimiz! Cəhənnəm əzabını bizdən uzaq elə. Doğrusu, onun əzabı həmişəlikdir.

وَٱلَّذِينَ يَقُولُونَ رَبَّنَا ٱصْرِفْ عَنَّا عَذَابَ
جَهَنَّمَ إِنَّ عَذَابَهَا كَانَ غَرَامًا ٦٥

66. Həqiqətən, ora nə pis məskən, necə də pis iqamətgahdır!"

إِنَّهَا سَآءَتْ مُسْتَقَرًّا وَمُقَامًا ٦٦

67. Onlar mallarını xərclədikdə nə israfçılıq, nə də xəsislik edər, bunların arasında orta bir yol tutarlar.

وَٱلَّذِينَ إِذَآ أَنفَقُوا۟ لَمْ يُسْرِفُوا۟ وَلَمْ يَقْتُرُوا۟
وَكَانَ بَيْنَ ذَٰلِكَ قَوَامًا ٦٧

68. Onlar Allahla yanaşı başqa məbuda yalvarmaz, Allahın haram etdiyi cana haqsız yerə qıymaz və zina etməzlər. Bunu edən kimsə cəzalandırılar.

وَٱلَّذِينَ لَا يَدْعُونَ مَعَ ٱللَّهِ إِلَٰهًا ءَاخَرَ وَلَا
يَقْتُلُونَ ٱلنَّفْسَ ٱلَّتِى حَرَّمَ ٱللَّهُ إِلَّا بِٱلْحَقِّ
وَلَا يَزْنُونَ وَمَن يَفْعَلْ ذَٰلِكَ يَلْقَ أَثَامًا ٦٨

69. Qiyamət günü onun əzabı qat-qat artırılar və onun içində zəlil olub əbədi qalar.

يُضَٰعَفْ لَهُ ٱلْعَذَابُ يَوْمَ ٱلْقِيَٰمَةِ وَيَخْلُدْ
فِيهِۦ مُهَانًا ٦٩

70. Ancaq tövbə edib iman gətirən və saleh əməllər edənlərdən başqa.

إِلَّا مَن تَابَ وَءَامَنَ وَعَمِلَ عَمَلًا صَٰلِحًا

فَأُولَٰٓئِكَ يُبَدِّلُ ٱللَّهُ سَيِّـَٔاتِهِمْ حَسَنَٰتٍۗ وَكَانَ ٱللَّهُ غَفُورًا رَّحِيمًا ﴿٧٠﴾

Allah onların pis əməllərini yaxşı əməllərlə əvəz edər. Allah Bağışlayandır, Rəhmlidir!

وَمَن تَابَ وَعَمِلَ صَٰلِحًا فَإِنَّهُۥ يَتُوبُ إِلَى ٱللَّهِ مَتَابًا ﴿٧١﴾

71. Kim tövbə edib yaxşı iş görərsə, o, doğrudan da Allaha tərəf qayıtmış olar.

وَٱلَّذِينَ لَا يَشْهَدُونَ ٱلزُّورَ وَإِذَا مَرُّوا۟ بِٱللَّغْوِ مَرُّوا۟ كِرَامًا ﴿٧٢﴾

72. Onlar yalandan şahidlik etməz, lağlağı məclisinə rast gəldikdə oradan ləyaqətlə ötüb keçərlər.

وَٱلَّذِينَ إِذَا ذُكِّرُوا۟ بِـَٔايَٰتِ رَبِّهِمْ لَمْ يَخِرُّوا۟ عَلَيْهَا صُمًّا وَعُمْيَانًا ﴿٧٣﴾

73. Onlara Rəbbinin ayələri xatırlandığı zaman o ayələrə qarşı kar və kor kimi davranmazlar.

وَٱلَّذِينَ يَقُولُونَ رَبَّنَا هَبْ لَنَا مِنْ أَزْوَٰجِنَا وَذُرِّيَّٰتِنَا قُرَّةَ أَعْيُنٍ وَٱجْعَلْنَا لِلْمُتَّقِينَ إِمَامًا ﴿٧٤﴾

74. Onlar deyərlər: “Ey Rəbbimiz! Bizə gözümüzün aydınlığı olan zövcələr və övladlar bəxş et və bizi müttəqilərə imam et!”

أُو۟لَٰٓئِكَ يُجْزَوْنَ ٱلْغُرْفَةَ بِمَا صَبَرُوا۟ وَيُلَقَّوْنَ فِيهَا تَحِيَّةً وَسَلَٰمًا ﴿٧٥﴾

75. Onlar səbir etdiklərinə görə Cənnətdə olan yüksək məqamla mükafatlandırılacaq, orada xeyir-dua ilə, salamla qarşılanacaqlar.

خَٰلِدِينَ فِيهَاۚ حَسُنَتْ مُسْتَقَرًّا وَمُقَامًا ﴿٧٦﴾

76. Onlar orada əbədi qalacaqlar. Ora nə gözəl məskən, necə də gözəl iqamətgahdır!

قُلْ مَا يَعْبَؤُا۟ بِكُمْ رَبِّى لَوْلَا دُعَآؤُكُمْۖ فَقَدْ كَذَّبْتُمْ فَسَوْفَ يَكُونُ لِزَامًۢا ﴿٧٧﴾

77. De: “Əgər yalvarmağınız olmasaydı, Rəbbim sizə diqqət yetirməzdi. Siz haqqı yalan saydınız. Ona görə də əzab sizi rahat buraxmayacaqdır!”



## əş-Şuara
## («Şairlər») surəsi

## سُورَةُ الشُّعَرَاءِ

*Mərhəmətli və Rəhmli*
*Allahın adı ilə!*

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

1. Ta. Sin. Mim.

طسٓمٓ ۝١

2. Bunlar aydın Kitabın ayələridir.

تِلۡكَ ءَايَٰتُ ٱلۡكِتَٰبِ ٱلۡمُبِينِ ۝٢

3. Onların iman gətirmədiyinə görə özünü həlakmı edəcəksən?

لَعَلَّكَ بَٰخِعٞ نَّفۡسَكَ أَلَّا يَكُونُواْ مُؤۡمِنِينَ ۝٣

4. Biz istəsəydik, göydən onlara elə bir əlamət göndərərdik ki, onun önündə başları itaətkarlıqla əyilərdi.

إِن نَّشَأۡ نُنَزِّلۡ عَلَيۡهِم مِّنَ ٱلسَّمَآءِ ءَايَةٗ فَظَلَّتۡ
أَعۡنَٰقُهُمۡ لَهَا خَٰضِعِينَ ۝٤

5. Mərhəmətli *Allahdan* onlara elə bir ayə gəlməz ki, ondan üz çevirməsinlər.

وَمَا يَأۡتِيهِم مِّن ذِكۡرٖ مِّنَ ٱلرَّحۡمَٰنِ مُحۡدَثٍ إِلَّا كَانُواْ
عَنۡهُ مُعۡرِضِينَ ۝٥

6. Onlar *ayələri* uydurma saydılar. Məsxərəyə qoyduqlarının xəbəri onlara yetişəcəkdir.

فَقَدۡ كَذَّبُواْ فَسَيَأۡتِيهِمۡ أَنۢبَٰٓؤُاْ مَا كَانُواْ بِهِۦ
يَسۡتَهۡزِءُونَ ۝٦

7. Yoxsa, onlar yer üzündə cürbəcür gözəl bitkilər bitirdiyimizi görmürlər?

أَوَلَمۡ يَرَوۡاْ إِلَى ٱلۡأَرۡضِ كَمۡ أَنۢبَتۡنَا فِيهَا مِن كُلِّ زَوۡجٖ
كَرِيمٍ ۝٧

8. Həqiqətən də, bunda bir əlamət vardır. Lakin onların əksəriyyəti mömin olmadı.

إِنَّ فِي ذَٰلِكَ لَأٓيَةٗۖ وَمَا كَانَ أَكۡثَرُهُم مُّؤۡمِنِينَ ۝٨

9. Bəli, sənin Rəbbin Qüdrətlidir, Rəhmlidir.

وَإِنَّ رَبَّكَ لَهُوَ ٱلۡعَزِيزُ ٱلرَّحِيمُ ۝٩

10. Bir zaman Rəbbin Musaya demişdi: “Get o zalım qövmün –

وَإِذۡ نَادَىٰ رَبُّكَ مُوسَىٰٓ أَنِ ٱئۡتِ ٱلۡقَوۡمَ ٱلظَّٰلِمِينَ ۝١٠

11. Firon xalqının yanına! Onlar qorxmurlarmı?”

قَوۡمَ فِرۡعَوۡنَۚ أَلَا يَتَّقُونَ ۝١١

**12.** *Musa* dedi: "Ey Rəbbim! Qorxuram ki, onlar məni yalançı hesab edələr,

قَالَ رَبِّ إِنِّيٓ أَخَافُ أَن يُكَذِّبُونِ ١٢

**13.** *belə olduqda* ürəyim sıxılar, dilim də söz tutmaz. Buna görə Haruna da *vəhy* göndər.

وَيَضِيقُ صَدۡرِي وَلَا يَنطَلِقُ لِسَانِي فَأَرۡسِلۡ
إِلَىٰ هَٰرُونَ ١٣

**14.** Onların məndən əvəzini çıxmaq istədikləri bir günahım da var. Buna görə məni öldürəcəklərindən qorxuram".

وَلَهُمۡ عَلَيَّ ذَنۢبٞ فَأَخَافُ أَن يَقۡتُلُونِ ١٤

**15.** *Allah* dedi: "Xeyr, *bu mümkün deyil*! İkiniz də möcüzələrimizlə *onların yanına* gedin! Şübhəsiz ki, Biz də sizinləyik, *hər şeyi* eşidirik.

قَالَ كَلَّاۖ فَٱذۡهَبَا بِـَٔايَٰتِنَآۖ إِنَّا مَعَكُم
مُّسۡتَمِعُونَ ١٥

**16.** Fironun yanına gedib deyin: "Biz aləmlərin Rəbbinin elçiləriyik!

فَأۡتِيَا فِرۡعَوۡنَ فَقُولَآ إِنَّا رَسُولُ رَبِّ ٱلۡعَٰلَمِينَ ١٦

**17.** İsrail oğullarını bizimlə birgə göndər!"

أَنۡ أَرۡسِلۡ مَعَنَا بَنِيٓ إِسۡرَٰٓءِيلَ ١٧

**18.** *Firon* dedi: "Biz səni körpə ikən *götürüb saxlayıb* boya-başa çatdırmadıqmı? Sən ömrünün bəzi illərini bizimlə yaşamadınmı?

قَالَ أَلَمۡ نُرَبِّكَ فِينَا وَلِيدٗا وَلَبِثۡتَ فِينَا مِنۡ
عُمُرِكَ سِنِينَ ١٨

**19.** Elədiyin *pis* əməli də elədin. *Doğrudan da*, sən bir nankorsan!"

وَفَعَلۡتَ فَعۡلَتَكَ ٱلَّتِي فَعَلۡتَ وَأَنتَ مِنَ
ٱلۡكَٰفِرِينَ ١٩

**20.** *Musa* dedi: "Mən onu edəndə nadan olmuşam.

قَالَ فَعَلۡتُهَآ إِذٗا وَأَنَا۠ مِنَ ٱلضَّآلِّينَ ٢٠

**21.** Mən sizdən qorxduğum üçün yanınızdan qaçıb getdim. Amma sonradan Rəbbim mənə hökmranlıq verdi və məni elçilərdən etdi.

فَفَرَرۡتُ مِنكُمۡ لَمَّا خِفۡتُكُمۡ فَوَهَبَ لِي رَبِّي حُكۡمٗا
وَجَعَلَنِي مِنَ ٱلۡمُرۡسَلِينَ ٢١

**22.** Başıma qaxdığın o nemətin də İsrail oğullarını özünə kölə etməyindir".

وَتِلْكَ نِعْمَةٌ تَمُنُّهَا عَلَيَّ أَنْ عَبَّدتَّ بَنِيٓ
إِسْرَٰٓءِيلَ ﴿٢٢﴾

**23.** Firon dedi: "Aləmlərin Rəbbi nədir?"

قَالَ فِرْعَوْنُ وَمَا رَبُّ ٱلْعَٰلَمِينَ ﴿٢٣﴾

**24.** *Musa* dedi: "Əgər yəqinliklə inanırsınızsa, *bilin ki*, O, göylərin, yerin və onların arasında olanların Rəbbidir!"

قَالَ رَبُّ ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضِ وَمَا بَيْنَهُمَآ إِن
كُنتُم مُّوقِنِينَ ﴿٢٤﴾

**25.** Firon ətrafındakılara dedi: "*Onun nə danışdığını* eşitmirsinizmi?"

قَالَ لِمَنْ حَوْلَهُۥٓ أَلَا تَسْتَمِعُونَ ﴿٢٥﴾

**26.** *Musa* dedi: "O sizin də, ulu babalarınızın da Rəbbidir!"

قَالَ رَبُّكُمْ وَرَبُّ ءَابَآئِكُمُ ٱلْأَوَّلِينَ ﴿٢٦﴾

**27.** *Firon* dedi: "Sizə göndərilmiş bu elçi, sözsüz ki, dəlidir!"

قَالَ إِنَّ رَسُولَكُمُ ٱلَّذِيٓ أُرْسِلَ إِلَيْكُمْ
لَمَجْنُونٌ ﴿٢٧﴾

**28.** *Musa* dedi: "Əgər anlayırsınızsa, *bilin ki*, O, şərqin, qərbin və bunların arasında olanların Rəbbidir!"

قَالَ رَبُّ ٱلْمَشْرِقِ وَٱلْمَغْرِبِ وَمَا بَيْنَهُمَآ
إِن كُنتُمْ تَعْقِلُونَ ﴿٢٨﴾

**29.** *Firon* dedi: "Əgər məndən başqasına sitayiş etsən, səni məhbusların yanına ataram!"

قَالَ لَئِنِ ٱتَّخَذْتَ إِلَٰهًا غَيْرِي لَأَجْعَلَنَّكَ
مِنَ ٱلْمَسْجُونِينَ ﴿٢٩﴾

**30.** *Musa* dedi: "Bəs sənə açıq-aşkar bir şey göstərsəm necə?"

قَالَ أَوَلَوْ جِئْتُكَ بِشَيْءٍ مُّبِينٍ ﴿٣٠﴾

**31.** *Firon* dedi: "Əgər doğru danışanlardansansa, göstər onu!"

قَالَ فَأْتِ بِهِۦٓ إِن كُنتَ مِنَ ٱلصَّٰدِقِينَ ﴿٣١﴾

**32.** *Musa* əsasını *yerə* atınca, o dərhal dönüb açıq-aşkar bir ilana çevrildi.

فَأَلْقَىٰ عَصَاهُ فَإِذَا هِيَ ثُعْبَانٌ مُّبِينٌ ﴿٣٢﴾

**33.** Əlini *qoynundan* çıxardan kimi o, baxanların *gözü qabağında* ağappaq *nur saçan bir əl* oldu.

وَنَزَعَ يَدَهُۥ فَإِذَا هِيَ بَيْضَآءُ لِلنَّٰظِرِينَ ﴿٣٣﴾

34. *Firon* ətrafındakı zadəganlara dedi: “Həqiqətən də, bu, bilikli bir sehrbazdır!

قَالَ لِلْمَلَإِ حَوْلَهُۥٓ إِنَّ هَٰذَا لَسَٰحِرٌ عَلِيمٌ ﴿٣٤﴾

35. O öz sehri ilə sizi torpağınızdan çıxartmaq istəyir. Nə təklif edirsiniz?”

يُرِيدُ أَن يُخْرِجَكُم مِّنْ أَرْضِكُم بِسِحْرِهِۦ فَمَاذَا تَأْمُرُونَ ﴿٣٥﴾

36. Onlar dedilər: “Onu qardaşı ilə bir qədər gözlət və şəhərlərə *adam* yığanlar göndər ki,

قَالُوٓا۟ أَرْجِهْ وَأَخَاهُ وَٱبْعَثْ فِى ٱلْمَدَآئِنِ حَٰشِرِينَ ﴿٣٦﴾

37. bütün bilikli sehrbazları sənin yanına gətirsinlər”.

يَأْتُوكَ بِكُلِّ سَحَّارٍ عَلِيمٍ ﴿٣٧﴾

38. Beləliklə, sehrbazlar bəlli bir günün müəyyən edilmiş vaxtında toplandılar.

فَجُمِعَ ٱلسَّحَرَةُ لِمِيقَٰتِ يَوْمٍ مَّعْلُومٍ ﴿٣٨﴾

39. Camaata deyildi: “Siz də yığışırsınızmı?

وَقِيلَ لِلنَّاسِ هَلْ أَنتُم مُّجْتَمِعُونَ ﴿٣٩﴾

40. Əgər sehrbazlar qalib gəlsələr, ola bilsin ki, biz də onlara tabe olaq”.

لَعَلَّنَا نَتَّبِعُ ٱلسَّحَرَةَ إِن كَانُوا۟ هُمُ ٱلْغَٰلِبِينَ ﴿٤٠﴾

41. Sehrbazlar gələn kimi Firona dedilər: “Əgər qalib gəlsək, bizə mükafat veriləcəkmi?”

فَلَمَّا جَآءَ ٱلسَّحَرَةُ قَالُوا۟ لِفِرْعَوْنَ أَئِنَّ لَنَا لَأَجْرًا إِن كُنَّا نَحْنُ ٱلْغَٰلِبِينَ ﴿٤١﴾

42. *Firon* dedi: “Bəli! Belə olacağı təqdirdə sizi *özümə* yaxın adamlardan edəcəyəm”.

قَالَ نَعَمْ وَإِنَّكُمْ إِذًا لَّمِنَ ٱلْمُقَرَّبِينَ ﴿٤٢﴾

43. Musa onlara dedi: “Nə atacaqsınızsa, atın!”

قَالَ لَهُم مُّوسَىٰٓ أَلْقُوا۟ مَآ أَنتُم مُّلْقُونَ ﴿٤٣﴾

44. Onlar iplərini və əsalarını yerə atıb: “Fironun qüdrətinə and olsun ki, biz qalib gələcəyik!”– dedilər.

فَأَلْقَوْا۟ حِبَالَهُمْ وَعِصِيَّهُمْ وَقَالُوا۟ بِعِزَّةِ فِرْعَوْنَ إِنَّا لَنَحْنُ ٱلْغَٰلِبُونَ ﴿٤٤﴾

**45.** Sonra Musa əsasını atdı və *əsa* onların düzəltdikləri şeyləri uddu.

فَأَلْقَىٰ مُوسَىٰ عَصَاهُ فَإِذَا هِيَ تَلْقَفُ مَا يَأْفِكُونَ ﴿٤٥﴾

**46.** Sehrbazlar səcdəyə qapandılar

فَأُلْقِيَ ٱلسَّحَرَةُ سَٰجِدِينَ ﴿٤٦﴾

**47.** və dedilər: "Biz iman gətirdik aləmlərin Rəbbinə –

قَالُوٓاْ ءَامَنَّا بِرَبِّ ٱلْعَٰلَمِينَ ﴿٤٧﴾

**48.** Musanın və Harunun Rəbbinə!"

رَبِّ مُوسَىٰ وَهَٰرُونَ ﴿٤٨﴾

**49.** *Firon* dedi: "Mən sizə izin verməmişdən əvvəl siz ona imanmı gətirdiniz? Şübhəsiz ki, o sizə sehr öyrədən böyüyünüzdür. Tezliklə biləcəksiniz! Mən sizin əllərinizi və ayaqlarınızı çarpaz kəsdirib hamınızı çarmıxa çəkdirəcəyəm".

قَالَ ءَامَنتُمْ لَهُۥ قَبْلَ أَنْ ءَاذَنَ لَكُمْ إِنَّهُۥ لَكَبِيرُكُمُ ٱلَّذِى عَلَّمَكُمُ ٱلسِّحْرَ فَلَسَوْفَ تَعْلَمُونَ لَأُقَطِّعَنَّ أَيْدِيَكُمْ وَأَرْجُلَكُم مِّنْ خِلَٰفٍ وَلَأُصَلِّبَنَّكُمْ أَجْمَعِينَ ﴿٤٩﴾

**50.** Onlar dedilər: "Zərər yox, biz *onsuz da* öz Rəbbimizə qayıdacağıq.

قَالُواْ لَا ضَيْرَ إِنَّآ إِلَىٰ رَبِّنَا مُنقَلِبُونَ ﴿٥٠﴾

**51.** Biz *Firon xalqı arasından* ilk iman gətirənlər olduğumuza görə Rəbbimizdən günahlarımızı bağışlayacağını umuruq".

إِنَّا نَطْمَعُ أَن يَغْفِرَ لَنَا رَبُّنَا خَطَٰيَٰنَآ أَن كُنَّآ أَوَّلَ ٱلْمُؤْمِنِينَ ﴿٥١﴾

**52.** Biz Musaya: "Qullarımla birlikdə gecə yola çıx. Çünki siz təqib olunacaqsınız"– *deyə* vəhy etdik.

۞ وَأَوْحَيْنَآ إِلَىٰ مُوسَىٰٓ أَنْ أَسْرِ بِعِبَادِىٓ إِنَّكُم مُّتَّبَعُونَ ﴿٥٢﴾

**53.** Firon şəhərlərə *əsgər* toplayanlar göndərdi.

فَأَرْسَلَ فِرْعَوْنُ فِى ٱلْمَدَآئِنِ حَٰشِرِينَ ﴿٥٣﴾

**54.** *O dedi*: "Bunlar kiçik bir dəstədir.

إِنَّ هَٰٓؤُلَآءِ لَشِرْذِمَةٌ قَلِيلُونَ ﴿٥٤﴾

**55.** Onlar bizi qəzəbləndirmişlər.

وَإِنَّهُمْ لَنَا لَغَآئِظُونَ ﴿٥٥﴾

**56.** Biz hamımız ayıq-sayıq olmalıyıq".

وَإِنَّا لَجَمِيعٌ حَٰذِرُونَ ﴿٥٦﴾

**57.** Biz *o zalım tayfanı* bağlardan və çeşmələrdən çıxartdıq;

فَأَخْرَجْنَٰهُم مِّن جَنَّٰتٍ وَعُيُونٍ ﴿٥٧﴾

**58.** xəzinələrdən və gözəl yerlərdən də *qovduq*.

وَكُنُوزٍ وَمَقَامٍ كَرِيمٍ ٥٨

**59.** Beləcə, Biz İsrail oğullarını o yerlərə varis etdik.

كَذَٰلِكَ وَأَوْرَثْنَاهَا بَنِي إِسْرَائِيلَ ٥٩

**60.** Günəş üfüqdən qalxarkən *Firon öz əsgərləri ilə* onları izləməyə başladılar.

فَأَتْبَعُوهُم مُّشْرِقِينَ ٦٠

**61.** İki dəstə bir-birini görüncə Musanın səhabələri: “Biz yaxalanacağıq!”– dedilər.

فَلَمَّا تَرَاءَى الْجَمْعَانِ قَالَ أَصْحَابُ مُوسَىٰ إِنَّا لَمُدْرَكُونَ ٦١

**62.** *Musa* dedi: “Xeyr, Rəbbim mənimlədir. O mənə doğru yol göstərəcəkdir!”

قَالَ كَلَّا إِنَّ مَعِيَ رَبِّي سَيَهْدِينِ ٦٢

**63.** Biz Musaya: “Əsanla dənizə vur!”– *deyə* vəhy etdik. *Dəniz* dərhal yarıldı, *on iki yol açıldı* və hər biri nəhəng bir dağ kimi oldu.

فَأَوْحَيْنَا إِلَىٰ مُوسَىٰ أَنِ اضْرِب بِّعَصَاكَ الْبَحْرَ فَانفَلَقَ فَكَانَ كُلُّ فِرْقٍ كَالطَّوْدِ الْعَظِيمِ ٦٣

**64.** O birilərini də ora yaxınlaşdırdıq.

وَأَزْلَفْنَا ثَمَّ الْآخَرِينَ ٦٤

**65.** Musa və onunla birlikdə olanların hamısını xilas etdik.

وَأَنجَيْنَا مُوسَىٰ وَمَن مَّعَهُ أَجْمَعِينَ ٦٥

**66.** O birilərini isə suya qərq etdik.

ثُمَّ أَغْرَقْنَا الْآخَرِينَ ٦٦

**67.** Şübhəsiz ki, bu *hekayətdə* bir ibrət vardır. Lakin onların çoxu iman gətirmədi.

إِنَّ فِي ذَٰلِكَ لَآيَةً وَمَا كَانَ أَكْثَرُهُم مُّؤْمِنِينَ ٦٧

**68.** Həqiqətən, sənin Rəbbin Qüdrətlidir, Rəhmlidir.

وَإِنَّ رَبَّكَ لَهُوَ الْعَزِيزُ الرَّحِيمُ ٦٨

**69.** Onlara İbrahimin əhvalatını da oxu.

وَاتْلُ عَلَيْهِمْ نَبَأَ إِبْرَاهِيمَ ٦٩

**70.** Bir zaman o öz atasına və tayfasına: “Nəyə ibadət edirsiniz?”– demişdi.

إِذْ قَالَ لِأَبِيهِ وَقَوْمِهِ مَا تَعْبُدُونَ ٧٠

71. Onlar dedilər: “Biz bütlərə ibadət edir və onlara tapınmaqda davam edirik”.

قَالُوا۟ نَعْبُدُ أَصْنَامًا فَنَظَلُّ لَهَا عَٰكِفِينَ ٧١

72. O dedi: “Onlara yalvardığınız zaman sizi eşidirlərmi?

قَالَ هَلْ يَسْمَعُونَكُمْ إِذْ تَدْعُونَ ٧٢

73. Yaxud sizə xeyir və ya zərər verirlərmi?”

أَوْ يَنفَعُونَكُمْ أَوْ يَضُرُّونَ ٧٣

74. Onlar dedilər: “Xeyr, amma biz öz atalarımızın belə etdiklərini gördük”.

قَالُوا۟ بَلْ وَجَدْنَآ ءَابَآءَنَا كَذَٰلِكَ يَفْعَلُونَ ٧٤

75. O dedi: “Siz nəyə ibadət etdiyinizi görürsünüzmü –

قَالَ أَفَرَءَيْتُم مَّا كُنتُمْ تَعْبُدُونَ ٧٥

76. həm siz, həm də ulu babalarınız?

أَنتُمْ وَءَابَآؤُكُمُ ٱلْأَقْدَمُونَ ٧٦

77. Aləmlərin Rəbbindən başqa, onların hamısı mənim düşmənimdir.

فَإِنَّهُمْ عَدُوٌّ لِّىٓ إِلَّا رَبَّ ٱلْعَٰلَمِينَ ٧٧

78. *O Rəbb ki*, məni yaratmış və məni doğru yola yönəltmişdir;

ٱلَّذِى خَلَقَنِى فَهُوَ يَهْدِينِ ٧٨

79. *O Rəbb ki*, məni yedirdir və içirdir;

وَٱلَّذِى هُوَ يُطْعِمُنِى وَيَسْقِينِ ٧٩

80. *O Rəbb ki*, xəstələndiyim zaman mənə şəfa verir;

وَإِذَا مَرِضْتُ فَهُوَ يَشْفِينِ ٨٠

81. *O Rəbb ki*, məni öldürəcək, sonra dirildəcəkdir;

وَٱلَّذِى يُمِيتُنِى ثُمَّ يُحْيِينِ ٨١

82. *O Rəbb ki*, Haqq-hesab günü xətalarımı bağışlayacağını Ondan umuram.

وَٱلَّذِىٓ أَطْمَعُ أَن يَغْفِرَ لِى خَطِيٓـَٔتِى يَوْمَ ٱلدِّينِ ٨٢

83. Ey Rəbbim! Mənə hikmət ver və məni əməlisalehlərə qovuşdur!

رَبِّ هَبْ لِى حُكْمًا وَأَلْحِقْنِى بِٱلصَّٰلِحِينَ ٨٣

84. Sonra gələnlər arasında *həmişə yad edilim deyə* mənə yaxşı ad qismət elə!

وَٱجْعَل لِّى لِسَانَ صِدْقٍ فِى ٱلْءَاخِرِينَ ٨٤

**85.** Məni Nəim bağının varislərindən et!

وَٱجۡعَلۡنِي مِن وَرَثَةِ جَنَّةِ ٱلنَّعِيمِ ٨٥

**86.** Atamı bağışla! Çünki o, azmışlardandır.

وَٱغۡفِرۡ لِأَبِيٓ إِنَّهُۥ كَانَ مِنَ ٱلضَّآلِّينَ ٨٦

**87.** Onların dirildiləcəyi gün məni rüsvay etmə!

وَلَا تُخۡزِنِي يَوۡمَ يُبۡعَثُونَ ٨٧

**88.** O gün ki, nə var-dövlət, nə də oğul-uşaq bir fayda verməyəcək.

يَوۡمَ لَا يَنفَعُ مَالٞ وَلَا بَنُونَ ٨٨

**89.** Ancaq sağlam bir qəlblə Allahın hüzuruna gələnlərdən başqa!"

إِلَّا مَنۡ أَتَى ٱللَّهَ بِقَلۡبٖ سَلِيمٖ ٨٩

**90.** Cənnət müttəqilərə yaxınlaşdırılar.

وَأُزۡلِفَتِ ٱلۡجَنَّةُ لِلۡمُتَّقِينَ ٩٠

**91.** Cəhənnəm də azğınlara göstərilər.

وَبُرِّزَتِ ٱلۡجَحِيمُ لِلۡغَاوِينَ ٩١

**92.** Onlara deyilər: "Hanı sizin ibadət etdikləriniz –

وَقِيلَ لَهُمۡ أَيۡنَ مَا كُنتُمۡ تَعۡبُدُونَ ٩٢

**93.** Allahdan başqa *pənah apardıqlarınız*? Onlar sizə kömək edə bilərlərmi, yaxud özlərinə köməkləri dəyə bilərmi?"

مِن دُونِ ٱللَّهِ هَلۡ يَنصُرُونَكُمۡ أَوۡ يَنتَصِرُونَ ٩٣

**94.** Onlar azğınlarla birlikdə *Cəhənnəmə* atılarlar,

فَكُبۡكِبُواْ فِيهَا هُمۡ وَٱلۡغَاوُۥنَ ٩٤

**95.** İblisin bütün əsgərləri də habelə.

وَجُنُودُ إِبۡلِيسَ أَجۡمَعُونَ ٩٥

**96.** Onlar orada höcətləşərək deyərlər:

قَالُواْ وَهُمۡ فِيهَا يَخۡتَصِمُونَ ٩٦

**97.** "Allaha and olsun ki, biz açıq-aydın azğınlıq içində idik –

تَٱللَّهِ إِن كُنَّا لَفِي ضَلَٰلٖ مُّبِينٍ ٩٧

**98.** o vaxt ki, biz sizi aləmlərin Rəbbinə tay tuturduq.

إِذۡ نُسَوِّيكُم بِرَبِّ ٱلۡعَٰلَمِينَ ٩٨

**99.** Bizi ancaq günahkarlar azdırdı.

وَمَآ أَضَلَّنَآ إِلَّا ٱلۡمُجۡرِمُونَ ٩٩

**100.** İndi isə bizim nə şəfaətçilərimiz,

فَمَا لَنَا مِن شَٰفِعِينَ ١٠٠

101. nə də *bizə* canıyanan bir dostumuz var!

وَلَا صَدِيقٍ حَمِيمٍ ﴿١٠١﴾

102. Bir də *dünyaya* qayıda bilsəydik, möminlərdən olardıq!"

فَلَوْ أَنَّ لَنَا كَرَّةً فَنَكُونَ مِنَ الْمُؤْمِنِينَ ﴿١٠٢﴾

103. Şübhəsiz ki, bunda bir ibrət vardır. Lakin onların əksəriyyəti yenə iman gətirmədi.

إِنَّ فِي ذَٰلِكَ لَآيَةً ۖ وَمَا كَانَ أَكْثَرُهُم مُّؤْمِنِينَ ﴿١٠٣﴾

104. Həqiqətən, sənin Rəbbin Qüdrətlidir, Rəhmlidir.

وَإِنَّ رَبَّكَ لَهُوَ الْعَزِيزُ الرَّحِيمُ ﴿١٠٤﴾

105. Nuh tayfası da elçiləri yalançı saydı.

كَذَّبَتْ قَوْمُ نُوحٍ الْمُرْسَلِينَ ﴿١٠٥﴾

106. O vaxt qardaşları Nuh onlara dedi: "Məgər qorxmursunuz?

إِذْ قَالَ لَهُمْ أَخُوهُمْ نُوحٌ أَلَا تَتَّقُونَ ﴿١٠٦﴾

107. Həqiqətən, mən sizin üçün etibar edilməli bir elçiyəm.

إِنِّي لَكُمْ رَسُولٌ أَمِينٌ ﴿١٠٧﴾

108. Allahdan qorxun və mənə itaət edin.

فَاتَّقُوا اللَّهَ وَأَطِيعُونِ ﴿١٠٨﴾

109. Mən bunun əvəzinə sizdən heç bir mükafat istəmirəm. Mənim mükafatım ancaq aləmlərin Rəbbinə aiddir.

وَمَا أَسْأَلُكُمْ عَلَيْهِ مِنْ أَجْرٍ ۖ إِنْ أَجْرِيَ إِلَّا عَلَىٰ رَبِّ الْعَالَمِينَ ﴿١٠٩﴾

110. Allahdan qorxun və mənə itaət edin!"

فَاتَّقُوا اللَّهَ وَأَطِيعُونِ ﴿١١٠﴾

111. Onlar dedilər: "Sənə ən rəzil adamlar tabe olduğu halda biz sənə inanarıqmı?"

۞ قَالُوا أَنُؤْمِنُ لَكَ وَاتَّبَعَكَ الْأَرْذَلُونَ ﴿١١١﴾

112. *Nuh* dedi: "Mən onların nə etdiklərini bilmirəm!

قَالَ وَمَا عِلْمِي بِمَا كَانُوا يَعْمَلُونَ ﴿١١٢﴾

113. Onların haqq-hesabı yalnız Rəbbimə aiddir. Kaş başa düşəydiniz!

إِنْ حِسَابُهُمْ إِلَّا عَلَىٰ رَبِّي ۖ لَوْ تَشْعُرُونَ ﴿١١٣﴾

114. Mən iman gətirənləri qovan deyiləm.

وَمَآ أَنَا۠ بِطَارِدِ ٱلْمُؤْمِنِينَ ﴿١١٤﴾

115. Mən yalnız açıq-aşkar bir qorxudanam”.

إِنْ أَنَا۠ إِلَّا نَذِيرٌ مُّبِينٌ ﴿١١٥﴾

116. Onlar dedilər: “Ey Nuh! Əgər *dəvətinə* son qoymasan, mütləq daşqalaq ediləcəksən”.

قَالُوا۟ لَئِن لَّمْ تَنتَهِ يَٰنُوحُ لَتَكُونَنَّ مِنَ ٱلْمَرْجُومِينَ ﴿١١٦﴾

117. *Nuh* dedi: “Ey Rəbbim! Qövmüm məni yalançı hesab etdi.

قَالَ رَبِّ إِنَّ قَوْمِى كَذَّبُونِ ﴿١١٧﴾

118. Mənimlə onların arasında qəti hökm ver, məni və mənimlə birlikdə olan möminləri *əzabdan* qurtar!”

فَٱفْتَحْ بَيْنِى وَبَيْنَهُمْ فَتْحًا وَنَجِّنِى وَمَن مَّعِىَ مِنَ ٱلْمُؤْمِنِينَ ﴿١١٨﴾

119. Biz onu və onunla birlikdə olanları yüklü gəmidə xilas etdik.

فَأَنجَيْنَٰهُ وَمَن مَّعَهُۥ فِى ٱلْفُلْكِ ٱلْمَشْحُونِ ﴿١١٩﴾

120. Yerdə qalanları isə suya qərq etdik.

ثُمَّ أَغْرَقْنَا بَعْدُ ٱلْبَاقِينَ ﴿١٢٠﴾

121. Şübhəsiz ki, bunda bir ibrət vardır. Lakin onların əksəriyyəti yenə iman gətirmədi.

إِنَّ فِى ذَٰلِكَ لَءَايَةً ۖ وَمَا كَانَ أَكْثَرُهُم مُّؤْمِنِينَ ﴿١٢١﴾

122. Həqiqətən, sənin Rəbbin Qüdrətlidir, Rəhmlidir.

وَإِنَّ رَبَّكَ لَهُوَ ٱلْعَزِيزُ ٱلرَّحِيمُ ﴿١٢٢﴾

123. Ad tayfası da elçiləri yalançı saydı.

كَذَّبَتْ عَادٌ ٱلْمُرْسَلِينَ ﴿١٢٣﴾

124. O vaxt qardaşları Hud onlara dedi: “Məgər qorxmursunuz?

إِذْ قَالَ لَهُمْ أَخُوهُمْ هُودٌ أَلَا تَتَّقُونَ ﴿١٢٤﴾

125. Həqiqətən, mən sizin üçün etibar etməli olduğunuz bir elçiyəm.

إِنِّى لَكُمْ رَسُولٌ أَمِينٌ ﴿١٢٥﴾

126. Allahdan qorxun və mənə itaət edin!

فَٱتَّقُوا۟ ٱللَّهَ وَأَطِيعُونِ ﴿١٢٦﴾

127. Mən bunun əvəzinə sizdən heç bir mükafat istəmirəm. Mənim

وَمَآ أَسْـَٔلُكُمْ عَلَيْهِ مِنْ أَجْرٍ ۖ إِنْ أَجْرِىَ إِلَّا عَلَىٰ

mükafatım ancaq aləmlərin Rəbbinə aiddir.

رب العالمين ١٢٧

128. Əcəba, siz hər təpədə əbəs yerə bir əlamətmi qurursunuz (hündür binalarmı tikirsiniz)?

أتبنون بكل ريع آية تعبثون ١٢٨

129. Sanki əbədi qalacaqsınız deyə qalalarmı tikirsiniz?

وتتخذون مصانع لعلكم تخلدون ١٢٩

130. *Bir kəsi* yaxaladığınız zaman qəddar hökmdar kimi yaxalayırsınız?

وإذا بطشتم بطشتم جبارين ١٣٠

131. Allahdan qorxun və mənə itaət edin!

فاتقوا الله وأطيعون ١٣١

132. Bildiyiniz nemətləri sizə verəndən qorxun.

واتقوا الذي أمدكم بما تعلمون ١٣٢

133. O sizə heyvanat və oğul-uşaq verdi,

أمدكم بأنعام وبنين ١٣٣

134. *üstəlik* bağlar və çeşmələr də əta etdi.

وجنات وعيون ١٣٤

135. Mən sizə üz verəcək böyük günün əzabından qorxuram".

إني أخاف عليكم عذاب يوم عظيم ١٣٥

136. Onlar dedilər: "Bizə öyüd-nəsihət versən də, verməsən də, bizim üçün birdir.

قالوا سواء علينا أوعظت أم لم تكن من
الواعظين ١٣٦

137. Bu, yalnız və yalnız əvvəlkilərin adətidir.

إن هذا إلا خلق الأولين ١٣٧

138. Biz əzaba düçar olan da deyilik".

وما نحن بمعذبين ١٣٨

139. Onlar onu yalançı saydılar. Biz də onları məhv etdik. Şübhəsiz ki, bunda bir ibrət vardır. Lakin onların əksəriyyəti iman gətirmədi.

فكذبوه فأهلكناهم إن في ذلك لآية وما
كان أكثرهم مؤمنين ١٣٩

140. Həqiqətən, sənin Rəbbin Qüdrətlidir, Rəhmlidir.

وَإِنَّ رَبَّكَ لَهُوَ ٱلْعَزِيزُ ٱلرَّحِيمُ ١٤٠

141. Səmud tayfası da elçiləri yalançı saydı.

كَذَّبَتْ ثَمُودُ ٱلْمُرْسَلِينَ ١٤١

142. O vaxt qardaşları Saleh onlara dedi: "Məgər qorxmursunuz?

إِذْ قَالَ لَهُمْ أَخُوهُمْ صَٰلِحٌ أَلَا تَتَّقُونَ ١٤٢

143. Şübhəsiz ki, mən sizin üçün etibar etməli olduğunuz bir elçiyəm.

إِنِّي لَكُمْ رَسُولٌ أَمِينٌ ١٤٣

144. Allahdan qorxun və mənə itaət edin.

فَٱتَّقُوا۟ ٱللَّهَ وَأَطِيعُونِ ١٤٤

145. Mən bunun əvəzinə sizdən heç bir mükafat istəmirəm. Mənim mükafatım ancaq aləmlərin Rəbbinə aiddir.

وَمَآ أَسْـَٔلُكُمْ عَلَيْهِ مِنْ أَجْرٍ إِنْ أَجْرِيَ إِلَّا عَلَىٰ
رَبِّ ٱلْعَٰلَمِينَ ١٤٥

146. Məgər siz burada olanların içində sərbəst buraxılacaqsınız?

أَتُتْرَكُونَ فِي مَا هَٰهُنَآ ءَامِنِينَ ١٤٦

147. Bağlar və bulaqlar içində,

فِي جَنَّٰتٍ وَعُيُونٍ ١٤٧

148. əkinlər və yumşaq meyvəli xurmalıqlar içində *arxayınlıqla qalacaqsınız*?

وَزُرُوعٍ وَنَخْلٍ طَلْعُهَا هَضِيمٌ ١٤٨

149. Dağlardan məharətlə evlər yonub düzəldəcəksiniz?

وَتَنْحِتُونَ مِنَ ٱلْجِبَالِ بُيُوتًا فَٰرِهِينَ ١٤٩

150. Allahdan qorxun və mənə itaət edin!

فَٱتَّقُوا۟ ٱللَّهَ وَأَطِيعُونِ ١٥٠

151. Həddi aşanların əmrinə tabe olmayın.

وَلَا تُطِيعُوٓا۟ أَمْرَ ٱلْمُسْرِفِينَ ١٥١

152. Onlar yer üzündə fəsad törədir və *özlərini günahdan* təmizləmirlər".

ٱلَّذِينَ يُفْسِدُونَ فِي ٱلْأَرْضِ وَلَا يُصْلِحُونَ ١٥٢

153. Onlar dedilər: “Sən yalnız və yalnız sehrlənmişlərdənsən.

قَالُوٓاْ إِنَّمَآ أَنتَ مِنَ ٱلۡمُسَحَّرِينَ ﴿١٥٣﴾

154. Sən də bizim kimi ancaq bir insansan. Əgər doğru danışanlardansansa, bizə bir möcüzə göstər”.

مَآ أَنتَ إِلَّا بَشَرٞ مِّثۡلُنَا فَأۡتِ بِـَٔايَةٍ إِن كُنتَ مِنَ ٱلصَّٰدِقِينَ ﴿١٥٤﴾

155. *Saleh* dedi: “*Möcüzə* bu dişi dəvədir! Onun da, sizin də müəyyən edilmiş vaxtlarda su içmək haqqınız vardır. (Bir gün o, su içməli, bir gün də siz su içməlisiniz).

قَالَ هَٰذِهِۦ نَاقَةٞ لَّهَا شِرۡبٞ وَلَكُمۡ شِرۡبُ يَوۡمٖ مَّعۡلُومٖ ﴿١٥٥﴾

156. Ona heç bir pislik etməyin, yoxsa böyük günün əzabı sizi yaxalayar”.

وَلَا تَمَسُّوهَا بِسُوٓءٖ فَيَأۡخُذَكُمۡ عَذَابُ يَوۡمٍ عَظِيمٖ ﴿١٥٦﴾

157. Onlar dəvənin diz vətərini kəsdilər, sonra da peşman oldular.

فَعَقَرُوهَا فَأَصۡبَحُواْ نَٰدِمِينَ ﴿١٥٧﴾

158. Əzab onları yaxaladı. Şübhəsiz ki, bunda bir ibrət vardır. Lakin onların əksəriyyəti yenə iman gətirmədi.

فَأَخَذَهُمُ ٱلۡعَذَابُۚ إِنَّ فِي ذَٰلِكَ لَأٓيَةٗۖ وَمَا كَانَ أَكۡثَرُهُم مُّؤۡمِنِينَ ﴿١٥٨﴾

159. Həqiqətən, sənin Rəbbin Qüdrətlidir, Rəhmlidir.

وَإِنَّ رَبَّكَ لَهُوَ ٱلۡعَزِيزُ ٱلرَّحِيمُ ﴿١٥٩﴾

160. Lut tayfası da elçiləri yalançı saydı.

كَذَّبَتۡ قَوۡمُ لُوطٍ ٱلۡمُرۡسَلِينَ ﴿١٦٠﴾

161. O vaxt qardaşları Lut onlara dedi: “Məgər qorxmursunuz?

إِذۡ قَالَ لَهُمۡ أَخُوهُمۡ لُوطٌ أَلَا تَتَّقُونَ ﴿١٦١﴾

162. Həqiqətən, mən sizin üçün etibar edilməli bir elçiyəm.

إِنِّي لَكُمۡ رَسُولٌ أَمِينٞ ﴿١٦٢﴾

163. Allahdan qorxun və mənə itaət edin!

فَٱتَّقُواْ ٱللَّهَ وَأَطِيعُونِ ﴿١٦٣﴾

164. Mən bunun əvəzinə sizdən heç bir mükafat istəmirəm. Mənim

وَمَآ أَسۡـَٔلُكُمۡ عَلَيۡهِ مِنۡ أَجۡرٍۖ إِنۡ أَجۡرِيَ إِلَّا

mükafatım ancaq aləmlərin Rəbbinə aiddir.

عَلَىٰ رَبِّ الْعَالَمِينَ ﴿١٦٤﴾

165. Doğrudanmı siz insanlar içində ancaq kişilərlə yaxınlıq edir

أَتَأْتُونَ الذُّكْرَانَ مِنَ الْعَالَمِينَ ﴿١٦٥﴾

166. və Rəbbinizin sizin üçün yaratdığı qadınlarınızı tərk edirsiniz? Siz, həqiqətən də, həddi aşan adamlarsınız".

وَتَذَرُونَ مَا خَلَقَ لَكُمْ رَبُّكُمْ مِنْ أَزْوَاجِكُمْ ۚ بَلْ أَنْتُمْ قَوْمٌ عَادُونَ ﴿١٦٦﴾

167. Onlar dedilər: "Ey Lut! Əgər *təbliğatına* son qoymasan, mütləq qovulanlardan olacaqsan!"

قَالُوا لَئِنْ لَمْ تَنْتَهِ يَا لُوطُ لَتَكُونَنَّ مِنَ الْمُخْرَجِينَ ﴿١٦٧﴾

168. O dedi: "Mən sizin əməllərinizə nifrət edənlərdənəm.

قَالَ إِنِّي لِعَمَلِكُمْ مِنَ الْقَالِينَ ﴿١٦٨﴾

169. Ey Rəbbim! Məni və ailəmi onların tutduqları işdən xilas et!"

رَبِّ نَجِّنِي وَأَهْلِي مِمَّا يَعْمَلُونَ ﴿١٦٩﴾

170. Biz onu və onun bütün ailəsini xilas etdik.

فَنَجَّيْنَاهُ وَأَهْلَهُ أَجْمَعِينَ ﴿١٧٠﴾

171. Geridə qalanlar arasındakı yaşlı qadından başqa.

إِلَّا عَجُوزًا فِي الْغَابِرِينَ ﴿١٧١﴾

172. Sonra da o birilərini darmadağın etdik.

ثُمَّ دَمَّرْنَا الْآخَرِينَ ﴿١٧٢﴾

173. Biz onların üstünə *daşlardan* yağış yağdırdıq. Qorxudulanların yağışı nə yaman imiş!

وَأَمْطَرْنَا عَلَيْهِمْ مَطَرًا ۖ فَسَاءَ مَطَرُ الْمُنْذَرِينَ ﴿١٧٣﴾

174. Şübhəsiz ki, bunda bir ibrət vardır. Lakin onların əksəriyyəti iman gətirmədi.

إِنَّ فِي ذَٰلِكَ لَآيَةً ۖ وَمَا كَانَ أَكْثَرُهُمْ مُؤْمِنِينَ ﴿١٧٤﴾

175. Həqiqətən, sənin Rəbbin Qüdrətlidir, Rəhmlidir.

وَإِنَّ رَبَّكَ لَهُوَ الْعَزِيزُ الرَّحِيمُ ﴿١٧٥﴾

onlar: “Rəbbiniz nə buyurdu?”– deyə soruşar, digərləri isə: “Haqqı *buyurdu*! O, Ucadır, Böyükdür!”– deyə cavab verərlər.

24. De: “Göylərdən və yerdən sizə ruzi verən kimdir?” De: “Allahdır! Elə isə biz və ya siz – *ikimizdən biri* ya doğru yolda, ya da açıq-aydın azğınlıq içindədir”.

۞قُلْ مَن يَرْزُقُكُم مِّنَ ٱلسَّمَٰوَٰتِ
وَٱلْأَرْضِ ۖ قُلِ ٱللَّهُ ۖ وَإِنَّآ أَوْ إِيَّاكُمْ لَعَلَىٰ
هُدًى أَوْ فِى ضَلَٰلٍ مُّبِينٍ ٢٤

25. De: “Siz bizim etdiyimiz günahlara görə sorğu-sual edilməyəcəksiniz, biz də sizin etdiklərinizə görə sorğu-sual edilməyəcəyik”.

قُل لَّا تُسْـَٔلُونَ عَمَّآ أَجْرَمْنَا وَلَا نُسْـَٔلُ
عَمَّا تَعْمَلُونَ ٢٥

26. De: “Rəbbimiz hamımızı bir araya cəmləşdirib sonra da aramızda ədalətlə hökm verəcəkdir. O, ən ədalətli Hakimdir, Bilәndir”.

قُلْ يَجْمَعُ بَيْنَنَا رَبُّنَا ثُمَّ يَفْتَحُ بَيْنَنَا بِٱلْحَقِّ
وَهُوَ ٱلْفَتَّاحُ ٱلْعَلِيمُ ٢٦

27. De: “Ona qoşduğunuz şərikləri bir mənə göstərin. Xeyr! O, Qüdrətli, Müdrik Allahdır!”

قُلْ أَرُونِىَ ٱلَّذِينَ أَلْحَقْتُم بِهِۦ شُرَكَآءَ ۖ كَلَّا ۚ
بَلْ هُوَ ٱللَّهُ ٱلْعَزِيزُ ٱلْحَكِيمُ ٢٧

28. Biz səni bütün insanlara müjdə verən və xəbərdarlıq edən *bir peyğəmbər* kimi göndərdik. Lakin insanların çoxu *bunu* bilmir.

وَمَآ أَرْسَلْنَٰكَ إِلَّا كَآفَّةً لِّلنَّاسِ بَشِيرًا
وَنَذِيرًا وَلَٰكِنَّ أَكْثَرَ ٱلنَّاسِ لَا
يَعْلَمُونَ ٢٨

29. Onlar: “Əgər doğru deyirsinizsə, bu vəd nə vaxt olacaq?”– deyirlər.

وَيَقُولُونَ مَتَىٰ هَٰذَا ٱلْوَعْدُ إِن كُنتُمْ
صَٰدِقِينَ ٢٩

30. De: “Sizə vəd edilmiş bir gün vardır ki, siz onu nə bircə saat belə yubada, nə də tezləşdirə bilərsiniz”.

قُل لَّكُم مِّيعَادُ يَوْمٍ لَّا تَسْتَـْٔخِرُونَ عَنْهُ
سَاعَةً وَلَا تَسْتَقْدِمُونَ ٣٠

31. Kafirlər dedilər: “Biz nə bu Qurana, nə də bundan əvvəlkilərə əsla

وَقَالَ ٱلَّذِينَ كَفَرُوا۟ لَن نُّؤْمِنَ بِهَٰذَا

inanmayacağıq!" Kaş sən o zalımları öz Rəbbinin hüzurunda saxlanılıb bir-birinə söz qaytardıqları anda görəydin. Zəiflər, öz şəxsiyyətləri haqda yüksək rəydə olanlara deyəcəklər: "Əgər siz olmasaydınız, biz iman gətirərdik".

ٱلْقُرْءَانِ وَلَا بِٱلَّذِى بَيْنَ يَدَيْهِ ۗ وَلَوْ تَرَىٰٓ إِذِ
ٱلظَّٰلِمُونَ مَوْقُوفُونَ عِندَ رَبِّهِمْ يَرْجِعُ
بَعْضُهُمْ إِلَىٰ بَعْضٍ ٱلْقَوْلَ يَقُولُ ٱلَّذِينَ
ٱسْتُضْعِفُوا۟ لِلَّذِينَ ٱسْتَكْبَرُوا۟ لَوْلَآ أَنتُمْ
لَكُنَّا مُؤْمِنِينَ ﴿٣١﴾

32. Özləri haqda yüksək rəydə olanlar da zəiflərə belə deyərlər: "Sizə doğru yol göstəricisi gəldikdən sonra sizi ondan bizmi yayındırdıq? Xeyr, siz özünüz günahkar idiniz".

قَالَ ٱلَّذِينَ ٱسْتَكْبَرُوا۟ لِلَّذِينَ ٱسْتُضْعِفُوٓا۟
أَنَحْنُ صَدَدْنَٰكُمْ عَنِ ٱلْهُدَىٰ بَعْدَ إِذْ جَآءَكُم ۖ
بَلْ كُنتُم مُّجْرِمِينَ ﴿٣٢﴾

33. Zəiflər özləri haqda yüksək rəydə olanlara deyərlər: "Xeyr! *İşiniz* gecə-gündüz hiylə qurmaq idi. Siz bizə Allahı inkar etməyi və Ona şəriklər qoşmağı əmr edirdiniz". Onlar əzabı gördükdə peşmançılıq hissini gizlədərlər. Kafirlərin boyunlarına zəncirlər vurarıq. Onlar ancaq etdikləri əməllərə görə cəzalandırılarlar.

وَقَالَ ٱلَّذِينَ ٱسْتُضْعِفُوا۟ لِلَّذِينَ ٱسْتَكْبَرُوا۟
بَلْ مَكْرُ ٱلَّيْلِ وَٱلنَّهَارِ إِذْ تَأْمُرُونَنَآ أَن
نَّكْفُرَ بِٱللَّهِ وَنَجْعَلَ لَهُۥٓ أَندَادًا ۚ وَأَسَرُّوا۟
ٱلنَّدَامَةَ لَمَّا رَأَوُا۟ ٱلْعَذَابَ ۚ وَجَعَلْنَا ٱلْأَغْلَٰلَ
فِىٓ أَعْنَاقِ ٱلَّذِينَ كَفَرُوا۟ ۚ هَلْ يُجْزَوْنَ إِلَّا مَا
كَانُوا۟ يَعْمَلُونَ ﴿٣٣﴾

34. Biz hansı bir məmləkətə xəbərdarlıq edən peyğəmbər göndərdiksə, onun cah-calal içində yaşayan sakinləri ona sadəcə olaraq: "Biz sizinlə göndərilənləri inkar edirik!"– dedilər.

وَمَآ أَرْسَلْنَا فِى قَرْيَةٍ مِّن نَّذِيرٍ إِلَّا قَالَ
مُتْرَفُوهَآ إِنَّا بِمَآ أُرْسِلْتُم بِهِۦ كَٰفِرُونَ ﴿٣٤﴾

35. Onlar: "Bizim mal-dövlətimiz də, övladlarımız da daha çoxdur və bizə əzab verilməyəcəkdir"– dedilər.

وَقَالُوا۟ نَحْنُ أَكْثَرُ أَمْوَٰلًا وَأَوْلَٰدًا وَمَا نَحْنُ
بِمُعَذَّبِينَ ﴿٣٥﴾

36. De: "Həqiqətən, Rəbbim istədiyinin ruzisini bol edər, *istədiyininkini də* azaldar. Lakin insanların çoxu *bunu* bilmir".

قُلْ إِنَّ رَبِّى يَبْسُطُ ٱلرِّزْقَ لِمَن يَشَآءُ وَيَقْدِرُ
وَلَٰكِنَّ أَكْثَرَ ٱلنَّاسِ لَا يَعْلَمُونَ ﴿٣٦﴾

37. Sizi bizə yaxınlaşdıra biləcək nə var-dövlətiniz, nə də oğul-uşağınızdır. Ancaq iman gətirib yaxşı işlər görənlər istisnadır. Məhz onların mükafatları etdikləri əməllərə görə qat-qat artırılacaq və onlar *Cənnətdəki* mənzillərində asudə yaşayacaqlar.

وَمَآ أَمْوَٰلُكُمْ وَلَآ أَوْلَٰدُكُم بِٱلَّتِى تُقَرِّبُكُمْ عِندَنَا
زُلْفَىٰٓ إِلَّا مَنْ ءَامَنَ وَعَمِلَ صَٰلِحًا فَأُو۟لَٰٓئِكَ
لَهُمْ جَزَآءُ ٱلضِّعْفِ بِمَا عَمِلُوا۟ وَهُمْ فِى ٱلْغُرُفَٰتِ
ءَامِنُونَ ٣٧

38. Ayələrimizi qüvvədən salmağa cəhd göstərənlər isə əzaba giriftar ediləcəklər.

وَٱلَّذِينَ يَسْعَوْنَ فِىٓ ءَايَٰتِنَا مُعَٰجِزِينَ أُو۟لَٰٓئِكَ
فِى ٱلْعَذَابِ مُحْضَرُونَ ٣٨

39. De: “Həqiqətən, Rəbbim istədiyi qullarına ruzisini bol edər, *istədiyinə də* onu azaldar. Nə xərcləsəniz, Allah onun əvəzini verər. O, ruzi verənlərin ən yaxşısıdır!”

قُلْ إِنَّ رَبِّى يَبْسُطُ ٱلرِّزْقَ لِمَن يَشَآءُ مِنْ
عِبَادِهِۦ وَيَقْدِرُ لَهُۥ ۚ وَمَآ أَنفَقْتُم مِّن شَىْءٍ
فَهُوَ يُخْلِفُهُۥ ۖ وَهُوَ خَيْرُ ٱلرَّٰزِقِينَ ٣٩

40. O gün *Allah* onların hamısını toplayacaq, sonra da mələklərə buyuracaq: “Bunlar sizəmi ibadət edirdilər?”

وَيَوْمَ يَحْشُرُهُمْ جَمِيعًا ثُمَّ يَقُولُ لِلْمَلَٰٓئِكَةِ
أَهَٰٓؤُلَآءِ إِيَّاكُمْ كَانُوا۟ يَعْبُدُونَ ٤٠

41. *Mələklər* deyəcəklər: “Sən paksan, müqəddəssən! Onlar deyil, Sənsən bizim Hamimiz! Xeyr, onlar cinlərə ibadət edirdilər. Əksəriyyəti də məhz onlara iman gətirmişdi”.

قَالُوا۟ سُبْحَٰنَكَ أَنتَ وَلِيُّنَا مِن دُونِهِم ۖ بَلْ كَانُوا۟
يَعْبُدُونَ ٱلْجِنَّ ۖ أَكْثَرُهُم بِهِم مُّؤْمِنُونَ ٤١

42. Bu gün bir-birinizə nə bir xeyir, nə də bir zərər verə bilərsiniz. Biz zalımlara: “Dadın yalan saydığınız Cəhənnəm əzabını!”– deyəcəyik.

فَٱلْيَوْمَ لَا يَمْلِكُ بَعْضُكُمْ لِبَعْضٍ نَّفْعًا وَلَا ضَرًّا
وَنَقُولُ لِلَّذِينَ ظَلَمُوا۟ ذُوقُوا۟ عَذَابَ ٱلنَّارِ ٱلَّتِى
كُنتُم بِهَا تُكَذِّبُونَ ٤٢

43. Ayələrimiz onlara açıq-aydın oxunduğu zaman: “Bu ancaq sizi atalarınızın ibadət etdiklərindən döndərmək istəyən bir adamdır!”–

وَإِذَا تُتْلَىٰ عَلَيْهِمْ ءَايَٰتُنَا بَيِّنَٰتٍ قَالُوا۟ مَا هَٰذَآ
إِلَّا رَجُلٌ يُرِيدُ أَن يَصُدَّكُمْ عَمَّا كَانَ يَعْبُدُ
ءَابَآؤُكُمْ وَقَالُوا۟ مَا هَٰذَآ إِلَّآ إِفْكٌ مُّفْتَرًى ۚ وَقَالَ

deyərlər. Onlar: “Bu, uydurma yalandan başqa bir şey deyildir!”– deyərlər. Kafirlərə haqq gəldikdə onun barəsində: “Bu yalnız açıq-aydın bir sehrdir!”– deyərlər.

ٱلَّذِينَ كَفَرُوا۟ لِلْحَقِّ لَمَّا جَآءَهُمْ إِنْ هَٰذَآ
إِلَّا سِحْرٌ مُّبِينٌ ٤٣

44. Hərçənd ki, Biz onlara oxuyub öyrənmələri üçün bir kitab verməmişdik və səndən əvvəl də onlara bir xəbərdarlıq edən göndərməmişdik.

وَمَآ ءَاتَيْنَٰهُم مِّن كُتُبٍ يَدْرُسُونَهَا ۖ وَمَآ
أَرْسَلْنَآ إِلَيْهِمْ قَبْلَكَ مِن نَّذِيرٍ ٤٤

45. Onlardan əvvəlkilər də *elçilərimizi* yalançı hesab etmişdilər. Müşriklər onlara verdiklərimizin onda birini belə əldə etməmişlər. Lakin onlar Mənim elçilərimi yalançı saydılar. *Görəydin*, Mənim *onları* həlak etməyim necə oldu!

وَكَذَّبَ ٱلَّذِينَ مِن قَبْلِهِمْ وَمَا بَلَغُوا۟
مِعْشَارَ مَآ ءَاتَيْنَٰهُمْ فَكَذَّبُوا۟ رُسُلِى ۖ
فَكَيْفَ كَانَ نَكِيرِ ٤٥

46. De: “Mənim sizə yalnız bircə nəsihətim var; Allah üçün iki-iki, bir-bir ayağa qalxın, sonra da bir düşünün. Sizin dostunuzda heç bir dəlilik əlaməti yoxdur. O, şiddətli əzab gəlməzdən əvvəl sizi ancaq xəbərdar edəndir”.

۞ قُلْ إِنَّمَآ أَعِظُكُم بِوَٰحِدَةٍ ۖ أَن تَقُومُوا۟ لِلَّهِ
مَثْنَىٰ وَفُرَٰدَىٰ ثُمَّ تَتَفَكَّرُوا۟ ۚ مَا بِصَاحِبِكُم
مِّن جِنَّةٍ ۚ إِنْ هُوَ إِلَّا نَذِيرٌ لَّكُم بَيْنَ يَدَىْ
عَذَابٍ شَدِيدٍ ٤٦

47. De: “Mən sizdən bir haqq istəmişəmsə, onu sizin üçün istəmişəm. Mənim haqqım ancaq Allahdan olacaqdır. O, hər şeyə Şahiddir”.

قُلْ مَا سَأَلْتُكُم مِّنْ أَجْرٍ فَهُوَ لَكُمْ ۖ إِنْ أَجْرِىَ إِلَّا
عَلَى ٱللَّهِ ۖ وَهُوَ عَلَىٰ كُلِّ شَىْءٍ شَهِيدٌ ٤٧

48. De: “Rəbbim haqqı endirir. O, qeybləri biləndir”.

قُلْ إِنَّ رَبِّى يَقْذِفُ بِٱلْحَقِّ عَلَّٰمُ ٱلْغُيُوبِ ٤٨

49. De: “Haqq gəldi. Batil *ona qarşı* nə ortaya *bir şey* çıxarar, nə də *onu* qaytara bilər”.

قُلْ جَآءَ ٱلْحَقُّ وَمَا يُبْدِئُ ٱلْبَٰطِلُ وَمَا
يُعِيدُ ٤٩

**50.** De: “Əgər mən *haqq* yoldan çıxsam, öz əleyhimə çıxmış olaram. Yox, əgər doğru yolla gedirəmsə, bu da Rəbbimin mənə nazil etdiyi vəhyə görədir. Həqiqətən, O, Eşidəndir, Yaxındır”.

قُلْ إِن ضَلَلْتُ فَإِنَّمَا أَضِلُّ عَلَىٰ نَفْسِي ۖ وَإِنِ اهْتَدَيْتُ فَبِمَا يُوحِي إِلَيَّ رَبِّي ۚ إِنَّهُ سَمِيعٌ قَرِيبٌ ﴿٥٠﴾

**51.** Kaş ki, sən o *kafirləri* qorxuya düşdükləri vaxt görəydin. *Onlar* qaçıb *canlarını* qurtara bilməyəcək və onsuz da yaxın bir yerdə ələ keçiriləcəklər.

وَلَوْ تَرَىٰ إِذْ فَزِعُوا فَلَا فَوْتَ وَأُخِذُوا مِن مَّكَانٍ قَرِيبٍ ﴿٥١﴾

**52.** Onlar: “Biz ona inandıq!”– deyəcəklər. Axı uzaq bir yerdə – *Axirətdə* imana necə nail ola bilərlər?!

وَقَالُوا آمَنَّا بِهِ وَأَنَّىٰ لَهُمُ التَّنَاوُشُ مِن مَّكَانٍ بَعِيدٍ ﴿٥٢﴾

**53.** Halbuki bundan əvvəl onu inkar edir və əlçatmaz bir yerdən qeyb haqqında fikir yürüdürdülər.

وَقَدْ كَفَرُوا بِهِ مِن قَبْلُ ۖ وَيَقْذِفُونَ بِالْغَيْبِ مِن مَّكَانٍ بَعِيدٍ ﴿٥٣﴾

**54.** Daha öncə onların bənzərlərinə edildiyi kimi, arzuladıqları şeylərlə onların arasına sədd çəkilər. Həqiqətən, onlar anlaşılmaz bir şübhə içində idilər.

وَحِيلَ بَيْنَهُمْ وَبَيْنَ مَا يَشْتَهُونَ كَمَا فُعِلَ بِأَشْيَاعِهِم مِّن قَبْلُ ۚ إِنَّهُمْ كَانُوا فِي شَكٍّ مُّرِيبٍ ﴿٥٤﴾



## Fatir
## («Yaradan») surəsi

سُورَةُ فَاطِرٍ

*Mərhəmətli və Rəhmli*
*Allahın adı ilə!*

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

1. Göyləri və yeri Yaradan, mələkləri iki, üç və dörd qanadlı elçilər edən Allaha həmd olsun! O, xəlq etdiklərindən istədiyini artırır. Həqiqətən, Allah hər şeyə qadirdir.

ٱلْحَمْدُ لِلَّهِ فَاطِرِ ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضِ جَاعِلِ ٱلْمَلَٰٓئِكَةِ رُسُلًا أُو۟لِىٓ أَجْنِحَةٍ مَّثْنَىٰ وَثُلَٰثَ وَرُبَٰعَ ۚ يَزِيدُ فِى ٱلْخَلْقِ مَا يَشَآءُ ۚ إِنَّ ٱللَّهَ عَلَىٰ كُلِّ شَىْءٍ قَدِيرٌ ١

2. Allah insanlara mərhəmətindən nəyi nəsib edərsə, heç kəs onun qarşısını ala bilməz. Onun göndərmədiyi bir şeyi də Ondan başqa heç kəs verə bilməz. O, Qüdrətlidir, Müdrikdir.

مَّا يَفْتَحِ ٱللَّهُ لِلنَّاسِ مِن رَّحْمَةٍ فَلَا مُمْسِكَ لَهَا ۖ وَمَا يُمْسِكْ فَلَا مُرْسِلَ لَهُۥ مِنۢ بَعْدِهِۦ ۚ وَهُوَ ٱلْعَزِيزُ ٱلْحَكِيمُ ٢

3. Ey insanlar! Allahın sizə verdiyi lütfünü bir xatırlayın. Allahdan başqa sizə göylərdən və yerdən ruzi verən bir xaliq varmı? Ondan başqa heç bir məbud yoxdur. Siz necə də *haqdan* döndərilirsiniz!

يَٰٓأَيُّهَا ٱلنَّاسُ ٱذْكُرُوا۟ نِعْمَتَ ٱللَّهِ عَلَيْكُمْ ۚ هَلْ مِنْ خَٰلِقٍ غَيْرُ ٱللَّهِ يَرْزُقُكُم مِّنَ ٱلسَّمَآءِ وَٱلْأَرْضِ ۚ لَآ إِلَٰهَ إِلَّا هُوَ ۖ فَأَنَّىٰ تُؤْفَكُونَ ٣

4. Əgər onlar səni yalançı hesab etsələr, *bil ki*, səndən əvvəl də elçilər yalançı hesab olunmuşdu. Bütün işlər ancaq Allaha qaytarılacaqdır.

وَإِن يُكَذِّبُوكَ فَقَدْ كُذِّبَتْ رُسُلٌ مِّن قَبْلِكَ ۚ وَإِلَى ٱللَّهِ تُرْجَعُ ٱلْأُمُورُ ٤

5. Ey insanlar! Həqiqətən, Allahın vədi bir həqiqətdir. Qoy bu dünya sizi aldatmasın, tovlayan *şeytan da* sizi yoldan çıxartmasın.

يَٰٓأَيُّهَا ٱلنَّاسُ إِنَّ وَعْدَ ٱللَّهِ حَقٌّ ۖ فَلَا تَغُرَّنَّكُمُ ٱلْحَيَوٰةُ ٱلدُّنْيَا ۖ وَلَا يَغُرَّنَّكُم بِٱللَّهِ ٱلْغَرُورُ ٥

6. Şübhəsiz ki, şeytan sizin düşməninizdir, siz də onu düşmən sayın. O öz tərəfdarlarını Od sakini olmağa çağırır.

إِنَّ ٱلشَّيْطَٰنَ لَكُمْ عَدُوٌّ فَٱتَّخِذُوهُ عَدُوًّا ۚ إِنَّمَا يَدْعُوا۟ حِزْبَهُۥ لِيَكُونُوا۟ مِنْ أَصْحَٰبِ ٱلسَّعِيرِ ٦

7. Kafirlər üçün şiddətli əzab tədarük edilmişdir. İman gətirib yaxşı işlər görənlər üçün isə bağışlanma və böyük bir mükafat hazırlanmışdır.

ٱلَّذِينَ كَفَرُواْ لَهُمْ عَذَابٌ شَدِيدٌۖ وَٱلَّذِينَ ءَامَنُواْ
وَعَمِلُواْ ٱلصَّٰلِحَٰتِ لَهُم مَّغْفِرَةٌ وَأَجْرٌ كَبِيرٌ ٧

8. Pis əməli özünə gözəl göstərilib onu yaxşı hesab edənlə, *doğru yolla gedən kimsə eyni ola bilərmi?* Həqiqətən, Allah istədiyini zəlalətə salır, istədiyini də doğru yola yönəldir. Sən onlara görə özünü üzüb əldən salma. Şübhəsiz ki, Allah onların nə törətdiklərini bilir.

أَفَمَن زُيِّنَ لَهُۥ سُوٓءُ عَمَلِهِۦ فَرَءَاهُ حَسَنًاۖ فَإِنَّ ٱللَّهَ
يُضِلُّ مَن يَشَآءُ وَيَهْدِي مَن يَشَآءُۖ فَلَا تَذْهَبْ
نَفْسُكَ عَلَيْهِمْ حَسَرَٰتٍۚ إِنَّ ٱللَّهَ عَلِيمُۢ بِمَا
يَصْنَعُونَ ٨

9. Buludları hərəkətə gətirən küləkləri göndərən Allahdır. Biz onları ölü bir diyara tərəf qovub, yeri ölümündən sonra onunla canlandırırıq. Diriltmə də belə olacaqdır.

وَٱللَّهُ ٱلَّذِيٓ أَرْسَلَ ٱلرِّيَٰحَ فَتُثِيرُ سَحَابًا فَسُقْنَٰهُ
إِلَىٰ بَلَدٍ مَّيِّتٍ فَأَحْيَيْنَا بِهِ ٱلْأَرْضَ بَعْدَ مَوْتِهَاۚ
كَذَٰلِكَ ٱلنُّشُورُ ٩

10. Kim qüdrət sahibi olmaq istəsə, *bilsin ki*, qüdrət bütünlüklə ancaq Allaha məxsusdur. Gözəl söz Ona tərəf yüksəlir və onu ucaldan yaxşı əməldir. Pis əməllər işlədib hiyləgərlik edənləri şiddətli bir əzab gözləyir. Onların qurduqları hiylələr də boşa çıxacaqdır.

مَن كَانَ يُرِيدُ ٱلْعِزَّةَ فَلِلَّهِ ٱلْعِزَّةُ جَمِيعًاۚ إِلَيْهِ يَصْعَدُ
ٱلْكَلِمُ ٱلطَّيِّبُ وَٱلْعَمَلُ ٱلصَّٰلِحُ يَرْفَعُهُۥۚ
وَٱلَّذِينَ يَمْكُرُونَ ٱلسَّيِّـَٔاتِ لَهُمْ عَذَابٌ
شَدِيدٌۖ وَمَكْرُ أُوْلَٰٓئِكَ هُوَ يَبُورُ ١٠

11. Allah sizi torpaqdan, sonra nütfədən yaratmış, sonra da sizi cütləşdirmişdir. Onun xəbəri olmadan heç bir dişi nə hamilə olar, nə də daşıdığını yerə qoya bilər. Uzunömürlünün uzun ömür sürməsi də, onun ömrünün qısaldılması da ancaq *açıq-aydın* Kitabda (Lövhi-məhfuzda) yazılmışdır. Həqiqətən, bu, Allah üçün çox asandır.

وَٱللَّهُ خَلَقَكُم مِّن تُرَابٍ ثُمَّ مِن نُّطْفَةٍ ثُمَّ
جَعَلَكُمْ أَزْوَٰجًاۚ وَمَا تَحْمِلُ مِنْ أُنثَىٰ وَلَا
تَضَعُ إِلَّا بِعِلْمِهِۦۚ وَمَا يُعَمَّرُ مِن مُّعَمَّرٍ وَلَا
يُنقَصُ مِنْ عُمُرِهِۦٓ إِلَّا فِي كِتَٰبٍۚ إِنَّ ذَٰلِكَ عَلَى ٱللَّهِ
يَسِيرٌ ١١

12. İki dəniz eyni deyildir. Birinin suyu dadlı, şirin və içməyə rahat, digərininki isə həddindən artıq duzlu və acıdır. Onların hər birindən təzə balıq yeyir, taxdığınız zinət əşyalarını çıxarırsınız. Sən gəmilərin onu yara-yara üzdüyünü görürsən. *Bütün bunlar Allahın* lütfünü axtarıb tapmağınız və şükür etməyiniz üçündür.

وَمَا يَسْتَوِي ٱلْبَحْرَانِ هَٰذَا عَذْبٌ فُرَاتٌ
سَآئِغٌ شَرَابُهُۥ وَهَٰذَا مِلْحٌ أُجَاجٌ ۖ وَمِن كُلٍّ
تَأْكُلُونَ لَحْمًا طَرِيًّا وَتَسْتَخْرِجُونَ
حِلْيَةً تَلْبَسُونَهَا ۖ وَتَرَى ٱلْفُلْكَ فِيهِ مَوَاخِرَ
لِتَبْتَغُوا۟ مِن فَضْلِهِۦ وَلَعَلَّكُمْ
تَشْكُرُونَ ﴿١٢﴾

13. O, gecəni gündüzə, gündüzü də gecəyə qatır. O, günəşi və ayı ram etmişdir. Onların hər biri müəyyən olunmuş vaxtadək hərəkət edir. Bu sizin Rəbbiniz olan Allahdır. Mülk Onundur. Sizin Ondan başqa yalvardıqlarınız xurma çəyirdəyinin pərdəsinə belə sahib deyillər.

يُولِجُ ٱلَّيْلَ فِى ٱلنَّهَارِ وَيُولِجُ ٱلنَّهَارَ فِى
ٱلَّيْلِ وَسَخَّرَ ٱلشَّمْسَ وَٱلْقَمَرَ ۖ كُلٌّ
يَجْرِى لِأَجَلٍ مُّسَمًّى ۚ ذَٰلِكُمُ ٱللَّهُ
رَبُّكُمْ لَهُ ٱلْمُلْكُ ۚ وَٱلَّذِينَ تَدْعُونَ مِن
دُونِهِۦ مَا يَمْلِكُونَ مِن قِطْمِيرٍ ﴿١٣﴾

14. Əgər siz onları çağırsanız, onlar sizin duanızı eşitməzlər, eşitsələr də cavab verə bilməzlər. Özləri də Qiyamət günü sizin *onlara* ibadət etdiyinizi danacaqlar. Heç kəs *hər şeydən* Xəbərdar olan *Allah* kimi sənə xəbər verə bilməz.

إِن تَدْعُوهُمْ لَا يَسْمَعُوا۟ دُعَآءَكُمْ وَلَوْ سَمِعُوا۟
مَا ٱسْتَجَابُوا۟ لَكُمْ ۖ وَيَوْمَ ٱلْقِيَٰمَةِ يَكْفُرُونَ
بِشِرْكِكُمْ ۚ وَلَا يُنَبِّئُكَ مِثْلُ خَبِيرٍ ﴿١٤﴾

15. Ey insanlar! Siz Allaha möhtacsınız. Allah isə Zəngindir, Tərifəlayiqdir.

۞ يَٰٓأَيُّهَا ٱلنَّاسُ أَنتُمُ ٱلْفُقَرَآءُ إِلَى ٱللَّهِ ۖ
وَٱللَّهُ هُوَ ٱلْغَنِىُّ ٱلْحَمِيدُ ﴿١٥﴾

16. Əgər istəsə, sizi yox edib *yerinizə* yeni bir məxluq gətirər.

إِن يَشَأْ يُذْهِبْكُمْ وَيَأْتِ بِخَلْقٍ جَدِيدٍ ﴿١٦﴾

17. Bu, Allah üçün çətin deyildir.

وَمَا ذَٰلِكَ عَلَى ٱللَّهِ بِعَزِيزٍ ﴿١٧﴾

18. Heç bir günahkar başqasının günah yükünü daşımaz. Yükü ağır

وَلَا تَزِرُ وَازِرَةٌ وِزْرَ أُخْرَىٰ ۚ وَإِن تَدْعُ مُثْقَلَةٌ

olan kimsə öz yükünü daşımaq üçün *başqasını köməyə* çağırsa və çağırdığı kimsə yaxın qohumu olsa belə, o yükdən heç nə daşınmaz. Sən ancaq Rəbbindən *Onu* görmədikləri halda qorxanları və namaz qılanları xəbərdar edirsən. Kim *günahlardan* təmizlənirsə, öz xeyrinə təmizlənmiş olur. Qayıdış də ancaq Allahadır.

إِلَىٰ حِمْلِهَا لَا يُحْمَلْ مِنْهُ شَيْءٌ وَلَوْ كَانَ ذَا
قُرْبَىٰٓ ۗ إِنَّمَا تُنذِرُ ٱلَّذِينَ يَخْشَوْنَ رَبَّهُم
بِٱلْغَيْبِ وَأَقَامُوا۟ ٱلصَّلَوٰةَ ۚ وَمَن تَزَكَّىٰ فَإِنَّمَا
يَتَزَكَّىٰ لِنَفْسِهِۦ ۚ وَإِلَى ٱللَّهِ ٱلْمَصِيرُ ﴿١٨﴾

19. Kor ilə görən eyni deyildir,

وَمَا يَسْتَوِى ٱلْأَعْمَىٰ وَٱلْبَصِيرُ ﴿١٩﴾

20. zülmətlərlə nur da,

وَلَا ٱلظُّلُمَٰتُ وَلَا ٱلنُّورُ ﴿٢٠﴾

21. kölgə ilə bürkü də *eyni deyildir*.

وَلَا ٱلظِّلُّ وَلَا ٱلْحَرُورُ ﴿٢١﴾

22. Dirilərlə ölülər də eyni deyillər. Şübhəsiz ki, Allah istədiyinə *haqqı* eşitdirir. Sən isə qəbirlərdə olanlara eşitdirə bilməzsən.

وَمَا يَسْتَوِى ٱلْأَحْيَآءُ وَلَا ٱلْأَمْوَٰتُ ۚ إِنَّ ٱللَّهَ
يُسْمِعُ مَن يَشَآءُ ۖ وَمَآ أَنتَ بِمُسْمِعٍ مَّن فِى
ٱلْقُبُورِ ﴿٢٢﴾

23. Sən ancaq qorxudub xəbərdar edənsən.

إِنْ أَنتَ إِلَّا نَذِيرٌ ﴿٢٣﴾

24. Həqiqətən, Biz səni haqla müjdə verən və qorxudub xəbərdar edən olaraq göndərdik. Elə bir ümmət yoxdur ki, ona xəbərdar edən *bir peyğəmbər* gəlmiş olmasın.

إِنَّآ أَرْسَلْنَٰكَ بِٱلْحَقِّ بَشِيرًا وَنَذِيرًا ۚ وَإِن
مِّنْ أُمَّةٍ إِلَّا خَلَا فِيهَا نَذِيرٌ ﴿٢٤﴾

25. Əgər onlar səni yalançı hesab etsələr, bil ki, onlardan əvvəlkilər də *elçiləri* yalançı hesab etmişdilər. Halbuki elçiləri onlara aydın dəlillər, müqəddəs yazılar və nur saçan kitab gətirmişdilər.

وَإِن يُكَذِّبُوكَ فَقَدْ كَذَّبَ ٱلَّذِينَ مِن قَبْلِهِمْ
جَآءَتْهُمْ رُسُلُهُم بِٱلْبَيِّنَٰتِ وَبِٱلزُّبُرِ
وَبِٱلْكِتَٰبِ ٱلْمُنِيرِ ﴿٢٥﴾

26. Sonra Mən *haqqı* inkar edənləri yaxaladım. *Görəydin* Mənim *onları* həlak etməyim necə oldu!

ثُمَّ أَخَذْتُ ٱلَّذِينَ كَفَرُوا۟ ۖ فَكَيْفَ كَانَ
نَكِيرِ ﴿٢٦﴾

27. Məgər Allahın göydən yağmur endirdiyini və onunla müxtəlif rəngli meyvələr yetişdirdiyimizi görmürsənmi? Dağlarda da müxtəlif rəngli – ağ, qırmızı və tünd qara cığırlar əmələ gətirdik.

أَلَمْ تَرَ أَنَّ ٱللَّهَ أَنزَلَ مِنَ ٱلسَّمَآءِ مَآءً
فَأَخْرَجْنَا بِهِۦ ثَمَرَٰتٍ مُّخْتَلِفًا أَلْوَٰنُهَا
وَمِنَ ٱلْجِبَالِ جُدَدٌۢ بِيضٌ وَحُمْرٌ مُّخْتَلِفٌ
أَلْوَٰنُهَا وَغَرَابِيبُ سُودٌ ٢٧

28. İnsanlar, heyvanlar və mal-qara arasında da bu cür müxtəlif rəngli olanları vardır. Allahdan Öz qulları arasında ancaq alimlər qorxarlar. Həqiqətən, Allah Qüdrətlidir, Bağışlayandır.

وَمِنَ ٱلنَّاسِ وَٱلدَّوَآبِّ وَٱلْأَنْعَٰمِ مُخْتَلِفٌ
أَلْوَٰنُهُۥ كَذَٰلِكَ إِنَّمَا يَخْشَى ٱللَّهَ مِنْ عِبَادِهِ
ٱلْعُلَمَٰٓؤُا۟ إِنَّ ٱللَّهَ عَزِيزٌ غَفُورٌ ٢٨

29. Allahın Kitabını oxuyanlar, namaz qılanlar və özlərinə verdiyimiz ruzilərdən gizli və aşkar xərcləyənlər səmərəsiz olmayacaq bir ticarətə ümid edirlər ki,

إِنَّ ٱلَّذِينَ يَتْلُونَ كِتَٰبَ ٱللَّهِ وَأَقَامُوا۟ ٱلصَّلَوٰةَ
وَأَنفَقُوا۟ مِمَّا رَزَقْنَٰهُمْ سِرًّا وَعَلَانِيَةً يَرْجُونَ
تِجَٰرَةً لَّن تَبُورَ ٢٩

30. *Allah* onlara mükafatlarını tam olaraq versin, üstəlik də onlara Öz lütfünü artırsın. Həqiqətən, O, Bağışlayandır, şükürün əvəzini verəndir.

لِيُوَفِّيَهُمْ أُجُورَهُمْ وَيَزِيدَهُم مِّن فَضْلِهِۦٓ
إِنَّهُۥ غَفُورٌ شَكُورٌ ٣٠

31. Sənə vəhy etdiyimiz Kitab, özündən əvvəlkiləri təsdiqləyici kimi *gələn* haqdır. Həqiqətən, Allah Öz qullarından Xəbərdardır, Görəndir.

وَٱلَّذِىٓ أَوْحَيْنَآ إِلَيْكَ مِنَ ٱلْكِتَٰبِ هُوَ ٱلْحَقُّ
مُصَدِّقًا لِّمَا بَيْنَ يَدَيْهِ إِنَّ ٱللَّهَ بِعِبَادِهِۦ
لَخَبِيرٌۢ بَصِيرٌ ٣١

32. Sonra, Kitabı qullarımız içərisindən seçdiklərimizə miras etdik. Onlardan kimisi özünə zülm edər, kimisi orta yol tutar, kimisi də Allahın izni ilə yaxşı işlərdə öndə gedər. Böyük lütf də budur.

ثُمَّ أَوْرَثْنَا ٱلْكِتَٰبَ ٱلَّذِينَ ٱصْطَفَيْنَا مِنْ
عِبَادِنَا فَمِنْهُمْ ظَالِمٌ لِّنَفْسِهِۦ وَمِنْهُم
مُّقْتَصِدٌ وَمِنْهُمْ سَابِقٌۢ بِٱلْخَيْرَٰتِ بِإِذْنِ
ٱللَّهِ ذَٰلِكَ هُوَ ٱلْفَضْلُ ٱلْكَبِيرُ ٣٢

**33.** Onlar Ədn bağlarına daxil olacaq, orada qızıl bilərziklərlə və incilərlə bəzədiləcəklər. Libasları da ipəkdən olacaqdır.

جَنَّٰتُ عَدۡنٖ يَدۡخُلُونَهَا يُحَلَّوۡنَ فِيهَا مِنۡ
أَسَاوِرَ مِن ذَهَبٖ وَلُؤۡلُؤٗاۖ وَلِبَاسُهُمۡ فِيهَا
حَرِيرٞ ٣٣

**34.** Onlar deyəcəklər: “Qəm-qüssəni bizdən uzaq edən Allaha həmd olsun! Həqiqətən, Rəbbimiz Bağışlayandır, şükürün əvəzini verəndir.

وَقَالُواْ ٱلۡحَمۡدُ لِلَّهِ ٱلَّذِيٓ أَذۡهَبَ عَنَّا ٱلۡحَزَنَۖ
إِنَّ رَبَّنَا لَغَفُورٞ شَكُورٌ ٣٤

**35.** Öz lütfü ilə bizi əbədi iqamətgahda yerləşdirən Odur. Orada bizə nə bir yorğunluq üz verəcək, nə də bir üzgünlük toxunacaqdır!”

ٱلَّذِيٓ أَحَلَّنَا دَارَ ٱلۡمُقَامَةِ مِن فَضۡلِهِۦ لَا
يَمَسُّنَا فِيهَا نَصَبٞ وَلَا يَمَسُّنَا فِيهَا لُغُوبٞ ٣٥

**36.** Kafirləri isə Cəhənnəm odu gözləyir. Orada nə öldürülməzlər ki, ölüb canları qurtarsın, nə də bu odun əzabı *onlar üçün* yüngülləşdirilər. Biz hər bir kafiri belə cəzalandırırıq.

وَٱلَّذِينَ كَفَرُواْ لَهُمۡ نَارُ جَهَنَّمَ لَا يُقۡضَىٰ
عَلَيۡهِمۡ فَيَمُوتُواْ وَلَا يُخَفَّفُ عَنۡهُم مِّنۡ
عَذَابِهَاۚ كَذَٰلِكَ نَجۡزِي كُلَّ كَفُورٖ ٣٦

**37.** Onlar orada fəryad qoparıb yalvaracaqlar: “Ey Rəbbimiz! Bizi *buradan* çıxart ki, *əvvəllər* etdiyimiz əməlləri deyil, yaxşı əməllər edək”. *Onlara deyiləcək*: “Məgər orada sizə düşünəcək kimsənin düşünə biləcəyi qədər uzun ömür vermədikmi? Sizə qorxudub xəbərdar edən *Peyğəmbər* də gəlmişdi. Elə isə dadın *əzabı*! Zalımlara kömək edən olmaz”.

وَهُمۡ يَصۡطَرِخُونَ فِيهَا رَبَّنَآ أَخۡرِجۡنَا
نَعۡمَلۡ صَٰلِحًا غَيۡرَ ٱلَّذِي كُنَّا نَعۡمَلُۚ
أَوَلَمۡ نُعَمِّرۡكُم مَّا يَتَذَكَّرُ فِيهِ مَن تَذَكَّرَ
وَجَآءَكُمُ ٱلنَّذِيرُۖ فَذُوقُواْ فَمَا لِلظَّٰلِمِينَ
مِن نَّصِيرٍ ٣٧

**38.** Şübhəsiz ki, Allah göylərin və yerin qeybini Biləndir. O, köksləərdə olanları da Bilir.

إِنَّ ٱللَّهَ عَٰلِمُ غَيۡبِ ٱلسَّمَٰوَٰتِ وَٱلۡأَرۡضِۚ
إِنَّهُۥ عَلِيمُۢ بِذَاتِ ٱلصُّدُورِ ٣٨

**39.** Sizi yer üzündə xələflər edən Odur. Kafirin küfrü öz əleyhinə olar. Kafirlərin küfrü Rəbbi yanında

هُوَ ٱلَّذِي جَعَلَكُمۡ خَلَٰٓئِفَ فِي ٱلۡأَرۡضِۚ فَمَن كَفَرَ
فَعَلَيۡهِ كُفۡرُهُۥۖ وَلَا يَزِيدُ ٱلۡكَٰفِرِينَ كُفۡرُهُمۡ عِندَ

ancaq onlara bəslənən qəzəbi artırar. Kafirlərin küfrü onlara ziyandan başqa bir şey artırmaz.

رَبِّهِمْ إِلَّا مَقْتًا ۖ وَلَا يَزِيدُ الْكَافِرِينَ كُفْرُهُمْ إِلَّا خَسَارًا ٣٩

40. De: “Allahdan başqa yalvardığınız şəriklər haqda düşündünüzmü? Bir mənə göstərin görüm, onlar yer üzündə nəyi yaradıblar? Yoxsa onların göylərin yaradılmasında şərikliyi var?” Yaxud onlara bir kitab vermişik, onlar da ondakı dəlilə istinad edirlər? Xeyr! Zalımlar bir-birinə ancaq yalan vəd verirlər.

قُلْ أَرَأَيْتُمْ شُرَكَاءَكُمُ الَّذِينَ تَدْعُونَ مِن دُونِ اللَّهِ أَرُونِي مَاذَا خَلَقُوا مِنَ الْأَرْضِ أَمْ لَهُمْ شِرْكٌ فِي السَّمَاوَاتِ أَمْ آتَيْنَاهُمْ كِتَابًا فَهُمْ عَلَىٰ بَيِّنَتٍ مِّنْهُ ۚ بَلْ إِن يَعِدُ الظَّالِمُونَ بَعْضُهُم بَعْضًا إِلَّا غُرُورًا ٤٠

41. Həqiqətən, Allah göyləri və yeri tərpənməsinlər deyə, tutub saxlayır. Əgər tərpənsələr, Ondan başqa onları heç kəs tutub saxlaya bilməz. Həqiqətən də, O, Həlimdir, Bağışlayandır.

۞ إِنَّ اللَّهَ يُمْسِكُ السَّمَاوَاتِ وَالْأَرْضَ أَن تَزُولَا ۚ وَلَئِن زَالَتَا إِنْ أَمْسَكَهُمَا مِنْ أَحَدٍ مِّن بَعْدِهِ ۚ إِنَّهُ كَانَ حَلِيمًا غَفُورًا ٤١

42. Onlar Allaha çox möhkəm and içdilər ki, özlərinə qorxudan *bir peyğəmbər* gəlsə, hər hansı ümmətdən daha çox doğru yolda olacaqlar. Onlara qorxudan *peyğəmbər* gəldikdə isə bu, onların ancaq nifrətini artırdı.

وَأَقْسَمُوا بِاللَّهِ جَهْدَ أَيْمَانِهِمْ لَئِن جَاءَهُمْ نَذِيرٌ لَّيَكُونُنَّ أَهْدَىٰ مِنْ إِحْدَى الْأُمَمِ ۖ فَلَمَّا جَاءَهُمْ نَذِيرٌ مَّا زَادَهُمْ إِلَّا نُفُورًا ٤٢

43. *Bütün bunlar* onların yer üzündə təkəbbür göstərmələrinə və yaramaz hiyləgərliklər törətdiklərinə görə idi. Yaramaz hiylələr isə ancaq öz sahiblərini qaplayar. Onlar əvvəlkilərin başlarına gələn aqibətdən başqasınımı gözləyirlər? Sən Allahın qayda-qanununa heç bir əvəz tapa bilməzsən, Allahın qayda-qanununda heç bir dəyişiklik də tapa bilməzsən.

اسْتِكْبَارًا فِي الْأَرْضِ وَمَكْرَ السَّيِّئِ ۚ وَلَا يَحِيقُ الْمَكْرُ السَّيِّئُ إِلَّا بِأَهْلِهِ ۚ فَهَلْ يَنظُرُونَ إِلَّا سُنَّتَ الْأَوَّلِينَ ۚ فَلَن تَجِدَ لِسُنَّتِ اللَّهِ تَبْدِيلًا ۖ وَلَن تَجِدَ لِسُنَّتِ اللَّهِ تَحْوِيلًا ٤٣

44. Məgər onlar yer üzündə gəzib-dolaşıb özlərindən əvvəlkilərin aqibətinin necə olduğunu görmürlərmi? Onlar ki bunlardan daha qüvvətli idilər. Göylərdə və yerdə Allahdan qaçıb xilas ola biləcək heç bir şey yoxdur. Həqiqətən, O, Biləndir və *hər şeyə* Qadirdir.

أَوَلَمْ يَسِيرُوا فِي الْأَرْضِ فَيَنظُرُوا كَيْفَ كَانَ
عَاقِبَةُ الَّذِينَ مِن قَبْلِهِمْ وَكَانُوا أَشَدَّ مِنْهُمْ
قُوَّةً وَمَا كَانَ اللَّهُ لِيُعْجِزَهُ مِن شَيْءٍ فِي السَّمَاوَاتِ
وَلَا فِي الْأَرْضِ إِنَّهُ كَانَ عَلِيمًا قَدِيرًا ﴿٤٤﴾

45. Əgər Allah insanları etdikləri günahlara görə *dərhal* cəzalandırsaydı, yer üzündə bir canlını belə sağ buraxmazdı. Lakin Allah onlara müəyyən vaxtadək möhlət verir. Vaxtları çatanda isə *hər kəsə öz əməlinə görə cəza, yaxud mükafat verəcəkdir*. Şübhəsiz ki, Allah Öz qullarını görür.

وَلَوْ يُؤَاخِذُ اللَّهُ النَّاسَ بِمَا كَسَبُوا مَا
تَرَكَ عَلَىٰ ظَهْرِهَا مِن دَابَّةٍ وَلَٰكِن
يُؤَخِّرُهُمْ إِلَىٰ أَجَلٍ مُّسَمًّى فَإِذَا جَاءَ
أَجَلُهُمْ فَإِنَّ اللَّهَ كَانَ بِعِبَادِهِ
بَصِيرًا ﴿٤٥﴾



## Ya sin surəsi

*Mərhəmətli və Rəhmli*
*Allahın adı ilə!*

1. Ya. Sin.
2. And olsun hikmətli Qurana!
3. Həqiqətən, sən göndərilmiş elçilərdənsən,
4. doğru yoldasan.
5. *Bu Quran* Qüdrətli və Rəhmli *Allah* tərəfindən nazil edilmişdir ki,
6. ataları xəbərdar edilməmiş, özləri də qafil olan bir tayfanı xəbərdar edəsən.
7. Onların əksəriyyəti barəsindəki söz gerçəkləşdi. Çünki onlar iman gətirmədilər.
8. Həqiqətən, Biz onların boyunlarına, çənələrinə dirənmiş zəncirlər keçirtmişik. Odur ki, başları təkəbbürlə yuxarı qalxmışdır.
9. Biz onların önlərindən bir sədd, arxalarından da başqa bir sədd çəkdik və gözlərinə pərdə saldıq. Buna görə də onlar *haqqı* görmürlər.
10. Sən onları qorxutsan da, qorxutmasan da, onlar üçün eynidir, iman gətirməyəcəklər.
11. Sən ancaq Zikrə tabe olub Mərhəmətli *Allahı* görmədən *Ondan*

## سُورَةُ يسٓ

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

يسٓ ①

وَٱلْقُرْءَانِ ٱلْحَكِيمِ ②

إِنَّكَ لَمِنَ ٱلْمُرْسَلِينَ ③

عَلَىٰ صِرَٰطٍ مُّسْتَقِيمٍ ④

تَنزِيلَ ٱلْعَزِيزِ ٱلرَّحِيمِ ⑤

لِتُنذِرَ قَوْمًا مَّآ أُنذِرَ ءَابَآؤُهُمْ فَهُمْ غَٰفِلُونَ ⑥

لَقَدْ حَقَّ ٱلْقَوْلُ عَلَىٰٓ أَكْثَرِهِمْ فَهُمْ لَا
يُؤْمِنُونَ ⑦

إِنَّا جَعَلْنَا فِىٓ أَعْنَٰقِهِمْ أَغْلَٰلًا فَهِىَ إِلَى
ٱلْأَذْقَانِ فَهُم مُّقْمَحُونَ ⑧

وَجَعَلْنَا مِنۢ بَيْنِ أَيْدِيهِمْ سَدًّا وَمِنْ خَلْفِهِمْ
سَدًّا فَأَغْشَيْنَٰهُمْ فَهُمْ لَا يُبْصِرُونَ ⑨

وَسَوَآءٌ عَلَيْهِمْ ءَأَنذَرْتَهُمْ أَمْ لَمْ تُنذِرْهُمْ لَا
يُؤْمِنُونَ ⑩

إِنَّمَا تُنذِرُ مَنِ ٱتَّبَعَ ٱلذِّكْرَ وَخَشِىَ

çəkinən şəxsi qorxuda bilərsən. Beləsini bağışlanma və çox gözəl bir mükafatla müjdələ.

ٱلرَّحْمَٰنَ بِٱلْغَيْبِ ۖ فَبَشِّرْهُ بِمَغْفِرَةٍ وَأَجْرٍ
كَرِيمٍ ١١

12. Həqiqətən, ölüləri diriltdən, onların bu dünyada törətdiklərini və tərk etdiklərini yazan Bizik. Biz hər şeyi açıq-aydın Yazıda (*Lövhi-məhfuzda*) qeydə almışıq.

إِنَّا نَحْنُ نُحْيِ ٱلْمَوْتَىٰ وَنَكْتُبُ مَا قَدَّمُوا۟
وَءَاثَٰرَهُمْ ۚ وَكُلَّ شَىْءٍ أَحْصَيْنَٰهُ فِىٓ
إِمَامٍ مُّبِينٍ ١٢

13. Sən onlara o zaman elçilər gəlmiş şəhər sakinlərini misal çək.

وَٱضْرِبْ لَهُم مَّثَلًا أَصْحَٰبَ ٱلْقَرْيَةِ إِذْ
جَآءَهَا ٱلْمُرْسَلُونَ ١٣

14. O zaman onlara iki nəfər *elçi* göndərdik, amma onlar ikisini də yalançı saydılar. Biz də *elçilərimizi* üçüncüsü ilə qüvvətləndirdik. *Bu elçilər*: “Həqiqətən, biz sizə göndərilmiş elçilərik”– dedilər.

إِذْ أَرْسَلْنَآ إِلَيْهِمُ ٱثْنَيْنِ فَكَذَّبُوهُمَا فَعَزَّزْنَا
بِثَالِثٍ فَقَالُوٓا۟ إِنَّآ إِلَيْكُم مُّرْسَلُونَ ١٤

15. Onlar dedilər: “Siz də bizim kimi sadəcə bir insansınız. Mərhəmətli *Allah sizə* heç bir şey nazil etməmişdir. Siz ancaq yalan danışırsınız”.

قَالُوا۟ مَآ أَنتُمْ إِلَّا بَشَرٌ مِّثْلُنَا وَمَآ أَنزَلَ
ٱلرَّحْمَٰنُ مِن شَىْءٍ إِنْ أَنتُمْ إِلَّا تَكْذِبُونَ ١٥

16. *Elçilər* dedilər: “Rəbbimiz bilir ki, biz, həqiqətən də, sizə göndərilmiş elçilərik.

قَالُوا۟ رَبُّنَا يَعْلَمُ إِنَّآ إِلَيْكُمْ لَمُرْسَلُونَ ١٦

17. Bizim vəzifəmiz ancaq *vəhy olunanı* aşkar təbliğ etməkdir”.

وَمَا عَلَيْنَآ إِلَّا ٱلْبَلَٰغُ ٱلْمُبِينُ ١٧

18. Onlar dedilər: “Biz sizdə bəd əlamət gördük. Əgər *dəvətinizə* son qoymasanız, sizi mütləq daşqalaq edəcəyik və bizdən sizə mütləq ağrılı-acılı bir əzab toxunacaqdır”.

قَالُوٓا۟ إِنَّا تَطَيَّرْنَا بِكُمْ ۖ لَئِن لَّمْ تَنتَهُوا۟
لَنَرْجُمَنَّكُمْ وَلَيَمَسَّنَّكُم مِّنَّا عَذَابٌ أَلِيمٌ ١٨

**19.** *Elçilər* dedilər: "Sizin uğursuzluğunuz öz ucbatınızdandır. Məgər sizə edilən öyüd-nəsihəti *bəd əlamət sayırsınız*? Doğrusu, siz həddi aşmış bir millətsiniz".

قَالُوا طَائِرُكُم مَّعَكُمْ أَئِن ذُكِّرْتُم بَلْ
أَنتُمْ قَوْمٌ مُّسْرِفُونَ ﴿١٩﴾

**20.** Şəhərin kənarından bir kişi qaça-qaça gəlib dedi: "Ay camaat! Elçilərin ardınca gedin!

وَجَاءَ مِنْ أَقْصَا الْمَدِينَةِ رَجُلٌ يَسْعَىٰ قَالَ
يَا قَوْمِ اتَّبِعُوا الْمُرْسَلِينَ ﴿٢٠﴾

**21.** Sizdən heç bir mükafat istəməyən, özləri də doğru yolda olan şəxslərin ardınca gedin!

اتَّبِعُوا مَن لَّا يَسْأَلُكُمْ أَجْرًا وَهُم
مُّهْتَدُونَ ﴿٢١﴾

**22.** Mənə nə olub ki, məni yaradana və hüzuruna qaytarılacağınız *Allaha* ibadət etməyim?

وَمَا لِيَ لَا أَعْبُدُ الَّذِي فَطَرَنِي وَإِلَيْهِ
تُرْجَعُونَ ﴿٢٢﴾

**23.** Mən heç Ondan başqa məbudlar qəbul edərəmmi? Əgər Mərhəmətli *Allah* mənə bir zərər yetirmək istəsə, onların şəfaəti mənə heç bir fayda verməz və onlar məni xilas edə bilməzlər.

أَأَتَّخِذُ مِن دُونِهِ آلِهَةً إِن يُرِدْنِ الرَّحْمَٰنُ
بِضُرٍّ لَّا تُغْنِ عَنِّي شَفَاعَتُهُمْ شَيْئًا وَلَا
يُنقِذُونِ ﴿٢٣﴾

**24.** Bax onda mən açıq-aydın azğınlığa düşmüş olaram.

إِنِّي إِذًا لَّفِي ضَلَالٍ مُّبِينٍ ﴿٢٤﴾

**25.** Həqiqətən, mən sizin Rəbbinizə iman gətirdim. Mənə qulaq asın!"

إِنِّي آمَنتُ بِرَبِّكُمْ فَاسْمَعُونِ ﴿٢٥﴾

**26.** *Şəhərin sakinləri bu kişini öldürdükdən sonra* ona: "Cənnətə daxil ol!"– deyildi. O dedi: "Kaş xalqım biləydi ki,

قِيلَ ادْخُلِ الْجَنَّةَ قَالَ يَا لَيْتَ قَوْمِي
يَعْلَمُونَ ﴿٢٦﴾

**27.** Rəbbim məni bağışladı və məni hörmətli adamlardan etdi".

بِمَا غَفَرَ لِي رَبِّي وَجَعَلَنِي مِنَ الْمُكْرَمِينَ ﴿٢٧﴾

**28.** Biz ondan sonra xalqının üstünə göydən heç bir qoşun göndərmədik və heç göndərən də deyildik.

۞ وَمَا أَنزَلْنَا عَلَىٰ قَوْمِهِ مِن بَعْدِهِ مِن جُندٍ
مِّنَ السَّمَاءِ وَمَا كُنَّا مُنزِلِينَ ﴿٢٨﴾

29. Onları məhv edən ancaq dəhşətli bir səs oldu. Onlar birdən sönüb getdilər.

إِن كَانَتْ إِلَّا صَيْحَةً وَٰحِدَةً فَإِذَا هُمْ
خَٰمِدُونَ ٢٩

30. Vay bu qulların halına! Onlara elə bir elçi gəlməyib ki, ona istehza etməsinlər.

يَٰحَسْرَةً عَلَى ٱلْعِبَادِ مَا يَأْتِيهِم مِّن رَّسُولٍ
إِلَّا كَانُوا۟ بِهِۦ يَسْتَهْزِءُونَ ٣٠

31. Məgər onlar özlərindən əvvəl neçə-neçə nəsilləri məhv etdiyimizi və onların bir daha geriyə – bunların yanına qayıtmadığını görmürlərmi?

أَلَمْ يَرَوْا۟ كَمْ أَهْلَكْنَا قَبْلَهُم مِّنَ ٱلْقُرُونِ
أَنَّهُمْ إِلَيْهِمْ لَا يَرْجِعُونَ ٣١

32. Hamısı bir yerdə Bizim hüzurumuza gətiriləcəklər.

وَإِن كُلٌّ لَّمَّا جَمِيعٌ لَّدَيْنَا مُحْضَرُونَ ٣٢

33. Ölü torpaq onlar üçün bir dəlildir. Biz onu yağışla dirildir, oradan taxıl çıxardırıq, onlar da ondan yeyirlər.

وَءَايَةٌ لَّهُمُ ٱلْأَرْضُ ٱلْمَيْتَةُ أَحْيَيْنَٰهَا
وَأَخْرَجْنَا مِنْهَا حَبًّا فَمِنْهُ يَأْكُلُونَ ٣٣

34. Biz orada xurma bağları və üzümlüklər yaratdıq, bulaqlar qaynadıb çıxartdıq ki,

وَجَعَلْنَا فِيهَا جَنَّٰتٍ مِّن نَّخِيلٍ وَأَعْنَٰبٍ
وَفَجَّرْنَا فِيهَا مِنَ ٱلْعُيُونِ ٣٤

35. onların meyvələrindən və öz əlləri ilə becərdiklərindən yesinlər. Bəs onlar şükür etməyəcəklərmi?

لِيَأْكُلُوا۟ مِن ثَمَرِهِۦ وَمَا عَمِلَتْهُ أَيْدِيهِمْ
أَفَلَا يَشْكُرُونَ ٣٥

36. Yerin bitirdiklərindən, insanların özlərindən və bilmədiklərindən bütün cütləri yaradan Allah pakdır, müqəddəsdir.

سُبْحَٰنَ ٱلَّذِى خَلَقَ ٱلْأَزْوَٰجَ كُلَّهَا
مِمَّا تُنۢبِتُ ٱلْأَرْضُ وَمِنْ أَنفُسِهِمْ وَمِمَّا لَا
يَعْلَمُونَ ٣٦

37. Gecə də onlar üçün bir dəlildir. Biz gündüzü ondan ayırıb çıxaran kimi onlar zülmət içində qalırlar.

وَءَايَةٌ لَّهُمُ ٱلَّيْلُ نَسْلَخُ مِنْهُ ٱلنَّهَارَ فَإِذَا
هُم مُّظْلِمُونَ ٣٧

38. Günəş də özünün qaldığı yerə axıb gedir. Bu, Qüdrətli, Bilən Allahın əzəli hökmüdür.

وَٱلشَّمْسُ تَجْرِى لِمُسْتَقَرٍّ لَّهَا ذَٰلِكَ
تَقْدِيرُ ٱلْعَزِيزِ ٱلْعَلِيمِ ٣٨

39. Ay üçün də mənzillər müəyyən etmişik. Nəhayət, o tədricən dönüb xurma ağacının qurumuş budağı kimi əyri olur.

وَالْقَمَرَ قَدَّرْنَاهُ مَنَازِلَ حَتَّىٰ عَادَ كَالْعُرْجُونِ الْقَدِيمِ ﴿٣٩﴾

40. Nə günəş aya çatar, nə də gecə gündüzü keçə bilər. Onların hər biri öz orbiti ilə üzüb gedir.

لَا الشَّمْسُ يَنبَغِي لَهَا أَن تُدْرِكَ الْقَمَرَ وَلَا اللَّيْلُ سَابِقُ النَّهَارِ ۚ وَكُلٌّ فِي فَلَكٍ يَسْبَحُونَ ﴿٤٠﴾

41. Onların nəslini yüklü gəmidə daşımağımız da onlar üçün bir dəlildir.

وَآيَةٌ لَّهُمْ أَنَّا حَمَلْنَا ذُرِّيَّتَهُمْ فِي الْفُلْكِ الْمَشْحُونِ ﴿٤١﴾

42. Biz onlar üçün buna bənzər daha neçə-neçə minik vasitələri yaratdıq.

وَخَلَقْنَا لَهُم مِّن مِّثْلِهِ مَا يَرْكَبُونَ ﴿٤٢﴾

43. Əgər istəsək, onları suya qərq edərik. Onda nə onların imdadına çatan olar, nə də onlar xilas ola bilərlər.

وَإِن نَّشَأْ نُغْرِقْهُمْ فَلَا صَرِيخَ لَهُمْ وَلَا هُمْ يُنقَذُونَ ﴿٤٣﴾

44. Yalnız Bizim onlara rəhm etməyimiz və onlara, müəyyən edilmiş vaxtadək, gün-güzəran nəsib etməyimiz istisnadır.

إِلَّا رَحْمَةً مِّنَّا وَمَتَاعًا إِلَىٰ حِينٍ ﴿٤٤﴾

45. Onlara: "Önünüzdə olandan və arxanızca gələndən (dünyada və axirətdə olan) əzabdan qorxun ki, bəlkə sizə rəhm oluna!"– deyildikdə üz çevirirlər.

وَإِذَا قِيلَ لَهُمُ اتَّقُوا مَا بَيْنَ أَيْدِيكُمْ وَمَا خَلْفَكُمْ لَعَلَّكُمْ تُرْحَمُونَ ﴿٤٥﴾

46. Onlara öz Rəbbinin ayələrindən elə bir ayə gəlmir ki, ondan üz döndərməsinlər.

وَمَا تَأْتِيهِم مِّنْ آيَةٍ مِّنْ آيَاتِ رَبِّهِمْ إِلَّا كَانُوا عَنْهَا مُعْرِضِينَ ﴿٤٦﴾

47. Onlara: "Allahın sizə verdiyi ruzidən sərf edin!"– deyildikdə, kafirlər möminlərə deyirlər: "Allahın istədiyi təqdirdə yedirdəcəyi kimsəni bizmi

وَإِذَا قِيلَ لَهُمْ أَنفِقُوا مِمَّا رَزَقَكُمُ اللَّهُ قَالَ الَّذِينَ كَفَرُوا لِلَّذِينَ آمَنُوا أَنُطْعِمُ مَن لَّوْ يَشَاءُ اللَّهُ أَطْعَمَهُ إِنْ أَنتُمْ إِلَّا فِي ضَلَالٍ مُّبِينٍ ﴿٤٧﴾

yedirdəcəyik? Siz ancaq açıq-aydın azğınlıq içindəsiniz".

48. Onlar: "Əgər doğru deyirsinizsə, bu vəd nə vaxt olacaq?"– deyə soruşurlar.

وَيَقُولُونَ مَتَىٰ هَٰذَا ٱلۡوَعۡدُ إِن كُنتُمۡ صَٰدِقِينَ ٤٨

49. Onlar sadəcə olaraq, bir-birləri ilə höcətləşərkən özlərini yaxalayacaq bir tükürpədici səsi gözləyirlər.

مَا يَنظُرُونَ إِلَّا صَيۡحَةٗ وَٰحِدَةٗ تَأۡخُذُهُمۡ
وَهُمۡ يَخِصِّمُونَ ٤٩

50. Onlar nə bir vəsiyyət etməyə qadir olacaq, nə də ailələrinin yanına qayıda biləcəklər.

فَلَا يَسۡتَطِيعُونَ تَوۡصِيَةٗ وَلَآ إِلَىٰٓ أَهۡلِهِمۡ
يَرۡجِعُونَ ٥٠

51. Sur ikinci dəfə üfürülən kimi onlar dərhal qəbirlərdən çıxıb Rəbbinə tərəf axışacaqlar.

وَنُفِخَ فِي ٱلصُّورِ فَإِذَا هُم مِّنَ ٱلۡأَجۡدَاثِ إِلَىٰ
رَبِّهِمۡ يَنسِلُونَ ٥١

52. Onlar deyəcəklər: "Vay halımıza! Bizi yatdığımız yerdən kim qaldırdı? Bu, Mərhəmətli Allahın vəd etdiyi qiyamətdir. Elçilər doğru deyirlərmiş".

قَالُواْ يَٰوَيۡلَنَا مَنۢ بَعَثَنَا مِن مَّرۡقَدِنَاۜۗ هَٰذَا مَا
وَعَدَ ٱلرَّحۡمَٰنُ وَصَدَقَ ٱلۡمُرۡسَلُونَ ٥٢

53. Bircə dəhşətli səs qopan kimi onların hamısı hüzurumuza gətiriləcəklər.

إِن كَانَتۡ إِلَّا صَيۡحَةٗ وَٰحِدَةٗ فَإِذَا هُمۡ
جَمِيعٞ لَّدَيۡنَا مُحۡضَرُونَ ٥٣

54. Bu gün heç kəsə heç bir haqsızlıq edilməyəcəkdir. Sizə ancaq etdiyiniz əməllərin əvəzi veriləcəkdir.

فَٱلۡيَوۡمَ لَا تُظۡلَمُ نَفۡسٞ شَيۡـٔٗا وَلَا تُجۡزَوۡنَ
إِلَّا مَا كُنتُمۡ تَعۡمَلُونَ ٥٤

55. Həqiqətən də Cənnət əhli həmin gün keyflə məşğul olacaqlar.

إِنَّ أَصۡحَٰبَ ٱلۡجَنَّةِ ٱلۡيَوۡمَ فِي شُغُلٖ فَٰكِهُونَ ٥٥

56. Onlar zövcələri ilə birlikdə kölgəliklərdə taxtlara söykənəcəklər.

هُمۡ وَأَزۡوَٰجُهُمۡ فِي ظِلَٰلٍ عَلَى ٱلۡأَرَآئِكِ
مُتَّكِـُٔونَ ٥٦

57. Orada onlar üçün meyvələr və istədikləri hər şey vardır.

لَهُمۡ فِيهَا فَٰكِهَةٞ وَلَهُم مَّا يَدَّعُونَ ٥٧

**58.** Üstəlik Rəhmli Rəbb onlara: "Salam" deyəcək.

سَلَٰمٞ قَوۡلٗا مِّن رَّبّٖ رَّحِيمٖ ٥٨

**59.** "Bu gün möminlərdən ayrılın, ey günahkarlar!

وَٱمۡتَٰزُواْ ٱلۡيَوۡمَ أَيُّهَا ٱلۡمُجۡرِمُونَ ٥٩

**60.** Ey Adəm övladları! Məgər Mən sizə buyurmadımmı ki, şeytana ibadət etməyin, o sizin açıq-aydın düşməninizdir,

۞أَلَمۡ أَعۡهَدۡ إِلَيۡكُمۡ يَٰبَنِيٓ ءَادَمَ أَن لَّا
تَعۡبُدُواْ ٱلشَّيۡطَٰنَۖ إِنَّهُۥ لَكُمۡ عَدُوّٞ
مُّبِينٞ ٦٠

**61.** Mənə ibadət edin? Doğru yol budur!

وَأَنِ ٱعۡبُدُونِيۚ هَٰذَا صِرَٰطٞ مُّسۡتَقِيمٞ ٦١

**62.** Artıq şeytan içərinizdən bir çoxlarını yoldan çıxartmışdır. Məgər dərk etmirdiniz?

وَلَقَدۡ أَضَلَّ مِنكُمۡ جِبِلّٗا كَثِيرًاۖ أَفَلَمۡ
تَكُونُواْ تَعۡقِلُونَ ٦٢

**63.** Bu sizə vəd edilmiş Cəhənnəmdir.

هَٰذِهِۦ جَهَنَّمُ ٱلَّتِي كُنتُمۡ تُوعَدُونَ ٦٣

**64.** Kafir olduğunuza görə bu gün orada yanın!"

ٱصۡلَوۡهَا ٱلۡيَوۡمَ بِمَا كُنتُمۡ تَكۡفُرُونَ ٦٤

**65.** Bu gün onların ağızlarına möhür vurarıq. Qazandıqları günahlar barəsində onların əlləri Bizimlə danışar, ayaqları da şəhadət verər.

ٱلۡيَوۡمَ نَخۡتِمُ عَلَىٰٓ أَفۡوَٰهِهِمۡ وَتُكَلِّمُنَآ أَيۡدِيهِمۡ
وَتَشۡهَدُ أَرۡجُلُهُم بِمَا كَانُواْ يَكۡسِبُونَ ٦٥

**66.** Əgər istəsəydik, onların gözlərini kor edərdik və onda onlar düz yolla getməyə çalışardılar. Amma necə görə bilərdilər?

وَلَوۡ نَشَآءُ لَطَمَسۡنَا عَلَىٰٓ أَعۡيُنِهِمۡ فَٱسۡتَبَقُواْ
ٱلصِّرَٰطَ فَأَنَّىٰ يُبۡصِرُونَ ٦٦

**67.** Əgər istəsəydik, onları yerlərindəcə elə eybəcər hala salardıq ki, nə irəli gedə, nə də geri qayıda bilərdilər.

وَلَوۡ نَشَآءُ لَمَسَخۡنَٰهُمۡ عَلَىٰ مَكَانَتِهِمۡ
فَمَا ٱسۡتَطَٰعُواْ مُضِيّٗا وَلَا يَرۡجِعُونَ ٦٧

**68.** Kimə uzun ömür veririksə, onu xilqətcə tərsinə çeviririk. Məgər başa düşmürlər?

وَمَن نُّعَمِّرۡهُ نُنَكِّسۡهُ فِي ٱلۡخَلۡقِۚ أَفَلَا
يَعۡقِلُونَ ٦٨

**69.** Biz Muhəmmədə şer öyrətmədik, bu ona heç yaraşmaz da. Bu ancaq öyüd-nəsihət və aydın Qurandır ki,

وَمَا عَلَّمْنَٰهُ ٱلشِّعْرَ وَمَا يَنۢبَغِى لَهُۥٓ ۚ إِنْ هُوَ إِلَّا
ذِكْرٌ وَقُرْءَانٌ مُّبِينٌ ﴿٦٩﴾

**70.** diri olanları qorxutsun və kafirlər barəsindəki söz gerçəkləşsin.

لِّيُنذِرَ مَن كَانَ حَيًّا وَيَحِقَّ ٱلْقَوْلُ عَلَى
ٱلْكَٰفِرِينَ ﴿٧٠﴾

**71.** Məgər onlar görmürlər ki, Biz onlardan ötrü sahib olduqları mal-qaranı Öz əllərimizlə yaratmışıq?

أَوَلَمْ يَرَوْا۟ أَنَّا خَلَقْنَا لَهُم مِّمَّا عَمِلَتْ أَيْدِينَآ
أَنْعَٰمًا فَهُمْ لَهَا مَٰلِكُونَ ﴿٧١﴾

**72.** Yaratdıqlarımızı öz istifadələrinə verdik ki, bəzilərindən minik kimi yararlansınlar və bəzilərini də yesinlər.

وَذَلَّلْنَٰهَا لَهُمْ فَمِنْهَا رَكُوبُهُمْ وَمِنْهَا
يَأْكُلُونَ ﴿٧٢﴾

**73.** Bunlarda onlar üçün başqa mənfəətlər və içiləcək süd də vardır. Yenə də şükür etməyəcəklərmi?

وَلَهُمْ فِيهَا مَنَٰفِعُ وَمَشَارِبُ ۖ أَفَلَا
يَشْكُرُونَ ﴿٧٣﴾

**74.** Bir çarə tapmaları üçün müşriklər Allahdan başqa məbudlar qəbul etdilər.

وَٱتَّخَذُوا۟ مِن دُونِ ٱللَّهِ ءَالِهَةً لَّعَلَّهُمْ
يُنصَرُونَ ﴿٧٤﴾

**75.** Amma məbudlar onlara heç bir kömək edə bilməzlər. Hərçənd ki, onlar bunlar üçün hazır durmuş əsgərlərdir.

لَا يَسْتَطِيعُونَ نَصْرَهُمْ وَهُمْ لَهُمْ جُندٌ
مُّحْضَرُونَ ﴿٧٥﴾

**76.** Onların sözü səni kədərləndirməsin. Şübhəsiz ki, Biz onların nəyi gizli saxladıqlarını və nəyi aşkar etdiklərini bilirik.

فَلَا يَحْزُنكَ قَوْلُهُمْ ۘ إِنَّا نَعْلَمُ مَا يُسِرُّونَ وَمَا
يُعْلِنُونَ ﴿٧٦﴾

**77.** Məgər insan onu nütfədən yaratdığımızı görmür? Budur, o indi açıq-aşkar mübahisə edir.

أَوَلَمْ يَرَ ٱلْإِنسَٰنُ أَنَّا خَلَقْنَٰهُ مِن نُّطْفَةٍ
فَإِذَا هُوَ خَصِيمٌ مُّبِينٌ ﴿٧٧﴾

**78.** O Bizə bir məsəl çəkdi, lakin yaradılışını unutdu. O dedi: "Çürümüş sümükləri kim dirildə bilər?"

وَضَرَبَ لَنَا مَثَلًا وَنَسِىَ خَلْقَهُۥ ۖ قَالَ مَن
يُحْىِ ٱلْعِظَٰمَ وَهِىَ رَمِيمٌ ﴿٧٨﴾

**79.** De: "Onları ilk dəfə yaradan Özü onları dirildəcəkdir. O, hər bir məxluquna yaxşı bələddir.

قُلْ يُحْيِيهَا ٱلَّذِىٓ أَنشَأَهَآ أَوَّلَ مَرَّةٍ وَهُوَ
بِكُلِّ خَلْقٍ عَلِيمٌ ٧٩

**80.** O sizin üçün yaşıl ağacdan od əmələ gətirdi. Budur, siz indi ondan od yandırırsınız".

ٱلَّذِى جَعَلَ لَكُم مِّنَ ٱلشَّجَرِ ٱلْأَخْضَرِ نَارًا
فَإِذَآ أَنتُم مِّنْهُ تُوقِدُونَ ٨٠

**81.** Göyləri və yeri yaradan onların eynisini yenidən xəlq etmək qüdrətinə malik olmazmı?! Şübhəsiz ki, O, Yaradandır, Biləndir.

أَوَلَيْسَ ٱلَّذِى خَلَقَ ٱلسَّمَـٰوَٰتِ وَٱلْأَرْضَ
بِقَـٰدِرٍ عَلَىٰٓ أَن يَخْلُقَ مِثْلَهُم بَلَىٰ وَهُوَ
ٱلْخَلَّـٰقُ ٱلْعَلِيمُ ٨١

**82.** Bir şeyi yaratmaq istədikdə ona təkcə: "Ol!" deyər, o da olar.

إِنَّمَآ أَمْرُهُۥٓ إِذَآ أَرَادَ شَيْـًٔا أَن يَقُولَ لَهُۥ كُن
فَيَكُونُ ٨٢

**83.** Əlində hər şeyin hökmü Olan Allah pak və müqəddəsdir. Siz ancaq Onun hüzuruna qaytarılacaqsınız.

فَسُبْحَـٰنَ ٱلَّذِى بِيَدِهِۦ مَلَكُوتُ كُلِّ شَىْءٍ
وَإِلَيْهِ تُرْجَعُونَ ٨٣



## əs-Saffat («Səf-səf duranlar») surəsi

## سُورَةُ الصَّافَّاتِ

*Mərhəmətli və Rəhmli*
*Allahın adı ilə!*

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

1. And olsun göylərdə və yerdə səf-səf duranlara,

وَٱلصَّٰٓفَّٰتِ صَفّٗا ١

2. imansızları qətiyyətlə qovanlara

فَٱلزَّٰجِرَٰتِ زَجۡرٗا ٢

3. və *Zikri* oxuyanlara!

فَٱلتَّٰلِيَٰتِ ذِكۡرًا ٣

4. Həqiqətən, sizin məbudunuz Təkdir!

إِنَّ إِلَٰهَكُمۡ لَوَٰحِدٞ ٤

5. O, həm göylərin, yerin və onların arasındakıların Rəbbi, həm də məşriqlərin Rəbbidir.

رَّبُّ ٱلسَّمَٰوَٰتِ وَٱلۡأَرۡضِ وَمَا بَيۡنَهُمَا وَرَبُّ
ٱلۡمَشَٰرِقِ ٥

6. Biz dünya səmasını parlaq ulduzlarla bəzədik

إِنَّا زَيَّنَّا ٱلسَّمَآءَ ٱلدُّنۡيَا بِزِينَةٍ ٱلۡكَوَاكِبِ ٦

7. və *onu* hər bir asi şeytandan mühafizə etdik.

وَحِفۡظٗا مِّن كُلِّ شَيۡطَٰنٖ مَّارِدٖ ٧

8. Onlar artıq ali topluma – *mələklərin söhbətlərinə* qulaq asa bilməzlər və hər tərəfdən üstlərinə *yandırıb yaxan alovlar* yağdırılar

لَّا يَسَّمَّعُونَ إِلَى ٱلۡمَلَإِ ٱلۡأَعۡلَىٰ وَيُقۡذَفُونَ مِن كُلِّ
جَانِبٖ ٨

9. *və oradan* qovularlar. Onları uzun sürəcək bir əzab gözləyir.

دُحُورٗاۖ وَلَهُمۡ عَذَابٞ وَاصِبٌ ٩

10. Lakin *şeytanlardan* hər kim *o söhbətlərdən bir söz* qapıb qaçarsa, onu yandırıb-yaxan parlaq bir alov təqib edər.

إِلَّا مَنۡ خَطِفَ ٱلۡخَطۡفَةَ فَأَتۡبَعَهُۥ شِهَابٞ
ثَاقِبٞ ١٠

11. *Kafirlərdən* soruş ki, onları yaratmaq çətindir, yoxsa Bizim *başqa* yaratdıqlarımızı? Biz ki onları yapışqan kimi palçıqdan yaratdıq.

فَٱسۡتَفۡتِهِمۡ أَهُمۡ أَشَدُّ خَلۡقًا أَم مَّنۡ خَلَقۡنَآۚ إِنَّا
خَلَقۡنَٰهُم مِّن طِينٖ لَّازِبِۭ ١١

12. Sən onlara təəccüb edirsən, onlar isə *səni* ələ salırlar.

بَلۡ عَجِبۡتَ وَيَسۡخَرُونَ ١٢

13. Onlara xatırlatdıqda düşünüb ibrət almırlar.

وَإِذَا ذُكِّرُواْ لَا يَذۡكُرُونَ ١٣

14. Bir möcüzə gördükdə isə ona istehza edir

وَإِذَا رَأَوۡاْ ءَايَةٗ يَسۡتَسۡخِرُونَ ١٤

15. və deyirlər: "Bu ancaq açıq-aydın bir sehrdir.

وَقَالُوٓاْ إِنۡ هَٰذَآ إِلَّا سِحۡرٞ مُّبِينٌ ١٥

16. Məgər biz öldükdən, sür-sümük olub torpağa çevrildikdən sonra dirildiləcəyikmi?

أَءِذَا مِتۡنَا وَكُنَّا تُرَابٗا وَعِظَٰمًا أَءِنَّا لَمَبۡعُوثُونَ ١٦

17. Ya da atalarımızmı *dirildiləcəklər*?"

أَوَءَابَآؤُنَا ٱلۡأَوَّلُونَ ١٧

18. De: "Bəli, özü də, zəlil günə qalmış olduğunuz halda *dirildiləcəksiniz*".

قُلۡ نَعَمۡ وَأَنتُمۡ دَٰخِرُونَ ١٨

19. Bu, təkcə dəhşətli bir səs olacaq və onlar qəfildən *dirilib* görməyə başlayacaqlar.

فَإِنَّمَا هِيَ زَجۡرَةٞ وَٰحِدَةٞ فَإِذَا هُمۡ يَنظُرُونَ ١٩

20. *Günahkarlar* deyəcəklər: "Vay halımıza! Bu ki, Haqq-hesab günüdür!"

وَقَالُواْ يَٰوَيۡلَنَا هَٰذَا يَوۡمُ ٱلدِّينِ ٢٠

21. *Onlara deyiləcək*: "Bu, yalan saydığınız fərqləndirmə günüdür!"

هَٰذَا يَوۡمُ ٱلۡفَصۡلِ ٱلَّذِي كُنتُم بِهِۦ تُكَذِّبُونَ ٢١

22. *Mələklərə belə əmr olunacaq*: "Toplayın bir yerə zalımları, onların yoldaşlarını və ibadət etdiklərini –

۞ٱحۡشُرُواْ ٱلَّذِينَ ظَلَمُواْ وَأَزۡوَٰجَهُمۡ وَمَا كَانُواْ يَعۡبُدُونَ ٢٢

23. Allahdan başqa. Onları Cəhənnəm yoluna yönəldin.

مِن دُونِ ٱللَّهِ فَٱهۡدُوهُمۡ إِلَىٰ صِرَٰطِ ٱلۡجَحِيمِ ٢٣

24. Onları dayandırın, çünki onlar sorğu-sual olunacaqlar".

وَقِفُوهُمۡۖ إِنَّهُم مَّسۡـُٔولُونَ ٢٤

25. *Günahkarlara deyiləcək*: “Sizə nə olub ki, bir-birinizə kömək etmirsiniz?”

مَا لَكُمْ لَا تَنَاصَرُونَ ٢٥

26. Bəli, onlar bu gün baş əyəcəklər!

بَلْ هُمُ ٱلْيَوْمَ مُسْتَسْلِمُونَ ٢٦

27. Onlar bir-birinə üz tutub soruşacaqlar.

وَأَقْبَلَ بَعْضُهُمْ عَلَىٰ بَعْضٍ يَتَسَآءَلُونَ ٢٧

28. *Tabe olanlar* deyəcəklər: “Siz bizim yanımıza sağ tərəfdən gəlirdiniz”.

قَالُوٓا۟ إِنَّكُمْ كُنتُمْ تَأْتُونَنَا عَنِ ٱلْيَمِينِ ٢٨

29. *Başçılar* deyəcəklər: “Xeyr! Siz inanan adamlar deyildiniz.

قَالُوا۟ بَل لَّمْ تَكُونُوا۟ مُؤْمِنِينَ ٢٩

30. Bizim sizin üzərinizdə heç bir hökmranlığımız da yox idi. Xeyr, siz özünüz həddi aşmış adamlar idiniz.

وَمَا كَانَ لَنَا عَلَيْكُم مِّن سُلْطَٰنٍۭ ۖ بَلْ كُنتُمْ قَوْمًا طَٰغِينَ ٣٠

31. Rəbbimizin Sözü bizim barəmizdə həqiqətə çevrildi. Biz *əzabı* hökmən dadacağıq.

فَحَقَّ عَلَيْنَا قَوْلُ رَبِّنَآ ۖ إِنَّا لَذَآئِقُونَ ٣١

32. Biz sizi azdırdıq. Çünki biz özümüz də azmış adamlar idik”.

فَأَغْوَيْنَٰكُمْ إِنَّا كُنَّا غَٰوِينَ ٣٢

33. Şübhəsiz ki, həmin gün onlar əzaba şərik olacaqlar.

فَإِنَّهُمْ يَوْمَئِذٍ فِى ٱلْعَذَابِ مُشْتَرِكُونَ ٣٣

34. Həqiqətən, Biz günahkarlarla belə rəftar edəcəyik.

إِنَّا كَذَٰلِكَ نَفْعَلُ بِٱلْمُجْرِمِينَ ٣٤

35. Çünki onlara: “Allahdan başqa *ibadətə layiq olan* məbud yoxdur!” – deyildikdə təkəbbür göstərir

إِنَّهُمْ كَانُوٓا۟ إِذَا قِيلَ لَهُمْ لَآ إِلَٰهَ إِلَّا ٱللَّهُ يَسْتَكْبِرُونَ ٣٥

36. və deyirdilər: “Məgər bir məcnun şairə görə məbudlarımızı tərk edəcəyik?”

وَيَقُولُونَ أَئِنَّا لَتَارِكُوٓا۟ ءَالِهَتِنَا لِشَاعِرٍ مَّجْنُونٍۭ ٣٦

37. Xeyr! O, haqqı gətirdi və *əvvəlki* peyğəmbərləri təsdiqlədi.

بَلْ جَآءَ بِٱلْحَقِّ وَصَدَّقَ ٱلْمُرْسَلِينَ ٣٧

**38.** Siz mütləq ağrılı-acılı əzabı dadacaqsınız.

إِنَّكُمْ لَذَآئِقُوا۟ ٱلْعَذَابِ ٱلْأَلِيمِ ٣٨

**39.** Siz ancaq etdiyiniz əməllərin cəzasını alacaqsınız.

وَمَا تُجْزَوْنَ إِلَّا مَا كُنتُمْ تَعْمَلُونَ ٣٩

**40.** Lakin Allahın seçilmiş *ixlaslı* qulları müstəsnadırlar.

إِلَّا عِبَادَ ٱللَّهِ ٱلْمُخْلَصِينَ ٤٠

**41.** Məhz onlar üçün müəyyən bir ruzi vardır –

أُو۟لَٰٓئِكَ لَهُمْ رِزْقٌ مَّعْلُومٌ ٤١

**42.** *Cənnət* meyvələri. Onlara ehtiram göstəriləcəkdir –

فَوَٰكِهُ وَهُم مُّكْرَمُونَ ٤٢

**43.** Nəim bağlarında.

فِى جَنَّٰتِ ٱلنَّعِيمِ ٤٣

**44.** Onlar taxtlar üstündə bir-biri ilə üzbəüz *oturacaqlar*.

عَلَىٰ سُرُرٍ مُّتَقَٰبِلِينَ ٤٤

**45.** Onlar üçün çeşmə şərabı ilə dolu piyalələr dolandırılacaqdır.

يُطَافُ عَلَيْهِم بِكَأْسٍ مِّن مَّعِينٍ ٤٥

**46.** Özü də ağappaq, içənlərə ləzzət verən *bir şərab*.

بَيْضَآءَ لَذَّةٍ لِّلشَّٰرِبِينَ ٤٦

**47.** O *şərab* nə baş ağrısı verər, nə də ondan məst olarlar.

لَا فِيهَا غَوْلٌ وَلَا هُمْ عَنْهَا يُنزَفُونَ ٤٧

**48.** Onların yanında baxışları *öz ərlərinə* dikilmiş iri qaragözlü hurilər olacaqdır.

وَعِندَهُمْ قَٰصِرَٰتُ ٱلطَّرْفِ عِينٌ ٤٨

**49.** Özü də qorunub saxlanılmış yumurta kimi *hurilər*.

كَأَنَّهُنَّ بَيْضٌ مَّكْنُونٌ ٤٩

**50.** Onlar bir-birilərinə tərəf dönüb soruşacaqlar.

فَأَقْبَلَ بَعْضُهُمْ عَلَىٰ بَعْضٍ يَتَسَآءَلُونَ ٥٠

**51.** Onlardan biri deyəcək: "Mənim bir yoldaşım var idi.

قَالَ قَآئِلٌ مِّنْهُمْ إِنِّى كَانَ لِى قَرِينٌ ٥١

**52.** O deyirdi: “Sən də inananlardansan?

يَقُولُ أَئِنَّكَ لَمِنَ الْمُصَدِّقِينَ ﴿٥٢﴾

**53.** Məgər biz öldükdən, torpağa çevrilib sür-sümük olduqdan sonra haqq-hesaba çəkilib cəzalandırılacağıq?”

أَئِذَا مِتْنَا وَكُنَّا تُرَابًا وَعِظَامًا أَئِنَّا لَمَدِينُونَ ﴿٥٣﴾

**54.** O *sözünə davam edib* deyəcək: “Siz *onun harada olduğunu* görmək istəyirsinizmi?”

قَالَ هَلْ أَنتُم مُّطَّلِعُونَ ﴿٥٤﴾

**55.** O boylanıb yoldaşını Cəhənnəmin ortasında görəcək

فَاطَّلَعَ فَرَآهُ فِي سَوَاءِ الْجَحِيمِ ﴿٥٥﴾

**56.** və deyəcəkdir: “Allaha and olsun ki, sən məni də məhv edəcəkdin.

قَالَ تَاللَّهِ إِن كِدتَّ لَتُرْدِينِ ﴿٥٦﴾

**57.** Əgər Rəbbimin lütfü olmasaydı, mən də *Cəhənnəmə* gətirilənlərdən olardım.

وَلَوْلَا نِعْمَةُ رَبِّي لَكُنتُ مِنَ الْمُحْضَرِينَ ﴿٥٧﴾

**58.** Doğrudanmı biz bir daha ölməyəcəyik–

أَفَمَا نَحْنُ بِمَيِّتِينَ ﴿٥٨﴾

**59.** ilk ölümümüzdən başqa? Doğrudanmı biz heç vaxt əzaba düçar olmayacağıq?”

إِلَّا مَوْتَتَنَا الْأُولَىٰ وَمَا نَحْنُ بِمُعَذَّبِينَ ﴿٥٩﴾

**60.** Həqiqətən, bu, böyük uğurdur.

إِنَّ هَٰذَا لَهُوَ الْفَوْزُ الْعَظِيمُ ﴿٦٠﴾

**61.** Qoy çalışanlar bunun üçün çalışsınlar!

لِمِثْلِ هَٰذَا فَلْيَعْمَلِ الْعَامِلُونَ ﴿٦١﴾

**62.** Ziyafət üçün bu yaxşıdır, yoxsa zəqqum ağacı?

أَذَٰلِكَ خَيْرٌ نُّزُلًا أَمْ شَجَرَةُ الزَّقُّومِ ﴿٦٢﴾

**63.** Biz onu zalımlar üçün bir sınaq etdik.

إِنَّا جَعَلْنَاهَا فِتْنَةً لِّلظَّالِمِينَ ﴿٦٣﴾

**64.** O, Cəhənnəmin lap dibindən bitib çıxan bir ağacdır.

إِنَّهَا شَجَرَةٌ تَخْرُجُ فِي أَصْلِ الْجَحِيمِ ﴿٦٤﴾

65. Onun meyvəsi şeytanların başları kimidir.

طَلْعُهَا كَأَنَّهُۥ رُءُوسُ ٱلشَّيَٰطِينِ ٦٥

66. *Günahkarlar* ondan yeyib qarınlarını dolduracaqlar.

فَإِنَّهُمْ لَءَاكِلُونَ مِنْهَا فَمَالِـُٔونَ مِنْهَا ٱلْبُطُونَ ٦٦

67. Sonra da üstündən onları qaynar su ilə qatışdırılmış bir içki gözləyir.

ثُمَّ إِنَّ لَهُمْ عَلَيْهَا لَشَوْبًا مِّنْ حَمِيمٍ ٦٧

68. Sonra onlar mütləq Cəhənnəmə qaytarılacaqlar.

ثُمَّ إِنَّ مَرْجِعَهُمْ لَإِلَى ٱلْجَحِيمِ ٦٨

69. Həqiqətən, onlar ata-babalarını azmış gördülər,

إِنَّهُمْ أَلْفَوْا۟ ءَابَآءَهُمْ ضَآلِّينَ ٦٩

70. özləri də tez-tələsik onların izini tutub getdilər.

فَهُمْ عَلَىٰٓ ءَاثَٰرِهِمْ يُهْرَعُونَ ٧٠

71. Həqiqətən, onlardan öncə əvvəlki nəsillərin çoxu zəlalətə düşmüşdü.

وَلَقَدْ ضَلَّ قَبْلَهُمْ أَكْثَرُ ٱلْأَوَّلِينَ ٧١

72. Artıq Biz onlara xəbərdar edən *peyğəmbərlər* göndərmişdik.

وَلَقَدْ أَرْسَلْنَا فِيهِم مُّنذِرِينَ ٧٢

73. Bax gör xəbərdar edilənlərin aqibəti necə oldu.

فَٱنظُرْ كَيْفَ كَانَ عَٰقِبَةُ ٱلْمُنذَرِينَ ٧٣

74. Yalnız Allahın seçilmiş *səmimi* qullarından başqa.

إِلَّا عِبَادَ ٱللَّهِ ٱلْمُخْلَصِينَ ٧٤

75. Nuh Bizə yalvarıb yaxardı. Biz *çağırışa* necə də gözəl cavab verənik!

وَلَقَدْ نَادَىٰنَا نُوحٌ فَلَنِعْمَ ٱلْمُجِيبُونَ ٧٥

76. Biz onu və ailəsini böyük sıxıntıdan qurtardıq.

وَنَجَّيْنَٰهُ وَأَهْلَهُۥ مِنَ ٱلْكَرْبِ ٱلْعَظِيمِ ٧٦

77. Təkcə onun nəslini qoruyub saxladıq.

وَجَعَلْنَا ذُرِّيَّتَهُۥ هُمُ ٱلْبَاقِينَ ٧٧

78. Sonra gələnlər arasında onun üçün *gözəl xatirə* qoyduq;

وَتَرَكْنَا عَلَيْهِ فِى ٱلْءَاخِرِينَ ٧٨

| | |
|---|---|
| **79.** aləmlər içərisində Nuha salam olsun! | سَلَٰمٌ عَلَىٰ نُوحٍ فِي ٱلْعَٰلَمِينَ ﴿٧٩﴾ |
| **80.** Həqiqətən, Biz yaxşı iş görənləri belə mükafatlandırırıq. | إِنَّا كَذَٰلِكَ نَجْزِي ٱلْمُحْسِنِينَ ﴿٨٠﴾ |
| **81.** Həqiqətən, o Bizim mömin qullarımızdandır. | إِنَّهُۥ مِنْ عِبَادِنَا ٱلْمُؤْمِنِينَ ﴿٨١﴾ |
| **82.** Sonra o birilərini suya qərq etdik. | ثُمَّ أَغْرَقْنَا ٱلْءَاخَرِينَ ﴿٨٢﴾ |
| **83.** Həqiqətən, İbrahim onun ardıcıllarından idi. | ۞ وَإِنَّ مِن شِيعَتِهِۦ لَإِبْرَٰهِيمَ ﴿٨٣﴾ |
| **84.** Bir zaman o, öz Rəbbinin yanına pak bir qəlblə gəldi. | إِذْ جَآءَ رَبَّهُۥ بِقَلْبٍ سَلِيمٍ ﴿٨٤﴾ |
| **85.** Onda o, öz atasına və qövmünə dedi: "Siz nəyə sitayiş edirsiniz? | إِذْ قَالَ لِأَبِيهِ وَقَوْمِهِۦ مَاذَا تَعْبُدُونَ ﴿٨٥﴾ |
| **86.** Allahı qoyub uydurma məbudlarımı diləyirsiniz? | أَئِفْكًا ءَالِهَةً دُونَ ٱللَّهِ تُرِيدُونَ ﴿٨٦﴾ |
| **87.** Aləmlərin Rəbbi barəsində nə düşünürsünüz?" | فَمَا ظَنُّكُم بِرَبِّ ٱلْعَٰلَمِينَ ﴿٨٧﴾ |
| **88.** O, ulduzlara bir nəzər salaraq | فَنَظَرَ نَظْرَةً فِي ٱلنُّجُومِ ﴿٨٨﴾ |
| **89.** "Mən xəstəyəm!"– dedi. | فَقَالَ إِنِّي سَقِيمٌ ﴿٨٩﴾ |
| **90.** Onlar ondan üz çevirib çıxıb getdilər. | فَتَوَلَّوْا۟ عَنْهُ مُدْبِرِينَ ﴿٩٠﴾ |
| **91.** O, xəlvətcə onların məbudlarının yanına gəlib *istehza ilə* dedi: "Siz *bu təamları* yemirsiniz? | فَرَاغَ إِلَىٰٓ ءَالِهَتِهِمْ فَقَالَ أَلَا تَأْكُلُونَ ﴿٩١﴾ |
| **92.** Sizə nə olub ki, danışmırsınız?" | مَا لَكُمْ لَا تَنطِقُونَ ﴿٩٢﴾ |
| **93.** Sonra onlara yaxınlaşıb sağ əli ilə bir zərbə endirdi. | فَرَاغَ عَلَيْهِمْ ضَرْبًۢا بِٱلْيَمِينِ ﴿٩٣﴾ |
| **94.** *Bütpərəstlər* tələsik onun yanına gəldilər. | فَأَقْبَلُوٓا۟ إِلَيْهِ يَزِفُّونَ ﴿٩٤﴾ |

**95.** O dedi: “Siz yonub düzəltdiklərinizəmi sitayiş edirsiniz?

قَالَ أَتَعْبُدُونَ مَا تَنْحِتُونَ ﴿٩٥﴾

**96.** Axı sizi də, sizin düzəltdiklərinizi də Allah yaratmışdır”.

وَٱللَّهُ خَلَقَكُمْ وَمَا تَعْمَلُونَ ﴿٩٦﴾

**97.** Onlar dedilər: “Bundan ötrü bir bina tikin və onu orada odlayın!”

قَالُوا۟ ٱبْنُوا۟ لَهُۥ بُنْيَـٰنًا فَأَلْقُوهُ فِى ٱلْجَحِيمِ ﴿٩٧﴾

**98.** Onlar İbrahimə hiylə qurmaq istədilər, Biz də onları rüsvay etdik.

فَأَرَادُوا۟ بِهِۦ كَيْدًا فَجَعَلْنَـٰهُمُ ٱلْأَسْفَلِينَ ﴿٩٨﴾

**99.** *O dedi*: “Mən Rəbbimə doğru gedirəm. O məni doğru yola yönəldəcəkdir”.

وَقَالَ إِنِّى ذَاهِبٌ إِلَىٰ رَبِّى سَيَهْدِينِ ﴿٩٩﴾

**100.** O dedi: “Ey Rəbbim! Mənə əməlisalehlərdən olan *övlad* bəxş et!”

رَبِّ هَبْ لِى مِنَ ٱلصَّـٰلِحِينَ ﴿١٠٠﴾

**101.** Biz də onu həlim xasiyyətli bir oğlan uşağı ilə müjdələdik.

فَبَشَّرْنَـٰهُ بِغُلَـٰمٍ حَلِيمٍ ﴿١٠١﴾

**102.** O, böyüyüb *atası ilə* bərabər çalışmaq həddinə çatdıqda *İbrahim* dedi: “Oğlum! Yuxuda gördüm ki, səni qurban kəsirəm. Bax gör nə düşünürsən!” O dedi: “Atacan! Sənə buyurulanı yerinə yetir. Allah qoysa məni səbirlilərdən olduğumu görəcəksən”.

فَلَمَّا بَلَغَ مَعَهُ ٱلسَّعْىَ قَالَ يَـٰبُنَىَّ إِنِّىٓ أَرَىٰ فِى
ٱلْمَنَامِ أَنِّىٓ أَذْبَحُكَ فَٱنظُرْ مَاذَا تَرَىٰ ۚ قَالَ
يَـٰٓأَبَتِ ٱفْعَلْ مَا تُؤْمَرُ ۖ سَتَجِدُنِىٓ إِن
شَآءَ ٱللَّهُ مِنَ ٱلصَّـٰبِرِينَ ﴿١٠٢﴾

**103.** Hər ikisi *Allahın əmrinə* tabe olduqları və *İbrahim* onu üzüstə yerə yıxdığı zaman

فَلَمَّآ أَسْلَمَا وَتَلَّهُۥ لِلْجَبِينِ ﴿١٠٣﴾

**104.** Biz onu çağırıb dedik: “Ey İbrahim!

وَنَـٰدَيْنَـٰهُ أَن يَـٰٓإِبْرَٰهِيمُ ﴿١٠٤﴾

**105.** Artıq sən yuxunu təsdiq etdin!” Biz yaxşı iş görənləri belə mükafatlandırırıq.

قَدْ صَدَّقْتَ ٱلرُّءْيَآ ۚ إِنَّا كَذَٰلِكَ نَجْزِى
ٱلْمُحْسِنِينَ ﴿١٠٥﴾

106. Həqiqətən də bu, açıq-aydın bir imtahandır.

إِنَّ هَٰذَا لَهُوَ الْبَلَاءُ الْمُبِينُ ﴿١٠٦﴾

107. Biz onun əvəzinə böyük bir qurbanlığı fidyə verdik.

وَفَدَيْنَاهُ بِذِبْحٍ عَظِيمٍ ﴿١٠٧﴾

108. Sonradan gələnlər arasında ona *gözəl xatirə* qoyduq.

وَتَرَكْنَا عَلَيْهِ فِي الْآخِرِينَ ﴿١٠٨﴾

109. İbrahimə salam olsun!

سَلَامٌ عَلَىٰ إِبْرَاهِيمَ ﴿١٠٩﴾

110. Həqiqətən, Biz yaxşı iş görənləri belə mükafatlandırırıq.

كَذَٰلِكَ نَجْزِي الْمُحْسِنِينَ ﴿١١٠﴾

111. Həqiqətən, o, Bizim mömin qullarımızdandır.

إِنَّهُ مِنْ عِبَادِنَا الْمُؤْمِنِينَ ﴿١١١﴾

112. Ona əməlisalehlərdən olacaq bir peyğəmbər – İshaq ilə müjdə verdik.

وَبَشَّرْنَاهُ بِإِسْحَاقَ نَبِيًّا مِنَ الصَّالِحِينَ ﴿١١٢﴾

113. Biz ona və İshaqa bərəkət verdik. Hər ikisinin nəslində yaxşı iş görənləri də var, açıq-aydın özünə zülm edənləri də.

وَبَارَكْنَا عَلَيْهِ وَعَلَىٰ إِسْحَاقَ ۚ وَمِنْ ذُرِّيَّتِهِمَا
مُحْسِنٌ وَظَالِمٌ لِنَفْسِهِ مُبِينٌ ﴿١١٣﴾

114. Biz Musa ilə Haruna da nemət bəxş etdik.

وَلَقَدْ مَنَنَّا عَلَىٰ مُوسَىٰ وَهَارُونَ ﴿١١٤﴾

115. Onların hər ikisini və tayfalarını böyük sıxıntıdan qurtardıq.

وَنَجَّيْنَاهُمَا وَقَوْمَهُمَا مِنَ الْكَرْبِ
الْعَظِيمِ ﴿١١٥﴾

116. Onlara kömək göstərdik və *onlar* qalib gəldilər.

وَنَصَرْنَاهُمْ فَكَانُوا هُمُ الْغَالِبِينَ ﴿١١٦﴾

117. Hər ikisinə aydın bir Kitab verdik.

وَآتَيْنَاهُمَا الْكِتَابَ الْمُسْتَبِينَ ﴿١١٧﴾

118. Hər ikisini də doğru yola yönəltdik.

وَهَدَيْنَاهُمَا الصِّرَاطَ الْمُسْتَقِيمَ ﴿١١٨﴾

119. Sonradan gələnlər arasında hər ikisinə *gözəl xatirə* qoyduq.

وَتَرَكْنَا عَلَيْهِمَا فِي الْآخِرِينَ ﴿١١٩﴾

| | |
|---|---|
| 120. Musaya və Haruna salam olsun! | سَلَٰمٌ عَلَىٰ مُوسَىٰ وَهَٰرُونَ ١٢٠ |
| 121. Həqiqətən, Biz yaxşı iş görənləri belə mükafatlandırırıq. | إِنَّا كَذَٰلِكَ نَجۡزِي ٱلۡمُحۡسِنِينَ ١٢١ |
| 122. Həqiqətən, onların ikisi də Bizim mömin qullarımızdandır. | إِنَّهُمَا مِنۡ عِبَادِنَا ٱلۡمُؤۡمِنِينَ ١٢٢ |
| 123. Şübhəsiz ki, İlyas da elçilərdəndir. | وَإِنَّ إِلۡيَاسَ لَمِنَ ٱلۡمُرۡسَلِينَ ١٢٣ |
| 124. Bir zaman o öz qövmünə demişdi: “Məgər qorxmursunuz? | إِذۡ قَالَ لِقَوۡمِهِۦٓ أَلَا تَتَّقُونَ ١٢٤ |
| 125. Siz yaradanların ən yaxşısını qoyub niyə Bələ yalvarırsınız – | أَتَدۡعُونَ بَعۡلٗا وَتَذَرُونَ أَحۡسَنَ ٱلۡخَٰلِقِينَ ١٢٥ |
| 126. həm sizin Rəbbiniz, həm də əcdadlarınızın Rəbbi olan Allahımı *tərk edirsiniz*?” | ٱللَّهَ رَبَّكُمۡ وَرَبَّ ءَابَآئِكُمُ ٱلۡأَوَّلِينَ ١٢٦ |
| 127. Onlar onu yalançı saydılar. Ona görə də hamısı *Cəhənnəmə* gətiriləcəkdir. | فَكَذَّبُوهُ فَإِنَّهُمۡ لَمُحۡضَرُونَ ١٢٧ |
| 128. Yalnız Allahın seçilmiş *səmimi* qullarından başqa. | إِلَّا عِبَادَ ٱللَّهِ ٱلۡمُخۡلَصِينَ ١٢٨ |
| 129. Sonradan gələnlər arasında ona *gözəl xatirə* qoyduq. | وَتَرَكۡنَا عَلَيۡهِ فِي ٱلۡأٓخِرِينَ ١٢٩ |
| 130. İlyasinə salam olsun! | سَلَٰمٌ عَلَىٰٓ إِلۡ يَاسِينَ ١٣٠ |
| 131. Həqiqətən, Biz yaxşı iş görənləri belə mükafatlandırırıq. | إِنَّا كَذَٰلِكَ نَجۡزِي ٱلۡمُحۡسِنِينَ ١٣١ |
| 132. Həqiqətən, o Bizim mömin qullarımızdandır. | إِنَّهُۥ مِنۡ عِبَادِنَا ٱلۡمُؤۡمِنِينَ ١٣٢ |
| 133. Şübhəsiz ki, Lut da elçilərdəndir. | وَإِنَّ لُوطٗا لَّمِنَ ٱلۡمُرۡسَلِينَ ١٣٣ |
| 134. Bir zaman Biz onu və bütün ailəsini xilas etdik. | إِذۡ نَجَّيۡنَٰهُ وَأَهۡلَهُۥٓ أَجۡمَعِينَ ١٣٤ |

135. Yalnız geridə qalanların içində olan yaşlı bir qadından başqa.

إِلَّا عَجُوزًا فِي ٱلْغَٰبِرِينَ ١٣٥

136. Sonra da o birilərini yerli-dibli yox etdik.

ثُمَّ دَمَّرْنَا ٱلْءَاخَرِينَ ١٣٦

137. Siz həm səhər çağı onların yanından keçirsiniz,

وَإِنَّكُمْ لَتَمُرُّونَ عَلَيْهِم مُّصْبِحِينَ ١٣٧

138. həm də axşam çağı. Məgər anlamırsınız?

وَبِٱلَّيْلِ أَفَلَا تَعْقِلُونَ ١٣٨

139. Yunus da, həqiqətən, elçilərdəndir.

وَإِنَّ يُونُسَ لَمِنَ ٱلْمُرْسَلِينَ ١٣٩

140. Bir zaman o, yüklü bir gəmiyə tərəf qaçdı.

إِذْ أَبَقَ إِلَى ٱلْفُلْكِ ٱلْمَشْحُونِ ١٤٠

141. Başqaları ilə birlikdə püşk atdı və uduzanlardan oldu.

فَسَاهَمَ فَكَانَ مِنَ ٱلْمُدْحَضِينَ ١٤١

142. O, qınanmağa layiq olduqda balıq onu uddu.

فَٱلْتَقَمَهُ ٱلْحُوتُ وَهُوَ مُلِيمٌ ١٤٢

143. Əgər o, Allaha tərif deyənlərdən olmasaydı,

فَلَوْلَآ أَنَّهُۥ كَانَ مِنَ ٱلْمُسَبِّحِينَ ١٤٣

144. balığın qarnında Qiyamət gününə qədər qalardı.

لَلَبِثَ فِي بَطْنِهِۦٓ إِلَىٰ يَوْمِ يُبْعَثُونَ ١٤٤

145. O, halsız olduğu vəziyyətdə *Biz* onu sahilə çıxartdıq.

۞ فَنَبَذْنَٰهُ بِٱلْعَرَآءِ وَهُوَ سَقِيمٌ ١٤٥

146. Onun başı üstündə balqabaq tağı bitirdik.

وَأَنۢبَتْنَا عَلَيْهِ شَجَرَةً مِّن يَقْطِينٍ ١٤٦

147. Biz onu yüz mindən də daha çox adama *peyğəmbər* göndərdik.

وَأَرْسَلْنَٰهُ إِلَىٰ مِاْئَةِ أَلْفٍ أَوْ يَزِيدُونَ ١٤٧

148. Onlar ona iman gətirdilər, Biz də onlara müəyyən vaxtadək firavanlıq nəsib etdik.

فَـَٔامَنُوا۟ فَمَتَّعْنَٰهُمْ إِلَىٰ حِينٍ ١٤٨

149. *Kafirlərdən* soruş: "Nəyə görə qızlar sənin Rəbbinin, oğlanlar isə onların olmalıdır?"

فَٱسْتَفْتِهِمْ أَلِرَبِّكَ ٱلْبَنَاتُ وَلَهُمُ ٱلْبَنُونَ ١٤٩

150. Yoxsa Biz mələkləri dişi yaratmışıq və onlar da *buna* şahid olublar?

أَمْ خَلَقْنَا ٱلْمَلَٰٓئِكَةَ إِنَٰثًا وَهُمْ شَٰهِدُونَ ١٥٠

151. Həqiqətən, onlar yalan uydurub deyirlər:

أَلَآ إِنَّهُم مِّنْ إِفْكِهِمْ لَيَقُولُونَ ١٥١

152. "Allah doğmuşdur". Şübhəsiz ki, onlar yalançıdırlar.

وَلَدَ ٱللَّهُ وَإِنَّهُمْ لَكَٰذِبُونَ ١٥٢

153. Məgər *Allah* qızları oğlanlardan üstünmü tutmuşdur?

أَصْطَفَى ٱلْبَنَاتِ عَلَى ٱلْبَنِينَ ١٥٣

154. Sizə nə olub, bu necə mühakimədir yürüdürsünüz?

مَا لَكُمْ كَيْفَ تَحْكُمُونَ ١٥٤

155. Məgər düşünüb ibrət almayacaqsınız?

أَفَلَا تَذَكَّرُونَ ١٥٥

156. Yoxsa sizin aydın bir dəliliniz vardır?

أَمْ لَكُمْ سُلْطَٰنٌ مُّبِينٌ ١٥٦

157. Əgər doğru deyirsinizsə, kitabınızı gətirin!

فَأْتُوا۟ بِكِتَٰبِكُمْ إِن كُنتُمْ صَٰدِقِينَ ١٥٧

158. Onlar Allahla cinlər arasında qohumluq olduğunu uydurdular. Həqiqətən, cinlər onların *Cəhənnəmə* gətiriləcəyini bilirlər.

وَجَعَلُوا۟ بَيْنَهُۥ وَبَيْنَ ٱلْجِنَّةِ نَسَبًا ۚ وَلَقَدْ عَلِمَتِ ٱلْجِنَّةُ إِنَّهُمْ لَمُحْضَرُونَ ١٥٨

159. Allah onların *Ona* aid etdikləri sifətlərdən uzaqdır.

سُبْحَٰنَ ٱللَّهِ عَمَّا يَصِفُونَ ١٥٩

160. Yalnız Allahın seçilmiş *səmimi* qullarından başqa.

إِلَّا عِبَادَ ٱللَّهِ ٱلْمُخْلَصِينَ ١٦٠

161. *Ey müşriklər*! Nə siz, nə də sizin tapındıqlarınız

فَإِنَّكُمْ وَمَا تَعْبُدُونَ ١٦١

162. *heç kəsi Allaha* qarşı yoldan çıxara bilməzsiniz;

مَآ أَنتُمْ عَلَيْهِ بِفَٰتِنِينَ ١٦٢

163. ancaq Cəhənnəmə girəcək kimsədən başqa.

إِلَّا مَنْ هُوَ صَالِ ٱلْجَحِيمِ ١٦٣

164. *Mələklər dedi*: "Bizlərdən hər kəsin müəyyən bir yeri vardır.

وَمَا مِنَّآ إِلَّا لَهُۥ مَقَامٌ مَّعْلُومٌ ١٦٤

165. Həqiqətən, biz səf-səf dururuq.

وَإِنَّا لَنَحْنُ ٱلصَّآفُّونَ ١٦٥

166. Həqiqətən, biz *Allahın şəninə* tәriflər deyirik".

وَإِنَّا لَنَحْنُ ٱلْمُسَبِّحُونَ ١٦٦

167. *Müşriklər* deyirdilər:

وَإِن كَانُوا۟ لَيَقُولُونَ ١٦٧

168. "Əgər bizdə də əvvəlkilərdə olan zikrdən (kitabdan) olsaydı,

لَوْ أَنَّ عِندَنَا ذِكْرًا مِّنَ ٱلْأَوَّلِينَ ١٦٨

169. biz mütləq Allahın seçilmiş *səmimi* qulları olardıq".

لَكُنَّا عِبَادَ ٱللَّهِ ٱلْمُخْلَصِينَ ١٦٩

170. Lakin onlar onu inkar etdilər. Onlar tezliklə biləcəklər.

فَكَفَرُوا۟ بِهِۦ فَسَوْفَ يَعْلَمُونَ ١٧٠

171. Bizim elçi göndərdiyimiz qullarımız haqqında bu Sözümüz əzəldən deyilmişdi:

وَلَقَدْ سَبَقَتْ كَلِمَتُنَا لِعِبَادِنَا ٱلْمُرْسَلِينَ ١٧١

172. "Həqiqətən, onlara kömək göstəriləcəkdir.

إِنَّهُمْ لَهُمُ ٱلْمَنصُورُونَ ١٧٢

173. Bizim əsgərlərimizin mütləq qələbəsi labüddür".

وَإِنَّ جُندَنَا لَهُمُ ٱلْغَٰلِبُونَ ١٧٣

174. Sən bir müddət onlardan üz çevir!

فَتَوَلَّ عَنْهُمْ حَتَّىٰ حِينٍ ١٧٤

175. Onlara bax! Onlar tezliklə *əzabı* görəcəklər.

وَأَبْصِرْهُمْ فَسَوْفَ يُبْصِرُونَ ١٧٥

176. Onlar əzabımızın tezliklə gəlməsinimi istəyirlər?

أَفَبِعَذَابِنَا يَسْتَعْجِلُونَ ١٧٦

177. Əzab onların yurdlarına endiyi zaman qorxudulanların sabahı necə də pis olacaq!

فَإِذَا نَزَلَ بِسَاحَتِهِمْ فَسَآءَ صَبَاحُ ٱلْمُنذَرِينَ ١٧٧

178. Sən bir müddət onlardan üz çevir!

وَتَوَلَّ عَنْهُمْ حَتَّىٰ حِينٍ ١٧٨

179. Onlara bax! Onlar tezliklə *əzabı* görəcəklər.

وَأَبْصِرْ فَسَوْفَ يُبْصِرُونَ ١٧٩

180. Qüdrət sahibi olan Rəbbin pakdır, müşriklərin *Ona* aid etdikləri sifətlərdən uzaqdır.

سُبْحَٰنَ رَبِّكَ رَبِّ ٱلْعِزَّةِ عَمَّا يَصِفُونَ ١٨٠

181. Elçilərə salam olsun!

وَسَلَٰمٌ عَلَى ٱلْمُرْسَلِينَ ١٨١

182. Aləmlərin Rəbbi olan Allaha həmd olsun!

وَٱلْحَمْدُ لِلَّهِ رَبِّ ٱلْعَٰلَمِينَ ١٨٢



## Sad surəsi

*Mərhəmətli və Rəhmli*
*Allahın adı ilə!*

1. Sad. Öyüd-nəsihətlə dolu Qurana and olsun!

2. Kafirlər təkəbbür və nifaq içindədirlər.

3. Biz onlardan öncə də neçə-neçə nəsilləri məhv etmişik. Onlar yalvarıb imdad diləyirdilər, lakin artıq qurtulma vaxtı keçmişdi.

4. Öz aralarından onlara xəbərdarlıq edən *bir peyğəmbər* gəldiyinə təəccüb edərək kafirlər dedilər: "Bu, yalançı bir sehrbazdır!

5. O, bütün məbudları bir məbudmu etdi? Həqiqətən, bu, əcaib bir şeydir".

6. Onların adlı-sanlı adamları çıxıb gedərək *dedilər*: "Gedin öz məbudlarınızla səbirlə davranın. Doğrusu, bu *sizdən* istənilən bir şeydir.

7. Biz bunu axırıncı dində də eşitməmişik. Bu, uydurmadan başqa bir şey deyil.

8. Məgər içimizdən təkcə onamı Zikr (Quran) vəhy edilmişdir?" Xeyr, onlar Mənim Zikrimə şəkk gətirirlər.

## سُورَةُ صٓ

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

صٓۚ وَٱلۡقُرۡءَانِ ذِي ٱلذِّكۡرِ ١

بَلِ ٱلَّذِينَ كَفَرُواْ فِي عِزَّةٖ وَشِقَاقٖ ٢

كَمۡ أَهۡلَكۡنَا مِن قَبۡلِهِم مِّن قَرۡنٖ فَنَادَواْ وَّلَاتَ حِينَ
مَنَاصٖ ٣

وَعَجِبُوٓاْ أَن جَآءَهُم مُّنذِرٞ مِّنۡهُمۡۖ وَقَالَ ٱلۡكَٰفِرُونَ
هَٰذَا سَٰحِرٞ كَذَّابٌ ٤

أَجَعَلَ ٱلۡأٓلِهَةَ إِلَٰهٗا وَٰحِدًاۖ إِنَّ هَٰذَا لَشَيۡءٌ
عُجَابٞ ٥

وَٱنطَلَقَ ٱلۡمَلَأُ مِنۡهُمۡ أَنِ ٱمۡشُواْ وَٱصۡبِرُواْ عَلَىٰٓ
ءَالِهَتِكُمۡۖ إِنَّ هَٰذَا لَشَيۡءٞ يُرَادُ ٦

مَا سَمِعۡنَا بِهَٰذَا فِي ٱلۡمِلَّةِ ٱلۡأٓخِرَةِ إِنۡ هَٰذَآ إِلَّا
ٱخۡتِلَٰقٌ ٧

أَءُنزِلَ عَلَيۡهِ ٱلذِّكۡرُ مِنۢ بَيۡنِنَاۚ بَلۡ هُمۡ فِي شَكّٖ مِّن
ذِكۡرِيۚ بَلۡ لَّمَّا يَذُوقُواْ عَذَابِ ٨

Xeyr, onlar Mənim əzabımı hələ dadmayıblar.

9. Yoxsa sənin Qüdrətli və Bəxşedən Rəbbinin rəhmət xəzinələri onlardadır?

أَمْ عِندَهُمْ خَزَآئِنُ رَحْمَةِ رَبِّكَ ٱلْعَزِيزِ ٱلْوَهَّابِ ٩

10. Ya da, göylərin, yerin və onların arasında olanların üzərində hakimiyyət onlaramı verilmişdir? Qoy onda istənilən yolla *göyə* qalxsınlar.

أَمْ لَهُم مُّلْكُ ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضِ وَمَا بَيْنَهُمَا فَلْيَرْتَقُوا۟ فِى ٱلْأَسْبَٰبِ ١٠

11. Bu ordu da əvvəlki əlbir dəstələr kimi darmadağın ediləcəkdir.

جُندٌ مَّا هُنَالِكَ مَهْزُومٌ مِّنَ ٱلْأَحْزَابِ ١١

12. Onlardan əvvəl Nuh qövmü, Ad və dirəklər sahibi Firon da *elçiləri* yalançı saymışdılar.

كَذَّبَتْ قَبْلَهُمْ قَوْمُ نُوحٍ وَعَادٌ وَفِرْعَوْنُ ذُو ٱلْأَوْتَادِ ١٢

13. Həmçinin Səmud, Lut qövmü və Əykə əhli də. Bunlar əlbir dəstələr idi.

وَثَمُودُ وَقَوْمُ لُوطٍ وَأَصْحَٰبُ لْـَٔيْكَةِ أُو۟لَٰٓئِكَ ٱلْأَحْزَابُ ١٣

14. Hər biri elçiləri yalançı hesab etdi və Mənim cəzam da gerçəkləşdi.

إِن كُلٌّ إِلَّا كَذَّبَ ٱلرُّسُلَ فَحَقَّ عِقَابِ ١٤

15. Onlar qarşısıalınmaz təkcə bir tükürpədici səsi gözləyirlər.

وَمَا يَنظُرُ هَٰٓؤُلَآءِ إِلَّا صَيْحَةً وَٰحِدَةً مَّا لَهَا مِن فَوَاقٍ ١٥

16. Onlar *istehza edərək*: "Ey Rəbbimiz! Bizim payımızı Hesablaşma günü gəlməmişdən əvvəl tezliklə ver!"– dedilər.

وَقَالُوا۟ رَبَّنَا عَجِّل لَّنَا قِطَّنَا قَبْلَ يَوْمِ ٱلْحِسَابِ ١٦

17. Onların dediklərinə səbir et və qüdrətli qulumuz Davudu yadına sal! O, daim *Allaha* üz tutardı.

ٱصْبِرْ عَلَىٰ مَا يَقُولُونَ وَٱذْكُرْ عَبْدَنَا دَاوُۥدَ ذَا ٱلْأَيْدِ إِنَّهُۥٓ أَوَّابٌ ١٧

**18.** Biz dağları ona ram etmişdik. Onlar axşam çağı və səhər onunla birlikdə *Allahın şəninə* təriflər deyirdilər.

إِنَّا سَخَّرْنَا ٱلْجِبَالَ مَعَهُۥ يُسَبِّحْنَ بِٱلْعَشِىِّ وَٱلْإِشْرَاقِ ١٨

**19.** Biz quşları da toplum halda *ona ram etmişdik*. Hamısı daima *Allaha* üz tutardı.

وَٱلطَّيْرَ مَحْشُورَةً ۖ كُلٌّ لَّهُۥٓ أَوَّابٌ ١٩

**20.** Biz onun mülkünü möhkəmləndirdik, özünə də hikmət (peyğəmbərlik) və düzgün qərar çıxartmaq qabiliyyəti bəxş etdik.

وَشَدَدْنَا مُلْكَهُۥ وَءَاتَيْنَٰهُ ٱلْحِكْمَةَ وَفَصْلَ ٱلْخِطَابِ ٢٠

**21.** *Davudun yanında* çəkişənlərin xəbəri sənə gəlib çatdımı? O zaman onlar divarı aşıb məbədə girdilər.

۞ وَهَلْ أَتَىٰكَ نَبَؤُا۟ ٱلْخَصْمِ إِذْ تَسَوَّرُوا۟ ٱلْمِحْرَابَ ٢١

**22.** Onlar Davudun yanına daxil olduqda *Davud* onlardan qorxdu. Onlar dedilər: "Qorxma! Biz iki iddiaçıyıq. Birimiz digərinin haqqını tapdalamışdır. Aramızda ədalətlə hökm ver, haqsızlıq etmə və bizə düz yolu göstər!

إِذْ دَخَلُوا۟ عَلَىٰ دَاوُۥدَ فَفَزِعَ مِنْهُمْ ۖ قَالُوا۟ لَا تَخَفْ ۖ خَصْمَانِ بَغَىٰ بَعْضُنَا عَلَىٰ بَعْضٍ فَٱحْكُم بَيْنَنَا بِٱلْحَقِّ وَلَا تُشْطِطْ وَٱهْدِنَآ إِلَىٰ سَوَآءِ ٱلصِّرَٰطِ ٢٢

**23.** Bu mənim qardaşımdır. Onun doxsan doqquz qoyunu, mənim isə bircə qoyunum vardır. *Bununla belə*: "Onu mənə ver!"– dedi və mübahisədə mənə üstün gəldi".

إِنَّ هَٰذَآ أَخِى لَهُۥ تِسْعٌ وَتِسْعُونَ نَعْجَةً وَلِىَ نَعْجَةٌ وَٰحِدَةٌ فَقَالَ أَكْفِلْنِيهَا وَعَزَّنِى فِى ٱلْخِطَابِ ٢٣

**24.** *Davud* dedi: "O sənin qoyununu öz qoyunlarına qatmaq istəməklə, sənə qarşı haqsızlıq etmişdir. Həqiqətən, şəriklərin çoxu bir-birinin haqqını tapdalayar. Yalnız iman gətirib yaxşı işlər görənlərdən başqa. Onlar isə çox azdırlar!" Bunları

قَالَ لَقَدْ ظَلَمَكَ بِسُؤَالِ نَعْجَتِكَ إِلَىٰ نِعَاجِهِۦ ۖ وَإِنَّ كَثِيرًا مِّنَ ٱلْخُلَطَآءِ لَيَبْغِى بَعْضُهُمْ عَلَىٰ بَعْضٍ إِلَّا ٱلَّذِينَ ءَامَنُوا۟ وَعَمِلُوا۟ ٱلصَّٰلِحَٰتِ وَقَلِيلٌ مَّا هُمْ ۗ وَظَنَّ دَاوُۥدُ أَنَّمَا فَتَنَّٰهُ فَٱسْتَغْفَرَ رَبَّهُۥ وَخَرَّ رَاكِعًا وَأَنَابَ ۩ ٢٤

dedikdən sonra, Davud Bizim onu sınağa çəkdiyimizi yəqinləşdirərək, Rəbbindən özünün bağışlanmasını dilədi və səcdəyə qapanıb tövbə etdi.

**25.** Biz bunu ona bağışladıq. Həqiqətən, o Bizə yaxın olanlardandır və onun üçün gözəl qayıdış yeri hazırlanmışdır.

فَغَفَرْنَا لَهُۥ ذَٰلِكَ ۖ وَإِنَّ لَهُۥ عِندَنَا لَزُلْفَىٰ
وَحُسْنَ مَـَٔابٍ ٢٥

**26.** Ey Davud! Biz səni yer üzündə xəlifə təyin etdik. Elə isə insanlar arasında ədalətlə hökm ver, nəfsin istəyinə uyma, yoxsa o səni Allahın yolundan azdırar. Həqiqətən, Allahın yolundan azanları hesablaşma gününü unutduqları üçün şiddətli bir əzab gözləyir.

يَٰدَاوُۥدُ إِنَّا جَعَلْنَٰكَ خَلِيفَةً فِى ٱلْأَرْضِ فَٱحْكُم
بَيْنَ ٱلنَّاسِ بِٱلْحَقِّ وَلَا تَتَّبِعِ ٱلْهَوَىٰ فَيُضِلَّكَ عَن
سَبِيلِ ٱللَّهِ ۚ إِنَّ ٱلَّذِينَ يَضِلُّونَ عَن سَبِيلِ ٱللَّهِ
لَهُمْ عَذَابٌ شَدِيدٌۢ بِمَا نَسُوا۟ يَوْمَ ٱلْحِسَابِ ٢٦

**27.** Biz göyü, yeri və onların arasındakılarını nahaq yerə xəlq etməmişik. Bu, kafirlərin zənnidir. Vay o kafirlərin Oddakı halına!

وَمَا خَلَقْنَا ٱلسَّمَآءَ وَٱلْأَرْضَ وَمَا بَيْنَهُمَا بَٰطِلًا ۚ
ذَٰلِكَ ظَنُّ ٱلَّذِينَ كَفَرُوا۟ ۚ فَوَيْلٌ لِّلَّذِينَ كَفَرُوا۟ مِنَ
ٱلنَّارِ ٢٧

**28.** Biz heç iman gətirib yaxşı işlər görənləri yer üzündə fitnə-fəsad törədənlərə tay tutarıqmı? Ya da Allahdan qorxanları günahkarlara tay tutarıqmı?

أَمْ نَجْعَلُ ٱلَّذِينَ ءَامَنُوا۟ وَعَمِلُوا۟ ٱلصَّٰلِحَٰتِ كَٱلْمُفْسِدِينَ
فِى ٱلْأَرْضِ أَمْ نَجْعَلُ ٱلْمُتَّقِينَ كَٱلْفُجَّارِ ٢٨

**29.** *Bu* mübarək Kitabı, *insanların* onun ayələrini düşünüb anlaması və ağıl sahiblərinin də ondan ibrət götürməsi üçün sənə nazil etdik.

كِتَٰبٌ أَنزَلْنَٰهُ إِلَيْكَ مُبَٰرَكٌ لِّيَدَّبَّرُوٓا۟ ءَايَٰتِهِۦ
وَلِيَتَذَكَّرَ أُو۟لُوا۟ ٱلْأَلْبَٰبِ ٢٩

**30.** Biz Davuda Süleymanı bəxş etdik. O necə də gözəl qul idi! Daima *Allaha* üz tutardı.

وَوَهَبْنَا لِدَاوُۥدَ سُلَيْمَٰنَ ۚ نِعْمَ ٱلْعَبْدُ ۖ إِنَّهُۥٓ
أَوَّابٌ ٣٠

31. Bir dəfə axşam çağı ona *üç ayağı üstündə durub bir ayağının* dırnağını yerə vuran, çapar atlar göstərildi.

إِذۡ عُرِضَ عَلَيۡهِ بِٱلۡعَشِيِّ ٱلصَّٰفِنَٰتُ ٱلۡجِيَادُ ٣١

32. *Süleyman* dedi: “Mən, *günəş* üfüqdə batanadək nemətə olan məhəbbəti Rəbbimi zikr etməkdən üstün tutdum – *atlar məni əsr namazından yayındırdı*”.

فَقَالَ إِنِّيٓ أَحۡبَبۡتُ حُبَّ ٱلۡخَيۡرِ عَن ذِكۡرِ رَبِّي حَتَّىٰ
تَوَارَتۡ بِٱلۡحِجَابِ ٣٢

33. *Süleyman*: “Onları yanıma qaytarın!”– dedi. O, atların qıçlarını və boyunlarını vurmağa başladı.

رُدُّوهَا عَلَيَّۖ فَطَفِقَ مَسۡحَۢا بِٱلسُّوقِ
وَٱلۡأَعۡنَاقِ ٣٣

34. Biz Süleymanı sınağa çəkib taxtının üstünə *cansız* bir cəsəd atdıq. Sonra o tövbə edib qayıtdı.

وَلَقَدۡ فَتَنَّا سُلَيۡمَٰنَ وَأَلۡقَيۡنَا عَلَىٰ كُرۡسِيِّهِۦ
جَسَدٗا ثُمَّ أَنَابَ ٣٤

35. O dedi: “Ey Rəbbim! Məni bağışla və mənə elə bir səltənət ver ki, məndən sonra heç kimə nəsib olmasın. Həqiqətən, Sən Bəxşedənsən.

قَالَ رَبِّ ٱغۡفِرۡ لِي وَهَبۡ لِي مُلۡكٗا لَّا يَنۢبَغِي لِأَحَدٖ
مِّنۢ بَعۡدِيٓۖ إِنَّكَ أَنتَ ٱلۡوَهَّابُ ٣٥

36. Biz də, onun əmri ilə istədiyi yerə sakitcə əsən küləyi ona ram etdik.

فَسَخَّرۡنَا لَهُ ٱلرِّيحَ تَجۡرِي بِأَمۡرِهِۦ رُخَآءً حَيۡثُ
أَصَابَ ٣٦

37. Həmçinin şeytanlardan olan müxtəlif nəqşlər vuran bənnaları, dalğıcları

وَٱلشَّيَٰطِينَ كُلَّ بَنَّآءٖ وَغَوَّاصٖ ٣٧

38. və başqalarını da zəncirlənmiş halda *ona tabe etdik*

وَءَاخَرِينَ مُقَرَّنِينَ فِي ٱلۡأَصۡفَادِ ٣٨

39. *və buyurduq*: “Bu Bizim hədiyyəmizdir! *Bunlardan istədiyinə* versən də, verməsən də *səndən* haqq-hesab tələb olunmayacaqdır”.

هَٰذَا عَطَآؤُنَا فَٱمۡنُنۡ أَوۡ أَمۡسِكۡ بِغَيۡرِ حِسَابٖ ٣٩

40. Həqiqətən, o Bizə yaxın olanlardandır və onun üçün gözəl qayıdış yeri hazırlanmışdır.

وَإِنَّ لَهُۥ عِندَنَا لَزُلۡفَىٰ وَحُسۡنَ مَـَٔابٖ ٤٠

41. Qulumuz Əyyubu da yada sal! Bir zaman o öz Rəbbinə yalvarıb demişdi: “Şeytan mənə bəla və əzab toxundurmuşdur!”

وَٱذۡكُرۡ عَبۡدَنَآ أَيُّوبَ إِذۡ نَادَىٰ رَبَّهُۥٓ أَنِّي مَسَّنِيَ ٱلشَّيۡطَٰنُ بِنُصۡبٖ وَعَذَابٍ ٤١

42. *Biz ona dedik*: “Ayağını yerə vur! Budur yuyunmaq və içmək üçün sərin su!”

ٱرۡكُضۡ بِرِجۡلِكَۖ هَٰذَا مُغۡتَسَلُۢ بَارِدٞ وَشَرَابٞ ٤٢

43. Bizdən bir mərhəmət və ağıl sahiblərinə bir ibrət olsun deyə, ona ailəsini yenidən və üstəlik bir o qədər də əlavə *övlad* bəxş etdik.

وَوَهَبۡنَا لَهُۥٓ أَهۡلَهُۥ وَمِثۡلَهُم مَّعَهُمۡ رَحۡمَةٗ مِّنَّا وَذِكۡرَىٰ لِأُوْلِي ٱلۡأَلۡبَٰبِ ٤٣

44. *Biz ona dedik*: “Əlinə bir dəstə *çubuq* götür və onunla *arvadını* vur. Andını pozma”. Həqiqətən, Biz onu səbir edən gördük. Necə də gözəl qul idi! O, daima Allaha üz tutardı.

وَخُذۡ بِيَدِكَ ضِغۡثٗا فَٱضۡرِب بِّهِۦ وَلَا تَحۡنَثۡۗ إِنَّا وَجَدۡنَٰهُ صَابِرٗاۚ نِّعۡمَ ٱلۡعَبۡدُ إِنَّهُۥٓ أَوَّابٞ ٤٤

45. Qüdrət və bəsirət sahibi olan qullarımız İbrahimi, İshaqı və Yəqubu da yada sal!

وَٱذۡكُرۡ عِبَٰدَنَآ إِبۡرَٰهِيمَ وَإِسۡحَٰقَ وَيَعۡقُوبَ أُوْلِي ٱلۡأَيۡدِي وَٱلۡأَبۡصَٰرِ ٤٥

46. Biz onları Axirət yurdunu sadiq ürəklə andıqlarına görə seçdik.

إِنَّآ أَخۡلَصۡنَٰهُم بِخَالِصَةٖ ذِكۡرَى ٱلدَّارِ ٤٦

47. Həqiqətən, onlar Bizim yanımızda seçilmiş ən yaxşı kimsələrdəndirlər.

وَإِنَّهُمۡ عِندَنَا لَمِنَ ٱلۡمُصۡطَفَيۡنَ ٱلۡأَخۡيَارِ ٤٧

48. İsmaili, əl-Yəsəʾi və Zül-Kifli də yada sal! Onların hamısı ən yaxşı kimsələrdəndir.

وَٱذۡكُرۡ إِسۡمَٰعِيلَ وَٱلۡيَسَعَ وَذَا ٱلۡكِفۡلِۖ وَكُلّٞ مِّنَ ٱلۡأَخۡيَارِ ٤٨

49. Bu, bir xatırlatmadır. Allahdan qorxanları gözəl bir qayıdış yeri gözləyir –

هَٰذَا ذِكۡرٞۚ وَإِنَّ لِلۡمُتَّقِينَ لَحُسۡنَ مَـَٔابٖ ٤٩

50. qapıları onlar üçün açılmış Ədn bağları.

جَنَّٰتِ عَدۡنٖ مُّفَتَّحَةٗ لَّهُمُ ٱلۡأَبۡوَٰبُ ٥٠

51. Onlar orada *taxtlara* dirsəklənib çoxlu-çoxlu meyvələr və cənnətə məxsus içkilər istəyəcəklər.

مُتَّكِـِٔينَ فِيهَا يَدۡعُونَ فِيهَا بِفَٰكِهَةٖ كَثِيرَةٖ وَشَرَابٖ ٥١

52. Onların yanında gözlərini *ərindən* çəkməyən həmyaşıdları olacaqdır.

۞وَعِندَهُمۡ قَٰصِرَٰتُ ٱلطَّرۡفِ أَتۡرَابٌ ٥٢

53. Hesablaşma günü üçün sizə vəd olunanlar bunlardır.

هَٰذَا مَا تُوعَدُونَ لِيَوۡمِ ٱلۡحِسَابِ ٥٣

54. Bəli, bu Bizim verdiyimiz nemətdir. O, tükənməzdir.

إِنَّ هَٰذَا لَرِزۡقُنَا مَا لَهُۥ مِن نَّفَادٍ ٥٤

55. Bax belə! Şübhəsiz ki, azğınları da çox pis qayıdış yeri gözləyir –

هَٰذَاۚ وَإِنَّ لِلطَّٰغِينَ لَشَرَّ مَـَٔابٖ ٥٥

56. içində yanacaqları Cəhənnəm. Ora nə pis yataqdır!

جَهَنَّمَ يَصۡلَوۡنَهَا فَبِئۡسَ ٱلۡمِهَادُ ٥٦

57. Bu, qaynar su və irindir. Qoy onu dadsınlar!

هَٰذَا فَلۡيَذُوقُوهُ حَمِيمٞ وَغَسَّاقٞ ٥٧

58. *Kafirlər üçün əzabın* buna bənzər başqa növləri də vardır.

وَءَاخَرُ مِن شَكۡلِهِۦٓ أَزۡوَٰجٌ ٥٨

59. *Kafirlərin başçılarına deyiləcək*: "Bu sizinlə birlikdə *Cəhənnəmə* girən dəstədir. *Başçılar deyəcəklər*: "Onlara salam olmasın! Şübhəsiz ki, onlar odda yanacaqlar".

هَٰذَا فَوۡجٞ مُّقۡتَحِمٞ مَّعَكُمۡ لَا مَرۡحَبَۢا
بِهِمۡۚ إِنَّهُمۡ صَالُواْ ٱلنَّارِ ٥٩

60. *Tabe olanlar* deyəcəklər: "Xeyr, sizin özünüzə salam olmasın! Bunu bizə siz təqdim edirdiniz. Ora necə də pis qərar tutulan yerdir!"

قَالُواْ بَلۡ أَنتُمۡ لَا مَرۡحَبَۢا بِكُمۡۖ أَنتُمۡ قَدَّمۡتُمُوهُ لَنَاۖ
فَبِئۡسَ ٱلۡقَرَارُ ٦٠

61. Onlar deyəcəklər: "Ey Rəbbimiz! Bunu bizə kim təqdim edibsə, onun əzabını odda ikiqat elə!"

قَالُواْ رَبَّنَا مَن قَدَّمَ لَنَا هَٰذَا فَزِدۡهُ عَذَابٗا
ضِعۡفٗا فِي ٱلنَّارِ ٦١

62. *Günahkarlar* deyəcəklər: “Bizə nə olub ki, *dünyada ikən* pis adamlar saydığımız kişiləri burada görmürük?

وَقَالُوا مَا لَنَا لَا نَرَىٰ رِجَالًا كُنَّا نَعُدُّهُم مِّنَ الْأَشْرَارِ ﴿٦٢﴾

63. Biz onları *haqsızcasınamı* məsxərəyə qoyurduq? Nə isə, onlar gözə dəymirlər?”

أَتَّخَذْنَاهُمْ سِخْرِيًّا أَمْ زَاغَتْ عَنْهُمُ الْأَبْصَارُ ﴿٦٣﴾

64. Şübhəsiz ki, bu, od sakinlərinin bir-biri ilə höcətləşməsi bir həqiqətdir.

إِنَّ ذَٰلِكَ لَحَقٌّ تَخَاصُمُ أَهْلِ النَّارِ ﴿٦٤﴾

65. De: “Mən yalnız xəbərdar edənəm. Tək olan, *hər şeyə* Qalib gələn Allahdan başqa məbud yoxdur”.

قُلْ إِنَّمَا أَنَا مُنذِرٌ ۖ وَمَا مِنْ إِلَٰهٍ إِلَّا اللَّهُ الْوَاحِدُ الْقَهَّارُ ﴿٦٥﴾

66. O, göylərin, yerin və onların arasında olanların Rəbbidir. O, Qüdrətlidir, Bağışlayandır.

رَبُّ السَّمَاوَاتِ وَالْأَرْضِ وَمَا بَيْنَهُمَا الْعَزِيزُ الْغَفَّارُ ﴿٦٦﴾

67. De: “O, böyük xəbərdir.

قُلْ هُوَ نَبَأٌ عَظِيمٌ ﴿٦٧﴾

68. Siz isə ondan üz döndərirsiniz.

أَنتُمْ عَنْهُ مُعْرِضُونَ ﴿٦٨﴾

69. Ali toplum mübahisə apararkən mənim onlardan heç bir xəbərim yox idi.

مَا كَانَ لِيَ مِنْ عِلْمٍ بِالْمَلَإِ الْأَعْلَىٰ إِذْ يَخْتَصِمُونَ ﴿٦٩﴾

70. Mənə, ancaq açıq-aydın xəbərdar edən olduğuma görə vəhy olunur”.

إِن يُوحَىٰ إِلَيَّ إِلَّا أَنَّمَا أَنَا نَذِيرٌ مُّبِينٌ ﴿٧٠﴾

71. Bir zaman sənin Rəbbin mələklərə belə demişdi: “Mən palçıqdan bir insan yaradacağam.

إِذْ قَالَ رَبُّكَ لِلْمَلَائِكَةِ إِنِّي خَالِقٌ بَشَرًا مِّن طِينٍ ﴿٧١﴾

72. Mən ona surət verib Öz ruhumdan üfürdüyüm zaman ona səcdə edin!”

فَإِذَا سَوَّيْتُهُ وَنَفَخْتُ فِيهِ مِن رُّوحِي فَقَعُوا لَهُ سَاجِدِينَ ﴿٧٢﴾

73. Mələklərin hamısı birlikdə səcdə etdi,

فَسَجَدَ الْمَلَائِكَةُ كُلُّهُمْ أَجْمَعُونَ ﴿٧٣﴾

74. yalnız İblisdən başqa! O təkəbbür göstərdi və kafirlərdən oldu.

إِلَّا إِبْلِيسَ اسْتَكْبَرَ وَكَانَ مِنَ الْكَافِرِينَ ﴿٧٤﴾

**75.** *Allah* dedi: “Ey İblis! Sənə Mənim iki əlimlə yaratdığıma səcdə etməyə mane olan nə idi? Təkəbbür göstərdin, yoxsa özünü yüksək tutdun?”

قَالَ يَٰٓإِبۡلِيسُ مَا مَنَعَكَ أَن تَسۡجُدَ لِمَا خَلَقۡتُ بِيَدَيَّۖ أَسۡتَكۡبَرۡتَ أَمۡ كُنتَ مِنَ ٱلۡعَالِينَ ٧٥

**76.** *İblis* dedi: “Mən ondan daha xeyirliyəm. Çünki Sən məni oddan, onu isə palçıqdan yaratdın!”

قَالَ أَنَا۠ خَيۡرٞ مِّنۡهُ خَلَقۡتَنِي مِن نَّارٖ وَخَلَقۡتَهُۥ مِن طِينٖ ٧٦

**77.** *Allah* dedi: “Çıx oradan! Sən artıq *rəhmətimdən* qovulmuşsan!

قَالَ فَٱخۡرُجۡ مِنۡهَا فَإِنَّكَ رَجِيمٞ ٧٧

**78.** Haqq-hesab gününə qədər lənətim sənin üzərində olacaqdır!”

وَإِنَّ عَلَيۡكَ لَعۡنَتِيٓ إِلَىٰ يَوۡمِ ٱلدِّينِ ٧٨

**79.** *İblis* dedi: “Ey Rəbbim! Onlar dirildiləcəkləri günə qədər mənə möhlət ver”.

قَالَ رَبِّ فَأَنظِرۡنِيٓ إِلَىٰ يَوۡمِ يُبۡعَثُونَ ٧٩

**80.** *Allah* dedi: “Sən möhlət verilənlərdənsən –

قَالَ فَإِنَّكَ مِنَ ٱلۡمُنظَرِينَ ٨٠

**81.** vaxtı məlum olan günə qədər!”

إِلَىٰ يَوۡمِ ٱلۡوَقۡتِ ٱلۡمَعۡلُومِ ٨١

**82.** *İblis* dedi: “Sənin qüdrətinə and olsun ki, onların hamısını yoldan çıxaracağam;

قَالَ فَبِعِزَّتِكَ لَأُغۡوِيَنَّهُمۡ أَجۡمَعِينَ ٨٢

**83.** Təkcə Sənin seçilmiş *ixlaslı* qullarından başqa!”

إِلَّا عِبَادَكَ مِنۡهُمُ ٱلۡمُخۡلَصِينَ ٨٣

**84.** *Allah* dedi: “*Budur* haqq! Mən yalnız haqqı deyirəm!

قَالَ فَٱلۡحَقُّ وَٱلۡحَقَّ أَقُولُ ٨٤

**85.** Mən Cəhənnəmi səninlə və sənə tabe olanların hamısı ilə dolduracağam!”

لَأَمۡلَأَنَّ جَهَنَّمَ مِنكَ وَمِمَّن تَبِعَكَ مِنۡهُمۡ أَجۡمَعِينَ ٨٥

**86.** De: “Mən buna görə sizdən heç bir mükafat istəmirəm və mən özümdən bir şey uydurmağa çalışmıram.

قُلۡ مَآ أَسۡـَٔلُكُمۡ عَلَيۡهِ مِنۡ أَجۡرٖ وَمَآ أَنَا۠ مِنَ ٱلۡمُتَكَلِّفِينَ ٨٦

87. Bu *Quran* aləmlərə ancaq xatırlatmadır.

إِنۡ هُوَ إِلَّا ذِكۡرٌ لِّلۡعَٰلَمِينَ ٨٧

88. Siz onun verdiyi xəbəri bir vaxtdan sonra mütləq biləcəksiniz!"

وَلَتَعۡلَمُنَّ نَبَأَهُۥ بَعۡدَ حِينِۭ ٨٨



# əz-Zumər («Zümrələr») surəsi

# سُورَةُ الزُّمَرِ

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

1. Bu Kitab Qüdrətli və Müdrik Allahdan nazil edilmişdir.

تَنزِيلُ ٱلْكِتَٰبِ مِنَ ٱللَّهِ ٱلْعَزِيزِ ٱلْحَكِيمِ ١

2. Biz Kitabı sənə bir həqiqət kimi nazil etmişik. Sən də, dinin yalnız Allaha məxsus olduğuna iman gətirərək Ona ibadət et!

إِنَّآ أَنزَلْنَآ إِلَيْكَ ٱلْكِتَٰبَ بِٱلْحَقِّ فَٱعْبُدِ ٱللَّهَ
مُخْلِصًا لَّهُ ٱلدِّينَ ٢

3. Doğrusu, əsl din ancaq Allaha məxsusdur. Allahı qoyub başqalarını özlərinə dost tutanlar: “Biz, onlara ancaq bizi Allaha daha çox yaxınlaşdırsınlar deyə ibadət edirik”– *deyirlər*. Əlbəttə ki, Allah ziddiyyətə düşdükləri şeylər barəsində onların arasında Öz hökmünü verəcəkdir. Şübhəsiz ki, Allah yalançı və kafirləri doğru yola yönəltməz.

أَلَا لِلَّهِ ٱلدِّينُ ٱلْخَالِصُ وَٱلَّذِينَ ٱتَّخَذُوا۟
مِن دُونِهِۦٓ أَوْلِيَآءَ مَا نَعْبُدُهُمْ إِلَّا
لِيُقَرِّبُونَآ إِلَى ٱللَّهِ زُلْفَىٰٓ إِنَّ ٱللَّهَ يَحْكُمُ
بَيْنَهُمْ فِى مَا هُمْ فِيهِ يَخْتَلِفُونَ ۗ إِنَّ ٱللَّهَ لَا
يَهْدِى مَنْ هُوَ كَٰذِبٌ كَفَّارٌ ٣

4. Allah övlad götürmək fikrində olsaydı, xəlq etdiklərindən hər hansı birini seçərdi. O, pakdır, müqəddəsdir. O, Tək olan, *hər şeyə* Qalib gələn Allahdır.

لَّوْ أَرَادَ ٱللَّهُ أَن يَتَّخِذَ وَلَدًا لَّٱصْطَفَىٰ مِمَّا
يَخْلُقُ مَا يَشَآءُ ۚ سُبْحَٰنَهُۥ ۖ هُوَ ٱللَّهُ ٱلْوَٰحِدُ
ٱلْقَهَّارُ ٤

5. O, göyləri və yeri bir həqiqət kimi yaratmışdır. O, gecəni gündüzə bürüyür, gündüzü də gecəyə bürüyür. O, günəşi və ayı ram etdi. Onların hər biri müəyyən olunmuş vaxtadək hərəkət edir. O, Qüdrətlidir, Bağışlayandır.

خَلَقَ ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضَ بِٱلْحَقِّ ۖ
يُكَوِّرُ ٱلَّيْلَ عَلَى ٱلنَّهَارِ وَيُكَوِّرُ ٱلنَّهَارَ
عَلَى ٱلَّيْلِ ۖ وَسَخَّرَ ٱلشَّمْسَ وَٱلْقَمَرَ ۖ كُلٌّ
يَجْرِى لِأَجَلٍ مُّسَمًّى ۗ أَلَا هُوَ ٱلْعَزِيزُ
ٱلْغَفَّٰرُ ٥

6. Allah sizi tək bir nəfərdən yaratdı. Sonra onun özündən zövcəsini yaratdı. O sizdən ötrü səkkiz cüt heyvan endirdi. O sizi analarınızın bətnlərində üç zülmət içərisində yaranış ardından yaranışa salaraq yaradır. Bu sizin Rəbbiniz olan Allahdır. Mülk Ona məxsusdur. Ondan başqa heç bir məbud yoxdur. Siz necə də *haqdan* döndərilirsiniz!

خَلَقَكُم مِّن نَّفْسٍ وَٰحِدَةٖ ثُمَّ جَعَلَ مِنۡهَا زَوۡجَهَا وَأَنزَلَ لَكُم مِّنَ ٱلۡأَنۡعَٰمِ ثَمَٰنِيَةَ أَزۡوَٰجٖۚ يَخۡلُقُكُمۡ فِي بُطُونِ أُمَّهَٰتِكُمۡ خَلۡقٗا مِّنۢ بَعۡدِ خَلۡقٖ فِي ظُلُمَٰتٖ ثَلَٰثٖۚ ذَٰلِكُمُ ٱللَّهُ رَبُّكُمۡ لَهُ ٱلۡمُلۡكُۖ لَآ إِلَٰهَ إِلَّا هُوَۖ فَأَنَّىٰ تُصۡرَفُونَ ٦

7. Küfr etsəniz, *bilin ki*, Allah sizə möhtac deyildir. O, qullarının kafirlik etməsinə razı olmaz. Əgər şükür etsəniz, buna görə sizdən razı qalar. Heç bir günahkar başqasının günah yükünü daşımaz. Sonra Rəbbinizin yanına qayıdacaqsınız. O sizə nə etdiklərinizi bildirəcəkdir. Həqiqətən, O, kökslərdə olanları bilir.

إِن تَكۡفُرُواْ فَإِنَّ ٱللَّهَ غَنِيٌّ عَنكُمۡۖ وَلَا يَرۡضَىٰ لِعِبَادِهِ ٱلۡكُفۡرَۖ وَإِن تَشۡكُرُواْ يَرۡضَهُ لَكُمۡۗ وَلَا تَزِرُ وَازِرَةٞ وِزۡرَ أُخۡرَىٰۚ ثُمَّ إِلَىٰ رَبِّكُم مَّرۡجِعُكُمۡ فَيُنَبِّئُكُم بِمَا كُنتُمۡ تَعۡمَلُونَۚ إِنَّهُۥ عَلِيمُۢ بِذَاتِ ٱلصُّدُورِ ٧

8. İnsana bir zərər toxunduqda Rəbbinə üz tutub təkcə Ona yalvarır. Sonra Allah Özündən insana bir nemət verəndə o, əvvəlcə kimə yalvardığını unudur və *insanları* Allahın yolundan çıxartmaq məqsədilə Ona şəriklər qoşur. De: "Küfrünlə *bu dünyada* bir az dolan. Şübhəsiz ki, sən Cəhənnəm sakinlərindənsən!"

۞وَإِذَا مَسَّ ٱلۡإِنسَٰنَ ضُرّٞ دَعَا رَبَّهُۥ مُنِيبًا إِلَيۡهِ ثُمَّ إِذَا خَوَّلَهُۥ نِعۡمَةٗ مِّنۡهُ نَسِيَ مَا كَانَ يَدۡعُوٓاْ إِلَيۡهِ مِن قَبۡلُ وَجَعَلَ لِلَّهِ أَندَادٗا لِّيُضِلَّ عَن سَبِيلِهِۦۚ قُلۡ تَمَتَّعۡ بِكُفۡرِكَ قَلِيلًا إِنَّكَ مِنۡ أَصۡحَٰبِ ٱلنَّارِ ٨

9. Məgər gecə saatlarını səcdə edərək və ayaq üstə duraraq ibadət içində keçirən, axirətdən çəkinən və Rəbbinin rəhmətinə ümid bəsləyən kimsə *kafirlə eynidirmi*? De: "Heç bilənlərlə bilməyənlər eyni ola

أَمَّنۡ هُوَ قَٰنِتٌ ءَانَآءَ ٱلَّيۡلِ سَاجِدٗا وَقَآئِمٗا يَحۡذَرُ ٱلۡأٓخِرَةَ وَيَرۡجُواْ رَحۡمَةَ رَبِّهِۦۗ قُلۡ هَلۡ يَسۡتَوِي ٱلَّذِينَ يَعۡلَمُونَ وَٱلَّذِينَ لَا يَعۡلَمُونَۗ إِنَّمَا يَتَذَكَّرُ أُوْلُواْ ٱلۡأَلۡبَٰبِ ٩

bilərmi? *Bundan* ancaq ağıl sahibləri düşünüb ibrət alarlar".

10. *Qullarıma Mənim bu Sözümü* de: "Ey Mənim iman gətirən qullarım! Rəbbinizdən qorxun! Bu dünyada yaxşılıq edənləri yaxşılıq (*Cənnət bağı*) gözləyir. Allahın *yaratdığı* yer üzü genişdir. Yalnız səbir edənlərə mükafatları hesabsız veriləcəkdir".

قُلْ يَٰعِبَادِ ٱلَّذِينَ ءَامَنُوا۟ ٱتَّقُوا۟ رَبَّكُمْ ۚ لِلَّذِينَ
أَحْسَنُوا۟ فِى هَٰذِهِ ٱلدُّنْيَا حَسَنَةٌ ۗ وَأَرْضُ
ٱللَّهِ وَٰسِعَةٌ ۗ إِنَّمَا يُوَفَّى ٱلصَّٰبِرُونَ أَجْرَهُم بِغَيْرِ
حِسَابٍ ١٠

11. De: "Mənə, dini yalnız Allaha məxsus edərək, Ona ibadət etmək əmr olunmuşdur.

قُلْ إِنِّىٓ أُمِرْتُ أَنْ أَعْبُدَ ٱللَّهَ مُخْلِصًا لَّهُ ٱلدِّينَ ١١

12. Mənə həm də müsəlmanların birincisi olmaq əmr olunmuşdur".

وَأُمِرْتُ لِأَنْ أَكُونَ أَوَّلَ ٱلْمُسْلِمِينَ ١٢

13. De: "Rəbbimə asi olsam, o əzəmətli günün əzabından qorxaram".

قُلْ إِنِّىٓ أَخَافُ إِنْ عَصَيْتُ رَبِّى عَذَابَ يَوْمٍ عَظِيمٍ ١٣

14. De: "Mən dinimi məhz Allaha məxsus edərək yalnız Ona ibadət edirəm.

قُلِ ٱللَّهَ أَعْبُدُ مُخْلِصًا لَّهُۥ دِينِى ١٤

15. Siz də Ondan başqa istədiyinizə ibadət edin". De: "Şübhəsiz ki, ziyan çəkənlər Qiyamət günü özlərini və ailələrini ziyana uğradanlardır. Açıq-aşkar ziyan da elə budur!"

فَٱعْبُدُوا۟ مَا شِئْتُم مِّن دُونِهِۦ ۗ قُلْ إِنَّ ٱلْخَٰسِرِينَ
ٱلَّذِينَ خَسِرُوٓا۟ أَنفُسَهُمْ وَأَهْلِيهِمْ يَوْمَ ٱلْقِيَٰمَةِ ۗ
أَلَا ذَٰلِكَ هُوَ ٱلْخُسْرَانُ ٱلْمُبِينُ ١٥

16. Onların üstündə də oddan təbəqələr, altında da *oddan* təbəqələr olacaqdır. Allah Öz qullarını bununla qorxudur. Ey qullarım! Məndən qorxun!

لَهُم مِّن فَوْقِهِمْ ظُلَلٌ مِّنَ ٱلنَّارِ وَمِن تَحْتِهِمْ ظُلَلٌ ۚ
ذَٰلِكَ يُخَوِّفُ ٱللَّهُ بِهِۦ عِبَادَهُۥ ۚ يَٰعِبَادِ فَٱتَّقُونِ ١٦

17. Tağuta ibadət etməkdən çəkinib Allaha üz tutanlara müjdə vardır. Qullarımı müjdələ!

وَٱلَّذِينَ ٱجْتَنَبُوا۟ ٱلطَّٰغُوتَ أَن يَعْبُدُوهَا وَأَنَابُوٓا۟ إِلَى
ٱللَّهِ لَهُمُ ٱلْبُشْرَىٰ ۚ فَبَشِّرْ عِبَادِ ١٧

**18.** O kəslər ki, sözə qulaq asıb onun ən yaxşısına tabe olurlar, onlar Allahın doğru yola yönəltdiyi şəxslərdir. Ağıl sahibləri də məhz onlardır.

ٱلَّذِينَ يَسْتَمِعُونَ ٱلْقَوْلَ فَيَتَّبِعُونَ أَحْسَنَهُۥٓ
أُو۟لَٰٓئِكَ ٱلَّذِينَ هَدَىٰهُمُ ٱللَّهُ ۖ وَأُو۟لَٰٓئِكَ هُمْ
أُو۟لُوا۟ ٱلْأَلْبَٰبِ ﴿١٨﴾

**19.** Haqqında əzab sözü gerçəkləşmiş kimsəni və Cəhənnəmdə olacaq kəsi sənmi xilas edəcəksən?

أَفَمَنْ حَقَّ عَلَيْهِ كَلِمَةُ ٱلْعَذَابِ أَفَأَنتَ تُنقِذُ
مَن فِى ٱلنَّارِ ﴿١٩﴾

**20.** Lakin Rəbbindən qorxanları üst-üstə tikilmiş, altından çaylar axan otaqlar gözləyir. Bu, Allahın vədidir. Allah vədinə xilaf çıxmaz.

لَٰكِنِ ٱلَّذِينَ ٱتَّقَوْا۟ رَبَّهُمْ لَهُمْ غُرَفٌ مِّن فَوْقِهَا غُرَفٌ
مَّبْنِيَّةٌ تَجْرِى مِن تَحْتِهَا ٱلْأَنْهَٰرُ ۖ وَعْدَ ٱللَّهِ
لَا يُخْلِفُ ٱللَّهُ ٱلْمِيعَادَ ﴿٢٠﴾

**21.** Məgər Allahın göydən yağmur endirib onu yer üzündəki çeşmələrə axıtdığını görmürsənmi? Sonra *Allah* onunla müxtəlif rəngli əkinlər yetişdirir. Sonra onlar quruyur və sən onları saralmış görürsən. Sonra da *Allah* onları çör-çöpə döndərir. Həqiqətən, bunda ağıl sahibləri üçün ibrət vardır.

أَلَمْ تَرَ أَنَّ ٱللَّهَ أَنزَلَ مِنَ ٱلسَّمَآءِ مَآءً فَسَلَكَهُۥ
يَنَٰبِيعَ فِى ٱلْأَرْضِ ثُمَّ يُخْرِجُ بِهِۦ زَرْعًا مُّخْتَلِفًا
أَلْوَٰنُهُۥ ثُمَّ يَهِيجُ فَتَرَىٰهُ مُصْفَرًّا ثُمَّ
يَجْعَلُهُۥ حُطَٰمًا ۚ إِنَّ فِى ذَٰلِكَ لَذِكْرَىٰ
لِأُو۟لِى ٱلْأَلْبَٰبِ ﴿٢١﴾

**22.** Məgər Allahın, köksünü İslam üçün açdığı və Rəbbinin nura yönəltdiyi şəxs *kafirlə eyni ola bilərmi*? Qəlbi Allahın Zikrinə qarşı sərt olanların vay halına! Onlar həqiqətən azğınlıq içindədirlər.

أَفَمَن شَرَحَ ٱللَّهُ صَدْرَهُۥ لِلْإِسْلَٰمِ فَهُوَ عَلَىٰ
نُورٍ مِّن رَّبِّهِۦ ۚ فَوَيْلٌ لِّلْقَٰسِيَةِ قُلُوبُهُم مِّن ذِكْرِ
ٱللَّهِ ۚ أُو۟لَٰٓئِكَ فِى ضَلَٰلٍ مُّبِينٍ ﴿٢٢﴾

**23.** Allah Sözün ən gözəlini – *ayələri* bir-birinə bənzəyən və təkrarlanan Kitab kimi nazil etdi. Rəbbindən qorxanların ondan dəriləri ürpəşər. Sonra isə Allahı yad etməklə dəriləri və qəlbləri yumşalır. Bu, Allahın hidayətidir. Onunla istədiyini doğru

ٱللَّهُ نَزَّلَ أَحْسَنَ ٱلْحَدِيثِ كِتَٰبًا مُّتَشَٰبِهًا
مَّثَانِىَ تَقْشَعِرُّ مِنْهُ جُلُودُ ٱلَّذِينَ يَخْشَوْنَ
رَبَّهُمْ ثُمَّ تَلِينُ جُلُودُهُمْ وَقُلُوبُهُمْ إِلَىٰ
ذِكْرِ ٱللَّهِ ۚ ذَٰلِكَ هُدَى ٱللَّهِ يَهْدِى بِهِۦ مَن
يَشَآءُ ۚ وَمَن يُضْلِلِ ٱللَّهُ فَمَا لَهُۥ مِنْ هَادٍ ﴿٢٣﴾

yola yönəldir. Allahın zəlalətə saldığı şəxsə isə yol göstərən olmaz.

24. Qiyamət gününün dəhşətli əzabından üzü ilə qorunan kəs *möminlə eynidirmi*? Zalımlara: “Qazandığınızı dadın!”– deyilər.

أَفَمَن يَتَّقِي بِوَجْهِهِۦ سُوٓءَ ٱلْعَذَابِ يَوْمَ
ٱلْقِيَٰمَةِ ۚ وَقِيلَ لِلظَّٰلِمِينَ ذُوقُوا۟ مَا كُنتُمْ
تَكْسِبُونَ ﴿٢٤﴾

25. Onlardan əvvəlkilər də *peyğəmbərləri* yalançı saymışdılar və buna görə əzab da onlara gözləmədikləri yerdən gəldi.

كَذَّبَ ٱلَّذِينَ مِن قَبْلِهِمْ فَأَتَىٰهُمُ ٱلْعَذَابُ
مِنْ حَيْثُ لَا يَشْعُرُونَ ﴿٢٥﴾

26. Allah onlara dünya həyatında rüsvayçılığı daddırdı. Axirət əzabı isə daha böyükdür. Kaş ki, biləydilər!

فَأَذَاقَهُمُ ٱللَّهُ ٱلْخِزْيَ فِي ٱلْحَيَوٰةِ ٱلدُّنْيَا ۖ وَلَعَذَابُ
ٱلْـَٔاخِرَةِ أَكْبَرُ ۚ لَوْ كَانُوا۟ يَعْلَمُونَ ﴿٢٦﴾

27. Biz bu Quranda insanlar üçün hər cür məsəllər çəkdik ki, bəlkə, düşünüb dərk edələr.

وَلَقَدْ ضَرَبْنَا لِلنَّاسِ فِي هَٰذَا ٱلْقُرْءَانِ مِن كُلِّ
مَثَلٍ لَّعَلَّهُمْ يَتَذَكَّرُونَ ﴿٢٧﴾

28. *Biz onlara* heç bir qüsuru olmayan, ərəbcə Quran nazil etdik ki, bəlkə *Allahdan* qorxsunlar.

قُرْءَانًا عَرَبِيًّا غَيْرَ ذِي عِوَجٍ لَّعَلَّهُمْ يَتَّقُونَ ﴿٢٨﴾

29. Allah bir-biri ilə çəkişən bir neçə şərikli ağası olan kişi ilə tək bir ağası olan kişini məsəl çəkir. Onlar məsəlcə eyni ola bilərmi? Həmd Allaha məxsusdur, lakin onların əksəriyyəti *bunu* bilmir.

ضَرَبَ ٱللَّهُ مَثَلًا رَّجُلًا فِيهِ شُرَكَآءُ مُتَشَٰكِسُونَ
وَرَجُلًا سَلَمًا لِّرَجُلٍ هَلْ يَسْتَوِيَانِ مَثَلًا ۚ
ٱلْحَمْدُ لِلَّهِ ۚ بَلْ أَكْثَرُهُمْ لَا يَعْلَمُونَ ﴿٢٩﴾

30. Əslində, sən də öləcəksən, onlar da öləcəklər!

إِنَّكَ مَيِّتٌ وَإِنَّهُم مَّيِّتُونَ ﴿٣٠﴾

31. Sonra siz Qiyamət günü Rəbbinizin yanında mübahisə edəcəksiniz.

ثُمَّ إِنَّكُمْ يَوْمَ ٱلْقِيَٰمَةِ عِندَ رَبِّكُمْ تَخْتَصِمُونَ ﴿٣١﴾

32. Allaha qarşı yalan uyduran və həqiqət ona bəyan edildikdə onu yalan sayan kimsədən daha zalım

۞ فَمَنْ أَظْلَمُ مِمَّن كَذَبَ عَلَى ٱللَّهِ
وَكَذَّبَ بِٱلصِّدْقِ إِذْ جَآءَهُۥٓ ۚ أَلَيْسَ فِي

kim ola bilər? Məgər Cəhənnəmdə
kafirlər üçün yer yoxdur?

جَهَنَّمَ مَثْوًى لِّلْكَـٰفِرِينَ ٣٢

33. Haqqı gətirən və onu
təsdiq edənlər isə əsl
müttəqilərdir.

وَٱلَّذِى جَآءَ بِٱلصِّدْقِ وَصَدَّقَ بِهِۦٓ
أُو۟لَـٰٓئِكَ هُمُ ٱلْمُتَّقُونَ ٣٣

34. Onlar üçün Rəbbinin yanında
dilədikləri hər şey vardır. Yaxşı işlər
görənlərin mükafatı budur.

لَهُم مَّا يَشَآءُونَ عِندَ رَبِّهِمْ ۚ ذَٰلِكَ جَزَآءُ
ٱلْمُحْسِنِينَ ٣٤

35. Beləcə, Allah onların etdikləri ən pis
əməlləri bağışlayacaq və etdikləri ən
yaxşı əməllərə görə mükafatlarını
verəcəkdir.

لِيُكَفِّرَ ٱللَّهُ عَنْهُمْ أَسْوَأَ ٱلَّذِى عَمِلُوا۟
وَيَجْزِيَهُمْ أَجْرَهُم بِأَحْسَنِ ٱلَّذِى كَانُوا۟
يَعْمَلُونَ ٣٥

36. Məgər Allah Öz qulunu qane
etmirmi? Onlar isə səni Ondan
başqaları ilə qorxudurlar. Allahın
zəlalətə saldığı kimsəyə isə doğru yol
göstərən olmaz.

أَلَيْسَ ٱللَّهُ بِكَافٍ عَبْدَهُۥ ۖ وَيُخَوِّفُونَكَ
بِٱلَّذِينَ مِن دُونِهِۦ ۚ وَمَن يُضْلِلِ ٱللَّهُ فَمَا
لَهُۥ مِنْ هَادٍ ٣٦

37. Allahın doğru yola yönəltdiyi
kimsəni də azdıran olmaz. Məgər
Allah Qüdrətli, intiqam almağa qadir
deyilmi?

وَمَن يَهْدِ ٱللَّهُ فَمَا لَهُۥ مِن مُّضِلٍّ ۗ أَلَيْسَ
ٱللَّهُ بِعَزِيزٍ ذِى ٱنتِقَامٍ ٣٧

38. Əgər sən onlardan: "Göyləri və yeri
kim yaratmışdır?"– deyə soruşsan,
onlar mütləq: "Allah!"– deyəcəklər.
De: "Bir deyin görək, əgər Allah
mənə bir zərər toxundurmaq
istəsə, sizin Allahdan başqa ibadət
etdikləriniz Onun zərərini aradan
qaldıra bilərlərmi? Ya da O mənə
bir mərhəmət göstərmək istəsə,
onlar Onun mərhəmətinin qarşısını
ala bilərlərmi?" De: "Mənə Allah

وَلَئِن سَأَلْتَهُم مَّنْ خَلَقَ ٱلسَّمَـٰوَٰتِ وَٱلْأَرْضَ
لَيَقُولُنَّ ٱللَّهُ ۚ قُلْ أَفَرَءَيْتُم مَّا تَدْعُونَ مِن
دُونِ ٱللَّهِ إِنْ أَرَادَنِىَ ٱللَّهُ بِضُرٍّ هَلْ هُنَّ
كَـٰشِفَـٰتُ ضُرِّهِۦٓ أَوْ أَرَادَنِى بِرَحْمَةٍ هَلْ
هُنَّ مُمْسِكَـٰتُ رَحْمَتِهِۦ ۚ قُلْ حَسْبِىَ ٱللَّهُ ۖ
عَلَيْهِ يَتَوَكَّلُ ٱلْمُتَوَكِّلُونَ ٣٨

yetər. Təvəkkül edənlər yalnız Ona
təvəkkül edirlər!"

39. De: "Ey qövmüm! Əlinizdən gələni
edin, mən də edəcəyəm. Siz tezliklə
biləcəksiniz ki,

قُلْ يَٰقَوْمِ ٱعْمَلُوا۟ عَلَىٰ مَكَانَتِكُمْ إِنِّى
عَٰمِلٌ ۖ فَسَوْفَ تَعْلَمُونَ ٣٩

40. kimə rüsvayedici əzab gələcək,
kim də sürəkli əzaba düçar
olacaqdır".

مَن يَأْتِيهِ عَذَابٌ يُخْزِيهِ وَيَحِلُّ عَلَيْهِ عَذَابٌ
مُّقِيمٌ ٤٠

41. Biz Kitabı sənə, insanlar üçün zəruri
olan bir həqiqət kimi nazil etdik.
Kim doğru yolla getsə, xeyri onun
özünə olar, kim azğınlığa düşsə,
ziyanı onun öz əleyhinə olar. Sən
onların müdafiəçisi deyilsən.

إِنَّآ أَنزَلْنَا عَلَيْكَ ٱلْكِتَٰبَ لِلنَّاسِ بِٱلْحَقِّ ۖ
فَمَنِ ٱهْتَدَىٰ فَلِنَفْسِهِۦ ۖ وَمَن ضَلَّ فَإِنَّمَا
يَضِلُّ عَلَيْهَا ۖ وَمَآ أَنتَ عَلَيْهِم بِوَكِيلٍ ٤١

42. Allah ölənlərin canını ölüm anında,
ölməyənlərin canını isə onlar yuxuda
ikən alır. Ölümünə hökm verdiyi
kəsin canını saxlayır, digərini isə
müəyyən olunmuş vaxtadək buraxır.
Həqiqətən, bunda ağıl sahibləri üçün
dəlillər vardır.

ٱللَّهُ يَتَوَفَّى ٱلْأَنفُسَ حِينَ مَوْتِهَا وَٱلَّتِى
لَمْ تَمُتْ فِى مَنَامِهَا ۖ فَيُمْسِكُ ٱلَّتِى قَضَىٰ
عَلَيْهَا ٱلْمَوْتَ وَيُرْسِلُ ٱلْأُخْرَىٰٓ إِلَىٰٓ أَجَلٍ
مُّسَمًّى ۚ إِنَّ فِى ذَٰلِكَ لَءَايَٰتٍ لِّقَوْمٍ
يَتَفَكَّرُونَ ٤٢

43. Yoxsa onlar Allahdan qeyrilərinimi
özlərinə şəfaətçi etdilər? De: "Əgər
onlar heç bir şeyə malik deyillərsə
və heç bir şey anlamırlarsa, bəs necə
olsun?"

أَمِ ٱتَّخَذُوا۟ مِن دُونِ ٱللَّهِ شُفَعَآءَ ۚ قُلْ أَوَلَوْ
كَانُوا۟ لَا يَمْلِكُونَ شَيْـًٔا وَلَا
يَعْقِلُونَ ٤٣

44. De: "Şəfaət bütünlüklə Allaha
məxsusdur. Göylərin və yerin
hökmranlığı da Ona məxsusdur.
Sonra siz Ona qaytarılacaqsınız".

قُل لِّلَّهِ ٱلشَّفَٰعَةُ جَمِيعًا ۖ لَّهُۥ مُلْكُ ٱلسَّمَٰوَٰتِ
وَٱلْأَرْضِ ۖ ثُمَّ إِلَيْهِ تُرْجَعُونَ ٤٤

45. Allah tək olaraq xatırlandığı zaman
Axirətə inanmayanların qəlbini nifrət

وَإِذَا ذُكِرَ ٱللَّهُ وَحْدَهُ ٱشْمَأَزَّتْ قُلُوبُ

bürüyür. Ondan qeyriləri yad edildiyi zaman isə onlar sevinirlər.

ٱلَّذِينَ لَا يُؤْمِنُونَ بِٱلْـَٔاخِرَةِ ۖ وَإِذَا ذُكِرَ
ٱلَّذِينَ مِن دُونِهِۦٓ إِذَا هُمْ يَسْتَبْشِرُونَ ﴿٤٥﴾

46. De: “Ey göyləri və yeri Yaradan, qeybi və aşkarı Bilən Allahım! Qullarının arasında baş verən ziddiyyətlərlə bağlı hökmü yalnız Sən verəcəksən!”

قُلِ ٱللَّهُمَّ فَاطِرَ ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضِ عَٰلِمَ
ٱلْغَيْبِ وَٱلشَّهَٰدَةِ أَنتَ تَحْكُمُ بَيْنَ عِبَادِكَ
فِى مَا كَانُوا۟ فِيهِ يَخْتَلِفُونَ ﴿٤٦﴾

47. Yer üzündə olanların hamısı və, üstəlik bir o qədər də əlavə, zalımlara məxsus olsaydı, onlar mütləq hamısını Qiyamət gününün dəhşətli əzabından qurtarmaq üçün fidyə verərdilər. Lakin Allahdan onlara güman etmədikləri bir əzab düçar olacaqdır.

وَلَوْ أَنَّ لِلَّذِينَ ظَلَمُوا۟ مَا فِى ٱلْأَرْضِ جَمِيعًا
وَمِثْلَهُۥ مَعَهُۥ لَٱفْتَدَوْا۟ بِهِۦ مِن سُوٓءِ ٱلْعَذَابِ
يَوْمَ ٱلْقِيَٰمَةِ ۚ وَبَدَا لَهُم مِّنَ ٱللَّهِ مَا لَمْ يَكُونُوا۟
يَحْتَسِبُونَ ﴿٤٧﴾

48. Onların qazandıqları pis əməllər öz qarşılarına çıxacaq və istehza etdikləri əzab onları bürüyəcəkdir.

وَبَدَا لَهُمْ سَيِّـَٔاتُ مَا كَسَبُوا۟ وَحَاقَ بِهِم
مَّا كَانُوا۟ بِهِۦ يَسْتَهْزِءُونَ ﴿٤٨﴾

49. İnsana bir zərər toxunduğu zaman Bizə yalvarır. Sonra Biz ona Özümüzdən bir nemət verdikdə deyir: “Bu mənə yalnız özümdə olan biliyə görə verilmişdir!” Xeyr, bu, bir imtahandır, lakin onların çoxu bunu bilmir.

فَإِذَا مَسَّ ٱلْإِنسَٰنَ ضُرٌّ دَعَانَا ثُمَّ إِذَا خَوَّلْنَٰهُ
نِعْمَةً مِّنَّا قَالَ إِنَّمَآ أُوتِيتُهُۥ عَلَىٰ عِلْمٍۭ ۚ بَلْ هِىَ
فِتْنَةٌ وَلَٰكِنَّ أَكْثَرَهُمْ لَا يَعْلَمُونَ ﴿٤٩﴾

50. Bunu onlardan əvvəlkilər də demişdilər. Amma qazandıqları şeylər onlara heç bir fayda vermədi.

قَدْ قَالَهَا ٱلَّذِينَ مِن قَبْلِهِمْ فَمَآ أَغْنَىٰ عَنْهُم
مَّا كَانُوا۟ يَكْسِبُونَ ﴿٥٠﴾

51. Onlar işlətdikləri pis əməllərin cəzasına çatdılar. Bunlardan zalım olanlara da qazandıqları günahların

فَأَصَابَهُمْ سَيِّـَٔاتُ مَا كَسَبُوا۟ ۚ وَٱلَّذِينَ
ظَلَمُوا۟ مِنْ هَٰٓؤُلَآءِ سَيُصِيبُهُمْ سَيِّـَٔاتُ

cəzası yetişəcək və onlar qaçıb canlarını qurtara bilməyəcəklər.

مَا كَسَبُوا۟ ۚ وَمَا هُم بِمُعْجِزِينَ ﴿٥١﴾

52. Məgər onlar bilmirlərmi ki, Allah istədiyinin ruzisini bol edir, istədiyinə də onu azaldır? Həqiqətən, bunda iman gətirən qövm üçün ibrətlər vardır.

أَوَلَمْ يَعْلَمُوٓا۟ أَنَّ ٱللَّهَ يَبْسُطُ ٱلرِّزْقَ لِمَن يَشَآءُ
وَيَقْدِرُ ۚ إِنَّ فِى ذَٰلِكَ لَءَايَٰتٍ لِّقَوْمٍ يُؤْمِنُونَ ﴿٥٢﴾

53. Qullarıma mənim bu sözümü de: "Ey Mənim özlərinə qarşı həddi aşmış qullarım! Allahın rəhmindən ümidinizi üzməyin. Şübhəsiz ki, Allah bütün günahları bağışlayır. O, həqiqətən, Bağışlayandır, Rəhmlidir!"

۞ قُلْ يَٰعِبَادِىَ ٱلَّذِينَ أَسْرَفُوا۟ عَلَىٰٓ أَنفُسِهِمْ
لَا تَقْنَطُوا۟ مِن رَّحْمَةِ ٱللَّهِ ۚ إِنَّ ٱللَّهَ يَغْفِرُ
ٱلذُّنُوبَ جَمِيعًا ۚ إِنَّهُۥ هُوَ ٱلْغَفُورُ
ٱلرَّحِيمُ ﴿٥٣﴾

54. Əzab sizə gəlməmişdən öncə Rəbbinizə üz tutun və Ona itaət edin. Sonra sizə heç bir kömək olunmaz.

وَأَنِيبُوٓا۟ إِلَىٰ رَبِّكُمْ وَأَسْلِمُوا۟ لَهُۥ مِن قَبْلِ
أَن يَأْتِيَكُمُ ٱلْعَذَابُ ثُمَّ لَا تُنصَرُونَ ﴿٥٤﴾

55. Əzab sizə fərqinə varmadığınız bir halda qəflətən gəlməmişdən əvvəl Rəbbinizdən sizə nazil edilən ən gözəl Sözə tabe olun!

وَٱتَّبِعُوٓا۟ أَحْسَنَ مَآ أُنزِلَ إِلَيْكُم مِّن
رَّبِّكُم مِّن قَبْلِ أَن يَأْتِيَكُمُ ٱلْعَذَابُ بَغْتَةً
وَأَنتُمْ لَا تَشْعُرُونَ ﴿٥٥﴾

56. Sonra kimsə deməsin ki: "Allaha qarşı etdiyim etinasızlıqlara görə vay mənim halıma! Həqiqətən, mən dinə və dində olanlara rişxənd edənlərdən idim!"

أَن تَقُولَ نَفْسٌ يَٰحَسْرَتَىٰ عَلَىٰ مَا فَرَّطتُ
فِى جَنۢبِ ٱللَّهِ وَإِن كُنتُ لَمِنَ ٱلسَّٰخِرِينَ ﴿٥٦﴾

57. Yaxud deməsin: "Əgər Allah məni doğru yola yönəltsəydi, mən mütləq müttəqilərdən olardım!"

أَوْ تَقُولَ لَوْ أَنَّ ٱللَّهَ هَدَىٰنِى لَكُنتُ مِنَ
ٱلْمُتَّقِينَ ﴿٥٧﴾

58. Həm də əzabı gördüyü zaman deməsin: "Kaş ki, bir də dünyaya qayıdaydım, yaxşı işlər görənlərdən olardım!"

أَوْ تَقُولَ حِينَ تَرَى ٱلْعَذَابَ لَوْ أَنَّ لِى كَرَّةً
فَأَكُونَ مِنَ ٱلْمُحْسِنِينَ ﴿٥٨﴾

**59.** Xeyr! Ayələrim sənə gəlmişdi, sən isə onları yalan saydın, təkəbbür göstərdin və kafirlərdən oldun".

بَلَىٰ قَدْ جَاءَتْكَ آيَاتِي فَكَذَّبْتَ بِهَا وَاسْتَكْبَرْتَ وَكُنْتَ مِنَ الْكَافِرِينَ ﴿٥٩﴾

**60.** Sən Qiyamət günü Allaha qarşı yalan uyduranların üzlərini qapqara görəcəksən. Məgər Cəhənnəmdə təkəbbürlülər üçün yer yoxdur?

وَيَوْمَ الْقِيَامَةِ تَرَى الَّذِينَ كَذَبُوا عَلَى اللَّهِ وُجُوهُهُمْ مُسْوَدَّةٌ ۚ أَلَيْسَ فِي جَهَنَّمَ مَثْوًى لِلْمُتَكَبِّرِينَ ﴿٦٠﴾

**61.** Allah müttəqilərə uğurlarına görə nicat verəcək. Onlara pislik toxunmayacaq və onlar kədərlənməyəcəklər.

وَيُنَجِّي اللَّهُ الَّذِينَ اتَّقَوْا بِمَفَازَتِهِمْ لَا يَمَسُّهُمُ السُّوءُ وَلَا هُمْ يَحْزَنُونَ ﴿٦١﴾

**62.** Allah hər şeyin Xaliqidir. O, hər şeyi Qoruyandır.

اللَّهُ خَالِقُ كُلِّ شَيْءٍ ۖ وَهُوَ عَلَىٰ كُلِّ شَيْءٍ وَكِيلٌ ﴿٦٢﴾

**63.** Göylərin və yerin açarları Ondadır. Məhz Allahın ayələrini inkar edənlər ziyana uğrayanlardır.

لَهُ مَقَالِيدُ السَّمَاوَاتِ وَالْأَرْضِ ۗ وَالَّذِينَ كَفَرُوا بِآيَاتِ اللَّهِ أُولَٰئِكَ هُمُ الْخَاسِرُونَ ﴿٦٣﴾

**64.** De: "Mənə Allahdan qeyrisinəmi ibadət etməyi əmr edirsiniz, ey cahillər?"

قُلْ أَفَغَيْرَ اللَّهِ تَأْمُرُونِّي أَعْبُدُ أَيُّهَا الْجَاهِلُونَ ﴿٦٤﴾

**65.** Sənə və səndən əvvəlkilərə belə vəhy olunmuşdur: "Əgər şərik qoşsan, əməlin puç olacaq və mütləq ziyana uğrayanlardan olacaqsan.

وَلَقَدْ أُوحِيَ إِلَيْكَ وَإِلَى الَّذِينَ مِنْ قَبْلِكَ لَئِنْ أَشْرَكْتَ لَيَحْبَطَنَّ عَمَلُكَ وَلَتَكُونَنَّ مِنَ الْخَاسِرِينَ ﴿٦٥﴾

**66.** Sən yalnız Allaha ibadət et və şükür edənlərdən ol!"

بَلِ اللَّهَ فَاعْبُدْ وَكُنْ مِنَ الشَّاكِرِينَ ﴿٦٦﴾

**67.** Onlar Allahı layiqincə qiymətləndirmədilər. Halbuki Qiyamət günü yer bütünlüklə Onun Ovcunda olacaq, göylər

وَمَا قَدَرُوا اللَّهَ حَقَّ قَدْرِهِ وَالْأَرْضُ جَمِيعًا قَبْضَتُهُ يَوْمَ الْقِيَامَةِ وَالسَّمَاوَاتُ مَطْوِيَّاتٌ بِيَمِينِهِ ۚ سُبْحَانَهُ وَتَعَالَىٰ عَمَّا

isə Onun Əli ilə büküləcəkdir. O, pakdır, müqəddəsdir və onların Ona qoşduqları şəriklərdən ucadır.

يُشْرِكُونَ ٦٧

68. Sur üfürüləcək və Allahın istədiyi kimsələrdən başqa göylərdə və yerdə kim varsa, hamısı öləcəkdir. Sonra bir daha ona üfürülən kimi onlar qalxıb baxacaqlar.

وَنُفِخَ فِي ٱلصُّورِ فَصَعِقَ مَن فِي ٱلسَّمَٰوَٰتِ
وَمَن فِي ٱلْأَرْضِ إِلَّا مَن شَآءَ ٱللَّهُ ثُمَّ نُفِخَ
فِيهِ أُخْرَىٰ فَإِذَا هُمْ قِيَامٌ يَنظُرُونَ ٦٨

69. Yer öz Rəbbinin nuru ilə işıqlanacaq, əməllər yazılmış kitab hər kəsin qarşısına qoyulacaq, peyğəmbərlər və şahidlər gətiriləcəkdir. Onların arasında ədalətlə hökm veriləcək və onlara haqsızlıq edilməyəcəkdir.

وَأَشْرَقَتِ ٱلْأَرْضُ بِنُورِ رَبِّهَا وَوُضِعَ
ٱلْكِتَٰبُ وَجِاْىٓءَ بِٱلنَّبِيِّـۧنَ وَٱلشُّهَدَآءِ
وَقُضِيَ بَيْنَهُم بِٱلْحَقِّ وَهُمْ لَا يُظْلَمُونَ ٦٩

70. Hər kəsə öz əməlinin əvəzi tam veriləcəkdir. Allah onların nə etdiklərini yaxşı bilir.

وَوُفِّيَتْ كُلُّ نَفْسٍ مَّا عَمِلَتْ وَهُوَ أَعْلَمُ بِمَا
يَفْعَلُونَ ٧٠

71. Kafirlər dəstə-dəstə Cəhənnəmə sürüklənəcəklər. Nəhayət, ora çatdıqda onun qapıları açılacaq və onun gözətçiləri onlara deyəcəklər: "Məgər öz içərinizdən Rəbbinizin ayələrini sizə oxuyan və sizi bu gününüzə qovuşacağınızla xəbərdar edən elçilər gəlməmişdi?" Onlar: "Əlbəttə, gəlmişdi!"– deyəcəklər. Lakin əzab Sözü kafirlər barəsində gerçəkləşdi.

وَسِيقَ ٱلَّذِينَ كَفَرُوٓاْ إِلَىٰ جَهَنَّمَ زُمَرًا
حَتَّىٰٓ إِذَا جَآءُوهَا فُتِحَتْ أَبْوَٰبُهَا وَقَالَ
لَهُمْ خَزَنَتُهَآ أَلَمْ يَأْتِكُمْ رُسُلٌ مِّنكُمْ يَتْلُونَ
عَلَيْكُمْ ءَايَٰتِ رَبِّكُمْ وَيُنذِرُونَكُمْ لِقَآءَ
يَوْمِكُمْ هَٰذَا قَالُواْ بَلَىٰ وَلَٰكِنْ حَقَّتْ كَلِمَةُ
ٱلْعَذَابِ عَلَى ٱلْكَٰفِرِينَ ٧١

72. Onlara: "İçində əbədi qalacağınız Cəhənnəmin qapılarına girin!"– deyiləcək. Təkəbbürlülərin yeri necə də pisdir!

قِيلَ ٱدْخُلُوٓاْ أَبْوَٰبَ جَهَنَّمَ خَٰلِدِينَ فِيهَا
فَبِئْسَ مَثْوَى ٱلْمُتَكَبِّرِينَ ٧٢

üstünə xeyir-bərəkətsiz bir külək göndərmişdik.

42. O külək üstündən keçdiyi hər bir şeyi sovurub külə döndərirdi.

مَا تَذَرُ مِن شَيْءٍ أَتَتْ عَلَيْهِ إِلَّا جَعَلَتْهُ كَالرَّمِيمِ ﴿٤٢﴾

43. Səmud qövmünün hekayətində də ibrət vardır. O zaman onlara: “Müəyyən vaxtadək dolanıb-keçinin!”– deyilmişdi.

وَفِي ثَمُودَ إِذْ قِيلَ لَهُمْ تَمَتَّعُوا حَتَّىٰ حِينٍ ﴿٤٣﴾

44. Onlar öz Rəbbinin əmrindən çıxdılar və onları gözləri baxa-baxa ildırım vurdu.

فَعَتَوْا عَنْ أَمْرِ رَبِّهِمْ فَأَخَذَتْهُمُ الصَّاعِقَةُ وَهُمْ يَنظُرُونَ ﴿٤٤﴾

45. Onlar ayağa qalxa bilmədilər və onlara kömək edən də olmadı.

فَمَا اسْتَطَاعُوا مِن قِيَامٍ وَمَا كَانُوا مُنتَصِرِينَ ﴿٤٥﴾

46. Daha əvvəl Nuh qövmünü məhv etdik. Çünki onlar fasiq adamlar idilər.

وَقَوْمَ نُوحٍ مِّن قَبْلُ ۖ إِنَّهُمْ كَانُوا قَوْمًا فَاسِقِينَ ﴿٤٦﴾

47. Biz göyü qüdrətlə yaratdıq və Biz onu genişləndiririk.

وَالسَّمَاءَ بَنَيْنَاهَا بِأَيْدٍ وَإِنَّا لَمُوسِعُونَ ﴿٤٧﴾

48. Yeri də Biz döşədik. Nə gözəl döşəyənlərik Biz!

وَالْأَرْضَ فَرَشْنَاهَا فَنِعْمَ الْمَاهِدُونَ ﴿٤٨﴾

49. Biz hər şeydən erkək və dişi olmaqla cütlər yaratdıq ki, bəlkə, düşünüb ibrət alasınız.

وَمِن كُلِّ شَيْءٍ خَلَقْنَا زَوْجَيْنِ لَعَلَّكُمْ تَذَكَّرُونَ ﴿٤٩﴾

50. De: “Allaha tərəf qaçın! Mən sizi Onunla açıq-aşkar qorxudub xəbərdar edənəm!

فَفِرُّوا إِلَى اللَّهِ ۖ إِنِّي لَكُم مِّنْهُ نَذِيرٌ مُّبِينٌ ﴿٥٠﴾

51. Allahla yanaşı başqa bir məbud qəbul etməyin. Mən sizi Onunla açıq-aşkar qorxudub xəbərdar edənəm!”

وَلَا تَجْعَلُوا مَعَ اللَّهِ إِلَٰهًا آخَرَ ۖ إِنِّي لَكُم مِّنْهُ نَذِيرٌ مُّبِينٌ ﴿٥١﴾

52. Beləcə, onlardan əvvəlkilərə də elə bir elçi gəlmədi ki, onun barəsində: “Sehrbazdır, ya da dəlidir!”– deməsinlər.

كَذَٰلِكَ مَآ أَتَى ٱلَّذِينَ مِن قَبۡلِهِم مِّن رَّسُولٍ إِلَّا
قَالُواْ سَاحِرٌ أَوۡ مَجۡنُونٌ ٥٢

53. Onlar bunu bir-birinə vəsiyyətmi etmişlər? Xeyr, onlar həddi aşan adamlardır.

أَتَوَاصَوۡاْ بِهِۦۚ بَلۡ هُمۡ قَوۡمٞ طَاغُونَ ٥٣

54. Artıq onlardan üz döndər! Sən buna görə qınanmazsan.

فَتَوَلَّ عَنۡهُمۡ فَمَآ أَنتَ بِمَلُومٖ ٥٤

55. Sən xatırlat! Çünki xatırlatmaq möminlərə fayda verir.

وَذَكِّرۡ فَإِنَّ ٱلذِّكۡرَىٰ تَنفَعُ ٱلۡمُؤۡمِنِينَ ٥٥

56. Mən cinləri və insanları ancaq Mənə ibadət etmək üçün yaratdım.

وَمَا خَلَقۡتُ ٱلۡجِنَّ وَٱلۡإِنسَ إِلَّا لِيَعۡبُدُونِ ٥٦

57. Mən onlardan ruzi istəmirəm. Mən onlardan Məni yedirtmələrini də istəmirəm.

مَآ أُرِيدُ مِنۡهُم مِّن رِّزۡقٖ وَمَآ أُرِيدُ أَن يُطۡعِمُونِ ٥٧

58. Həqiqətən, Allah ruzi verəndir, qüvvət sahibidir, Mətindir.

إِنَّ ٱللَّهَ هُوَ ٱلرَّزَّاقُ ذُو ٱلۡقُوَّةِ ٱلۡمَتِينُ ٥٨

59. Şübhəsiz ki, zülm edənləri həmtaylarının qisməti kimi bir qismət gözləyir. Qoy onlar Məni tələsdirməsinlər!

فَإِنَّ لِلَّذِينَ ظَلَمُواْ ذَنُوبٗا مِّثۡلَ ذَنُوبِ أَصۡحَٰبِهِمۡ
فَلَا يَسۡتَعۡجِلُونِ ٥٩

60. Onlara vəd olunmuş Gündən ötrü vay kafirlərin halına!

فَوَيۡلٞ لِّلَّذِينَ كَفَرُواْ مِن يَوۡمِهِمُ ٱلَّذِي
يُوعَدُونَ ٦٠



## ət-Tur
## («Tur dağı») surəsi

سورة الطور

*Mərhəmətli və Rəhmli*
*Allahın adı ilə!*

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

1. And olsun Tur dağına!
2. And olsun yazılmış Kitaba –
3. nazik dəri üzərində *olan Kitaba*!
4. And olsun Beytulməmura!
5. And olsun yüksək tavana!
6. And olsun alovlanan dənizə!
7. Rəbbinin əzabı hökmən vaqe olacaqdır.
8. Heç nə onun qarşısını ala bilməz.
9. O gün göy şiddətlə sarsılacaq,
10. dağlar da hərəkətə gələcəkdir.
11. O gün vay halına *haqqı* yalan sayanların!
12. O kəslər ki, yalan bataqlığında əylənirlər.
13. O gün onlar amansızcasına *sürüdülərək* Cəhənnəm oduna atılacaqlar.
14. *Onlara deyiləcək*: “Bu sizin yalan saydığınız Cəhənnəm odudur!
15. Bəlkə bu da sehrdir, siz görmürsünüz?

وَٱلطُّورِ ١
وَكِتَٰبٖ مَّسۡطُورٖ ٢
فِي رَقّٖ مَّنشُورٖ ٣
وَٱلۡبَيۡتِ ٱلۡمَعۡمُورِ ٤
وَٱلسَّقۡفِ ٱلۡمَرۡفُوعِ ٥
وَٱلۡبَحۡرِ ٱلۡمَسۡجُورِ ٦
إِنَّ عَذَابَ رَبِّكَ لَوَٰقِعٞ ٧
مَّا لَهُۥ مِن دَافِعٖ ٨
يَوۡمَ تَمُورُ ٱلسَّمَآءُ مَوۡرٗا ٩
وَتَسِيرُ ٱلۡجِبَالُ سَيۡرٗا ١٠
فَوَيۡلٞ يَوۡمَئِذٖ لِّلۡمُكَذِّبِينَ ١١
ٱلَّذِينَ هُمۡ فِي خَوۡضٖ يَلۡعَبُونَ ١٢
يَوۡمَ يُدَعُّونَ إِلَىٰ نَارِ جَهَنَّمَ دَعًّا ١٣
هَٰذِهِ ٱلنَّارُ ٱلَّتِي كُنتُم بِهَا تُكَذِّبُونَ ١٤
أَفَسِحۡرٌ هَٰذَآ أَمۡ أَنتُمۡ لَا تُبۡصِرُونَ ١٥

16. Yanın orada! Dözsəniz də, dözməsəniz də sizin üçün eynidir. Sizə ancaq etdiyiniz əməllərin cəzası verilir".

ٱصْلَوْهَا فَٱصْبِرُوٓا۟ أَوْ لَا تَصْبِرُوا۟ سَوَآءٌ
عَلَيْكُمْ ۖ إِنَّمَا تُجْزَوْنَ مَا كُنتُمْ تَعْمَلُونَ ١٦

17. Şübhəsiz ki, müttəqilər Cənnət bağlarında və nemət içində yaşayacaqlar.

إِنَّ ٱلْمُتَّقِينَ فِى جَنَّـٰتٍ وَنَعِيمٍ ١٧

18. Rəbbinin onlara bəxş etdiyinə sevinəcəklər. Rəbbi onları Cəhənnəm əzabından xilas etmişdir.

فَـٰكِهِينَ بِمَآ ءَاتَىٰهُمْ رَبُّهُمْ وَوَقَىٰهُمْ رَبُّهُمْ
عَذَابَ ٱلْجَحِيمِ ١٨

19. *Onlara deyiləcək*: "Xeyirxah əməllərinizin əvəzi olaraq nuşcanlıqla yeyin, için!"

كُلُوا۟ وَٱشْرَبُوا۟ هَنِيٓـًٔۢا بِمَا كُنتُمْ تَعْمَلُونَ ١٩

20. Onlar səflərlə salınmış mütəkkələrə dirsəklənəcəklər. Biz onları iri qaragözlü hurilərlə evləndirəcəyik.

مُتَّكِـِٔينَ عَلَىٰ سُرُرٍ مَّصْفُوفَةٍ ۖ وَزَوَّجْنَـٰهُم
بِحُورٍ عِينٍ ٢٠

21. Möminlərin imanda onların arxasınca gedən nəsillərini də *Cənnətdə* özlərinə qovuşduracağıq. Onların əməllərindən heç bir şey əskiltməyəcəyik. Hər kəs qazandığının girovudur.

وَٱلَّذِينَ ءَامَنُوا۟ وَٱتَّبَعَتْهُمْ ذُرِّيَّتُهُم بِإِيمَـٰنٍ
أَلْحَقْنَا بِهِمْ ذُرِّيَّتَهُمْ وَمَآ أَلَتْنَـٰهُم مِّنْ عَمَلِهِم
مِّن شَىْءٍ ۚ كُلُّ ٱمْرِئٍۭ بِمَا كَسَبَ رَهِينٌ ٢١

22. Onlara istədikləri meyvədən və ətdən bol-bol verəcəyik.

وَأَمْدَدْنَـٰهُم بِفَـٰكِهَةٍ وَلَحْمٍ مِّمَّا يَشْتَهُونَ ٢٢

23. Onlar orada bir-birinə şərab dolu badə uzadacaqlar. Bu *şərab* onları nə boşboğazlığa, nə də günaha təhrik edər.

يَتَنَـٰزَعُونَ فِيهَا كَأْسًا لَّا لَغْوٌ فِيهَا وَلَا تَأْثِيمٌ ٢٣

24. Onların ətrafında xidmətlərinə verilmiş, qorunub saxlanılan mirvari kimi yeniyetmə oğlanlar dolanacaqlar.

۞ وَيَطُوفُ عَلَيْهِمْ غِلْمَانٌ لَّهُمْ كَأَنَّهُمْ لُؤْلُؤٌ
مَّكْنُونٌ ٢٤

**25.** Onlar bir-birinə üz tutub soruşacaqlar.

وَأَقۡبَلَ بَعۡضُهُمۡ عَلَىٰ بَعۡضٖ يَتَسَآءَلُونَ ٢٥

**26.** Onlar deyəcəklər: "Biz əvvəllər ailəmiz içində olarkən *Allahdan* qorxurduq.

قَالُوٓاْ إِنَّا كُنَّا قَبۡلُ فِيٓ أَهۡلِنَا مُشۡفِقِينَ ٢٦

**27.** Allah da bizə mərhəmət göstərdi və bizi qızmar yel əzabından qorudu.

فَمَنَّ ٱللَّهُ عَلَيۡنَا وَوَقَىٰنَا عَذَابَ ٱلسَّمُومِ ٢٧

**28.** Biz əvvəllər Ona dua edirdik. Həqiqətən, O, yaxşılıq edəndir, Rəhmlidir!"

إِنَّا كُنَّا مِن قَبۡلُ نَدۡعُوهُۖ إِنَّهُۥ هُوَ ٱلۡبَرُّ ٱلرَّحِيمُ ٢٨

**29.** *Onlara* xatırlat! Sən öz Rəbbinin neməti sayəsində nə kahinsən, nə də dəli!

فَذَكِّرۡ فَمَآ أَنتَ بِنِعۡمَتِ رَبِّكَ بِكَاهِنٖ وَلَا مَجۡنُونٍ ٢٩

**30.** Yoxsa onlar: "O bir şairdir. Biz onun ölümünü gözləyirik!"– deyirlər.

أَمۡ يَقُولُونَ شَاعِرٞ نَّتَرَبَّصُ بِهِۦ رَيۡبَ ٱلۡمَنُونِ ٣٠

**31.** De: "Gözləyin, mən də sizinlə birlikdə gözləyənlərdənəm!"

قُلۡ تَرَبَّصُواْ فَإِنِّي مَعَكُم مِّنَ ٱلۡمُتَرَبِّصِينَ ٣١

**32.** Yoxsa onların ağılları bunu onlara əmr edir? Yaxud onlar azğın adamlardır?

أَمۡ تَأۡمُرُهُمۡ أَحۡلَٰمُهُم بِهَٰذَآۚ أَمۡ هُمۡ قَوۡمٞ طَاغُونَ ٣٢

**33.** Yoxsa onlar: "Bunu özündən uydurdun!"– deyirlər. Xeyr, onlar iman gətirmirlər.

أَمۡ يَقُولُونَ تَقَوَّلَهُۥۚ بَل لَّا يُؤۡمِنُونَ ٣٣

**34.** Əgər doğru söyləyirlərsə, qoy *Qurana* bənzər bir kəlam gətirsinlər.

فَلۡيَأۡتُواْ بِحَدِيثٖ مِّثۡلِهِۦٓ إِن كَانُواْ صَٰدِقِينَ ٣٤

**35.** Bəlkə onlar öz-özünə yaranıblar? Yaxud onlar yaradanlardır?

أَمۡ خُلِقُواْ مِنۡ غَيۡرِ شَيۡءٍ أَمۡ هُمُ ٱلۡخَٰلِقُونَ ٣٥

**36.** Yoxsa onlar göyləri və yeri yaradıblar? Xeyr, onlar qətiyyən inanmırlar.

أَمۡ خَلَقُواْ ٱلسَّمَٰوَٰتِ وَٱلۡأَرۡضَۚ بَل لَّا يُوقِنُونَ ٣٦

37. Yoxsa sənin Rəbbinin xəzinələri onlardadır? Yaxud onlar hökm sahibidirlər?

أَمْ عِندَهُمْ خَزَآئِنُ رَبِّكَ أَمْ هُمُ ٱلْمُصَيْطِرُونَ ٣٧

38. Yoxsa onların, üstünə çıxıb *mələklərin söhbətlərini* dinlədikləri bir nərdivanı vardır? Onda qoy onların mələkləri dinləyənləri anlaşıqlı bir dəlil gətirsinlər!

أَمْ لَهُمْ سُلَّمٌ يَسْتَمِعُونَ فِيهِ ۖ فَلْيَأْتِ
مُسْتَمِعُهُم بِسُلْطَٰنٍ مُّبِينٍ ٣٨

39. Yoxsa qızlar Onun, oğlanlar isə sizindir?

أَمْ لَهُ ٱلْبَنَٰتُ وَلَكُمُ ٱلْبَنُونَ ٣٩

40. Yoxsa sən onlardan bir mükafat istəyirsən və onlar da borclu qaldıqlarına görə ağır yük altındadırlar?

أَمْ تَسْـَٔلُهُمْ أَجْرًا فَهُم مِّن مَّغْرَمٍ مُّثْقَلُونَ ٤٠

41. Yoxsa onlar qeybi bilir və *onu* yazırlar?

أَمْ عِندَهُمُ ٱلْغَيْبُ فَهُمْ يَكْتُبُونَ ٤١

42. Yoxsa bir hiylə qurmaq istəyirlər? Amma kafirlər özləri o hiylənin qurbanı olacaqlar.

أَمْ يُرِيدُونَ كَيْدًا ۖ فَٱلَّذِينَ كَفَرُوا۟ هُمُ ٱلْمَكِيدُونَ ٤٢

43. Yoxsa onların Allahdan başqa bir məbudu var? Allah onların qoşduqları şəriklərdən uzaqdır.

أَمْ لَهُمْ إِلَٰهٌ غَيْرُ ٱللَّهِ ۚ سُبْحَٰنَ ٱللَّهِ عَمَّا يُشْرِكُونَ ٤٣

44. Əgər onlar göy parçalarının düşdüyünü görsələr: “Bulud topasıdır!”– deyərlər.

وَإِن يَرَوْا۟ كِسْفًا مِّنَ ٱلسَّمَآءِ سَاقِطًا يَقُولُوا۟ سَحَابٌ
مَّرْكُومٌ ٤٤

45. Sən onları sarsılacaqları günə qovuşana qədər tərk et!

فَذَرْهُمْ حَتَّىٰ يُلَٰقُوا۟ يَوْمَهُمُ ٱلَّذِى فِيهِ يُصْعَقُونَ ٤٥

46. O gün hiylələri onlara heç bir fayda verməyəcək və onlara kömək göstərilməyəcəkdir.

يَوْمَ لَا يُغْنِى عَنْهُمْ كَيْدُهُمْ شَيْـًٔا وَلَا هُمْ يُنصَرُونَ ٤٦

47. Həqiqətən, zalımlar üçün bundan *başqa* əzab da hazırlanmışdır. Lakin onların çoxu *bunu* bilmir.

وَإِنَّ لِلَّذِينَ ظَلَمُوا عَذَابًا دُونَ ذَٰلِكَ وَلَٰكِنَّ
أَكْثَرَهُمْ لَا يَعْلَمُونَ ﴿٤٧﴾

48. Sən öz Rəbbinin hökmünə səbir et! Həqiqətən, sən Bizim Gözlərimiz önündəsən. *Yuxudan* qalxdıqda Rəbbini həmd ilə zikr et!

وَاصْبِرْ لِحُكْمِ رَبِّكَ فَإِنَّكَ بِأَعْيُنِنَا ۖ وَسَبِّحْ بِحَمْدِ
رَبِّكَ حِينَ تَقُومُ ﴿٤٨﴾

49. Gecənin bir vaxtında, bir də ulduzlar batandan sonra Onun şəninə təriflər de!

وَمِنَ اللَّيْلِ فَسَبِّحْهُ وَإِدْبَارَ النُّجُومِ ﴿٤٩﴾



## ən-Nəcm («Ulduz») surəsi

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

1. And olsun batmaqda olan ulduza!
2. Sizin yoldaşınız nə *haqdan* azmış, nə də *yoldan* çıxmışdır.
3. O, öz istəyi ilə danışmır.
4. Bu, ona təlqin edilən bir vəhydir.
5. Bunu ona çox qüvvətli olan öyrətdi –
6. gözəl görünüşlü *Cəbrail*. O, yüksəlib *öz surətində göründü.*
7. O, ən uca üfüqdə idi.
8. Sonra *Muhəmmədə* yaxınlaşıb aşağı endi.
9. O, iki yay uzunluğunda, hətta ondan da yaxın məsafədə idi.
10. Sonra *Allah* Öz quluna nazil edəcəyini vəhy etdi.
11. *Peyğəmbərin* qəlbi gördüyünü yalan saymadı.
12. İndi siz onunla gördüyü şey barəsində mübahisəmi edirsiniz?
13. Onu bir daha *öz surətində* enərkən gördü –
14. son həddəki Sidr ağacının yanında.

## سُورَةُ النَّجْمِ

بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ

وَالنَّجْمِ إِذَا هَوَىٰ ١

مَا ضَلَّ صَاحِبُكُمْ وَمَا غَوَىٰ ٢

وَمَا يَنطِقُ عَنِ الْهَوَىٰ ٣

إِنْ هُوَ إِلَّا وَحْيٌ يُوحَىٰ ٤

عَلَّمَهُ شَدِيدُ الْقُوَىٰ ٥

ذُو مِرَّةٍ فَاسْتَوَىٰ ٦

وَهُوَ بِالْأُفُقِ الْأَعْلَىٰ ٧

ثُمَّ دَنَا فَتَدَلَّىٰ ٨

فَكَانَ قَابَ قَوْسَيْنِ أَوْ أَدْنَىٰ ٩

فَأَوْحَىٰ إِلَىٰ عَبْدِهِ مَا أَوْحَىٰ ١٠

مَا كَذَبَ الْفُؤَادُ مَا رَأَىٰ ١١

أَفَتُمَارُونَهُ عَلَىٰ مَا يَرَىٰ ١٢

وَلَقَدْ رَآهُ نَزْلَةً أُخْرَىٰ ١٣

عِندَ سِدْرَةِ الْمُنتَهَىٰ ١٤

15. Məva bağı da onun yanındadır.

عِندَهَا جَنَّةُ ٱلۡمَأۡوَىٰٓ ١٥

16. O zaman Sidr ağacını bürüyən bürümüşdü.

إِذۡ يَغۡشَى ٱلسِّدۡرَةَ مَا يَغۡشَىٰ ١٦

17. *Peyğəmbərin* gözü yayınmadı və həddi aşmadı.

مَا زَاغَ ٱلۡبَصَرُ وَمَا طَغَىٰ ١٧

18. O, öz Rəbbinin ən böyük dəlillərindən *bəzisini* gördü.

لَقَدۡ رَأَىٰ مِنۡ ءَايَٰتِ رَبِّهِ ٱلۡكُبۡرَىٰٓ ١٨

19. Siz *tapındığınız* Lat və Uzzanı gördünüzmü?

أَفَرَءَيۡتُمُ ٱللَّٰتَ وَٱلۡعُزَّىٰ ١٩

20. Həmçinin üçüncü olan Mənatı da?

وَمَنَوٰةَ ٱلثَّالِثَةَ ٱلۡأُخۡرَىٰٓ ٢٠

21. Məgər oğlanlar sizin, qızlar Onundurmu?

أَلَكُمُ ٱلذَّكَرُ وَلَهُ ٱلۡأُنثَىٰ ٢١

22. Onda bu ədalətsiz bölgü olardı!

تِلۡكَ إِذٗا قِسۡمَةٞ ضِيزَىٰٓ ٢٢

23. Onlar sizin və atalarınızın qoyduqları adlardan başqa bir şey deyildir. Allah onlar haqqında heç bir dəlil nazil etməmişdir. Onlar yalnız zənnə və nəfslərinin istəklərinə uyarlar. Halbuki Rəbbindən onlara doğru yolu göstərən rəhbər artıq gəlmişdir.

إِنۡ هِيَ إِلَّآ أَسۡمَآءٞ سَمَّيۡتُمُوهَآ أَنتُمۡ وَءَابَآؤُكُم مَّآ
أَنزَلَ ٱللَّهُ بِهَا مِن سُلۡطَٰنٍۚ إِن يَتَّبِعُونَ إِلَّا ٱلظَّنَّ
وَمَا تَهۡوَى ٱلۡأَنفُسُۖ وَلَقَدۡ جَآءَهُم مِّن رَّبِّهِمُ
ٱلۡهُدَىٰٓ ٢٣

24. Yoxsa insan üçün istədiyi hər şey hazırlanmışdır?

أَمۡ لِلۡإِنسَٰنِ مَا تَمَنَّىٰ ٢٤

25. Axirət də, dünya da Allahındır.

فَلِلَّهِ ٱلۡأٓخِرَةُ وَٱلۡأُولَىٰ ٢٥

26. Göylərdə neçə-neçə mələklər vardır ki, onların şəfaəti Allahın istədiyi və Özünün razı qaldığı kimsələrdən başqa *heç kəsə* heç bir fayda verməz.

۞وَكَم مِّن مَّلَكٖ فِي ٱلسَّمَٰوَٰتِ لَا تُغۡنِي
شَفَٰعَتُهُمۡ شَيۡـًٔا إِلَّا مِنۢ بَعۡدِ أَن يَأۡذَنَ ٱللَّهُ لِمَن
يَشَآءُ وَيَرۡضَىٰٓ ٢٦

27. Axirətə inanmayanlar, həqiqətən də, mələklərə qadın adları verirlər.

إِنَّ ٱلَّذِينَ لَا يُؤۡمِنُونَ بِٱلۡأٓخِرَةِ لَيُسَمُّونَ
ٱلۡمَلَٰٓئِكَةَ تَسۡمِيَةَ ٱلۡأُنثَىٰ ٢٧

**28.** Halbuki buna dair heç bir bilgiləri yoxdur. Sadəcə olaraq zənnə qapılırlar. Zənn isə əsla həqiqət ola bilməz.

وَمَا لَهُم بِهِۦ مِنْ عِلْمٍۖ إِن يَتَّبِعُونَ إِلَّا ٱلظَّنَّۖ وَإِنَّ ٱلظَّنَّ لَا يُغْنِى مِنَ ٱلْحَقِّ شَيْـًٔا ٢٨

**29.** Sən də Bizi zikr etməkdən üz çevirib dünya həyatından başqa bir şey istəməyənlərdən üz döndər!

فَأَعْرِضْ عَن مَّن تَوَلَّىٰ عَن ذِكْرِنَا وَلَمْ يُرِدْ إِلَّا ٱلْحَيَوٰةَ ٱلدُّنْيَا ٢٩

**30.** Onların bilik səviyyəsi budur. Şübhəsiz ki, sənin Rəbbin Onun yolundan azanı da, doğru yolla gedəni də yaxşı tanıyır.

ذَٰلِكَ مَبْلَغُهُم مِّنَ ٱلْعِلْمِۚ إِنَّ رَبَّكَ هُوَ أَعْلَمُ بِمَن ضَلَّ عَن سَبِيلِهِۦ وَهُوَ أَعْلَمُ بِمَنِ ٱهْتَدَىٰ ٣٠

**31.** Göylərdə və yerdə nə varsa, Allahındır. *Bu, Allahın* pislik edənlərə əməllərinin cəzasını verməsi, yaxşılıq edənləri isə ən gözəli ilə (Cənnətlə) mükafatlandırması üçündür.

وَلِلَّهِ مَا فِى ٱلسَّمَٰوَٰتِ وَمَا فِى ٱلْأَرْضِ لِيَجْزِىَ ٱلَّذِينَ أَسَٰٓـُٔوا۟ بِمَا عَمِلُوا۟ وَيَجْزِىَ ٱلَّذِينَ أَحْسَنُوا۟ بِٱلْحُسْنَى ٣١

**32.** Onlar kiçik günahlar istisna olmaqla, böyük günahlardan və iyrənc əməllərdən çəkinirlər. Həqiqətən, sənin Rəbbin geniş məğfirət sahibidir. O, sizi torpaqdan yaradanda da, siz analarınızın bətnində rüşeym halında olanda da sizi yaxşı tanıyırdı. Özünüzü təmizə çıxartmayın! Çünki O, kimin *Allahdan* qorxduğunu yaxşı bilir.

ٱلَّذِينَ يَجْتَنِبُونَ كَبَٰٓئِرَ ٱلْإِثْمِ وَٱلْفَوَٰحِشَ إِلَّا ٱللَّمَمَۚ إِنَّ رَبَّكَ وَٰسِعُ ٱلْمَغْفِرَةِۚ هُوَ أَعْلَمُ بِكُمْ إِذْ أَنشَأَكُم مِّنَ ٱلْأَرْضِ وَإِذْ أَنتُمْ أَجِنَّةٌ فِى بُطُونِ أُمَّهَٰتِكُمْۖ فَلَا تُزَكُّوٓا۟ أَنفُسَكُمْۖ هُوَ أَعْلَمُ بِمَنِ ٱتَّقَىٰٓ ٣٢

**33.** Gördünmü üz çevirəni,

أَفَرَءَيْتَ ٱلَّذِى تَوَلَّىٰ ٣٣

**34.** *malından* azacıq verib sonra heç verməyəni?

وَأَعْطَىٰ قَلِيلًا وَأَكْدَىٰٓ ٣٤

**35.** Məgər o, qeybi bilirmi ki, *bunu* görsün?

أَعِندَهُۥ عِلْمُ ٱلْغَيْبِ فَهُوَ يَرَىٰٓ ٣٥

| | |
|---|---|
| 36. Yoxsa Musanın səhifələrində olanlar barədə ona xəbər verilmədi? | أَمْ لَمْ يُنَبَّأْ بِمَا فِي صُحُفِ مُوسَىٰ ٣٦ |
| 37. Məgər vəfalı olan İbrahimin *səhifələrində olanlar barədə ona bildirilmədi*? | وَإِبْرَٰهِيمَ ٱلَّذِي وَفَّىٰٓ ٣٧ |
| 38. Heç bir günahkar başqasının günah yükünü daşımaz. | أَلَّا تَزِرُ وَازِرَةٌ وِزْرَ أُخْرَىٰ ٣٨ |
| 39. İnsan can atdığı şeyə nail olar. | وَأَن لَّيْسَ لِلْإِنسَٰنِ إِلَّا مَا سَعَىٰ ٣٩ |
| 40. Əlbəttə, onun can atdığı *əməl* ona nəsib olacaqdır. | وَأَنَّ سَعْيَهُۥ سَوْفَ يُرَىٰ ٤٠ |
| 41. Sonra da ona *bunun* əvəzi tam veriləcəkdir!" | ثُمَّ يُجْزَىٰهُ ٱلْجَزَآءَ ٱلْأَوْفَىٰ ٤١ |
| 42. Son dönüş sənin Rəbbinədir. | وَأَنَّ إِلَىٰ رَبِّكَ ٱلْمُنتَهَىٰ ٤٢ |
| 43. Güldürən də, ağladan da Odur! | وَأَنَّهُۥ هُوَ أَضْحَكَ وَأَبْكَىٰ ٤٣ |
| 44. Öldürən də, dirildən də Odur! | وَأَنَّهُۥ هُوَ أَمَاتَ وَأَحْيَا ٤٤ |
| 45. O, *insanlardan və heyvanlardan* biri erkək və biri də dişi olmaqla iki cüt yaratdı – | وَأَنَّهُۥ خَلَقَ ٱلزَّوْجَيْنِ ٱلذَّكَرَ وَٱلْأُنثَىٰ ٤٥ |
| 46. axıdılan bir nütfədən. | مِن نُّطْفَةٍ إِذَا تُمْنَىٰ ٤٦ |
| 47. Təkrar diriltmək də Ona aiddir. | وَأَنَّ عَلَيْهِ ٱلنَّشْأَةَ ٱلْأُخْرَىٰ ٤٧ |
| 48. Dövlətli edən də, kasıb edən də Odur. | وَأَنَّهُۥ هُوَ أَغْنَىٰ وَأَقْنَىٰ ٤٨ |
| 49. Şiranın (ulduz) da Rəbbi Odur. | وَأَنَّهُۥ هُوَ رَبُّ ٱلشِّعْرَىٰ ٤٩ |
| 50. O, əvvəlki Ad *tayfasını* məhv etdi. | وَأَنَّهُۥٓ أَهْلَكَ عَادًا ٱلْأُولَىٰ ٥٠ |
| 51. Səmudu da *məhv edib onlardan heç kəsi* sağ buraxmadı. | وَثَمُودَا۟ فَمَآ أَبْقَىٰ ٥١ |
| 52. Daha öncə Nuh qövmünü də *məhv etdi*, çünki onlar daha zalım, daha azğın kimsələr idi. | وَقَوْمَ نُوحٍ مِّن قَبْلُ إِنَّهُمْ كَانُوا۟ هُمْ أَظْلَمَ وَأَطْغَىٰ ٥٢ |

53. Alt-üst olmuş kəndləri də O viran qoydu.
وَٱلْمُؤْتَفِكَةَ أَهْوَىٰ ٥٣

54. Onların başına gətirdiyini gətirdi.
فَغَشَّىٰهَا مَا غَشَّىٰ ٥٤

55. Sən öz Rəbbinin hansı nemətlərinə şübhə edirsən?
فَبِأَيِّ ءَالَآءِ رَبِّكَ تَتَمَارَىٰ ٥٥

56. Bu da əvvəlki *xəbərdarlıq edib* qorxudanlar kimi bir qorxudandır.
هَٰذَا نَذِيرٌ مِّنَ ٱلنُّذُرِ ٱلْأُولَىٰٓ ٥٦

57. Yaxınlaşan *Qiyamət günü* yaxınlaşdı.
أَزِفَتِ ٱلْءَازِفَةُ ٥٧

58. Allahdan başqa heç kəs onun qarşısını ala bilməz.
لَيْسَ لَهَا مِن دُونِ ٱللَّهِ كَاشِفَةٌ ٥٨

59. Siz bu Sözə təəccüblənirsiniz,
أَفَمِنْ هَٰذَا ٱلْحَدِيثِ تَعْجَبُونَ ٥٩

60. gülürsünüz, heç ağlamırsınız,
وَتَضْحَكُونَ وَلَا تَبْكُونَ ٦٠

61. və oynayıb əylənirsiniz?
وَأَنتُمْ سَٰمِدُونَ ٦١

62. Siz Allaha səcdə qılın və *Ona* ibadət edin!
فَٱسْجُدُوا۟ لِلَّهِ وَٱعْبُدُوا۟ ۩ ٦٢



## əl-Qəmər («Ay») surəsi

## سُورَةُ القَمَرِ

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

1. O Saat (Qiyamət) yaxınlaşdı və ay bölündü.

ٱقۡتَرَبَتِ ٱلسَّاعَةُ وَٱنشَقَّ ٱلۡقَمَرُ ١

2. Onlar bir möcüzə gördükdə üz döndərib: "*Bu*, tez keçib-gedən bir sehrdir" deyirlər.

وَإِن يَرَوۡاْ ءَايَةٗ يُعۡرِضُواْ وَيَقُولُواْ سِحۡرٞ مُّسۡتَمِرّٞ ٢

3. Onlar *Peyğəmbəri* yalançı saydılar və öz nəfslərinin istəklərinə tabe oldular. Halbuki hər bir iş bərqərar olacaqdır.

وَكَذَّبُواْ وَٱتَّبَعُوٓاْ أَهۡوَآءَهُمۡۚ وَكُلُّ أَمۡرٖ مُّسۡتَقِرّٞ ٣

4. Onlara *küfrdən* çəkindirən neçə-neçə xəbərlər gəlmişdir.

وَلَقَدۡ جَآءَهُم مِّنَ ٱلۡأَنۢبَآءِ مَا فِيهِ مُزۡدَجَرٌ ٤

5. Bu böyük bir hikmətdir. Lakin *arxa çevirənlərə* təhdidlər nə fayda verə bilər?!

حِكۡمَةُۢ بَٰلِغَةٞۖ فَمَا تُغۡنِ ٱلنُّذُرُ ٥

6. Sən də onları tərk et! Carçının onları xoşagəlməz bir şeyə çağıracağı gün

فَتَوَلَّ عَنۡهُمۡۘ يَوۡمَ يَدۡعُ ٱلدَّاعِ إِلَىٰ شَيۡءٖ نُّكُرٍ ٦

7. onlar zəlil baxışlarla gözlərini aşağı dikmiş halda, ətrafa yayılan çəyirtkələr kimi qəbirlərindən çıxacaqlar.

خُشَّعًا أَبۡصَٰرُهُمۡ يَخۡرُجُونَ مِنَ ٱلۡأَجۡدَاثِ كَأَنَّهُمۡ
جَرَادٞ مُّنتَشِرٞ ٧

8. Kafirlər carçıya tərəf tələsərək: "Bu nə çətin bir gündür!"– deyəcəklər.

مُّهۡطِعِينَ إِلَى ٱلدَّاعِۖ يَقُولُ ٱلۡكَٰفِرُونَ هَٰذَا يَوۡمٌ
عَسِرٞ ٨

9. Onlardan əvvəl Nuh qövmü *elçiləri* yalançı hesab etmişdi. Onlar qulumuzu yalançı sayıb: "O,

۞كَذَّبَتۡ قَبۡلَهُمۡ قَوۡمُ نُوحٖ فَكَذَّبُواْ عَبۡدَنَا وَقَالُواْ
مَجۡنُونٞ وَٱزۡدُجِرَ ٩

dəlidir!"– dedilər və ona hədə-qorxu gəldilər.

10. O, Rəbbinə yalvarıb: "Məni üstələdilər! *Mənə* kömək et!"– dedi.

فَدَعَا رَبَّهُۥٓ أَنِّى مَغْلُوبٌ فَٱنتَصِرْ ١٠

11. Biz göyün qapılarını leysan yağışı ilə açdıq.

فَفَتَحْنَآ أَبْوَٰبَ ٱلسَّمَآءِ بِمَآءٍ مُّنْهَمِرٍ ١١

12. Yeri yarıb bulaqlar qaynatdıq. *Göydən tökülən və yerdən çıxan* sular əzəldən yazılmış bir iş üçün bir-birinə qovuşdu.

وَفَجَّرْنَا ٱلْأَرْضَ عُيُونًا فَٱلْتَقَى ٱلْمَآءُ عَلَىٰٓ أَمْرٍ
قَدْ قُدِرَ ١٢

13. Biz onu taxtalardan pərçimlənib mismarlanmış gəmidə daşıdıq.

وَحَمَلْنَٰهُ عَلَىٰ ذَاتِ أَلْوَٰحٍ وَدُسُرٍ ١٣

14. İnkar edilmiş *peyğəmbərə* mükafat olaraq o *gəmi* Gözlərimiz önündə üzüb gedirdi.

تَجْرِى بِأَعْيُنِنَا جَزَآءً لِّمَن كَانَ كُفِرَ ١٤

15. Andolsun ki, Biz *həmin hadisəni* nəsillərə ibrət üçün saxladıq. Amma heç bir yada salan varmı?

وَلَقَد تَّرَكْنَٰهَآ ءَايَةً فَهَلْ مِن مُّدَّكِرٍ ١٥

16. *Görəydin* Mənim əzabım və qorxutmağım necə oldu!

فَكَيْفَ كَانَ عَذَابِى وَنُذُرِ ١٦

17. Andolsun ki, Biz Quranı yada salmaq üçün asanlaşdırdıq. Amma heç bir yada salan varmı?

وَلَقَدْ يَسَّرْنَا ٱلْقُرْءَانَ لِلذِّكْرِ فَهَلْ مِن مُّدَّكِرٍ ١٧

18. Ad *qövmü* də *elçiləri* yalançı saydı. *Görəydin* Mənim əzabım və qorxutmağım necə oldu!

كَذَّبَتْ عَادٌ فَكَيْفَ كَانَ عَذَابِى وَنُذُرِ ١٨

19. Biz uzun sürən uğursuz bir gündə onların üstünə çox soyuq külək göndərdik.

إِنَّآ أَرْسَلْنَا عَلَيْهِمْ رِيحًا صَرْصَرًا فِى يَوْمِ نَحْسٍ
مُّسْتَمِرٍّ ١٩

**20.** O, insanları kökündən çıxardılmış xurma kötükləri kimi qopardıb atırdı.

تَنزِعُ ٱلنَّاسَ كَأَنَّهُمۡ أَعۡجَازُ نَخۡلٖ مُّنقَعِرٖ ٢٠

**21.** *Görəydin* Mənim əzabım və qorxutmağım necə oldu!

فَكَيۡفَ كَانَ عَذَابِي وَنُذُرِ ٢١

**22.** Andolsun ki, Biz Quranı yada salmaq üçün asanlaşdırdıq. Amma heç bir yada salan varmı?

وَلَقَدۡ يَسَّرۡنَا ٱلۡقُرۡءَانَ لِلذِّكۡرِ فَهَلۡ مِن مُّدَّكِرٖ ٢٢

**23.** Səmud *qövmü* də xəbərdarlıq edənləri (peyğəmbərləri Salehi) yalan saydı.

كَذَّبَتۡ ثَمُودُ بِٱلنُّذُرِ ٢٣

**24.** Onlar dedilər: "Özümüzdən olan bir adamamı tabe olacağıq? Onda biz azğınlığa düşər və ağılsız iş görmüş olarıq!

فَقَالُوٓاْ أَبَشَرٗا مِّنَّا وَٰحِدٗا نَّتَّبِعُهُۥٓ إِنَّآ إِذٗا لَّفِي ضَلَٰلٖ وَسُعُرٍ ٢٤

**25.** Zikr aramızdan təkcə onamı verildi? Xeyr, o, yalançıdır, lovğadır!"

أَءُلۡقِيَ ٱلذِّكۡرُ عَلَيۡهِ مِنۢ بَيۡنِنَا بَلۡ هُوَ كَذَّابٌ أَشِرٞ ٢٥

**26.** Sabah onlar kimin yalançı və lovğa olduğunu mütləq biləcəklər.

سَيَعۡلَمُونَ غَدٗا مَّنِ ٱلۡكَذَّابُ ٱلۡأَشِرُ ٢٦

**27.** Biz onları sınağa çəkmək üçün bir dişi dəvə göndərəcəyik. Onların *nə edəcəklərini* gözlə və *əziyyətlərinə* səbir et!

إِنَّا مُرۡسِلُواْ ٱلنَّاقَةِ فِتۡنَةٗ لَّهُمۡ فَٱرۡتَقِبۡهُمۡ وَٱصۡطَبِرۡ ٢٧

**28.** Onlara xəbər ver ki, *bu* su, dəvə ilə onlar arasında bölüşdürülmüşdür. Hər biri su içməyə öz növbəsində gəlsin!"

وَنَبِّئۡهُمۡ أَنَّ ٱلۡمَآءَ قِسۡمَةُۢ بَيۡنَهُمۡۖ كُلُّ شِرۡبٖ مُّحۡتَضَرٞ ٢٨

**29.** Onlar öz yoldaşlarını çağırdılar. O da dəvəni tutub diz vətərini kəsdi.

فَنَادَوۡاْ صَاحِبَهُمۡ فَتَعَاطَىٰ فَعَقَرَ ٢٩

**30.** *Görəydin* Mənim əzabım və qorxutmağım necə oldu!

فَكَيۡفَ كَانَ عَذَابِي وَنُذُرِ ٣٠

31. Həqiqətən, Biz onlara bircə tükürpədici səs göndərdik və onlar mal-qara ağılında istifadə edilən quru saman kimi oldular.

إنا أرسلنا عليهم صيحة واحدة فكانوا كهشيم المحتظر ٣١

32. Andolsun ki, Biz Quranı yada salmaq üçün asanlaşdırdıq. Amma heç bir yada salan varmı?

ولقد يسرنا القرآن للذكر فهل من مدكر ٣٢

33. Lut qövmü də xəbərdarlıq edənləri (peyğəmbərləri Lutu) yalan saydı.

كذبت قوم لوط بالنذر ٣٣

34. Biz onların üstünə *qasırğa ilə birgə* daşlar göndərdik. Yalnız Lutun ailəsini sübh çağı xilas etdik –

إنا أرسلنا عليهم حاصبا إلا آل لوط نجيناهم بسحر ٣٤

35. Özümüzdən bir mərhəmət olaraq! Biz şükür edənləri belə mükafatlandırırıq.

نعمة من عندنا كذلك نجزي من شكر ٣٥

36. Andolsun ki, *Lut* onları Bizim əzabımızla hədələdi, onlar isə bu xəbərdarlıqlara şübhə ilə yanaşdılar.

ولقد أنذرهم بطشتنا فتماروا بالنذر ٣٦

37. Onlar *Lutdan* qonaqlarını israrla tələb etdilər. Biz də onları kor etdik *və dedik*: "Əzabımı və təhdidlərimi dadın!"

ولقد راودوه عن ضيفه فطمسنا أعينهم فذوقوا عذابي ونذر ٣٧

38. Sübh tezdən onlara yaxalarından əl çəkməyəcək bir əzab gəldi.

ولقد صبحهم بكرة عذاب مستقر ٣٨

39. Elə isə əzabımı və təhdidlərimi dadın!

فذوقوا عذابي ونذر ٣٩

40. Andolsun ki, Biz Quranı yada salmaq üçün asanlaşdırdıq. Amma heç bir yada salan varmı?

ولقد يسرنا القرآن للذكر فهل من مدكر ٤٠

41. Xəbərdarlıqlar Firon nəslinə də göndərildi.

ولقد جاء آل فرعون النذر ٤١

| | |
|---|---|
| **42.** Onlar dəlillərimizin hamısını yalan saydılar. Biz də onları Qüvvət və Qüdrətimizə layiq şəkildə əzabla yaxaladıq. | كَذَّبُوا بِـَٔايَٰتِنَا كُلِّهَا فَأَخَذْنَٰهُمْ أَخْذَ عَزِيزٍ مُّقْتَدِرٍ ٤٢ |
| **43.** Sizin kafirləriniz onlardan yaxşıdırmı? Yoxsa Kitablarda sizə toxunulmazlıq vəd edilmişdir? | أَكُفَّارُكُمْ خَيْرٌ مِّنْ أُولَٰٓئِكُمْ أَمْ لَكُم بَرَآءَةٌ فِى ٱلزُّبُرِ ٤٣ |
| **44.** Yoxsa onlar: “Biz qalib gələcək bir dəstəyik!”– deyirlər? | أَمْ يَقُولُونَ نَحْنُ جَمِيعٌ مُّنتَصِرٌ ٤٤ |
| **45.** Bu dəstə mütləq məğlub olacaq və arxaya dönüb qaçacaqdır. | سَيُهْزَمُ ٱلْجَمْعُ وَيُوَلُّونَ ٱلدُّبُرَ ٤٥ |
| **46.** Xeyr! Onlara vəd edilmiş vaxt o Saatdır (Qiyamət günüdür). O Saat isə daha ağır, daha acıdır. | بَلِ ٱلسَّاعَةُ مَوْعِدُهُمْ وَٱلسَّاعَةُ أَدْهَىٰ وَأَمَرُّ ٤٦ |
| **47.** Şübhəsiz ki, günahkarlar azğınlıq və əzab-əziyyət içindədirlər. | إِنَّ ٱلْمُجْرِمِينَ فِى ضَلَٰلٍ وَسُعُرٍ ٤٧ |
| **48.** O gün onlar üzüstə Cəhənnəmə sürüklənəcək *və onlara*: “Cəhənnəmin təmasını dadın!”– *deyiləcəkdir.* | يَوْمَ يُسْحَبُونَ فِى ٱلنَّارِ عَلَىٰ وُجُوهِهِمْ ذُوقُوا مَسَّ سَقَرَ ٤٨ |
| **49.** Biz, həqiqətən də, hər şeyi qədərincə yaratdıq. | إِنَّا كُلَّ شَىْءٍ خَلَقْنَٰهُ بِقَدَرٍ ٤٩ |
| **50.** Biz bircə dəfə əmr edirik, o da bir göz qırpımında yerinə yetir. | وَمَآ أَمْرُنَآ إِلَّا وَٰحِدَةٌ كَلَمْحٍ بِٱلْبَصَرِ ٥٠ |
| **51.** Andolsun ki, Biz *neçə-neçə* həmtaylarınızı məhv etmişik. Amma heç yada salan varmı? | وَلَقَدْ أَهْلَكْنَآ أَشْيَاعَكُمْ فَهَلْ مِن مُّدَّكِرٍ ٥١ |
| **52.** Onların etdiyi hər şey *əməllərinin yazıldığı* kitablarındadır. | وَكُلُّ شَىْءٍ فَعَلُوهُ فِى ٱلزُّبُرِ ٥٢ |

53. Hər bir kiçik və böyük *əməl* yazılmışdır.

وَكُلُّ صَغِيرٍ وَكَبِيرٍ مُّسْتَطَرٌ ﴿٥٣﴾

54. Şübhəsiz ki, müttəqilər Cənnət bağlarında və çaylar kənarında,

إِنَّ الْمُتَّقِينَ فِي جَنَّاتٍ وَنَهَرٍ ﴿٥٤﴾

55. qadir Hökmdarın hüzurundakı haqq məclisində olacaqlar!

فِي مَقْعَدِ صِدْقٍ عِندَ مَلِيكٍ مُّقْتَدِرٍ ﴿٥٥﴾



## ər-Rəhman («Mərhəmətli») surəsi




*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بسم الله الرحمن الرحيم

1. Mərhəmətli *Allah*

الرحمن ١

2. Quranı öyrətdi.

علم القرءان ٢

3. İnsanı yaratdı,

خلق الإنسان ٣

4. ona danışmağı öyrətdi.

علمه البيان ٤

5. Günəş və ay müəyyən bir ölçü ilə *hərəkət edir.*

الشمس والقمر بحسبان ٥

6. Otlar da, ağaclar da səcdə edir.

والنجم والشجر يسجدان ٦

7. *Allah* göyü ucaltdı və tərəzini qoydu ki,

والسماء رفعها ووضع الميزان ٧

8. çəkidə həddi aşmayasınız.

ألا تطغوا في الميزان ٨

9. *Əşyaları* tərəzidə insafla çəkin və çəkini əskiltməyin.

وأقيموا الوزن بالقسط ولا تخسروا الميزان ٩

10. O, yeri məxluqat üçün döşədi.

والأرض وضعها للأنام ١٠

11. Orada meyvələr və salxımlı xurma ağacları vardır.

فيها فكهة والنخل ذات الأكمام ١١

12. Həmçinin saçaqlı dənli bitkilər və xoş ətirli çiçəklər də vardır.

والحب ذو العصف والريحان ١٢

13. Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فبأي ءالاء ربكما تكذبان ١٣

14. O, insanı saxsı kimi quru gildən yaratdı,

خلق الإنسان من صلصل كالفخار ١٤

**15.** cinləri də təmiz oddan yaratdı.

وَخَلَقَ ٱلْجَآنَّ مِن مَّارِجٍ مِّن نَّارٍ ﴿١٥﴾

**16.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَيِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ﴿١٦﴾

**17.** *Allah* iki məşriqin və iki məğribin Rəbbidir.

رَبُّ ٱلْمَشْرِقَيْنِ وَرَبُّ ٱلْمَغْرِبَيْنِ ﴿١٧﴾

**18.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَيِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ﴿١٨﴾

**19.** O, qarşı-qarşıya gələn iki dənizi bir-birinə qovuşdurdu.

مَرَجَ ٱلْبَحْرَيْنِ يَلْتَقِيَانِ ﴿١٩﴾

**20.** Onların arasında maneə vardır, onu keçə bilməzlər.

بَيْنَهُمَا بَرْزَخٌ لَّا يَبْغِيَانِ ﴿٢٠﴾

**21.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَيِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ﴿٢١﴾

**22.** Onlardan mirvari və mərcan çıxır.

يَخْرُجُ مِنْهُمَا ٱللُّؤْلُؤُ وَٱلْمَرْجَانُ ﴿٢٢﴾

**23.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَيِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ﴿٢٣﴾

**24.** Dənizdə dağlar kimi, yelkənləri qaldırılmış halda üzən gəmilər də Onundur.

وَلَهُ ٱلْجَوَارِ ٱلْمُنشَـَٔاتُ فِى ٱلْبَحْرِ كَٱلْأَعْلَـٰمِ ﴿٢٤﴾

**25.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَيِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ﴿٢٥﴾

**26.** *Yer* üzündə olan hər kəs ölümə məhkumdur.

كُلُّ مَنْ عَلَيْهَا فَانٍ ﴿٢٦﴾

**27.** Ancaq Rəbbinin əzəmətli və kəramətli Üzü əbədidir.

وَيَبْقَىٰ وَجْهُ رَبِّكَ ذُو ٱلْجَلَـٰلِ وَٱلْإِكْرَامِ ﴿٢٧﴾

**28.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَيِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ﴿٢٨﴾

**29.** Göylərdə və yerdə olan hər kəs *ehtiyacı olan şeyi* Ondan diləyir. O hər gün bir işdədir.

يَسْـَٔلُهُۥ مَن فِى ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضِ ۚ كُلَّ يَوْمٍ هُوَ فِى
شَأْنٍ ٢٩

**30.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَىِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ٣٠

**31.** Ey ağır yükü olan *insan və cin tayfası*! Tezliklə ancaq sizinlə məşğul olacağıq.

سَنَفْرُغُ لَكُمْ أَيُّهَ ٱلثَّقَلَانِ ٣١

**32.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَىِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ٣٢

**33.** Ey cin və insan tayfası! Əgər göylərin və yerin hüdudlarını yarıb keçə bilərsinizsə, keçin! Siz ancaq qüdrət və qüvvətlə keçə bilərsiniz.

يَٰمَعْشَرَ ٱلْجِنِّ وَٱلْإِنسِ إِنِ ٱسْتَطَعْتُمْ أَن
تَنفُذُوا۟ مِنْ أَقْطَارِ ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضِ
فَٱنفُذُوا۟ ۚ لَا تَنفُذُونَ إِلَّا بِسُلْطَٰنٍ ٣٣

**34.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَىِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ٣٤

**35.** Sizin üstünüzə tüstüsüz alov və ərimiş mis *və ya tüstü* göndəriləcək və siz bir-birinizə kömək edə bilməyəcəksiniz.

يُرْسَلُ عَلَيْكُمَا شُوَاظٌ مِّن نَّارٍ وَنُحَاسٌ فَلَا
تَنتَصِرَانِ ٣٥

**36.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَىِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ٣٦

**37.** Göy yarılıb dağ edilmiş yağ *yaxud ərinmiş qurğuşun* kimi qıpqırmızı olacaqdır.

فَإِذَا ٱنشَقَّتِ ٱلسَّمَآءُ فَكَانَتْ وَرْدَةً
كَٱلدِّهَانِ ٣٧

**38.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَىِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ٣٨

**39.** O gün nə insan, nə də cin günahı barəsində sorğu-sual olunmayacaqdır.

فَيَوْمَئِذٍ لَّا يُسْـَٔلُ عَن ذَنۢبِهِۦٓ إِنسٌ وَلَا جَآنٌّ ٣٩

**40.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَيِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ٤٠

**41.** Günahkarlar simalarından tanınacaq, kəkillərindən və ayaqlarından yaxalanacaqlar.

يُعْرَفُ ٱلْمُجْرِمُونَ بِسِيمَٰهُمْ فَيُؤْخَذُ بِٱلنَّوَٰصِى وَٱلْأَقْدَامِ ٤١

**42.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَيِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ٤٢

**43.** Budur günahkarların yalan hesab etdikləri Cəhənnəm!

هَٰذِهِۦ جَهَنَّمُ ٱلَّتِى يُكَذِّبُ بِهَا ٱلْمُجْرِمُونَ ٤٣

**44.** Onlar onunla qaynar su arasında dolanacaqlar.

يَطُوفُونَ بَيْنَهَا وَبَيْنَ حَمِيمٍ ءَانٍ ٤٤

**45.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَيِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ٤٥

**46.** Rəbbinin hüzurunda durmaqdan qorxanları iki Cənnət bağı gözləyir.

وَلِمَنْ خَافَ مَقَامَ رَبِّهِۦ جَنَّتَانِ ٤٦

**47.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَيِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ٤٧

**48.** İkisində də *növbənöv meyvələrlə dolu* budaqlar vardır.

ذَوَاتَآ أَفْنَانٍ ٤٨

**49.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَيِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ٤٩

**50.** İkisində də iki axar bulaq vardır.

فِيهِمَا عَيْنَانِ تَجْرِيَانِ ٥٠

**51.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَيِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ٥١

**52.** İkisində də hər meyvədən qoşa-qoşa vardır.

فِيهِمَا مِن كُلِّ فَٰكِهَةٍ زَوْجَانِ ٥٢

**53.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَيِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ٥٣

**54.** Onlar orada astarları atlazdan olan döşəklərə dirsəklənəcəklər. Hər iki bağın meyvələri onlara yaxın olacaqdır.

مُتَّكِـِٔينَ عَلَىٰ فُرُشِۭ بَطَآئِنُهَا مِنۡ إِسۡتَبۡرَقٖۚ وَجَنَى ٱلۡجَنَّتَيۡنِ دَانٖ ٥٤

**55.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَيِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ٥٥

**56.** Orada gözlərini *öz ərlərinə* dikmiş, onlardan əvvəl özlərinə heç bir insan və cin toxunmamış qızlar vardır.

فِيهِنَّ قَٰصِرَٰتُ ٱلطَّرۡفِ لَمۡ يَطۡمِثۡهُنَّ إِنسٞ قَبۡلَهُمۡ وَلَا جَآنّٞ ٥٦

**57.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَيِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ٥٧

**58.** Onlar sanki yaqut və mərcandırlar.

كَأَنَّهُنَّ ٱلۡيَاقُوتُ وَٱلۡمَرۡجَانُ ٥٨

**59.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَيِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ٥٩

**60.** Yaxşılığın əvəzi ancaq yaxşılıq deyildirmi?

هَلۡ جَزَآءُ ٱلۡإِحۡسَٰنِ إِلَّا ٱلۡإِحۡسَٰنُ ٦٠

**61.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَيِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ٦١

**62.** Bu ikisindən başqa daha iki Cənnət bağı da vardır.

وَمِن دُونِهِمَا جَنَّتَانِ ٦٢

**63.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَيِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ٦٣

**64.** Hər ikisi tünd yaşıldır.

مُدۡهَآمَّتَانِ ٦٤

**65.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَيِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ٦٥

**66.** İkisində də fəvvarə vuran iki bulaq vardır.

فِيهِمَا عَيۡنَانِ نَضَّاخَتَانِ ٦٦

**67.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَيِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ٦٧

**68.** İkisində də *cürbəcür* meyvələr, xurma ağacları və nar vardır.

فِيهِمَا فَٰكِهَةٌ وَنَخْلٌ وَرُمَّانٌ ٦٨

**69.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَيِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ٦٩

**70.** Orada xoş xasiyyətli, gözəl qızlar vardır.

فِيهِنَّ خَيْرَٰتٌ حِسَانٌ ٧٠

**71.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَيِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ٧١

**72.** Çadırlarda gözlərini *öz ərlərinə* dikmiş hurilər vardır.

حُورٌ مَّقْصُورَٰتٌ فِى ٱلْخِيَامِ ٧٢

**73.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَيِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ٧٣

**74.** Onlardan əvvəl özlərinə heç bir insan və cin toxunmamış qızlar vardır.

لَمْ يَطْمِثْهُنَّ إِنسٌ قَبْلَهُمْ وَلَا جَآنٌّ ٧٤

**75.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَيِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ٧٥

**76.** Onlar yaşıl balışlara və gözəl döşəkcələrə dirsəklənəcəklər.

مُتَّكِـِٔينَ عَلَىٰ رَفْرَفٍ خُضْرٍ وَعَبْقَرِىٍّ حِسَانٍ ٧٦

**77.** Elə isə Rəbbinizin hansı nemətlərini yalan sayırsınız?

فَبِأَيِّ ءَالَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ٧٧

**78.** Sənin əzəmət və kərəm sahibi olan Rəbbinin adı nə qədər mübarəkdir.

تَبَٰرَكَ ٱسْمُ رَبِّكَ ذِى ٱلْجَلَٰلِ وَٱلْإِكْرَامِ ٧٨



## əl-Vaqiə («Vaqiə») surəsi

## سورة الواقعة

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ

| | |
|---|---|
| 1. Vaqiə qopacağı zaman | إِذَا وَقَعَتِ الْوَاقِعَةُ ۝١ |
| 2. onun qopduğunu heç kəs dana bilməz. | لَيْسَ لِوَقْعَتِهَا كَاذِبَةٌ ۝٢ |
| 3. O, *bəzilərini* alçaldacaq, *bəzilərini də* ucaldacaqdır. | خَافِضَةٌ رَّافِعَةٌ ۝٣ |
| 4. Yer şiddətlə titrədiyi zaman, | إِذَا رُجَّتِ الْأَرْضُ رَجًّا ۝٤ |
| 5. Dağlar parça-parça olub ovxalandığı | وَبُسَّتِ الْجِبَالُ بَسًّا ۝٥ |
| 6. və ətrafa səpələnmiş toz-torpağa döndüyü zaman, | فَكَانَتْ هَبَاءً مُّنبَثًّا ۝٦ |
| 7. siz üç dəstəyə ayrılacaqsınız. | وَكُنتُمْ أَزْوَاجًا ثَلَاثَةً ۝٧ |
| 8. Sağ tərəf sahibləri. Nə xoşbəxtdir sağ tərəf sahibləri! | فَأَصْحَابُ الْمَيْمَنَةِ مَا أَصْحَابُ الْمَيْمَنَةِ ۝٨ |
| 9. Sol tərəf sahibləri. Nə bədbəxtdir sol tərəf sahibləri! | وَأَصْحَابُ الْمَشْأَمَةِ مَا أَصْحَابُ الْمَشْأَمَةِ ۝٩ |
| 10. *Xeyirxah işlərdə* öndə gedənlər, *Cənnətdə də* öndədirlər! | وَالسَّابِقُونَ السَّابِقُونَ ۝١٠ |
| 11. Onlar *Allaha* yaxın olanlar, | أُولَٰئِكَ الْمُقَرَّبُونَ ۝١١ |
| 12. Nəim bağlarında *qalacaq kimsələrdir*. | فِي جَنَّاتِ النَّعِيمِ ۝١٢ |
| 13. Onların çoxu əvvəlki nəsillərdən, | ثُلَّةٌ مِّنَ الْأَوَّلِينَ ۝١٣ |
| 14. az bir qismi də axırıncılardandır. | وَقَلِيلٌ مِّنَ الْآخِرِينَ ۝١٤ |
| 15. *Onlar* bəzənmiş taxtlar üstündə | عَلَىٰ سُرُرٍ مَّوْضُونَةٍ ۝١٥ |

**16.** qarşı-qarşıya əyləşib dirsəklənəcəklər.

مُتَّكِـِٔينَ عَلَيۡهَا مُتَقَٰبِلِينَ ١٦

**17.** Onların ətrafında həmişəcavan *xidmətçi* oğlanlar fırlanacaqlar;

يَطُوفُ عَلَيۡهِمۡ وِلۡدَٰنٞ مُّخَلَّدُونَ ١٧

**18.** çeşmə şərabı ilə dolu badələr, bardaqlar və qədəhlərlə –

بِأَكۡوَابٖ وَأَبَارِيقَ وَكَأۡسٖ مِّن مَّعِينٖ ١٨

**19.** ondan başları ağrımaz və məst olmazlar,

لَّا يُصَدَّعُونَ عَنۡهَا وَلَا يُنزِفُونَ ١٩

**20.** bəyənib seçdikləri meyvələr

وَفَٰكِهَةٖ مِّمَّا يَتَخَيَّرُونَ ٢٠

**21.** və istədikləri quş əti ilə *hərlənəcəklər*.

وَلَحۡمِ طَيۡرٖ مِّمَّا يَشۡتَهُونَ ٢١

**22.** *Onları* iri qaragözlü hurilər gözləyir –

وَحُورٌ عِينٞ ٢٢

**23.** *sədəf içində* saxlanılmış mirvariyə bənzər *hurilər*.

كَأَمۡثَٰلِ ٱللُّؤۡلُوِٕ ٱلۡمَكۡنُونِ ٢٣

**24.** *Bu*, onların etdikləri əməllərin mükafatı olacaq.

جَزَآءَۢ بِمَا كَانُواْ يَعۡمَلُونَ ٢٤

**25.** Onlar orada nə boş söz, nə də günaha səbəb olan söhbət eşidəcəklər.

لَا يَسۡمَعُونَ فِيهَا لَغۡوٗا وَلَا تَأۡثِيمًا ٢٥

**26.** Ancaq: "Salam! Salam!"– sözləri *eşidəcəklər*.

إِلَّا قِيلٗا سَلَٰمٗا سَلَٰمٗا ٢٦

**27.** Sağ tərəf sahibləri. Nə xoşbəxtdir sağ tərəf sahibləri!

وَأَصۡحَٰبُ ٱلۡيَمِينِ مَآ أَصۡحَٰبُ ٱلۡيَمِينِ ٢٧

**28.** *Onlar* tikansız sidr ağacları arasında,

فِي سِدۡرٖ مَّخۡضُودٖ ٢٨

**29.** meyvələri salxım-salxım asılmış banan ağacları altında,

وَطَلۡحٖ مَّنضُودٖ ٢٩

**30.** uzanmış kölgəliklərdə,

وَظِلّٖ مَّمۡدُودٖ ٣٠

**31.** daim axan sular kənarında,

وَمَآءٖ مَّسۡكُوبٖ ٣١

**32.** çoxlu meyvələr,

وَفَٰكِهَةٖ كَثِيرَةٖ ٣٢

**33.** tükənməz və qadağan edilməyən *meyvələr* içində

لَّا مَقۡطُوعَةٖ وَلَا مَمۡنُوعَةٖ ٣٣

**34.** və hündür döşəklər üstündə olacaqlar.

وَفُرُشٖ مَّرۡفُوعَةٍ ٣٤

**35.** Biz *Cənnətdəki* qadınları yeni biçimdə yaradacağıq.

إِنَّآ أَنشَأۡنَٰهُنَّ إِنشَآءٗ ٣٥

**36.** Onları bakirə qızlar edəcəyik –

فَجَعَلۡنَٰهُنَّ أَبۡكَارًا ٣٦

**37.** ərlərini sevən, həmyaşıdlar.

عُرُبًا أَتۡرَابٗا ٣٧

**38.** *Bunlar* sağ tərəf sahibləri üçündür.

لِّأَصۡحَٰبِ ٱلۡيَمِينِ ٣٨

**39.** Onların çoxu əvvəlki nəsillərdən,

ثُلَّةٞ مِّنَ ٱلۡأَوَّلِينَ ٣٩

**40.** bir qismi də axırıncılardandır.

وَثُلَّةٞ مِّنَ ٱلۡأٓخِرِينَ ٤٠

**41.** Sol tərəf sahibləri. Nə bədbəxtdir sol tərəf sahibləri!

وَأَصۡحَٰبُ ٱلشِّمَالِ مَآ أَصۡحَٰبُ ٱلشِّمَالِ ٤١

**42.** Onlar qızmar yel və qaynar su içində,

فِي سَمُومٖ وَحَمِيمٖ ٤٢

**43.** qapqara duman kölgəsində olacaqlar.

وَظِلّٖ مِّن يَحۡمُومٖ ٤٣

**44.** *Bu duman* nə sərin, nə də xoşagələndir.

لَّا بَارِدٖ وَلَا كَرِيمٍ ٤٤

**45.** Onlar bundan əvvəl cah-calal içində idilər,

إِنَّهُمۡ كَانُواْ قَبۡلَ ذَٰلِكَ مُتۡرَفِينَ ٤٥

**46.** böyük günah işlətməkdə israr edirdilər

وَكَانُواْ يُصِرُّونَ عَلَى ٱلۡحِنثِ ٱلۡعَظِيمِ ٤٦

**47.** və deyirdilər: "Məgər biz ölüb torpaq və sür-sümük olduqdan sonra yenidənmi dirildiləcəyik?

وَكَانُواْ يَقُولُونَ أَئِذَا مِتۡنَا وَكُنَّا تُرَابٗا وَعِظَٰمًا أَءِنَّا لَمَبۡعُوثُونَ ٤٧

**48.** Yaxud bizim əcdadlarımız *dirildiləcəklərmi*?"

أَوَءَابَآؤُنَا ٱلْأَوَّلُونَ ﴿٤٨﴾

**49.** De: "Şübhəsiz ki, əvvəlkilər də, sonrakılar da,

قُلْ إِنَّ ٱلْأَوَّلِينَ وَٱلْـَٔاخِرِينَ ﴿٤٩﴾

**50.** bəlli bir günün müəyyən vaxtında mütləq toplanılacaqlar.

لَمَجْمُوعُونَ إِلَىٰ مِيقَـٰتِ يَوْمٍ مَّعْلُومٍ ﴿٥٠﴾

**51.** Sonra, siz ey *doğru yoldan* azanlar, *haqqı* yalan sayanlar!

ثُمَّ إِنَّكُمْ أَيُّهَا ٱلضَّآلُّونَ ٱلْمُكَذِّبُونَ ﴿٥١﴾

**52.** Siz mütləq zəqqum ağacından yeyəcəksiniz,

لَـَٔاكِلُونَ مِن شَجَرٍ مِّن زَقُّومٍ ﴿٥٢﴾

**53.** qarınlarınızı onunla dolduracaqsınız,

فَمَالِـُٔونَ مِنْهَا ٱلْبُطُونَ ﴿٥٣﴾

**54.** üstündən də qaynar su içəcəksiniz.

فَشَـٰرِبُونَ عَلَيْهِ مِنَ ٱلْحَمِيمِ ﴿٥٤﴾

**55.** *Siz onu* susamış xəstə dəvələr kimi içəcəksiniz".

فَشَـٰرِبُونَ شُرْبَ ٱلْهِيمِ ﴿٥٥﴾

**56.** Bu onların Haqq-hesab günündəki ziyafətidir.

هَـٰذَا نُزُلُهُمْ يَوْمَ ٱلدِّينِ ﴿٥٦﴾

**57.** Sizi Biz yaratdıq. Bəs nə üçün *dirildiləcəyinizi* təsdiq etmirsiniz?

نَحْنُ خَلَقْنَـٰكُمْ فَلَوْلَا تُصَدِّقُونَ ﴿٥٧﴾

**58.** Axıtdığınız nütfəni gördünüzmü?

أَفَرَءَيْتُم مَّا تُمْنُونَ ﴿٥٨﴾

**59.** Onu siz yaradırsınız, yoxsa Biz?

ءَأَنتُمْ تَخْلُقُونَهُۥٓ أَمْ نَحْنُ ٱلْخَـٰلِقُونَ ﴿٥٩﴾

**60.** Sizin aranızda ölümü Biz müəyyən etdik və heç nə Bizim qarşımızı ala bilməz.

نَحْنُ قَدَّرْنَا بَيْنَكُمُ ٱلْمَوْتَ وَمَا نَحْنُ بِمَسْبُوقِينَ ﴿٦٠﴾

**61.** Sizi bənzərləriniz ilə əvəz etməyə və sizi özünüz bilmədiyiniz başqa bir şəkildə yaratmağa *Bizə mane olan tapılmaz.*

عَلَىٰٓ أَن نُّبَدِّلَ أَمْثَـٰلَكُمْ وَنُنشِئَكُمْ فِى مَا لَا
تَعْلَمُونَ ﴿٦١﴾

**62.** Siz ilk yaradılışı bilirsiniz. Bəs nə üçün *dirildiləcəyiniz barədə* düşünmürsünüz?

وَلَقَدۡ عَلِمۡتُمُ ٱلنَّشۡأَةَ ٱلۡأُولَىٰ فَلَوۡلَا تَذَكَّرُونَ ٦٢

**63.** Əkdiyinizi gördünüzmü?

أَفَرَءَيۡتُم مَّا تَحۡرُثُونَ ٦٣

**64.** Onu siz bitirirsiniz, yoxsa Biz?

ءَأَنتُمۡ تَزۡرَعُونَهُۥٓ أَمۡ نَحۡنُ ٱلزَّٰرِعُونَ ٦٤

**65.** Əgər Biz istəsəydik, onu bir saman çöpünə döndərər, siz də heyrətə gələrdiniz,

لَوۡ نَشَآءُ لَجَعَلۡنَٰهُ حُطَٰمٗا فَظَلۡتُمۡ
تَفَكَّهُونَ ٦٥

**66.** *və deyərdiniz*: "Biz ziyana uğradıq.

إِنَّا لَمُغۡرَمُونَ ٦٦

**67.** Daha doğrusu *nemətlərdən* məhrum olduq!"

بَلۡ نَحۡنُ مَحۡرُومُونَ ٦٧

**68.** İçdiyiniz suyu gördünüzmü?

أَفَرَءَيۡتُمُ ٱلۡمَآءَ ٱلَّذِي تَشۡرَبُونَ ٦٨

**69.** Onu buluddan siz endirirsiniz, yoxsa Biz?

ءَأَنتُمۡ أَنزَلۡتُمُوهُ مِنَ ٱلۡمُزۡنِ أَمۡ نَحۡنُ ٱلۡمُنزِلُونَ ٦٩

**70.** Əgər istəsəydik, onu acı edərdik. Bəs nə üçün şükür etmirsiniz?

لَوۡ نَشَآءُ جَعَلۡنَٰهُ أُجَاجٗا فَلَوۡلَا تَشۡكُرُونَ ٧٠

**71.** Yandırdığınız odu gördünüzmü?

أَفَرَءَيۡتُمُ ٱلنَّارَ ٱلَّتِي تُورُونَ ٧١

**72.** Onun ağacını siz yaradırsınız, yoxsa Biz?

ءَأَنتُمۡ أَنشَأۡتُمۡ شَجَرَتَهَآ أَمۡ نَحۡنُ ٱلۡمُنشِـُٔونَ ٧٢

**73.** Biz onu *Cəhənnəmi* yada salmaq və müsafirlərin istifadəsi üçün yaratdıq.

نَحۡنُ جَعَلۡنَٰهَا تَذۡكِرَةٗ وَمَتَٰعٗا لِّلۡمُقۡوِينَ ٧٣

**74.** Elə isə Ulu Rəbbinin adına təriflər de!

فَسَبِّحۡ بِٱسۡمِ رَبِّكَ ٱلۡعَظِيمِ ٧٤

**75.** Ulduzların batdığı yerlərə and olsun!

۞ فَلَآ أُقۡسِمُ بِمَوَٰقِعِ ٱلنُّجُومِ ٧٥

**76.** Kaş bunun, doğrudan da, böyük bir and olduğunu biləydiniz.

وَإِنَّهُۥ لَقَسَمٞ لَّوۡ تَعۡلَمُونَ عَظِيمٌ ٧٦

| | |
|---|---|
| **77.** Həqiqətən, bu, ehtirama layiq Qurandır, | إِنَّهُۥ لَقُرْءَانٌ كَرِيمٌ ٧٧ |
| **78.** qorunub saxlanılan Yazıdadır (Lövhi-məhfuzdadır). | فِي كِتَٰبٍ مَّكْنُونٍ ٧٨ |
| **79.** Ona yalnız pak olanlar toxunur. | لَّا يَمَسُّهُۥٓ إِلَّا ٱلْمُطَهَّرُونَ ٧٩ |
| **80.** O, aləmlərin Rəbbi tərəfindən nazil edilmişdir. | تَنزِيلٌ مِّن رَّبِّ ٱلْعَٰلَمِينَ ٨٠ |
| **81.** Siz bu kəlamı yalan sayırsınız? | أَفَبِهَٰذَا ٱلْحَدِيثِ أَنتُم مُّدْهِنُونَ ٨١ |
| **82.** Sizə verilən ruziyə *şükür etməyi*, onu yalan saymaqla yerinə yetirirsiniz? | وَتَجْعَلُونَ رِزْقَكُمْ أَنَّكُمْ تُكَذِّبُونَ ٨٢ |
| **83.** *Can* boğaza yetişdiyi zaman – | فَلَوْلَآ إِذَا بَلَغَتِ ٱلْحُلْقُومَ ٨٣ |
| **84.** həmin an siz *can verən adama* baxırsınız. | وَأَنتُمْ حِينَئِذٍ تَنظُرُونَ ٨٤ |
| **85.** Biz ona sizdən daha yaxın oluruq, siz isə *bunu* görmürsünüz. | وَنَحْنُ أَقْرَبُ إِلَيْهِ مِنكُمْ وَلَٰكِن لَّا تُبْصِرُونَ ٨٥ |
| **86.** Madam ki siz *iddianıza görə* haqq-hesab olunmayacaqsınız | فَلَوْلَآ إِن كُنتُمْ غَيْرَ مَدِينِينَ ٨٦ |
| **87.** və doğru danışanlarsınız, onda, o canı geri qaytarın? | تَرْجِعُونَهَآ إِن كُنتُمْ صَٰدِقِينَ ٨٧ |
| **88.** Amma əgər o, *Allaha* yaxın olanlardandırsa, | فَأَمَّآ إِن كَانَ مِنَ ٱلْمُقَرَّبِينَ ٨٨ |
| **89.** onda rəhmətə, gözəl ruziyə və Nəim bağına yetişər. | فَرَوْحٌ وَرَيْحَانٌ وَجَنَّتُ نَعِيمٍ ٨٩ |
| **90.** Əgər o, sağ tərəf sahiblərindəndirsə, | وَأَمَّآ إِن كَانَ مِنْ أَصْحَٰبِ ٱلْيَمِينِ ٩٠ |
| **91.** *ona*: "Sağ tərəf sahiblərindən sənə salam olsun!"– *deyiləcəkdir*. | فَسَلَٰمٌ لَّكَ مِنْ أَصْحَٰبِ ٱلْيَمِينِ ٩١ |
| **92.** Yox əgər o, *haqqı* yalan sayanlardan və *doğru yoldan* azanlardandırsa, | وَأَمَّآ إِن كَانَ مِنَ ٱلْمُكَذِّبِينَ ٱلضَّآلِّينَ ٩٢ |

**93.** *onun* ziyafəti qaynar su olacaq,

فَنُزُلٌ مِّنْ حَمِيمٍ ﴿٩٣﴾

**94.** özü də Cəhənnəmdə yanacaqdır.

وَتَصْلِيَةُ جَحِيمٍ ﴿٩٤﴾

**95.** Həqiqətən, bu, şübhə doğurmayan bir həqiqətdir.

إِنَّ هَٰذَا لَهُوَ حَقُّ الْيَقِينِ ﴿٩٥﴾

**96.** Elə isə Ulu Rəbbinin adına təriflər de!

فَسَبِّحْ بِاسْمِ رَبِّكَ الْعَظِيمِ ﴿٩٦﴾



## əl-Hədid («Dəmir») surəsi

## سُورَةُ الحَدِيد

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ

1. Göylərdə və yerdə olanların hamısı Allahın şəninə təriflər deyir. O, Qüdrətlidir, Müdrikdir.

سَبَّحَ لِلَّهِ مَا فِي السَّمَاوَاتِ وَالْأَرْضِ ۖ وَهُوَ الْعَزِيزُ
الْحَكِيمُ ﴿١﴾

2. Göylərin və yerin hökmranlığı Ona məxsusdur. O həm dirildir, həm də öldürür. O, hər şeyə qadirdir.

لَهُ مُلْكُ السَّمَاوَاتِ وَالْأَرْضِ ۖ يُحْيِي وَيُمِيتُ ۖ وَهُوَ
عَلَىٰ كُلِّ شَيْءٍ قَدِيرٌ ﴿٢﴾

3. Əvvəl də, Axır da, Zahir də, Batin də Odur. O, hər şeyi bilir.

هُوَ الْأَوَّلُ وَالْآخِرُ وَالظَّاهِرُ وَالْبَاطِنُ ۖ وَهُوَ
بِكُلِّ شَيْءٍ عَلِيمٌ ﴿٣﴾

4. Göyləri və yeri altı gündə yaradan, sonra da Ərşə ucalan Odur. O, yerə girəni də, oradan çıxanı da, göydən enəni də, oraya qalxanı da bilir. Siz harada olsanız belə, O sizinlədir. Allah sizin nə etdiklərinizi görür.

هُوَ الَّذِي خَلَقَ السَّمَاوَاتِ وَالْأَرْضَ فِي سِتَّةِ
أَيَّامٍ ثُمَّ اسْتَوَىٰ عَلَى الْعَرْشِ ۚ يَعْلَمُ مَا يَلِجُ
فِي الْأَرْضِ وَمَا يَخْرُجُ مِنْهَا وَمَا يَنْزِلُ مِنَ السَّمَاءِ
وَمَا يَعْرُجُ فِيهَا ۖ وَهُوَ مَعَكُمْ أَيْنَ مَا كُنْتُمْ ۚ وَاللَّهُ بِمَا
تَعْمَلُونَ بَصِيرٌ ﴿٤﴾

5. Göylərin və yerin hökmranlığı Ona məxsusdur. *Bütün* işlər ancaq Allaha qaytarılacaqdır.

لَهُ مُلْكُ السَّمَاوَاتِ وَالْأَرْضِ ۚ وَإِلَى اللَّهِ تُرْجَعُ
الْأُمُورُ ﴿٥﴾

6. O, gecəni gündüzə qatır, gündüzü də gecəyə qatır. O, kökslərdə olanları bilir.

يُولِجُ اللَّيْلَ فِي النَّهَارِ وَيُولِجُ النَّهَارَ فِي اللَّيْلِ ۚ وَهُوَ
عَلِيمٌ بِذَاتِ الصُّدُورِ ﴿٦﴾

7. Allaha və Onun Elçisinə iman gətirin! Sizin ixtiyarınıza verdiyi maldan *xeyirxah işlərə* sərf edin! Sizdən iman gətirib *mallarından* xərcləyənləri böyük bir mükafat gözləyir.

آمِنُوا بِاللَّهِ وَرَسُولِهِ وَأَنْفِقُوا مِمَّا جَعَلَكُمْ
مُسْتَخْلَفِينَ فِيهِ ۖ فَالَّذِينَ آمَنُوا مِنْكُمْ وَأَنْفَقُوا
لَهُمْ أَجْرٌ كَبِيرٌ ﴿٧﴾

8. Peyğəmbər sizi Rəbbinizə iman gətirməyə çağırdığı halda, sizə nə olub ki, Allaha iman gətirmirsiniz? Əgər siz möminsinizsə, *bilin ki,* artıq O, sizdən əhd almışdır.

وَمَا لَكُمْ لَا تُؤْمِنُونَ بِاللَّهِ وَالرَّسُولُ يَدْعُوكُمْ
لِتُؤْمِنُوا بِرَبِّكُمْ وَقَدْ أَخَذَ مِيثَاقَكُمْ إِن
كُنتُم مُّؤْمِنِينَ ٨

9. Sizi zülmətlərdən nura çıxartmaq üçün Öz quluna açıq-aydın ayələri nazil edən Odur. Həqiqətən, Allah sizə Şəfqətlidir, Rəhmlidir.

هُوَ الَّذِي يُنَزِّلُ عَلَىٰ عَبْدِهِ آيَاتٍ بَيِّنَاتٍ لِّيُخْرِجَكُم
مِّنَ الظُّلُمَاتِ إِلَى النُّورِ وَإِنَّ اللَّهَ بِكُمْ لَرَءُوفٌ
رَّحِيمٌ ٩

10. Sizə nə olub ki, *malınızdan* Allah yolunda xərcləmirsiniz? Halbuki göylərin və yerin mirası Allahındır. Sizlərdən *Məkkənin* fəthindən əvvəl xərcləyib döyüşənlər *başqaları ilə* eyni deyillər. Onların dərəcəsi *mallarını fəthdən* sonra xərcləyib döyüşənlərdən daha üstündür. Amma Allah onların hamısına ən gözəl olanı vəd etmişdir. Allah sizin nə etdiklərinizdən xəbərdardır.

وَمَا لَكُمْ أَلَّا تُنفِقُوا فِي سَبِيلِ اللَّهِ وَلِلَّهِ مِيرَاثُ
السَّمَاوَاتِ وَالْأَرْضِ لَا يَسْتَوِي مِنكُم مَّنْ أَنفَقَ
مِن قَبْلِ الْفَتْحِ وَقَاتَلَ أُولَٰئِكَ أَعْظَمُ دَرَجَةً
مِّنَ الَّذِينَ أَنفَقُوا مِن بَعْدُ وَقَاتَلُوا وَكُلًّا وَعَدَ
اللَّهُ الْحُسْنَىٰ وَاللَّهُ بِمَا تَعْمَلُونَ خَبِيرٌ ١٠

11. Kimdir o şəxs ki, Allaha gözəl bir borc versin (Allah yolunda malını yaxşı işlərə sərf etsin), O da onun üçün bunu qat-qat artırsın? Onun üçün çox dəyərli bir mükafat da vardır.

مَّن ذَا الَّذِي يُقْرِضُ اللَّهَ قَرْضًا حَسَنًا
فَيُضَاعِفَهُ لَهُ وَلَهُ أَجْرٌ كَرِيمٌ ١١

12. O gün sən mömin kişilərin və mömin qadınların nurunun onların önlərindən və sağ tərəflərindən yayıldığını görəcəksən. *Onlara:* "Bu gün sizin müjdəniz *ağacları* altından çaylar axan Cənnət bağlarıdır. Siz orada əbədi qalacaqsınız!"– *deyiləcək.* Bu, böyük uğurdur.

يَوْمَ تَرَى الْمُؤْمِنِينَ وَالْمُؤْمِنَاتِ يَسْعَىٰ
نُورُهُم بَيْنَ أَيْدِيهِمْ وَبِأَيْمَانِهِم بُشْرَاكُمُ
الْيَوْمَ جَنَّاتٌ تَجْرِي مِن تَحْتِهَا الْأَنْهَارُ خَالِدِينَ
فِيهَا ذَٰلِكَ هُوَ الْفَوْزُ الْعَظِيمُ ١٢

**13.** O gün münafiq kişilər və münafiq qadınlar iman gətirənlərə: "*Bir az* gözləyin ki, biz də sizin işığınızdan alaq"– deyəcəklər. *Onlara* deyiləcəkdir: "Geriyə qayıdıb işıq axtarın!" Onların arasına içəri tərəfində mərhəmət, çöl tərəfində əzab olan qapılı bir sədd çəkiləcəkdir.

يَوْمَ يَقُولُ الْمُنَافِقُونَ وَالْمُنَافِقَاتُ لِلَّذِينَ آمَنُوا
انظُرُونَا نَقْتَبِسْ مِن نُّورِكُمْ قِيلَ ارْجِعُوا وَرَاءَكُمْ
فَالْتَمِسُوا نُورًا فَضُرِبَ بَيْنَهُم بِسُورٍ لَّهُ بَابٌ
بَاطِنُهُ فِيهِ الرَّحْمَةُ وَظَاهِرُهُ مِن قِبَلِهِ الْعَذَابُ ١٣

**14.** *Münafiqlər* onları haraylayıb deyəcəklər: "Məgər biz sizinlə birlikdə deyildikmi?" *Möminlər* deyəcəklər: "Bəli, lakin siz öz-özünüzü aldadırdınız, *möminlərə bəla üz verməsini* gözləyirdiniz, *haqqa* şübhə edirdiniz və Allahın əmri gələnədək xülyalar sizi yoldan çıxartdı. Tovlayan *şeytan* Allah barəsində sizi yaman aldatdı.

يُنَادُونَهُمْ أَلَمْ نَكُن مَّعَكُمْ قَالُوا بَلَىٰ وَلَٰكِنَّكُمْ فَتَنتُمْ
أَنفُسَكُمْ وَتَرَبَّصْتُمْ وَارْتَبْتُمْ وَغَرَّتْكُمُ الْأَمَانِيُّ
حَتَّىٰ جَاءَ أَمْرُ اللَّهِ وَغَرَّكُم بِاللَّهِ الْغَرُورُ ١٤

**15.** Bu gün nə sizdən, nə də kafirlərdən heç bir fidyə qəbul olunmaz. Sığınacağınız yer də oddur. Sizə layiq olan elə odur. Ora nə pis dönüş yeridir!"

فَالْيَوْمَ لَا يُؤْخَذُ مِنكُمْ فِدْيَةٌ وَلَا مِنَ الَّذِينَ
كَفَرُوا مَأْوَاكُمُ النَّارُ هِيَ مَوْلَاكُمْ
وَبِئْسَ الْمَصِيرُ ١٥

**16.** Möminlərin qəlbinin Allahın zikri və haqdan nazil olan *ayələr* üçün yumşalması, daha öncə özlərinə Kitab verilmiş, uzun bir müddət keçdikdən sonra isə qəlbləri sərtləşmiş, çoxusu da fasiq olmuş kimsələr kimi olmaması vaxtı gəlib çatmadımı?

۞ أَلَمْ يَأْنِ لِلَّذِينَ آمَنُوا أَن تَخْشَعَ قُلُوبُهُمْ
لِذِكْرِ اللَّهِ وَمَا نَزَلَ مِنَ الْحَقِّ وَلَا يَكُونُوا
كَالَّذِينَ أُوتُوا الْكِتَابَ مِن قَبْلُ فَطَالَ عَلَيْهِمُ الْأَمَدُ
فَقَسَتْ قُلُوبُهُمْ وَكَثِيرٌ مِّنْهُمْ فَاسِقُونَ ١٦

**17.** Bilin ki, Allah torpağı onun ölümündən sonra diriltdir. Biz ayələri sizə izah etdik ki, bəlkə anlayasınız.

اعْلَمُوا أَنَّ اللَّهَ يُحْيِي الْأَرْضَ بَعْدَ مَوْتِهَا قَدْ بَيَّنَّا
لَكُمُ الْآيَاتِ لَعَلَّكُمْ تَعْقِلُونَ ١٧

## ət-Talaq («Boşanma») surəsi

سُورَةُ الطَّلَاقِ

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

1. Ey Peyğəmbər! Qadınları boşadığınız zaman onları gözləmə müddətlərində boşayın, gözləmə müddətini hesablayın və Rəbbiniz olan Allahdan qorxun. Onları, açıq-aşkar zinakarlıq etmələri istisna olmaqla, öz evlərinizdən qovub çıxartmayın və onlar özləri də çıxmasınlar. Bu, Allahın hüdudlarıdır. Allahın qoyduğu hüdudları aşan kimsə özünə zülm etmiş olar. Sən bilmirsən, ola bilsin ki, Allah bundan sonra *başqa* bir hökm versin.

يَٰٓأَيُّهَا ٱلنَّبِيُّ إِذَا طَلَّقۡتُمُ ٱلنِّسَآءَ فَطَلِّقُوهُنَّ
لِعِدَّتِهِنَّ وَأَحۡصُواْ ٱلۡعِدَّةَۖ وَٱتَّقُواْ ٱللَّهَ رَبَّكُمۡۖ لَا
تُخۡرِجُوهُنَّ مِنۢ بُيُوتِهِنَّ وَلَا يَخۡرُجۡنَ إِلَّآ أَن
يَأۡتِينَ بِفَٰحِشَةٖ مُّبَيِّنَةٖۚ وَتِلۡكَ حُدُودُ ٱللَّهِۚ
وَمَن يَتَعَدَّ حُدُودَ ٱللَّهِ فَقَدۡ ظَلَمَ نَفۡسَهُۥۚ لَا تَدۡرِي
لَعَلَّ ٱللَّهَ يُحۡدِثُ بَعۡدَ ذَٰلِكَ أَمۡرٗا ١

2. *Gözləmə* vaxtı bitdikdə onları *şəriətə* müvafiq olaraq saxlayın və yaxud onlardan müvafiq qaydada ayrılın. Aranızdan iki ədalətli şahid çağırın və Allah üçün şahidlik edin. Allaha və Axirət gününə iman gətirənlərə verilən nəsihət budur. Allahdan qorxana, *Allah* çıxış yolu göstərər

فَإِذَا بَلَغۡنَ أَجَلَهُنَّ فَأَمۡسِكُوهُنَّ بِمَعۡرُوفٍ أَوۡ
فَارِقُوهُنَّ بِمَعۡرُوفٖ وَأَشۡهِدُواْ ذَوَيۡ عَدۡلٖ مِّنكُمۡ
وَأَقِيمُواْ ٱلشَّهَٰدَةَ لِلَّهِۚ ذَٰلِكُمۡ يُوعَظُ بِهِۦ مَن كَانَ
يُؤۡمِنُ بِٱللَّهِ وَٱلۡيَوۡمِ ٱلۡأٓخِرِۚ وَمَن يَتَّقِ ٱللَّهَ
يَجۡعَل لَّهُۥ مَخۡرَجٗا ٢

3. və ona təsəvvürünə gətirmədiyi bir yerdən ruzi bəxş edər. Kim Allaha təvəkkül etsə, *Allah* ona kifayət edər. Allah Öz əmrini yerinə yetirəndir. Allah hər şey üçün bir ölçü qoymuşdur.

وَيَرۡزُقۡهُ مِنۡ حَيۡثُ لَا يَحۡتَسِبُۚ وَمَن يَتَوَكَّلۡ عَلَى
ٱللَّهِ فَهُوَ حَسۡبُهُۥٓۚ إِنَّ ٱللَّهَ بَٰلِغُ أَمۡرِهِۦۚ قَدۡ
جَعَلَ ٱللَّهُ لِكُلِّ شَيۡءٖ قَدۡرٗا ٣

4. Heyzdən kəsilmiş *yaşlı* qadınlarınızın *iddəsi barəsində* şübhəniz varsa, onların, eləcə də hələ heyz görməmiş

وَٱلَّٰٓـِٔي يَئِسۡنَ مِنَ ٱلۡمَحِيضِ مِن
نِّسَآئِكُمۡ إِنِ ٱرۡتَبۡتُمۡ فَعِدَّتُهُنَّ ثَلَٰثَةُ

qızların gözləmə müddəti üç aydır. Hamilə qadınların gözləmə müddəti isə onlar hamiləlikdən azad olana qədərdir. Kim Allahdan qorxarsa, *Allah* onun işini asanlaşdırar.

أَشْهُرٍ وَاللَّائِي لَمْ يَحِضْنَ ۚ وَأُولَاتُ الْأَحْمَالِ
أَجَلُهُنَّ أَنْ يَضَعْنَ حَمْلَهُنَّ ۚ وَمَنْ يَتَّقِ
اللَّهَ يَجْعَلْ لَهُ مِنْ أَمْرِهِ يُسْرًا ﴿٤﴾

5. Bu, Allahın sizə nazil etdiyi əmridir. Kim Allahdan qorxarsa, *Allah* onun *günahlarından* keçər və onun mükafatını artırar.

ذَٰلِكَ أَمْرُ اللَّهِ أَنْزَلَهُ إِلَيْكُمْ ۚ وَمَنْ يَتَّقِ اللَّهَ
يُكَفِّرْ عَنْهُ سَيِّئَاتِهِ وَيُعْظِمْ لَهُ أَجْرًا ﴿٥﴾

6. Onlara *gözləmə müddətləri başa çatanadək* imkanınız daxilində öz yaşadığınız yerdə qalmağa yer verin. Sıxışdırmaq məqsədilə onlara zərər yetirməyin. Əgər onlar hamilədirlərsə, hamiləlikdən azad olana qədər onlara *malınızdan* xərcləyin. Sizin üçün uşaq əmizdirirlərsə, onların haqqını verin. Öz aranızda xoşluqla razılığa gəlin. Bir-birinizi çətinliyə salsanız, uşağı əmizdirməyi başqa bir qadına həvalə edin.

أَسْكِنُوهُنَّ مِنْ حَيْثُ سَكَنْتُمْ مِنْ وُجْدِكُمْ وَلَا
تُضَارُّوهُنَّ لِتُضَيِّقُوا عَلَيْهِنَّ ۚ وَإِنْ كُنَّ أُولَاتِ حَمْلٍ
فَأَنْفِقُوا عَلَيْهِنَّ حَتَّىٰ يَضَعْنَ حَمْلَهُنَّ ۚ فَإِنْ أَرْضَعْنَ
لَكُمْ فَآتُوهُنَّ أُجُورَهُنَّ ۖ وَأْتَمِرُوا بَيْنَكُمْ
بِمَعْرُوفٍ ۖ وَإِنْ تَعَاسَرْتُمْ فَسَتُرْضِعُ لَهُ أُخْرَىٰ ﴿٦﴾

7. Var-dövlət sahibi öz varına görə xərcləsin. İmkanı az olan isə Allahın ona verdiyindən xərcləsin. Allah heç kəsin üzərinə Özünün ona verdiyi nemətdən artıq yük qoymaz. Allah hər bir çətinlikdən sonra asanlıq verir.

لِيُنْفِقْ ذُو سَعَةٍ مِنْ سَعَتِهِ ۖ وَمَنْ قُدِرَ عَلَيْهِ رِزْقُهُ
فَلْيُنْفِقْ مِمَّا آتَاهُ اللَّهُ ۚ لَا يُكَلِّفُ اللَّهُ نَفْسًا إِلَّا
مَا آتَاهَا ۚ سَيَجْعَلُ اللَّهُ بَعْدَ عُسْرٍ يُسْرًا ﴿٧﴾

8. Neçə-neçə məmləkətlər öz Rəbbinin və Onun elçilərinin əmrinə asi oldu. Biz də onlarla sərt haqq-hesab çəkib onları dəhşətli əzablara düçar etdik.

وَكَأَيِّنْ مِنْ قَرْيَةٍ عَتَتْ عَنْ أَمْرِ رَبِّهَا وَرُسُلِهِ
فَحَاسَبْنَاهَا حِسَابًا شَدِيدًا وَعَذَّبْنَاهَا عَذَابًا نُكْرًا ﴿٨﴾

9. Onlar əməllərinin cəzasını daddılar və aqibətləri ziyana uğramaq oldu.

فَذَاقَتْ وَبَالَ أَمْرِهَا وَكَانَ عَٰقِبَةُ أَمْرِهَا خُسْرًا ٩

10. Allah onlar üçün şiddətli əzab hazırladı. Ey iman gətirmiş ağıl sahibləri, Allahdan qorxun! Allah sizə Zikr nazil etmiş

أَعَدَّ ٱللَّهُ لَهُمْ عَذَابًا شَدِيدًا ۖ فَٱتَّقُوا۟ ٱللَّهَ يَٰٓأُو۟لِى
ٱلْأَلْبَٰبِ ٱلَّذِينَ ءَامَنُوا۟ ۚ قَدْ أَنزَلَ ٱللَّهُ إِلَيْكُمْ ذِكْرًا ١٠

11. və iman gətirib yaxşı işlər görənləri zülmətlərdən nura çıxartmaq üçün Allahın aydın ayələrini sizə oxuyan bir elçi *göndərmişdir*. Hər kəs Allaha iman gətirib saleh əməl işləsə, *Allah* onu içində əbədi qalacağı, *ağacları* altından çaylar axan Cənnət bağlarına daxil edər. Allah ona gözəl ruzi nəsib etmişdir.

رَّسُولًا يَتْلُوا۟ عَلَيْكُمْ ءَايَٰتِ ٱللَّهِ مُبَيِّنَٰتٍ لِّيُخْرِجَ
ٱلَّذِينَ ءَامَنُوا۟ وَعَمِلُوا۟ ٱلصَّٰلِحَٰتِ مِنَ ٱلظُّلُمَٰتِ
إِلَى ٱلنُّورِ ۚ وَمَن يُؤْمِنۢ بِٱللَّهِ وَيَعْمَلْ صَٰلِحًا يُدْخِلْهُ
جَنَّٰتٍ تَجْرِى مِن تَحْتِهَا ٱلْأَنْهَٰرُ خَٰلِدِينَ فِيهَآ أَبَدًا ۖ
قَدْ أَحْسَنَ ٱللَّهُ لَهُۥ رِزْقًا ١١

12. Yeddi göyü və yerdən də bir o qədərini yaradan Allahdır. Vəhy onların arasında ona görə nazil olur ki, Allahın hər şeyə qadir olduğunu və Allahın hər şeyi elmi ilə əhatə etdiyini biləsiniz.

ٱللَّهُ ٱلَّذِى خَلَقَ سَبْعَ سَمَٰوَٰتٍ وَمِنَ ٱلْأَرْضِ
مِثْلَهُنَّ يَتَنَزَّلُ ٱلْأَمْرُ بَيْنَهُنَّ لِتَعْلَمُوٓا۟ أَنَّ ٱللَّهَ
عَلَىٰ كُلِّ شَىْءٍ قَدِيرٌ وَأَنَّ ٱللَّهَ قَدْ أَحَاطَ
بِكُلِّ شَىْءٍ عِلْمًۢا ١٢



# ət-Təhrim («Qadağan») surəsi

سُورَةُ التَّحْرِيمِ

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

1. Ey Peyğəmbər! Zövcələrini razı salmağa çalışaraq Allahın sənə halal etdiyi şeyi nə üçün özünə qadağan edirsən? Allah Bağışlayandır, Rəhmlidir.

يَٰٓأَيُّهَا ٱلنَّبِيُّ لِمَ تُحَرِّمُ مَآ أَحَلَّ ٱللَّهُ لَكَ تَبْتَغِي مَرْضَاتَ أَزْوَٰجِكَ وَٱللَّهُ غَفُورٞ رَّحِيمٞ ١

2. Allah, andlarınızdan *kəffarə verməklə* azad olmağı sizdən ötrü qanuniləşdirmişdir. Allah sizin himayədarınızdır. O, Biləndir, Müdrikdir.

قَدْ فَرَضَ ٱللَّهُ لَكُمْ تَحِلَّةَ أَيْمَٰنِكُمْ وَٱللَّهُ مَوْلَىٰكُمْ وَهُوَ ٱلْعَلِيمُ ٱلْحَكِيمُ ٢

3. Bir zaman Peyğəmbər öz zövcələrindən birinə sirr verdi. O da bunu *onun digər zövcəsinə* xəbər verdikdə və Allah da bunu *Peyğəmbərə* aşkar etdikdə o, bunun bir qismini *sirr verdiyi* zövcəsinə bildirdi, digər qismindən isə vaz keçdi. *Peyğəmbər* bunu ona bildirdikdə *zövcəsi* dedi: "Bunu sənə kim xəbər verdi?" O dedi: "Bunu mənə *hər şeyi* Bilən, Xəbərdar olan *Allah* xəbər verdi!"

وَإِذْ أَسَرَّ ٱلنَّبِيُّ إِلَىٰ بَعْضِ أَزْوَٰجِهِۦ حَدِيثٗا فَلَمَّا نَبَّأَتْ بِهِۦ وَأَظْهَرَهُ ٱللَّهُ عَلَيْهِ عَرَّفَ بَعْضَهُۥ وَأَعْرَضَ عَنۢ بَعْضٖ فَلَمَّا نَبَّأَهَا بِهِۦ قَالَتْ مَنْ أَنۢبَأَكَ هَٰذَا قَالَ نَبَّأَنِيَ ٱلْعَلِيمُ ٱلْخَبِيرُ ٣

4. Əgər ikiniz də Allaha tövbə etsəniz, *yaxşı olar*. Çünki hər ikinizin qəlbi *günaha* meyl etmişdir. Əgər *Peyğəmbərə* qarşı bir-birinizə dəstək versəniz, *bilin ki*, Allah, Cəbrail və əməlisaleh möminlər onun dostu və yardımçısıdır. Bunlardan başqa mələklər də onun yardımçılarıdır.

إِن تَتُوبَآ إِلَى ٱللَّهِ فَقَدْ صَغَتْ قُلُوبُكُمَا وَإِن تَظَٰهَرَا عَلَيْهِ فَإِنَّ ٱللَّهَ هُوَ مَوْلَىٰهُ وَجِبْرِيلُ وَصَٰلِحُ ٱلْمُؤْمِنِينَ وَٱلْمَلَٰٓئِكَةُ بَعْدَ ذَٰلِكَ ظَهِيرٌ ٤

5. Əgər o sizi boşasa, Rəbbi sizin əvəzinizə ona sizdən daha yaxşı zövcələr – müsəlman, mömin, itaətkar, tövbə edən, ibadət edən, oruc tutan dul qadınlar və bakirə qızlar verə bilər.

عَسَىٰ رَبُّهُۥٓ إِن طَلَّقَكُنَّ أَن يُبْدِلَهُۥٓ أَزْوَٰجًا خَيْرًا
مِّنكُنَّ مُسْلِمَٰتٍ مُّؤْمِنَٰتٍ قَٰنِتَٰتٍ تَٰٓئِبَٰتٍ عَٰبِدَٰتٍ
سَٰٓئِحَٰتٍ ثَيِّبَٰتٍ وَأَبْكَارًا ٥

6. Ey iman gətirənlər! Özünüzü və ailənizi yanacağı insanlar və daşlar olan oddan qoruyun! Onun başı üstündə Allahın onlara verdiyi əmrlərə heç vaxt asi olmayan, özlərinə buyurulanları yerinə yetirən amansız və güclü mələklər vardır.

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ قُوٓا۟ أَنفُسَكُمْ وَأَهْلِيكُمْ
نَارًا وَقُودُهَا ٱلنَّاسُ وَٱلْحِجَارَةُ عَلَيْهَا
مَلَٰٓئِكَةٌ غِلَاظٌ شِدَادٌ لَّا يَعْصُونَ ٱللَّهَ
مَآ أَمَرَهُمْ وَيَفْعَلُونَ مَا يُؤْمَرُونَ ٦

7. Ey kafir olanlar! Bu gün üzr diləməyin. Siz ancaq etdiyiniz əməllərin cəzasını çəkəcəksiniz!

يَٰٓأَيُّهَا ٱلَّذِينَ كَفَرُوا۟ لَا تَعْتَذِرُوا۟ ٱلْيَوْمَ إِنَّمَا
تُجْزَوْنَ مَا كُنتُمْ تَعْمَلُونَ ٧

8. Ey iman gətirənlər! Allaha səmimi olaraq tövbə edin. Ola bilsin ki, Rəbbiniz günahlarınızdan keçsin və sizi, Allah o Peyğəmbəri və onunla birlikdə iman gətirənləri utandırmayacağı gündə, *ağacları* altından çaylar axan Cənnət bağlarına daxil etsin. Onların nuru önlərindən və sağ tərəflərindən ətrafa yayılacaqdır. Onlar deyəcəklər: "Ey Rəbbimiz! Nurumuzu bizim üçün tamamla və bizi bağışla. Həqiqətən, Sən hər şeyə qadirsən!"

يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ تُوبُوٓا۟ إِلَى ٱللَّهِ تَوْبَةً
نَّصُوحًا عَسَىٰ رَبُّكُمْ أَن يُكَفِّرَ عَنكُمْ
سَيِّـَٔاتِكُمْ وَيُدْخِلَكُمْ جَنَّٰتٍ تَجْرِى
مِن تَحْتِهَا ٱلْأَنْهَٰرُ يَوْمَ لَا يُخْزِى ٱللَّهُ ٱلنَّبِىَّ
وَٱلَّذِينَ ءَامَنُوا۟ مَعَهُۥ نُورُهُمْ يَسْعَىٰ بَيْنَ
أَيْدِيهِمْ وَبِأَيْمَٰنِهِمْ يَقُولُونَ رَبَّنَآ أَتْمِمْ لَنَا
نُورَنَا وَٱغْفِرْ لَنَآ إِنَّكَ عَلَىٰ كُلِّ شَىْءٍ
قَدِيرٌ ٨

9. Ey Peyğəmbər! Kafirlərə və münafiqlərə qarşı vuruş! Onlarla sərt davran! Onların sığınacağı yer Cəhənnəmdir. Ora necə də pis dönüş yeridir!

يَٰٓأَيُّهَا ٱلنَّبِىُّ جَٰهِدِ ٱلْكُفَّارَ وَٱلْمُنَٰفِقِينَ
وَٱغْلُظْ عَلَيْهِمْ وَمَأْوَىٰهُمْ جَهَنَّمُ وَبِئْسَ
ٱلْمَصِيرُ ٩

10. Allah kafirlərə Nuhun arvadı ilə Lutun arvadını misal çəkdi. Onlar Bizim əməlisaleh qullarımızdan iki qulun nikahı altında idilər. Onlar ərlərinə xəyanət etdilər və bunlar onları Allahdan heç cür xilas edə bilmədilər. Onlara: "Girənlərlə birgə ikiniz də oda girin!"– deyildi.

ضَرَبَ ٱللَّهُ مَثَلًا لِّلَّذِينَ كَفَرُوا۟ ٱمْرَأَتَ نُوحٍ
وَٱمْرَأَتَ لُوطٍ ۖ كَانَتَا تَحْتَ عَبْدَيْنِ مِنْ
عِبَادِنَا صَٰلِحَيْنِ فَخَانَتَاهُمَا فَلَمْ يُغْنِيَا
عَنْهُمَا مِنَ ٱللَّهِ شَيْـًٔا وَقِيلَ ٱدْخُلَا ٱلنَّارَ
مَعَ ٱلدَّٰخِلِينَ ﴿١٠﴾

11. Allah iman gətirənlərə isə Fironun zövcəsini misal çəkdi. O zaman o: "Ey Rəbbim! Mənə Öz yanında – Cənnətdə bir ev tik. Məni Firondan və onun əməlindən xilas et. Məni zalım adamlardan qurtar!"– demişdi.

وَضَرَبَ ٱللَّهُ مَثَلًا لِّلَّذِينَ ءَامَنُوا۟
ٱمْرَأَتَ فِرْعَوْنَ إِذْ قَالَتْ رَبِّ ٱبْنِ لِى
عِندَكَ بَيْتًا فِى ٱلْجَنَّةِ وَنَجِّنِى مِن فِرْعَوْنَ
وَعَمَلِهِۦ وَنَجِّنِى مِنَ ٱلْقَوْمِ ٱلظَّٰلِمِينَ ﴿١١﴾

12. Həmçinin ismətini qoruyan İmran qızı Məryəmi də *misal çəkdi*. Biz ona *paltarının yaxasından* Öz ruhumuzdan (Cəbrail vasitəsi ilə ) üfürdük. O, Rəbbinin Sözlərini və Onun Kitablarını təsdiq etdi və itaət edənlərdən oldu.

وَمَرْيَمَ ٱبْنَتَ عِمْرَٰنَ ٱلَّتِىٓ أَحْصَنَتْ
فَرْجَهَا فَنَفَخْنَا فِيهِ مِن رُّوحِنَا وَصَدَّقَتْ
بِكَلِمَٰتِ رَبِّهَا وَكُتُبِهِۦ وَكَانَتْ مِنَ
ٱلْقَٰنِتِينَ ﴿١٢﴾



## əl-Mulk
## («Mülk») surəsi

سُورَةُ المُلْكِ

*Mərhəmətli və Rəhmli*
*Allahın adı ilə!*

1. Mülk Əlində Olan *Allah* ən Əzəmətli, xeyri və bərəkəti bol Olandır. O hər şeyə qadirdir.
2. Əməl baxımından hansınızın daha yaxşı olduğunuzu sınamaq üçün ölümü və həyatı yaradan Odur. O, Qüdrətlidir, Bağışlayandır.
3. Yeddi göyü təbəqələr şəklində quran Odur. Sən Mərhəmətli *Allahın* yaratdığında qətiyyən bir uyuşmazlıq tapmazsan. Bir başını qaldırıb *göyə diqqət yetir*, heç onda bir çat görürsənmi?
4. Sonra göz gəzdirib təkrar bax. Göz zəlil və yorğun halda özünə tərəf dönəcəkdir.
5. Andolsun ki, Biz *sizə* yaxın olan göyü *ulduzlarla bəzədik* və onları şeytanlara atılan *alovlar* etdik. Biz onlar üçün yandırıb-yaxan od əzabı hazırlamışıq.
6. Rəbbinə qarşı çıxanlar Cəhənnəm əzabına düçar olacaqlar. Ora nə pis dönüş yeridir.
7. Onlar oraya adıldıqda onun dəhşətli uğultuyla qaynadığını eşidəcəklər.

بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ

تَبَارَكَ الَّذِي بِيَدِهِ الْمُلْكُ وَهُوَ عَلَىٰ كُلِّ شَيْءٍ
قَدِيرٌ ١

الَّذِي خَلَقَ الْمَوْتَ وَالْحَيَاةَ لِيَبْلُوَكُمْ أَيُّكُمْ أَحْسَنُ
عَمَلًا وَهُوَ الْعَزِيزُ الْغَفُورُ ٢

الَّذِي خَلَقَ سَبْعَ سَمَاوَاتٍ طِبَاقًا مَا تَرَىٰ فِي
خَلْقِ الرَّحْمَٰنِ مِنْ تَفَاوُتٍ فَارْجِعِ الْبَصَرَ هَلْ تَرَىٰ
مِنْ فُطُورٍ ٣

ثُمَّ ارْجِعِ الْبَصَرَ كَرَّتَيْنِ يَنْقَلِبْ إِلَيْكَ الْبَصَرُ خَاسِئًا
وَهُوَ حَسِيرٌ ٤

وَلَقَدْ زَيَّنَّا السَّمَاءَ الدُّنْيَا بِمَصَابِيحَ وَجَعَلْنَاهَا
رُجُومًا لِلشَّيَاطِينِ وَأَعْتَدْنَا لَهُمْ عَذَابَ السَّعِيرِ ٥

وَلِلَّذِينَ كَفَرُوا بِرَبِّهِمْ عَذَابُ جَهَنَّمَ وَبِئْسَ
الْمَصِيرُ ٦

إِذَا أُلْقُوا فِيهَا سَمِعُوا لَهَا شَهِيقًا وَهِيَ
تَفُورُ ٧

8. Cəhənnəm, qəzəbindən az qala parçalansın. Hər dəfə bir dəstə oraya atılarkən *Cəhənnəmin* gözətçiləri onlardan soruşacaqlar: "Məgər sizə xəbərdarlıq edən *bir peyğəmbər* gəlməmişdi?"

تَكَادُ تَمَيَّزُ مِنَ ٱلۡغَيۡظِۖ كُلَّمَآ أُلۡقِيَ فِيهَا فَوۡجٞ
سَأَلَهُمۡ خَزَنَتُهَآ أَلَمۡ يَأۡتِكُمۡ نَذِيرٞ ٨

9. Onlar deyəcəklər: "Əlbəttə, bizə qorxudan *bir peyğəmbər* gəlmişdi. Amma biz *onu* yalançı sayıb: "Allah heç bir şey nazil etməyib, siz də ancaq böyük bir azğınlıq içindəsiniz"– demişdik.

قَالُواْ بَلَىٰ قَدۡ جَآءَنَا نَذِيرٞ فَكَذَّبۡنَا وَقُلۡنَا مَا نَزَّلَ ٱللَّهُ
مِن شَيۡءٍ إِنۡ أَنتُمۡ إِلَّا فِي ضَلَٰلٖ كَبِيرٖ ٩

10. Onlar deyəcəklər: "Əgər biz dinləsəydik və ya anlasaydıq alov şölələri saçan od sakinlərinin içində olmazdıq!"

وَقَالُواْ لَوۡ كُنَّا نَسۡمَعُ أَوۡ نَعۡقِلُ مَا كُنَّا فِيٓ أَصۡحَٰبِ
ٱلسَّعِيرِ ١٠

11. Onlar öz günahlarını etiraf edəcəklər. Rədd olsun alovlu od sakinləri!

فَٱعۡتَرَفُواْ بِذَنۢبِهِمۡ فَسُحۡقٗا لِّأَصۡحَٰبِ ٱلسَّعِيرِ ١١

12. Həqiqətən, öz Rəbbindən *Onu* görmədikləri halda qorxanlar üçün bağışlanma və böyük bir mükafat vardır.

إِنَّ ٱلَّذِينَ يَخۡشَوۡنَ رَبَّهُم بِٱلۡغَيۡبِ لَهُم مَّغۡفِرَةٞ
وَأَجۡرٞ كَبِيرٞ ١٢

13. Sözünüzü gizli saxlasanız da, onu açıq desəniz də, *fərqi yoxdur*, *Allah* kökslərdə olanları bilir.

وَأَسِرُّواْ قَوۡلَكُمۡ أَوِ ٱجۡهَرُواْ بِهِۦٓۖ إِنَّهُۥ عَلِيمُۢ بِذَاتِ
ٱلصُّدُورِ ١٣

14. Yaradan *Allah* Lətif və hər şeydən Xəbərdar olduğu halda, ola bilərmi ki, O, *gizlində və aşkarda olanları* bilməsin?

أَلَا يَعۡلَمُ مَنۡ خَلَقَ وَهُوَ ٱللَّطِيفُ ٱلۡخَبِيرُ ١٤

15. Yeri sizin ixtiyarınıza verən Odur. Onun hər tərəfində gəzin və *Allahın* ruzisindən yeyin. Qayıdış da Onadır.

هُوَ ٱلَّذِي جَعَلَ لَكُمُ ٱلۡأَرۡضَ ذَلُولٗا فَٱمۡشُواْ فِي
مَنَاكِبِهَا وَكُلُواْ مِن رِّزۡقِهِۦۖ وَإِلَيۡهِ ٱلنُّشُورُ ١٥

16. Göydə Olanın sizi yerə batırmayacağına əminsinizmi? O zaman yer hərəkətə gəlib titrəyəcəkdir.

ءَأَمِنتُم مَّن فِي ٱلسَّمَآءِ أَن يَخۡسِفَ بِكُمُ ٱلۡأَرۡضَ
فَإِذَا هِيَ تَمُورُ ١٦

17. Ya da ki, göydə Olanın üstünüzə daşlar yağdırmayacağına əminsinizmi? Siz, Mənim xəbərdarlığımın necə nəticələr verdiyini biləcəksiniz.

أَمۡ أَمِنتُم مَّن فِي ٱلسَّمَآءِ أَن يُرۡسِلَ عَلَيۡكُمۡ
حَاصِبٗاۖ فَسَتَعۡلَمُونَ كَيۡفَ نَذِيرِ ١٧

18. *Müşriklərdən* əvvəlkilər də bunu yalançı hesab etmişdilər. *Görəydin* Mənim *onları* həlak etməyim necə oldu!

وَلَقَدۡ كَذَّبَ ٱلَّذِينَ مِن قَبۡلِهِمۡ فَكَيۡفَ كَانَ نَكِيرِ ١٨

19. Məgər onlar *başları* üzərində dəstə-dəstə pərvazlanıb *uçan*, *hərdən də qanadlarını* yığan quşları görmürlərmi? Onları *havada* ancaq Mərhəmətli *Allah* saxlayır. Şübhəsiz ki, O, hər şeyi görür.

أَوَلَمۡ يَرَوۡاْ إِلَى ٱلطَّيۡرِ فَوۡقَهُمۡ صَٰٓفَّٰتٖ وَيَقۡبِضۡنَۚ
مَا يُمۡسِكُهُنَّ إِلَّا ٱلرَّحۡمَٰنُۚ إِنَّهُۥ بِكُلِّ شَيۡءِۭ
بَصِيرٌ ١٩

20. Ya da Mərhəmətli *Allahdan* başqa sizə kömək edə biləcək qoşununuz varmı? Kafirlər ancaq aldanmaqdadırlar!

أَمَّنۡ هَٰذَا ٱلَّذِي هُوَ جُندٞ لَّكُمۡ يَنصُرُكُم مِّن دُونِ
ٱلرَّحۡمَٰنِۚ إِنِ ٱلۡكَٰفِرُونَ إِلَّا فِي غُرُورٍ ٢٠

21. Ya da O Öz ruzisini kəssə, sizə kim ruzi verə bilər? Xeyr, onlar təkəbbür göstərməkdə və *haqdan* qaçmaqda davam edirlər.

أَمَّنۡ هَٰذَا ٱلَّذِي يَرۡزُقُكُمۡ إِنۡ أَمۡسَكَ رِزۡقَهُۥۚ بَل
لَّجُّواْ فِي عُتُوّٖ وَنُفُورٍ ٢١

22. Elə isə üzü üstə sürünərək gedən daha doğru yoldadır, yoxsa düz yolda özü şax gedən?

أَفَمَن يَمۡشِي مُكِبًّا عَلَىٰ وَجۡهِهِۦٓ أَهۡدَىٰٓ أَمَّن
يَمۡشِي سَوِيًّا عَلَىٰ صِرَٰطٖ مُّسۡتَقِيمٖ ٢٢

23. De: “Sizi yaradan, sizə qulaq, göz və ürək verən Odur. Necə də az şükür edirsiniz!”

قُلۡ هُوَ ٱلَّذِيٓ أَنشَأَكُمۡ وَجَعَلَ لَكُمُ ٱلسَّمۡعَ
وَٱلۡأَبۡصَٰرَ وَٱلۡأَفۡـِٔدَةَۚ قَلِيلٗا مَّا تَشۡكُرُونَ ٢٣

**24.** De: “Sizi yer üzünə yayan da Odur. Siz Onun hüzuruna toplanılacaqsınız!”

قُلْ هُوَ ٱلَّذِى ذَرَأَكُمْ فِى ٱلْأَرْضِ وَإِلَيْهِ تُحْشَرُونَ ﴿٢٤﴾

**25.** Onlar deyirlər: “Əgər doğru deyirsinizsə, bu vəd nə vaxt olacaq?”

وَيَقُولُونَ مَتَىٰ هَٰذَا ٱلْوَعْدُ إِن كُنتُمْ صَٰدِقِينَ ﴿٢٥﴾

**26.** De: “*Buna aid* bilgi yalnız Allah yanındadır. Mən isə ancaq xəbərdar və bəyan edənəm!”

قُلْ إِنَّمَا ٱلْعِلْمُ عِندَ ٱللَّهِ وَإِنَّمَآ أَنَا۠ نَذِيرٌ مُّبِينٌ ﴿٢٦﴾

**27.** Kafirlər əzabın yaxın olduğunu gördükdə üzləri eybəcər görkəm alacaq və *onlara*: “Sizin durmadan istədiyiniz *əzab* bax budur!”– deyiləcəkdir.

فَلَمَّا رَأَوْهُ زُلْفَةً سِيٓـَٔتْ وُجُوهُ ٱلَّذِينَ كَفَرُوا۟ وَقِيلَ هَٰذَا ٱلَّذِى كُنتُم بِهِۦ تَدَّعُونَ ﴿٢٧﴾

**28.** De: “Deyin görüm, əgər Allah məni və mənimlə birlikdə olanları məhv edərsə və ya bizə mərhəmət göstərərsə, bəs *siz* kafirləri ağrılı-acılı əzabdan kim qurtara bilər?”

قُلْ أَرَءَيْتُمْ إِنْ أَهْلَكَنِىَ ٱللَّهُ وَمَن مَّعِىَ أَوْ رَحِمَنَا فَمَن يُجِيرُ ٱلْكَٰفِرِينَ مِنْ عَذَابٍ أَلِيمٍ ﴿٢٨﴾

**29.** De: “O, *Mərhəmətli* Allahdır! Biz Ona iman gətirib, Ona təvəkkül etmişik. Kimin tam azğınlıq içində olduğunu *tezliklə* biləcəksiniz.

قُلْ هُوَ ٱلرَّحْمَٰنُ ءَامَنَّا بِهِۦ وَعَلَيْهِ تَوَكَّلْنَا فَسَتَعْلَمُونَ مَنْ هُوَ فِى ضَلَٰلٍ مُّبِينٍ ﴿٢٩﴾

**30.** De: “Deyin görüm, əgər suyunuz *yerin dibinə çöksə, Allahdan başqa* kim sizə axar su gətirə bilər?”

قُلْ أَرَءَيْتُمْ إِنْ أَصْبَحَ مَآؤُكُمْ غَوْرًا فَمَن يَأْتِيكُم بِمَآءٍ مَّعِينٍۭ ﴿٣٠﴾



## əl-Qələm («Qələm») surəsi

سُورَةُ القَلَمِ

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

1. Nun. And olsun qələmə və qələmə alınanlara!

نٓۚ وَٱلۡقَلَمِ وَمَا يَسۡطُرُونَ ١

2. Məhz Rəbbinin mərhəmətinə görə sən dəli deyilsən.

مَآ أَنتَ بِنِعۡمَةِ رَبِّكَ بِمَجۡنُونٖ ٢

3. Şübhəsiz ki, sənin üçün tükənməz bir mükafat hazırlanmışdır.

وَإِنَّ لَكَ لَأَجۡرًا غَيۡرَ مَمۡنُونٖ ٣

4. Həqiqətən də, sən böyük əxlaq sahibisən!

وَإِنَّكَ لَعَلَىٰ خُلُقٍ عَظِيمٖ ٤

5. Sən də görəcəksən, onlar da –

فَسَتُبۡصِرُ وَيُبۡصِرُونَ ٥

6. hansınızın dəli olduğunu.

بِأَييِّكُمُ ٱلۡمَفۡتُونُ ٦

7. Şübhəsiz ki, Rəbbin Onun yolundan azanları və haqq yolda olanları daha yaxşı tanıyır.

إِنَّ رَبَّكَ هُوَ أَعۡلَمُ بِمَن ضَلَّ عَن سَبِيلِهِۦ وَهُوَ
أَعۡلَمُ بِٱلۡمُهۡتَدِينَ ٧

8. Elə isə *haqqı* yalan sayanlara güzəştə getmə.

فَلَا تُطِعِ ٱلۡمُكَذِّبِينَ ٨

9. *Müşriklər* istəyirlər ki, sən *onlara* güzəşt edəsən, onlar da *sənə* güzəşt etsinlər.

وَدُّواْ لَوۡ تُدۡهِنُ فَيُدۡهِنُونَ ٩

10. İtaət etmə hər tez-tez and içənə, alçağa,

وَلَا تُطِعۡ كُلَّ حَلَّافٖ مَّهِينٍ ١٠

11. qeybət edənə, dedi-qodu yayana,

هَمَّازٖ مَّشَّآءِۭ بِنَمِيمٖ ١١

12. xeyrə mane olana, həddi aşana, günahkara,

مَّنَّاعٖ لِّلۡخَيۡرِ مُعۡتَدٍ أَثِيمٍ ١٢

13. daş ürəkliyə, bunlardan sonra da *başqasının adını mənimsəyən* fırıldaqçıya –

عُتُلِّۭ بَعۡدَ ذَٰلِكَ زَنِيمٍ ١٣

14. o *adam* var-dövlət və oğul-uşaq sahibi olsa belə.

أَن كَانَ ذَا مَالٍ وَبَنِينَ ﴿١٤﴾

15. Ayələrimiz ona oxunduğu zaman: "Bu, keçmişdəkilərin əsatirlərindəndir!"– deyər.

إِذَا تُتْلَىٰ عَلَيْهِ ءَايَٰتُنَا قَالَ أَسَٰطِيرُ ٱلْأَوَّلِينَ ﴿١٥﴾

16. Biz onun burnuna damğa vuracağıq.

سَنَسِمُهُۥ عَلَى ٱلْخُرْطُومِ ﴿١٦﴾

17. Həqiqətən, Biz bağ sahiblərini sınağa çəkdiyimiz kimi onları da sınağa çəkdik. O zaman *bağ sahibləri* səhər açılanda *bağda olan meyvələri* mütləq dərəcəklərinə and içmişdilər

إِنَّا بَلَوْنَٰهُمْ كَمَا بَلَوْنَآ أَصْحَٰبَ ٱلْجَنَّةِ إِذْ أَقْسَمُوا۟ لَيَصْرِمُنَّهَا مُصْبِحِينَ ﴿١٧﴾

18. və heç bir istisna da etməmişdilər ("inşallah" deməmişdilər).

وَلَا يَسْتَثْنُونَ ﴿١٨﴾

19. Onlar yuxuda ikən Rəbbinin əzabı *o bağı* bürüdü.

فَطَافَ عَلَيْهَا طَآئِفٌ مِّن رَّبِّكَ وَهُمْ نَآئِمُونَ ﴿١٩﴾

20. *Bağ yanıb* zülmət gecə kimi *qapqara* oldu.

فَأَصْبَحَتْ كَٱلصَّرِيمِ ﴿٢٠﴾

21. Onlar səhər qalxdıqda bir-birlərini çağırdılar:

فَتَنَادَوْا۟ مُصْبِحِينَ ﴿٢١﴾

22. "Əgər *meyvə* dərəcəksinizsə, bağınıza erkən gedin!"

أَنِ ٱغْدُوا۟ عَلَىٰ حَرْثِكُمْ إِن كُنتُمْ صَٰرِمِينَ ﴿٢٢﴾

23. Onlar *bağa* yollandılar, *yol boyu da* bir-birlərinə *belə* pıçıldayırdılar:

فَٱنطَلَقُوا۟ وَهُمْ يَتَخَٰفَتُونَ ﴿٢٣﴾

24. "Bu gün oraya – yanınıza heç bir kasıb girməsin!"

أَن لَّا يَدْخُلَنَّهَا ٱلْيَوْمَ عَلَيْكُم مِّسْكِينٌ ﴿٢٤﴾

25. Onlar bu məqsədlə *kasıbları bağa buraxmamağa* qadir olacaqlarını zənn edib erkən getdilər.

وَغَدَوْا۟ عَلَىٰ حَرْدٍ قَٰدِرِينَ ﴿٢٥﴾

26. *Bağı* görəndə isə *belə* dedilər: "Deyəsən, biz düz gəlməmişik!

فَلَمَّا رَأَوْهَا قَالُوٓا۟ إِنَّا لَضَآلُّونَ ﴿٢٦﴾

27. Xeyr! Biz *bu bağın xeyrindən* məhrum olmuşuq!”

بَلْ نَحْنُ مَحْرُومُونَ ٢٧

28. Onların ən insaflısı dedi: “Məgər mən sizə *Allahın şəninə* təriflər söyləyin deməmişdimmi?”

قَالَ أَوْسَطُهُمْ أَلَمْ أَقُل لَّكُمْ لَوْلَا تُسَبِّحُونَ ٢٨

29. Onlar dedilər: “Rəbbimiz pakdır, müqəddəsdir! Həqiqətən də, biz özümüzə zülm etmişik!”

قَالُوا سُبْحَانَ رَبِّنَا إِنَّا كُنَّا ظَالِمِينَ ٢٩

30. Onlar dönüb bir-birlərini qınamağa başladılar

فَأَقْبَلَ بَعْضُهُمْ عَلَىٰ بَعْضٍ يَتَلَاوَمُونَ ٣٠

31. *və* dedilər: “Vay halımıza! Biz həddi aşanlarıq!

قَالُوا يَا وَيْلَنَا إِنَّا كُنَّا طَاغِينَ ٣١

32. Ola bilsin ki, Rəbbimiz bizə *bu bağın* əvəzinə ondan daha yaxşısını versin. Əlbəttə, biz Rəbbimizə yönəlirik”.

عَسَىٰ رَبُّنَا أَن يُبْدِلَنَا خَيْرًا مِّنْهَا إِنَّا إِلَىٰ رَبِّنَا رَاغِبُونَ ٣٢

33. *Dünyadakı* əzab belədir. Axirət əzabı isə daha böyükdür! Kaş biləydilər!

كَذَٰلِكَ الْعَذَابُ ۖ وَلَعَذَابُ الْآخِرَةِ أَكْبَرُ ۚ لَوْ كَانُوا يَعْلَمُونَ ٣٣

34. Şübhəsiz ki, müttəqilər üçün Rəbbin dərgahında Nəim bağları hazırlanmışdır.

إِنَّ لِلْمُتَّقِينَ عِندَ رَبِّهِمْ جَنَّاتِ النَّعِيمِ ٣٤

35. Biz heç müsəlmanları günahkarlara tay tutarıqmı?

أَفَنَجْعَلُ الْمُسْلِمِينَ كَالْمُجْرِمِينَ ٣٥

36. Sizə nə olub, necə hökm verirsiniz?

مَا لَكُمْ كَيْفَ تَحْكُمُونَ ٣٦

37. Yoxsa sizin elə bir kitabınız vardır ki, *üsyankarla itaətkarın eyni olduğunu* ondan oxuyursunuz?

أَمْ لَكُمْ كِتَابٌ فِيهِ تَدْرُسُونَ ٣٧

38. *Ya da* onda bəyəndiyiniz hər bir şeyin sizin olacağı *yazılmışdır*?

إِنَّ لَكُمْ فِيهِ لَمَا تَخَيَّرُونَ ٣٨

**39.** Yaxud Bizimlə Qiyamət gününədək əhd bağlamısınız ki, istədiyiniz hər şey sizin olacaqdır?

أَمْ لَكُمْ أَيْمَٰنٌ عَلَيْنَا بَٰلِغَةٌ إِلَىٰ يَوْمِ ٱلْقِيَٰمَةِ إِنَّ لَكُمْ لَمَا
تَحْكُمُونَ ٣٩

**40.** Onlardan soruş ki, kim buna zamin duracaqdır?

سَلْهُمْ أَيُّهُم بِذَٰلِكَ زَعِيمٌ ٤٠

**41.** Yoxsa onların şərikləri vardır? Əgər doğru danışırlarsa, onda qoy şəriklərini gətirsinlər.

أَمْ لَهُمْ شُرَكَآءُ فَلْيَأْتُوا۟ بِشُرَكَآئِهِمْ إِن كَانُوا۟
صَٰدِقِينَ ٤١

**42.** Ayağın açılacağı və onlar səcdəyə çağırılacaqları, lakin *buna* qadir ola bilməyəcəkləri gün –

يَوْمَ يُكْشَفُ عَن سَاقٍ وَيُدْعَوْنَ إِلَى ٱلسُّجُودِ
فَلَا يَسْتَطِيعُونَ ٤٢

**43.** onların baxışları yazıq görkəm alacaq, özlərini də zillət bürüyəcəkdir. Hərçənd ki, onlar *dünyada* ikən sağ-salamat halda səcdə qılmağa dəvət olunurdular.

خَٰشِعَةً أَبْصَٰرُهُمْ تَرْهَقُهُمْ ذِلَّةٌ وَقَدْ كَانُوا۟ يُدْعَوْنَ
إِلَى ٱلسُّجُودِ وَهُمْ سَٰلِمُونَ ٤٣

**44.** Bu Sözü yalan sayanları Mənim öhdəmə burax. Biz onları *tovlayıb* bilmədikləri bir yöndən tədricən *əzaba* sürükləyirik.

فَذَرْنِى وَمَن يُكَذِّبُ بِهَٰذَا ٱلْحَدِيثِ
سَنَسْتَدْرِجُهُم مِّنْ حَيْثُ لَا يَعْلَمُونَ ٤٤

**45.** *Hələlik* Mən onlara möhlət verirəm. Şübhəsiz ki, Mənim *kafirlər üçün qurduğum* hiyləm çox güclüdür.

وَأُمْلِى لَهُمْ إِنَّ كَيْدِى مَتِينٌ ٤٥

**46.** Yoxsa sən onlardan bir muzd istəyirsən və onlar da ağır bir borca düşüblər?

أَمْ تَسْـَٔلُهُمْ أَجْرًا فَهُم مِّن مَّغْرَمٍ مُّثْقَلُونَ ٤٦

**47.** Yoxsa qeyb onların əlindədir və onlar da *ona baxıb istədiklərini* yazırlar?

أَمْ عِندَهُمُ ٱلْغَيْبُ فَهُمْ يَكْتُبُونَ ٤٧

**48.** Sən öz Rəbbinin hökmünə səbir et və balıq sahibi *Yunus* kimi olma! O zaman o, qəm-qüssə içində

فَٱصْبِرْ لِحُكْمِ رَبِّكَ وَلَا تَكُن كَصَاحِبِ
ٱلْحُوتِ إِذْ نَادَىٰ وَهُوَ مَكْظُومٌ ٤٨

*Rəbbinə* dua etmişdi.

**49.** Əgər Rəbbinin mərhəməti ona yetişməsəydi, o, qınanmış halda *heç bir bitki bitməyən* boş yerə atılacaqdı.

لَّوْلَآ أَن تَدَٰرَكَهُۥ نِعْمَةٌ مِّن رَّبِّهِۦ لَنُبِذَ بِٱلْعَرَآءِ
وَهُوَ مَذْمُومٌ ٤٩

**50.** Lakin Rəbbi onu seçib əməlisalehlərdən etdi.

فَٱجْتَبَٰهُ رَبُّهُۥ فَجَعَلَهُۥ مِنَ ٱلصَّٰلِحِينَ ٥٠

**51.** Həqiqətən, kafirlər *bu* Zikri eşitdikləri zaman öz baxışları ilə az qala səni gözə gətirələr. Onlar *çarəsizlikdən*: "O, dəlidir!"– deyirlər.

وَإِن يَكَادُ ٱلَّذِينَ كَفَرُوا۟ لَيُزْلِقُونَكَ بِأَبْصَٰرِهِمْ
لَمَّا سَمِعُوا۟ ٱلذِّكْرَ وَيَقُولُونَ إِنَّهُۥ لَمَجْنُونٌ ٥١

**52.** Halbuki bu *Quran* aləmlər üçün öyüd-nəsihətdən başqa bir şey deyildir.

وَمَا هُوَ إِلَّا ذِكْرٌ لِّلْعَٰلَمِينَ ٥٢



## əl-Həqqa («Haqq olan») surəsi

## سُورَةُ الحَاقَّةِ

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

1. Haqq olan *Qiyamət*!

ٱلْحَآقَّةُ ١

2. Nədir haqq olan *Qiyamət*?

مَا ٱلْحَآقَّةُ ٢

3. Sən nə biləsən ki, nədir haqq olan *Qiyamət*?

وَمَآ أَدْرَىٰكَ مَا ٱلْحَآقَّةُ ٣

4. Səmud və Ad *tayfaları qəlbləri* qorxuya salan *Qiyaməti* yalan saydılar.

كَذَّبَتْ ثَمُودُ وَعَادٌۢ بِٱلْقَارِعَةِ ٤

5. Səmud *tayfası* qorxunc bir səslə məhv edildi.

فَأَمَّا ثَمُودُ فَأُهْلِكُوا۟ بِٱلطَّاغِيَةِ ٥

6. Ad *tayfası* isə hədsiz soyuq və şiddətli küləklə yox edildi.

وَأَمَّا عَادٌ فَأُهْلِكُوا۟ بِرِيحٍ صَرْصَرٍ عَاتِيَةٍ ٦

7. *Allah* onu yeddi gecə, səkkiz gün fasilə vermədən onların üstündə əsdirdi. *Sən orada olsaydın*, o tayfanı xurma ağacının yıxılmış çürük gövdələri kimi yerə sərilmiş görərdin.

سَخَّرَهَا عَلَيْهِمْ سَبْعَ لَيَالٍ وَثَمَٰنِيَةَ أَيَّامٍ حُسُومًا فَتَرَى ٱلْقَوْمَ فِيهَا صَرْعَىٰ كَأَنَّهُمْ أَعْجَازُ نَخْلٍ خَاوِيَةٍ ٧

8. Sən onlardan qalan bir kimsəyə heç rast gəlmisənmi?

فَهَلْ تَرَىٰ لَهُم مِّنۢ بَاقِيَةٍ ٨

9. Firon da, ondan əvvəlkilər də, alt-üst olmuş kəndlər (Lut qövmü) də günah işlətmişdilər.

وَجَآءَ فِرْعَوْنُ وَمَن قَبْلَهُۥ وَٱلْمُؤْتَفِكَٰتُ بِٱلْخَاطِئَةِ ٩

10. Onlar öz Rəbbinin elçisinə asi oldular, O da onları *şiddəti* artan bir əzabla yaxaladı.

فَعَصَوْا۟ رَسُولَ رَبِّهِمْ فَأَخَذَهُمْ أَخْذَةً رَّابِيَةً ١٠

11. Su aşıb-daşdıqda Biz sizi üzən gəmidə daşıdıq.

إِنَّا لَمَّا طَغَا ٱلۡمَآءُ حَمَلۡنَٰكُمۡ فِي ٱلۡجَارِيَةِ ١١

12. Sizə bir xatırlatma olsun və yadda saxlayan qulaqlar onu yadda saxlasın deyə *belə* etdik.

لِنَجۡعَلَهَا لَكُمۡ تَذۡكِرَةٗ وَتَعِيَهَآ أُذُنٞ وَٰعِيَةٞ ١٢

13. Sur bircə dəfə üfürüləcəyi,

فَإِذَا نُفِخَ فِي ٱلصُّورِ نَفۡخَةٞ وَٰحِدَةٞ ١٣

14. yer və dağlar qaldırılıb bircə dəfə bir-birinə çırpılacağı zaman –

وَحُمِلَتِ ٱلۡأَرۡضُ وَٱلۡجِبَالُ فَدُكَّتَا دَكَّةٗ وَٰحِدَةٗ ١٤

15. həmin gün Vaqiə qopacaq.

فَيَوۡمَئِذٖ وَقَعَتِ ٱلۡوَاقِعَةُ ١٥

16. Göy yarılacaq və həmin gün o, süst olacaqdır.

وَٱنشَقَّتِ ٱلسَّمَآءُ فَهِيَ يَوۡمَئِذٖ وَاهِيَةٞ ١٦

17. Mələklər isə onun ətrafında olacaqlar. O gün sənin Rəbbinin Ərşini səkkiz *mələk* daşıyacaqdır.

وَٱلۡمَلَكُ عَلَىٰٓ أَرۡجَآئِهَاۚ وَيَحۡمِلُ عَرۡشَ رَبِّكَ فَوۡقَهُمۡ يَوۡمَئِذٖ ثَمَٰنِيَةٞ ١٧

18. O gün siz *məhşərə* gətiriləcəksiniz və heç bir sirriniz gizlədilməyəcəkdir.

يَوۡمَئِذٖ تُعۡرَضُونَ لَا تَخۡفَىٰ مِنكُمۡ خَافِيَةٞ ١٨

19. Kitabı sağ əlinə verilən deyəcəkdir: "Budur, oxuyun kitabımı!

فَأَمَّا مَنۡ أُوتِيَ كِتَٰبَهُۥ بِيَمِينِهِۦ فَيَقُولُ هَآؤُمُ ٱقۡرَءُواْ كِتَٰبِيَهۡ ١٩

20. Mən bilirdim ki, etdiklərimin hesabına qovuşacağam".

إِنِّي ظَنَنتُ أَنِّي مُلَٰقٍ حِسَابِيَهۡ ٢٠

21. O, xoşbəxt həyat sürəcəkdir –

فَهُوَ فِي عِيشَةٖ رَّاضِيَةٖ ٢١

22. uca bir Cənnətdə –

فِي جَنَّةٍ عَالِيَةٖ ٢٢

23. *elə bir Cənnətdə ki,* onun meyvələri lap yaxınlıqda olacaqdır.

قُطُوفُهَا دَانِيَةٞ ٢٣

24. *Onlara*: "Keçmiş günlərdə etdiyiniz əməllərə görə nuşcanlıqla yeyin-için!"– *deyiləcəkdir*

كُلُواْ وَٱشۡرَبُواْ هَنِيٓـَٔۢا بِمَآ أَسۡلَفۡتُمۡ فِي ٱلۡأَيَّامِ ٱلۡخَالِيَةِ ٢٤

**25.** Kitabı sol əlinə verilən kimsə isə deyəcəkdir: “Kaş kitabım mənə verilməyəydi!

وَأَمَّا مَنْ أُوتِيَ كِتَٰبَهُۥ بِشِمَالِهِۦ فَيَقُولُ يَٰلَيْتَنِى لَمْ أُوتَ كِتَٰبِيَهْ ٢٥

**26.** Hesabımdan da xəbərim olmayaydı!

وَلَمْ أَدْرِ مَا حِسَابِيَهْ ٢٦

**27.** Kaş ilk ölümüm həmişəlik olaydı!

يَٰلَيْتَهَا كَانَتِ ٱلْقَاضِيَةَ ٢٧

**28.** Var-dövlətim məni *əzabdan* qurtarmadı.

مَآ أَغْنَىٰ عَنِّى مَالِيَهْ ٢٨

**29.** Hökmranlığım da məhv olub getdi”.

هَلَكَ عَنِّى سُلْطَٰنِيَهْ ٢٩

**30.** *Mələklərə deyiləcək*: “Onu yaxalayıb zəncirləyin!

خُذُوهُ فَغُلُّوهُ ٣٠

**31.** Sonra da Cəhənnəmə atın!

ثُمَّ ٱلْجَحِيمَ صَلُّوهُ ٣١

**32.** Onu uzunluğu yetmiş dirsək olan zəncirə vurun!

ثُمَّ فِى سِلْسِلَةٍ ذَرْعُهَا سَبْعُونَ ذِرَاعًا فَٱسْلُكُوهُ ٣٢

**33.** Çünki o, Böyük Allaha iman gətirmirdi,

إِنَّهُۥ كَانَ لَا يُؤْمِنُ بِٱللَّهِ ٱلْعَظِيمِ ٣٣

**34.** və *heç kəsi* kasıbı yedirtməyə rəğbətləndirmirdi.

وَلَا يَحُضُّ عَلَىٰ طَعَامِ ٱلْمِسْكِينِ ٣٤

**35.** Bu gün burada onun üçün bir dost tapılmaz.

فَلَيْسَ لَهُ ٱلْيَوْمَ هَٰهُنَا حَمِيمٌ ٣٥

**36.** Qanlı irindən başqa yeməyi də yoxdur.

وَلَا طَعَامٌ إِلَّا مِنْ غِسْلِينٍ ٣٦

**37.** Onu ancaq günahkarlar yeyər”.

لَّا يَأْكُلُهُۥٓ إِلَّا ٱلْخَٰطِـُٔونَ ٣٧

**38.** And içirəm həm gördüklərinizə,

فَلَآ أُقْسِمُ بِمَا تُبْصِرُونَ ٣٨

**39.** həm də görmədiklərinizə!

وَمَا لَا تُبْصِرُونَ ٣٩

**40.** Bu, möhtərəm bir Elçinin sözüdür.

إِنَّهُۥ لَقَوْلُ رَسُولٍ كَرِيمٍ ٤٠

**41.** O, şair sözü deyildir! Necə də az inanırsınız!

وَمَا هُوَ بِقَوْلِ شَاعِرٍ ۚ قَلِيلًا مَّا تُؤْمِنُونَ ٤١

42. O, kahin sözü də deyildir! Necə də az düşünürsünüz!

وَلَا بِقَوْلِ كَاهِنٍ قَلِيلًا مَّا تَذَكَّرُونَ ﴿٤٢﴾

43. O, aləmlərin Rəbbi tərəfindən vəhy edilmişdir!

تَنزِيلٌ مِّن رَّبِّ الْعَالَمِينَ ﴿٤٣﴾

44. Əgər *Muhəmməd* bəzi sözləri özündən uydurub Bizə aid etsəydi,

وَلَوْ تَقَوَّلَ عَلَيْنَا بَعْضَ الْأَقَاوِيلِ ﴿٤٤﴾

45. Biz onu sağ əlindən yaxalayar,

لَأَخَذْنَا مِنْهُ بِالْيَمِينِ ﴿٤٥﴾

46. sonra da şah damarını kəsərdik.

ثُمَّ لَقَطَعْنَا مِنْهُ الْوَتِينَ ﴿٤٦﴾

47. İçərinizdən heç kəs buna mane ola bilməzdi.

فَمَا مِنكُم مِّنْ أَحَدٍ عَنْهُ حَاجِزِينَ ﴿٤٧﴾

48. Həqiqətən, bu *Quran* müttəqilər üçün bir nəsihətdir.

وَإِنَّهُ لَتَذْكِرَةٌ لِّلْمُتَّقِينَ ﴿٤٨﴾

49. Aranızdan Quranı yalan sayanlar olduğunu da bilirik!

وَإِنَّا لَنَعْلَمُ أَنَّ مِنكُم مُّكَذِّبِينَ ﴿٤٩﴾

50. Həqiqətən, bu, kafirlər üçün bir peşmançılıqdır.

وَإِنَّهُ لَحَسْرَةٌ عَلَى الْكَافِرِينَ ﴿٥٠﴾

51. Sözsüz ki, bu *Quran* əsl həqiqətdir.

وَإِنَّهُ لَحَقُّ الْيَقِينِ ﴿٥١﴾

52. Elə isə Böyük Rəbbinin adına təriflər de!

فَسَبِّحْ بِاسْمِ رَبِّكَ الْعَظِيمِ ﴿٥٢﴾



## əl-Maaric («Dərəcələr») surəsi

## سورة المعارج

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ

1. İstəyən kimsə baş verəcək əzabı istədi–
2. *bunu* kafirlər üçün *dilədi. O* əzabın qarşısını alan tapılmayacaq.
3. O, dərəcələr sahibi olan Allahdandır.
4. Mələklər və Ruh *Cəbrail* Ona doğru sayı əlli min ilə bərabər bir gün ərzində qalxırlar.
5. Sən təmkinlə səbir et!
6. Doğrusu, *kafirlər* o *əzabın* uzaq olduğunu güman edirlər.
7. Biz isə onun yaxın olduğunu görürük.
8. O gün göy əridilmiş metal kimi olacaqdır.
9. Dağlar da *didilmiş* yuna bənzəyəcəklər.
10. Dost dostun halını xəbər almayacaq.
11. *Halbuki* onlar bir-birini görəcəklər. Günahkar o günün əzabından qurtarmaq üçün fidyə vermək istəyər – öz oğullarını,
12. həyat yoldaşını və qardaşını,

سَأَلَ سَائِلٌ بِعَذَابٍ وَاقِعٍ ١

لِّلْكَافِرِينَ لَيْسَ لَهُ دَافِعٌ ٢

مِّنَ اللَّهِ ذِي الْمَعَارِجِ ٣

تَعْرُجُ الْمَلَائِكَةُ وَالرُّوحُ إِلَيْهِ فِي يَوْمٍ كَانَ
مِقْدَارُهُ خَمْسِينَ أَلْفَ سَنَةٍ ٤

فَاصْبِرْ صَبْرًا جَمِيلًا ٥

إِنَّهُمْ يَرَوْنَهُ بَعِيدًا ٦

وَنَرَاهُ قَرِيبًا ٧

يَوْمَ تَكُونُ السَّمَاءُ كَالْمُهْلِ ٨

وَتَكُونُ الْجِبَالُ كَالْعِهْنِ ٩

وَلَا يَسْأَلُ حَمِيمٌ حَمِيمًا ١٠

يُبَصَّرُونَهُمْ يَوَدُّ الْمُجْرِمُ لَوْ يَفْتَدِي مِنْ عَذَابِ
يَوْمِئِذٍ بِبَنِيهِ ١١

وَصَاحِبَتِهِ وَأَخِيهِ ١٢

| | |
|---|---|
| **13.** ona sığınacaq vermiş nəslini | وَفَصِيلَتِهِ ٱلَّتِي تُـْٔوِيهِ ﴿١٣﴾ |
| **14.** və yer üzündə olanların hamısını – təki *bu* onu xilas etsin. | وَمَن فِي ٱلْأَرْضِ جَمِيعًا ثُمَّ يُنجِيهِ ﴿١٤﴾ |
| **15.** Xeyr! Bu, alovu şölələnən Oddur – | كَلَّآ إِنَّهَا لَظَىٰ ﴿١٥﴾ |
| **16.** başın dərisini sıyırıb çıxaran *bir od.* | نَزَّاعَةً لِّلشَّوَىٰ ﴿١٦﴾ |
| **17.** *O od* çağırır *haqqa* arxa çevirəni, *ondan* üz döndərəni | تَدْعُواْ مَنْ أَدْبَرَ وَتَوَلَّىٰ ﴿١٧﴾ |
| **18.** və *mal-dövlət* yığıb saxlayanı. | وَجَمَعَ فَأَوْعَىٰٓ ﴿١٨﴾ |
| **19.** Həqiqətən, insan kəmhövsələ yaradılmışdır. | ۞ إِنَّ ٱلْإِنسَٰنَ خُلِقَ هَلُوعًا ﴿١٩﴾ |
| **20.** Ona bir pislik toxunduqda özündən çıxır, | إِذَا مَسَّهُ ٱلشَّرُّ جَزُوعًا ﴿٢٠﴾ |
| **21.** bir xeyir nəsib olduqda isə xəsislik edir. | وَإِذَا مَسَّهُ ٱلْخَيْرُ مَنُوعًا ﴿٢١﴾ |
| **22.** Namaz qılanlar istisnadır. | إِلَّا ٱلْمُصَلِّينَ ﴿٢٢﴾ |
| **23.** O kəslər ki, namazlarını həmişə qılırlar. | ٱلَّذِينَ هُمْ عَلَىٰ صَلَاتِهِمْ دَآئِمُونَ ﴿٢٣﴾ |
| **24.** O kəslər ki, onların mallarında məlum bir haqq vardır- | وَٱلَّذِينَ فِيٓ أَمْوَٰلِهِمْ حَقٌّ مَّعْلُومٌ ﴿٢٤﴾ |
| **25.** dilənən və *həya edib* dilənməyən miskinlər üçün. | لِّلسَّآئِلِ وَٱلْمَحْرُومِ ﴿٢٥﴾ |
| **26.** O kəslər ki, Haqq-hesab gününü təsdiq edirlər. | وَٱلَّذِينَ يُصَدِّقُونَ بِيَوْمِ ٱلدِّينِ ﴿٢٦﴾ |
| **27.** O kəslər ki, Rəbbinin əzabından qorxurlar. | وَٱلَّذِينَ هُم مِّنْ عَذَابِ رَبِّهِم مُّشْفِقُونَ ﴿٢٧﴾ |
| **28.** Axı Rəbbinin əzabı *onlar üçün də* təhlükəsiz deyil. | إِنَّ عَذَابَ رَبِّهِمْ غَيْرُ مَأْمُونٍ ﴿٢٨﴾ |

29. O kəslər ki, tənasül üzvlərini *zinadan* qoruyurlar –

وَٱلَّذِينَ هُمۡ لِفُرُوجِهِمۡ حَٰفِظُونَ ٢٩

30. zövcələrindən və sahib olduqları cariyələrdən başqa. *Buna görə* onlar əsla qınanmazlar.

إِلَّا عَلَىٰٓ أَزۡوَٰجِهِمۡ أَوۡ مَا مَلَكَتۡ أَيۡمَٰنُهُمۡ فَإِنَّهُمۡ غَيۡرُ مَلُومِينَ ٣٠

31. Bundan artığını istəyənlər isə həddi aşanlardır.

فَمَنِ ٱبۡتَغَىٰ وَرَآءَ ذَٰلِكَ فَأُوْلَٰٓئِكَ هُمُ ٱلۡعَادُونَ ٣١

32. O kəslər ki, əmanəti danmır və əhdlərini pozmurlar.

وَٱلَّذِينَ هُمۡ لِأَمَٰنَٰتِهِمۡ وَعَهۡدِهِمۡ رَٰعُونَ ٣٢

33. O kəslər ki, şahidliklərində mətindirlər.

وَٱلَّذِينَ هُم بِشَهَٰدَٰتِهِمۡ قَآئِمُونَ ٣٣

34. Bir də o kəslər ki, namazlarını dəqiqliklə qılırlar.

وَٱلَّذِينَ هُمۡ عَلَىٰ صَلَاتِهِمۡ يُحَافِظُونَ ٣٤

35. Cənnət bağlarında hörmət göstəriləcək insanlar da elə onlar olacaqdır.

أُوْلَٰٓئِكَ فِي جَنَّٰتٖ مُّكۡرَمُونَ ٣٥

36. Sənə doğru tələsən kafirlərə nə olub belə –

فَمَالِ ٱلَّذِينَ كَفَرُواْ قِبَلَكَ مُهۡطِعِينَ ٣٦

37. sağdan-soldan dəstələrlə ətrafına yığışırlar?

عَنِ ٱلۡيَمِينِ وَعَنِ ٱلشِّمَالِ عِزِينَ ٣٧

38. Deyəsən onların hamısı Nəim cənnətinə bir təhər girə biləcəklərini düşünürlər?

أَيَطۡمَعُ كُلُّ ٱمۡرِيٕٖ مِّنۡهُمۡ أَن يُدۡخَلَ جَنَّةَ نَعِيمٖ ٣٨

39. Xeyr! Bu mümkün deyil! Biz onları bildikləri şeydən xəlq etmişik.

كَلَّآۖ إِنَّا خَلَقۡنَٰهُم مِّمَّا يَعۡلَمُونَ ٣٩

40. And içirəm məşriqlərin və məğriblərin Rəbbinə! Biz doğrudan da, elə bir qüdrətə malikik ki, –

فَلَآ أُقۡسِمُ بِرَبِّ ٱلۡمَشَٰرِقِ وَٱلۡمَغَٰرِبِ إِنَّا لَقَٰدِرُونَ ٤٠

41. *onları* daha yaxşıları ilə əvəz edə bilərik. *Bunda* qarşımıza çıxa bilən tapılmaz.

عَلَىٰٓ أَن نُّبَدِّلَ خَيۡرٗا مِّنۡهُمۡ وَمَا نَحۡنُ بِمَسۡبُوقِينَ ٤١

**42.** Vədə verilmiş günə çatanadək onlarla daha işin olmasın, qoy boş-boş danışsınlar və əylənsinlər.

فَذَرْهُمْ يَخُوضُوا وَيَلْعَبُوا حَتَّىٰ يُلَٰقُوا يَوْمَهُمُ
ٱلَّذِى يُوعَدُونَ ﴿٤٢﴾

**43.** O gün, məbudlarına ibadətə can atırmışlar kimi onlar qəbirlərdən çıxacaqlar.

يَوْمَ يَخْرُجُونَ مِنَ ٱلْأَجْدَاثِ سِرَاعًا كَأَنَّهُمْ إِلَىٰ
نُصُبٍ يُوفِضُونَ ﴿٤٣﴾

**44.** O *gün onların* baxışları yerə dikiləcək, özlərini də zillət bürüyəcəkdir. Budur onların xəbərdar edildikləri gün!

خَٰشِعَةً أَبْصَٰرُهُمْ تَرْهَقُهُمْ ذِلَّةٌ ذَٰلِكَ ٱلْيَوْمُ ٱلَّذِى
كَانُوا۟ يُوعَدُونَ ﴿٤٤﴾



## Nuh surəsi

## سُورَةُ نُوحٍ

*Mərhəmətli və Rəhmli*
*Allahın adı ilə!*

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

1. Həqiqətən, Biz Nuhu öz qövmünə göndərdik *və dedik*: “Sən öz qövmünü, onlara ağrılı-acılı bir əzab gəlməmişdən əvvəl xəbərdar et!”

إِنَّآ أَرۡسَلۡنَا نُوحًا إِلَىٰ قَوۡمِهِۦٓ أَنۡ أَنذِرۡ قَوۡمَكَ مِن
قَبۡلِ أَن يَأۡتِيَهُمۡ عَذَابٌ أَلِيمٞ ١

2. O dedi: “Ey qövmüm! Şübhəsiz ki, mən sizi aydın bir tərzdə xəbərdar edənəm!

قَالَ يَٰقَوۡمِ إِنِّي لَكُمۡ نَذِيرٞ مُّبِينٌ ٢

3. Allaha ibadət edin, Ondan qorxun və mənə itaət edin!

أَنِ ٱعۡبُدُواْ ٱللَّهَ وَٱتَّقُوهُ وَأَطِيعُونِ ٣

4. *Belə etsəniz*, O sizin günahlarınızdan keçər və sizə müəyyən vaxtadək möhlət verər. Həqiqətən, Allahın *müəyyən etdiyi* vaxt gəlib çatdıqda əsla təxirə salınmaz. Kaş biləydiniz!”

يَغۡفِرۡ لَكُم مِّن ذُنُوبِكُمۡ وَيُؤَخِّرۡكُمۡ إِلَىٰٓ أَجَلٖ
مُّسَمًّىۚ إِنَّ أَجَلَ ٱللَّهِ إِذَا جَآءَ لَا يُؤَخَّرُۚ لَوۡ كُنتُمۡ
تَعۡلَمُونَ ٤

5. O dedi: “Ey Rəbbim, mən xalqımı gecə də, gündüz də dəvət etdim.

قَالَ رَبِّ إِنِّي دَعَوۡتُ قَوۡمِي لَيۡلٗا وَنَهَارٗا ٥

6. Amma dəvətim onların *haqdan* qaçmalarını daha da artırdı.

فَلَمۡ يَزِدۡهُمۡ دُعَآءِيٓ إِلَّا فِرَارٗا ٦

7. Sən onları bağışlayasan deyə mən hər dəfə onları *imana* dəvət etdikdə, onlar barmaqlarını qulaqlarına tıxayır, paltarlarına bürünür, *küfrlərində* israr edir və ötkəm-ötkəm təkəbbürlənirdilər.

وَإِنِّي كُلَّمَا دَعَوۡتُهُمۡ لِتَغۡفِرَ لَهُمۡ جَعَلُوٓاْ
أَصَٰبِعَهُمۡ فِيٓ ءَاذَانِهِمۡ وَٱسۡتَغۡشَوۡاْ ثِيَابَهُمۡ
وَأَصَرُّواْ وَٱسۡتَكۡبَرُواْ ٱسۡتِكۡبَارٗا ٧

8. Sonra mən onları aşkarcasına dəvət etdim.

ثُمَّ إِنِّي دَعَوۡتُهُمۡ جِهَارٗا ٨

9. Sonra mən onlara *həm uca səslə, həm də* gizlicə bildirib

ثُمَّ إِنِّيٓ أَعۡلَنتُ لَهُمۡ وَأَسۡرَرۡتُ لَهُمۡ إِسۡرَارٗا ٩

10. dedim: “Rəbbinizdən bağışlanmağınızı diləyin! Həqiqətən, O, çox Bağışlayandır!

فَقُلۡتُ ٱسۡتَغۡفِرُواْ رَبَّكُمۡ إِنَّهُۥ كَانَ غَفَّارٗا ١٠

11. O, sizin üzərinizə bol-bol yağış göndərər,

يُرۡسِلِ ٱلسَّمَآءَ عَلَيۡكُم مِّدۡرَارٗا ١١

12. var-dövlət və oğul-uşaqla sizin imdadınıza çatar, sizin üçün bağlar salar və çaylar yaradar.

وَيُمۡدِدۡكُم بِأَمۡوَٰلٖ وَبَنِينَ وَيَجۡعَل لَّكُمۡ جَنَّٰتٖ
وَيَجۡعَل لَّكُمۡ أَنۡهَٰرٗا ١٢

13. Necə olub ki, siz Allahın böyüklüyünü layiqincə uca tutmursunuz?

مَّا لَكُمۡ لَا تَرۡجُونَ لِلَّهِ وَقَارٗا ١٣

14. Axı O sizi mərhələlərlə yaratdı.

وَقَدۡ خَلَقَكُمۡ أَطۡوَارًا ١٤

15. Məgər Allahın yeddi göyü təbəqə-təbəqə necə yaratdığını görmürsünüz?

أَلَمۡ تَرَوۡاْ كَيۡفَ خَلَقَ ٱللَّهُ سَبۡعَ سَمَٰوَٰتٖ طِبَاقٗا ١٥

16. Ayı bir nur, günəşi də çıraq etmişdir.

وَجَعَلَ ٱلۡقَمَرَ فِيهِنَّ نُورٗا وَجَعَلَ ٱلشَّمۡسَ
سِرَاجٗا ١٦

17. Allah sizi torpaqdan bir bitki kimi bitirmişdir.

وَٱللَّهُ أَنۢبَتَكُم مِّنَ ٱلۡأَرۡضِ نَبَاتٗا ١٧

18. Sonra O sizi ora qaytaracaq və yenidən çıxardacaqdır.

ثُمَّ يُعِيدُكُمۡ فِيهَا وَيُخۡرِجُكُمۡ إِخۡرَاجٗا ١٨

19. Allah yeri sizin üçün xalı təki döşədi.

وَٱللَّهُ جَعَلَ لَكُمُ ٱلۡأَرۡضَ بِسَاطٗا ١٩

20. *Belə etdi* ki, orada geniş yollarla hərəkət edəsiniz”.

لِّتَسۡلُكُواْ مِنۡهَا سُبُلٗا فِجَاجٗا ٢٠

21. Nuh dedi: “Ey Rəbbim! Onlar mənə asi oldular və var-dövləti, övladı özünə zərərdən başqa bir şey artırmayan bir adama tabe oldular.

قَالَ نُوحٞ رَّبِّ إِنَّهُمۡ عَصَوۡنِي وَٱتَّبَعُواْ مَن لَّمۡ يَزِدۡهُ
مَالُهُۥ وَوَلَدُهُۥٓ إِلَّا خَسَارٗا ٢١

**22.** Onlar *mənə qarşı* böyük bir hiylə işlətdilər

وَمَكَرُوا۟ مَكْرًا كُبَّارًا ﴿٢٢﴾

**23.** və *özlərinə tabe olanlara* dedilər: "Öz məbudlarınızı tərk etməyin; Vəddi, Suvaı, Yəğusu, Yəuqu və Nəsri tərk etməyin!"

وَقَالُوا۟ لَا تَذَرُنَّ ءَالِهَتَكُمْ وَلَا تَذَرُنَّ وَدًّا وَلَا
سُوَاعًا وَلَا يَغُوثَ وَيَعُوقَ وَنَسْرًا ﴿٢٣﴾

**24.** Artıq onlar çoxlarını azdırmışlar. Sən də zalımlara azğınlıqdan başqa bir şey artırma".

وَقَدْ أَضَلُّوا۟ كَثِيرًا ۖ وَلَا تَزِدِ ٱلظَّٰلِمِينَ إِلَّا
ضَلَٰلًا ﴿٢٤﴾

**25.** Onlar öz günahlarına görə *suya* qərq edildilər və oda atıldılar. Onlar özlərinə Allahdan savayı köməkçilər tapmadılar.

مِّمَّا خَطِيٓـَٰٔتِهِمْ أُغْرِقُوا۟ فَأُدْخِلُوا۟ نَارًا فَلَمْ يَجِدُوا۟
لَهُم مِّن دُونِ ٱللَّهِ أَنصَارًا ﴿٢٥﴾

**26.** Nuh dedi: "Ey Rəbbim, kafirlərdən yer üzündə bir nəfəri belə sağ qoyma!

وَقَالَ نُوحٌ رَّبِّ لَا تَذَرْ عَلَى ٱلْأَرْضِ مِنَ ٱلْكَٰفِرِينَ
دَيَّارًا ﴿٢٦﴾

**27.** Əgər Sən onları *sağ* qoysan, onlar qullarını azdıracaq və yalnız günahkar, kafir *övladlar* doğub-törədəcəklər.

إِنَّكَ إِن تَذَرْهُمْ يُضِلُّوا۟ عِبَادَكَ وَلَا يَلِدُوٓا۟
إِلَّا فَاجِرًا كَفَّارًا ﴿٢٧﴾

**28.** Ey Rəbbim! Məni, valideynlərimi, evimə mömin kimi daxil olanları və *bütün* mömin kişi və qadınları bağışla! Zülmkarların isə ancaq həlakını artır".

رَّبِّ ٱغْفِرْ لِى وَلِوَٰلِدَىَّ وَلِمَن دَخَلَ بَيْتِىَ
مُؤْمِنًا وَلِلْمُؤْمِنِينَ وَٱلْمُؤْمِنَٰتِ وَلَا تَزِدِ
ٱلظَّٰلِمِينَ إِلَّا تَبَارًۢا ﴿٢٨﴾



## əl-Cinn
## («Cinlər») surəsi

سُورَةُ الجِنِّ

*Mərhəmətli və Rəhmli*
*Allahın adı ilə!*

بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ

1. De: "Mənə vəhy olundu ki, cinlərdən bir dəstə *Quranı* dinlədikdən sonra *öz tayfalarına qayıdıb* dedilər: "Həqiqətən, biz heyrətamiz bir Quran dinlədik!

قُلْ أُوحِيَ إِلَيَّ أَنَّهُ اسْتَمَعَ نَفَرٌ مِّنَ الْجِنِّ فَقَالُوا
إِنَّا سَمِعْنَا قُرْآنًا عَجَبًا ١

2. O, doğru yola yönəldir. Biz ona inandıq və *bundan sonra* əsla kimsəni Rəbbimizə şərik qoşmayacağıq.

يَهْدِي إِلَى الرُّشْدِ فَآمَنَّا بِهِ ۖ وَلَن نُّشْرِكَ بِرَبِّنَا
أَحَدًا ٢

3. Doğrudan da, Rəbbimizin əzəməti çox yüksəkdir. O, nə zövcə, nə də övlad sahibi olmamışdır.

وَأَنَّهُ تَعَالَىٰ جَدُّ رَبِّنَا مَا اتَّخَذَ صَاحِبَةً وَلَا
وَلَدًا ٣

4. Bizim səfehimiz *İblis* Allaha qarşı hədsiz *yalanlar* danışır.

وَأَنَّهُ كَانَ يَقُولُ سَفِيهُنَا عَلَى اللَّهِ شَطَطًا ٤

5. Biz zənnə qapılaraq düşünürdük ki, insanlar da, cinlər də Allaha iftira atmazlar.

وَأَنَّا ظَنَنَّا أَن لَّن تَقُولَ الْإِنسُ وَالْجِنُّ عَلَى اللَّهِ
كَذِبًا ٥

6. Həqiqətən, insanlardan bəziləri cinlərin bəzilərinə sığınırdılar. *Bu isə* onların azğınlığını artırırdı.

وَأَنَّهُ كَانَ رِجَالٌ مِّنَ الْإِنسِ يَعُوذُونَ بِرِجَالٍ مِّنَ
الْجِنِّ فَزَادُوهُمْ رَهَقًا ٦

7. Onlar da siz zənn etdiyiniz kimi, elə düşünürdülər ki, Allah ölənləri diriltməyəcəkdir.

وَأَنَّهُمْ ظَنُّوا كَمَا ظَنَنتُمْ أَن لَّن يَبْعَثَ اللَّهُ أَحَدًا ٧

8. Biz səmaya qalxdıqda onun sərt gözətçilər və yandırıb-yaxan alovlarla dolu olduğunun şahidi olduq.

وَأَنَّا لَمَسْنَا السَّمَاءَ فَوَجَدْنَاهَا مُلِئَتْ
حَرَسًا شَدِيدًا وَشُهُبًا ٨

9. Biz *əvvəllər gizlicə* qulaq asmaq üçün göyün bəzi sahələrində otururdıq. Amma kim bunu indi etmək istəsə, o, pusquda gözləyən yandırıcı alova rast gələr.

وَأَنَّا كُنَّا نَقْعُدُ مِنْهَا مَقَاعِدَ لِلسَّمْعِ فَمَن
يَسْتَمِعِ الْآنَ يَجِدْ لَهُ شِهَابًا رَّصَدًا ٩

10. Biz bilmirik, *bununla* yerdəkilərə pislik etmək qəsd edilmişdir, yoxsa Rəbbi onları doğru yola yönəltmək istəmişdir?

وَأَنَّا لَا نَدْرِي أَشَرٌّ أُرِيدَ بِمَن فِي الْأَرْضِ أَمْ أَرَادَ
بِهِمْ رَبُّهُمْ رَشَدًا ١٠

11. Əlbəttə, aramızda saleh əməl sahibləri də, onlar kimi olmayanlar da var. Biz ayrı-ayrı yollar tutmuşuq.

وَأَنَّا مِنَّا الصَّالِحُونَ وَمِنَّا دُونَ ذَٰلِكَ كُنَّا طَرَائِقَ
قِدَدًا ١١

12. Biz yəqin etdik ki, yer üzündə Allahdan yaxa qurtara bilmərik. *Göyə* qaçmalı olsaq da Onun əzabından yayına bilməyəcəyik.

وَأَنَّا ظَنَنَّا أَن لَّن نُّعْجِزَ اللَّهَ فِي الْأَرْضِ وَلَن
نُّعْجِزَهُ هَرَبًا ١٢

13. Biz doğru yolu göstərən rəhbəri eşitdiyimiz zaman ona iman gətirdik. Rəbbinə iman gətirən, nə *savabının* azalmasından, nə də haqsızlığa uğramaqdan qorxmaz.

وَأَنَّا لَمَّا سَمِعْنَا الْهُدَىٰ آمَنَّا بِهِ فَمَن يُؤْمِن
بِرَبِّهِ فَلَا يَخَافُ بَخْسًا وَلَا رَهَقًا ١٣

14. Sözsüz ki, bizlərdən müsəlmanlar da var, *doğru yoldan* sapanlar da. Müsəlman olan şəxslər doğru yol tutanlardır.

وَأَنَّا مِنَّا الْمُسْلِمُونَ وَمِنَّا الْقَاسِطُونَ فَمَنْ
أَسْلَمَ فَأُولَٰئِكَ تَحَرَّوْا رَشَدًا ١٤

15. *Doğru yoldan* sapanlar Cəhənnəm üçün odun olacaqlar".

وَأَمَّا الْقَاسِطُونَ فَكَانُوا لِجَهَنَّمَ حَطَبًا ١٥

16. Əgər onlar o yolda sabit qalsaydılar, Biz onlara bol-bol su verərdik.

وَأَلَّوِ اسْتَقَامُوا عَلَى الطَّرِيقَةِ لَأَسْقَيْنَاهُم مَّاءً
غَدَقًا ١٦

17. *Belə edərdik* ki, bununla onları sınayaq. Kim öz Rəbbinin zikrindən

لِّنَفْتِنَهُمْ فِيهِ وَمَن يُعْرِضْ عَن ذِكْرِ رَبِّهِ

üz döndərərsə, O, həmin şəxsi şiddətli bir əzaba məruz qoyar.

يَسْلُكْهُ عَذَابًا صَعَدًا ﴿١٧﴾

18. Şübhəsiz ki, məscidlər Allahındır. Allahdan başqa heç kəsə dua etməyin!

وَأَنَّ الْمَسَاجِدَ لِلَّهِ فَلَا تَدْعُوا مَعَ اللَّهِ أَحَدًا ﴿١٨﴾

19. Allahın qulu qalxıb Allaha dua etdikdə *cinlər* az qala onun dövrəsində bir-birinə keçib çəpər yaradırdılar.

وَأَنَّهُ لَمَّا قَامَ عَبْدُ اللَّهِ يَدْعُوهُ كَادُوا يَكُونُونَ
عَلَيْهِ لِبَدًا ﴿١٩﴾

20. De: “Mən yalnız öz Rəbbimə dua edirəm və kimisə Ona şərik qoşmuram!”

قُلْ إِنَّمَا أَدْعُو رَبِّي وَلَا أُشْرِكُ بِهِ أَحَدًا ﴿٢٠﴾

21. De: “Mən sizə nə ziyan verməyə, nə də *sizi* doğru yola yönəltməyə qadir deyiləm!”

قُلْ إِنِّي لَا أَمْلِكُ لَكُمْ ضَرًّا وَلَا رَشَدًا ﴿٢١﴾

22. De: “Həqiqətən, məni Allahdan kimsə xilas edə bilməz və mən Ondan başqa bir pənah yeri tapa bilmərəm!

قُلْ إِنِّي لَن يُجِيرَنِي مِنَ اللَّهِ أَحَدٌ وَلَنْ أَجِدَ مِن
دُونِهِ مُلْتَحَدًا ﴿٢٢﴾

23. *Mənim əlimdən gələn* ancaq Allahı və Onun göndərdiklərini təbliğ etməkdir. Kim Allaha və Onun Elçisinə asi olarsa, onun üçün içərisində əbədi qalacaqları Cəhənnəm odu hazırlanmışdır”.

إِلَّا بَلَاغًا مِّنَ اللَّهِ وَرِسَالَاتِهِ وَمَن يَعْصِ اللَّهَ
وَرَسُولَهُ فَإِنَّ لَهُ نَارَ جَهَنَّمَ خَالِدِينَ فِيهَا أَبَدًا ﴿٢٣﴾

24. Onlar özlərinə vəd olunmuş *əzabı* gördükləri zaman kimin köməkçisinin daha zəif və sayca daha az olduğunu biləcəklər.

حَتَّىٰ إِذَا رَأَوْا مَا يُوعَدُونَ فَسَيَعْلَمُونَ مَنْ
أَضْعَفُ نَاصِرًا وَأَقَلُّ عَدَدًا ﴿٢٤﴾

25. De: “Mən sizə vəd olunmuş *əzabın* yaxın olduğunu və yaxud Rəbbimin onun üçün uzun bir müddət təyin etmiş olduğunu bilmirəm.

قُلْ إِنْ أَدْرِي أَقَرِيبٌ مَّا تُوعَدُونَ أَمْ يَجْعَلُ لَهُ
رَبِّي أَمَدًا ﴿٢٥﴾

26. O, qeybi Bilәndir vә Öz qeybini heç kәsә açmaz;

عَٰلِمُ ٱلۡغَيۡبِ فَلَا يُظۡهِرُ عَلَىٰ غَيۡبِهِۦٓ أَحَدًا ٢٦

27. razı qaldığı elçidәn başqa. Hәqiqәtәn, *Allah* onların önündә vә arxasında gözәtçilәr qoyur ki,

إِلَّا مَنِ ٱرۡتَضَىٰ مِن رَّسُولٖ فَإِنَّهُۥ يَسۡلُكُ
مِنۢ بَيۡنِ يَدَيۡهِ وَمِنۡ خَلۡفِهِۦ رَصَدٗا ٢٧

28. *hәr kәs* onların, Rәbbinin göndәrdiklәrini necә tәbliğ etdiyini bilsin. *Allah* onların nә etdiklәrini nәzarәti altında saxlayır vә hәr şeyi ayrı-ayrılıqda hesaba alır".

لِّيَعۡلَمَ أَن قَدۡ أَبۡلَغُواْ رِسَٰلَٰتِ رَبِّهِمۡ وَأَحَاطَ
بِمَا لَدَيۡهِمۡ وَأَحۡصَىٰ كُلَّ شَيۡءٍ عَدَدَۢا ٢٨



## əl-Muzzəmmil («Bürünmüş») surəsi

سُورَةُ المُزَّمِّلِ

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

1. Ey *libasına* bürünüb örtünmüş *peyğəmbər*!

يَٰٓأَيُّهَا ٱلْمُزَّمِّلُ ١

2. Az bir hissəsi istisna olmaqla gecələr *namaza* dur!

قُمِ ٱلَّيْلَ إِلَّا قَلِيلًا ٢

3. *Gecənin* yarısını, yaxud ondan bir az əskilt,

نِّصْفَهُۥٓ أَوِ ٱنقُصْ مِنْهُ قَلِيلًا ٣

4. və ya ona artır. Quranı da aramla oxu!

أَوْ زِدْ عَلَيْهِ وَرَتِّلِ ٱلْقُرْءَانَ تَرْتِيلًا ٤

5. Həqiqətən Biz sənə ağır bir Söz – *Quran* vəhy edəcəyik.

إِنَّا سَنُلْقِى عَلَيْكَ قَوْلًا ثَقِيلًا ٥

6. Sözsüz ki, gecə qalxmaq çox çətin və *Quran* oxumaq daha münasibdir.

إِنَّ نَاشِئَةَ ٱلَّيْلِ هِىَ أَشَدُّ وَطْـًٔا وَأَقْوَمُ قِيلًا ٦

7. Şübhəsiz ki, gündüz sənin üçün uzun-uzadı işlər vardır.

إِنَّ لَكَ فِى ٱلنَّهَارِ سَبْحًا طَوِيلًا ٧

8. Rəbbinin adını zikr et və özünü tamamilə Ona həsr et!

وَٱذْكُرِ ٱسْمَ رَبِّكَ وَتَبَتَّلْ إِلَيْهِ تَبْتِيلًا ٨

9. O, məşriqin və məğribin Rəbbidir. Ondan başqa məbud yoxdur. Elə isə Onu *özünə* Himayəçi götür!

رَّبُّ ٱلْمَشْرِقِ وَٱلْمَغْرِبِ لَآ إِلَٰهَ إِلَّا هُوَ فَٱتَّخِذْهُ وَكِيلًا ٩

10. *Müşriklərin* dediklərinə səbir et və onlardan xoşluqla uzaqlaş.

وَٱصْبِرْ عَلَىٰ مَا يَقُولُونَ وَٱهْجُرْهُمْ هَجْرًا جَمِيلًا ١٠

11. Məni, *ayələrimi* yalan sayan var-dövlət sahibləri ilə tək burax və onlara bir az möhlət ver.

وَذَرْنِى وَٱلْمُكَذِّبِينَ أُو۟لِى ٱلنَّعْمَةِ وَمَهِّلْهُمْ قَلِيلًا ١١

12. Həqiqətən, Bizdə *onlar üçün* qandallar və Cəhənnəm hazırlanmışdır,

إِنَّ لَدَيْنَآ أَنكَالًا وَجَحِيمًا ﴿١٢﴾

13. boğazda tıxanıb keçməyən yemək və ağrılı-acılı bir əzab da *vardır.*

وَطَعَامًا ذَا غُصَّةٍ وَعَذَابًا أَلِيمًا ﴿١٣﴾

14. O gün yer və dağlar titrəyəcək, dağlar səpələnən qum təpəsinə dönəcəkdir.

يَوْمَ تَرْجُفُ ٱلْأَرْضُ وَٱلْجِبَالُ وَكَانَتِ ٱلْجِبَالُ كَثِيبًا
مَّهِيلًا ﴿١٤﴾

15. Həqiqətən, Biz Firona elçi göndərdiyimiz kimi sizə də şahidlik edəcək elçi göndərdik.

إِنَّآ أَرْسَلْنَآ إِلَيْكُمْ رَسُولًا شَٰهِدًا عَلَيْكُمْ كَمَآ
أَرْسَلْنَآ إِلَىٰ فِرْعَوْنَ رَسُولًا ﴿١٥﴾

16. Firon elçiyə asi oldu. Biz də onu şiddətli bir əzabla yaxaladıq.

فَعَصَىٰ فِرْعَوْنُ ٱلرَّسُولَ فَأَخَذْنَٰهُ أَخْذًا وَبِيلًا ﴿١٦﴾

17. Əgər küfr etsəniz, uşaqların saçlarının ağaracağı gündən necə yaxa qurtaracaqsınız?

فَكَيْفَ تَتَّقُونَ إِن كَفَرْتُمْ يَوْمًا يَجْعَلُ
ٱلْوِلْدَٰنَ شِيبًا ﴿١٧﴾

18. *O gün* göy parçalanacaq. *Allahın* vədi mütləq yerinə yetəcəkdir.

ٱلسَّمَآءُ مُنفَطِرٌۢ بِهِۦ ۚ كَانَ وَعْدُهُۥ مَفْعُولًا ﴿١٨﴾

19. Həqiqətən, bu, bir nəsihətdir. Kim istəsə, Rəbbinə tərəf yönələr.

إِنَّ هَٰذِهِۦ تَذْكِرَةٌ ۖ فَمَن شَآءَ ٱتَّخَذَ إِلَىٰ رَبِّهِۦ
سَبِيلًا ﴿١٩﴾

20. Həqiqətən, Rəbbin bilir ki, sən və səninlə olan insanların bir qismi *bəzən* gecənin üçdə ikisindən az, *bəzən* yarısını, *bəzən də* üçdə birini *ibadət üçün* durursunuz. Gecə və gündüzü Allah ölçüb müəyyənləşdirir. O, sizin bunları hesablamaqda çətinlik çəkəcəyinizi nəzərə alaraq, tövbələrinizi qəbul etdi. Elə isə *namaz qılarkən* Qurandan *sizə asan gələni* oxuyun!

۞ إِنَّ رَبَّكَ يَعْلَمُ أَنَّكَ تَقُومُ أَدْنَىٰ مِن ثُلُثَيِ ٱلَّيْلِ وَنِصْفَهُۥ
وَثُلُثَهُۥ وَطَآئِفَةٌ مِّنَ ٱلَّذِينَ مَعَكَ ۚ وَٱللَّهُ يُقَدِّرُ ٱلَّيْلَ
وَٱلنَّهَارَ ۚ عَلِمَ أَن لَّن تُحْصُوهُ فَتَابَ عَلَيْكُمْ ۖ فَٱقْرَءُوا۟ مَا
تَيَسَّرَ مِنَ ٱلْقُرْءَانِ ۚ عَلِمَ أَن سَيَكُونُ مِنكُم مَّرْضَىٰ ۙ
وَءَاخَرُونَ يَضْرِبُونَ فِى ٱلْأَرْضِ يَبْتَغُونَ مِن
فَضْلِ ٱللَّهِ ۙ وَءَاخَرُونَ يُقَٰتِلُونَ فِى سَبِيلِ ٱللَّهِ ۖ
فَٱقْرَءُوا۟ مَا تَيَسَّرَ مِنْهُ ۚ وَأَقِيمُوا۟ ٱلصَّلَوٰةَ وَءَاتُوا۟ ٱلزَّكَوٰةَ
وَأَقْرِضُوا۟ ٱللَّهَ قَرْضًا حَسَنًا ۚ وَمَا تُقَدِّمُوا۟ لِأَنفُسِكُم مِّنْ

مِّنْ خَيْرٍ تَجِدُوهُ عِندَ اللَّهِ هُوَ خَيْرًا وَأَعْظَمَ أَجْرًا وَاسْتَغْفِرُوا
اللَّهَ إِنَّ اللَّهَ غَفُورٌ رَّحِيمٌ ٢٠

O bilir ki, bəziləriniz xəstə olacaq, digərləriniz Allahın mərhəmətindən *ruzi* əldə etmək məqsədilə müxtəlif yerlərə səfərə çıxacaq, bir qisminiz də Allah yolunda vuruşacaqdır. Buna görə *namaz qılarkən* Qurandan sizə asan olanı oxuyun! Namaz qılın, zəkatınızı ödəyin və Allaha gözəl bir borc verin. Bu dünyada qabaqcadan özünüzə hansı xeyirli əməlləri tədarük etsəniz, Allah yanında onun daha xeyirlisi ilə və daha böyük mükafatla əvəz olunduğunu görəcəksiniz. Elə isə Allahdan sizi əfv etməsini istəyin! Şübhəsiz ki, Allah Bağışlayandır, Rəhmlidir!



## əl-Muddəssir («Örtünmüş») surəsi

سُورَةُ المُدَّثِّرِ

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

1. Ey *libasına bürünüb* örtünmüş *peyğəmbər*!

يَٰٓأَيُّهَا ٱلۡمُدَّثِّرُ ١

2. Qalx və *insanları* xəbərdar et!

قُمۡ فَأَنذِرۡ ٢

3. Təkcə Rəbbini uca tut!

وَرَبَّكَ فَكَبِّرۡ ٣

4. Geyimini təmiz saxla!

وَثِيَابَكَ فَطَهِّرۡ ٤

5. Pis şeyləri tərk et!

وَٱلرُّجۡزَ فَٱهۡجُرۡ ٥

6. Yaxşılığı təmənna məqsədilə etmə!

وَلَا تَمۡنُن تَسۡتَكۡثِرُ ٦

7. Rəbbin üçün səbir et!

وَلِرَبِّكَ فَٱصۡبِرۡ ٧

8. Sur üfürülərkən –

فَإِذَا نُقِرَ فِي ٱلنَّاقُورِ ٨

9. Çətin bir gün olacaq.

فَذَٰلِكَ يَوۡمَئِذٖ يَوۡمٌ عَسِيرٌ ٩

10. *Həmin gün* kafirlərə asan olmayacaqdır.

عَلَى ٱلۡكَٰفِرِينَ غَيۡرُ يَسِيرٖ ١٠

11. Məni yaratdığım kimsə ilə tək burax;

ذَرۡنِي وَمَنۡ خَلَقۡتُ وَحِيدٗا ١١

12. Mən ona bolluca var-dövlət bağışladım,

وَجَعَلۡتُ لَهُۥ مَالٗا مَّمۡدُودٗا ١٢

13. qayğısına qalan oğullar *verdim*

وَبَنِينَ شُهُودٗا ١٣

14. və onu hər cür imkanlarla təmin etdim.

وَمَهَّدتُّ لَهُۥ تَمۡهِيدٗا ١٤

15. *Bunlara baxmayaraq*, o, *yenə də* əlavə etməyimi arzulayır.

ثُمَّ يَطۡمَعُ أَنۡ أَزِيدَ ١٥

16. Xeyr! Çünki o, ayələrimizi inadla inkar edir.

كَلَّآۖ إِنَّهُۥ كَانَ لِأٓيَٰتِنَا عَنِيدٗا ١٦

17. Mən onu sərt bir yoxuşa sürükləyəcəyəm.

سَأُرْهِقُهُۥ صَعُودًا ١٧

18. Çünki o, fikirləşərək qərara gəldi.

إِنَّهُۥ فَكَّرَ وَقَدَّرَ ١٨

19. Ona ölüm olsun! Necə qərara gəldi?

فَقُتِلَ كَيْفَ قَدَّرَ ١٩

20. Sonra *yenə* ona ölüm olsun! Gör nə qərara gəldi?

ثُمَّ قُتِلَ كَيْفَ قَدَّرَ ٢٠

21. Sonra o nəzər saldı.

ثُمَّ نَظَرَ ٢١

22. Üz-gözünü turşudub qaşqabağını tökdü.

ثُمَّ عَبَسَ وَبَسَرَ ٢٢

23. Sonra da arxasını çevirib təkəbbür göstərdi

ثُمَّ أَدْبَرَ وَٱسْتَكْبَرَ ٢٣

24. və dedi: "Bu, sehrbazlardan *eşidilib təkrarlanan* sehrdən başqa bir şey deyildir!

فَقَالَ إِنْ هَٰذَآ إِلَّا سِحْرٌ يُؤْثَرُ ٢٤

25. Bu, adi insan kəlamıdır!

إِنْ هَٰذَآ إِلَّا قَوْلُ ٱلْبَشَرِ ٢٥

26. Mən onu Səqərə salacağam.

سَأُصْلِيهِ سَقَرَ ٢٦

27. Sən haradan biləsən ki, Səqər nədir?!

وَمَآ أَدْرَىٰكَ مَا سَقَرُ ٢٧

28. O, kimsəni *sağ-salamat* buraxmaz,

لَا تُبْقِى وَلَا تَذَرُ ٢٨

29. dərini yandırıb-yaxar.

لَوَّاحَةٌ لِّلْبَشَرِ ٢٩

30. Onun üzərində on doqquz *gözətçi mələk* vardır.

عَلَيْهَا تِسْعَةَ عَشَرَ ٣٠

31. Biz Cəhənnəm gözətçilərini yalnız mələklərdən etdik və onların sayını *on doqquz* etdik ki, *bu*, kafirlər üçün ancaq bir sınaq olsun, özlərinə Kitab verilənlər yəqinlik hasil etsinlər, iman gətirənlərin imanı artsın, Kitab verilənlər və möminlər *haqqa*

وَمَا جَعَلْنَآ أَصْحَٰبَ ٱلنَّارِ إِلَّا مَلَٰٓئِكَةً ۙ وَمَا جَعَلْنَا
عِدَّتَهُمْ إِلَّا فِتْنَةً لِّلَّذِينَ كَفَرُوا۟ لِيَسْتَيْقِنَ ٱلَّذِينَ
أُوتُوا۟ ٱلْكِتَٰبَ وَيَزْدَادَ ٱلَّذِينَ ءَامَنُوٓا۟ إِيمَٰنًا ۙ وَلَا يَرْتَابَ
ٱلَّذِينَ أُوتُوا۟ ٱلْكِتَٰبَ وَٱلْمُؤْمِنُونَ ۙ وَلِيَقُولَ ٱلَّذِينَ
فِى قُلُوبِهِم مَّرَضٌ وَٱلْكَٰفِرُونَ مَاذَآ أَرَادَ ٱللَّهُ بِهَٰذَا

şübhə etməsinlər və qəlblərində xəstəlik olanlar və kafirlər: “Allah bu məsəllə nə demək istəyir?”– desinlər. Allah istədiyi kimsəni belə azdırır, istədiyini də doğru yola yönəldir. Sənin Rəbbinin qoşunları barədə yalnız Özü bilir. Bu, bəşəriyyət üçün ancaq bir xatırlatmadır.

مَثَلًا كَذَٰلِكَ يُضِلُّ ٱللَّهُ مَن يَشَآءُ وَيَهْدِى مَن يَشَآءُ وَمَا يَعْلَمُ جُنُودَ رَبِّكَ إِلَّا هُوَ وَمَا هِىَ إِلَّا ذِكْرَىٰ لِلْبَشَرِ ٣١

32. Xeyr! And olsun aya!

كَلَّا وَٱلْقَمَرِ ٣٢

33. And olsun dönüb uzaqlaşan gecəyə!

وَٱلَّيْلِ إِذْ أَدْبَرَ ٣٣

34. And olsun ağarmaqda olan sübh çağına!

وَٱلصُّبْحِ إِذَآ أَسْفَرَ ٣٤

35. Doğrudan da o *Cəhənnəm* ən böyük fəlakətdir,

إِنَّهَا لَإِحْدَى ٱلْكُبَرِ ٣٥

36. həm bəşəriyyət üçün xəbərdarlıqdır,

نَذِيرًا لِّلْبَشَرِ ٣٦

37. həm də sizlərdən *yaxşı işlər görüb* irəli çıxmaq və ya *günah edib* geriyə düşmək istəyənlər üçün.

لِمَن شَآءَ مِنكُمْ أَن يَتَقَدَّمَ أَوْ يَتَأَخَّرَ ٣٧

38. Hər bir kəs qazandığının girovuna çevrilir,

كُلُّ نَفْسٍ بِمَا كَسَبَتْ رَهِينَةٌ ٣٨

39. sağ tərəf sahiblərindən başqa.

إِلَّآ أَصْحَٰبَ ٱلْيَمِينِ ٣٩

40. Onlar Cənnət bağlarında bir-birlərindən soruşacaqlar –

فِى جَنَّٰتٍ يَتَسَآءَلُونَ ٤٠

41. günahkarlar barəsində.

عَنِ ٱلْمُجْرِمِينَ ٤١

42. Sizi Səqərə salan nədir?

مَا سَلَكَكُمْ فِى سَقَرَ ٤٢

43. Onlar deyəcəklər: “Biz namaz qılanlardan deyildik.

قَالُوا۟ لَمْ نَكُ مِنَ ٱلْمُصَلِّينَ ٤٣

44. Kasıbı da yedizdirməzdik.

وَلَمْ نَكُ نُطْعِمُ ٱلْمِسْكِينَ ٤٤

45. *Batil sözlər* danışanlarla birlikdə biz də danışardıq,

وَكُنَّا نَخُوضُ مَعَ ٱلۡخَآئِضِينَ ٤٥

46. və Haqq-hesab gününü yalan hesab edərdik –

وَكُنَّا نُكَذِّبُ بِيَوۡمِ ٱلدِّينِ ٤٦

47. *ölüm* yəqinliyi bizə gələnə qədər".

حَتَّىٰٓ أَتَىٰنَا ٱلۡيَقِينُ ٤٧

48. Odur ki, şəfaət edənlərin şəfaəti onlara fayda verməz.

فَمَا تَنفَعُهُمۡ شَفَٰعَةُ ٱلشَّٰفِعِينَ ٤٨

49. Onlara nə olub ki, nəsihətdən üz döndərirlər?

فَمَا لَهُمۡ عَنِ ٱلتَّذۡكِرَةِ مُعۡرِضِينَ ٤٩

50. Sanki ürküdülmüş *vəhşi* uzunqulaqlardır ki,

كَأَنَّهُمۡ حُمُرٞ مُّسۡتَنفِرَةٞ ٥٠

51. ovçulardan *yaxud aslandan* qaçırlar.

فَرَّتۡ مِن قَسۡوَرَةِۭ ٥١

52. Əksinə, onlardan hər biri vəhy olunmuş səhifələrin *məhz* ona verilməsini istəyir.

بَلۡ يُرِيدُ كُلُّ ٱمۡرِيٕٖ مِّنۡهُمۡ أَن يُؤۡتَىٰ صُحُفٗا مُّنَشَّرَةٗ ٥٢

53. Xeyr! Əksinə, onlar Axirətdən qorxmurlar.

كَلَّاۖ بَل لَّا يَخَافُونَ ٱلۡأٓخِرَةَ ٥٣

54. Xeyr! Bu *Quran* bir nəsihətdir.

كَلَّآ إِنَّهُۥ تَذۡكِرَةٞ ٥٤

55. İstəyən onu xatırlayar.

فَمَن شَآءَ ذَكَرَهُۥ ٥٥

56. *B*ilin ki, Allah istəmədikcə onlar xatırlaya bilməzlər. Mütləq qüdrətindən qorxub çəkinməyə layiq olan da, bağışlamağa qadir olan da Odur!

وَمَا يَذۡكُرُونَ إِلَّآ أَن يَشَآءَ ٱللَّهُۚ هُوَ أَهۡلُ ٱلتَّقۡوَىٰ وَأَهۡلُ ٱلۡمَغۡفِرَةِ ٥٦



## əl-Qiyamə («Qiyamət») surəsi

## سُورَةُ القِيَامَةِ

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

1. And içirəm Qiyamət gününə!
2. And içirəm peşmançılıq çəkən nəfsə!
3. İnsan elə düşünür ki, Biz onun sümüklərini yığa bilməyəcəyik.
4. Mütləq *yığacağıq*! Biz onun barmaq uclarını bərpa etməyə qadirik.
5. Lakin insan *bundan sonra da* günah etmək fikrindədir.
6. O: "Qiyamət günü nə vaxt olacaq!"– deyə *rişxəndlə* soruşur.
7. Gözlər bərələ qalacağı,
8. ay tutulacağı
9. və günəşlə ayın qovuşacağı zaman –
10. o gün insan deyəcəkdir: "Hara qaçaq?"
11. Xeyr, *o gün pənah aparılacaq yer* tapılmayacaq.
12. O gün qayıdış ancaq sənin Rəbbinə olacaqdır.
13. O gün insana əvvəllər etdiyi və sonraya saxladığı *əməlləri* barədə xəbər veriləcəkdir.
14. Əslində, insan öz əleyhinə şahidlik edəcəkdir –

لَآ أُقْسِمُ بِيَوْمِ ٱلْقِيَٰمَةِ ١

وَلَآ أُقْسِمُ بِٱلنَّفْسِ ٱللَّوَّامَةِ ٢

أَيَحْسَبُ ٱلْإِنسَٰنُ أَلَّن نَّجْمَعَ عِظَامَهُۥ ٣

بَلَىٰ قَٰدِرِينَ عَلَىٰٓ أَن نُّسَوِّىَ بَنَانَهُۥ ٤

بَلْ يُرِيدُ ٱلْإِنسَٰنُ لِيَفْجُرَ أَمَامَهُۥ ٥

يَسْـَٔلُ أَيَّانَ يَوْمُ ٱلْقِيَٰمَةِ ٦

فَإِذَا بَرِقَ ٱلْبَصَرُ ٧

وَخَسَفَ ٱلْقَمَرُ ٨

وَجُمِعَ ٱلشَّمْسُ وَٱلْقَمَرُ ٩

يَقُولُ ٱلْإِنسَٰنُ يَوْمَئِذٍ أَيْنَ ٱلْمَفَرُّ ١٠

كَلَّا لَا وَزَرَ ١١

إِلَىٰ رَبِّكَ يَوْمَئِذٍ ٱلْمُسْتَقَرُّ ١٢

يُنَبَّؤُا۟ ٱلْإِنسَٰنُ يَوْمَئِذٍۭ بِمَا قَدَّمَ وَأَخَّرَ ١٣

بَلِ ٱلْإِنسَٰنُ عَلَىٰ نَفْسِهِۦ بَصِيرَةٌ ١٤

| | |
|---|---|
| **15.** üzrlü olub-olmadığı bütün halları ortaya qoysa da. | وَلَوْ أَلْقَىٰ مَعَاذِيرَهُۥ ﴿١٥﴾ |
| **16.** *Cəbrail sənə Quranı nazil etdikdə* onu tələm-tələsik yadda saxlamaq üçün dilini tərpətmə! | لَا تُحَرِّكْ بِهِۦ لِسَانَكَ لِتَعْجَلَ بِهِۦٓ ﴿١٦﴾ |
| **17.** Şübhəsiz ki, *sənin qəlbində* onun qərar tutması və *dilinlə* onun oxunması Bizə aiddir. | إِنَّ عَلَيْنَا جَمْعَهُۥ وَقُرْءَانَهُۥ ﴿١٧﴾ |
| **18.** Biz onu oxuduğumuz zaman sən onun oxunuşunu izlə. | فَإِذَا قَرَأْنَٰهُ فَٱتَّبِعْ قُرْءَانَهُۥ ﴿١٨﴾ |
| **19.** Sonra, sözsüz ki, onu izah etmək də Bizə aiddir. | ثُمَّ إِنَّ عَلَيْنَا بَيَانَهُۥ ﴿١٩﴾ |
| **20.** Xeyr! Əksinə, siz tez ötüb keçən *fani dünyanı* sevir, | كَلَّا بَلْ تُحِبُّونَ ٱلْعَاجِلَةَ ﴿٢٠﴾ |
| **21.** Axirətdən isə uzaqlaşırsınız. | وَتَذَرُونَ ٱلْءَاخِرَةَ ﴿٢١﴾ |
| **22.** O gün *neçə-neçə* üzlər nurlanacaq | وُجُوهٌ يَوْمَئِذٍ نَّاضِرَةٌ ﴿٢٢﴾ |
| **23.** və öz Rəbbinə baxacaqdır. | إِلَىٰ رَبِّهَا نَاظِرَةٌ ﴿٢٣﴾ |
| **24.** O gün *neçə-neçə* üzlər də tutulub qaralacaq | وَوُجُوهٌ يَوْمَئِذٍۭ بَاسِرَةٌ ﴿٢٤﴾ |
| **25.** və yəqin edəcək ki, onlara müsibət artıq üz vermişdir. | تَظُنُّ أَن يُفْعَلَ بِهَا فَاقِرَةٌ ﴿٢٥﴾ |
| **26.** Xeyr, o *ruh* körpücük sümüklərinə yetişəcəyi zaman; | كَلَّآ إِذَا بَلَغَتِ ٱلتَّرَاقِىَ ﴿٢٦﴾ |
| **27.** "Ovsunu kim oxuyacaq?"– deyiləcəkdir. | وَقِيلَ مَنْ رَاقٍ ﴿٢٧﴾ |
| **28.** *Can verən adam dünya həyatından* ayrıldığını yəqin edəcəyi | وَظَنَّ أَنَّهُ ٱلْفِرَاقُ ﴿٢٨﴾ |
| **29.** və ayaq ayağa dolaşacağı zaman – | وَٱلْتَفَّتِ ٱلسَّاقُ بِٱلسَّاقِ ﴿٢٩﴾ |

**30.** o gün *hər kəs* Rəbbinin hüzuruna gətiriləcəkdir.

إِلَىٰ رَبِّكَ يَوْمَئِذٍ ٱلْمَسَاقُ ٣٠

**31.** O *kafir* nə *Quranı* təsdiq etdi, nə də namaz qıldı.

فَلَا صَدَّقَ وَلَا صَلَّىٰ ٣١

**32.** *Haqqı da* yalan saydı və üz döndərdi.

وَلَٰكِن كَذَّبَ وَتَوَلَّىٰ ٣٢

**33.** Sonra da lovğa-lovğa öz ailəsinin yanına getdi.

ثُمَّ ذَهَبَ إِلَىٰٓ أَهْلِهِۦ يَتَمَطَّىٰٓ ٣٣

**34.** Vay sənin halına, vay!

أَوْلَىٰ لَكَ فَأَوْلَىٰ ٣٤

**35.** Yenə də vay sənin halına, vay!

ثُمَّ أَوْلَىٰ لَكَ فَأَوْلَىٰٓ ٣٥

**36.** Bəlkə insan özbaşına qoyulacağını güman edir?

أَيَحْسَبُ ٱلْإِنسَٰنُ أَن يُتْرَكَ سُدًى ٣٦

**37.** Məgər o, *kişi* toxumundan axıdılan bir damla nütfə deyildimi?

أَلَمْ يَكُ نُطْفَةً مِّن مَّنِىٍّ يُمْنَىٰ ٣٧

**38.** Sonra laxtalanmış qan oldu. Allah *onu* yaradıb kamil bir görkəmə saldı.

ثُمَّ كَانَ عَلَقَةً فَخَلَقَ فَسَوَّىٰ ٣٨

**39.** Ondan da bir cüt kişi və qadın yaratdı.

فَجَعَلَ مِنْهُ ٱلزَّوْجَيْنِ ٱلذَّكَرَ وَٱلْأُنثَىٰٓ ٣٩

**40.** Məgər O, ölüləri diriltməyə qadir deyil?

أَلَيْسَ ذَٰلِكَ بِقَٰدِرٍ عَلَىٰٓ أَن يُحْۦِىَ ٱلْمَوْتَىٰ ٤٠



## əl-İnsan
## («İnsan») surəsi

## سُورَةُ الإِنسَانِ

*Mərhəmətli və Rəhmli*
*Allahın adı ilə!*

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

1. Doğrudanmı insanın heç kimə məlum olmadığı bir dövr hələ də ötüb keçməmişdir?

هَلْ أَتَىٰ عَلَى ٱلْإِنسَٰنِ حِينٌ مِّنَ ٱلدَّهْرِ لَمْ يَكُن شَيْـًٔا
مَّذْكُورًا ١

2. İnsanı qarışdırılmış nütfədən yaradaraq onu sınaqdan keçirmək məqsədilə eşidən və görən etdik.

إِنَّا خَلَقْنَا ٱلْإِنسَٰنَ مِن نُّطْفَةٍ أَمْشَاجٍ نَّبْتَلِيهِ
فَجَعَلْنَٰهُ سَمِيعًۢا بَصِيرًا ٢

3. Şübhəsiz ki, Biz ona yol göstərdik! Fərqi yoxdur, ya şükür etsin, ya da naşükür olsun.

إِنَّا هَدَيْنَٰهُ ٱلسَّبِيلَ إِمَّا شَاكِرًا وَإِمَّا كَفُورًا ٣

4. Doğrudan da, kafirlərdən ötrü zəncirlər, buxovlar və alovsaçan od hazırlamışıq.

إِنَّآ أَعْتَدْنَا لِلْكَٰفِرِينَ سَلَٰسِلَا۟ وَأَغْلَٰلًا وَسَعِيرًا ٤

5. Sözsüz ki, itaətkarlar kafur qatılmış *şərabla dolu* badələrdən nuş edəcəklər.

إِنَّ ٱلْأَبْرَارَ يَشْرَبُونَ مِن كَأْسٍ كَانَ مِزَاجُهَا كَافُورًا ٥

6. *Bu elə* bir bulaqdır ki, Allahın qulları ondan doyunca içər və onun mənsəbini istədikləri səmtə yönəldərlər.

عَيْنًا يَشْرَبُ بِهَا عِبَادُ ٱللَّهِ يُفَجِّرُونَهَا تَفْجِيرًا ٦

7. Onlar vəd etdikləri nəziri verər və dəhşəti *hər yeri* sarsıdacaq gündən qorxarlar.

يُوفُونَ بِٱلنَّذْرِ وَيَخَافُونَ يَوْمًا كَانَ شَرُّهُۥ مُسْتَطِيرًا ٧

8. Onlar özlərinin istədikləri şeylərdən kasıba, yetimə və əsirə də verərlər

وَيُطْعِمُونَ ٱلطَّعَامَ عَلَىٰ حُبِّهِۦ مِسْكِينًا وَيَتِيمًا
وَأَسِيرًا ٨

9. *və deyərlər*: "Biz sizi yalnız Allahın Üzü xatirinə (ixlasla, savabını Allahdan umaraq) yedirdirik

إِنَّمَا نُطْعِمُكُمْ لِوَجْهِ ٱللَّهِ لَا نُرِيدُ مِنكُمْ جَزَآءً وَلَا
شُكُورًا ٩

və sizdən nə əvəzini, nə də minnətdarlıq gözləyirik!

10. Əslində, biz, Rəbbimizdən gələ bilən çox kəskin və ağır bir gündən ehtiyat edirik!"

إِنَّا نَخَافُ مِن رَّبِّنَا يَوْمًا عَبُوسًا قَمْطَرِيرًا ﴿١٠﴾

11. Bunun əvəzində Allah da onları həmin günün şərindən qoruyar və onlara gözəllik və sevinc nəsib edər;

فَوَقَىٰهُمُ ٱللَّهُ شَرَّ ذَٰلِكَ ٱلْيَوْمِ وَلَقَّىٰهُمْ نَضْرَةً وَسُرُورًا ﴿١١﴾

12. onlara səbir etdiklərinə görə Cənnəti bəxş edər və *orada geyəcəkləri* ipəklə mükafatlandırar.

وَجَزَىٰهُم بِمَا صَبَرُوا۟ جَنَّةً وَحَرِيرًا ﴿١٢﴾

13. *Onlar* orada taxtlar üzərində mütəkkələrə dirsəklənəcək və orada nə günəş, nə də şaxta görməyəcəklər.

مُّتَّكِـِٔينَ فِيهَا عَلَى ٱلْأَرَآئِكِ ۖ لَا يَرَوْنَ فِيهَا شَمْسًا وَلَا زَمْهَرِيرًا ﴿١٣﴾

14. *Cənnət ağaclarının* kölgələri özləri onlara yaxınlaşacaq, meyvələri də tam onların ixtiyarına veriləcək.

وَدَانِيَةً عَلَيْهِمْ ظِلَـٰلُهَا وَذُلِّلَتْ قُطُوفُهَا تَذْلِيلًا ﴿١٤﴾

15. Onların ətrafına təamlarla dolu gümüşdən hazırlanmış qablar və büllur qədəhlər dolandırılacaq.

وَيُطَافُ عَلَيْهِم بِـَٔانِيَةٍ مِّن فِضَّةٍ وَأَكْوَابٍ كَانَتْ قَوَارِيرَا۠ ﴿١٥﴾

16. Gümüşdən olan elə büllur qədəhlər ki, *xidmətçilər* onları *cənnətdəkilərin* içmək istədikləri həcmdə hazırlamışlar.

قَوَارِيرَا۟ مِن فِضَّةٍ قَدَّرُوهَا تَقْدِيرًا ﴿١٦﴾

17. Orada onlara zəncəfil qatılmış *şərab badəsi* içirdiləcək.

وَيُسْقَوْنَ فِيهَا كَأْسًا كَانَ مِزَاجُهَا زَنجَبِيلًا ﴿١٧﴾

18. *Bu elə* bir bulaqdandır ki, o, Cənnətdə Səlsəbil adlanır.

عَيْنًا فِيهَا تُسَمَّىٰ سَلْسَبِيلًا ﴿١٨﴾

19. Onların ətrafında həmişə gənc olan *xidmətçi* cavanlar dolanacaqlar. Onları gördükdə səpələnmiş mirvari dənələri olduqlarını sanarsan.

۞ وَيَطُوفُ عَلَيْهِمْ وِلْدَٰنٌ مُّخَلَّدُونَ إِذَا رَأَيْتَهُمْ حَسِبْتَهُمْ لُؤْلُؤًا مَّنثُورًا ﴿١٩﴾

20. *Cənnətdə* hara baxsan nemət və əzəmətli səltənət nişanəsi görərsən.

وَإِذَا رَأَيْتَ ثَمَّ رَأَيْتَ نَعِيمًا وَمُلْكًا كَبِيرًا ٢٠

21. Onlar əyinlərinə taftadan və atlazdan yaşıl paltarlar geyəcəklər. Onların qoluna gümüş bilərziklər bağlanacaq. Onların Rəbbi onlara tərtəmiz şərab içirdəcəkdir.

عَٰلِيَهُمْ ثِيَابُ سُندُسٍ خُضْرٌ وَإِسْتَبْرَقٌ وَحُلُّوٓا۟
أَسَاوِرَ مِن فِضَّةٍ وَسَقَىٰهُمْ رَبُّهُمْ شَرَابًا طَهُورًا ٢١

22. *Onlara deyiləcəkdir*: "Həqiqətən, bu sizə bir hədiyyədir və səyiniz təşəkkürə layiqdir".

إِنَّ هَٰذَا كَانَ لَكُمْ جَزَآءً وَكَانَ سَعْيُكُم مَّشْكُورًا ٢٢

23. Biz Quranı sənə hissə-hissə aramla nazil etdik.

إِنَّا نَحْنُ نَزَّلْنَا عَلَيْكَ ٱلْقُرْءَانَ تَنزِيلًا ٢٣

24. Belə ki, Rəbbinin qərar verəcəyinə qədər səbir et və onlardan heç bir günahkara və ya nankora itaət etmə!

فَٱصْبِرْ لِحُكْمِ رَبِّكَ وَلَا تُطِعْ مِنْهُمْ ءَاثِمًا أَوْ
كَفُورًا ٢٤

25. Səhər-axşam Rəbbinin adını zikr et!

وَٱذْكُرِ ٱسْمَ رَبِّكَ بُكْرَةً وَأَصِيلًا ٢٥

26. Gecənin bir hissəsində Ona səcdə et və gecədə uzun müddət Onun şəninə təriflər de!

وَمِنَ ٱلَّيْلِ فَٱسْجُدْ لَهُۥ وَسَبِّحْهُ لَيْلًا
طَوِيلًا ٢٦

27. Əsl həqiqətdə, bunlar ötəri dünyanı üstün tutaraq qarşılarındakı ağır günü görməməzliyə vururlar.

إِنَّ هَٰٓؤُلَآءِ يُحِبُّونَ ٱلْعَاجِلَةَ وَيَذَرُونَ وَرَآءَهُمْ
يَوْمًا ثَقِيلًا ٢٧

28. Biz onları yaratdıq və xilqətini möhkəmlətdik. Əgər istəsək, onları özlərinə bənzərləri ilə dəyişdirərik.

نَّحْنُ خَلَقْنَٰهُمْ وَشَدَدْنَآ أَسْرَهُمْ وَإِذَا شِئْنَا
بَدَّلْنَآ أَمْثَٰلَهُمْ تَبْدِيلًا ٢٨

29. Həqiqətən, bu bir ibrətdir. İstəyən, Rəbbinə doğru aparan bir yol tutar.

إِنَّ هَٰذِهِۦ تَذْكِرَةٌ فَمَن شَآءَ ٱتَّخَذَ إِلَىٰ رَبِّهِۦ
سَبِيلًا ٢٩

30. Amma Allah istəməyincə, siz istəyə bilməzsiniz! Həqiqətən, Allah Bilәndir, Müdrikdir!

وَمَا تَشَآءُونَ إِلَّآ أَن يَشَآءَ ٱللَّهُ إِنَّ ٱللَّهَ كَانَ
عَلِيمًا حَكِيمًا ٣٠

31. O, istədiyini Öz mərhəmətinə qovuşdurar. Zalımlara isə, O, ağrılı-acılı əzab hazırlamışdır.

يُدۡخِلُ مَن يَشَآءُ فِي رَحۡمَتِهِۦۚ وَٱلظَّٰلِمِينَ أَعَدَّ لَهُمۡ عَذَابًا أَلِيمَۢا ٣١



## əl-Mursəlat («Göndərilənlər») surəsi

## سُورَةُ المُرۡسَلَاتِ

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

| | |
|---|---|
| 1. And olsun xeyirlə göndərilənlərə | وَٱلۡمُرۡسَلَٰتِ عُرۡفٗا ١ |
| 2. və şiddətlə əsənlərə! | فَٱلۡعَٰصِفَٰتِ عَصۡفٗا ٢ |
| 3. And olsun *Allahın əmrini* yaydıqca yayanlara, | وَٱلنَّٰشِرَٰتِ نَشۡرٗا ٣ |
| 4. *haqqı nahaqdan* ayırdıqca ayıranlara | فَٱلۡفَٰرِقَٰتِ فَرۡقٗا ٤ |
| 5. və zikri çatdıranlara – | فَٱلۡمُلۡقِيَٰتِ ذِكۡرًا ٥ |
| 6. üzr diləmək və ya qorxutmaq üçün *çatdıranlara*! | عُذۡرًا أَوۡ نُذۡرًا ٦ |
| 7. Sizə vəd edilmiş *Qiyamət* mütləq vaqe olacaqdır. | إِنَّمَا تُوعَدُونَ لَوَٰقِعٞ ٧ |
| 8. Ulduzlar sönəcəyi zaman; | فَإِذَا ٱلنُّجُومُ طُمِسَتۡ ٨ |
| 9. Göy yarılacağı zaman; | وَإِذَا ٱلسَّمَآءُ فُرِجَتۡ ٩ |
| 10. Dağlar dağılacağı zaman; | وَإِذَا ٱلۡجِبَالُ نُسِفَتۡ ١٠ |
| 11. Elçilərə vaxt təyin olunacağı zaman | وَإِذَا ٱلرُّسُلُ أُقِّتَتۡ ١١ |
| 12. *deyiləcəkdir*: "*Bunlara* verilmiş möhlət hansı günə qədərdir?" | لِأَيِّ يَوۡمٍ أُجِّلَتۡ ١٢ |
| 13. *Deyiləcəkdir*: "Ayırd etmə gününədək!" | لِيَوۡمِ ٱلۡفَصۡلِ ١٣ |
| 14. Sən ayırd etmə gününün nə olduğunu bilirsənmi? | وَمَآ أَدۡرَىٰكَ مَا يَوۡمُ ٱلۡفَصۡلِ ١٤ |
| 15. *Qiyaməti* yalan sayanların o gün vay halına! | وَيۡلٞ يَوۡمَئِذٖ لِّلۡمُكَذِّبِينَ ١٥ |

| | |
|---|---|
| **16.** Məgər Biz ilk nəsilləri həlak etmədikmi?! | أَلَمْ نُهْلِكِ ٱلْأَوَّلِينَ ١٦ |
| **17.** Sonrakıları da onlara qatacağıq. | ثُمَّ نُتْبِعُهُمُ ٱلْآخِرِينَ ١٧ |
| **18.** Biz günah sahibləri ilə belə davranırıq. | كَذَٰلِكَ نَفْعَلُ بِٱلْمُجْرِمِينَ ١٨ |
| **19.** *Qiyaməti* yalan sayanların o Gün vay halına! | وَيْلٌ يَوْمَئِذٍ لِّلْمُكَذِّبِينَ ١٩ |
| **20.** Məgər Biz sizi dəyərsiz bir sudan xəlq etmədikmi? | أَلَمْ نَخْلُقكُّم مِّن مَّآءٍ مَّهِينٍ ٢٠ |
| **21.** Biz onu etibarlı bir yerdə yerləşdirmədikmi – | فَجَعَلْنَٰهُ فِى قَرَارٍ مَّكِينٍ ٢١ |
| **22.** məlum bir vaxta kimi? | إِلَىٰ قَدَرٍ مَّعْلُومٍ ٢٢ |
| **23.** Biz *nütfəni yaratmağa* qadir olduq. Nə gözəl Qadir olanlarıq *Biz*! | فَقَدَرْنَا فَنِعْمَ ٱلْقَٰدِرُونَ ٢٣ |
| **24.** *Qiyaməti* yalan sayanların o gün vay halına! | وَيْلٌ يَوْمَئِذٍ لِّلْمُكَذِّبِينَ ٢٤ |
| **25.** Məgər Biz yeri məskən etmədikmi – | أَلَمْ نَجْعَلِ ٱلْأَرْضَ كِفَاتًا ٢٥ |
| **26.** dirilər və ölülərə? | أَحْيَآءً وَأَمْوَٰتًا ٢٦ |
| **27.** Orada möhkəm dayanan uca dağlar yaratmadıqmı və sizə şirin sulardan içirtmədikmi? | وَجَعَلْنَا فِيهَا رَوَٰسِىَ شَٰمِخَٰتٍ وَأَسْقَيْنَٰكُم مَّآءً فُرَاتًا ٢٧ |
| **28.** *Qiyaməti* yalan sayanların o gün vay halına! | وَيْلٌ يَوْمَئِذٍ لِّلْمُكَذِّبِينَ ٢٨ |
| **29.** *Onlara belə deyiləcək*: "Gedin yalan hesab etdiyiniz *Cəhənnəmə*! | ٱنطَلِقُوٓا۟ إِلَىٰ مَا كُنتُم بِهِۦ تُكَذِّبُونَ ٢٩ |
| **30.** Üç qola ayrılan kölgəliyə gedin!" | ٱنطَلِقُوٓا۟ إِلَىٰ ظِلٍّ ذِى ثَلَٰثِ شُعَبٍ ٣٠ |
| **31.** Ora nə kölgə salır, nə də alovdan qoruyur. | لَّا ظَلِيلٍ وَلَا يُغْنِى مِنَ ٱللَّهَبِ ٣١ |

**32.** *Cəhənnəm* hərəsi hündür imarət həcmində qığılcımlar püskürür.

إِنَّهَا تَرْمِي بِشَرَرٍ كَالْقَصْرِ ٣٢

**33.** Onlar sanki sarı dəvələrdir.

كَأَنَّهُ جِمَالَتٌ صُفْرٌ ٣٣

**34.** *Qiyaməti* yalan sayanların o gün vay halına!

وَيْلٌ يَوْمَئِذٍ لِلْمُكَذِّبِينَ ٣٤

**35.** Bu, *günahkarların* danışa bilməyəcəkləri bir gündür.

هَٰذَا يَوْمُ لَا يَنطِقُونَ ٣٥

**36.** Onlara üzrxahlıq üçün izin belə verilməyəcəkdir.

وَلَا يُؤْذَنُ لَهُمْ فَيَعْتَذِرُونَ ٣٦

**37.** *Qiyaməti* yalan sayanların o gün vay halına!

وَيْلٌ يَوْمَئِذٍ لِلْمُكَذِّبِينَ ٣٧

**38.** Bu *gün, haqqı batildən* ayırd etmə günüdür. *Ey kafirlər*! Biz həm sizi, həm də əvvəlkiləri *bir yerə* cəm etdik!

هَٰذَا يَوْمُ الْفَصْلِ جَمَعْنَاكُمْ وَالْأَوَّلِينَ ٣٨

**39.** Əgər hiyləniz varsa, Mənə qarşı işlədin!

فَإِن كَانَ لَكُمْ كَيْدٌ فَكِيدُونِ ٣٩

**40.** *Qiyaməti* yalan sayanların o gün vay halına!

وَيْلٌ يَوْمَئِذٍ لِلْمُكَذِّبِينَ ٤٠

**41.** Şübhəsiz ki, müttəqilər kölgəliklərdə, çeşmələr başında

إِنَّ الْمُتَّقِينَ فِي ظِلَالٍ وَعُيُونٍ ٤١

**42.** və istədikləri meyvələr içində olacaqlar.

وَفَوَاكِهَ مِمَّا يَشْتَهُونَ ٤٢

**43.** *Onlara deyiləcək*: "Xeyirxah əməllərinizə görə nuşcanlıqla yeyin-için!

كُلُوا وَاشْرَبُوا هَنِيئًا بِمَا كُنتُمْ تَعْمَلُونَ ٤٣

**44.** Şübhəsiz ki, Biz yaxşı əməl sahiblərini belə mükafatlandırırıq!"

إِنَّا كَذَٰلِكَ نَجْزِي الْمُحْسِنِينَ ٤٤

**45.** *Qiyaməti* yalan sayanların o gün vay halına!

وَيۡلٞ يَوۡمَئِذٖ لِّلۡمُكَذِّبِينَ ٤٥

**46.** Kafirlərə deyiləcək: “Yeyin və bir az əylənin! Həqiqətən, siz günahkarlarsınız!

كُلُواْ وَتَمَتَّعُواْ قَلِيلًا إِنَّكُم مُّجۡرِمُونَ ٤٦

**47.** *Qiyaməti* yalan sayanların o gün vay halına!

وَيۡلٞ يَوۡمَئِذٖ لِّلۡمُكَذِّبِينَ ٤٧

**48.** Onlara: “Rüku edin!”– deyildiyi zaman rüku etməzlər.

وَإِذَا قِيلَ لَهُمُ ٱرۡكَعُواْ لَا يَرۡكَعُونَ ٤٨

**49.** *Qiyaməti* yalan sayanların o gün vay halına!

وَيۡلٞ يَوۡمَئِذٖ لِّلۡمُكَذِّبِينَ ٤٩

**50.** Onlar bu *Qurandan* sonra hansı sözə inanacaqlar?

فَبِأَيِّ حَدِيثِۭ بَعۡدَهُۥ يُؤۡمِنُونَ ٥٠



## ən-Nəbə («Xəbər») surəsi

## سُورَةُ النَّبَإِ

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

| | |
|---|---|
| 1. Onlar nə barədə bir-birindən soruşurlar? | عَمَّ يَتَسَآءَلُونَ ١ |
| 2. Böyük bir xəbər barəsində – | عَنِ ٱلنَّبَإِ ٱلْعَظِيمِ ٢ |
| 3. *elə bir xəbər* ki, onlar onun haqqında ziddiyyətdədirlər. | ٱلَّذِى هُمْ فِيهِ مُخْتَلِفُونَ ٣ |
| 4. Xeyr, onlar Qiyamətin *həqiqət olduğunu* hökmən biləcəklər! | كَلَّا سَيَعْلَمُونَ ٤ |
| 5. Bir daha xeyr! Onlar hökmən biləcəklər! | ثُمَّ كَلَّا سَيَعْلَمُونَ ٥ |
| 6. Məgər Biz yeri yataq etmədikmi ?! | أَلَمْ نَجْعَلِ ٱلْأَرْضَ مِهَٰدًا ٦ |
| 7. Dağları da dirək?! | وَٱلْجِبَالَ أَوْتَادًا ٧ |
| 8. Biz sizi cüt yaratdıq. | وَخَلَقْنَٰكُمْ أَزْوَٰجًا ٨ |
| 9. Yuxunuzu da *sizin üçün* rahatlıq etdik. | وَجَعَلْنَا نَوْمَكُمْ سُبَاتًا ٩ |
| 10. Gecəni örtük etdik, | وَجَعَلْنَا ٱلَّيْلَ لِبَاسًا ١٠ |
| 11. gündüzü isə ruzi qazanmaq vaxtı. | وَجَعَلْنَا ٱلنَّهَارَ مَعَاشًا ١١ |
| 12. Üstünüzdə yeddi möhkəm *göy* qurduq | وَبَنَيْنَا فَوْقَكُمْ سَبْعًا شِدَادًا ١٢ |
| 13. və çox parlaq bir çıraq yaratdıq. | وَجَعَلْنَا سِرَاجًا وَهَّاجًا ١٣ |
| 14. Biz buludlardan şırıltıyla yağış yağdırdıq ki, | وَأَنزَلْنَا مِنَ ٱلْمُعْصِرَٰتِ مَآءً ثَجَّاجًا ١٤ |
| 15. onunla taxıl və digər bitkilər yetişdirək, | لِّنُخْرِجَ بِهِۦ حَبًّا وَنَبَاتًا ١٥ |

**16.** habelə *ağaclarının qol-budaqları bir-birinə* sarmaşan bağlar salaq.

وَجَنَّاتٍ أَلْفَافًا ﴿١٦﴾

**17.** Həqiqətən, ayırd etmə günü bəlli bir vaxta təyin edilmişdir!

إِنَّ يَوْمَ الْفَصْلِ كَانَ مِيقَاتًا ﴿١٧﴾

**18.** Sur üfürüləcəyi gün siz dəstə-dəstə gələcəksiniz.

يَوْمَ يُنفَخُ فِي الصُّورِ فَتَأْتُونَ أَفْوَاجًا ﴿١٨﴾

**19.** *O gün* göyün qapıları açılacaqdır.

وَفُتِحَتِ السَّمَاءُ فَكَانَتْ أَبْوَابًا ﴿١٩﴾

**20.** Dağlar da hərəkətə gətirilib ilğıma çevriləcək.

وَسُيِّرَتِ الْجِبَالُ فَكَانَتْ سَرَابًا ﴿٢٠﴾

**21.** Həqiqətən, Cəhənnəm *kafirlər üçün* pusquda dayanıb gözləyir.

إِنَّ جَهَنَّمَ كَانَتْ مِرْصَادًا ﴿٢١﴾

**22.** O, həddi aşanların qayıdacağı yerdir.

لِّلطَّاغِينَ مَآبًا ﴿٢٢﴾

**23.** Onlar orada əsrlər boyu qalacaqlar.

لَّابِثِينَ فِيهَا أَحْقَابًا ﴿٢٣﴾

**24.** Onlar orada nə bir sərinlik, nə də sərinləşdirici içki dadacaqlar.

لَّا يَذُوقُونَ فِيهَا بَرْدًا وَلَا شَرَابًا ﴿٢٤﴾

**25.** *İçdikləri* yalnız qaynar su və irin *olacaq* –

إِلَّا حَمِيمًا وَغَسَّاقًا ﴿٢٥﴾

**26.** *törətdikləri əməllərinə* uyğun bir cəza kimi.

جَزَاءً وِفَاقًا ﴿٢٦﴾

**27.** Doğrusu, onlar haqq-hesab çəkiləcəklərinə ümid etmirdilər.

إِنَّهُمْ كَانُوا لَا يَرْجُونَ حِسَابًا ﴿٢٧﴾

**28.** Ayələrimizi də qətiyyətlə təkzib edirdilər.

وَكَذَّبُوا بِآيَاتِنَا كِذَّابًا ﴿٢٨﴾

**29.** Biz hər bir şeyi hesablayıb yazmışıq.

وَكُلَّ شَيْءٍ أَحْصَيْنَاهُ كِتَابًا ﴿٢٩﴾

**30.** Elə isə dadın əzabı! Biz sizə əzabdan başqa bir şey artırmayacağıq!

فَذُوقُوا فَلَن نَّزِيدَكُمْ إِلَّا عَذَابًا ﴿٣٠﴾

**31.** Həqiqətən, müttəqilər üçün nicat yeri vardır.

إِنَّ لِلْمُتَّقِينَ مَفَازًا ﴿٣١﴾

**32.** *Həmçinin* bağlar və üzümlüklər,

حَدَآئِقَ وَأَعۡنَٰبٗا ٣٢

**33.** dolğun döşlü həmyaşıd qızlar

وَكَوَاعِبَ أَتۡرَابٗا ٣٣

**34.** və ləbələb doldurulmuş qədəhlər də *vardır*!

وَكَأۡسٗا دِهَاقٗا ٣٤

**35.** Onlar orada nə mənasız sözlər, nə də iftira eşidəcəklər.

لَّا يَسۡمَعُونَ فِيهَا لَغۡوٗا وَلَا كِذَّٰبٗا ٣٥

**36.** *Bunlar* sənin Rəbbindən olan mükafatlar, artıqlaması ilə verilən töhfələrdir.

جَزَآءٗ مِّن رَّبِّكَ عَطَآءً حِسَابٗا ٣٦

**37.** Göylərin, yerin və onların arasında olanların Rəbbi Rəhmanın *mükafatıdır*. Onlar Allahın hüzurunda bir söz deməyə qadir olmayacaqlar.

رَّبِّ ٱلسَّمَٰوَٰتِ وَٱلۡأَرۡضِ وَمَا بَيۡنَهُمَا ٱلرَّحۡمَٰنِۖ لَا
يَمۡلِكُونَ مِنۡهُ خِطَابٗا ٣٧

**38.** Ruh (Cəbrail) və mələklər səf-səf duracağı gün, Rəhmanın izin verdiyi kimsələrdən və doğru *söz* deyənlərdən başqa heç kəs danışmayacaq.

يَوۡمَ يَقُومُ ٱلرُّوحُ وَٱلۡمَلَٰٓئِكَةُ صَفّٗاۖ لَّا يَتَكَلَّمُونَ
إِلَّا مَنۡ أَذِنَ لَهُ ٱلرَّحۡمَٰنُ وَقَالَ صَوَابٗا ٣٨

**39.** O *gün*, gerçək bir gündür. Kim istəsə öz Rəbbi yanında sığınacaq tapar!

ذَٰلِكَ ٱلۡيَوۡمُ ٱلۡحَقُّۖ فَمَن شَآءَ ٱتَّخَذَ إِلَىٰ رَبِّهِۦ
مَـَٔابًا ٣٩

**40.** Həqiqətən, Biz sizi yaxın əzab barədə xəbərdar etdik. O gün insan öz əlləri ilə nələr etdiyini görəcək, kafir isə deyəcəkdir: "Kaş mən torpaq olaydım!"

إِنَّآ أَنذَرۡنَٰكُمۡ عَذَابٗا قَرِيبٗا يَوۡمَ يَنظُرُ ٱلۡمَرۡءُ مَا قَدَّمَتۡ
يَدَاهُ وَيَقُولُ ٱلۡكَافِرُ يَٰلَيۡتَنِي كُنتُ تُرَٰبَۢا ٤٠

## ən-Naziat («Can alanlar») surəsi

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

1. And olsun *kafirlərin canını* zorla alanlara!
2. And olsun *möminlərin canını* rahatlıqla alanlara!
3. And olsun *göydə* üzdükcə üzənlərə!
4. And olsun ötdükcə ötənlərə!
5. And olsun buyruqları yerinə yetirənlərə!
6. O gün lərzəyə gələn lərzələnəcək,
7. onun ardınca təkrar lərzələnəcək.
8. Həmən gün qəlblər *qorxudan* tir-tir əsəcək.
9. Bu qəlb *sahiblərinin* gözləri məzlum görkəm alacaq.
10. Onlar deyirlər: "Yəni biz *yenidən* bundan qabaqkı halımıza döndəriləcəyik?
11. Sümüklərimiz çürüdükdən sonra?"
12. Onlar dedilər: "Belə olduğu halda bu, zərərli bir qayıdışdır".
13. O *surun üfürülməsi* təkcə qorxunc bir səsdir.
14. *O vaxt* onlar ləngimədən *qəbirlərindən* yerin səthinə çıxacaqlar.

## سُورَةُ النَّازِعَاتِ

بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ

وَالنَّازِعَاتِ غَرْقًا ١

وَالنَّاشِطَاتِ نَشْطًا ٢

وَالسَّابِحَاتِ سَبْحًا ٣

فَالسَّابِقَاتِ سَبْقًا ٤

فَالْمُدَبِّرَاتِ أَمْرًا ٥

يَوْمَ تَرْجُفُ الرَّاجِفَةُ ٦

تَتْبَعُهَا الرَّادِفَةُ ٧

قُلُوبٌ يَوْمَئِذٍ وَاجِفَةٌ ٨

أَبْصَارُهَا خَاشِعَةٌ ٩

يَقُولُونَ أَإِنَّا لَمَرْدُودُونَ فِي الْحَافِرَةِ ١٠

أَإِذَا كُنَّا عِظَامًا نَخِرَةً ١١

قَالُوا تِلْكَ إِذًا كَرَّةٌ خَاسِرَةٌ ١٢

فَإِنَّمَا هِيَ زَجْرَةٌ وَاحِدَةٌ ١٣

فَإِذَا هُمْ بِالسَّاهِرَةِ ١٤

**15.** Musanın hadisəsi sənə yetişdimi?

هَلۡ أَتَىٰكَ حَدِيثُ مُوسَىٰٓ ١٥

**16.** O zaman Rəbbi onu müqəddəs Tuva vadisində səsləyib demişdi:

إِذۡ نَادَىٰهُ رَبُّهُۥ بِٱلۡوَادِ ٱلۡمُقَدَّسِ طُوًى ١٦

**17.** "Fironun yanına yollan! O, həddini çox aşmışdır.

ٱذۡهَبۡ إِلَىٰ فِرۡعَوۡنَ إِنَّهُۥ طَغَىٰ ١٧

**18.** De: "*Günahlardan* xilas olmaq istəyirsənmi?

فَقُلۡ هَل لَّكَ إِلَىٰٓ أَن تَزَكَّىٰ ١٨

**19.** Səni Rəbbinə doğru yönəldimmi ki, *Ondan* qorxub çəkinəsən?"

وَأَهۡدِيَكَ إِلَىٰ رَبِّكَ فَتَخۡشَىٰ ١٩

**20.** *Musa* ən böyük möcüzəni Firona göstərdi.

فَأَرَىٰهُ ٱلۡأٓيَةَ ٱلۡكُبۡرَىٰ ٢٠

**21.** O isə *haqqı* yalan sayıb asi oldu.

فَكَذَّبَ وَعَصَىٰ ٢١

**22.** Sonra da üz döndərib *fəsad törətməyə* girişdi.

ثُمَّ أَدۡبَرَ يَسۡعَىٰ ٢٢

**23.** O, *camaatını* toplayıb onlara hündür səslə müraciət edərək

فَحَشَرَ فَنَادَىٰ ٢٣

**24.** dedi: "Sizin ən uca rəbbiniz mənəm!"

فَقَالَ أَنَا۠ رَبُّكُمُ ٱلۡأَعۡلَىٰ ٢٤

**25.** Belə olduqda, Allah da onu dünya və Axirət əzabı ilə yaxaladı.

فَأَخَذَهُ ٱللَّهُ نَكَالَ ٱلۡأٓخِرَةِ وَٱلۡأُولَىٰٓ ٢٥

**26.** Həqiqətən, bunda *Allahdan* qorxanlardan ötrü işarə var.

إِنَّ فِي ذَٰلِكَ لَعِبۡرَةٗ لِّمَن يَخۡشَىٰٓ ٢٦

**27.** Sizin yaradılışınız çətindir, yoxsa göyün? *Allah* onu qurdu,

ءَأَنتُمۡ أَشَدُّ خَلۡقًا أَمِ ٱلسَّمَآءُۚ بَنَىٰهَا ٢٧

**28.** onun qübbəsini yüksəltdi və düzəldib kamilləşdirdi,

رَفَعَ سَمۡكَهَا فَسَوَّىٰهَا ٢٨

**29.** gecəsini qaranlıq edib, səhərini də *nurlandırdı*.

وَأَغۡطَشَ لَيۡلَهَا وَأَخۡرَجَ ضُحَىٰهَا ٢٩

**30.** Sonra yeri döşəyib,

وَٱلۡأَرۡضَ بَعۡدَ ذَٰلِكَ دَحَىٰهَآ ٣٠

**31.** onda su və otlaq yaratdı,

أَخۡرَجَ مِنۡهَا مَآءَهَا وَمَرۡعَىٰهَا ٣١

**32.** dağları da yerə bərkitdi.

وَٱلۡجِبَالَ أَرۡسَىٰهَا ٣٢

**33.** *Bunlar* sizin və mal-qaranızın faydalanmasından ötrüdür.

مَتَٰعٗا لَّكُمۡ وَلِأَنۡعَٰمِكُمۡ ٣٣

**34.** Ən böyük fəlakətin gəldiyi zaman –

فَإِذَا جَآءَتِ ٱلطَّآمَّةُ ٱلۡكُبۡرَىٰ ٣٤

**35.** o gün insan törətdiklərini xatırlayacaqdır.

يَوۡمَ يَتَذَكَّرُ ٱلۡإِنسَٰنُ مَا سَعَىٰ ٣٥

**36.** Cəhənnəm isə hər görmə qabiliyyəti olan *adamlara* göstəriləcəkdir.

وَبُرِّزَتِ ٱلۡجَحِيمُ لِمَن يَرَىٰ ٣٦

**37.** Kim həddi aşmışsa,

فَأَمَّا مَن طَغَىٰ ٣٧

**38.** dünya həyatını *axirətdən* üstün bilmişsə,

وَءَاثَرَ ٱلۡحَيَوٰةَ ٱلدُّنۡيَا ٣٨

**39.** həqiqətən, Cəhənnəm onun sığınacağı olacaqdır.

فَإِنَّ ٱلۡجَحِيمَ هِيَ ٱلۡمَأۡوَىٰ ٣٩

**40.** Ancaq kim Rəbbinin hüzuruna gələcəyindən qorxmuş və nəfsinə ehtirası yasaq etmişsə,

وَأَمَّا مَنۡ خَافَ مَقَامَ رَبِّهِۦ وَنَهَى ٱلنَّفۡسَ عَنِ ٱلۡهَوَىٰ ٤٠

**41.** həqiqətən, Cənnət onun məskəni olacaq.

فَإِنَّ ٱلۡجَنَّةَ هِيَ ٱلۡمَأۡوَىٰ ٤١

**42.** Səndən o Saat barəsində: "O nə vaxt qopacaq?"– *deyə* soruşurlar.

يَسۡـَٔلُونَكَ عَنِ ٱلسَّاعَةِ أَيَّانَ مُرۡسَىٰهَا ٤٢

**43.** Axı sən onu haradan biləsən?!

فِيمَ أَنتَ مِن ذِكۡرَىٰهَآ ٤٣

**44.** Onu kamil bilmək sənin Rəbbinə aiddir.

إِلَىٰ رَبِّكَ مُنتَهَىٰهَآ ٤٤

**45.** Sən yalnız ondan qorxanı xəbərdar edənsən.

إِنَّمَآ أَنتَ مُنذِرُ مَن يَخۡشَىٰهَا ٤٥

كَأَنَّهُمْ يَوْمَ يَرَوْنَهَا لَمْ يَلْبَثُوٓا۟ إِلَّا عَشِيَّةً أَوْ
ضُحَىٰهَا ﴿٤٦﴾

46. Onlar Qiyaməti gördükləri an *dünyada* yalnız bir axşam çağı və yaxud bir gündüz qədər yaşadıqlarını güman edəcəklər!



## Abəsə («Qaşqabağını tökdü») surəsi

سُورَةُ عَبَسَ

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

1. O qaşqabağını sallayıb üzünü yana çevirdi –
2. yanına bir korun gəlməsinə görə.
3. Nə bilirdin ki, bəlkə o *günahlardan* təmizlənəcəkdi
4. və yaxud nəsihət dinləyib faydalanacaqdı.
5. *Nəsihətə* ehtiyacı olmayana gəlincə isə,
6. sən ona diqqət yetirirsən.
7. Onun təmizlənməməyinin sənə bir dəxli yoxdur.
8. Səy göstərib sənin yanına gələn,
9. *Allahdan* qorxan kimsəyə gəlincə,
10. ona məhəl qoymursan!
11. Xeyr! Şübhəsiz ki, bu, bir nəsihətdir.
12. Kim istəsə, qoy onu xatırlayıb ibrət alsın.
13. *Bu Quran* kəramətli səhifələrdə -
14. yüksək və pak *səhifələrdədir*.
15. *Bu səhifələr* elçilərin əllərində -
16. möhtərəm və müti olanların *əllərindədir*.

عَبَسَ وَتَوَلَّىٰٓ ١

أَن جَآءَهُ ٱلۡأَعۡمَىٰ ٢

وَمَا يُدۡرِيكَ لَعَلَّهُۥ يَزَّكَّىٰٓ ٣

أَوۡ يَذَّكَّرُ فَتَنفَعَهُ ٱلذِّكۡرَىٰٓ ٤

أَمَّا مَنِ ٱسۡتَغۡنَىٰ ٥

فَأَنتَ لَهُۥ تَصَدَّىٰ ٦

وَمَا عَلَيۡكَ أَلَّا يَزَّكَّىٰ ٧

وَأَمَّا مَن جَآءَكَ يَسۡعَىٰ ٨

وَهُوَ يَخۡشَىٰ ٩

فَأَنتَ عَنۡهُ تَلَهَّىٰ ١٠

كَلَّآ إِنَّهَا تَذۡكِرَةٞ ١١

فَمَن شَآءَ ذَكَرَهُۥ ١٢

فِي صُحُفٖ مُّكَرَّمَةٖ ١٣

مَّرۡفُوعَةٖ مُّطَهَّرَةِۭ ١٤

بِأَيۡدِي سَفَرَةٖ ١٥

كِرَامِۭ بَرَرَةٖ ١٦

**17.** Qoy ölsün *kafir* insan! O necə də nankordur!

قُتِلَ الْإِنسَانُ مَا أَكْفَرَهُ ﴿١٧﴾

**18.** *Qoy baxıb görsün Allah* onu nədən yaradıb?

مِنْ أَيِّ شَيْءٍ خَلَقَهُ ﴿١٨﴾

**19.** *Allah* onu nütfədən yaratdı və müəyyən şəkildə formalaşdırdı.

مِن نُّطْفَةٍ خَلَقَهُ فَقَدَّرَهُ ﴿١٩﴾

**20.** Sonra da onun yolunu asanlaşdırdı.

ثُمَّ السَّبِيلَ يَسَّرَهُ ﴿٢٠﴾

**21.** Sonra onu öldürüb qəbirə yerləşdirdi.

ثُمَّ أَمَاتَهُ فَأَقْبَرَهُ ﴿٢١﴾

**22.** İstədiyi bir zaman onu dirildəcəkdir.

ثُمَّ إِذَا شَاءَ أَنشَرَهُ ﴿٢٢﴾

**23.** Xeyr! O, hələ də *Allahın* ona buyurduğunu yerinə yetirməmişdir.

كَلَّا لَمَّا يَقْضِ مَا أَمَرَهُ ﴿٢٣﴾

**24.** Qoy insan yediyinə diqqət yetirsin!

فَلْيَنظُرِ الْإِنسَانُ إِلَىٰ طَعَامِهِ ﴿٢٤﴾

**25.** Həqiqətən, yağışı bol-bol Biz yağdırırıq.

أَنَّا صَبَبْنَا الْمَاءَ صَبًّا ﴿٢٥﴾

**26.** Sonra da yeri çat-çat yarıb

ثُمَّ شَقَقْنَا الْأَرْضَ شَقًّا ﴿٢٦﴾

**27.** orada taxıl yetişdiririk.

فَأَنبَتْنَا فِيهَا حَبًّا ﴿٢٧﴾

**28.** *Habelə* üzüm və yonca,

وَعِنَبًا وَقَضْبًا ﴿٢٨﴾

**29.** zeytun və xurma *ağacları*,

وَزَيْتُونًا وَنَخْلًا ﴿٢٩﴾

**30.** sıx-sıx bağlar,

وَحَدَائِقَ غُلْبًا ﴿٣٠﴾

**31.** meyvələr və otlar da *bitiririk*.

وَفَاكِهَةً وَأَبًّا ﴿٣١﴾

**32.** *Bu nemətlər* sizin istifadəniz və mal-qaranızın faydalanması üçündür.

مَّتَاعًا لَّكُمْ وَلِأَنْعَامِكُمْ ﴿٣٢﴾

**33.** Qulaqbatırıcı bir səs gələndə –

فَإِذَا جَاءَتِ الصَّاخَّةُ ﴿٣٣﴾

**34.** o gün insan qaçacaq öz qardaşından,

يَوْمَ يَفِرُّ الْمَرْءُ مِنْ أَخِيهِ ﴿٣٤﴾

**35.** anasından,
atasından,

وَأُمِّهِ وَأَبِيهِ ﴿٣٥﴾

| | |
|---|---|
| 36. arvadından və övladlarından! | وَصَٰحِبَتِهِۦ وَبَنِيهِ ٣٦ |
| 37. O gün onlardan hər birinin yetərincə işi olacaqdır. | لِكُلِّ ٱمۡرِيٕٖ مِّنۡهُمۡ يَوۡمَئِذٖ شَأۡنٞ يُغۡنِيهِ ٣٧ |
| 38. O gün *neçə-neçə* üzlər parlayacaq, | وُجُوهٞ يَوۡمَئِذٖ مُّسۡفِرَةٞ ٣٨ |
| 39. güləcək və fərəhlənəcəkdir. | ضَاحِكَةٞ مُّسۡتَبۡشِرَةٞ ٣٩ |
| 40. O gün *neçə-neçə* üzlərə toz-torpaq hopacaq, | وَوُجُوهٞ يَوۡمَئِذٍ عَلَيۡهَا غَبَرَةٞ ٤٠ |
| 41. onları zülmət bürüyəcəkdir. | تَرۡهَقُهَا قَتَرَةٌ ٤١ |
| 42. Məhz onlar kafirlər, günahkarlardır! | أُوْلَٰٓئِكَ هُمُ ٱلۡكَفَرَةُ ٱلۡفَجَرَةُ ٤٢ |



## ət-Təkvir («Sarınma») surəsi




*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

1. Günəş sarınacağı zaman;

إِذَا ٱلشَّمۡسُ كُوِّرَتۡ ١

2. ulduzlar soluxub sönəcəyi zaman;

وَإِذَا ٱلنُّجُومُ ٱنكَدَرَتۡ ٢

3. dağlar hərəkətə gətiriləcəyi zaman;

وَإِذَا ٱلۡجِبَالُ سُيِّرَتۡ ٣

4. boğaz dəvələr başlı-başına qalacaqları zaman;

وَإِذَا ٱلۡعِشَارُ عُطِّلَتۡ ٤

5. vəhşi heyvanlar bir yerə toplanılacağı zaman;

وَإِذَا ٱلۡوُحُوشُ حُشِرَتۡ ٥

6. dənizlər alovlanacağı zaman;

وَإِذَا ٱلۡبِحَارُ سُجِّرَتۡ ٦

7. hər kəs *öz tayına* qovuşdurulacağı zaman;

وَإِذَا ٱلنُّفُوسُ زُوِّجَتۡ ٧

8. diri-diri *torpağa* basdırılmış qız *uşağı* soruşulacağı zaman –

وَإِذَا ٱلۡمَوۡءُۥدَةُ سُئِلَتۡ ٨

9. hansı günaha görə öldürülmüşdür;

بِأَيِّ ذَنۢبٖ قُتِلَتۡ ٩

10. səhifələr açılacağı zaman;

وَإِذَا ٱلصُّحُفُ نُشِرَتۡ ١٠

11. göy qopardılacağı zaman;

وَإِذَا ٱلسَّمَآءُ كُشِطَتۡ ١١

12. Cəhənnəm alovlandırılacağı zaman

وَإِذَا ٱلۡجَحِيمُ سُعِّرَتۡ ١٢

13. və Cənnət *möminlərə* yaxınlaşdırılacağı zaman;

وَإِذَا ٱلۡجَنَّةُ أُزۡلِفَتۡ ١٣

14. hər kəs bu gün üçün özünə nə tədarük etdiyini biləcəkdir.

عَلِمَتۡ نَفۡسٞ مَّآ أَحۡضَرَتۡ ١٤

15. And içirəm *gecə çıxıb gündüz* batan *ulduzlara*,

فَلَآ أُقۡسِمُ بِٱلۡخُنَّسِ ١٥

| | |
|---|---|
| **16.** seyrə çıxıb gizlənən *səyyarələrə*, | الْجَوَارِ الْكُنَّسِ ﴿١٦﴾ |
| **17.** qaralmaqda olan gecəyə, | وَاللَّيْلِ إِذَا عَسْعَسَ ﴿١٧﴾ |
| **18.** və açılmaqda olan səhərə! | وَالصُّبْحِ إِذَا تَنَفَّسَ ﴿١٨﴾ |
| **19.** Həqiqətən, bu, göndərdiyimiz möhtərəm bir elçinin sözüdür. | إِنَّهُ لَقَوْلُ رَسُولٍ كَرِيمٍ ﴿١٩﴾ |
| **20.** *O elçi ki*, qüvvətlidir, Ərşin sahibi yanında *böyük* hörmət sahibidir, | ذِي قُوَّةٍ عِندَ ذِي الْعَرْشِ مَكِينٍ ﴿٢٠﴾ |
| **21.** orada itaət ediləndir, etibarlıdır. | مُطَاعٍ ثَمَّ أَمِينٍ ﴿٢١﴾ |
| **22.** Sizin dostunuz *Muhəmməd* divanə deyildir. | وَمَا صَاحِبُكُم بِمَجْنُونٍ ﴿٢٢﴾ |
| **23.** O, *Cəbraili* aydın üfüqdə gördü. | وَلَقَدْ رَآهُ بِالْأُفُقِ الْمُبِينِ ﴿٢٣﴾ |
| **24.** O, qeybdən də xəsislik edən deyildir. | وَمَا هُوَ عَلَى الْغَيْبِ بِضَنِينٍ ﴿٢٤﴾ |
| **25.** Bu *Quran* daşqalaq olunmuş şeytanın sözü də deyildir. | وَمَا هُوَ بِقَوْلِ شَيْطَانٍ رَجِيمٍ ﴿٢٥﴾ |
| **26.** Elə isə *ondan üz döndərib* hara gedirsiniz? | فَأَيْنَ تَذْهَبُونَ ﴿٢٦﴾ |
| **27.** Bu, aləmlərə yalnız bir nəsihətdir – | إِنْ هُوَ إِلَّا ذِكْرٌ لِّلْعَالَمِينَ ﴿٢٧﴾ |
| **28.** sizlərdən doğru *yolda* olmaq istəyənlər üçün. | لِمَن شَاءَ مِنكُمْ أَن يَسْتَقِيمَ ﴿٢٨﴾ |
| **29.** Aləmlərin Rəbbi Allah istəməyincə, siz istəyə bilməzsiniz! | وَمَا تَشَاءُونَ إِلَّا أَن يَشَاءَ اللَّهُ رَبُّ الْعَالَمِينَ ﴿٢٩﴾ |



## əl-İnfitar («Parçalanma») surəsi

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

1. Göy parçalanacağı zaman;
2. ulduzlar səpələnəcəyi zaman;
3. dənizlər daşıb bir-birinə qarışacağı zaman;
4. qəbirlər çevriləcəyi zaman;
5. hər kəs əvvəlcədən *özü üçün* nəyi tədarük edib, nəyi sonraya saxladığını biləcəkdir.
6. Ey insan! Səni öz Səxavətli Rəbbinə qarşı qoyan nədir?
7. O ki, səni yaradıb kamilləşdirdi və sənə gözəl bir surət verdi.
8. Səni istədiyi şəklə saldı.
9. Xeyr! Əksinə, siz Qiyaməti yalan hesab edirsiniz!
10. Həqiqətən, sizin üstünüzdə nəzarətçilər vardır –
11. çox möhtərəm, *əməllərinizi* yazanlar.
12. Onlar sizin nə etdiklərinizi bilirlər.
13. Həqiqətən, itaətkarlar nemət içində olacaqlar.
14. Şübhəsiz ki, günahkarlar da Cəhənnəmdə olacaqlar.

## سُورَةُ الانفِطَارِ

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

إِذَا ٱلسَّمَآءُ ٱنفَطَرَتۡ ١

وَإِذَا ٱلۡكَوَاكِبُ ٱنتَثَرَتۡ ٢

وَإِذَا ٱلۡبِحَارُ فُجِّرَتۡ ٣

وَإِذَا ٱلۡقُبُورُ بُعۡثِرَتۡ ٤

عَلِمَتۡ نَفۡسٞ مَّا قَدَّمَتۡ وَأَخَّرَتۡ ٥

يَٰٓأَيُّهَا ٱلۡإِنسَٰنُ مَا غَرَّكَ بِرَبِّكَ ٱلۡكَرِيمِ ٦

ٱلَّذِي خَلَقَكَ فَسَوَّىٰكَ فَعَدَلَكَ ٧

فِيٓ أَيِّ صُورَةٖ مَّا شَآءَ رَكَّبَكَ ٨

كَلَّا بَلۡ تُكَذِّبُونَ بِٱلدِّينِ ٩

وَإِنَّ عَلَيۡكُمۡ لَحَٰفِظِينَ ١٠

كِرَامٗا كَٰتِبِينَ ١١

يَعۡلَمُونَ مَا تَفۡعَلُونَ ١٢

إِنَّ ٱلۡأَبۡرَارَ لَفِي نَعِيمٖ ١٣

وَإِنَّ ٱلۡفُجَّارَ لَفِي جَحِيمٖ ١٤

15. Onlar ora Haqq-hesab günü girəcəklər.

يَصْلَوْنَهَا يَوْمَ الدِّينِ ١٥

16. Onlar əsla ondan yayına bilməyəcəklər.

وَمَا هُمْ عَنْهَا بِغَائِبِينَ ١٦

17. Sən haradan biləydin ki, Haqq-hesab günü nədir?

وَمَا أَدْرَاكَ مَا يَوْمُ الدِّينِ ١٧

18. Doğrudan da, sən haradan biləydin ki, Haqq-hesab günü nədir?

ثُمَّ مَا أَدْرَاكَ مَا يَوْمُ الدِّينِ ١٨

19. O gün heç kəs heç kəsə fayda verə bilməz və həmin gün hakimiyyət Allaha məxsus olacaqdır!

يَوْمَ لَا تَمْلِكُ نَفْسٌ لِنَفْسٍ شَيْئًا وَالْأَمْرُ
يَوْمَئِذٍ لِلَّهِ ١٩



## əl-Mutaffifin («Çəkidə və ölçüdə aldadanlar») surəsi

سُورَةُ المُطَفِّفِينَ

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

1. Çəkidə və ölçüdə aldadanların vay halına!
2. O kəslərin ki, camaatdan *bir şey* aldıqda *onu* tam almaq istəyərlər,
3. *onlar üçün bir şey* ölçdükdə və ya çəkdikdə onu ziyana salarlar.
4. Onlar dirildiləcəklərini fikirləşmirlərmi?
5. *Həm də* əzəmətli bir gündə.
6. O gündə ki, insanlar aləmlərin Rəbbinin qarşısında dayanacaqlar.
7. Xeyr! Həqiqətən, günahkarların kitabı Siccindədir.
8. Sən haradan biləsən ki, Siccin nədir?!
9. O, yazılı bir kitabdır!
10. O gün *haqqı* yalan hesab edənlərin vay halına!
11. O kəslərin ki, Haqq-hesab gününü yalan hesab edirlər.
12. Amma bunu, həddini aşan günahkardan başqa, heç kəs yalan hesab etməz.

وَيۡلٞ لِّلۡمُطَفِّفِينَ ١

ٱلَّذِينَ إِذَا ٱكۡتَالُواْ عَلَى ٱلنَّاسِ يَسۡتَوۡفُونَ ٢

وَإِذَا كَالُوهُمۡ أَو وَّزَنُوهُمۡ يُخۡسِرُونَ ٣

أَلَا يَظُنُّ أُوْلَٰٓئِكَ أَنَّهُم مَّبۡعُوثُونَ ٤

لِيَوۡمٍ عَظِيمٖ ٥

يَوۡمَ يَقُومُ ٱلنَّاسُ لِرَبِّ ٱلۡعَٰلَمِينَ ٦

كَلَّآ إِنَّ كِتَٰبَ ٱلۡفُجَّارِ لَفِي سِجِّينٖ ٧

وَمَآ أَدۡرَىٰكَ مَا سِجِّينٞ ٨

كِتَٰبٞ مَّرۡقُومٞ ٩

وَيۡلٞ يَوۡمَئِذٖ لِّلۡمُكَذِّبِينَ ١٠

ٱلَّذِينَ يُكَذِّبُونَ بِيَوۡمِ ٱلدِّينِ ١١

وَمَا يُكَذِّبُ بِهِۦٓ إِلَّا كُلُّ مُعۡتَدٍ أَثِيمٍ ١٢

| | |
|---|---|
| 13. Ayələrimiz ona oxunduğu zaman: “Bu, keçmişdəkilərin uydurduğu əfsanələrdir!”– deyir. | إِذَا تُتۡلَىٰ عَلَيۡهِ ءَايَٰتُنَا قَالَ أَسَٰطِيرُ ٱلۡأَوَّلِينَ ١٣ |
| 14. Xeyr! Onların qəlbini qazandıqları *günahlar* bürümüşdür. | كَلَّاۖ بَلۡۜ رَانَ عَلَىٰ قُلُوبِهِم مَّا كَانُواْ يَكۡسِبُونَ ١٤ |
| 15. Xeyr, həmin gün onlarla Rəbbi arasına pərdə çəkiləcək! | كَلَّآ إِنَّهُمۡ عَن رَّبِّهِمۡ يَوۡمَئِذٖ لَّمَحۡجُوبُونَ ١٥ |
| 16. Sonra onlar Cəhənnəmə girəcəklər | ثُمَّ إِنَّهُمۡ لَصَالُواْ ٱلۡجَحِيمِ ١٦ |
| 17. və *onlara* deyiləcək: “Budur sizin yalan hesab etdiyiniz *Cəhənnəm*!” | ثُمَّ يُقَالُ هَٰذَا ٱلَّذِي كُنتُم بِهِۦ تُكَذِّبُونَ ١٧ |
| 18. Xeyr! Həqiqətən, itaətkarların kitabı İlliyyundadir! | كَلَّآ إِنَّ كِتَٰبَ ٱلۡأَبۡرَارِ لَفِي عِلِّيِّينَ ١٨ |
| 19. Sən haradan biləsən ki, İlliyyun nədir?! | وَمَآ أَدۡرَىٰكَ مَا عِلِّيُّونَ ١٩ |
| 20. O, elə bir yazılı kitabdır ki, | كِتَٰبٞ مَّرۡقُومٞ ٢٠ |
| 21. onu yalnız *Allaha* yaxın olanlar görürlər! | يَشۡهَدُهُ ٱلۡمُقَرَّبُونَ ٢١ |
| 22. Həqiqətən, itaətkarlar nemətlər içində olacaqlar. | إِنَّ ٱلۡأَبۡرَارَ لَفِي نَعِيمٍ ٢٢ |
| 23. Onlar taxtlar üstündə seyrə dalacaqlar. | عَلَى ٱلۡأَرَآئِكِ يَنظُرُونَ ٢٣ |
| 24. Sən onların çöhrəsində səadət parlaqlığı görəcəksən. | تَعۡرِفُ فِي وُجُوهِهِمۡ نَضۡرَةَ ٱلنَّعِيمِ ٢٤ |
| 25. Onlara möhürlü şərabdan içirdiləcəkdir. | يُسۡقَوۡنَ مِن رَّحِيقٖ مَّخۡتُومٍ ٢٥ |
| 26. Onun möhürü müşkdür. Qoy çalışanlar onun üçün səy göstərsinlər! | خِتَٰمُهُۥ مِسۡكٞۚ وَفِي ذَٰلِكَ فَلۡيَتَنَافَسِ ٱلۡمُتَنَٰفِسُونَ ٢٦ |

| | |
|---|---|
| **27.** Onun qatışığı isə təsnim bulağındandır. | وَمِزَاجُهُۥ مِن تَسۡنِيمٍ ٢٧ |
| **28.** *O təsnim elə* bir bulaqdır ki, ondan *Allaha* yaxın olanlar içərlər. | عَيۡنٗا يَشۡرَبُ بِهَا ٱلۡمُقَرَّبُونَ ٢٨ |
| **29.** Doğrudan da, günah edənlər iman gətirənlərə gülürdülər, | إِنَّ ٱلَّذِينَ أَجۡرَمُواْ كَانُواْ مِنَ ٱلَّذِينَ ءَامَنُواْ يَضۡحَكُونَ ٢٩ |
| **30.** onların yanından keçdikdə bir-birinə qaş-göz edirdilər, | وَإِذَا مَرُّواْ بِهِمۡ يَتَغَامَزُونَ ٣٠ |
| **31.** öz ailələrinin yanına fərəhlə qayıdırdılar, | وَإِذَا ٱنقَلَبُوٓاْ إِلَىٰٓ أَهۡلِهِمُ ٱنقَلَبُواْ فَكِهِينَ ٣١ |
| **32.** möminləri gördükdə isə deyirdilər: "Həqiqətən, bunlar azmışlardır!" | وَإِذَا رَأَوۡهُمۡ قَالُوٓاْ إِنَّ هَٰٓؤُلَآءِ لَضَآلُّونَ ٣٢ |
| **33.** Halbuki bu günahkarlar onlara gözətçi qoyulmamışdılar. | وَمَآ أُرۡسِلُواْ عَلَيۡهِمۡ حَٰفِظِينَ ٣٣ |
| **34.** Bu gün məhz iman gətirənlər kafirlərə güləcəklər. | فَٱلۡيَوۡمَ ٱلَّذِينَ ءَامَنُواْ مِنَ ٱلۡكُفَّارِ يَضۡحَكُونَ ٣٤ |
| **35.** Onlar taxtlar üstündə *ətrafa* baxacaqlar. | عَلَى ٱلۡأَرَآئِكِ يَنظُرُونَ ٣٥ |
| **36.** Kafirlər törətdiklərinin cəzasını aldılarmı?! | هَلۡ ثُوِّبَ ٱلۡكُفَّارُ مَا كَانُواْ يَفۡعَلُونَ ٣٦ |



## əl-İnşiqaq («Yarılma») surəsi

## سورة الانشقاق

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ

1. Göy yarılacağı
إِذَا السَّمَاءُ انشَقَّتْ ١

2. və Rəbbini dinləyib boyun əyməyə hazır olacağı zaman;
وَأَذِنَتْ لِرَبِّهَا وَحُقَّتْ ٢

3. Yer dümdüz ediləcəyi,
وَإِذَا الْأَرْضُ مُدَّتْ ٣

4. içindəkiləri kənara atıb boşalacağı
وَأَلْقَتْ مَا فِيهَا وَتَخَلَّتْ ٤

5. və Rəbbini dinləyib boyun əyməyə hazır olacağı zaman;
وَأَذِنَتْ لِرَبِّهَا وَحُقَّتْ ٥

6. Ey insan! Sən, həqiqətən də, səy göstərib Rəbbinə tərəf can atırsan. Sən Onunla qarşılaşacaqsan!
يَا أَيُّهَا الْإِنسَانُ إِنَّكَ كَادِحٌ إِلَىٰ رَبِّكَ كَدْحًا فَمُلَاقِيهِ ٦

7. Kimin kitabı sağ əlinə veriləcəksə,
فَأَمَّا مَنْ أُوتِيَ كِتَابَهُ بِيَمِينِهِ ٧

8. o, yüngül sorğu-suala tutulacaq
فَسَوْفَ يُحَاسَبُ حِسَابًا يَسِيرًا ٨

9. və sevincək öz ailəsinə qayıdacaqdır!
وَيَنقَلِبُ إِلَىٰ أَهْلِهِ مَسْرُورًا ٩

10. Kimin kitabı arxa tərəfindən veriləcəksə,
وَأَمَّا مَنْ أُوتِيَ كِتَابَهُ وَرَاءَ ظَهْرِهِ ١٠

11. o *özünə* ölüm diləyəcək
فَسَوْفَ يَدْعُو ثُبُورًا ١١

12. və alovlu oda atılacaqdır!
وَيَصْلَىٰ سَعِيرًا ١٢

13. Sözsüz ki, o, *dünyada ikən* öz ailəsində sevinc içində idi
إِنَّهُ كَانَ فِي أَهْلِهِ مَسْرُورًا ١٣

14. və elə güman edirdi ki, *Rəbbinin hüzuruna* qayıtmayacaqdır.
إِنَّهُ ظَنَّ أَن لَّن يَحُورَ ١٤

15. Xeyr! Sözsüz ki, Rəbbi onu görürdü.
بَلَىٰ إِنَّ رَبَّهُ كَانَ بِهِ بَصِيرًا ١٥

| | |
|---|---|
| **16.** And içirəm şəfəqə, | فَلَآ أُقۡسِمُ بِٱلشَّفَقِ ١٦ |
| **17.** gecəyə və *onun* ağuşuna aldıqlarına, | وَٱلَّيۡلِ وَمَا وَسَقَ ١٧ |
| **18.** bədirlənmiş *on dörd gecəlik* aya! | وَٱلۡقَمَرِ إِذَا ٱتَّسَقَ ١٨ |
| **19.** Siz mütləq haldan-hala keçib dəyişəcəksiniz. | لَتَرۡكَبُنَّ طَبَقًا عَن طَبَقٖ ١٩ |
| **20.** Onlara nə olub ki, iman gətirmirlər | فَمَا لَهُمۡ لَا يُؤۡمِنُونَ ٢٠ |
| **21.** və onlara Quran oxunduqda səcdə etmirlər? | وَإِذَا قُرِئَ عَلَيۡهِمُ ٱلۡقُرۡءَانُ لَا يَسۡجُدُونَ ۩ ٢١ |
| **22.** Əksinə, küfr edənlər *haqqı* yalan sayırlar. | بَلِ ٱلَّذِينَ كَفَرُواْ يُكَذِّبُونَ ٢٢ |
| **23.** Allah *onların* nəyi gizlətdiklərini çox yaxşı bilir! | وَٱللَّهُ أَعۡلَمُ بِمَا يُوعُونَ ٢٣ |
| **24.** Elə isə onları ağrılı-acılı bir əzabla müjdələ, | فَبَشِّرۡهُم بِعَذَابٍ أَلِيمٍ ٢٤ |
| **25.** iman gətirib yaxşı işlər görənlər istisna olmaqla! Onlar üçün tükənməz mükafatlar hazırlanmışdır. | إِلَّا ٱلَّذِينَ ءَامَنُواْ وَعَمِلُواْ ٱلصَّٰلِحَٰتِ لَهُمۡ أَجۡرٌ غَيۡرُ مَمۡنُونِۭ ٢٥ |



## əl-Buruc («Bürclər») surəsi

## سُورَةُ البُرُوجِ

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

1. And olsun bürclü göyə!

وَٱلسَّمَآءِ ذَاتِ ٱلۡبُرُوجِ ١

2. And olsun vədə verilmiş günə!

وَٱلۡيَوۡمِ ٱلۡمَوۡعُودِ ٢

3. And olsun şahidlik edənə və edilənə!

وَشَاهِدٖ وَمَشۡهُودٖ ٣

4. Məhv olsun xəndək kənarında yığışanlar!

قُتِلَ أَصۡحَٰبُ ٱلۡأُخۡدُودِ ٤

5. Odunla alışdırılmış *xəndək*.

ٱلنَّارِ ذَاتِ ٱلۡوَقُودِ ٥

6. Onlar o *xəndəyin* qırağında oturub,

إِذۡ هُمۡ عَلَيۡهَا قُعُودٞ ٦

7. möminlərə öz verdikləri işgəncələrə şahidlik edirdilər.

وَهُمۡ عَلَىٰ مَا يَفۡعَلُونَ بِٱلۡمُؤۡمِنِينَ شُهُودٞ ٧

8. *Kafirlər* onlardan yalnız Qüdrətli, Tərifəlayiq Allaha iman gətirdiklərinə görə intiqam alırdılar.

وَمَا نَقَمُواْ مِنۡهُمۡ إِلَّآ أَن يُؤۡمِنُواْ بِٱللَّهِ ٱلۡعَزِيزِ ٱلۡحَمِيدِ ٨

9. Halbuki, göylərdə və yerdə mütləq hakimiyyət Ona məxsusdur. Allah hər şeyə Şahiddir.

ٱلَّذِي لَهُۥ مُلۡكُ ٱلسَّمَٰوَٰتِ وَٱلۡأَرۡضِۚ وَٱللَّهُ عَلَىٰ كُلِّ شَيۡءٖ شَهِيدٌ ٩

10. O kəslər ki, mömin kişi və qadınları *yandırmaqla* sınağa çəkmiş, sonra da tövbə etməmişlər, onlara Cəhənnəm əzabı və onları yandırıb-yaxacaq od əzabı hazırlanmışdır.

إِنَّ ٱلَّذِينَ فَتَنُواْ ٱلۡمُؤۡمِنِينَ وَٱلۡمُؤۡمِنَٰتِ ثُمَّ لَمۡ يَتُوبُواْ فَلَهُمۡ عَذَابُ جَهَنَّمَ وَلَهُمۡ عَذَابُ ٱلۡحَرِيقِ ١٠

11. Şübhəsiz ki, iman gətirib yaxşı işlər görənlər üçün *ağacları* altından çaylar axan Cənnət bağları vardır. Bu, böyük müvəffəqiyyətdir.

إِنَّ ٱلَّذِينَ ءَامَنُواْ وَعَمِلُواْ ٱلصَّٰلِحَٰتِ لَهُمۡ جَنَّٰتٞ تَجۡرِي مِن تَحۡتِهَا ٱلۡأَنۡهَٰرُۚ ذَٰلِكَ ٱلۡفَوۡزُ ٱلۡكَبِيرُ ١١

| | |
|---|---|
| **12.** Doğrudan da, Rəbbinin *günahkarları* yaxalaması çox şiddətlidir! | إِنَّ بَطْشَ رَبِّكَ لَشَدِيدٌ ﴿١٢﴾ |
| **13.** Həqiqətən, O, *hər şeyi* ilkin yaradır və *onu yenidən* bərpa edir! | إِنَّهُۥ هُوَ يُبْدِئُ وَيُعِيدُ ﴿١٣﴾ |
| **14.** Bağışlayan da, Sevən də Odur! | وَهُوَ ٱلْغَفُورُ ٱلْوَدُودُ ﴿١٤﴾ |
| **15.** Ərşin sahibidir, Şan-şöhrətlidir! | ذُو ٱلْعَرْشِ ٱلْمَجِيدُ ﴿١٥﴾ |
| **16.** İstədiyini edəndir. | فَعَّالٌ لِّمَا يُرِيدُ ﴿١٦﴾ |
| **17.** Qoşunlar haqqında əhvalat sənə çatıbmı? | هَلْ أَتَىٰكَ حَدِيثُ ٱلْجُنُودِ ﴿١٧﴾ |
| **18.** Firon və Səmud *qoşunlarının.* | فِرْعَوْنَ وَثَمُودَ ﴿١٨﴾ |
| **19.** Xeyr, küfr edənlər *haqqı* yalan saymaqdadırlar. | بَلِ ٱلَّذِينَ كَفَرُوا۟ فِى تَكْذِيبٍ ﴿١٩﴾ |
| **20.** Allah *onları* arxadan əhatə etmişdir. | وَٱللَّهُ مِن وَرَآئِهِم مُّحِيطٌۢ ﴿٢٠﴾ |
| **21.** Bəli, bu şanlı Qurandır. | بَلْ هُوَ قُرْءَانٌ مَّجِيدٌ ﴿٢١﴾ |
| **22.** O, mühafizə edilən lövhədədir. | فِى لَوْحٍ مَّحْفُوظٍۭ ﴿٢٢﴾ |



## ət-Tariq («Gecə yolçusu») surəsi

## سُورَةُ الطَّارِقِ

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ

1. And olsun səmaya və gecə yolçusuna!

وَالسَّمَاءِ وَالطَّارِقِ ١

2. Sən nə bilirsən ki, gecə yolçusu nədir?

وَمَا أَدْرَاكَ مَا الطَّارِقُ ٢

3. *Bu, qaranlıqları* dəlib keçən ulduzdur.

النَّجْمُ الثَّاقِبُ ٣

4. Elə bir kimsə yoxdur ki, onun üzərində gözətçi olmasın!

إِن كُلُّ نَفْسٍ لَّمَّا عَلَيْهَا حَافِظٌ ٤

5. Qoy insan nədən yaradıldığına bir baxsın!

فَلْيَنظُرِ الْإِنسَانُ مِمَّ خُلِقَ ٥

6. *İnsan* axıdılan nütfədən yaradılmışdır.

خُلِقَ مِن مَّاءٍ دَافِقٍ ٦

7. Bu *nütfə* bel və köks sümükləri arasından çıxır.

يَخْرُجُ مِن بَيْنِ الصُّلْبِ وَالتَّرَائِبِ ٧

8. Şübhəsiz ki, *Allah* onu *dirildib* qaytarmağa qadirdir.

إِنَّهُ عَلَىٰ رَجْعِهِ لَقَادِرٌ ٨

9. Sirlərin sınaqdan keçiriləcəyi gün,

يَوْمَ تُبْلَى السَّرَائِرُ ٩

10. onun nə bir qüvvəsi, nə də bir köməkçisi olar.

فَمَا لَهُ مِن قُوَّةٍ وَلَا نَاصِرٍ ١٠

11. And olsun *yağmurla* qayıdan göyə!

وَالسَّمَاءِ ذَاتِ الرَّجْعِ ١١

12. And olsun *növbənöv bitkilərlə* yarılan yerə!

وَالْأَرْضِ ذَاتِ الصَّدْعِ ١٢

13. Həqiqətən, bu, *haqqı batildən* ayırd edən bir kəlamdır.

إِنَّهُ لَقَوْلٌ فَصْلٌ ١٣

14. O, əyləncə də deyildir. — وَمَا هُوَ بِٱلۡهَزۡلِ ١٤

15. Həqiqətən, *kafirlər* hiylə qururlar. — إِنَّهُمۡ يَكِيدُونَ كَيۡدٗا ١٥

16. Mən də hiylə qururam. — وَأَكِيدُ كَيۡدٗا ١٦

17. Kafirlərə hələ möhlət ver! Onlara bir az da möhlət ver. — فَمَهِّلِ ٱلۡكَٰفِرِينَ أَمۡهِلۡهُمۡ رُوَيۡدَۢا ١٧



## əl-Əla («Ən Uca») surəsi

## سُورَةُ الأَعْلَى

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

1. Ən Uca Rəbbinin adına təriflər de!
2. O *Rəbbin* ki, *hər şeyi* yaradıb kamilləşdirdi;
3. O *Rəbbin* ki, *hər şeyin müqəddəratını* əzəldən müəyyən edərək yol göstərdi;
4. O *Rəbbin* ki, otlağı cücərtdi,
5. sonra da qaralmış samana çevirdi.
6. Biz sənə *Quranı* elə oxumaq imkanı verəcəyik ki, o, yadından çıxmayacaq.
7. Əlbəttə, Allahın istədiyindən başqa. Həqiqətən, O, aşkardakından da, gizli qalandan da xəbərdardır.
8. Səni ən asan olana müvəffəq edərik.
9. Xatırlatmanın fayda verdiyini görsən, *onlara* xatırlat!
10. *Allahdan* qorxanlar öyüd-nəsihət götürərlər.
11. Ən bədbəxt kimsələr isə onu qulaqardına vurarlar.
12. O kimsə ki, Cəhənnəmə atılacaq.
13. O orada nə öləcək, nə də yaşaya biləcəkdir.

بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ

سَبِّحِ اسْمَ رَبِّكَ الْأَعْلَى ﴿١﴾

الَّذِي خَلَقَ فَسَوَّىٰ ﴿٢﴾

وَالَّذِي قَدَّرَ فَهَدَىٰ ﴿٣﴾

وَالَّذِي أَخْرَجَ الْمَرْعَىٰ ﴿٤﴾

فَجَعَلَهُ غُثَاءً أَحْوَىٰ ﴿٥﴾

سَنُقْرِئُكَ فَلَا تَنسَىٰ ﴿٦﴾

إِلَّا مَا شَاءَ اللَّهُ إِنَّهُ يَعْلَمُ الْجَهْرَ وَمَا يَخْفَىٰ ﴿٧﴾

وَنُيَسِّرُكَ لِلْيُسْرَىٰ ﴿٨﴾

فَذَكِّرْ إِن نَّفَعَتِ الذِّكْرَىٰ ﴿٩﴾

سَيَذَّكَّرُ مَن يَخْشَىٰ ﴿١٠﴾

وَيَتَجَنَّبُهَا الْأَشْقَى ﴿١١﴾

الَّذِي يَصْلَى النَّارَ الْكُبْرَىٰ ﴿١٢﴾

ثُمَّ لَا يَمُوتُ فِيهَا وَلَا يَحْيَىٰ ﴿١٣﴾

14. *Günahlardan* təmizlənən kimsə isə uğur qazanmışdır.
قَدْ أَفْلَحَ مَن تَزَكَّىٰ ﴿١٤﴾

15. *O kimsə ki*, Rəbbinin adını xatırlayıb namaz qılmışdır.
وَذَكَرَ اسْمَ رَبِّهِ فَصَلَّىٰ ﴿١٥﴾

16. Xeyr, siz dünya həyatını olduqca üstün tutursunuz;
بَلْ تُؤْثِرُونَ الْحَيَاةَ الدُّنْيَا ﴿١٦﴾

17. Axirət isə daha xeyirli və daha süreklidir.
وَالْآخِرَةُ خَيْرٌ وَأَبْقَىٰ ﴿١٧﴾

18. Həqiqətən də bu, əvvəlki səhifələrdə bildirilmişdir –
إِنَّ هَٰذَا لَفِي الصُّحُفِ الْأُولَىٰ ﴿١٨﴾

19. İbrahimin və Musanın səhifələrində.
صُحُفِ إِبْرَاهِيمَ وَمُوسَىٰ ﴿١٩﴾



## əl-Ğaşiyə («Bürüyən») surəsi

سُورَةُ الغَاشِيَةِ

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

1. *Aləmi* Bürüyənin xəbəri sənə gəlib çatdımı?
2. O gün *neçə-neçə* üzlər zəlil olub yerə dikiləcək,
3. üzülüb əldən düşəcək,
4. çox qızmar oda girəcək,
5. qaynar çeşmədən içirdiləcəkdir.
6. Onlara daridən başqa bir yemək verilməyəcəkdir.
7. *O onları* nə doydurar, nə də aclıqdan xilas edər.
8. O gün neçəsinin üzündə fərəh görünəcək,
9. *dünyadakı* səylərindən məmnun qalacaq,
10. uca Cənnətdə olacaq,
11. orada faydasız söz eşitməyəcəkdir.
12. Orada axar çeşmələr vardır;
13. Orada hündür taxtlar,
14. düzülmüş piyalələr,
15. yan-yana qoyulmuş yastıqlar,
16. və döşəmələrə sərilmiş xalçalar vardır.

هَلْ أَتَىٰكَ حَدِيثُ ٱلْغَٰشِيَةِ ﴿١﴾

وُجُوهٌ يَوْمَئِذٍ خَٰشِعَةٌ ﴿٢﴾

عَامِلَةٌ نَّاصِبَةٌ ﴿٣﴾

تَصْلَىٰ نَارًا حَامِيَةً ﴿٤﴾

تُسْقَىٰ مِنْ عَيْنٍ ءَانِيَةٍ ﴿٥﴾

لَّيْسَ لَهُمْ طَعَامٌ إِلَّا مِن ضَرِيعٍ ﴿٦﴾

لَّا يُسْمِنُ وَلَا يُغْنِى مِن جُوعٍ ﴿٧﴾

وُجُوهٌ يَوْمَئِذٍ نَّاعِمَةٌ ﴿٨﴾

لِّسَعْيِهَا رَاضِيَةٌ ﴿٩﴾

فِى جَنَّةٍ عَالِيَةٍ ﴿١٠﴾

لَّا تَسْمَعُ فِيهَا لَٰغِيَةً ﴿١١﴾

فِيهَا عَيْنٌ جَارِيَةٌ ﴿١٢﴾

فِيهَا سُرُرٌ مَّرْفُوعَةٌ ﴿١٣﴾

وَأَكْوَابٌ مَّوْضُوعَةٌ ﴿١٤﴾

وَنَمَارِقُ مَصْفُوفَةٌ ﴿١٥﴾

وَزَرَابِىُّ مَبْثُوثَةٌ ﴿١٦﴾

17. Məgər onlar dəvənin necə yaradıldığını görmürlər?

أَفَلَا يَنظُرُونَ إِلَى ٱلْإِبِلِ كَيْفَ خُلِقَتْ ١٧

18. Göyün necə yüksəldiyini *görmürlər*?

وَإِلَى ٱلسَّمَآءِ كَيْفَ رُفِعَتْ ١٨

19. Dağların necə sancıldığını *görmürlər*?

وَإِلَى ٱلْجِبَالِ كَيْفَ نُصِبَتْ ١٩

20. Yerin necə döşədildiyini *görmürlər*?

وَإِلَى ٱلْأَرْضِ كَيْفَ سُطِحَتْ ٢٠

21. *Onlara* nəsihət ver! Sən yalnız nəsihətçisən.

فَذَكِّرْ إِنَّمَآ أَنتَ مُذَكِّرٌ ٢١

22. Sən onların üstündə hökmdar deyilsən.

لَّسْتَ عَلَيْهِم بِمُصَيْطِرٍ ٢٢

23. Lakin üz döndərib küfr edəni,

إِلَّا مَن تَوَلَّىٰ وَكَفَرَ ٢٣

24. Allah ən şiddətli əzabla cəzalandırar.

فَيُعَذِّبُهُ ٱللَّهُ ٱلْعَذَابَ ٱلْأَكْبَرَ ٢٤

25. Şübhəsiz ki, onların dönüşü Bizədir.

إِنَّ إِلَيْنَآ إِيَابَهُمْ ٢٥

26. Sonra onları sorğu-suala çəkmək də Bizə aiddir.

ثُمَّ إِنَّ عَلَيْنَا حِسَابَهُم ٢٦



# əl-Fəcr («Dan yeri») surəsi

سُورَةُ الفَجْرِ

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ

1. And olsun dan yerinə!
2. And olsun on gecəyə!
3. And olsun cütə və təkə!
4. And olsun keçib getməkdə olan gecəyə!
5. Məgər bu *andlar* ağıl sahibi üçün kifayət deyilmi?
6. Məgər görmədinmi ki, Rəbbin nələr etdi Ad *qövmünə*,
7. sütunlar sahibi İrəm *qəbiləsinə* –
8. halbuki, yer üzündə onlar kimisi xəlq edilməmişdi;
9. *Habelə* vadidə qayaları yonan Səmud *qövmünə*?
10. Eləcə də sütunlar sahibi Firona?
11. Onlar o kəslər idi ki, ölkələrində həddi aşmış,
12. çoxlu fitnə-fəsad törətmişdilər.
13. Rəbbin də onları əzabla qamçıladı.
14. Həqiqətən, sənin Rəbbin nəzarət edir.
15. İnsana gəlincə, Rəbbi onu sınayıb ehtiram göstərəndə və ona nemət verəndə: “Rəbbim mənə ehtiram göstərdi!”– deyər.

وَالْفَجْرِ ﴿١﴾
وَلَيَالٍ عَشْرٍ ﴿٢﴾
وَالشَّفْعِ وَالْوَتْرِ ﴿٣﴾
وَاللَّيْلِ إِذَا يَسْرِ ﴿٤﴾
هَلْ فِي ذَٰلِكَ قَسَمٌ لِّذِي حِجْرٍ ﴿٥﴾
أَلَمْ تَرَ كَيْفَ فَعَلَ رَبُّكَ بِعَادٍ ﴿٦﴾
إِرَمَ ذَاتِ الْعِمَادِ ﴿٧﴾
الَّتِي لَمْ يُخْلَقْ مِثْلُهَا فِي الْبِلَادِ ﴿٨﴾
وَثَمُودَ الَّذِينَ جَابُوا الصَّخْرَ بِالْوَادِ ﴿٩﴾
وَفِرْعَوْنَ ذِي الْأَوْتَادِ ﴿١٠﴾
الَّذِينَ طَغَوْا فِي الْبِلَادِ ﴿١١﴾
فَأَكْثَرُوا فِيهَا الْفَسَادَ ﴿١٢﴾
فَصَبَّ عَلَيْهِمْ رَبُّكَ سَوْطَ عَذَابٍ ﴿١٣﴾
إِنَّ رَبَّكَ لَبِالْمِرْصَادِ ﴿١٤﴾
فَأَمَّا الْإِنسَانُ إِذَا مَا ابْتَلَاهُ رَبُّهُ فَأَكْرَمَهُ
وَنَعَّمَهُ فَيَقُولُ رَبِّي أَكْرَمَنِ ﴿١٥﴾

**16.** Amma onu sınamaq üçün ruzisini azaldanda: "Rəbbim məni alçaltdı!"– deyər.

وَأَمَّآ إِذَا مَا ٱبْتَلَىٰهُ فَقَدَرَ عَلَيْهِ رِزْقَهُۥ فَيَقُولُ رَبِّىٓ أَهَٰنَنِ ﴿١٦﴾

**17.** Xeyr! Əslində siz yetimə ehtiram göstərmirsiniz,

كَلَّا ۖ بَل لَّا تُكْرِمُونَ ٱلْيَتِيمَ ﴿١٧﴾

**18.** kasıbı yedirməyə bir-birinizi təhrik etmirsiniz,

وَلَا تَحَٰٓضُّونَ عَلَىٰ طَعَامِ ٱلْمِسْكِينِ ﴿١٨﴾

**19.** mirası hərisliklə yeyirsiniz,

وَتَأْكُلُونَ ٱلتُّرَاثَ أَكْلًا لَّمًّا ﴿١٩﴾

**20.** var-dövləti də hərisliklə sevirsiniz.

وَتُحِبُّونَ ٱلْمَالَ حُبًّا جَمًّا ﴿٢٠﴾

**21.** Xeyr! Elə ki yer lərzəyə gəlib parça-parça olacaq,

كَلَّآ إِذَا دُكَّتِ ٱلْأَرْضُ دَكًّا دَكًّا ﴿٢١﴾

**22.** sənin Rəbbin və səf-səf *düzülmüş* mələklər gələcək

وَجَآءَ رَبُّكَ وَٱلْمَلَكُ صَفًّا صَفًّا ﴿٢٢﴾

**23.** və o gün Cəhənnəm gətiriləcək. O gün insan *günahlarını* xatırlayacaqdır. Lakin *bu* xatırlamanın ona nə faydası?

وَجِاىٓءَ يَوْمَئِذٍۭ بِجَهَنَّمَ ۚ يَوْمَئِذٍ يَتَذَكَّرُ ٱلْإِنسَٰنُ وَأَنَّىٰ لَهُ ٱلذِّكْرَىٰ ﴿٢٣﴾

**24.** O: "Kaş *axirət* həyatım üçün əvvəlcədən hazırlıq görəydim!"– deyəcəkdir.

يَقُولُ يَٰلَيْتَنِى قَدَّمْتُ لِحَيَاتِى ﴿٢٤﴾

**25.** O gün heç kəs *Allahın* verdiyi əzab *kimi* əzab verə bilməz

فَيَوْمَئِذٍ لَّا يُعَذِّبُ عَذَابَهُۥٓ أَحَدٌ ﴿٢٥﴾

**26.** və heç kəs Onun buxovladığı *kimi* buxovlaya bilməz.

وَلَا يُوثِقُ وَثَاقَهُۥٓ أَحَدٌ ﴿٢٦﴾

**27.** *O gün mömինə deyiləcəkdir*: "Ey arxayın olan kəs!

يَٰٓأَيَّتُهَا ٱلنَّفْسُ ٱلْمُطْمَئِنَّةُ ﴿٢٧﴾

**28.** Razı qalmış və razılıq qazanmış halda öz Rəbbinə tərəf dön!

ٱرْجِعِىٓ إِلَىٰ رَبِّكِ رَاضِيَةً مَّرْضِيَّةً ﴿٢٨﴾

29. Mənim qullarımın *cərgəsinə* keçi! فَٱدۡخُلِي فِي عِبَٰدِي ٢٩

30. Cənnətimə daxil ol! وَٱدۡخُلِي جَنَّتِي ٣٠



## əl-Bələd («Şəhər») surəsi

## سُورَةُ البَلَدِ

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

| | |
|---|---|
| 1. And içirəm bu şəhərə (Məkkəyə)! | لَآ أُقۡسِمُ بِهَٰذَا ٱلۡبَلَدِ ١ |
| 2. Sən də o şəhərin sakinisən. | وَأَنتَ حِلُّۢ بِهَٰذَا ٱلۡبَلَدِ ٢ |
| 3. And olsun valideynə və onun törəməsinə! | وَوَالِدٖ وَمَا وَلَدَ ٣ |
| 4. Biz insanı çətinlik içində xəlq etdik. | لَقَدۡ خَلَقۡنَا ٱلۡإِنسَٰنَ فِي كَبَدٍ ٤ |
| 5. O, heç kəsin ona gücü çatmayacağınımı güman edir?! | أَيَحۡسَبُ أَن لَّن يَقۡدِرَ عَلَيۡهِ أَحَدٞ ٥ |
| 6. O deyir: "Mən çoxlu var-dövlət sərf etmişəm!" | يَقُولُ أَهۡلَكۡتُ مَالٗا لُّبَدًا ٦ |
| 7. O, heç kəsin onu görməyəcəyinimi zənn edir?! | أَيَحۡسَبُ أَن لَّمۡ يَرَهُۥٓ أَحَدٌ ٧ |
| 8. Məgər ona iki gözü Biz verməmişikmi?! | أَلَمۡ نَجۡعَل لَّهُۥ عَيۡنَيۡنِ ٨ |
| 9. Bir dillə iki dodaq *verməmişikmi*?! | وَلِسَانٗا وَشَفَتَيۡنِ ٩ |
| 10. Onu iki yoxuşlu yola yönəltmədikmi?! | وَهَدَيۡنَٰهُ ٱلنَّجۡدَيۡنِ ١٠ |
| 11. O isə sərt yoxuşu aşmağa can atmadı. | فَلَا ٱقۡتَحَمَ ٱلۡعَقَبَةَ ١١ |
| 12. Sən nə bilirsən ki, sərt yoxuş nədir? | وَمَآ أَدۡرَىٰكَ مَا ٱلۡعَقَبَةُ ١٢ |
| 13. O, bir kölə azad etməkdir | فَكُّ رَقَبَةٍ ١٣ |
| 14. və ya aclıq günündə möhtaca yemək verməkdir – | أَوۡ إِطۡعَٰمٞ فِي يَوۡمٖ ذِي مَسۡغَبَةٖ ١٤ |
| 15. qohumluq əlaqəsi çatan bir yetimə, | يَتِيمٗا ذَا مَقۡرَبَةٍ ١٥ |

16. yaxud aclıqdan yerə uzanmış kasıba!

أَوْ مِسْكِينًا ذَا مَتْرَبَةٍ ١٦

17. Sonra isə o, iman gətirən, bir-birinə səbir və mərhəmət tövsiyə edənlərdən olmaqdır.

ثُمَّ كَانَ مِنَ ٱلَّذِينَ ءَامَنُوا۟ وَتَوَاصَوْا۟ بِٱلصَّبْرِ
وَتَوَاصَوْا۟ بِٱلْمَرْحَمَةِ ١٧

18. Onlar sağ tərəf sahibləridir.

أُو۟لَٰٓئِكَ أَصْحَٰبُ ٱلْمَيْمَنَةِ ١٨

19. Ayələrimizi inkar edənlər isə sol tərəf sahibləridir.

وَٱلَّذِينَ كَفَرُوا۟ بِـَٔايَٰتِنَا هُمْ أَصْحَٰبُ ٱلْمَشْـَٔمَةِ ١٩

20. Od onların üzərində qapanacaqdır.

عَلَيْهِمْ نَارٌ مُّؤْصَدَةٌۢ ٢٠



## əş-Şəms
## («Günəş») surəsi

*Mərhəmətli və Rəhmli*
*Allahın adı ilə!*

1. And olsun günəşə və onun saçdığı şəfəqə!
2. And olsun ondan sonra zühur edən aya!
3. And olsun *günəşi* açıqlığa çıxardan gündüzə!
4. And olsun *günəşi* bürüyən gecəyə!
5. And olsun göyə və onu qurana!
6. And olsun yerə və onu döşəyənə!
7. And olsun nəfsə və onu yaradıb kamilləşdirənə,
8. ona günahları və *Allahdan* qorxmağı təlqin edənə!
9. Nəfsini *günahdan* təmizləyən uğur qazanmışdır.
10. Onu *günaha* batıran isə ziyana uğramışdır.
11. Səmud *qövmü* öz azğınlığı üzündən *Allahın elçisini* təkzib etdi.
12. Onların ən bədbəxti *dəvəni kəsməyə* qalxdıqda
13. Allahın elçisi onlara dedi: “Allahın bu dişi dəvəsinə *toxunmayın* və onun su içməsinə *mane olmayın*!”

## سُورَةُ الشَّمْسِ

بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ

وَالشَّمْسِ وَضُحَاهَا ١
وَالْقَمَرِ إِذَا تَلَاهَا ٢
وَالنَّهَارِ إِذَا جَلَّاهَا ٣
وَاللَّيْلِ إِذَا يَغْشَاهَا ٤
وَالسَّمَاءِ وَمَا بَنَاهَا ٥
وَالْأَرْضِ وَمَا طَحَاهَا ٦
وَنَفْسٍ وَمَا سَوَّاهَا ٧
فَأَلْهَمَهَا فُجُورَهَا وَتَقْوَاهَا ٨
قَدْ أَفْلَحَ مَن زَكَّاهَا ٩
وَقَدْ خَابَ مَن دَسَّاهَا ١٠
كَذَّبَتْ ثَمُودُ بِطَغْوَاهَا ١١
إِذِ انبَعَثَ أَشْقَاهَا ١٢
فَقَالَ لَهُمْ رَسُولُ اللَّهِ نَاقَةَ اللَّهِ وَسُقْيَاهَا ١٣

14. Onlar isə peyğəmbəri yalançı sayıb, dəvənin diz vətərini kəsdilər. Onların Rəbbi də bu günahlarına görə onların hamısını qırıb yerlə-yeksan etdi.

فَكَذَّبُوهُ فَعَقَرُوهَا فَدَمْدَمَ عَلَيْهِمْ رَبُّهُم
بِذَنۢبِهِمْ فَسَوَّىٰهَا ﴿١٤﴾

15. *Allah* günahkarlara etdiyinin *nəticəsindən* çəkinməz!

وَلَا يَخَافُ عُقْبَٰهَا ﴿١٥﴾



## əl-Leyl
## («Gecə») surəsi




*Mərhəmətli və Rəhmli*
*Allahın adı ilə!*

بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ

1. And olsun *yer üzünü zülmətə* bürüməkdə olan gecəyə!

وَاللَّيْلِ إِذَا يَغْشَىٰ ﴿١﴾

2. And olsun *günəşin çıxması ilə* aydınlaşan gündüzə!

وَالنَّهَارِ إِذَا تَجَلَّىٰ ﴿٢﴾

3. And olsun kişini və qadını yaradana!

وَمَا خَلَقَ الذَّكَرَ وَالْأُنثَىٰ ﴿٣﴾

4. Sizin can atdıqlarınız başqa-başqadır.

إِنَّ سَعْيَكُمْ لَشَتَّىٰ ﴿٤﴾

5. Kim *haqqını* verir və *Allahdan* qorxursa,

فَأَمَّا مَنْ أَعْطَىٰ وَاتَّقَىٰ ﴿٥﴾

6. və ən gözəl olan "*lə ilahə illəllah*" *kəlməsini* təsdiq edirsə,

وَصَدَّقَ بِالْحُسْنَىٰ ﴿٦﴾

7. Biz onu ən asan olana nail edəcəyik.

فَسَنُيَسِّرُهُ لِلْيُسْرَىٰ ﴿٧﴾

8. Kim də xəsislik edərək *Rəbbinə* ehtiyacı olmadığını güman edirsə

وَأَمَّا مَن بَخِلَ وَاسْتَغْنَىٰ ﴿٨﴾

9. və ən gözəl olan "*lə ilahə illəllah*" *kəlməsini* yalan hesab edirsə,

وَكَذَّبَ بِالْحُسْنَىٰ ﴿٩﴾

10. Biz onun üstünə ən çətin olanı yükləyəcəyik.

فَسَنُيَسِّرُهُ لِلْعُسْرَىٰ ﴿١٠﴾

11. *Cəhənnəmə* düşdükdə var-dövləti ona fayda verməyəcək.

وَمَا يُغْنِي عَنْهُ مَالُهُ إِذَا تَرَدَّىٰ ﴿١١﴾

12. Şübhəsiz ki, doğru yola yönəltmək Bizə aiddir.

إِنَّ عَلَيْنَا لَلْهُدَىٰ ﴿١٢﴾

13. Sözsüz ki, Axirət də, dünya həyatı da Bizimdir.

وَإِنَّ لَنَا لَلْآخِرَةَ وَالْأُولَىٰ ﴿١٣﴾

14. Mən sizi alov saçan bir odla qorxutdum.

فَأَنذَرْتُكُمْ نَارًا تَلَظَّىٰ ﴿١٤﴾

15. Ona ancaq ən bədbəxt kimsə girər.

لَا يَصْلَاهَا إِلَّا الْأَشْقَى ﴿١٥﴾

16. O kimsə ki, *haqqı* yalan sayır və ondan üz döndərir.

الَّذِي كَذَّبَ وَتَوَلَّىٰ ﴿١٦﴾

17. *Allahdan* ən çox qorxan isə o *Oddan* uzaqlaşdırılar.

وَسَيُجَنَّبُهَا الْأَتْقَى ﴿١٧﴾

18. O kimsə ki, malını *Allah yolunda* verir, *günahlardan* təmizlənir.

الَّذِي يُؤْتِي مَالَهُ يَتَزَكَّىٰ ﴿١٨﴾

19. Əvəzi veriləcək nemət üçün onun heç kəsə minnəti olmaz.

وَمَا لِأَحَدٍ عِندَهُ مِن نِّعْمَةٍ تُجْزَىٰ ﴿١٩﴾

20. *O bunu* ancaq Ən Uca Rəbbinin Üzünü dilədiyindən (ixlasla) *edər*.

إِلَّا ابْتِغَاءَ وَجْهِ رَبِّهِ الْأَعْلَىٰ ﴿٢٠﴾

21. Andolsun ki, O, mütləq razı qalacaqdır!

وَلَسَوْفَ يَرْضَىٰ ﴿٢١﴾



## əd-Duha
## («Səhər») surəsi

*Mərhəmətli və Rəhmli*
*Allahın adı ilə!*

1. And olsun səhərə!
2. And olsun sakitləşən gecəyə!
3. Rəbbin nə səni tərk etmişdi, nə də *sənə* acığı tutmuşdu.
4. Həqiqətən, Axirət sənə dünya həyatından daha xeyirlidir.
5. Şübhəsiz ki, Rəbbin sənə *nemət* bəxş edəcək, sən də razı qalacaqsan.
6. Məgər O, səni yetim çağında qoruyub sığınacaq vermədimi?
7. Səni çaşqın olduğun halda doğru yola yönəltmədimi?
8. Kasıb olduğun zaman səni varlandırmadımı?
9. Elə isə yetimə xor baxma!
10. *S*əndən *kömək* diləyəni qovma!
11. Və Rəbbinin nemə

## سُورَةُ الضُّحَى

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

وَٱلضُّحَىٰ ١
وَٱلَّيۡلِ إِذَا سَجَىٰ ٢
مَا وَدَّعَكَ رَبُّكَ وَمَا قَلَىٰ ٣
وَلَلۡـَٔاخِرَةُ خَيۡرٞ لَّكَ مِنَ ٱلۡأُولَىٰ ٤
وَلَسَوۡفَ يُعۡطِيكَ رَبُّكَ فَتَرۡضَىٰٓ ٥
أَلَمۡ يَجِدۡكَ يَتِيمٗا فَـَٔاوَىٰ ٦
وَوَجَدَكَ ضَآلّٗا فَهَدَىٰ ٧
وَوَجَدَكَ عَآئِلٗا فَأَغۡنَىٰ ٨
فَأَمَّا ٱلۡيَتِيمَ فَلَا تَقۡهَرۡ ٩
وَأَمَّا ٱلسَّآئِلَ فَلَا تَنۡهَرۡ ١٠
وَأَمَّا بِنِعۡمَةِ رَبِّكَ فَحَدِّثۡ ١١



## əş-Şərh
## («Genişlənmə») surəsi

## سُورَةُ الشَّرۡحِ

*Mərhəmətli və Rəhmli*
*Allahın adı ilə!*

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

1. Məgər Biz sənin üçün köksünü açmadıqmı?

أَلَمۡ نَشۡرَحۡ لَكَ صَدۡرَكَ ١

2. Yükünü səndən götürmədikmi?

وَوَضَعۡنَا عَنكَ وِزۡرَكَ ٢

3. *Onlar* belini bükürdü.

ٱلَّذِيٓ أَنقَضَ ظَهۡرَكَ ٣

4. Biz adını sənə görə ucaltmadıqmı?

وَرَفَعۡنَا لَكَ ذِكۡرَكَ ٤

5. Sözsüz ki, hər çətinliyin ardınca asanlıq gəlir.

فَإِنَّ مَعَ ٱلۡعُسۡرِ يُسۡرًا ٥

6. Əlbəttə ki, hər çətinliyin ardınca asanlıq gəlir.

إِنَّ مَعَ ٱلۡعُسۡرِ يُسۡرٗا ٦

7. *İşlərini* qurtaran kimi *Allah yolunda* çalış!

فَإِذَا فَرَغۡتَ فَٱنصَبۡ ٧

8. *Ancaq* Rəbbinə üz tut!

وَإِلَىٰ رَبِّكَ فَٱرۡغَب ٨



## ət-Tin
## («Əncir») surəsi

*Mərhəmətli və Rəhmli*
*Allahın adı ilə!*

1. And olsun əncirə və zeytuna!
2. And olsun Sinay dağına!
3. And olsun bu təhlükəsiz şəhərə (Məkkəyə)!
4. Biz insanı ən gözəl surətdə yaratdıq!
5. Sonra isə onu aşağı qatların ən aşağısına – *Cəhənnəmin dibinə* qaxacağıq.
6. İman gətirib yaxşı işlər görənlər istisna olmaqla! Onlar üçün tükənməz mükafat hazırlanmışdır.
7. Bundan sonra dini yalanlamağa səni nə məcbur edir?
8. Məgər Allah hakimlərin Hakimi deyilmi?!

## سُورَةُ التِّين

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

وَٱلتِّينِ وَٱلزَّيۡتُونِ ١

وَطُورِ سِينِينَ ٢

وَهَٰذَا ٱلۡبَلَدِ ٱلۡأَمِينِ ٣

لَقَدۡ خَلَقۡنَا ٱلۡإِنسَٰنَ فِيٓ أَحۡسَنِ تَقۡوِيمٖ ٤

ثُمَّ رَدَدۡنَٰهُ أَسۡفَلَ سَٰفِلِينَ ٥

إِلَّا ٱلَّذِينَ ءَامَنُواْ وَعَمِلُواْ ٱلصَّٰلِحَٰتِ فَلَهُمۡ أَجۡرٌ
غَيۡرُ مَمۡنُونٖ ٦

فَمَا يُكَذِّبُكَ بَعۡدُ بِٱلدِّينِ ٧

أَلَيۡسَ ٱللَّهُ بِأَحۡكَمِ ٱلۡحَٰكِمِينَ ٨



## əl-Ələq («Laxtalanmış qan») surəsi

## سُورَةُ العَلَقِ

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

1. Yaradan Rəbbinin adı ilə oxu!
2. O, insanı qan laxtasından yaratdı.
3. Oxu! Sənin Rəbbin müqayisəsiz səxavətə malikdir.
4. O, qələmlə *yazmağı* öyrətdi.
5. İnsana bilmədiklərini öyrətdi.
6. Xeyr! İnsan, doğrudan da, həddini aşır –
7. özünün ehtiyacsız olduğunu zənn etdiyinə görə.
8. Axı son dönüşün Rəbbinədir!
9. Gördünmü o kəsi ki, mane olur –
10. bir bəndəyə namaz qıldığı zaman?
11. Söylə görək, əgər o *bəndə* doğru yoldadırsa,
12. yaxud *Allahdan* qorxmağı əmr edirsə, *onda necə olsun*?
13. Söylə görək, əgər *o kafir haqqı* yalan sayıb üz döndəribsə, *onda necə olsun*?
14. Məgər o bilmir ki, Allah görür?!
15. Xeyr! Əgər *yaramaz əməlinə* son qoymasa, *Biz onun* kəkilindən tutacağıq –

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

ٱقْرَأْ بِٱسْمِ رَبِّكَ ٱلَّذِى خَلَقَ ١

خَلَقَ ٱلْإِنسَٰنَ مِنْ عَلَقٍ ٢

ٱقْرَأْ وَرَبُّكَ ٱلْأَكْرَمُ ٣

ٱلَّذِى عَلَّمَ بِٱلْقَلَمِ ٤

عَلَّمَ ٱلْإِنسَٰنَ مَا لَمْ يَعْلَمْ ٥

كَلَّآ إِنَّ ٱلْإِنسَٰنَ لَيَطْغَىٰٓ ٦

أَن رَّءَاهُ ٱسْتَغْنَىٰٓ ٧

إِنَّ إِلَىٰ رَبِّكَ ٱلرُّجْعَىٰٓ ٨

أَرَءَيْتَ ٱلَّذِى يَنْهَىٰ ٩

عَبْدًا إِذَا صَلَّىٰٓ ١٠

أَرَءَيْتَ إِن كَانَ عَلَى ٱلْهُدَىٰٓ ١١

أَوْ أَمَرَ بِٱلتَّقْوَىٰٓ ١٢

أَرَءَيْتَ إِن كَذَّبَ وَتَوَلَّىٰٓ ١٣

أَلَمْ يَعْلَم بِأَنَّ ٱللَّهَ يَرَىٰ ١٤

كَلَّا لَئِن لَّمْ يَنتَهِ لَنَسْفَعًۢا بِٱلنَّاصِيَةِ ١٥

16. yalançı, günahkar kəkilindən.

نَاصِيَةٍ كَاذِبَةٍ خَاطِئَةٍ ﴿١٦﴾

17. Qoy öz yığnağını çağırsın.

فَلْيَدْعُ نَادِيَهُۥ ﴿١٧﴾

18. Biz də əzab mələklərini çağıracağıq.

سَنَدْعُ ٱلزَّبَانِيَةَ ﴿١٨﴾

19. Xeyr, sən ona qulaq asma! Səcdə qıl və *Allaha* yaxınlaş!

كَلَّا لَا تُطِعْهُ وَٱسْجُدْ وَٱقْتَرِب ۩ ﴿١٩﴾



## əl-Qədr («Qədr gecəsi») surəsi

## سُورَةُ القَدْرِ

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ

1. Həqiqətən, Biz Quranı Qədr gecəsində nazil etdik!
2. Sən haradan biləsən ki, Qədr gecəsi nədir?
3. Qədr gecəsi min aydan xeyirlidir.
4. O gecə Rəbbinin izni ilə mələklər və Ruh *Cəbrail* hər işə görə *yerə* enirlər.
5. O gecə sübh açılanadək əmin-amanlıq olur.

إِنَّا أَنزَلْنَٰهُ فِي لَيْلَةِ الْقَدْرِ ﴿١﴾

وَمَا أَدْرَىٰكَ مَا لَيْلَةُ الْقَدْرِ ﴿٢﴾

لَيْلَةُ الْقَدْرِ خَيْرٌ مِّنْ أَلْفِ شَهْرٍ ﴿٣﴾

تَنَزَّلُ الْمَلَٰٓئِكَةُ وَالرُّوحُ فِيهَا بِإِذْنِ رَبِّهِم مِّن كُلِّ أَمْرٍ ﴿٤﴾

سَلَٰمٌ هِيَ حَتَّىٰ مَطْلَعِ الْفَجْرِ ﴿٥﴾



## əl-Beyyinə («Açıq-aydın dəlil») surəsi

## سُورَةُ البَيِّنَةِ

*Mərhəmətli və Rəhimli Allahın adı ilə!*

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

1. Kitab əhlindən və müşriklərdən inkar edənlər onlara açıq-aydın dəlil gəlməyincə *küfrlərindən* əl çəkmədilər.

لَمۡ يَكُنِ ٱلَّذِينَ كَفَرُواْ مِنۡ أَهۡلِ ٱلۡكِتَٰبِ وَٱلۡمُشۡرِكِينَ
مُنفَكِّينَ حَتَّىٰ تَأۡتِيَهُمُ ٱلۡبَيِّنَةُ ١

2. *Bu dəlil* pak səhifələri oxuyan Allahın göndərdiyi Elçidir.

رَسُولٞ مِّنَ ٱللَّهِ يَتۡلُواْ صُحُفٗا مُّطَهَّرَةٗ ٢

3. Onların içində doğru yazılar vardır.

فِيهَا كُتُبٞ قَيِّمَةٞ ٣

4. Kitab verilənlər onlara yalnız aydın bir dəlil gəldikdən sonra firqələrə bölündülər.

وَمَا تَفَرَّقَ ٱلَّذِينَ أُوتُواْ ٱلۡكِتَٰبَ إِلَّا مِنۢ بَعۡدِ مَا
جَآءَتۡهُمُ ٱلۡبَيِّنَةُ ٤

5. Halbuki onlara, dini məhz Allaha məxsus edərək, həniflər kimi ibadət etmək, namaz qılmaq və zəkat vermək əmr olunmuşdu. Doğru din də elə budur!

وَمَآ أُمِرُوٓاْ إِلَّا لِيَعۡبُدُواْ ٱللَّهَ مُخۡلِصِينَ لَهُ
ٱلدِّينَ حُنَفَآءَ وَيُقِيمُواْ ٱلصَّلَوٰةَ وَيُؤۡتُواْ
ٱلزَّكَوٰةَۚ وَذَٰلِكَ دِينُ ٱلۡقَيِّمَةِ ٥

6. Həqiqətən, Kitab əhlindən və müşriklərdən inkar edənlərin məskəni Cəhənnəm odu olacaq və orada əbədi qalacaqlar. Onlar məxluqatın ən pisləridir.

إِنَّ ٱلَّذِينَ كَفَرُواْ مِنۡ أَهۡلِ ٱلۡكِتَٰبِ
وَٱلۡمُشۡرِكِينَ فِي نَارِ جَهَنَّمَ خَٰلِدِينَ فِيهَآۚ أُوْلَٰٓئِكَ
هُمۡ شَرُّ ٱلۡبَرِيَّةِ ٦

7. Şübhəsiz ki, iman gətirib yaxşı işlər görənlər məxluqların ən yaxşısıdırlar.

إِنَّ ٱلَّذِينَ ءَامَنُواْ وَعَمِلُواْ ٱلصَّٰلِحَٰتِ
أُوْلَٰٓئِكَ هُمۡ خَيۡرُ ٱلۡبَرِيَّةِ ٧

8. Onların Rəbbinin yanındakı mükafatı *ağacları* altından çaylar axan, içində əbədi qalacaqları

جَزَآؤُهُمۡ عِندَ رَبِّهِمۡ جَنَّٰتُ عَدۡنٖ تَجۡرِي
مِن تَحۡتِهَا ٱلۡأَنۡهَٰرُ خَٰلِدِينَ فِيهَآ أَبَدٗاۖ رَّضِيَ ٱللَّهُ

Ədn bağlarıdır. Allah onlardan razıdır, onlar da Ondan razıdırlar. Bu nemətlər, Rəbbindən qorxan kimsələrdən ötrüdür!

عَنْهُمْ وَرَضُوا عَنْهُ ذَٰلِكَ لِمَنْ خَشِيَ رَبَّهُ ۝٨



## əz-Zəlzələ («Zəlzələ») surəsi




*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ

1. Yer titrəyib lərzəyə gələcəyi zaman;
2. Yer öz yükünü bayıra atacağı
3. və insan: “Ona nə olub?”– deyəcəyi zaman –
4. həmin gün yer öz əhvalatlarını danışacaqdır.
5. Çünki Rəbbin ona vəhy edəcəkdir.
6. O gün insanlar əməllərinin onlara göstərilməsi üçün dəstə-dəstə gələcəklər.
7. Zərrə qədər yaxşılıq edən *əvəzini* alacaqdır.
8. Zərrə qədər pislik edən də *əvəzini* alacaqdır.

إِذَا زُلْزِلَتِ الْأَرْضُ زِلْزَالَهَا ١

وَأَخْرَجَتِ الْأَرْضُ أَثْقَالَهَا ٢

وَقَالَ الْإِنْسَانُ مَا لَهَا ٣

يَوْمَئِذٍ تُحَدِّثُ أَخْبَارَهَا ٤

بِأَنَّ رَبَّكَ أَوْحَىٰ لَهَا ٥

يَوْمَئِذٍ يَصْدُرُ النَّاسُ أَشْتَاتًا لِيُرَوْا أَعْمَالَهُمْ ٦

فَمَنْ يَعْمَلْ مِثْقَالَ ذَرَّةٍ خَيْرًا يَرَهُ ٧

وَمَنْ يَعْمَلْ مِثْقَالَ ذَرَّةٍ شَرًّا يَرَهُ ٨



## əl-Adiyat («Çapanlar») surəsi

## سُورَةُ العَادِيَاتِ

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

1. And olsun tövşüyə-tövşüyə çapanlara!

وَٱلْعَٰدِيَٰتِ ضَبْحًا ١

2. And olsun dırnaqları ilə qığılcım çıxaranlara!

فَٱلْمُورِيَٰتِ قَدْحًا ٢

3. And olsun sübh çağı həmlə edənlərə ki,

فَٱلْمُغِيرَٰتِ صُبْحًا ٣

4. hücuma keçib tozanaq qaldıraraq

فَأَثَرْنَ بِهِۦ نَقْعًا ٤

5. qoşunun içərisinə soxulurlar.

فَوَسَطْنَ بِهِۦ جَمْعًا ٥

6. Həqiqətən, insan Rəbbinə qarşı yaman nankordur.

إِنَّ ٱلْإِنسَٰنَ لِرَبِّهِۦ لَكَنُودٌ ٦

7. Özü də bunun şahididir.

وَإِنَّهُۥ عَلَىٰ ذَٰلِكَ لَشَهِيدٌ ٧

8. Həqiqətən, o, var-dövlətə çox hərisdir.

وَإِنَّهُۥ لِحُبِّ ٱلْخَيْرِ لَشَدِيدٌ ٨

9. Məgər o bilmir ki, qəbirlərdə olanlar çıxardılacağı

۞ أَفَلَا يَعْلَمُ إِذَا بُعْثِرَ مَا فِى ٱلْقُبُورِ ٩

10. və köksləndə olanlar aşkar ediləcəyi zaman –

وَحُصِّلَ مَا فِى ٱلصُّدُورِ ١٠

11. məhz o gün Rəbbi onlardan xəbərdar olacaqdır?

إِنَّ رَبَّهُم بِهِمْ يَوْمَئِذٍ لَّخَبِيرٌۢ ١١



## əl-Qariə («Qorxuya salan») surəsi

## سُورَةُ القَارِعَةِ

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

1. *Qəlbləri* Qorxuya salan Qariə!
2. *Qəlbləri* Qorxuya salan Qariə nədir?
3. Sən haradan biləsən ki, *qəlbləri* Qorxuya salan Qariə nədir?
4. O gün insanlar *ətrafa* səpələnmiş pərvanələr tək olacaqlar.
5. Dağlar isə didilmiş yun görkəmi alacaqdır.
6. *O gün* kimin tərəziləri ağır gələrsə
7. xoşbəxt güzəran sürəcək.
8. Kimin tərəziləri yüngül gələrsə,
9. məskəni Haviyə olacaqdır.
10. Sən haradan biləsən ki, o nədir?
11. O, çox qızmar bir oddur!

ٱلْقَارِعَةُ ١

مَا ٱلْقَارِعَةُ ٢

وَمَآ أَدْرَىٰكَ مَا ٱلْقَارِعَةُ ٣

يَوْمَ يَكُونُ ٱلنَّاسُ كَٱلْفَرَاشِ ٱلْمَبْثُوثِ ٤

وَتَكُونُ ٱلْجِبَالُ كَٱلْعِهْنِ ٱلْمَنفُوشِ ٥

فَأَمَّا مَن ثَقُلَتْ مَوَٰزِينُهُۥ ٦

فَهُوَ فِى عِيشَةٍ رَّاضِيَةٍ ٧

وَأَمَّا مَنْ خَفَّتْ مَوَٰزِينُهُۥ ٨

فَأُمُّهُۥ هَاوِيَةٌ ٩

وَمَآ أَدْرَىٰكَ مَا هِيَهْ ١٠

نَارٌ حَامِيَةٌۢ ١١



## ət-Təkasur («Çoxluğa hərislik») surəsi




*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

1. Çoxluğa hərisliyiniz başınızı o qədər qatdı ki,

أَلۡهَىٰكُمُ ٱلتَّكَاثُرُ ١

2. gömülməklə qəbirləri ziyarət etdiniz.

حَتَّىٰ زُرۡتُمُ ٱلۡمَقَابِرَ ٢

3. Yox-yox! Siz *aqibətinizi* hökmən biləcəksiniz!

كَلَّا سَوۡفَ تَعۡلَمُونَ ٣

4. Bir də yox! Siz *aqibətinizi* tezliklə biləcəksiniz!

ثُمَّ كَلَّا سَوۡفَ تَعۡلَمُونَ ٤

5. Xeyr! Kaş ki, yəqin biləydiniz.

كَلَّا لَوۡ تَعۡلَمُونَ عِلۡمَ ٱلۡيَقِينِ ٥

6. Siz Cəhənnəmi mütləq görəcəksiniz!

لَتَرَوُنَّ ٱلۡجَحِيمَ ٦

7. Onu həqiqətən öz gözünüzlə mütləq görəcəksiniz!

ثُمَّ لَتَرَوُنَّهَا عَيۡنَ ٱلۡيَقِينِ ٧

8. Sonra, o gün nemətlər barəsində hökmən sorğu-suala tutulacaqsınız.

ثُمَّ لَتُسۡـَٔلُنَّ يَوۡمَئِذٍ عَنِ ٱلنَّعِيمِ ٨



## əl-Əsr
## («Axşam çağı») surəsi

سُورَةُ العَصۡرِ

*Mərhəmətli və Rəhmli*
*Allahın adı ilə!*

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

1. And olsun axşam çağına!
2. Həqiqətən, insan ziyan içərisindədir.
3. Yalnız iman gətirib yaxşı işlər görənlər, bir-birinə haqqı məsləhət görənlər və bir-birinə səbirli olmağı məsləhət edənlərdən başqa.

وَٱلۡعَصۡرِ ١
إِنَّ ٱلۡإِنسَٰنَ لَفِي خُسۡرٍ ٢
إِلَّا ٱلَّذِينَ ءَامَنُواْ وَعَمِلُواْ ٱلصَّٰلِحَٰتِ
وَتَوَاصَوۡاْ بِٱلۡحَقِّ وَتَوَاصَوۡاْ بِٱلصَّبۡرِ ٣



## əl-Huməzə («Tənə edən») surəsi

## سُورَةُ الهُمَزَةِ

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ

1. Hər bir qeybət edənin, tənə vuranın vay halına!

وَيْلٌ لِّكُلِّ هُمَزَةٍ لُّمَزَةٍ ١

2. O şəxs ki, mal-dövlət toplayıb onu *təkrar-təkrar* sayır

الَّذِي جَمَعَ مَالًا وَعَدَّدَهُ ٢

3. və elə güman edir ki, var-dövləti onu əbədi saxlayacaqdır.

يَحْسَبُ أَنَّ مَالَهُ أَخْلَدَهُ ٣

4. Xeyr! O, mütləq Hutəməyə atılacaqdır.

كَلَّا لَيُنبَذَنَّ فِي الْحُطَمَةِ ٤

5. Sən haradan biləsən ki, Hutəmə nədir?

وَمَا أَدْرَاكَ مَا الْحُطَمَةُ ٥

6. *Bu*, Allahın qaladığı Oddur.

نَارُ اللَّهِ الْمُوقَدَةُ ٦

7. *O Od* ki, qalxıb ürəklərə çatacaq.

الَّتِي تَطَّلِعُ عَلَى الْأَفْئِدَةِ ٧

8. Həqiqətən, o *Od* onların üzərində qapanacaqdır.

إِنَّهَا عَلَيْهِم مُّؤْصَدَةٌ ٨

9. *Özləri də orada* yüksək dirəklərə bağlanmış *olacaqlar*.

فِي عَمَدٍ مُّمَدَّدَةٍ ٩



## əl-Fil
## («Fil») surəsi

*Mərhəmətli və Rəhimli*
*Allahın adı ilə!*

1. Rəbbinin fil sahiblərinə nələr etdiyini görmədinmi?
2. Məgər *Rəbbin* onların hiyləsini dolaşığa salmadımı?
3. Onların üzərinə qatar-qatar quşlar göndərdi.
4. *O quşlar ki*, onların üstünə *odda bişmiş* bərk gildən daşlar yağdırdı.
5. *Allah* onları sanki yeyilmiş əkin yarpağına döndərdi.

## سُورَةُ الفِيلِ

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

أَلَمۡ تَرَ كَيۡفَ فَعَلَ رَبُّكَ بِأَصۡحَٰبِ
ٱلۡفِيلِ ١
أَلَمۡ يَجۡعَلۡ كَيۡدَهُمۡ فِي تَضۡلِيلٖ ٢
وَأَرۡسَلَ عَلَيۡهِمۡ طَيۡرًا أَبَابِيلَ ٣
تَرۡمِيهِم بِحِجَارَةٖ مِّن سِجِّيلٖ ٤
فَجَعَلَهُمۡ كَعَصۡفٖ مَّأۡكُولِۭ ٥



## Qureyş
## («Qureyş») surəsi

سُورَةُ قُرَيۡشٍ

*Mərhəmətli və Rəhmli*
*Allahın adı ilə!*

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

1. Qureyşin birliyi xatirinə,

لِإِيلَٰفِ قُرَيۡشٍ ١

2. onların qış və yay səfərlərindəki birliyi xatirinə

إِۦلَٰفِهِمۡ رِحۡلَةَ ٱلشِّتَآءِ وَٱلصَّيۡفِ ٢

3. qoy onlar bu Evin Rəbbinə ibadət etsinlər.

فَلۡيَعۡبُدُواْ رَبَّ هَٰذَا ٱلۡبَيۡتِ ٣

4. *Allah* onlara aclıqdan *sonra* yemək verdi və qorxudan *sonra* əmin-amanlıq bəxş etdi.

ٱلَّذِيٓ أَطۡعَمَهُم مِّن جُوعٖ وَءَامَنَهُم مِّنۡ خَوۡفِۭ ٤



## əl-Maun («Xırda-xuruş») surəsi

## سُورَةُ المَاعُون

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

1. Dini yalan sayan o kimsəni gördünmü?

أَرَءَيْتَ ٱلَّذِى يُكَذِّبُ بِٱلدِّينِ ١

2. O elə adamdır ki, yetimi qovar

فَذَٰلِكَ ٱلَّذِى يَدُعُّ ٱلْيَتِيمَ ٢

3. və *heç kəsi* kasıba əl tutmağa sövq etməz.

وَلَا يَحُضُّ عَلَىٰ طَعَامِ ٱلْمِسْكِينِ ٣

4. Vay halına namaz qılanların –

فَوَيْلٌ لِّلْمُصَلِّينَ ٤

5. o şəxslərin ki, onlar namazlarında səhlənkardırlar.

ٱلَّذِينَ هُمْ عَن صَلَاتِهِمْ سَاهُونَ ٥

6. Onlar riyakardırlar

ٱلَّذِينَ هُمْ يُرَآءُونَ ٦

7. və az bir şey verməkdən belə imtina edirlər.

وَيَمْنَعُونَ ٱلْمَاعُونَ ٧



## əl-Kovsər («Bolluq») surəsi

سُورَةُ الكَوثَر

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ

1. Həqiqətən, Biz Kovsəri sənə bağışladıq.

إِنَّا أَعْطَيْنَاكَ الْكَوْثَرَ ۝١

2. Sən də Rəbbin üçün namaz qıl və qurban kəs!

فَصَلِّ لِرَبِّكَ وَانْحَرْ ۝٢

3. Doğrusu, sənə ədavət bəsləyənin özü sonsuzdur.

إِنَّ شَانِئَكَ هُوَ الْأَبْتَرُ ۝٣



## əl-Kafirun («Kafirlər») surəsi

سُورَةُ الكَافِرُونَ

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

1. De: "Ey kafirlər!

قُلْ يَٰٓأَيُّهَا ٱلْكَٰفِرُونَ ١

2. Mən sizin ibadət etdiklərinizə ibadət etmərəm,

لَآ أَعْبُدُ مَا تَعْبُدُونَ ٢

3. siz də mənim ibadət etdiyimə ibadət edən deyilsiniz.

وَلَآ أَنتُمْ عَٰبِدُونَ مَآ أَعْبُدُ ٣

4. Mən sizin ibadət etdiklərinizə ibadət edən deyiləm,

وَلَآ أَنَا۠ عَابِدٌ مَّا عَبَدتُّمْ ٤

5. siz də mənim ibadət etdiyimə ibadət edən deyilsiniz.

وَلَآ أَنتُمْ عَٰبِدُونَ مَآ أَعْبُدُ ٥

6. Sizin dininiz sizə, mənim dinim də mənədir!"

لَكُمْ دِينُكُمْ وَلِىَ دِينِ ٦



# ən-Nəsr
# («Kömək») surəsi




*Mərhəmətli və Rəhmli*
*Allahın adı ilə!*

1. Allahın köməyi və qələbə gəldiyi zaman,
2. insanların dəstə-dəstə Allahın dininə girdiklərini gördükdə
3. həmd ilə Rəbbini təriflə və Ondan bağışlanmağını dilə. Həqiqətən, O, tövbələri qəbul edəndir!

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

إِذَا جَآءَ نَصۡرُ ٱللَّهِ وَٱلۡفَتۡحُ ١

وَرَأَيۡتَ ٱلنَّاسَ يَدۡخُلُونَ فِي دِينِ ٱللَّهِ أَفۡوَاجٗا ٢

فَسَبِّحۡ بِحَمۡدِ رَبِّكَ وَٱسۡتَغۡفِرۡهُۚ إِنَّهُۥ كَانَ تَوَّابَۢا ٣



## əl-Məsəd
## («Xurma lifi») surəsi

## سُورَةُ المَسَد

*Mərhəmətli və Rəhimli*
*Allahın adı ilə!*

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

1. Əbu Ləhəbin əlləri qurusun, qurudu da!

تَبَّتْ يَدَآ أَبِي لَهَبٍ وَتَبَّ ١

2. Nə var-dövləti, nə də qazandıqları onu qurtara bilməyəcək.

مَآ أَغْنَىٰ عَنْهُ مَالُهُۥ وَمَا كَسَبَ ٢

3. O, alovlanan oda atılacaqdır.

سَيَصْلَىٰ نَارًا ذَاتَ لَهَبٍ ٣

4. Onun odun şələsi daşıyan arvadı da.

وَٱمْرَأَتُهُۥ حَمَّالَةَ ٱلْحَطَبِ ٤

5. Arvadının boynunda xurma liflərindən kəndir olacaqdır.

فِي جِيدِهَا حَبْلٌ مِّن مَّسَدٍۭ ٥



## əl-İxlas («Xalis ibadət») surəsi

سُورَةُ الإخلاص

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ

1. De: "O Allah Təkdir!
2. Allah Möhtac deyildir.
3. O, nə doğub, nə doğulub,
4. Onun bənzəri də yoxdur".

قُلْ هُوَ اللَّهُ أَحَدٌ ١

اللَّهُ الصَّمَدُ ٢

لَمْ يَلِدْ وَلَمْ يُولَدْ ٣

وَلَمْ يَكُن لَّهُ كُفُوًا أَحَدٌ ٤



## əl-Fələq («Sübh») surəsi

## سُورَةُ الفَلَقِ

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

بِسْمِ اللَّهِ الرَّحْمَٰنِ الرَّحِيمِ

1. De: "Sığınıram sübhün Rəbbinə!
2. Məxluqatının şərindən,
3. çökən zülmətin şərindən,
4. düyünlərə üfürən *cadugər* qadınların şərindən
5. və həsəd apardığı zaman paxılın şərindən!"

قُلْ أَعُوذُ بِرَبِّ الْفَلَقِ ۝١
مِن شَرِّ مَا خَلَقَ ۝٢
وَمِن شَرِّ غَاسِقٍ إِذَا وَقَبَ ۝٣
وَمِن شَرِّ النَّفَّاثَاتِ فِي الْعُقَدِ ۝٤
وَمِن شَرِّ حَاسِدٍ إِذَا حَسَدَ ۝٥



## ən-Nəs («İnsanlar») surəsi

*Mərhəmətli və Rəhimli Allahın adı ilə!*

1. De: "Sığınıram insanların Rəbbinə,
2. insanların Hökmdarına,
3. insanların məbuduna!
4. Vəsvəsə verənin, *Allahın adı çəkiləndə isə hövlündən* geri çəkilən *şeytanın* şərindən.
5. *O şeytan* ki, insanların ürəklərinə vəsvəsə salır,
6. cinlərdən də *olur*, insanlardan da!"

## سُورَةُ النَّاسِ

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

قُلۡ أَعُوذُ بِرَبِّ ٱلنَّاسِ ١

مَلِكِ ٱلنَّاسِ ٢

إِلَٰهِ ٱلنَّاسِ ٣

مِن شَرِّ ٱلۡوَسۡوَاسِ ٱلۡخَنَّاسِ ٤

ٱلَّذِي يُوَسۡوِسُ فِي صُدُورِ ٱلنَّاسِ ٥

مِنَ ٱلۡجِنَّةِ وَٱلنَّاسِ ٦



# فهرس أسماء السور وبيان المكي والمدني منها

# Surələrin mündəricatı



| nº | Sura | Səhifə | | السورة |
|---|---|---|---|---|
| 1 | əl-Fatihə | 1 | Məkkə | سورة الفاتحة |
| 2 | əl-Bəqərə | 2 | Mədinə | سورة البقرة |
| 3 | Əli-İmran | 61 | Mədinə | سورة آل عمران |
| 4 | ən-Nisa | 96 | Mədinə | سورة النساء |
| 5 | əl-Maidə | 132 | Mədinə | سورة المائدة |
| 6 | əl-Ənam | 159 | Mədinə | سورة الأنعام |
| 7 | əl-Əraf | 190 | Mədinə | سورة الأعراف |
| 8 | əl-Ənfəl | 225 | Mədinə | سورة الأنفال |
| 9 | ət-Tovbə | 238 | Mədinə | سورة التوبة |
| 10 | Yunus | 263 | Məkkə | سورة يونس |
| 11 | Hud | 281 | Məkkə | سورة هود |
| 12 | Yusuf | 301 | Məkkə | سورة يوسف |
| 13 | ər-Rəd | 319 | Mədinə | سورة الرعد |
| 14 | İbrahim | 328 | Məkkə | سورة إبراهيم |
| 15 | əl-Hicr | 337 | Məkkə | سورة الحجر |
| 16 | ən-Nəhl | 346 | Məkkə | سورة النحل |
| 17 | əl-İsra | 365 | Məkkə | سورة الإسراء |
| 18 | əl-Kəhf | 381 | Məkkə | سورة الكهف |
| 19 | Məryəm | 398 | Məkkə | سورة مريم |
| 20 | Ta ha | 409 | Məkkə | سورة طه |
| 21 | əl-Ənbiya | 425 | Məkkə | سورة الأنبياء |
| 22 | əl-Həcc | 439 | Mədinə | سورة الحج |
| 23 | əl-Muminun | 452 | Məkkə | سورة المؤمنون |
| 24 | ən-Nur | 465 | Mədinə | سورة النور |
| 25 | əl-Furqan | 477 | Məkkə | سورة الفرقان |
| 26 | əş-Şuəra | 487 | Məkkə | سورة الشعراء |
| 27 | ən-Nəml | 505 | Məkkə | سورة النمل |

| nº | Surə | Səhifə | | السورة |
|---|---|---|---|---|
| 28 | əl-Qasəs | 518 | Məkkə | سورة القصص |
| 29 | əl-Ənkəbut | 533 | Məkkə | سورة العنكبوت |
| 30 | ər-Rum | 544 | Məkkə | سورة الروم |
| 31 | Loğman | 553 | Məkkə | سورة لقمان |
| 32 | əs-Səcdə | 559 | Məkkə | سورة السجدة |
| 33 | əl-Əhzab | 563 | Mədinə | سورة الأحزاب |
| 34 | Səba | 576 | Məkkə | سورة سبإ |
| 35 | Fatir | 585 | Məkkə | سورة فاطر |
| 36 | Ya sin | 593 | Məkkə | سورة يس |
| 37 | əs-Saffat | 602 | Məkkə | سورة الصافات |
| 38 | Sad | 616 | Məkkə | سورة ص |
| 39 | əz-Zumər | 626 | Məkkə | سورة الزمر |
| 40 | Ğafir | 638 | Məkkə | سورة غافر |
| 41 | Fussilət | 651 | Məkkə | سورة فصلت |
| 42 | əş-Şura | 60 | Məkkə | سورة الشورى |
| 43 | əz-Zuxruf | 669 | Məkkə | سورة الزخرف |
| 44 | əd-Duxan | 679 | Məkkə | سورة الدخان |
| 45 | əl-Casiyə | 684 | Məkkə | سورة الجاثية |
| 46 | əl-Əhqaf | 690 | Məkkə | سورة الأحقاف |
| 47 | Muhəmməd | 697 | Mədinə | سورة محمد |
| 48 | əl-Fath | 703 | Mədinə | سورة الفتح |
| 49 | əl-Hucurat | 709 | Mədinə | سورة الحجرات |
| 50 | Qaf | 713 | Məkkə | سورة ق |
| 51 | əz-Zariyət | 718 | Məkkə | سورة الذاريات |
| 52 | ət-Tur | 723 | Məkkə | سورة الطور |
| 53 | ən-Nəcm | 728 | Məkkə | سورة النجم |
| 54 | əl-Qamər | 733 | Məkkə | سورة القمر |
| 55 | ər-Rəhman | 739 | Məkkə | سورة الرحمن |
| 56 | əl-Vaqiə | 745 | Məkkə | سورة الواقعة |

| nº | Surə | Səhifə | | السورة |
|---|---|---|---|---|
| 57 | əl-Hədid | 752 | Mədinə | سورة الحديد |
| 58 | əl-Mucadilə | 758 | Mədinə | سورة المجادلة |
| 59 | əl-Həşr | 763 | Mədinə | سورة الحشر |
| 60 | əl-Mumtəhinə | 768 | Mədinə | سورة الممتحنة |
| 61 | əs-Saff | 772 | Mədinə | سورة الصف |
| 62 | əl-Cumuə | 775 | Mədinə | سورة الجمعة |
| 63 | əl-Munafiqun | 777 | Mədinə | سورة المنافقون |
| 64 | əl-Təğabun | 779 | Mədinə | سورة التغابن |
| 65 | ət-Talaq | 782 | Mədinə | سورة الطلاق |
| 66 | ət-Təhrim | 785 | Mədinə | سورة التحريم |
| 67 | əl-Mulk | 788 | Məkkə | سورة الملك |
| 68 | əl-Qələm | 792 | Məkkə | سورة القلم |
| 69 | əl-Haqqa | 797 | Məkkə | سورة الحاقة |
| 70 | əl-Məaric | 801 | Məkkə | سورة المعارج |
| 71 | Nuh | 805 | Məkkə | سورة نوح |
| 72 | əl-Cinn | 808 | Məkkə | سورة الجن |
| 73 | əl-Muzzəmmil | 812 | Məkkə | سورة المزمل |
| 74 | əl-Muddəssir | 815 | Məkkə | سورة المدثر |
| 75 | əl-Qiyamə | 819 | Məkkə | سورة القيامة |
| 76 | əl-İnsan | 822 | Mədinə | سورة الإنسان |
| 77 | əl-Mursəlat | 826 | Məkkə | سورة المرسلات |
| 78 | ən-Nəbə | 830 | Məkkə | سورة النبإ |
| 79 | ən-Naziat | 833 | Məkkə | سورة النازعات |
| 80 | Abəsə | 837 | Məkkə | سورة عبس |
| 81 | ət-Təkvir | 840 | Məkkə | سورة التكوير |
| 82 | əl-İnfitar | 842 | Məkkə | سورة الانفطار |
| 83 | əl-Mutaffifin | 844 | Məkkə | سورة المطففين |
| 84 | əl-İnşiqaq | 847 | Məkkə | سورة الانشقاق |
| 85 | əl-Buruc | 849 | Məkkə | سورة البروج |

| nº | Surə | Səhifə | | السورة |
|---|---|---|---|---|
| 86 | ət-Tariq | 851 | Məkkə | سورة الطارق |
| 87 | əl-Əla | 853 | Məkkə | سورة الأعلى |
| 88 | əl-Ğaşiyə | 855 | Məkkə | سورة الغاشية |
| 89 | əl-Fəcr | 857 | Məkkə | سورة الفجر |
| 90 | əl-Bələd | 860 | Məkkə | سورة البلد |
| 91 | əş-Şəms | 862 | Məkkə | سورة الشمس |
| 92 | əl-Leyl | 864 | Məkkə | سورة الليل |
| 93 | əd-Duha | 866 | Məkkə | سورة الضحى |
| 94 | əş-Şərh | 867 | Məkkə | سورة الشرح |
| 95 | ət-Tin | 868 | Məkkə | سورة التين |
| 96 | əl-Aləq | 869 | Məkkə | سورة العلق |
| 97 | əl-Qədr | 871 | Məkkə | سورة القدر |
| 98 | əl-Beyyinə | 872 | Mədinə | سورة البينة |
| 99 | əz-Zəlzələ | 874 | Mədinə | سورة الزلزلة |
| 100 | əl-Adiyat | 875 | Məkkə | سورة العاديات |
| 101 | əl-Qariə | 876 | Məkkə | سورة القارعة |
| 102 | ət-Təkasur | 877 | Məkkə | سورة التكاثر |
| 103 | əl-Əsr | 878 | Məkkə | سورة العصر |
| 104 | əl-Huməzə | 879 | Məkkə | سورة الهمزة |
| 105 | əl-Fil | 880 | Məkkə | سورة الفيل |
| 106 | Qureyş | 881 | Məkkə | سورة قريش |
| 107 | əl-Maun | 882 | Məkkə | سورة الماعون |
| 108 | əl-Kovsər | 883 | Məkkə | سورة الكوثر |
| 109 | əl-Kafirun | 884 | Məkkə | سورة الكافرون |
| 110 | ən-Nəsr | 885 | Mədinə | سورة النصر |
| 111 | əl-Məsəd | 886 | Məkkə | سورة المسد |
| 112 | əl-İxlas | 887 | Məkkə | سورة الإخلاص |
| 113 | əl-Fələq | 888 | Məkkə | سورة الفلق |
| 114 | ən-Nəs | 889 | Məkkə | سورة الناس |

إن وزارة الشؤون الإسلامية والأوقاف والدعوة والإرشاد

في المملكة العربية السعودية

المشرفة على مجمع الملك فهد

لطباعة المصحف الشريف في المدينة المنورة

إذ يسرها أن يصدر المجمع هذه الطبعة من القرآن الكريم

وترجمة معانيه إلى اللغة الأذرية

نسأل الله أن ينفع بها الناس

وأن يجزي

خادم الحرمين الشريفين الملك عبد الله بن عبد العزيز آل سعود

أحسن الجزاء على جهوده العظيمة في نشر كتاب الله الكريم

والله ولي التوفيق

---

Qurani Kərimin nəşri üzrə Kral Fəhd adına Kompleksin Hamisi olan Səudiyyə Ərəbistanı Krallığının İslam işləri, vəqfləri, təbliğatı və təlimi Nazirliyi Qurani Kərimin və onun Azərbaycan dilinə mənaca tərcüməsi ilə birlikdə bu nəşrinin işıq üzü görməsi münasibətilə özünün dərin məmnuniyyət hissi keçirdiyini bəyan edir.

Qoy Böyük Allah bu nəşri insanlar üçün faydalı etsin və Allahın Müqəddəs Kitabının geniş yayılması üçün sərf etdiyi yüksək və davamlı səylərinə görə iki Toxunulmaz və Şərəfli Məscidin Xadimi Kral Abdullah ibn Əbdül-Əziz Əli Səudu ən gözəl tərzdə mükafatlandırsın!

Doğru yola yönəldən təkcə Allahdır!






---

ص.ب ٦٢٦٢ - المدينة المنورة
www.qurancomplex.gov.sa
contact@qurancomplex.gov.sa






---


**p/q 6262 - Mədinə şəhəri**
**Səudiyyə Ərəbistanı Krallığı**
www.qurancomplex.gov.sa
contact@qurancomplex.gov.sa

ⓒ **مجمع الملك فهد لطباعة المصحف الشريف ، ١٤٣٣ هـ**
فهرسة مكتبة الملك فهد الوطنية أثناء النشر .

مجمع الملك فهد لطباعة المصحف الشريف
**ترجمة معاني القرآن الكريم إلى اللغة الأذرية. / مجمع الملك**
فهد لطباعة المصحف الشريف . - المدينة المنورة ١٤٣٣ هـ

٩١٢ ص ؛ ١٤ × ٢١ سم

**ردمك: ٩-٥٣-٨٠٩٥-٦٠٣-٩٧٨**

١- القرآن - ترجمة - اللغة الأذرية أ. العنوان
ديوي ٢٢١٫٠٤ ١٤٣٣/٢١٥٨

**رقم الإيداع: ١٤٣٣/٢١٥٨**

**ردمك: ٩-٥٣-٨٠٩٥-٦٠٣-٩٧٨**


